

*Azərbaycan Dövlət Pedaqoji İnstitutu böyük və çətin yol keçmişdir. Onun kollektivi Azərbaycan ümumtəhsil məktəbinin inkişafında böyük xidmət göstərmiş, institut xalq maarifi üçün yüksəkixtisaslı kadrlar ocağına çevrilmişdir.*

**Heydər Əliyev**
*Azərbaycan xalqının ümummilli lideri*



*Azərbaycan Dövlət Pedaqoji Universiteti ölkəmizin təhsil tarixində xüsusi yer tutan, zəngin ənənələrə malik ali təhsil müəssisələrindəndir. Yarandığı vaxtdan etibarən Universitet üzərinə düşən vəzifələri həmişə layiqincə yerinə yetirmiş, respublikamızla yanaşı, bir sıra digər ölkələr üçün elmi-pedaqoji kadr hazırlanması işini müvəffəqiyyətlə həyata keçirmişdir.*

**İlham Əliyev**
*Azərbaycan Respublikasının Prezidenti*

Soprano
Alt

# Azərbaycan Dövlət Pedaqoji Universitetinin Himni

söz. OQTAY RZA

mus. E. DADAŞOVA

Moderato

S.
A.

8

mf

Ya - şa - yı - rıq, ya - ra - dı - rıq Tü - kən - mə - yən sev - gin i - lə.

Ya - şın ar - tıb co - xal - sa da, Gənc - lə - şir - sən il - dən - i - lə. Mə - zun - la - rın can - lı çı - raq

1. 2. da capo al

Şə - fəq ya - yır el - dən - e - lə. el - dən - e - lə. Qa - baq - da - dır ən u - ğur - lu, Xoş gü - nü - müz,

xoş ça - ğı - mız; Al - qış sə - nə, ey möh - tə - şəm A - li təh - sil o - ca - ğı - mız! Mil - li a - dət-

ən - ə - nə - yə Qay - naq - la - nıb növ - ra - ğı - mız; Müs - tə - qil - dır Və - tə - ni - miz, Mü - qəd - dəs - dir

tor - pa - ğı - mız; Al - qış sə - nə, ey möh - tə - şəm, A - li təh - sil o - ca - ğı - mız, hey!

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin**
**100 illik yubileyinə həsr olunur**

**Layihənin və ön sözün müəllifi:** **Cəfər Cəfərov**
ADPU-nun rektoru,
tarix elmləri doktoru, professor

**Elmi redaktor:** **Asəf Zamanov**
ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, fizika-riyaziyyat elmləri doktoru, professor

**Rüstəmov F.A.** Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi. (1921-2021). I cild. Bakı, ADPU, 2021, 384 səh.

ADPU-nun 100 illiyinə həsr olunmuş "Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi" kitabı iki cilddən ibarətdir.

Birinci cilddə ADPU-nun təşəkkülü və inkişafının bir əsrlik tarixi zəngin elmi mənbələr və arxiv sənədləri əsasında şərh olunur. Azərbaycanda ziyalı təbəqəsinin və elmi-pedaqoji potensialın formalaşmasında yüksəkixtisaslı müəllim kadrlarının hazırlanmasında universitetin müstəsna rolundan bəhs edilir.

İkinci cilddə hazırda universitetin müasir idarəetmə strukturu – rektorluq, prorektorluq, fakültələr, kafedralar, şöbələr və bölmələr, SABAH qrupları, filiallar, müstəqil fəaliyyət göstərən qurumlar (Həmkarlar İttifaqı Komitəsi, Tələbə Həmkarlar İttifaqı Komitəsi, Tələbə Gənclər Təşkilatı, Türk Tələbələrinin İdarəetmə Şurası,Türk odası, poliklinika və s.) və Azərbaycan Dövlət Pedaqoji Kolleci haqqında məlumatlar öz əksini tapmışdır.

Kitab təhsil tarixçiləri, tədqiqatçılar və geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.

ISBN 978-9952-8427-1-5

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı**

2021-ci ildə respublikamızın ilk ali pedaqoji təhsil ocağının – Azərbaycan Dövlət Pedaqoji Universitetinin fəaliyyətə başlamasının 100 illiyi tamam olur.

Azərbaycan Dövlət Pedaqoji Universiteti ölkəmizin təhsil tarixində xüsusi yer tutan, zəngin ənənələrə malik ali təhsil müəssisələrindəndir. Yarandığı vaxtdan etibarən Universitet üzərinə düşən vəzifələri həmişə layiqincə yerinə yetirmiş, respublikamızla yanaşı, bir sıra digər ölkələr üçün elmi-pedaqoji kadr hazırlanması işini müvəffəqiyyətlə həyata keçirmişdir. Azərbaycanın tanınmış ictimai, elm və mədəniyyət xadimləri arasında Universitetin çox sayda məzunları vardır.

İxtisaslaşmış ali təhsil müəssisəsi kimi Azərbaycan Dövlət Pedaqoji Universiteti müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə müstəqil Azərbaycanın inkişafına töhfələrini əsirgəmir. Universitetdə qabaqcıl elmi nailiyyətlərdən, innovativ təlim-tədris texnologiyalarından faydalanmaqla ali təhsilin məzmun və keyfiyyət göstəricilərinin təkmilləşdirilməsi istiqamətində zəruri addımlar atılır.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, ölkədə yüksək ixtisaslı pedaqoji və elmi-pedaqoji kadr yetişdirilməsi sahəsində mühüm xidmətlərini nəzərə alaraq, Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd olunmasını təmin etmək məqsədilə qərara alıram:

1.Azərbaycan Respublikasının Təhsil Nazirliyi Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinə dair tədbirlər planı hazırlayıb həyata keçirsin.

2.Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham Əliyev**

*Azərbaycan Respublikasının Prezidenti*

*Bakı şəhəri, 17 aprel 2021 -ci il*



**Cəfər Cəfərov,**
*ADPU-nun rektoru,*
*tarix elmləri doktoru, professor*

## Ön söz

Azərbaycan maarifçilərinin milli təəssübkeşliyi, əzmkarlığı və fədakarlığı sayəsində 100 il əvvəl yaradılan Azərbaycan Dövlət Pedaqoji Universiteti çətin, mürəkkəb və şərəfli bir yol keçmiş, milli düşüncənin inkişafına, elmi təfəkkürün və ziyalı təbəqəsinin formalaşmasına, pedaqoji və elmi-pedaqoji kadr hazırlığına misilsiz töhfələr verməklə zəngin ənənələrə malik şöhrətli təhsil və elm məbədinə çevrilmişdir.

Azərbaycan Xalq Komissarları Sovetinin sədri Nəriman Nərimanovun 1921-ci il 26 avqust tarixli 66 saylı *"Ali Pedaqoji Kişi İnstitutunun təşkili haqqında"* dekreti əsasında təşkil edilən təhsil ocağının fəaliyyətinə ümummilli lider Heydər Əliyev və onun siyasi kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən həmişə yüksək qiymət verilmişdir. Ulu öndər Heydər Əliyevin ayrı-ayrı vaxtlarda 5 dəfə (1971, 1973, 1977, 1981, 1982) universitetə gəlişi professor-müəllim heyətinin daha səmərəli və məhsuldar fəaliyyəti üçün stimul yaratmışdır. Heydər Əliyev ilk dəfə 1971-ci ildə Pedaqoji İnstitutun partiya təşkilatının hesabat-seçki konfransında, 1973-cü ildə institutun 50 illik, 1981-ci ildə 60 illik yubileylərində iştirak etmiş, yüksək dövlət mükafatlarını kollektivə təqdim edərək müəllim kadrları hazırlığının perspektivləri ilə bağlı geniş nitq söyləmişdir. 2 dəfə (1977 və 1982) Pedaqoji İnstitutda

qəbul imtahanı prosesini izləmiş, institutun professor-müəllim heyəti və abituriyentlərin valideynləri ilə görüşmüşdür. Pedaqoji İnstitutun inkişafına daim diqqət və qayğı göstərən Heydər Əliyev 14 avqust 1978-ci ildə Bolqarıstan Xalq Respublikasında əmək semestrində (tələbə inşaat dəstəsində) iştirak edən institutun bir qrup tələbəsi ilə Sofiya şəhərində görüşmüş, gənclərə əmək və təhsildə müvəffəqiyyətlər arzulamışdır.

Ulu öndər Heydər Əliyevin Pedaqoji İnstitutun 50 illik yubileyində dediyi *"Azərbaycan Dövlət Pedaqoji İnstitutu böyük və çətin yol keçmişdir. Onun kollektivi Azərbaycan ümumtəhsil məktəbinin inkişafında böyük xidmət göstərmiş, institut xalq maarifi üçün yüksəkixtisaslı kadrlar ocağına çevrilmişdir"* sözləri institutun inkişaf strategiyasının hazırlanmasında və həyata keçirilməsində mühüm rol oynamışdır.

Pedaqoji Universitet fəaliyyət göstərdiyi illər ərzində 160 mindən artıq yüksəkixtisaslı müəllim kadrları hazırlığında üzərinə düşən missiyanı layiqincə yerinə yetirmiş, bu sahədə liderliyini qoruyub saxlamışdır. Azərbaycanda pedaqogika, psixologiya və ayrı-ayrı fənlərin tədrisi metodikası bir elm sahəsi kimi məhz bu qocaman təhsil ocağında təşəkkül taparaq inkişaf etmişdir. Azərbaycan ETPEİ (indiki Təhsil İnstitutu), keçən əsrin 30-40-cı illərində fəaliyyət göstərən ikiillik müəllimlər institutları, indiki Gəncə Dövlət Universiteti, Azərbaycan Dillər Universiteti və Bakı Slavyan Universiteti ya Pedaqoji İnstitutun ayrı-ayrı fakültələrinin bazasında yaradılmış, ya da institutun pedaqoji kadrlarının köməyi ilə fəaliyyətə başlamışdır.

Azərbaycan Pedaqoji İnstitutunun Naxçıvan filialı (1967-1972) əsasında Y.Məmmədəliyev adına Naxçıvan Pedaqoji İnstitutu, onun əsasında isə Naxçıvan Dövlət Universiteti formalaşmışdır. 1967-ci ildə 3 ixtisas üzrə 102 nəfər tələbə və 3 nəfər ştatda olan müəllimlə fəaliyyətə başlayan indiki Naxçıvan Dövlət Universitetində hazırda 6 minə yaxın tələbə təhsil alır.

1969-cu ildə Azərbaycan Pedaqoji İnstitutunun filialı kimi fəaliyyətə başlayan Xankəndi Pedaqoji İnstitutu 1973-cü ildə müstəqil ali məktəbə çevrilmiş,16 may 1988-ci ilə kimi fəaliyyət göstərmişdir.1988-ci ildə erməni millətçiləri tərəfindən Xankəndidən qovulan institutun Azərbaycan bölməsinin müəllim və tələbələri bir müddət Gəncə Pedaqoji İnstitutunda yerləşmiş, sonra isə Şuşaya qayıtmışlar. Pedaqoji İnstitutun Şuşa fakültəsi, onun əsasında isə Şuşa filialı yaradılmışdır. Həmin filial hazırda Ağcabədi filialı olaraq ADPU-nun nəzdində fəaliyyət göstərir.

Bu gün elə bir təhsil müəssisəsi (məktəbəqədər, ümumtəhsil, texniki-peşə, orta ixtisas, ali), elmi idarə, təşkilat və ya təhsillə bağlı QHT yoxdur ki, orada Pedaqoji Universitetin məzunları çalışmasın. Məzunlarımız həm də dövlət orqanlarında və özəl qurumlarda, güc strukturlarında, nazirlik, komitə, səhmdar cəmiyyəti və agentliklərdə uğurla fəaliyyət göstərirlər.

Ümumiyyətlə, Pedaqoji Universitet ölkədə pedaqoji və elmi-pedaqoji kadrların hazırlığını, təkmilləşdirilməsini və ixtisasının artırılmasını həyata keçirən pedaqoji təhsil müəssisələrinin (ali və ya orta ixtisas) yaradılmasında ilkin baza rolunu oynamış, onların sonrakı inkişafına təkan vermişdir. Elə bu səbəbdəndir ki, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi ilə bağlı 17 aprel 2021-ci il tarixli Sərəncamında deyilir: *"Yarandığı vaxtdan etibarən Universitet üzərinə düşən vəzifələri həmişə layiqincə yerinə yetirmiş, respublikamızla yanaşı, bir sıra digər ölkələr üçün elmi-pedaqoji kadr hazırlanması işini müvəffəqiyyətlə həyata keçirmişdir."*

Son illərdə Pedaqoji Universitet Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin diqqət və qayğısı sayəsində dinamik inkişaf edir. Cənab Prezidentin 26 dekabr 2006-cı il tarixli Sərəncamı ilə ADPU-nun 85 illik, 18 aprel 2012-ci il tarixli Sərəncamı ilə 90 illik yubileyləri dövlət səviyyəsində keçirilmiş, elmin və təhsilin inkişafındakı xidmətlərinə görə universitetin əməkdaşlarından 2-si "Şöhrət" ordeni, 26-sı "Tərəqqi" medalı, 5-i "Əməkdar elm xadimi", 39-u "Əməkdar müəllim", 2-si "Əməkdar rəssam", 1-i "Əməkdar jurnalist", 1-i "Əməkdar mühəndis", 1-i "Əməkdar mədəniyyət işçisi" fəxri adları ilə təltif olunmuş, 1 nəfərə Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdü verilmişdir. Yubileylərdən sonra da dövlət başçısının müvafiq sərəncamları ilə universitetimizin

əməkdaşlarından 2-si "Şöhrət" ordeni, 1-i 3-cü dərəcəli "Vətənə xidmətə görə" ordeni, 3-ü "Tərəqqi" medalı, 1-i "Əməkdar elm xadimi", 1-i "Əməkdar bədən tərbiyəsi və idman xadimi", 2-si "Əməkdar mədəniyyət işçisi", 3-ü "Əməkdar müəllim" fəxri adlarına layiq görülüb, 2 nəfərə Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdü verilib.

Azərbaycan Respublikasının Prezidenti cənab İ.Əliyevin Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında Sərəncamı 20 mindən çox üzvü olan ADPU ailəsinə sonsuz sevinc bəxş etməklə yanaşı, həm də onları daha səmərəli işləməyə ruhlandırmışdır. Kollektivimiz yuxarıda adı çəkilən sərəncamları Pedaqoji Universitetin fəaliyyətinə dövlətimizin xüsusi diqqət və qayğısının təzahürü kimi dəyərləndirərək, ölkə başçısına dərin hörmət və minnətdarlığını bildirir. Yubiley ərəfəsində daha çox yada düşənlər bu təhsil ocağını yaradan və yaşadanlar olur. 6 tələbə və 8 müəllimlə fəaliyyətə başlayan Ali Kişi Pedaqoji İnstitutu 1924/25-ci tədris ilində inzibati cəhətdən Ali Qadın Pedaqoji İnstitutu ilə birləşdirildi, 1926/27-ci tədris ilinin sonunda isə Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsinin tərkibinə verildi. Az sonra məlum oldu ki, ADU-nun Pedaqoji fakültəsi milli məktəblərin müəllim kadrlara olan tələbatını ödəmək iqtidarında deyil. Fədakar ziyalıların inadlı səyləri nəticəsində Ali Pedaqoji İnstitut 28 sentyabr 1929-cu ildə yenidən müstəqil ali təhsil ocağı kimi təşkil edildi. 1930-cu ildə ali təhsil tarixində gözlənilməz hadisə baş verdi, milli dövlətçilik təfəkkürünə ağır zərbə vuruldu. Belə ki, Azərbaycan Dövlət Universitetinin 10 illik yubileyindən 5 ay sonra universitet ləğv edildi və onun fakültələri əsasında müstəqil sahə institutları yaradıldı. Bu dəfə ADU-nun Pedaqoji fakültəsi yenidən təşkil edilən Pedaqoji İnstituta birləşdirildi. Struktur dəyişikliyi ilə əlaqədar Ali Pedaqoji İnstitut yenidən təşkil olundu və ona V.İ.Leninin adı verildi.

Sovet-alman müharibəsi başlananda digər ali təhsil müəssisələri kimi, Azərbaycan Dövlət Pedaqoji İnstitutu da ciddi sınaq qarşısında qaldı, onun maliyyə imkanları tükəndi, müəllim və tələbələrin vəziyyəti ağırlaşdı. Azərbaycan Xalq Komissarları Soveti və Azərbaycan KP MK 19 sentyabr 1941-ci ildə "V.İ.Lenin adına ADPİ-nin S.M.Kirov adına ADU ilə birləşdirilməsi haqqında" qərar qəbul etmək məcburiyyətində qaldı. Müharibənin gedişində əsaslı dönüş yarandıqdan sonra ADPİ yenidən müstəqil institut kimi bərpa edildi (1943) və cəbhədə həlak olmuş müəllimləri əvəz edə biləcək kadrların hazırlanması sahəsində məqsədyönlü fəaliyyətə başladı. İnstitutun maddi-texniki bazası möhkəmləndirildi, qəbul planı artırıldı, qiyabi şöbənin fəaliyyəti yenidən quruldu, ali pedaqoji təhsilin məzmunu yeniləşdirildi, professor-müəllim heyətinin tərkibi elmi dərəcəlilərin hesabına xeyli artdı, dissertasiya üzərində işləyənlərlə bağlı stimullaşdırıcı tədbirlər həyata keçirildi, elmlər doktoru dissertasiyası yazanların iş yeri və əmək haqqı saxlanılmaqla elmi işçi vəzifəsinə keçirilmələrinə icazə verildi. Bu kimi sistemli və kompleks tədbirlər nəticəsində ADPİ pedaqoji və elmi-pedaqoji kadr hazırlığında böyük uğurlara imza ata bildi.

26 may 1972-ci ildə ADPİ müəllim kadrlarının hazırlanması və pedaqogika elminin inkişafı sahəsində qazandığı müvəffəqiyyətlərə görə SSRİ Ali Sovetinin Rəyasət Heyəti tərəfindən "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif olundu. İndiki Dövlət Təhlükəsizliyi Xidmətinin Mədəniyyət Mərkəzində yüksək dövlət mükafatını institutun kollektivinə Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev təqdim etdi. 1981-ci il dekabr ayının 23-də yenə həmin mərkəzdə institutun 60 illik yubileyi keçirildi. Azərbaycanda təhsilin, elmin, mədəniyyətin inkişafına yüksək dəyər verən Heydər Əliyev ikinci dəfə yubiley tədbirində iştirak etdi. Ulu öndər çıxışında respublikanın həyatında baş verən müsbət dəyişikliklərdə institutun rolunu böyük razılıq hissi ilə qeyd etdi və Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin qərarı ilə ADPİ-nin Fəxri Fərmanla təltif edildiyini bildirdi. Tədbirdə ulu öndər Heydər Əliyev institutun əməkdaşlarının müəllim kadrları hazırlığındakı fəaliyyətini yüksək qiymətləndirdi: *"Müəllimlik işi həm şərəfli, həm də çətin işdir. Ali məktəb müəllimi olmaq, müəllimlər hazırlamaq, yəni müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda ikiqat məsuliyyətli işdir. Biz yaxşı bilirik ki, 65 min nəfərdən artıq müəllim hazırlamaq üçün professor və müəllimlərin bütün nəsilləri nə qədər zəhmət çəkmişlər."*

Ümummilli liderin də dediyi kimi, universitetin guşə daşını qoyanların, burada pedaqoji fəaliyyətlə məşğul olan professor-müəllim heyətinin uzun illər ərzində sərf etdiyi gərgin əmək müəyyən müddətdən sonra öz bəhrəsini verməyə başlamışdır. Belə ki, institutun məzunları respublikada savadsızlığın ləğvində, icbari ibtidai təhsilin (1930-1934), yeddiillik (1935-1958), səkkizillik (1959-1966) və icbari ümumi orta təhsilin (1967-1975) həyata keçirilməsində müstəsna rol oynamışlar.

İnstitutun ilk müəllimlərindən olan görkəmli pedaqoq Abdulla bəy Əfəndizadənin *"Biz istəyirik ki, məktəbimiz ümumtürk ellərinin hüsn-rəğbətini qazansın, bütün Şərq elmi üçün inqilab məşəli olsun.. Oksford və Kembric darülfünunları kimi Şekspirlər, Nyutonlar, Miller və Darvinlər yetişdirməyə müvəffəq olsun*" arzuları az sonra reallaşdı. Böyük zəka sahiblərindən dərs alan Pedaqoji İnstitutun yetirmələrinin əksəriyyəti istedadlı alim, mədəniyyət xadimi və yazıçı kimi məşhurlaşdı, partiya və dövlət xadimi kimi tanındı, qabaqcıl müəllim kimi ad-san qazandı.

Universitetin məzunları – ***Azərbaycan EA-nın həqiqi üzvləri*** *Yusif Məmmədəliyev, Heydər Hüseynov, İbrahim İbrahimov, Zahid Xəlilov, Həsən Abdullayev, Məcid Rəsulov, Əşrəf Hüseynov, İsmayıl Hüseynov, Abdulla Qarayev, Əlisöhbət Sumbatzadə, Məmməd Arif Dadaşzadə, Məmmədcəfər Cəfərov, Məmmədağa Şirəliyev, Həmid Araslı, Feyzulla Qasımzadə, Budaq Budaqov, Cavad Abdinov, Bahadur Tağıyev, Qərib Məmmədov, İsa Həbibbəyli, Vaqif Abbasov, İsmayıl Hacıyev,* ***müxbir üzvləri*** *Əbdüləzəl Dəmirçizadə, Mövsüm Mövsümzadə, Şamxal Məmmədov, Maqsud Cavadov, Cümşüd Zülfüqarlı, Zərifə Budaqova, Afad Qurbanov, Hacı Qadir Qədirzadə, Hacıfəxrəddin Səfərli, Oruc Həsənli,* ***SSRİ PEA-nın həqiqi üzvü*** *Mehdi Mehdizadə,* ***müxbir üzvləri*** *Abasqulu Abaszadə, Hüseyn Əhmədov, Sədi İmanov,* ***görkəmli şair və yazıçılar*** *Səməd Vurğun, Süleyman Rəhimov, Mehdi Hüseyn, Mikayıl Müşfiq, Əbülhəsən Ələkbərzadə, Eyyub Abbasov, İlyas Əfəndiyev, Şıxəli Qurbanov, İsmayıl Şıxlı, Zeynal Xəlil, Gəray Fəzli, Məmməd Rahim, Məmməd Araz, Qılman İlkin, Əhməd Cəmil, Mədinə Gülgün, Mikayıl Rzaquluzadə, Osman Sarıvəlli, Qabil, Mirvarid Dilbazi, Tofiq Bayram, İlyas Tapdıq, Ənvər Əlibəyli, Zeynal Xəlil, Zeynal Cabbarzadə, Böyükağa Qasımzadə, Sərdar Əsəd,* ***görkəmli bəstəkarlar*** *Səid Rüstəmov, Oqtay Rəcəbov* xalqımızın şöhrət simvollarına çevriliblər.

İnstitutun professor-müəllim heyəti və məzunları ölkədə elmi-pedaqoji elitanın formalaşmasında müstəsna xidmətlər göstərmişlər. Fəxrlə qeyd olunmalıdır ki, Azərbaycan Elmlər Akademiyasını təsis edən 15 nəfərdən *3-ü* (Yusif Məmmədəliyev, Heydər Hüseynov, Səməd Vurğun) *Pedaqoji Universitetin məzunu*, *5 isə müəllimi* (Yusif Məmmədəliyev, Heydər Hüseynov, Aleksandr Qrossheym, Üzeyir Hacıbəyov, Mir Əsədulla Mirqasımov) olmuşdur. Akademiyanın prezidentlərindən *3 nəfəri* (*Yusif Məmmədəliyev, Zahid Xəlilov, Həsən Abdullayev*) Pedaqoji Universitetin yetirmələridir. Yusif Məmmədəliyev iki dəfə (1947-1951 və 1958-1961) Elmlər Akademiyasının prezidenti seçilib.

Pedaqoji Universitet Azərbaycanda elm və təhsilin inkişafına dəyərli töhfələr verən tanınmış alimlər yetişdirməklə yanaşı, həm də elmi mərkəz kimi formalaşıb inkişaf etmişdir. Bu ali təhsil müəssisəsində *pedaqogika və psixologiya* (Əhməd Seyidov, Mehdi Mehdizadə, Əhməd Zəkuzadə, Mərdan Muradxanov, Şövqi Ağayev, Hüseyn Əhmədov, Əbdül Əlizadə), *riyaziyyat* (Məmməd Əfəndiyev, Maqsud Cavadov, İbrahim İbrahimov, Mais Cavadov), *fizika* (Abasqulu Abaszadə, Sədi İmanov), *kimya* (Həbibulla Şahtaxtinski, Şamxal Məmmədov, Allahverdi Verdizadə), *biologiya* (Zəhra Şahtaxtinskaya, Abdulla Qarayev), *tarix* (Zülfəli İbrahimov, Yusif Yusifov), *filologiya* (Bəkir Çobanzadə, Məmmədağa Şirəliyev, Əbdüləzəl Dəmirçizadə, Mikayıl Rəfili, Əli Sultanlı, Həmid Araslı, Feyzulla Qasımzadə, Afad Qurbanov, Həsən Mirzəyev və b.), *fəlsəfə* (Heydər Hüseynov) və digər sahələr üzrə elmi məktəblər və istiqamətlər inkişaf etdirilmişdir.

SSRİ Xalq müəllimləri *Zahid Şöyübov, Cəbrayıl Zəkiyev və İsrafil Şükürovun,* Sosialist Əməyi Qəhrəmanları *Səfa İmanov, Zərbəli Səmədov və Rüstəm Səfərəliyevin,* Sovet İttifaqı Qəhrəmanları *Mehdi Hüseynzadə, Xıdır Mustafayev, Fariz Səfərov və Səlahəddin Kazımovun*, Azərbaycanın Milli Qəhrəmanları *Mirələkbər İbrahimov* və *Mətləb*

*Quliyevin,* "Zəfər" ordenli general-polkovnik *Əli Nağıyevin,* "Azərbaycan Bayrağı" ordenli *Malik Bayramov və Mürşid Məmmədovun* Pedaqoji Universitetin məzunları olmaları bizi qürurlandırmaya bilməz.

Pedaqoji Universitetin tarixi həm də onu yaradanların, yaşadanların, burada təhsil alan tələbələrin, aspirantların (doktorantların), şüurlu həyatını elm və təhsilə həsr etmiş professor-müəllimlərin tərcümeyi-hallarıdır. Kitabda Pedaqoji Universitetin tarixinə düşmüş, onun təşkilində, inkişafında və idarə edilməsində xidmətləri olan 31 rektor (direktor), Ali Pedaqoji Qadın İnstitutunun ilk və son direktoru Sara Xuramoviç, Abdulla Şaiq adına Nümunə məktəbinin direktoru Qafur Əfəndizadə haqqında verilən oçerklər sələflərimizə və müasirlərimizə xüsusi ehtiramın ifadəsi kimi dəyərləndirilməlidir.

ADPU-ya rəhbərlik edən direktor və rektorlar fərqli dövrlərdə, fərqli ideologiya və fərqli idarəetmə sistemlərində fəaliyyət göstərmişlər. İnstitutun təşkili və formalaşmasının ilkin mərhələsi Odessa Universitetinin məzunu *Fətulla bəy Rzabəylinin,* Peterburq Universitetinin məzunu *Məmməd Əfəndiyevin*, Tiflis Müəllimlər İnstitutunun məzunu *Həbib bəy Mahmudbəyovun*, Peterburq Psixonevroloji İnstitutunun məzunu, Başqırd Hökumətinin sədri olmuş *Şarif Manatovun* və Kiyev Politexnik Universitetinin məzunu Cəlil Məmmədzadənin adı və yorulmaz fəaliyyəti ilə bağlıdır. Həmin dövrdə ali təhsilli müəllim kadrları hazırlığında mövcud olan ciddi çətinliklər (ali pedaqoji məktəb quruculuğu ilə bağlı təcrübənin olmaması, orta təhsilli gənclərin sayının az olması, bütün ixtisaslar üzrə ana dilində dərs deyə biləcək müəllimlərin çatışmaması, milli dildə dərslik və dərs vəsaitlərinin hazırlanmaması, tədris laboratoriyalarının zəruri avadanlıqlarla təchiz edilməməsi, institutun daimi tədris binasının olmaması və s.) məhz onların fədakarlığı nəticəsində aradan qaldırılmışdır.

Keçən əsrin 30-cu illəri institutun həyatında çox çətin və mürəkkəb mərhələ kimi yadda qalıb. O dövrdə rəhbərlik tez-tez dəyişdirilsə də, ADPİ-də təşkilati məsələlərin həllində, tədris və elmi-tədqiqat işlərinin düzgün qurulmasında direktor vəzifəsində çalışan Tiflis Müəllimlər İnstitutunun məzunu *Pənah Qasımovun,* Azərbaycan Dövlət Universitetinin məzunu *Bəşir Bünyatovun,* Azərbaycan Dövlət Universitetinin məzunu *Məmməd Bayramovun,* Şərq Zəhmətkeşləri Kommunist Universitetinin məzunu *Mirzə Məmmədovun*, Tiflis Politexnik İnstitutunun məzunu *Mirzə Davud Rəsulzadənin*, Azərbaycan Dövlət Universitetinin məzunu *Hüseyn Musayevin*, Azərbaycan Pedaqoji İnstitutunun məzunu *Aqil Salayevin*, Zaqafqaziya Kommunist Universitetinin məzunu *Camal Əliyevin* və ÜİK(b)P MK-nın Marksizm-leninizm İnstitutunun Azərbaycan filialının məzunu *Ələsgər Həşimovun* mühüm xidmətləri oldu.

30-cu illərin II yarısında başlanan repressiya dalğası Pedaqoji İnstitutun ən yaxşı müəllimlərinin böyük bir hissəsinin cismən məhv edilməsi və ya Sibirə sürgün olunması ilə nəticələndi. İnstitutun direktorları olmuş Pənah Qasımov, Məmməd Bayramov, Mirzə Davud Rəsulzadə, Hüseyn Musayev repressiya maşınının təzyiqindən yan keçə bilmədilər. Məmməd Bayramov, Mirzə Məmmədov həbs ediləndən bir il sonra – 1938-ci ildə Bakıda güllələndilər.

Müharibədən sonrakı illərdə də ADPİ müəllim kadrları hazırlığı sahəsində liderliyini qoruyub saxladı və özünün dinamik inkişafını təmin etdi. Bu illərdə instituta ayrı-ayrı vaxtlarda maarif və mədəniyyət naziri olmuş *Məmməd Ələkbərov*, 23 il Azərbaycan maarifinə nazir kimi rəhbərlik etmiş akademik *Mehdi Mehdizadə*, professorlar – *Ağamməd Abdullayev, Əhməd Seyidov, Cəfər Hacıyev, Həmid Qədirov, Cəbrayıl Ələsgərov, Mehdixan Vəkilov, Mehdi Əliyev, Şövqi Ağayev* rəhbərlik etdilər.

1970-1980-ci illərdə instituta prof.*Həşim Ağayev* və AMEA-nın müxbir üzvü, prof. *Afad Qurbanov* rəhbərlik etmişlər.

1990-cı ilin əvvəllində Azərbaycan yenidən öz müstəqilliyinə qovuşdu. Sosial-iqtisadi, ictimai-siyasi və elmi-mədəni sferada ciddi dəyişikliklər baş verdi. Buna müvafiq olaraq, ali təhsil müəssisələrinin statusunda, strukturunda və idarəedilməsində yeniliklər meydana gəldi. 1991-ci ildə Pedaqoji İnstituta "universitet" statusu verildi. Bu, ADPU-ya müstəqil fəaliyyət göstərmək, kadr siyasətini sərbəst həyata keçirmək, təhsil müəssisəsinin büdcəsinə daxil olan vəsaitdən səmərəli istifadə

etmək, xarici ölkələrin ali təhsil müəssisələri və elm mərkəzləri ilə birbaşa əlaqə saxlamaq, qarşılıqlı müəllim və tələbə mübadiləsi aparmaq imkanı verdi. Bu illərdə Pedaqoji Universitetə AMEA-nın müxbir üzvü, prof. *Səlvər Aslanov,* prof. *Nizami Xudiyev*, prof.*Bəhlul Ağayev və* AMEA-nın müxbir üzvü, prof.*Yusif Məmmədov*[1] rəhbərlik etdilər.

Fəxr hissi ilə qeyd etmək istərdim ki, ADPU-nun kollektivi ilə birgə fəaliyyət göstərərək şərəfli missiyanı davam etdirmək mənə də nəsib oldu. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 23 iyun 2016-cı il tarixli Sərəncamı ilə bu qocaman elm və təhsil ocağına rektor təyin olundum. Bu elə bir dövr idi ki, dövlət başçısının 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutunun ADPU-ya qoşulması prosesi gedirdi. Qarşıda çətin və məsuliyyətli vəzifə dururdu. Hesab edirəm ki, bütün problem və çətinliklərə rəğmən, üzərimizə qoyulan vəzifəni nisbətən qısa müddətdə həll etməyə, universitetin sakit, sabit və ritmik fəaliyyətini təmin etməyə, unifikasiyanı başa çatdırmağa nail olduq.

Tələbə nailiyyətlərinin qiymətləndirilməsində VTS test sistemi ilə yanaşı, imtahanların yazılı şəkildə aparılmasına üstünlük verməklə, tələbələrə imtahan formasını müstəqil seçmək imkanı yaradıldı. İnfrastrukturun yeniləşdirilməsi, auditoriyaların təmiri, ümumtəhsil məktəbləri və xarici ölkələrin pedaqoji kadr hazırlığını həyata keçirən ali məktəbləri ilə əlaqələrin genişləndirilməsi, qəbul imtahanlarında yüksək bal toplayan tələbələrin universitetimizə cəlb edilməsi, müəllim kadrları hazırlığının nəzəri və praktiki problemləri ilə bağlı respublika və beynəlxalq səviyyəli konfransların keçirilməsi, xarici və milli təhsil ekspertlərinin, elm və sənət adamlarının iştirakı ilə "Pedaqoji Forum"un təşkili, beynəlxalq və regional layihələrdə iştirak, filiallarımızda müəllimlərin iştirakı ilə keçirilən görüşlər fəaliyyətimizin əsas istiqamətlərini təşkil etdi. Universitetimizin "Səbail" tədris korpusunda yerləşən 14 mərtəbəli binanın üzlük hissəsi Azərbaycan Respublikasının Birinci vitse-prezidenti Mehriban xanım Əliyevanın rəhbərlik etdiyi Heydər Əliyev Fondunun köməyi ilə tam yeniləndi.

Universitetimizdə nəşr olunan "Pedaqoji Universitetin Xəbərləri", "Tarix, insan və cəmiyyət", "Fizika, riyaziyyat və informatika tədrisi", "Musiqi elmi, mədəniyyəti və təhsilinin aktual problemləri", "Təhsildə İKT" jurnallarının elmi səviyyəsi yüksəldildi və dövriliyi təmin olundu. Respublikada ilk dəfə olaraq universitetimizdə "Magistrant" dövri elmi-jurnalının nəşrinə başlanıldı. Jurnalın ilk nömrəsi universitetin 100 illiyi ərəfəsində nəşr olundu. 2018-ci ildə "Clarivate Analytics" şirkəti tərəfindən ADPU elmi məqalələrin nəşrində inkişaf sürətinə görə son 3 ilin "Web of Science" elmi bazasının "Ən mütərəqqi Universiteti" mükafatına layiq görüldü.

ADPU-nun Elmi Şurası tərəfindən 24 oktyabr 2018-ci ildə təsdiq edilən "Adlı təqaüdlər haqqında" Əsasnamənin tələblərinə uyğun olaraq, müxtəlif ixtisaslar (və ya fakültələr) üzrə tələbələr üçün xüsusi təqaüdlər təsis edildi. Həmin təqaüdlər dövlət sifarişi və ya ödənişli əsaslarla təhsil almalarından asılı olmayaraq, semestri (birinci tədris ilinin birinci semestri istisna olmaqla) ən yüksək nailiyyətlərlə başa vuran tələbələrə təyin olunur. Universitet üzrə ən yüksək nəticə göstərən tələbəyə Heydər Əliyev, fakültələr üzrə uğurlu nəticəyə sahib olan tələbələrə isə Nizami, Abbasqulu ağa Bakıxanov, Yusif Məmmədəliyev, Zahid Xəlilov, Həsən Abdullayev, Üzeyir Hacıbəyov, Mehdi Mehdizadə, Qafur Rəşad Mirzəzadə, Abdulla Şaiq təqaüdləri verilir.

İnnovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksək nüfuza malik təhsilverənlərin yeni nəslinin formalaşdırılması məqsədilə kafedra müdiri, professor, dosent, baş müəllim və müəllim vəzifələrinin tutulması qaydalarında Elmi Şuranın qərarı ilə edilmiş dəyişiklik qısa bir vaxtda həm seçkidə iştirak edənlərin, həm də universitet əməkdaşlarının seçki sistemi və tədris prosesi ilə bağlı baxışlarında köklü dəyişiklik yaratdı. Elmi-metodik hazırlığı, İKT bacarığı, yeni təlim texnologiyalarına bələdliyi ilə seçilənlər uğur qazana bildilər.

Ali pedaqoji təhsilin məzmunu, idarəetmə, insan resursları, infrastrukturun yeniləşdirilməsi

[1] *Hazırda prof.Yusif Məmmədov AMEA-nın həqiqi üzvüdür*

sahəsində aparılan islahatlar, sağlam, şəffaf və obyektiv təhsil mühitinin yaradılması, Bakı məktəblərinin yuxarı sinif şagirdləri, qabaqcıl məktəb direktorları, ustad müəllimlər, valideynlərlə "Açıq qapı" günlərinin keçirilməsi, müəllimlik peşəsi ilə bağlı söhbətlərin aparılması qəbulda yüksək bal toplayan abituriyentlərin ADPU-ya marağının artmasına səbəb olmuşdur. İldən-ilə universitetə və onun filiallarına yüksək balla daxil olan tələbələrin, MİQ imtahanlarında uğur qazanan məzunların sayı dinamik şəkildə artır. Belə ki, 2016/17-ci tədris ilində ADPU-ya qəbul olunanlar arasında 500-dən çox bal toplayanların sayı 117 idisə, 2018/19-cu tədris ilində bu göstərici 527 olmuşdur. Əgər 2015/16-cı tədris ilində MİQ imtahanlarında məzunların cəmi 61 nəfəri 50-60 bal toplamışdısa, 2019/20-ci tədris ilində belə məzunların sayı 347 nəfər olmuşdur. 2020/21-ci tədris ilində İbtidai təhsil fakültəsinin MİQ-də iştirak edən məzunlarından 6 nəfəri 60 bal toplamışdır. 2020/21-ci tədris ilində məzunlardan 298 nəfəri respublikamızın və xarici ölkələrin universitetlərinin magistratura səviyyəsinə qəbul olunmuşdusa, 2021/22-ci tədris ili üzrə magistraturaya qəbul imtahanlarında iştirak edib ixtisas seçiminə buraxılanların sayı 956-dır.

Son illərdə universitetin beynəlxalq əlaqələri xeyli genişlənmiş, Avropa və MDB ölkələrinin 53 nüfuzlu universiteti ilə əməkdaşlıq müqaviləsi imzalanmışdır. Türkiyə Respublikasının müxtəlif universitetləri ilə ikitərəfli əməkdaşlıqdan əlavə, "Mövlanə" mübadilə proqramı çərçivəsində də əməkdaşlıq edilir. Ümumiyyətlə, ikitərəfli əməkdaşlıq görüşləri xeyli genişlənib, müxtəlif xarici ölkələrin ali təhsil müəssisələrinin, səfirliklərin, beynəlxalq təşkilatların nümayəndələri ADPU-da qonaq olub, əlaqələrin genişləndirilməsi istiqamətində danışıqlar aparılıb, niyyət protokolları imzalanıb.

ADPU-nun beynəlxalq təşkilat və qurumlarla əlaqəsini daha da genişləndirmək məqsədilə Avropa Müəllim Hazırlığı Şəbəkəsi (ETEN) tərəfindən İsveçin Goteburq şəhərində keçirilən konfransda, Danimarkanın Kopenhagen şəhərindəki Universitet Kollecində (UCC) əməkdaşlıq çərçivəsində keçirilən görüşdə, Universitet Prezidentlərinin Beynəlxalq Assosiasiyasının Vyanada (Avstriya) keçirilən "Təhsildə İnnovasiya" adlı konfransında iştirak edilmişdir.

Universitetin nüfuzunun yüksəldilməsi və təhsilin keyfiyyətinin artırılması ilə bağlı bir sıra tədbirlər və layihələr həyata keçirilir. Bu baxımdan ABŞ-ın Corc Vaşinqton Universiteti ilə magistr hazırlığı ilə bağlı ikili diplom proqramı layihəsini xüsusi qeyd etmək olar. 31 yanvar 2020-ci il tarixində Azərbaycan Dövlət Pedaqoji Universiteti və Corc Vaşinqton Universiteti arasında ikili diplom proqramı üzrə saziş imzalanmışdır. Həmin sazişin şərtlərinə görə, 2020/21 və 2021/22-ci tədris illərində menecment (təhsilin təşkili və idarəolunması) ixtisasına 25 nəfər magistrant qəbul olunmuşdur.

Universitetimizdə ilk dəfə olaraq magistratura səviyyəsində təhsil üzrə MBA (təhsilin təşkili və idarə edilməsi), təlim və tədrisin təşkili və metodikası üzrə SABAH magistratura və gənclərlə iş ixtisaslaşmaları üzrə mütəxəssis hazırlığına başlanılmışdır. 2021/22-ci tədris ilində biznesin təşkili və idarə olunması (təhsilin təşkili və idarə edilməsi) ixtisaslaşmasına 48, təlim və tədrisin təşkili və metodikası ixtisaslaşmasına (SABAH) 23, gənclərlə iş ixtisaslaşmasına 5 magistrant qəbul olunmuşdur. Fizika, texnologiya, riyaziyyat, informatika, kimya və biologiya müəllimliyi ixtisaslarında STEAM bacarıqları olan yeni nəsil müəllimlərin hazırlanması yönündə işlər aparılır. ADPU-da STEAM laboratoriyası yaradılıb, seçilmiş professor-müəllim heyətinə Təhsil İnstitutu ilə birlikdə müvafiq təlimlər keçirilib və yeni tədris ilindən yuxarıda qeyd olunan ixtisasların tələbələrinə "STEAM" fənni tədris ediləcəkdir. Həmçinin inklüziv təhsil yanaşmasının geniş tətbiqinə və müvafiq ixtisaslarda inklüziv təhsil fənninin tədrisinə başlanılır.

Azərbaycan Respublikası ilə xarici ölkələr arasında təhsil sahəsində imzalanmış ikitərəfli sazişlər çərçivəsində və ya ADPU-nun əcnəbi vətəndaşlarla birbaşa bağladığı müqavilələr əsasında universitetimizdə 78 əcnəbi tələbə və magistrant, 85 əcnəbi dinləyici təhsil almışdır. Hazırda 180-dən çox əcnəbi vətəndaş ADPU-nun hazırlıq, bakalavriat və magistratura səviyyələrinin müxtəlif ixtisaslarında təhsil alır. Onların arasında Türkiyə, Rusiya, Gürcüstan, Çin, Türkmənistan, Suriya, Ukrayna vətəndaşları vardır.

2016-2019-cu illərdə ADPU-nun 68 əməkdaşı xarici universitetlər və təşkilatlar tərəfindən keçirilən seminar, konfrans və təlimlərdə iştirak etmiş, 6 tələbəsi mübadilə proqramı çərçivəsində xaricdə təhsil almışdır.

Hazırda Pedaqoji Universitetin *Filologiya* (dekan əvəzi prof.Mahirə Hüseynova), *Tarix və coğrafiya* (dekan əvəzi dos.Asif Axundov), *Riyaziyyat* (dekan dos.Araz Fərəcov), *Kimya və biologiya* (dekan dos.Elnarə Mehbalıyeva), *Məktəbəqədər təhsil* (dekan prof. Şəhla Əliyeva), *İncəsənət və fiziki tərbiyə* (dekan dos. Laçın Həsənova), *Fizika* (dekan dos.Arzu Daşdəmirov), *İbtidai təhsil* (dekan prof.Fərrux Rüstəmov) fakültələrində, *Sabah mərkəzində (*dos. Lalə Mürsəlbəyova*)*, *Ağcabədi* (direktor dos. Mobil Məcidov), *Cəlilabad* (direktor dos.Xudayar Sultanlı), *Quba* (direktor dos.Yusif Alıyev), *Şamaxı* (direktor dos.Tünzalə Yusifova), *Şəki (*direktor dos.Rafiq Rəsulov) filiallarında və nəzdindəki *Azərbaycan Dövlət Pedaqoji Kollecində* (direktor dos. İsrayıl İsgəndərov) 18218 tələbənin təlim-tərbiyəsi ilə 1553 nəfər professor-müəllim və 652 nəfər tədris-köməkçi heyət məşğul olur.

Universitet əməkdaşları tərəfindən aparılan elmi-tədqiqat işlərinin səviyyəsi ildən-ilə yüksəlir, onların tətbiqi imkanları genişlənir. Yalnız 2020-ci ildə 791 nəfər əməkdaş elmi-tədqiqat işlərinə cəlb edilmiş, 54 istiqamətdə, 166 problem, 521 mövzu üzrə tədqiqat aparılmışdır. 56 iş tədris prosesində tətbiq olunmuşdur. Aparılmış elmi-tədqiqat işlərinin nəticələri əsasında 12 monoqrafiya, 16 dərslik, 45 dərs vəsaiti, 178 proqram və metodik vəsait, 862 məqalə (321-i xaricdə, 23-ü impakt-faktorlu jurnalda) və 226 tezis (122-si xaricdə) çap olunmuşdur.

Son illərdə ADPU-da müxtəlif elm sahələrində innovasiyaların tətbiqi, müvafiq ixtisaslar üzrə aparıcı mütəxəssislərin tədris prosesinə cəlb edilməsi və birgə elmi tədqiqatların aparılması üçün AMEA-nın elmi təşkilatları və institutları ilə əməkdaşlıq genişləndirilmişdir. AMEA-nın Riyaziyyat və Mexanika İnstitutu, Akademik H.Abdullayev adında Fizika İnstitutu, akademik Ə.Hüseynov adına İdarəetmə Sistemləri İnstitutu, Nizami adına Ədəbiyyat İnstitutu, Nəsimi adına Dilçilik İnstitutu, Folklor İnstitutu, akademik Y.H.Məmmədəliyev adına Neft-Kimya Prosesləri İnstitutu, akademik Ə.M.Quliyev adına Aşqarlar Kimyası İnstitutu, Kataliz və Qeyri-Üzvi Kimya İnstitutu, Coğrafiya İnstitutu, Topraqşünaslıq və Aqrokimya İnstitutu, Tarix İnstitutu, Arxeologiya və Etnoqrafiya İnstitutu, Fəlsəfə İnstitutu, Şərqşünaslıq İnstitutu, habelə oxşar profilli ali təhsil müəssisələri ilə sıx əlaqələr qurulmuşdur.

Rəqabətədavamlı insan kapitalının formalaşdırılmasında yeni düşüncəyə, təhsil-tərbiyə texnologiyasına, əxlaqi və mənəvi saflığa, yüksək peşə və ixtisas hazırlığına, ümummədəni səriştələrə malik müəllim kadrlarının hazırlığı, onların dövlətə və dövlətçiliyə sədaqət ruhunda tərbiyəsi Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim kollektivinin əsas hədəflərindəndir. Bu məqsədlə universitetimizdə ulu öndər Heydər Əliyevin xatirəsi əbədiləşdirilmiş, abidəsi qoyulmuş, Heydər Əliyev Məktəbinin lektoriyası və Heydər Əliyev Mərkəzi yaradılmışdır. Mərkəzin nəzdində 2007-ci ildən Heydər Əliyev Muzeyi fəaliyyət göstərir. Mərkəzdə və muzeydə ümummilli lider Heydər Əliyevin həyat və fəaliyyətini əks etdirən kitablar, məcmuələr, jurnallar, fotoşəkillər, arxiv sənədlərinin surətləri və digər eksponatlar saxlanılır. Mərkəzin əsas vəzifəsi ümummilli liderə aid materialları sistemləşdirmək və nümayiş etdirməkdən, onun ictimai-siyasi və nəzəri irsi ilə bağlı tədqiqatlar aparmaqdan, müxtəlif səpkili tədbirlər və sərgilər təşkil etməklə ulu öndərin zəngin həyat yolunu, ideya-nəzəri irsini və dövlətçilik təcrübəsini universitetin əməkdaşları, tələbələri və qonaqları, tərəfdaşlıq etdiyi ümumtəhsil məktəblərinin şagirdləri arasında təbliğ etməkdən ibarətdir. Hər tədris ilində təsdiq edilən iş planı və qrafik əsasında mərkəzdə “Heydər Əliyev dərsləri”, konfranslar, seminarlar, dəyirmi masalar, diskussiyalar, müsabiqələr, bilik yarışları keçirilir, dinləyicilərə Heydər Əliyevin həyat və fəaliyyəti haqqında ətraflı məlumat verilir.

Ulu öndərin irsində Vətən sevgisi, azərbaycançılıq məfkurəsi, dil sevgisi, milli mədəniyyət sevgisi, xalqına, dövlətinə sədaqət hissi mühüm yer tutur. Bu irsin qorunması və gələcək nəsillərə çatdırılması, hər bir gəncdə azərbaycançılıq hissinin formalaşdırılması ən vacib vəzifələrdəndir. İkinci Qarabağ müharibəsi göstərdi ki, məktəblərimizdə təhsil alan nəslin azərbaycançılıq ideologiyası əsa-




*ADPU-nun foyesində Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin abidəsi*

sında tərbiyə edilməsi Azərbaycan müəllimlərinin və həmin müəllimləri hazırlayan ali pedaqoji təhsil müəssisələrinin fəaliyyətinin əsasını təşkil edir. Cəsarətlə deyə bilərik ki, Azərbaycan məktəbi və Azərbaycan müəllimi Vətən müharibəsi imtahanından uğurla çıxdı. Məhz bu məktəblərdə müəllimlərdən əxlaq, mənəviyyat, düşmənə nifrət dərsi alan, şəhidliyin fəlsəfəsini dərk edənlər öz qanları və canları hesabına təcavüzkarı təslim aktını imzalamağa məcbur etdilər. 30 ildən artıq düşmən tapdağı altında qalan torpaqlarımızın müzəffər Ali Baş Komandan cənab İlham Əliyevin rəhbərliyi ilə qaytarılması tariximizin ən parlaq səhifəsinə çevrildi. Ulu öndər Heydər Əliyev böyük uzaqgörənliklə deyirdi ki, mənim görüb başa çatdırmadığım işləri Azərbaycan xalqının dəstəyi ilə İlham Əliyev



*Heydər Əliyev Məktəbinin lektoriyası*



*Heydər Əliyev Mərkəzinin ümumi görünüşü*



ADPU-nun böyük akt zalı



ADPU-nun kiçik akt zalı

başa çatdıracaq. Ulu öndərin arzusunda olduğu, lakin başa çatdıra bilmədiyi ən birinci vəzifə isə Azərbaycanın ərazi bütövlüyünün təmin olunması, torpaqlarımızın işğaldan azad edilməsi idi. Prezident İlham Əliyev hərb meydanında müzəffər sərkərdə kimi mümkünsüzü mümkün etdi, informasiya müharibəsində böyük diplomat kimi haqq səsimizi bütün dünyaya çatdırdı. Bu tarixi qələbə cənab Prezidentin 17 illik daxili və xarici siyasətinin məntiqi nəticəsi oldu. Ay yarım ərzində rəşadətli Silahlı Qüvvələrimiz Ali Baş Komandanın rəhbərliyi ilə Ermənistan ordusunu darmadağın edərək şanlı Zəfər salnaməsi yazdı. Fəxr edirik ki, Vətən müharibəsində misilsiz qəhrəmanlıq göstərən əsgər və zabitlərin sırasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin 129 tələbə və məzunu da var. Tarixə "dəmir yumruq" adı ilə düşən bu müharibədə ADPU ailəsinin 11 üzvü şəhidlik zirvəsinə yüksəldi, 6 nəfər qazi oldu. Tarixi qələbənin qazanılmasında payı olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin təmsilçiləri olmağımızdan iftixar hissi keçiririk. İllər keçəcək, nəsillər dəyişəcək, amma 44 günlük qəhrəmanlıq savaşımız həmişə haqlı qürur mənbəyimiz olaraq qalacaqdır!

Zəfər sevincini yaşayan Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim və tələbə heyəti universitetin 100 illik yubileyinin keçirilməsinə xüsusi diqqət göstərən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevə və Birinci vitse-prezident Mehriban xanım Əliyevaya dərin hörmət və minnətdarlığını bildirir.

Əminliklə bəyan edirik ki, bundan sonra da çoxminli kollektivimiz elm və təhsildə, pedaqoji və elmi-pedaqoji kadr hazırlığında və gənc nəslin tərbiyəsində öz fəaliyyətini yeni yaradıcılıq ruhu ilə davam etdirəcəkdir.

# I Fəsil

# Azərbaycan Dövlət Pedaqoji Universitetinin təşkili və inkişafının ilk mərhələsi (1921-1930-cu illər)

## Azərbaycanda ali pedaqoji təhsilin təşkilini şərtləndirən ictimai-siyasi şərait və mədəni mühit

XIX əsrin ikinci yarısından etibarən maarifçilik ideyalarının yayılması ilə Azərbaycanda baş vermiş köklü ictimai-siyasi və mədəni dəyişikliklər yeni tipli məktəblərin, dövri mətbuatın və teatrın yaranmasını təmin etməklə milli özünüdərkin gerçəkləşməsi üçün zəmin hazırladı.

XX əsrin əvvəllərində milli təfəkkürə və qan yaddaşına, soy-kökünə qayıdış, milli oyanış, özünüdərk, xalqın ruhunda, təfəkküründə yaşayan azadlıq yanğısı gerçək həqiqətə çevrildi. Milli maarifçilər tərəfindən formalaşdırılan milli istiqlal konsepsiyasının dolğunluğu və onun səmərəli şəkildə təbliği və tətbiqi azad Azərbaycan vətəndaşının tərbiyə olunması və ictimai mübarizələr səhnəsinə atılması vəzifəsini qarşıya qoydu[2]. Bu müqəddəs vəzifənin metodoloji əsaslarını müəyyənləşdirən M.Ə.Rəsulzadə Azərbaycan gəncliyinə təlqin edirdi ki, milli müstəqilliyə malik olmayan millət azadlığını və haqqını qoruya bilməz. Belə bir dövrdə milli məktəb, milli dərslik, milli tərbiyə problemlərini həll etməyə qabil ziyalılar dəstəsi yetişdi. Milli mənafe uğrunda eyni platformada dayanan bu ziyalılar müxtəlif cərəyanları təbliğ edirdilər.

Milli ziyalılar yeni məktəbləri (qəza məktəbi, ali ibtidai məktəb, şəhər məktəbi, rus-müsəlman məktəbi, realni məktəb, gimnaziya və s.) maarifçiliyin milli şüur təliminin müqəddəs idealı hesab edirdilər. Onlar yaxşı başa düşürdülər ki, orta əsrlərdə Azərbaycanda elmin, təhsilin və mədəniyyətin inkişafında böyük tarixi rol oynamış ənənəvi məktəb və mədrəsə yeni maarifçiliyin ideya və təşkilati mərkəzi, hərəkət və fəaliyyət orqanı ola bilməz. Üsuli-cədid hərəkatının qarşısında ənənəvi məktəbləri müasir məktəblərə çevirmək vəzifəsi dururdu. Yeni üsullu məktəblərin yaradılması, təhsilin məzmunu və təlim metodlarının təkmilləşdirilməsi, məktəbyaşlı uşaqların ümumi, icbari və pulsuz təhsilə cəlb edilməsi, qadın təhsilinin həyata keçirilməsi, kitabxana və qiraətxanaların açılması, xeyriyyə cəmiyyətlərinin təşkili, yaşlılar üçün cümə (bazar günü) və axşam məktəblərinin açılması Azərbaycanda 1905-1907-ci illər inqilabından sonra daha da genişlənən pedaqoji hərəkatın leytmotivini təşkil edirdi. Milli ziyalıların xalqa yalnız əlifba öyrətməklə məsud olacaqları ilə bağlı istək və arzuları Rusiyada baş verən ictimai-siyasi hadisələrin fonunda əriyib yox olmuşdu. Ona görə də XX əsrin əvvəllərində milli ziyalılar xalqa yalnız əlifba öyrətməklə kifayətlənmir, millətə istiqlal, istiqbal, mücadilə və mübarizə dərsi keçməklə onları siyasi mübarizəyə və müstəqilliyə hazırlayırdılar. Milli mətbuat səhifələrində "əkilən" milli ideyalar XX əsrin əvvəllərindən "bar" verməyə başladı, ayrı-ayrı maarifçilərin nəzəri fikirləri milli ideologiya səviyyəsinə yüksəldi, milli partiyaların, nəhayətdə isə Milli Hökumətin yaradılması ilə başa çatdı.

1918-ci ilin mayın 28-də yaranan Azərbaycan hökumətinin fəaliyyətində başlıca istiqamətlərdən birini ölkənin ərazi bütövlüyünün qorunması, digərini isə xalq maarifinin yeni əsasda, milli platformada təşkili təyin edirdi. Təhsilin, maarif və mədəniyyətin milli əsasda qurulması dövlətin əsas təməl prinsiplərindən biri hesab edilirdi. Mübarizə milli mədəniyyətin bütün sahələrini əhatə etsə də,

[2] *Rüstəmov F. XX əsrin əvvəllərində Azərbaycanda milli istiqlal ideologiyasının formalaşması. Etnopsixologiya və etnopedaqogika: mənbələr və müasir problemlər. Bakı: ADPU, 1992, s.32-33*

əsas etibarı ilə xalq maarifinin milli ruhda, yeni tərzdə təşkili, məktəblərin milliləşdirilməsi, ana dilində məktəblərin yaradılması, milli ali və orta ixtisaslı kadr hazırlığı və təlimin məzmunu ətrafında mərkəzləşmişdi ki, bunu da təsadüfi hal hesab etmək olmaz. Çünki məktəb mədəniyyətin əsas həlqəsini, təməlini təşkil edir. N.Nərimanov yazırdı: *"Hər bir millətin mədəni tərəqqisi məktəblə, məktəbin tərəqqi tapması isə müəllimlərlə bağlıdır*". Elə bu səbəbdən də Cümhuriyyətin ilk maarif naziri Nəsib bəy Yusifbəyli deyirdi: *"İstiqlalımız, istiqbalımız həp maariflə bağlıdır. Əgər milli maarifimiz, milli məktəbimiz tərəqqi etməzsə, bizim üçün fəlah və nicat ümidi qalmaz"*.

Respublikada xalq maarifini, məktəb təhsilini qaydaya salmaq, milli ali, orta və ibtidai məktəb şəbəkəsi yaratmaq, mövcud məktəbləri milliləşdirmək və digər bu kimi tədbirləri yerinə yetirmək məqsədilə Azərbaycan hökumətinin qərarına əsasən 30 iyul 1918-ci ildə Xalq Maarif Nazirliyi yaradıldı. Nazirliyin qarşısında duran ən mühüm vəzifələrdən biri milli məktəblər üçün müəllim kadrları hazırlamaqdan ibarət idi. Bu məqsədlə Azərbaycan mədəniyyətinə onlarla işıqlı zəka bəxş etmiş Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasının Azərbaycan şöbəsi F.Köçərlinin səyi və işgüzarlığı nəticəsində Qazaxa köçürüldü. 1918-1919-cu tədris ilində Gəncə müəllimlər seminariyası milliləşdirildi. Bakıda kişi və qadın, Nuxada kişi seminariyaları açıldı. 1919-cu ilin əvvəllərində Bakı qadın seminariyası kişi seminariyasına çevrildi ki, orada da həmin ilin payızında dövlət hesabına yaşayan və oxuyan 40 nəfər uşaq üçün pansionat (yataqxana) açıldı. Seminariyada kiçik və böyük hazırlıq və I siniflər fəaliyyət göstərirdi ki, orada da ilin sonunda 60 şagird təhsil alırdı. Zaqatala, Ağdam və Şuşa şəhərlərində də seminariyaların açılması nəzərdə tutuldu. İbtidai məktəblərin müəllimlərə olan ehtiyacını təmin etmək məqsədi ilə Gəncə, Nuxa və Şuşada 200 nəfər müəllim hazırlayan kurslar açıldı.

1919-cu ilin əvvəllərində respublika ərazisində 23 dövlət orta təhsil müəssisəsi fəaliyyət göstərirdi ki, onlardan da 6-sı kişi, 4-ü qadın gimnaziyası, 5-i realni məktəb, 3-ü müəllimlər seminariyası, 3-ü "Müqəddəs Nina" qız məktəbi, politexnik məktəb və kommersiya (ticarət-F.R) məktəbi idi[3].

Təhsil ocaqlarının milliləşdirilməsini daha səmərəli təşkil etmək, ibtidai siniflərin müəllimlərə ehtiyacını ödəmək üçün Bakıda, Qazaxda, Qusarda, Salyanda və Zaqatalada da qısa müddətli kurslar açıldı ki, bunların da hər birində 50 nəfər müdavim təhsil alırdı. Parlamentdə Göyçayda realni məktəbin açılması haqqında qanun layihəsi təsdiq olunmuşdu. Türkiyədən dəvət olunmuş 50 nəfər müəllim respublikada xalq maarifinin yenidən təşkilində səylə çalışır, dərsliklər yazır, tədris vəsaitləri hazırlayır, milliləşdirilmiş məktəblərdə dərs deyirdilər.

Ali təhsilli milli kadr hazırlığı Milli hökumətin əsas hədəflərindən biri idi. Bu, olduqca çətin və mürəkkəb bir iş idi. Maliyyə və kadr sahəsində ciddi problemlər var idi. Çar hökuməti Azərbaycanda ali məktəblərin açılmasına mane olduğundan, burada milli dildə dərslik və dərs vəsaitləri, digər əlavə tədris resursları, ümumiyyətlə hazırlanmamışdı. Digər tərəfdən, ali təhsil quruculuğu sahəsində də təcrübə yox idi. Milli kadr hazırlığı məqsədilə Parlament 100 gəncin Türkiyə, Rusiya və Avropanın nüfuzlu universitetlərinə göndərilməsini qərara almaqla yanaşı, həm də Bakıda ali təhsil müəssisələrinin təşkilini vacib hesab etdi.

1919/20- ci tədris ilində 10 nəfərin İngiltərə, 23 nəfərin İtaliya, 45 nəfərin Fransa, 9 nəfərin Türkiyə və 13 nəfərin Rusiyaya göndərilməsi qərara alındı. Bir o qədər tələbənin İstanbula göndərilməsi qərara alınmışdı. Xaricə göndərilən həmin tələbələrin xərci üçün hökumət Xalq Maarifi Nazirliyinin sərəncamında olan dövlət xəzinəsindən 7 milyon manat ayırmışdı. Avropaya göndərilənlərin hər biri üçün 1000 frank yol xərci, hər ay isə 400 frank təqaüd, Rusiyaya göndərilənlər üçün 3 min manat yol xərci və hər ay bir o qədər də təqaüd nəzərdə tutulmuşdur. Dövlət hesabına təhsil alan tələbələr təhsilini başa vurduqdan sonra hökumətin göndərdiyi yerdə 4 il işləməli idilər. Xaricə göndərilən tələbələrin maddi təminatının

[3] *Rüstəmov F.Milli maarifimizin qaranquşları (ADR dövründə məktəb) //"Azərbaycan məktəbi" jurnalı,1992,№2-3,s.54-60*

qarşılanmasında mesenat Hacı Zeynalabdin Tağıyev əsl fədakarlıq nümunəsi göstərmişdir. Onun evi xarici qonaqların qarşılanması üçün nəzərdə tutulmuşdu. Bu xeyirxahlıq missiyasını və məsuliyyətini üzərinə götürən H.Z.Tağıyevin də öz şərtləri vardı:1.Hər tələbəyə təhsil müddəti ərzində ayda 50 manat veriləcəkdir. Yay tətillərində Qafqaza gəliş-gediş xərcləri də ayrıca ödəniləcəkdir. 2.Tələbə ali təhsilini bitirdikdən sonra mütləq Vətəninə dönərək öz ölkəsinə xidmət edəcəkdir. 3.Tələbə qeyri-türklə və ya qeyri - müsəlmanla evlənməyəcəkdir. 4.Tələbə təhsilini bitirib həyata atıldıqdan sonra təhsil müddəti ərzində aldığı pulları birdəfəlik və ya hissə-hissə Xeyriyyə Cəmiyyətinə ödəyəcəkdi. Komissiya Hacı Zeynalabdin Tağıyevin şərtlərini redaktə edərək demokratik quruluşlu respublikanın hüquqi dövlət ideyaları ilə uzlaşmadığına görə üçüncü bəndi ixtisara saldı.

Xarici ölkələrə oxumaq üçün 100 nəfərin göndərilməsi planlaşdırılsa da, (Rusiya və Ukraynada təhsil almalı olanlar da nəzərə alınmaqla) 102 nəfər tələbə göndərilmişdi[4].

1919-cu il aprelin 14-də Nəsib bəy Yusifbəylinin sədrliyi ilə yaradılan IV hökumət kabinetinin Parlamentə təqdim etdiyi proqramda Bakıda universitet təsis edilməsi məsələsi ön plana çəkildi. Nəsib bəy Yusifbəyli Tiflisdə yaradılmış Zaqafqaziya Universitetinin Bakıya köçürülməsini məqbul variantlardan biri kimi Azərbaycan Parlamentinə təqdim etmişdi. Uzun-uzadı danışıqların aparılmasına baxmayaraq, Zaqafqaziya Universitetini Bakıya köçürmək mümkün olmadı, müstəqil universitet yaratmaq qərara alındı. Bu məqsədlə Xalq Maarif Nazirliyi tərəfindən prof.V.İ.Razumovski Bakıya dəvət olundu və Universitet komissiyasına sədr təyin edildi. Komissiyaya prof.Vasili İvanoviç Razumovski (sədr), prof.Aleksandr Mixayloviç Levin, prof.Nikolay Aleksandroviç Dubrovski, Bakı şəhər Bələdiyyə idarəsindən Əlicabbar Orucəliyev, Xalq Maarif Nazirliyindən Məmmədağa Şahtaxtinski (üzvlər) və İvan İvanoviç Babuşkin (katib) daxil idi. Komissiya Universitetin təsis olunması ilə bağlı zəruri olan qanun layihələrini (“Bakı Dövlət Universitetinin təsis edilməsi haqqında”; “Bakı Dövlət Universitetinin Nizamnaməsi”; “Bakı Dövlət Universitetinin 1919/20-ci dərs ili üçün ştat və xərclər haqqında”) hazırlayıb hökumətə təqdim etdi. Hökumətin 7 iyul 1919-cu il tarixli qərarı ilə həmin sənədlər Azərbaycan Parlamentinə təqdim olundu. Təxminən iki aya yaxın bir müddətdə həmin sənədlər Azərbaycan Parlamentinin müvafiq komissiyalarında ətraflı müzakirə olundu.

Ciddi müzakirələrdən sonra universitetin təsis edilməsi ilə bağlı qanun layihələri Parlamentin 21 avqust 1919-cu il tarixli 67-ci iclasının gündəliyinə salındı. Bu tarixi iclasa tanınmış pedaqoq Sultan Məcid Qənizadə sədrlik edirdi. Onun giriş sözündən sonra iclasın katibi Mehdi bəy Hacınski universitetlə bağlı sənədlərin məzmunu və mahiyyəti, komissiyalarda irəli sürülən təklif və edilən düzəlişlər haqqında ətraflı məlumat verdi. Müzakirələrdə ilk söz alan “İttihad” fraksiyasının rəhbəri Qarabəy Qarabəyov müzakirələrin dayandırılmasını, layihələrin yenidən komissiyalara qaytarılmasını, ümumiyyətlə isə, universitet açılmasının hələlik mümkün olmadığını fraksiyası adından bəyan etdi. Parlamentdə səsə qoyulan həmin təklif səs çoxluğu ilə (28 səs lehinə, 17 səs əleyhinə) qəbul edildiyindən universitetin təsis olunması ilə bağlı məsələ gündəlikdən çıxarıldı. Parlamentdə böyük nüfuz sahibi olan Məmməd Əmin Rəsulzadə ilk olaraq söz aldı və təqdim olunmuş layihələrin yenidən müzakirəyə çıxarılması ilə bağlı tarixi çıxış etdi. Ondan sonra xalq maarif naziri Rəşid xan Kaplanov, Səmədağa Ağamalıoğlu, Əliheydər Qarayev, Mustafa Məmmədov və başqaları çıxış edərək Bakıda universitet açılmasının əhəmiyyətini əsaslandırdılar. Dörd saatdan artıq çəkən gərgin mübarizədən sonra Parlament öz qərarına yenidən baxmaq və təqdim olunmuş layihələrin müzakirəsinə başlamaq haqqında qərar qəbul etmək məcburiyyətində qaldı. Parlamentin 25 avqust və 1 sentyabr tarixli 68-ci və 70-ci iclaslarında 10 maddəlik “Bakı Dövlət Universitetinin təsis olunması haqqında Qanun” ətraflı müzakirə olunaraq sonuncu iclasda qəbul

[4] *Tahirzadə Ə.,Tahirli O. Azərbaycan Cümhuriyyəti tələbələri. Bakı,2016,s.103-105*

edildi. 29 sentyabr 1919-cu ildə Parlamentin iclasında 5 fəsil 72 maddədən ibarət "Bakı Dövlət Universitetinin Nizamnaməsi" təsdiq olundu.

"Azərbaycan gəncliyini elm və texnika əsrinə hazırlamaq üçün (M.Ə.Rəsulzadə)" təbii lisanda, tariximizin, ədəbiyyatımızın inkişafına kömək edə biləcək kəslərin yetişməsi məqsədilə 1 sentyabr 1919-cu ildə parlamentdə keçmiş qanunlar arasında uzun yaşaya bilən tarixi əhəmiyyəti olan yeganə qanun "(S.Agamalıoglu) qəbul edildi. M.Ə.Rəsulzadənin gücü və maarifçilik köməyi ilə" (prof.V.İ. Razumovski) Bakı Dövlət Universiteti təsis edildi. Universitetin ilk rektoru prof.V.İ.Razumovski parlamentdəki çıxışında deyirdi*:"Azərbaycan öz ali maarif ocağını açdı. Türk xalqları tarixinə yeni parlaq səhifə yazıldı. Avropa və Asiyanın hüdudlarında yeni bir məşəl şölələndi"*.

Dərslər sentyabrda deyil, noyabr ayında başlandı. Bununla bağlı "Azərbaycan" qəzeti 17 noyabr 1919-cu ildə yazırdı: "Dün Azərbaycan Darülfünun ilk dəfə olaraq açıldı və ilk gündür ki, məşğuliyyətə başladı".

Azərbaycan Xalq Cümhuriyyəti dövründə Xalq Maarif Nazirliyində bir sıra çox əhəmiyyətli qanun layihələri irəli sürülmüşdü. Azərbaycan orta təhsil məktəbləri üçün 600, İstanbul məktəbləri üçün 50 təqaüdün təsisi, 650 təqaüdçünün hamısının təhsil haqqından azad edilməsi, dərsliklərlə təmin edilməsi, 300 nəfərə ayda 200 manat, digər 300 nəfərin hər birinə isə 900 manat, İstanbula göndərilən 50 nəfərin hər birinə isə ayda 200 manat məbləğində təqaüdün verilməsi, elmi pedaqoji jurnallarının nəşri, Gəncə, Qazax, Şuşa və Nuxada kişilər üçün 2 illik, Gəncə, Bakı və Nuxada qadınlar üçün 1 illik pedaqoji kursların açılması,Türkiyədən dəvət olunan müəllimlərin əmək haqqının 50 faiz artırılması və s. qanun layihələri vaxtın azlığından Parlamentdə təsdiq olunmadı. Bu qanun layihələrinin təsdiq olunmasına Milli Hökumətin zamanı çatmadı.

Xalq Maarif Nazirliyi 1920-ci ilin sentyabr ayında Azərbaycanda orta təhsil müəssisələri üçün müəllim kadrları hazırlayacaq ***Ali Pedaqoji İnstitutun*** açılmasını planlaşdırsa da, buna nail ola bilmədi.

"Azərbaycan" qəzetinin 29 aprel 1919-cu il sayında[5] verilən məlumatdan aydın olur ki, təlim müddəti 4 illik olacaq Ali Pedaqoji İnstitutda orta məktəblər (həm II dərəcəli, həm də orta ixtisas) üçün müəllim kadrları hazırlanmalı idi. Tədrisin təşkilində pedaqoji fənlərə üstünlük verilməsi, tələbələrin fransız, alman və ingilis dillərindən birini öyrənməsi, təhsilin pulsuz olması, məzunların institutu bitirdikdən sonra 4 il orta məktəblərdə işləməsi, mühazirə oxumaq üçün xarici ölkələrdən professorların dəvət edilməsi və institutun nəzdində internatın (yataqxana) yaradılması nəzərdə tutulurdu. İnstituta hər il 20-25 nəfər tələbənin qəbulu, institutun nəzdində nümunəvi kişi gimnaziyasının açılması, son kursda təhsil alan tələbələrin professorların müşayiəti ilə sınaq dərsləri deməsi planlaşdırılmışdı.

Mətbuatda yeni yaradılacaq Pedaqoji İnstitutun tələbələrinin pedaqoji təcrübə keçmələri üçün IV kişi gimnaziyasının institutun tərkibinə verilməsi ən yaxşı variant hesab edilirdi.

Pedaqoji İnstitutun təşkilatçılarından olan Fətulla bəy Rzabəyli Ali Pedaqoji İnstitutun təşkili ideyasının Azərbaycan Xalq Cümhuriyyəti dövründə irəli sürüldüyünü bildirərək yazırdı*:"Müsavat hökuməti zamanı möhtərəm yoldaşım Həmid Şahtaxtlı tərəfindən dəxi ideyası meydana atılan Türk Ali Pedaqoji İnstitutun müxtəsər tarixçəsini bitirərək gələcək ali pedaqoji institutun təsvirimdə canlandıraraq qurduğum projesini bir kaç kəlmə ilə tərsim etmək istərdim: Xəzər dənizi sahilində mövcud Şərqin qapısı olan birinci türk sosialist şura cümhuriyyətinin coğrafi vəziyyətinə görə şu müqəddəs binanın müəzzəm bir elm xəzinəsi olacağına qələmlə və ruhumla iman etmişəm. Zəhmətkeş kütləsinə xidmət fikrini daşıyan hər bir elm aşiqləri hər tərəfdən irfan ocağına axın- axın gələcəkdir. Lisan, ədəbiyyat, istilah və bu kimi sair məsələlər həp burada həll olunacaq, həp burada bütün məktəblərə yayılacaqdır. Pedaqoji İnstitutu Azərbaycanda şərq institutu olaraq və Azərbaycandan bütün türk ölkələrinə yanar məşəl kimi ziya saçacaqdır"*.

[5] *Сообщение о планируемом открытии педагогического института. Газ. «Азербайджан», 29 апреля 1919*

## Ali Pedaqoji Kişi İnstitutunun təşkili. İnstitutun ilk nizamnaməsi

1920-ci ilin 28 aprelində süngülər üstündə hakimiyyətə gələn bolşeviklər xalq maarif sistemini sosializm ideologiyası əsasında yenidən təşkil etdilər. Xalq Maarif Nazirliyini ləğv edərək onun yerinə Xalq Maarif Komissarlığı yaratdılar. Respublikada bütün mədəni-maarif işlərinə rəhbərlik etmək yeni yaradılan komissarlığa həvalə olundu. 10 may1920-ci ildə Azərbaycan XMK tərəfindən Azərbaycanda sovet maarif sisteminin qurulmasının hüquqi əsaslarını müəyyən edən "Yeni sovet məktəbi yaratmaq haqqında" dekret verildi. Dekretdə köhnə ibtidai və orta məktəblərin politexnik məktəblə əvəz olunması, *tədrisin ana dilində aparılması,* tədrisin icbari və pulsuz olması[6] xüsusi qeyd olundu. Məktəbyaşlı uşaqların məktəbə cəlbi prosesi sürətləndirildi, Bakıda və qəzalarda yeni məktəb binaları tikildi. İbtidai təhsil şəbəkəsinin sürətlə genişlənməsi ibtidai məktəblərdə (I dərəcəli) və savad kurslarında dərs deyə biləcək milli müəllim kadrlarına olan ehtiyacı daha da artırdı. Xalq Maarif Komissarlığı ilk növbədə 2 və 3 aylıq kursların təşkilinə başladı.1920-ci ilin yayında Bakıda və digər qəza mərkəzlərində təşkil edilən qısamüddətli kurslarda 1120 nəfər müəllim hazırlandı. Ümumiyyətlə,1920-1923-cü illərdə 2365 müəllim qısamüddətli kurslarda təkmilləşmə keçdi[7]. Qısa müddətdə keyfiyyətli müəllim kadrları çox çətin idi. Ona görə də Azərbaycan XMK bir illik pedaqoji kurslar açmağı məqsədəuyğun hesab etdi. Bir illik pedaqoji kursların məzunlarının I dərəcəli məktəbin son (IV-V), ikinci dərəcəli məktəbin ilk iki siniflərində (VI-VII) dərs deməsi nəzərdə tutulurdu. Bakıda bir illik pedaqoji kursun layihəsi F.Rzabəyli tərəfindən hazırlandı və təsdiq üçün Xalq Maarif Komissarlığına təqdim olundu.1920-ci ilin 17 noyabrında layihə Xalq Maarif Komissarlığının Kollegiyası tərəfindən təsdiq olundu. Bakı Kişi Müəllimlər Seminariyasının[8] binasında kurs üçün bir neçə otaq ayrıldı. Kursa cəlb edilənlərin əksəriyyəti ibtidai məktəblərdə işlədiyindən məşğələlər axşam keçirilirdi. Nazirlik tərəfindən kursun inzibati-pedaqoji heyəti aşağıdakı kimi təsdiq edilmişdi:

1) Kursların müdiri – Fətulla bəy Rzabəyli
2) Müdir müavini – Həbib bəy Mahmudbəyli
3) İkinci müavin – Rəhim Cəfərov

*Müəlllimlər*

1) Əfəndizadə Abdullah
2) Əfəndizadə Məhəmməd
3) Talıbzadə Abdullah Şaiq
4) İbrahimov Mirzə Möhsün
5) Mirzə Camalov Hüseyn
6) Əfəndizadə Yusif
7) Hüseynzadə Sadıq
8) Adiyev Məhəmməd Əli
9) Yeremeyev
10) Dubrovin
11) Qara Mirzə
12) Boqoslovski
13) Almeforov
14) Zeyferet
15) Qatquşin
16) Tağı Unusof
17) Xanzadyan
18) Teteryan
19) Qaziyans
20) Ter-Qriqoryan
21) Ter-Andrasyan

Üç şöbədə (Azərbaycan, rus və erməni) fəaliyyət göstərən kurslara 150 nəfər cəlb edilmişdi. Təlim müdavimlərin ana dilinə uyğun olaraq Azərbaycan, rus və erməni dillərində aparılırdı. Qəza xalq maarif şöbələri tərəfindən göndərilən kişi və qadın müdavimlər üçün ayrı-ayrılıqda internatlar (yataqxanalar) təşkil edilmişdi. Kursu bitirənlərə şəhadətnamə verilirdi.

Birillik kurslar Ali Pedaqoji İnstitutun təşkili üçün yaxşı bir təcrübə oldu. Xalq Maarif Komissarlığı tərəfindən açılması nəzərdə tutulan Ali Pedaqoji Kişi İnstitutun nizamnaməsinin hazırlanması Fətulla bəy Rzabəyliyə həvalə olundu. Həmin nizamnamə Azərbaycan SSR Xalq Maarif Komis-

---
[6] *"Azərbaycan arxivi" jurnalı, Bakı, 1975, №1-2, s.13-14*
[7] *Azərbaycan Mərkəzi Statistika Xəbərləri İdarəsi.1924, №112 (8),s.62*
[8] *Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdindəki Azərbaycan Dövlət Pedaqoji Kollecinin sələfi*

sarlığı tərəfindən 13 iyun 1921-ci ildə təsdiq edildi[9]. Azərbaycan və rus dillərində hazırlanan ilk nizamnamə çox mükəmməl idi. İnstitutun sonrakı nizamnamələri onun əsasında hazırlanmışdı. Nizamnamədə 7 bölmədə aşağıdakı müddəalar nəzərdə tutulurdu.

## Azərbaycan Dövləti Türk Zükur[10] Ali Pedaqoji İnstitutu

### I. Ümumi qism

1.Azərbaycan birinci Dövləti Türk Zükur Ali Pedaqoji İnstitutu kəndilərini pedaqoji fəaliyyətləri ilə təchiz etmək istəyən gənc türk vətəndaşlarına ətraflı pedaqoji təhsilini vermək məqsədini təqib ediyor[11].

2.İnstitutda tədris ***dövləti türk dilində*** aparılıyor.

3.İnstitut ikinci dərəcəli məktəblər üçün mükəmməl hazırlıqlı müəllimlər buraxıyor.

4.İnstitut Xalq Maarif Komissarlığının təsvibi ilə müdir tərəfindən idarə ediliyor.

5.İnstitutda institut tələbələri üçün internat vardır.

6.Tələbələr tətbiqat dərsləri vermək üçün institut nəzdində (müttəhid məsai məktəbinin ümumi vəziyyəti əsası üzrə) 2-ci dərəcəli nümunə məktəbi təsis ediliyor.

### II. Tədrisat qismi

7.Tələbələr 2-ci dərəcəli müttəhid məsai məktəbində yeni tədris məsələlərilə əlaqədar olaraq dərs apara bilmək üçün fənni təhsil və düzgün hazırlıq görməlidirlər.

8.İnstitut 3 sinifdən ibarətdir: birinci, ümumi və ancaq nəzəri təhsil, 2 sonuncu isə ixtisasi və tətbiqi (praktik) siniflərdir.

9.İxtisas sinifləri iş bu qruplara ayrılıyorlar:

a) Tarix-ədəbiyyat

b) Təbiət-coğrafiya

c) Fizik-riyaziyyat

10. İnstitutda sənəyi-tədrisiyə (akademik il) 40 həftə olmalıdır.

*Qeyd: İnstitut tələbələri yay tətilinə buraxılıyorlar.*

11.İnstitutda atidəki dərslər oxuduluyor:

1.Ana dili; 2.Fəlsəfə (məntiq, ruhyat, tarix, fəlsəfə); 3.Pedaqoji və didaktik; 4.Riyaziyyat; 5.Astronomiya; 6.Fizika; 7.Kimya; 8. Elm-i təbiyyə; 9.Coğrafiya 10.Tarix-i ümumi; 11.Şərq tarixi; 12. Siyasi iqtisad; 13. İctimaiyyat; 14. Şura qanun-i əsasisi; 15.Kənd təsərrüfatı; 16. Rus lisanı; 17. Şərq hüsnxətti; 18. Əl işləri; 19. Musiqi

12.Siniflərdə keçiləcək dərslərin təqsimi, imtahan və keza tələbələrin tətbiqat işləri intizamı, Xalq Maarif Komissarlığının xüsusi qərarları mucibincə icra ediliyor.

*II maddəyə əlavə*

1. Ana dili

a) Ümumi təhsil sinfi:

*Ədəbiyyat nümunələri ilə tanış etmək, əsərləri məzmun və üslub etibarilə təhlil etmək.*

b) İxtisas siniflərində:

*Lisan tarixi, onun şəkilləri, xüsusiyyətləri, ədəbiyyat tarixi, üsul-i tədris, sərf və nəhv, üslubiyyat (stilistik), izahlı qiraət, nəzəriyat-i ədəbiyyə, asar-i atiqə və hüfruyat təhriyyatı*

IV – pedaqoji, didaktik və fənni tərbiyə tarixi

V – riyaziyyat

a)Ümumi təhsil sinfində:

*Elementar cəbr, həndəsə və müsəlləsat. Təbiət (funksiyon) və onun qrafik ilə arayəsi, hesab-i əsfər-i namütənahi*

b) İxtisas siniflərində:

*Hesab-i təfazuli və hesab-i tamami (diferensial və inteqral) və bunların həndəsəyə tətbiqi, müsəlləsat-i kurbiyə, cəbr-i ali, hesab-i nəzəri və hesab-i ehtimalidən müxtəsər məlumat, tarix-i riyaziyyat.*

VI – astronomi (kainat)

a)Ümumi təhsil sinfində: kosmoqrafiya kursu.

b)İxtisasi siniflərdə: təsviri və səfərik astronomi

VII -fizik (hikmət əl-təbiyə)

a)Ümumi təhsil sinfində

[9] *Ali Pedaqoji İnstitutun salnaməsi. (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi:prof.F.A.Rüstəmov). Bakı:Elm və təhsil, 2020, s.36*
[10] *kişi*
[11] *Nəzərdə tutulur*

*Fizikdən müntəxab fəsillər, yeni nəzəriyyat və hipotezlər burada tətbiqat işlərinə və məsələlər halına fazla əhəmiyyət veriləcəkdir.*

VIII – kimya

a) Ümumi təhsil sinfində

Qeyri-üzvi və üzvi kimya – kimyadan laborator işləri

b) İxtisasi siniflərdə

*Kimyayi qeyri-üzvi və üzvidən müntəxab parçalar.Kimya təhlili. Müxtəsər fizioloji kimya.*

IX – Elm-i təbiyyə

a)Ümumi sinifdə

*Nəbatat, heyvanat, geoloji ilə bərabər mineroloji*

b)İxtisas siniflərində

*Tarix və fizioloji nəbati. Tarix və fizioloji heyvani. Geoloji. Bioloji.*

X – Coğrafiya. Fiziki, riyazi və iqtisadi coğrafiya

XI – Tarix-i ədəbiyyat

XII-XIII – sosioloji və şura qanuni əsasisi.

XIV – kənd təsərrüfatı məfhumundan, siyasi ziraət və kənd təsərrüfatı sistemi anlaşılıyor. Bununçün də bu kursun siyasi iqtisad və iqtisadi coğrafiya ixtisası dairəsində oxudulması lazım gəlir.

*I, II, III qruplara üsul-i tədris:*

Təbiət və riyaziyyatçılara fizik təcrübələrinin texnikası. Təbiətçilərə elim-i təəbiyə təcrübələrinin texnikası.

13.Pedaqoji şurası, Maarif Komissarlığının təsdiqi ilə II maddədə göstərilən dərslərdən başqa yeni dərslər əlavə etmək səlahiyyətini haizdir .

14. Maarif işlərinin gedişi və pratik vəziyyəti ilə yaxından tanış olmaq üçün tələbələr, müəllimləri və Maarif Komissarlığı instruktorları rəhbərliyi ilə məktəbə qədər və məktəbdən xaric idarələrə gediyorlar.

**III.Tələbələr**

15. İnstituta 16 yaşından küçük və müəllimlik vəzifəsini iyi aparmağa mane ola biləcək cismani xəstəliyi olmayan şəxslər qəbul edilirlər.

İnstituta birinci sırada darülmüəlliminləri iyi yetişdirmiş, sonra 2-ci dərəcəli məktəbləri ikmal etmiş və nəhayət, xüsusi imtahan vermiş olan tələbələr qəbul ediliyorlar.

16.Hər sinifdə 40-dan fazla tələbə olmamalıdır. İcabında müvazi siniflər açıla bilir.

17.Yılda bir dəfə (sənənin başlanğıcında və ancaq birinci sinfə) tələbə qəbul ediliyor.

18.Tələbələr maddi tərəfdən təmin ediliyorlar.

19.İnstitut kursunu mükəmməl bitirmiş olan tələbələr diplom alıyorlar.

20. İnstitutdan məzun tələbələr, Maarif Komissarlığının göstərməsilə 3 yıldan az olmamaq şərtilə cümhuriyyətin maarif idarələrinin birisində vəzifədə bulunmalıdırlar.

**IV.İnstitutda vəzifədə bulunan şəxslər**

21.İnstitutun tədrisat və təsərrüfat qismləri məsuliyyəti müdir üzərindədir.

22.İnstitut müdiri. Maarif işçiləri İttifaqı rizası ilə pedaqoji şurası tərəfindən, ali təhsil görmüş və pedaqoji fəaliyyətləri ilə tanınmış olan şəxslərdən 3 sənə müddətinə intixab olunuyor və Maarif Komissarlığı tərəfindən təsdiq ediliyor.

23.Müdir, tədrisat və təsərrüfat işlərinə aid olan məsələləri kəndisi yalnız deyil, pedaqoji şurası və təsərrüfat kollegiyası rizası ilə həll ediyor.

24.İnstitutda müdirdən başqa:

a) Müdir müavini

b) İxtisas və ümumi təhsil dərsləri müəllimləri

c) Laborantlar

d) Doktor

e) İnstitut kanselyariyası müdiri

f) İki kargüzar

g) Makinəçi

h) İdarə yazıçısı

i) Xəzinədar (eyni zamanda mühasibəçi)

j) Ekonom, aşpaz və texniki xidmətçilər bulunuyor.

25.Müəllimlər, müavin-i müdir və laborantlar pedaqoji şurası tərəfindən pedaqoji fəaliyyətləri ilə tanınmış olan şəxslərdən dəvət və Maarif Komissarlığı tərəfindən təsdiq ediliyorlar.

*Qeyd: Tədrisat və təsərrüfat qismlərində tam məsuliyyət institut müdiri üzərində olduğundan müdir müavini namizədliyi müdir tərəfindən göstəriliyor.*

26.Müəllimlər tələbələrin tətbiqat dərslərində iştirak və rəhbərlik etməlidirlər.

27.Hər institut müəllimi (5 sənəlik tədris stajı olduğu təqdirdə) məlumatını genişlətmək üçün bir sənədən fazla olmamaq şərtilə elmi mərkəzlərə göndərilə bilir. Bu zamanda məzkur müəllim bütün

maaşını alıyor. Göndərilmiş olan müəllim qayıtdıqda gördüyü işlər xüsusunda məruzədə bulunur.

*Qeyd: Göndərilən müəllimin əvəzində dərs vermək üçün dəvət edilən müavinə veriləcək maaşın miqdarı smetaya əlavə olaraq əslinə mutabiq və muadil olur.*

28. Yeni açılmış olan institutun müəllimləri icabından az dərs veriyorsa da (siniflər az olduğuna görə) bütün maaş alıyorlar.

### V. Pedaqoji şura

29. Pedaqoji şurasına pedaqoji personalı, doktor və müəllimlərin dörddə biri miqdarında tələbə nümayəndələri daxildir.

*Qeyd: 2-ci dərəcəli nümunə məktəbinin müdir və müəllimləri pedaqoji şurası üzvüdürlər.*

30. İclaslarda sədarəti müdir aparıyor.

31. Pedaqoji şurası katibi bir sənəlik müddətinə intixab olunur.

32. Pedaqoji şurasının üzvlərinin ½-nin iclasda olduqları zaman çıxardığı qərarlar qanunidir.

33. Bütün işlər əksəriyyət səslə həll ediliyor.

***Qeyd:*** *Müəllimlərdən birinin pedaqoji şurası üzvlərinin ⅔ -sinin iclasda iştirakı ilə tərdi qanunidir. Bu məsələ pedaqoji şurası üzvlərinin əksəriyyəti tərəfindən verilən təhrir-i ərizədən sonra Maarif Komissarlığı tərəfindən təsdiq olunur.*

34. Pedaqoji şurasının ayda bir dəfə pedaqoji iclası oluyor. İcabında təcili iclas yapıla bilir. Pedaqoji şurasının öhdəsində institutun təlim -tərbiyə cəhətinin rəhbərliyi duruyor.

### VI.Təsərrüfat kollegiyası

35.İnstitutun təsərrüfat işlərinin icrası təsərrüfat heyətinə həvalə olunur.

36.Təsərrüfat heyəti üzvləri:

a) Müdir, yaxud müavini

b) Pedaqoji şurasının bir üzvü

c) Texniki xidmətçilərin bir nümayəndəsi

d) 2 nəfər tələbələrin nümayəndəsi

37.Təsərrüfat heyətinin vəzifəsi:

a) Sənəlik smeta projesini tərtib etmək

b) Smeta üzrə xərcləmək

c) İnstitut adından hər növ əmlakı aktnaməyə bağlamaq

### VII.İnstitutun hüququ

38.İnstitut kəndi dairəsində müstəqil və şəxsi hüquqa malik olaraq, təcrübə istasiyonları, laboratorlar, müzelər (muzeylər -F.R.), kitabxanalar, elmi dərnəklər, cəmiyyətlər, açıq yığıncaqlar, mühazirələr düzəltmək; pedaqoji şurası üzvlərini hər bir fənni idarələrə göndərmək; ehtiyacını təmin etmək üçün arazi almaq və istifadə etmək səlahiyyətini haizdir.

İnstitut kənd təsərrüfatı koloniyası təşkil ediyor.

***Qeyd:*** İnstitutun damğası (möhürü) vardır.



*Ali Pedaqoji İnstitutun möhürü (1926)*

Nizamnamə hazırlanarkən Bakı Dövlət Universitetinin və Rusiyanın ali pedaqoji təhsil müəssisələrinin nizamnaməsindən istifadə olunmuşdu. Nizamnamə, demokratik prinsiplər əsasında hazırlanmışdı. İnstitutda təhsil müddəti üç il idi. Tədris ili 40 həftə müəyyən edilmişdi. Biliyin mənimsənilməsini yoxlamaq və ona nəzarət etmək məqsədilə kollokvium, zaçot və imtahanların keçirilməsi planlaşdırılmışdı. İnstituta 16 yaşından yuxarı zəhmətkeş balaları, ilk növbədə müəllimlər seminariyasını, yaxud ikinci dərəcəli məktəbləri bitirən və fiziki cəhətdən qüsurlu olmayanlar imtahan vermək şərti ilə qəbul oluna bilərdi.

İnstitutun nizamnaməsi təsdiq edildikdən az sonra Azərbaycan Dövlət Kişi Pedaqoji İnstitutunun açılması ilə bağlı Azərbaycan SSR Xalq Komissarları Soveti tərəfindən dekret verildi. Böyük dövlət və siyasət xadimi Nəriman Nərimanovun imzaladığı 26 avqust 1921-ci il tarixli 66 saylı dekretdə[12] deyilirdi:

[12] *"Kommunist" qəzeti, 26 avqust 1921*

*“Respublikanın vahid əmək məktəbinin ideyalarını həyata tətbiq etməyə qabil yüksək ixtisaslı maarif işçiləri hazırlamaq məqsədilə bu ilin sentyabr ayının 1-dən etibarən Bakı şəhərində II dərəcəli şura məktəbləri üçün türk (Azərbaycan-F.R.) dilində müəllimlər hazırlaya biləcək Azərbaycan Dövlət Kişi Pedaqoji İnstitutu təsis edilsin. İnstitutun təşkilinə həmin dekretin nəşrindən dərhal sonra başlanılsın.”*

***Xalq Komissarları Sovetinin sədri*** ***N.Nərimanov***
***Xalq Maarif Komissarı*** ***D.Bünyadzadə***
***Xalq Maarif Komissarlığının işlər müdiri*** ***Şirvani***
***Katib*** ***R.Tahirov***



Yeni yaranan Ali Pedaqoji Kişi İnstitutunun həmin dövrdə mövcud olan digər ali məktəblərdən (Azərbaycan Dövlət Universiteti, Azərbaycan Politexnik İnstitutu, Azərbaycan Dövlət Konservatoriyası) özəlliyi ondan ibarət idi ki, burada tədris milli dildə təşkil edilməli idi. Ali pedaqoji məktəbdə ayrı-ayrı ixtisaslarda Azərbaycan dilində mühazirə oxuyacaq müəllimlərin, elmi-pedaqoji və metodiki ədəbiyyatın, stabil terminologiyanın olmaması ciddi problemlər yaradırdı. Ali Pedaqoji Kişi İnstitutunun tez bir zamanda təşkil ediləcəyinə çoxları şübhə ilə yanaşırdı. Hətta Xalq Komissarları Sovetinin müvafiq dekretindən sonra da onun fəaliyyət göstərəcəyinə şübhə ilə yanaşanlar və hətta əks-təbliğat aparanlar da var idi. *“Azərbaycan yurduna ziya saçacaq bu maarif ocağı əleyhinə təbliğat da yapıyorlardu* [13].

Cavad Cuvarlı belələri haqqında yazırdı: ”*Bütün yılan, qurbağa və həşərat dilə gəlib, şöylə dedilər ki, a kişi, bu nə sərsəmlikdir, böylə də iş olarmı? Türk Ali Pedaqoji İnstitutu açıla bilərmi? Dəvə hara, hamam hara? Bu işi apara biləcək müəllimlər, mürəbbilər hanı? Yox-yox! Böylə şey olamaz!”*[14]. Bu münasibəti ciddi şəkildə tənqid edən Fətulla bəy Rzabəyli yazırdı: ”Bu anlatır ki, bu kimi ədalarda bulunan adamların qəlbi bizim qəlbimizlə çarpmıyor, onların damağı və ruhu əski rus sərvətdar hökumətinin “ruslaşdırma” və sair bu kimi murdar vərasətilə (miras-F.R.) məşbudur (doludur-F.R.). Şərəfinə məcmuə verilən bu gün əlavə olaraq bir daha o zatlara diyor:“*Azərbaycanda ikinci dərəcəlilər üçün müəllim hazırlayaraq pedaqoji institutu yaratmaq lazımdır və mümkündür.”*[15]

İnstitutun nizamnaməsinin hazırlanması, maliyyə-təsərrüfat xərclərinin və tədris binasının yerinin müəyyənləşdirilməsi məqsədilə təşkilat komitəsinin yaradılması üçün Xalq Maarif Komissarlığının ictimai tərbiyə şöbəsinin müdiri Azad Əmirova 1414 saylı mandat verilmişdi[16]. Onun ümumi rəhbərliyi ilə təşkilat komitəsi yaradılmışdı. Binanın yerinin müəyyənləşdirilməsi təşkilat komitəsinə həvalə edilmişdi.Təşkilat komitəsinin sədri *Fətulla bəy Rzabəyli*, üzvləri *Həbib bəy Mahmudbəyli*, *Rəhim Cəfərov*, katib isə birillik pedaqoji kurs bitirən *Əli Abbas Vəlixanlı* idi.Təşkilat komitəsinə verilən səlahiyyət daxilində *Abdulla Şaiq Talıbzadə, Məmməd Əfəndiyev* və *Sadıq Hüseynzadə* də təşkilat komitəsinə dəvət edildi.

---

*[13] Ali Pedaqoji İnstitutun salnaməsi. (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi: prof.**F.A.Rüstəmov**). Bakı:Elm və təhsil, 2020, s.38*
*[14] Yenə orada, s.157*
*[15] Yenə orada, s.38*
*[16] Rüstəmov F.Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektorları. Bakı: Elm və təhsil, 2019, s.22*

Hazırlıq komissiyasının gördüyü işlər haqqında sədr Fətulla bəy Rzabəyli bilavasitə Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri N.Nərimanova və Xalq maarif komissarı D.Bünyadzadəyə məlumat verir, onlardan lazımi göstəriş və yardım alırdı. N.Nərimanov komissiya üzvlərini qəbul edən zaman öz razılığını bildirərək demişdi: "*Mən görürəm, maarifin haradan başlanılmasını ruhən düzgün düşünmüş və Azərbaycan xalqının nicatı yolunu görüb bütün həyatınızı ona həsr etmişsiniz. Azərbaycan Respublikası bu zəhmətinizi hər zaman təqdir edəcək. Azərbaycan xalqı həmişə sizi yad edəcəkdir*"



*Azad bəy Əmirov (1883-1939)*

Təşkilat komitəsinin fəaliyyətini Xalq Maarif Komissarlığı ilə ***Azad bəy Əmirov*** koordinasiya edirdi. Təşkilat komitəsi Bakı Kişi Seminariyasının binasında (indiki AMEA-nın M.Füzuli adına Əlyazmalar İnstitutunun binası) fəaliyyət göstərirdi. Təşkilat komitəsinin ilk iclası 9 iyul 1921-ci ildə keçirildi. İlk iclasda institut üçün tədris binasının, nəzdində nümunə məktəbinin və internat (yataqxana) binasının yerinin müəyyənləşdirilməsi müzakirə olunaraq qərara alındı:

"İnstitutun ümumi mənafeyi üçün Xalq Maarif Komissarlığına müraciət edilərək aşağıdakı binaların birini instituta veriləsi xüsusunda binagüzarlıqda bulunmaları rica olunsun:

1) sabiq realni məktəbi;[17]
2) sabiq "Müqəddəs Nina məktəbi"[18];
3) sabiq "Marinski Ünas gimnaziyası"[19];
4) sabiq parlaman binası[20].

Bununla bərabər komisyonun rəyinə görə ən münasib bina sabiq realni məktəbin binası göstərilsin. Zira böylə bir bina institutun bütün təşkilatını kəndisində yerləşdirməyə qadir olacaqdır"[21].

Çox təəssüf ki, həmin binalarda əsgərlərin yerləşdirilməsi səbəbindən onların heç biri instituta verilmədi.

Təşkilat komitəsinə binanın tapılmasında Bakı maarif şöbəsinin məktəb işləri şöbəsinin müdiri Ağa Əli Rağib (Qasımov) kömək etdi. Onun köməyi ilə ***Lebedinski döngəsində*** (Sadavoya, 1-ci Çkalov döngəsi, Niyazi küçəsi, Şövkət Ələkbərova küçəsi) yerləşən ***1 №-li Turgenev məktəbi*** institut üçün boşaldıldı. Həmin binada 1 №-li Turgenev rus



*Ali Pedaqoji İnstitutun yerləşdiyi ilk bina*

---

[17] *Azərbaycan Dövlət İqtisad Universitetinin əsas binası*

[18] *Müqəddəs Nina "Xeyriyyə Cəmiyyətinin 1874 -cü ildə açdığı qız məktəbi. Məktəbin binası ilk əvvəl hərbi səhra hospitalı olub. 1888-ci ildə Qızlar məktəbinə verilib. 1895-ci ildə müəssisəyə gimnaziya statusu verilib. Gimnaziya öz fəaliyyətini 1918-ci ilədək davam etdirib.1918-1920-ci illərdə bu binada Hərbi Akademiya fəaliyyət göstərib. S.Mehmandarov Hərbi Akademiyanın direktoru, Ə.Şıxlinski isə onun müavini vəzifəsində çalışıb. 1933-1937-ci illərdə beynəlmiləl məktəb kimi fəaliyyət göstərib. 1937-dən 2010-cu ilin sentyabr ayına qədər burada 132 (Azərbaycan) və 134 (rus) №-li orta məktəblər fəaliyyət göstərib. Hazırda 132-134 nömrəli Təhsil Kompleksi kimi fəaliyyət göstərir.*

[19] *Mariya Qızlar Məktəbi (Marinski Qadın Gimnaziyası) 26 sentyabr 1887-ci ildə açılıb. Fəaliyyətini dayandırana kimi bu binada fəaliyyət göstərib. Sovet dövründə Bakı şəhər Partiya Komitəsi bu binada yerləşib. Hazırda Azərbaycan Milli İncəsənət Muzeyinin bir hissəsi həmin binada fəaliyyət göstərir.*

[20] *H.Z.Tağıyevin tikdirdiyi qız məktəbinin binası. Bina 1898-1901-ci illərdə tikilib. Məktəbin ərsəyə gəlməsinə 183 min 533 rubl pul xərclənib. Məktəbin rəsmi açılışı 1901-ci ildə olub. Azərbaycan Xalq Cümhuriyyətinin Parlamenti 1918-1920-ci illərdə bu binada yerləşib. Binada hazırda Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu fəaliyyət göstərir.*

[21] *Ali Pedaqoji İnstitutun salnaməsi. (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi:* ***prof.F.A.Rüstəmov****). Bakı:Elm və təhsil, 2020, s.39-40*

məktəbi (direktor Lebkoviç), həm də 7-ci "Mahmud bəy Mahmudbəyov" məktəbi (direktoru Əbdürrəhimov) yerləşirdi. Hər ikisi birinci dərəcəli (ibtidai) məktəb idi. Sonralar həmin məktəb Bakı şəhəri Voroşilov rayon 6 saylı məktəbə (hazırda Bakı şəhəri 6 saylı məktəb-lisey) çevrildi. Ali Pedaqoji İnstitut bir ildən artıq həmin binada yerləşdi.

İnstitutda dərs deyə biləcək müəllim heyətinin və tələbələrin azlığı üzündən ilk dərs tədris ilinin əvvəlində deyil, noyabrın 15-də cəmi 6 nəfər tələbə ilə başlandı. İnstituta qəbul olunan ilk 6 nəfər aşağıdakılardır:

1. Rəhimzadə Əbdülhüseyn - Salyan qəzasından
2. Musaxanlı Atababa -Bakı qəzasından
3. Axundzadə Vəli - Ağdam qəzasından
4. Süleymanzadə Məhəmməd- Göyçay qəzasından
5. Mustafazadə Ağaveyis - Göyçay qəzasından
6. Ədilzadə Əbdülmüsəvvər - Orta Asiyadan

Dərslər başlamamışdan əvvəl institutun rəhbər heyəti və dərs deyəcək müəllimlər Xalq Maarif Komissarlığı tərəfindən aşağıdakı tərkibdə təsdiq olunmuşdu: Odessa Universitetini bitirmiş ***Fətulla bəy Rzabəyli*** institutun direktoru, Tiflis Müəllimlər İnstitutunu bitirən ***Həbib bəy Mahmudbəyov*** direktor müavini, ***Abdulla Şaiq Talıbzadə*** ədəbiyyat, Peterburq Universitetinin məzunu ***Məmməd Əfəndiyev*** riyaziyyat, Odessa Universitetinin məzunu ***Həmid Şahtaxtinski*** pedaqogika və fəlsəfə, Almaniyanın Dapmştad ali texniki məktəbini bitirən ***Sadıq Hüseynov*** kimya, İstanbul Universitetinin məzunu ***İsmayıl Novruzi*** fizika və təbiət müəllimi, Leninqrad Ali Pedaqoji İnstitutunun məzunu ***V.Pismennaya*** isə rus dili ixtisası üzrə müəllim təyin edilmişdilər.



*Ali Pedaqoji İnstitutun direktoru F.Rzabəyli və ilk tələbələri*

**Fətulla bəy Rzabəyli**
*professor, Əməkdar elm xadimi*
*(1885 -1968)*



*28 fevral 1885-ci ildə Bakı şəhərində anadan olub. İbtidai təhsilini rus-tatar məktəbində, orta təhsilini I kişi gimnaziyasında alıb. Gimnaziyanı qızıl medalla, 1906-1911-ci illərdə təhsil aldığı Novorossiysk Universitetinin (Odessa) Fizika-riyaziyyat fakültəsinin təbiyyat şöbəsini I dərəcəli diplomla başa vurub. 1910-1913-cü illərdə həmin Universitetdə işləyib.1912-ci ildə Odessa Tədris Dairəsində birillik pedaqoji kurs qurtararaq orta məktəblərdə təbiyyat müəllimi olmaq hüququ qazanıb. 1913-1915-ci illərdə Krasnodarda Mixaylovski realni məktəbində müəllim işləyib. 1915-1916-cı illərdə IV kişi gimnaziyasında pedaqoji fəaliyyətlə məşğul olub. 1916-1917-ci illərdə Salyanda realni məktəbin direktoru işləyib. 1918-1919 -cu illərdə Azərbaycan SSR Xalq Maarif Nazirliyində ali və orta ixtisas məktəbləri şöbəsinin müdiri olub. 2 yanvar 1920-ci ildə Xalq Maarif Nazirliyində dəftərxana müdiri, 9 fevral 1920-ci ildə isə orta məktəblər şöbəsinin müdiri təyin olunub. 1920-1921-ci illərdə Azərbaycan SSR Xalq Maarif Komissarlığının məktəblər şöbəsinə başçılıq edib. Xalq Maarif Komissarlığının 17 noyabr 1920-ci il tarixli qərarı ilə Bakıda yaradılan birillik ali pedaqoji kurslara rəhbər təyin olunub. 1921-1924-cü illərdə Ali Pedaqoji İnstituta rəhbərlik edib.*

*1925-1928-ci illərdə Azərbaycan Xalq Maarif Komissarlığının Baş ictimai tərbiyə idarəsinin müdiri olub. Nəriman Nərimanov adına Sənaye Texnikumu, S.Ağamalıoğlu adına Kənd Təsərrüfatı Texnikumu, Diş Həkimliyi Texnikumu və sonralar onun əsasında yaranan Diş Həkimliyi İnstitutunun təşkilində, həmin müəssisələr üçün proqram və metodiki göstərişlərin hazırlanmasında xüsusi xidmətləri olub. 1926-1928-ci illərdə ADU-nun Tibb fakültəsində təhsil alıb. 1938-1942-ci illərdə həkim kimi fəaliyyət göstərib.*

*1928-ci ildə Azərbaycan Dövlət Universitetinin Elmi Şurasının qərarı ilə ona professor elmi adı verilib. Azərbaycan SSR Xalq Maarif Komissarlığının Dövlət Elm Şurasının 3 mart 1930-cu il tarixli, SSRİ AAK -nın 7 aprel 1950-ci il tarixli qərarları ilə onun Zoologiya kafedrası üzrə aldığı professor elmi adı təsdiq olunub.*

*1930-cu ildə BDU-nun Tibb fakültəsinin əsasında Azərbaycan Dövlət Tibb İnstitutu yaradılanda F.Rzabəyli orada Biologiya kafedrası təşkil edərək uzun müddət ona (1930-1933 və 1946-1964-cü illərdə) rəhbərlik edib. 1942-1949-cu illərdə Qiyabi Pedaqoji İnstitutda kafedra müdiri olub. 1933-cü ildə ADPİ-nin prorektoru, Biologiya fakültəsinin dekanı və fakültə elmi-metodik komissiyasının sədri olub. Azərbaycan Kənd Təsərrüfatı İnstitutu Bakıda fəaliyyət göstərəndə orada Zoologiya kafedrasının müdiri vəzifəsində çalışıb.*

*"Ümumi biologiya" (1931), "Biologiya terminləri lüğəti" (1934), "Biologiya" (1955) kitabları və 30-dan artıq elmi məqaləsi nəşr olunub.*

*24 may 1960-cı ildə Azərbaycan SSR Ali Soveti tərəfindən ona Əməkdar elm xadimi fəxri adı verilib, "Qafqazın müdafiəsinə görə" (1944), "Şərəfli əməyə görə" (1946) medalları ilə təltif olunub.*

*10 oktyabr 1968-ci ildə Bakı şəhərində vəfat edib və Fəxri Xiyabanda dəfn olunub.*

1921-ci ilin noyabrın 12-də Ali Pedaqoji Kişi İnstitutunun Pedaqoji Şurasının ilk iclası keçirildi. Şurada dərslərin mütəşəkkil keçirilməsi üçün kollektivin qarşısında duran mühüm vəzifələr müzakirə edildi. Tədris planına uyğun olaraq I tədris ilində tələbələrə riyaziyyat, ana dili, rus dili, rəsm, musiqi və başqa fənlərə dair ümumi məlumat verilirdi. İkinci kursdan tələbələr ixtisaslar üzrə ayrılırdı. İlk illərdə institutda üç ixtisas: tarix-ədəbiyyat, təbiyyat-coğrafiya və fizika-riyaziyyat üzrə müəllim kadrları hazırlanırdı. Ali Pedaqoji Kişi İnstitutunda dərslərin 1921-ci ilin noyabrında başlanmasına baxmayaraq, tələbə qəbulu davam edirdi. 1922-ci ilin yanvarında institutda oxuyan tələbələrin sayı 40 nəfərə çatdı. Birinci tədris ilini bütün tələbələr müvəffəqiyyətlə başa vuraraq yay tətilinə buraxıldılar. Yay tətili müddətində institutun nəzdində 40 nəfərlik pansion təşkil edildi.

İnstitutun birillik təcrübəsi göstərdi ki, tədris planına bir sıra yeni fənlər daxil edilməlidir. 1922/23-cü tədris ilində institutun tədris planına yeni fənlər daxil edildi. Elə həmin tədris ilinin ikinci yarısında Ali Pedaqoji Kişi İnstitutu keçmiş *realni məktəbin* binasına (indiki Azərbaycan Dövlət İqtisad Universitetinin əsas binası)[22] köçürüldü. Tələbələrin sayı artdığından əvvəlki bina tələbatı ödəmirdi. İnstitutun ilk məzunlarından olan Hacıbala

*[22] Realni məktəbin binası şəhərimizin memarlıq incilərindən biri hesab olunur. Bina realni məktəb üçün tikilib. Realni məktəbin binasının tikilməsinin maraqlı tarixi var. Bu məktəb 1837-ci ildə Şamaxı qəzasında üç sinifli məktəb kimi təşkil olunmuş, daha sonra pansionu olan dördillik ali ibtidai məktəbə çevrilmişdi.1860-cı ildə Şamaxıdakı dağıdıcı zəlzələdən sonra Bakıya köçürülmüşdü. 1867-ci ildə ali 4 illik məktəb realni gimnaziyaya, 1 yanvar 1874-cü ildə isə həmin gimnaziya realni məktəbə çevrilmişdi. Məktəb şəhərə köçürüləndə müvəqqəti olaraq Bakı qəza məktəbinin binasında yerləşdirilmişdi. 1891-ci ildə Şəhər Duması Nikolayevski küçəsi 6-da (Nikolayevski - Parlaman - Kommunist - İstiqlaliyyət küçəsi) realni məktəb binasının tikintisi üçün sahə ayırdı. Layihə 1892-ci ildə Bakı qubernatoruna təsdiq üçün təqdim olundu, ancaq "layihədə və büdcədə əhəmiyyətli çatışmazlıq" səbəbindən qəbul edilmədi. Bir ildən sonra binanın tikintisi yenidən müzakirə edilsə də, böyük məbləğli (300 min rubl.) layihəni təsdiq etdirmək mümkün olmadı. Qubernator Qafqaz hakiminin dəftərxanasına müraciət edərək layihəyə ciddi yanaşmağı, sanitar və texniki tələblərə cavab verib-vermməməsini yoxlamağı, zərurət olarsa layihəni Daxili İşlər Nazirliyinin texniki-tikinti komitəsinə göndərməyi xahiş etdi. Uzun müddətli yoxlamalardan sonra, nəhayət ki, 1900-cü ildə realnı məktəbin memar D.D.Buynov tərəfindən İtaliya intibahı üslubunda tərtib etdiyi layihə təsdiq olundu. 14 may 1901-ci ildə binanın təməl qoyma mərasimi keçirildi. Unikal memarlıq üslubu ilə tikilmiş binaların- yuxarı hissədən Şəhər Duması, aşağıdan isə H.Z.Tağıyevin qız məktəbi ilə əhatə olunan realni məktəbin binası ortadakı boşluğu doldurmaqla yanaşı, həm də öz gözəlliyi ilə şəhərə xüsusi yaraşıq verməli idi. Bina qısa bir zamanda tikildi və istifadəyə verildi.*




*Ali Pedaqoji İnstitutun binası (1922-1927)*

Hacıyev xatirələrində yazırdı: *"Bina şəraitinin genişlənməsi, tədris avadanlığı ilə təmin olunması və biologiya, insan anatomiya və fiziologiyası, botanika və kimya kabinet-laboratoriyaları təşkil edildi. Bu binada tədris korpusu, yataqxana, yeməkxana, nümunəvi məktəb (Şaiq adına nümunə məktəbi nəzərdə tutulur - F.R.) və bir çox müəllimlərin mənzilləri yerləşirdi."*[23] Həmin bina Ali Pedaqoji Kişi İnstitutu, Ali Pedaqoji Qadın İnstitutu və fəhlə fakültəsi arasında bölünmüşdü.



*Ali Pedaqoji İnstitutun ilk müəllimləri*

Binada bir müddət əsgərlər qaldığından təmirə ehtiyacı var idi. Təmir məqsədilə 16 min rubl. vəsait ayrılmışdı. Bina yay aylarında təmir edildi, laboratoriyalar və fənn kabinetləri yaradıldı. Tədris planına yeni fənlərin daxil edilməsi və tələbələrin sayının artması ilə əlaqədar olaraq antropologiya və rus dili üzrə Novorossiysk İmperator Universitetinin məzunu ***Davud Şərifli***, siyasi iqtisad üzrə ***Hüseyn Mirzəcamalov***, anatomiya üzrə Kazan Universitetini bitirən ***Fətullah Əlizadə***, rəsm üzrə Fransa Rəssamlıq Akademiyasını bitirən ***Kelxuc,*** dilçilik üzrə prof.***Bəkir Çobanzadə,*** musiqi üzrə ***Meyliyan,*** fizikadan təcrübə məşğələləri üzrə ***H.Berq,*** fizika ixtisası üzrə Kazan Universitetini bitirən ***Rəhim bəy Məlikov*** (o, Şimali Qafqazda işləyirdi), siyasi iqtisad üzrə Azərbaycan SSR Xalq maarif komissarının müavini ***Mustafa Quliyev,*** anatomiya üzrə Odessa Universitetini bitirən ***Mirəsədulla Mirqasımov*** və ictimaiyyat üzrə Kiyev Universitetini bitirən ***Cəlil Məmmədzadə (Məhəmmədzadə)***, botanika üzrə Peterburq Ali Qadınlar kursunun məzunu ***Səlimə xanım Osmanzadə,*** fars dili üzrə Paris Universitetini bitirən ***Mirzə Möhsün İbrahimi,*** psixologiya və məntiq üzrə Tiflis Aleksandrovski Müəllimlər İnstitutunu bitirən ***Abdulla Azaqbəyli***, coğrafiya üzrə ***Süleyman Səlim*** və ***B.Qarbulum*** müəllimliyə dəvət olundular. Azərbaycan hökumətinin dəvəti ilə Bakıya gələn türk ədəbiyyatı tarixi müəllimi ***İsmayıl Hikmət***, pedaqogika və pedaqogika tarixi müəllimi ***Xəlil Fikrət***, İstanbul Universitetinin tarix və ədəbiyyat şöbəsinin məzunu ***Məhiyəddin***, tanınmış türk təbiətşünas alimi ***İskəndər Abuzalımov*** da Ali Pedaqoji İnstitutda müəllim kadrları hazırlığına cəlb olundular.

Azərbaycan SSR Xalq Maarif Komissarlığı tərəfindən Azərbaycan Dövlət Universitetində işləmək üçün dəvət edilən görkəmli rus alimləri – akademiklərdən İ.Meşşanov, B.Bartold, N.Marr, A.Samoyloviç, professor P.Juze və b. həm də Ali Pedaqoji İnstitutda mühazirə oxuyurdular.

Ali Pedaqoji İnstituta tələbə qəbulu Azərbaycan SSR Xalq Maarif Komissarlığının təsdiq etdiyi qaydalara uyğun aparılırdı. 28 iyun 1922-ci ildə Xalq maarif komissarı Mustafa Quliyev *"1922/23-cü tədris ilində Azərbaycan SSR ali məktəblərinə tələbələrin qəbul qaydaları"*nı təsdiq etmişdi[24]. Orada qeyd olunurdu ki, ali məktəblərə II dərəcəli vahid əmək məktəblərini bitirmiş şagirdlər, fəhlə fakültələrinin və seminariyanın məzunları qəbul oluna bilər. Sənəd qəbulu 15 iyuldan 20 avqusta qədər XMK-nın nəzdində fəaliyyət göstərən xüsusi komissiya tərəfindən aparılırdı. Tələbə seçimi 5

[23] ***Hacıyev H.*** *Mənim tələbəlik illərim. "Gənc müəllim" qəzeti, 26 fevral 1973*
[24] *Газ. «Бакинский рабочий», 10 июля 1922*



*Ali Pedaqoji İnstitutun ilk müəllimləri: Ön sırada:Məmməd Əfəndiyev, Sadıq Hüseynov, Mirzə Möhsün İbrahimov, Həbib bəy Mahmudbəyov, Tağı Şahbazi, Səlimə Yaqubova (1926-1927-ci illər)*

sentyabra qədər davam edirdi. Vakant yerlər üçün 15 sentyabra kimi qəbul davam edirdi. Qəbul üçün şəxsin orta təhsil haqqında sənədi, türk (Azərbaycan) dilini bilməsi (türk dilində danışmağı və yazmağı bacarmasını yoxlamaq üçün komissiya tərəfindən xüsusi gün və saat müəyyənləşdirilirdi), müvafiq qurum və təşkilatların (Azərbaycan KP MK, AHİŞ, hərbi hissə) göndərişi tələb olunurdu. Sənəd verənlərin sayı vakant yerlərdən çox olanda, üstünlük birinci növbədə türk dilini bilənlərə, sonra fəhlə fakültələrinin məzunlarına, daha sonra isə Azərbaycan KP MK, AHİŞ və hərbi hissələrin göndərdikləri nümayəndələrə verilirdi.



*Kişi Pedaqoji İnstitutunun Pedaqoji Şurası və tələbə nümayəndələri*

İkinci tədris ilində instituta Azərbaycandan və digər respublikalardan 41 nəfər tələbə qəbul edildi. İnstitutun yenicə fəaliyyətə başlamasına baxmayaraq, şəxsən N.Nərimanovun köməyi sayəsində institutda bir neçə kabinə və laboratoriya yaratmaq mümkün olmuşdu. Onun göstərişi ilə Ali Xalq Təsərrüfatı Şurasının nəzdində olan kimya laboratoriyası bütünlüklə Ali Pedaqoji Kişi İnstitutuna verilmişdi. İnstitutun kimya və fizika laboratoriyalarında 120 tələbənin təcrübə aparması üçün imkan var idi. İnstitutun ilk məzunlarından olan Hacıbala Hacıyev[25] xatirələrində yazırdı:" *F.Rzabəyli ilə birlikdə mənə də N.Nərimanovla görüşmək nəsib olmuşdur. Biz institutun kimya avadanlığı ilə təmin edilməsini xahiş etdik. Az sonra keçmiş neft sahibkarlarına məxsus olan zəngin bir*

*[25] Hacıbala Hacıyev institutu qurtaran ili Gəncə Pedaqoji Texnikumuna direktor və müəllim təyin olunub. 1943-1949-cu ilərdə Gəncə Dövlət Pedaqoji İnstitutunun direktoru (rektoru) olub. Sonralar uzun müddət ADPİ-nin Biologiyanın tədrisi metodikası kafedrasının dosenti olub.*



*Ali Pedaqoji İnstitutun bir qrup müəllim və tələbəsi (1926)*

*kimya laboratoriyasının instituta verilməsi haqqında qərar çıxarıldı. N.Nərimanov həftədə bir-iki dəfə instituta gələr, yeni təşkil olunmuş kabinet və laboratoriyaları nəzərdən keçirər, tələbələrin geyim və yeməklərinə diqqət yetirər və təsərrüfat hissəsinə müəyyən tapşırıqlar verərdi*".

Azərbaycan KP MK və Xalq Komissarları Soveti ilk Ali Pedaqoji İnstitutun möhkəmləndirilməsi və genişləndirilməsi üçün ona hərtərəfli kömək göstərirdi. Respublika ali məktəbləri[26] içərisində Ali Pedaqoji Kişi İnstitutunda tədris ana dilində aparıldığından rəsmi dövlət orqanları tərəfindən daha çox diqqət mərkəzində idi. Hələ 1921-ci ildə institutun direktoru Fətulla bəy Rzabəyli Xalq Maarif Komissarlığının Kollegiya iclasında hesabat verərkən Xalq maarif komissarının müavini M.Quliyev institutun qarşısında duran vəzifələri şərh edərkən demişdi: *"Pedaqoji institut Azərbaycanda yeganədir. O, yalnız biz azərbaycanlıların deyil, bütün məhkum Şərq xalqlarının mədəni-maarif qayələrini təmin etməlidir"*.

1923-1924-cü tədris ilində institutda *tarix və etnoqrafiya muzeyi* yaradıldı. İnstitut təşkil olunduğu günlərdə onun kitabxanasında Azərbaycan dilində 50, başqa dillərdə isə cəmi 73 kitab vardısa, az sonra Moskvadan və başqa şəhərlərdən alınan ədəbiyyat hesabına kitabxananın fondu xeyli zənginləşdirildi.



*Riyaziyyat şöbəsinin tələbələri fizika laboratoriyasında*

[26] *Həmin dövrdə Azərbaycanda Ali Pedaqoji Kişi İnstitutundan başqa Azərbaycan Dövlət Universiteti, Azərbaycan Politexnik İnstitutu, Azərbaycan Konservatoriyası, Ali Rəssamlıq Məktəbi fəaliyyət göstərirdi.*



*Ali Pedaqoji İnstitutun bir qrup müəllimi və dekanları (1926)*

İstanbuldan xüsusi sifariş ilə türk dilində 700-ə qədər kitab göndərilmişdi. Kitabxananın işinə tələbələr cəlb olunmuşdu. Kitabxananın müdiri Əbdülhəsən Rəhimov, onun müavini isə Vəli Axundzadə idi.

Fizika kabinəsi üçün Moskvadan yeni cihazlar alınmışdı. Kimya laboratoriyasında və təbiət kabinəsindəki avadanlıqların sayı xeyli artmışdı. Fizika kabinetində 254, kimya kabinetində 874 cihaz var idi. Həmin ilin iyul ayına kimi cihaz almaq üçün fizika kabineti üçün 27 min, kimya kabineti üçün 130 min rubl. buraxılmışdı. Məktəbin fizika kabinəsinə Məhəmməd Abdullazadə, kimya kabinəsinə Sadıq Hüseynov rəhbərlik edirdi.

1921-ci ildə institutun kimya laboratoriyası nəinki Azərbaycan, hətta Gürcüstan və Ermənistan respublikalarındakı ali məktəblərin kimya laboratoriyalarından ən zəngini hesab olunurdu.[27]

Hökumət institutun maddi-texniki bazasının möhkəmləndirilməsi məqsədilə ona hərtərəfli yardım göstərirdi. İnstitutun maliyyə-təsərrüfat işinin yaxşılaşdırılması üçün 1923-1924-cü tədris ilində Azərbaycan SSR Xalq Komissarları Soveti və Xalq Maarif Komissarlığı xətti ilə institutun tədris və təsərrüfat işlərinə 112 min 69 manat vəsait ayırmışdı. Tələbə kontingentinin sayı artdıqca tədris və təsərrüfat işlərinə ayrılan vəsait də ildən-ilə artırdı.

1923-1924-cü tədris ilində institutda 1 ümumi hazırlıq sinfi, 6 ixtisas sinfi (2 riyaziyyat, 2 ədəbiyyat, 2 təbiyyat) vardı. İnstitutda təhsil alan tələbələrin ümumi sayı 100 nəfərə çatmışdı. Fətulla bəy Rzabəylinin yazdığına görə, üçüncü ədəbiyyat şöbəsində 6, riyaziyyat şöbəsində 9, təbiyyat şöbəsində 14, ikinci ədəbiyyat şöbəsində 9, riyaziyyat şöbəsində 8, təbiət şöbəsində 12, birinci ümumi təhsil şöbəsində 41 nəfər tələbə təhsil alırdı[28].

İnstitutun tələbələrinin yaşaması üçün 120 yerlik pansionu (yataqxana) var idi. F.Rzabəylinin müdiri olduğu birillik kursun müdavimləri üçün nəzərdə tutulan yataqxana bütövlükdə Pedaqoji İnstitutun sərəncamına verilmişdi. Yataqxana üçün zəruri avadanlıqların və tələbələr üçün üst geyimlərinin alınmasında Xalq Maarif Komissarlığının işlər müdiri Bəna Məmmədovun və F.Rzabəylinin yaxın dostu Həbib Dadaşın mühüm xidmətləri olmuşdu.1921-ci ilin noyabr ayının 21-də yataqxana tələbələri qəbul etməyə tam hazır idi.

[27] *Ali Pedaqoji İnstitutun salnaməsi. (Tərtib, transliterasiya, izahlar və ön sözün müəl-lifi:**prof.F.A.Rüstəmov**). Bakı: Elm və təhsil, 2020, s.39-40*

[28] *Yenə orada*

## Ali Pedaqoji Kişi İnstitutunun ilk məzunları

1923/24-cü tədris ilinin sonunda Ali Pedaqoji Kişi İnstitutunu 28 nəfər bitirdi. İlk məzunlar təbiyyat, riyaziyyat və ədəbiyyat şöbələrinin tələbələri olmuşdur.

| № | Adı və familiyaları | Hansı şöbənin məzunu olub | Hansı qəzadan və ya respublikadandır |
|---|---|---|---|
| 1 | Axundzadə Vəli | təbiyyat | Ağdam |
| 2 | Əhmədbəyli Əli Ağa | təbiyyat | Lənkəran |
| 3 | Əfəndizadə Əbdülrəşid | təbiyyat | Nuxa |
| 4 | Əfəndizadə Neman | təbiyyat | Göyçay |
| 5 | Bayramzadə Məhəmməd | təbiyyat | Nuxa |
| 6 | Bağırzadə Məhəmməd | ədəbiyyat | Gəncə |
| 7 | Cəfərzadə Həsən | təbiyyat | Gəncə |
| 8 | Hacızadə Hacıbala | təbiyyat | Qazax |
| 9 | Hacızadə Vahid | təbiyyat | Zaqatala |
| 10 | Hüseynzadə Surxay | təbiyyat | Şuşa |
| 11 | Rəhimzadə Abdülhüseyn | təbiyyat | Salyan |
| 12 | Rzazadə Rza | təbiyyat | Şamaxı |
| 13 | Rzazadə Həsənəddin | riyaziyyat | Tiflis |
| 14 | Zeynalzadə Zeynal | riyaziyyat | Şamaxı |
| 15 | Süleymanzadə Məhəmməd | riyaziyyat | Göyçay |
| 16 | Şərəfəddin Seyidaləm | ədəbiyyat | Türküstan-Daşkənd |
| 17 | Şahverdili Teymur | ədəbiyyat | Lənkəran |
| 18 | Qasımzadə Qafur | təbiyyat | Bakı |
| 19 | Abdizadə Cami Əkrəm | təbiyyat | Quba |
| 20 | Abdihzadə Tahir | təbiyyat | Kazan |
| 21 | Abdihzadə Məhəmməd | təbiyyat | Kazan |
| 22 | Abdihzadə Əli | təbiyyat | Ağdam |

| | | | |
|---|---|---|---|
| 23 | Abdilzadə Abdülməsur | riyaziyyat | Türkistan- Daşkənd |
| 24 | Məhəmmədzadə Vəli | riyaziyyat | Ağdam |
| 25 | Mədədzadə Məhəmməd | təbiyyat | Qazax |
| 26 | Mustafazadə Ağaveys | riyaziyyat | Göyçay |
| 27 | Musaxanlı Atababa | ədəbiyyat | Bakı |
| 28 | Nəcəfqulubəyzadə Nəsir | riyaziyyat | Ağdam |

Məzunlardan 7 nəfəri riyaziyyat, 17 nəfəri təbiyyat, 4 nəfəri isə ədəbiyyat ixtisası üzrə idi.

İnstitutda ilk məzun günü çox təntənəli şəkildə keçirildi. Xalq Maarif Komissarlığının, tanınmış elm adamlarının və institutun müəllimlərinin iştirakı ilə keçən məzun günündə öncə SSRİ Mərkəzi İcraiyyə Komitəsinin sədrlərindən biri olan ***N.Nərimanovun*** Azərbaycan Ali Pedaqoji İnstitutunun ilk məzunlarına - elmlərini yeni tamam etmiş müəllimlərə açıq məktubu oxundu. Məktubda deyilirdi:

*"Əziz yoldaşlar, təzə həyata qədəminizi təbrik edirəm. Vəzifəniz hər nə qədər qayət çətin və məsuliyyətli bir vəzifədirsə də, bunu da düşünməlisiniz:insanın ruhunu ucaldan bir çox şey vardırsa, onun ən birincisi zəhmətdir.*

*Mən, istərdim ki, siz gələcək həyatınızda üç məsələyə diqqət edəsiniz:*

*1) Sizin tərbiyənizdə olan Azərbaycan balaları gərək zəhmətsevən olsunlar, yəni çətinlikləri başqasının yox, öz zəhmətləri ilə dəf etsinlər. Bunun üçün balalara təbiəti sevdirmək, onları təbiətin əlamətləri ilə maraqlandırmaq lazım gəlir.*



*Fizika-riyaziyyat şöbəsinin məzunları- ayaq üstə duranlar (sağdan):Z.Azaqbəyli, B.Məhəmmədzadə, S.İbrahimzadə, M.Mehdizadə, S.Ağazadə, H.Həsənzadə, R.Kaşizadə, S.Ramazanzadə; oturanlar: F.Mahmudbəyli ,H.Mahmudzadə, M.İsmayılzadə, S.Hüseynzadə, Məhəmməd Əfəndizadə (dekan), H.Həmidzadə və b.*



*Tarix-ədəbiyyat şöbəsinin məzunları: ayaq üstə duranlar (sağdan): Z.Abdullazadə, H.Körükçü, M.Rzaquluzadə, B. Heydərzadə, M.Əliəkbərzadə, oturanlar:S.Məhəmmədzadə, Ə.Məmmədyarlı, İsmayıl Hikmət (dekan), Ş.Vəzirzadə, M.Teymurxanlı, O.Toplu, yerdəkilər: Ə.Hüseynzadə, T.Talıbzadə,*

*2) Sizin tərbiyənizdən çıxan cavanlarımız gərək cəsur, cürətli və dəyanətli olsunlar.Yəni bir parça çörəkdən ötəri ikiüzlülük etməsinlər, filankəsin xoşuna gəlmək üçün "qatığa qara" deməsinlər.*

*Amandır, yoldaşlar. Buna yaxşı fikir veriniz. Mənsəbdən ötəri yalan söyləyən, gündə vicdanını satan "ikiüzlü" adamlar bizim gələcək kommunaya üzv ola bilməzlər. Ona binaən uşaqlarla daima əlaqədə olaraq hərəkətinizdə, sözünüzdə artıq dərəcədə ehtiyatlı olmalısınız. Çünki uşaq gördüyünü tez götürər.*

*3) Biz iddiamızdan əl çəkmirik, Azərbaycan Şərq üçün bir məktəbdir, yəni Şərq hazırkı halında qalırsa biz ona hər cəhətdən müəllim olacağıq. Beş ildən sonra Türkiyə, İran, Əfqan üçün bizim müəllimlərimiz elm-fənn meydanında hazır olacaqlar. Ona görə dilimizi lüzumsuz qeyrisinin lisanının təsiri*



*Təbiyyat-aqranomi şöbəsinin məzunları- ayaq üstə duranlar (sağdan): Y.İsmayılzadə, Z.Həmidzadə, Ə.Mustafazadə, Z.Əlizadə, H.Musazadə, İ.Musazadə, Y.Məhəmmədzadə, H.Əfəndizadə, H.Hacızadə; oturanlar: müəllimlər və Səlimə xanım (dekan),*

*altında saxlamaq bütün işimizi təxirə salar. Bu səbəblərə görə dilimizi müstəqil bir şəklə salmaq üçün ən çox siz müəllimlərə ümid bağlayıb, məktəbi bitirmənizi yenə də səmimi qəlbdən təbrik edirəm”.*

Xalq maarif komissarı ***M.Quliyev*** də Ali Pedaqoji İnstitutun ilk məzunlarına təbrik məktubu ünvanlamışdı. Məktubda deyilirdi:

*“Dəyərli yoldaşlar, ağır çalışmalar yılı içərisində sizin tərbiyə almış olduğunuz pedaqoji institutumuz meydana çıxarıldı. İşçi və köylülər kəndi istismarçılar əleyhinə apardıqları ağır mübarizələr içərisində ehtiyac və yoxsulluğa baxmayaraq maarif və mədəniyyətin ilk ocaqlarını yaratdılar. Maarif və mədəniyyət böylə parlaq ocaqları halhazırda kəndi məsul vəzifələrini ifa edən pedaqoji institutlarımızdır. Bu yıllarda şura hökuməti pedaqoji institutların işini böyük bir diqqətlə təqib ediyordu. Bu yıl artıq kəndi böyük bayramını -bu institutlardan ilk tələbə buraxılışını tərtib ediyor. Maarif işçilərinin xəyalları doğru oldu.*

*Siz xalq maarifinin ilk mübarizləri, böyük xalq müəllimi adı ilə həyata addım atıyorsunuz. Hər şeydən əvvəl pedaqoji maarifinin gələcək boyu və çiçəklənməsi: pedaqoji institutlarımızın gələcək nişanəsi və qəza darülmüəllimlərimizin möhkəmlənməsi sizin işlərinizdən asılıdır. Biz mükərrirən demişiz ki, pedaqoji məktəblərini pedaqoji məfkurəsinin mərkəzi ad etməli, bizim bütün müəllimlərimiz onların ətrafına toplanmalı, orada bizim müəllimlərimizi hazırlamalı, tərbiyə və maarifin təməlini qoymalıyız. Müəllimlər sayının azlığı bizim pedaqoji məktəblərimizdə işi bu istiqamətə çevirməyə müsaidə etmiyordu. Siz var qüvvənizi bu sahəyə verməli və bütün enerji məktəbləri və texnikumlarımızın şərəfini yüksəltməlisiniz.*

*Siz məsudsunuz, zira siz böyük müəllim adını daşıyorsunuz. Sizin borcunuz bu böyük ada ləyaqətli olmanızdır. Əskidə müəllim bu çinovnik olmuş mülkədar və sərmayədarların qulu və hamisi rolunu oynuyordusa, şimdi müəllimi kəndi böyük vəzifəsini – yeni kommunizm cəmiyyətinin məsul yaradıcılığı və yeni nəslin tərbiyəçiliyini sədaqət və doğruluqla ifa etməlidir. Geri qalmış işçi və köylüyə ictimai bir işçi və rəhbər olmaq, zəhmətkeş həyatına yardımçı olmaq sizin vəzifəniz, sizin borcunuzdur.*

*Hər daim xatirdə saxlamalıdır ki, işçi və köylü kəndi sinfi düşmənləri, həyat-memat mübarizəsi veriyordurkən bitərəf qalmaq burjuaziyaya ən gözəl bir yardımda bulunmaqdır. Pedaqoji bitərəf qalmağa imkan verməz, yalnız kəndi xüsusi həyatı ilə maraqlanan mülkədar və dükancılar davam etməkdə olan sinfi mübarizəsində bitərəf qala bilirlər. Şura müəllimi hər şeydən əvvəl kommunist cəmiyyətinin məsul təşkilatçısıdır.*

*Dəyərli yoldaşlar! Mən əminəm ki, siz şura hökumətinin qayə və məfkurəsinin nəqli olacaq və böyük gənc nəslin mürəbbisi adını məğruranə daşıyacaqsınız!”*

Azərbaycan SSR XMK-nın Kollegiyasının 1924-cü il 24 may tarixli iclasının qərarı ilə institutu bitirənlərdən 3 nəfəri Bakı kişi seminariyasına, 3 nəfəri Gəncə, 2 nəfəri Şuşa, 2 nəfəri Qazax, 1 nəfəri Naxçıvan seminariyasına, qalanları isə digər maarif müəssisələrinə işə göndərildi.




*“Ali Pedaqoji İnstitutu salnaməsi” (1924)*

İnstitutun üç illiyi və ilk buraxılışı münasibəti ilə Xalq Maarif Komissarlığının Azərbaycan Dövlət Xalq nəşriyya-

tında ***"Ali Pedaqoji İnstitutu salnaməsi"*** (1924) məcmuəsi nəşr olunmuşdu[29].

Məcmuə məzunlara müraciətlə açılır: *"Yavrular!.. Pedaqoji İnstitutu sizi tərbiyə etdi; böyütdü və ruhani qida ilə bəslədi. İnstitut sizin ananızdır. Ananızı odlu qəlbinizlə sevmək, göz bəbəyi kimi barındırmaq, onun hər hangi məsum və səmimi, pak və munis baxışlarını yenə eyni şeylə isitmək, yaşadığınız hər saniyədə onun haqqını düşünmək, sizin müqəddəs və təmiz vəzifənizdir. Şimdi siz, onun və ancaq onun inkişafına, əbədiyyətlə yaşamasına, böyüməsinə, yüksəlməsinə deyil, Azərbaycan, bəlkə bütün şərq-türk zəhmətkeşlərinə işıq saçar bir məşəl olmasına, proletar kütləsinə xidmət etmək istəyən bəşəriyyətin pak və ali idealları uğrunda çarpışacaq, bin-bin sizlər kimi gənc ruhlu müəllimlər yetişdirməsinə səbəb olunuz!... 14 mayıs 1924"*[30]

İlk bölmə "*Ali Pedaqoji İnstitutun tarixçəsi*" adlanır. İnstitutun ilk direktoru Fətulla bəy Rzabəylinin "Azərbaycan birinci dövlət türk Ali Pedaqoji İnstitutunun açılış tarixçəsinə dair", A.Lukyanovanın "Ünas Ali Pedaqoji İnstitutunun surət-i təşkili və davamı" və "Nümunə məktəbi"nin müdiri Qafur Əfəndizadənin məruzəsi əsasında tərtib olunmuş "Nümunə məktəbinin tarixçəsi" məqalələri verilmişdir.

Məcmuənin ikinci bölməsində təşkilat və idarə işləri ilə bağlı Səfər Ramazanzadənin "Ali Pedaqoji İnstitutun tələbə təşkilatı", Feyzi Məhəmmədzadənin "İnstitutun Kommunist Gənclər İttifaqı özəyi", "Nümunə məktəbinin təşkilat və idarəsi" məqalələri öz əksini tapmışdır.

Məcmuənin *"Tərbiyə və tədris işləri"* bölməsində "Ali Pedaqoji İnstitutun Ədəbiyyat şöbəsində nümunə dərsləri" (İsmayıl Hikmət), "Ali Pedaqoji İnstitutu 1923-24 sənəsi hikmət-riyaziyyat şöbəsində riyaziyyatdan yapılan tətbiqat dərsləri haqqında izahat" (Məhəmməd Əfəndizadə), "Təbiət şöbəsində nümunə dərsləri" (E.Rəhimov), "Ali Ünas Pedaqoji İnstitutu tərbiyə işləri" (A.Lukyanova), "Müvəffəqiyyətin sirləri" (Xəlil Fikrət) verilmişdir.

*"İnstitutun gələcəyi"* bölməsində Nəriman Nərimanovun "Elmlərini yeni tamam etmiş müəllimlərə açıq məktub"u, Xalq maarif komissarı Mustafa Quliyevin "Məzunlara xitab" adlı təbrik məktubu verilib. Həmin bölmədə A.Əfəndizadənin (Azaqbəyli) "İctimai həyatda ali pedaqoji təhsilin və azərilər üçün Azərbaycan Ali Pedaqoji İnstitutunun əhəmiyyəti", E.Rəhimovun "Doğru vədələr", Abdulla Şaiq Talıbzadənin "İnstitut və Azərbaycan", Mirzə Möhsünün "Məzun talibə və tələbələrə bir xatirə", təbiyyat şöbəsinin məzunu Əbdülrəşid Əfəndizadənin "Məsul vəzifə qarşısında", ədəbiyyat şöbəsinin məzunu Surxay Hacıyevin "Vəzifəmiz" yazıları da yer alıb.

*"Bir xatirəcik"* bölməsində Ali Pedaqoji Qadın İnstitutunun məzunu Fatma Tutayevin, institutun



***Məmməd Rəşid oğlu Əfəndiyev***
*professor, Əməkdar elm xadimi*
*(1887-1977)*

*5 oktyabr 1887-ci ildə Nuxada (Şəkidə) Azərbaycanın görkəmli maarifçisi Rəşid bəy Əfəndiyevin ailəsində anadan olub. 1908-1913-cü illərdə Peterburq Universitetinin Fizika-riyaziyyat fakültəsində təhsil alıb. Ali təhsilini başa vurduqdan sonra qısa bir müddətdə Tiflisdə müəllimlik edib, sonra Azərbaycana qayıdaraq Nuxa gimnaziyasında pedaqoji fəaliyyətə başlayıb. ADR dövründə və sovet hakimiyyətinin ilk illərində o, həmin gimnaziyanın milliləşdirilməsində iştirak edib, gimnaziyanın aşağı siniflərində bütün fənlərin, yuxarı siniflərdə isə riyaziyyat fənninin ana dilində tədrisinə nail olub. Nuxa qəza xalq maarif şöbəsinin məktəblər bölməsinin müdiri vəzifəsində*

[29] *Ali Pedaqoji İnstitutu salnaməsi. (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi **prof.F.A.Rüstəmov**). Bakı:Elm və təhsil, 2020, 176 s.*
[30] *Yenə orada, s.22*

*çalışıb. Təşkil etdiyi klubda böyük ictimai-mədəni iş aparıb, məktəbyaşlı uşaqların təhsilə, yaşlı əhalinin savad kurslarına cəlb edilməsində fədakarlıq göstərib. Nuxa maarif işçiləri həmkarlar ittifaqının sədri olub. Azərbaycan Həmkarlar İttifaqı qurultayına nümayəndə seçilib. Nuxada üç aylıq pedaqoji kursun açılmasının təşəbbüskarı olub. Ali Pedaqoji İnstitutda pedaqoji fəaliyyətə dəvət olunan ilk 8 müəllimdən biri və fizika-riyaziyyat şöbəsinin ilk müdiri (dekanı) olub. Ali Pedaqoji İnstitutda riyaziyyat fənnindən Azərbaycan dilində mühazirə söyləyən ilk müəllim olmaqla yanaşı, həm də institutun təşkilində mühüm rol oynayıb. Fətulla bəy Rzabəylidən sonra Ali Pedaqoji İnstituta direktor vəzifəsinə təyin olunub. 1931-ci il sentyabrın 29-da ADPİ-nin Ali riyaziyyat kafedrasına müdir təyin olunub. 1934-1936-cı illərdə Riyaziyyat və təbiyyat elmləri fakültəsinin dekanı olub. 1935-ci ildə Azərbaycan SSR Xalq Maarif Komissarlığı tərəfindən riyaziyyat elmləri sahəsindəki böyük xidmətlərinə və səmərəli pedaqoji fəaliyyətinə görə ona dosent elmi adı verilib.*

*1938-ci ildə Azərbaycan Dövlət Universitetinin Riyazi analiz kafedrasına dəvət olunub.1941-1965-ci illərdə həmin kafedraya rəhbərlik edib. 1943-cü ildə Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyətinin qərarı ilə Əməkdar elm xadimi fəxri adına, 1944-cü ildə professor elmi adına layiq görülüb.*

*1948-1949-cu illərdə əvəzçiliklə Azərbaycan Dövlət Universitetinin nəzdindəki Fizika-Riyaziyyat Elmi Tədqiqat İnstitutunun direktoru vəzifəsində işləyib. ADU-da çalışsa da, ömrünün sonuna kimi Azərbaycan Pedaqoji İnstitutu ilə əlaqəsini kəsməmiş, burada Riyaziyyat fakültəsinin tələbələrinə diferensial tənliklərdən mühazirələr oxumuş, dövlət komissiyasının sədri olmuş, tələbələrinin riyaziyyatçı alim kimi yetişmələrinin xeyirxahlarından biri olmuşdur. Hesab, cəbr, həndəsə, triqonometriya fənləri üzrə formalaşdırdığı terminləri toplayaraq 1925-ci ildə kitab şəklində nəşr etdirib. Məhz onun və həmkarlarının elmi və metodiki yaradıcılığı nəticəsində Azərbaycanda riyazi terminologiya formalaşmağa başlayıb. M.Əfəndiyev, Ə.İ.Hüseynov, M.Cavadov, T.Abdullayev, C.Qasımov, B.Ağayev və başqalarının iştirakı ilə 1931-ci ildə "Riyaziyyat terminləri", 1939-cu ildə "Matematika terminləri", 1958-ci ildə isə yenidən "Riyaziyyat terminləri" nəşr olunub. 1941-1946-cı illərdə Azərbaycan Riyaziyyatçılar Cəmiyyətinin sədri olub."Adi diferensial tənliklər" (1950), "Matematik analizdən material və tapşırıqlar" (Ə.Hüseynovla birlikdə) (1939), "Diferensial tənliklər kursu" dərsliklərinin müəllifidir.*

*"Lenin" ordeni (1958) və 2 dəfə "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif olunub. Bakı Sovetinə deputat seçilib. 1 iyun 1977-ci ildə Bakı şəhərində vəfat edib.*

müəllimləri İsmayıl Novruzinin, Qafur Rəşadın, Heydər Verdiyevin, Cavad Cuvarlının, Xədicə Qazızadənin, Sübhanverdi Xanzadənin, E.Tahizin və Atababa Musaxanlının məzun tələbələrə təbrikləri verilib, xatirələr paylaşılıb. Məzunlara həsr olunmuş iki şeir- "Ali darülmüəllimat məzunlarına ithaf" (Fatma Tutayeva), "İlk fatehlərə!" (Nəsir Fətəlizadə) verilib.

İnstitutun əsas təşkilatçılarından biri olan Fətulla bəy Rzabəyli institutun ilk direktoru kimi 1921-1924-cü illərdə ona rəhbərlik etmişdir. Nəriman Nərimanovun təklifi ilə o, 1924-cü ildə Xalq Maarif Komissarlığında Baş İctimai Tərbiyə İdarəsinə müdir vəzifəsinə irəli çəkildikdən sonra institutun direktoru vəzifəsinə ***Məmməd Əfəndiyev*** təyin olundu.

Həmin dövrdə institutda aşağıda adları göstərilən müəllimlər fəaliyyət göstərirdi.

1. Məhəmməd Əfəndizadə – Leninqrad Universitetinin məzunu – institutun direktoru – riyaziyyat müəllimi
2. Həbib bəy Mahmudbəyli – Aleksandrovski Müəllimlər İnstiutunun məzunu – müdir müavini
3. Doktor Xəlil Fikrət – Berlin Universitetinin məzunu – pedaqogika və pedaqogika tarixi müəllimi
4. İsmayıl Hikmət – İstanbul Universitetinin məzunu– Türk ədəbiyyatı tarixi müəllimi
5. Abdulla Şaiq – Türk dili və ədəbiyyatı müəllimi
6. Mustafa Quliyev – Kiyev Universitetinin məzunu – siyasi iqtisad müəllimi

7. Cəlil Məhəmmədzadə – Kiyev Universitetinin məzunu – ictimaiyyat müəllimi

8. Mirzə Möhsün İbrahimzadə – Paris Universitetinin məzunu – fars ədəbiyyatı tarixi müəllimi

9. Davud Şərifli – Kiyev Universitetinin məzunu – antropoloji və rus ədəbiyyatı müəllimi

10. Sadıq Hüseynov – Darmştat Universitetinin məzunu– kimya müəllimi

11. Rəhim Məlikov – Kazan Universitetinin məzunu – fizika və kosmoqrafiya müəllimi

12. Səlimə Osmanzadə – Leninqrad Universitetinin məzunu – zooloji, təşrih və fizioloji nəbati müəlliməsi

13. Fətullah Rzabəyli – Odessa Universitetinin məzunu – üsul-i tədris və biologiya müəllimi

14. İsmayıl Novruzi – İstanbul Universitetinin məzunu– elm-i təbiyyə müəllimi

15. Doktor Əsədullah Mirqasımov – Odessa Universitetinin məzunu – təşrih-i insani müəllimi

16. Doktor Fəthullah Əlizadə – Kazan Universitetinin məzunu – insan fiziologiyası müəllimi

17. Abdullah Azaqbəyli – Aleksandrovski Müəllimlər İnstitutu məzunu – məntiq müəllimi

18.V.V.Pismennaya – Leninqrad Ali Pedaqoji İnstitutun məzunu – fransız dili müəllimi

19. Süleyman Səlim – İstanbul Darülfünunu məzunu– coğrafiya müəllimi

20. T.Qəribli – Derped Universitetinin məzunu – alman dili müəllimi

21. Keylihis – Florensiya Rəsm Akademiyası məzunu – qrafika müəllimi

22. Meyliyan – bəstəkar, musiqi müəllimi

23. Doktor Məhəmməd Rza Vəkilov – Xarkov Universitetinin məzunu –məktəbin həkimi

## Ali Pedaqoji Qadın İnstitutunun təşkili

Azərbaycan SSR XMK Kollegiyasının 1923-cü il 3 aprel tarixli qərarı ilə 1924-1925-ci tədris ilindən etibarən Ali Pedaqoji Kişi İnstitutu və Ali Pedaqoji Qadın İnstitutu inzibati cəhətdən birləşdirildi. Ali Pedaqoji Qadın İnstitutu necə yaranmışdı? Azərbaycanda ali pedaqoji qadın təhsilinin təşkilində müstəsna xidmətləri olan A.Lukyanova (Məktəbəqədər Qadın Tərbiyə İnstitutunun ilk direktoru) bu xüsusda yazırdı*:"Azərbaycan Şura hökuməti tərəfindən işğal edilər- edilməz qısamüddətli pedaqoji kursları açıldı; fəqət bu kurslar mükəmməl bir təhsil almaq və təhsilə davam etmək istəyənləri qənaətləndirə bilməzdi. Öz məmləkətinin tələbatını bilən və qadın təhsil və tərbiyəsinin tərəfdarı olan Xalq Maarif Komissarlığı Məktəbəqədər Tərbiyə İnstitutunun açılması xüsusunda Xalq Komissarları Sovetinə rapor verdi"*

Həqiqətən də Azərbaycan SSR Xalq Maarif Komissarlığının Kollegiyası 1921-ci ilin əvvəllərində Məktəbəqədər Qadın Tərbiyə İnstitutunun açılması ilə bağlı Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinə müraciət etmişdi. Ali qanunvericilik orqanında bu məsələ müzakirə olunmuş və Azərbaycan İnqilab Komitəsinin sədri N.Nərimanovun 23 dekabr 1920-ci il tarixli dekreti əsasında Birinci Məktəbəqədər Qadın Tərbiyə İnstitutu yaradılmışdı.



*Ali Pedaqoji Qadın İnstitutunun müəllimlər şurası*

Həmin dekretdə deyilirdi*:"Məktəbəqədər tərbiyə sahəsində təcrübəli kadrlar və rəhbər işçilər hazırlamaq, həmçinin qadınlar arasında tərbiyə işlərini yaymaqdan ötrü*



*Ali Pedaqoji Qadın İnstitutunun Pedaqoji Şurası və tələbə nümayəndələri*

*1921-ci il martın 1-dən etibarən Bakı şəhərində **Birinci Məktəbəqədər Qadın Tərbiyə İnstitutu** açılsın".*

İnstitut II dərəcəli məktəblər üçün qadın müəllimlər hazırlayırdı. İnstitutda üç hazırlıq qrupu və iki ixtisas şöbəsi (ədəbiyyat və ictimaiyyat; təbiyyat) fəaliyyət göstərirdi. Qəzalardan instituta oxumaq üçün göndərilənlərin səviyyələri çox aşağı olduğuna görə, onlar hazırlıq şöbəsində oxumalı olurdular. İlk illər hazırlıq şöbəsində oxuyanların sayı ixtisas şöbələrində təhsil alanların sayından bir neçə dəfə çox idi. Məsələn, 146 nəfər tələbədən yalnız 31 nəfəri ixtisas şöbələrində, 115 nəfəri (1-ci qrup - 29, 2-ci qrup - 42, 3-ci qrup - 44) isə hazırlıq qruplarında oxuyurdu[31].

Ali Pedaqoji Qadın İnstitutunda da təhsil müddəti 3 il idi. Birinci ildə Məktəbəqədər Qadın Tərbiyə İnstitutuna 30 nəfər qadın qəbul edilmişdi ki, onların da əsas hissəsini Azərbaycan qəzalarından gələnlər təşkil edirdi. İnstitutun nizamnaməsində ali təhsil ocağına müəllim seminariyasını və ikinci dərəcəli məktəbləri bitirən qızların qəbulu nəzərdə tutulsa da, ilk illərdə orta təhsilli azərbaycanlı qızların az olması səbəbindən 1 dərəcəli məktəb həcmində təhsili olanlar da qəbul edilmişdi. İnstituta ilk direktor Anna Nikolayevna Makinskaya[32] təyin olunmuşdu. Maraqlıdır ki, Ali Pedaqoji Kişi İnstitutu 6 nəfər tələbə ilə fəaliyyətə başladığı halda, Məktəbəqədər Qadın Tərbiyə İnstitutuna 30 nəfər (5 dəfə çox) tələbə qəbul edilmişdi.

Sonrakı illərdə onu A.Lukyanova və K.Ordubadskaya əvəz etdi. O dövrdə müəllim kadrları hazırlığında xüsusi xidmətləri olan Səlimə xanım Osmanzadə (o, eyni zamanda Ali Pedaqoji Kişi İnstitutunda təbiyyat-aqronomiya şöbəsinin müdiri idi), Xədicə Ağayeva, Şəfiqə Əfəndiyeva və Zəhraxanım Şahtaxtinskaya Birinci Məktəbəqədər Qadın Tərbiyə İnstitutunda çalışırdılar. İnstitutda Hüseyn Mirzəcamalov, Camo Cəbrayılbəyli, Azad Əmirov və Həmid Şahtaxtinski kimi tanınmış pedaqoqlar da dərs deyirdi. Burada çalışan 22 müəllimdən 18 nəfərinin ali təhsili var idi. Birinci Məktəbəqədər Qadın Tərbiyə İnstitutunun açılmasından bir il sonra Ali Pedaqoji İnstitutun nəzdin-

---

[31] *Azərbaycan Ali Pedaqoji İnstitutu.5 illik. (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi: **prof.F.A.Rüstəmov**). Bakı:Elm və təhsil, 2020, s.75*

[32] ***Anna Nikolayevna Makinskaya** uzun müddət Azərbaycan məktəblərində rus dili müəllimi işləyib. "Учебник по русскому языку для тюркских школ" (V.L.Arxarova ilə birlikdə), (1926), "Учебник по русскому языку для тюркских школ (V.L.Arxarova ilə birlikdə) (1927), "Учебная книга по русскому языку для тюркских школ 1-й ступени" (1927,1928), "Учебная книга по русскому языку" (1928), 3 hissəlik "Рабочая книга по русскому языку для тюркских школ" V.L.Arxarova və Şahtaxtinski ilə birlikdə) (1931), "Учебник по русскому языку" (V.L.Arxarova ilə birlikdə) (1934), "Учебник по русскому языку для талышских школ. Ч. 1" (1934), "Книга для чтения по русскому языку" (1938), "К вопросу об обучении орфографии русского языка в нерусской начальной школе" (1938), "Книга для чтения по русскому языку для 6-го класса армянской неполной средней и средней школы" (1941) dərsliklərinin və «Герои гражданской войны» (1940) kitabının müəllifidir.*


A.Lukyanova

dəki pedaqoji kurslarda oxuyan qızlar da yeni yaradılmış instituta köçürüldü. İnstitutda 45 tələbə vardı ki, onlardan da 22-si axşam oxuyurdu. Tələbələrin 90%-i ictimai vəziyyətinə görə kəndli və işçi, 10% isə kənd müəllimlərinin övladları idi.

Birinci Məktəbəqədər Qadın Tərbiyə İnstitutu 1922/23-cü tədris ilində Ali Pedaqoji Qadın İnstitutuna çevrildi.

Bununla bağlı Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri Qəzənfər Musabəyov 29 noyabr 1922-ci ildə xüsusi dekret imzalamışdı. Dekretdə deyilirdi:

”1.Bakı şəhərində mövcud olan Məktəbəqədər Tərbiyə İnstitutu türk dövlət dilində II dərəcəli məktəblər üçün qadın müəllimləri hazırlayan Ali Pedaqoji İnstituta çevrilsin.

2.Xalq Maarif Komissarlığı Kollegiyasının 13 iyun 1921-ci ildə Azərbaycan Dövlət Kişi Pedaqoji İnstitutu haqqında qəbul etdiyi nizamnamə Azərbaycan Qadın Pedaqoji İnstitutuna da şamil edilsin”.

Ali Pedaqoji Qadın İnstitutunun ilk və son direktoru Sara xanım Xuramoviç (Talışınskaya) olmuşdur.



***Sara xanım Xuramoviç (Talışınskaya)***
*(1880-1965)*

*1890-cı ildə fevralın 7-də Tiflisdə anadan olub. Rusiya İmperator Ordusunun general-mayoru Mirkazım bəy Talışxanovun qızıdır.1898-1906-cı illərdə Tiflis gimnaziyasında təhsil almışdır. Təhsilini başa vurduqdan sonra 1 il gimnaziyada zəif oxuyan uşaqlara dərs demişdir. 1907-ci ildə Tiflis şəhər idarəsi məktəblər şöbəsi onu Puşkin adına I şəhər ibtidai məktəbinə müəllim göndərir. Həmin məktəbin şagird kollektivi müxtəlif idi:4 sinifdə gürcü, 4 sinifdə isə azərbaycanlı uşaqlar təhsil alırdı. Sara xanım 1907-1915-ci illərdə həmin məktəbdə müəllim, 1915-1919-cu illərdə isə müdir vəzifəsində çalışmışdır. Tiflisdə yaşayarkən Tiflis Qadın Xeyriyyə Cəmiyyətinin fəal üzvlərindən biri olub. Cəmiyyətin xəzinədarlığına nəzarət ona həvalə olunub. Şəmistan Nəzirlinin yazdığına görə, inqilabdan əvvəl Kiyev Universitetinin hüquq fakültəsini bitirib. 1917-ci ildə Bakıda keçirilən müsəlman qadınlarının qurultayının iştirakçısı olub. 1919 -cu ildə Bakıya köçüb. 1919-cu il noyabrın 7-də Xalq Maarif Nazirliyi yanında yaradılmış islahat komissiyasına üzv seçilib. Azərbaycan müəllimlərinin III qurultayına nümayəndə seçilməsi, islahat komissiyasına daxil edilməsi onun ictimai-siyasi fəallığı və pedaqoji hazırlığı ilə bağlı idi. Sara xanımın Azərbaycan Qadın Tərbiyə İnstitutunun yaradılmasında və onun Azərbaycan Qadın Pedaqoji İnstitutuna çevrilməsində mühüm xidmətləri olmuşdur.*

*19 fevral 1965-ci ildə vəfat edib.*

1922-ci ilin yayında Azərbaycan Qadın Pedaqoji İnstitutuna daxil olmaq arzusunda olanların sayı artdı. İnstituta daxil olmaq üçün 115 nəfər ərizə vermişdi ki, müsabiqə nəticəsində onlardan 62-si (I kursa 52, II kursa 10) qəbul edildi. 1923/24-cü tədris ilində Qadın Pedaqoji İnstitutunda 104 qadın təhsil alırdı. Tələbələrin 50% -i axşam oxuyurdu. Tələbələrin sosial tərkibinə görə 75%-i kəndli, 18%-i fəhlə və 7% ziyalı övladları idi.

Pedaqoji kadr hazırlığında mühüm məsələlərdən biri də sinfi tərkibin düzgün müəyyənləşdirilməsi idi.

30-cu illərin ortalarına qədər Sovet İttifaqında tələbələrin sinfi tərkibinin tənzimlənməsinə ciddi diqqət yetirilirdi. Fəhlə və kəndli balalarına güzəşt və mükafatların verilməsi, təhsilin ödənişsiz olması, zəhmətkeş balalarına fərqləndirici təqaüdün verilməsi və s. partiya və hökumətin təhsil siyasətinin əsas istiqamətlərindən biri idi. Pedaqoji ali təhsil müəssisələrində tələbə gənclərin ictimai tərkibinə sovet və partiya rəhbər orqanları nəzarət edirdi.

Azərbaycan qəzalarında qadın təhsilinin aşağı səviyyədə olmasını nəzərə alan Xalq Maarif Komissarlığı III kursun 17 nəfər tələbəsini bir il müddətində I dərəcəli (ibtidai) məktəblərdə dərs demək üçün qəzalara göndərdi.

Ali Pedaqoji Qadın İnstitutunda müəllim kadrları hazırlığına ciddi fikir verilirdi. III kursun tələbələri ümumi dərslərdən başqa türk dilinin (Azərbaycan dilinin) tədrisi metodikası, hesabın tədrisi metodikası, təbiətin tədrisi metodikası və pedaqogika tarixi fənnini ətraflı öyrənirdilər. Bunlardan başqa hər bir tələbə türk dili (Azərbaycan dili), təbiət və hesabdan nümunə dərsləri verməli idi. İbtidai məktəblərə işləməyə göndərilən tələbələr bir ildən sonra yenidən instituta qayıdıb, II dərəcəli məktəblərdə işləmək üçün nəzərdə tutulan proqramın tələblərinə uyğun olaraq təhsillərini davam etdirirdilər. Onların yerinə isə III kursda oxuyan tələbələr göndərilirdi.

Qəzalara göndərilən ilk 17 qadın müəllimdən 2-si Bakıdan, 2-si Şamaxıdan, 4-ü Qazaxdan, 3-ü Şuşadan, 3-ü Gürcüstandan, 3-ü İrəvandan idi.

| № | Adı və familiyası | Hansı qəzadan və ya respublikadan idi |
|---|---|---|
| 1 | Axundzadə Mələk | Şamaxı |
| 2 | Atakişizadə Humay | Şamaxı |
| 3 | Eyyublu Sənubər | Qazax |
| 4 | Usubova Gövhər | Qazax |
| 5 | Tutayuq Fatma | Şuşa |
| 6 | Pinova Nəzirə | Gürcüstan-Axısqa |
| 7 | Hacızadə Tutu | Bakı |
| 8 | Xızırbəyli Şahizə | Gürcüstan-Axısqa |
| 9 | Xəlifəzadə Sürəyya | Şuşa |
| 10 | Şahtaxtlı Xədicə | Ermənistan-İrəvan |
| 11 | Sadıqzadə Şövkət | Şuşa |
| 12 | Səfərzadə Səkinə | Gürcüstan-Tiflis |
| 13 | Əlizadə Südabə | Ermənistan-İrəvan |

| | | |
|---|---|---|
| 14 | Qazızadə Güllərəc | Ermənistan-İrəvan |
| 15 | Qiyasbəyli Şirin | Qazax |
| 16 | Qiyasbəyli Müqdənisə | Qazax |
| 17 | Məhəmmədzadə Xanıman | Bakı |

## Ali Pedaqoji Kişi İnstitutunun Ali Pedaqoji Qadın İnstitutu ilə inzibati cəhətdən birləşdirilməsi

1924-1925-ci tədris ilindən həm Ali Pedaqoji Kişi İnstitutu, həm də Ali Pedaqoji Qadın İnstitutu 4 illik tədris planı ilə işə başladı. Həmin ildə Ali Pedaqoji Kişi İnstitutunda 142 tələbə oxuyurdu. Məmməd Əfəndiyevdən sonra Ali Pedaqoji İnstituta ***Həbib bəy Mahmudbəyov*** direktor təyin edildi.

İnstituta təkcə respublikamızdan deyil, həmçinin qonşu müttəfiq və muxtar respublikalardan – Orta Asiyadan, Dağıstan, Gürcüstan və Ermənistandan da gələnlər var idi. Ali pedaqoji institutun I kursuna qəza Xalq Maarif Şöbələrinin ehtiyaclarına uyğun olaraq qəbul üçün yerlər ayrılmışdı.



***Həbib bəy İbrahimxəlil oğlu Mahmudbəyov***
*(1864-1928)*

*1864-cü ildə iyun ayının 16-da Şamaxı şəhərində anadan olub. Atası İbrahimxəlil xeyirxah və maarifpərvər adam idi. O, oğlu Həbibi səkkiz yaşı olanda məhəllə məktəbinə oxumağa göndərir. Mirzə Hüseyn adlı molladan ərəb əlifbasını və Quran oxumağı öyrənən Həbib bəy Mahmudbəyovu mollaxanada verilən dini-sxolastik təlim qane etmədiyindən o, Şamaxı şəhər məktəbinə daxil olur. Şamaxı zəlzələsi zamanı məktəb tamamilə dağılır. Həbib bəy təhsilini davam etdirmək üçün Bakıya gəlir və burada realni məktəbə daxil olur. 1873-1881-ci illərdə Bakı realni məktəbində təhsil alır. Ali təhsil almaq arzusu ilə Tiflisə gedir və burada 1882-1887-ci illərdə Aleksandrovski Müəllimlər İnstitutunda təhsil alır. Haqqında danışdığımız ali məktəbə qəbul olunmaqdan ötrü dörd imtahan verilirdi: riyaziyyat, coğrafiya, rus dili (şifahi), rus dili (yazılı). Həbib bəy Mahmudbəyov imtahandan yüksək bal topladığına görə “xəzinə hesabına” instituta qəbul edilir. 1887-ci ildə H.Mahmudbəyov “Şəhər məktəbi müəllimi” adı alsa da, islam dininə mənsub olması səbəbindən* tələbə yoldaşları *S.M.Qənizadə və S.Əbdürrəhmanbəyov kimi təyinatdan kənarda qalır. S.M.Qənizadə ilə birlikdə Bakıya gəlir və burada ilk “rus-müsəlman” məktəbini açırlar.*

*Məktəbdə Həbib bəy hesab və rus dilini, S.M.Qənizadə ana dili və fars dilini tədris edirdi. Şəxsi məktəbin uğurları o qədər böyük olur ki, Bakı Duması dövlətin vəsaiti hesabına 1891-ci ildə Çəmbərəkənddə və Zərgərbazarda “rus-müsəlman” məktəbləri açır. Həbib bəy Mahmudbəyov 1-ci “rus-müsəlman” məktəbinə müdir təyin olunur. O, həm də 1889-1891-ci illərdə Mixaylovski Bakı şəhər məktəbində müəllim işləyir. 1896-cı ildə rus-müsəlman kitabxanası təşkil edir. Qafqaz Təlim Dairəsinin 1905-ci il 17 sentyabr 1386 saylı əmrinə əsasən 2 sinifli şəhər məktəbinə müdir vəzifəsinə təyin olunur, 1916-cı ilə qədər həmin vəzifədə çalışır.*

15 iyul 1925-ci ilin məlumatına görə, qəzalar və digər respublikalar üçün 80 yer ayrılmışdı ki, onların da 40-ı kişilər, 40-ı isə qadınlar üçün nəzərdə tutulmuşdu. Yerlər belə müəyyənləşdirilmişdi:[33] Qazax - 6 nəfər (3 kişi, 3 qadın ), Gəncə - 8 nəfər (4 kişi, 4 qadın), Ağdaş - 4 nəfər (2 kişi, 2 qadın), Nuxa - 8 nəfər (4 kişi, 4 qadın), Cəbrayıl - 4 nəfər (2 kişi, 2 qadın), Şamxor (Şəmkir) -2 nəfər (1 kişi, 1 qadın), Şamaxı - 4 nəfər (2 kişi, 2 qadın), Kürdüstan - 2 nəfər (1 kişi, 1 qadın), Naxçıvan MSSR-3 nəfər (1 kişi, 2 qadın), Salyan – 4 nəfər (2 kişi, 2 qadın), Lənkəran - 4 nəfər (2 kişi, 2 qadın), Zaqatala -2 nəfər (1 kişi, 1 qadın), DQMV- 2 nəfər (1 kişi, 1 qadın ), Ağdam - 4 nəfər (2 kişi, 2 qadın), Göyçay - 4 nəfər (2 kişi, 2 qadın), Gürcüstan -2 nəfər (1 kişi, 1 qadın), Ermənistan- 4 nəfər (2 kişi, 2 qadın), Dağıstan MSSR - 2 nəfər (1 kişi, 1 qadın), Türkmənistan SSR -2 nəfər (1 kişi, 1 qadın), Özbəkistan SSR- 2 nəfər (1 kişi, 1 qadın).

1924/25-ci tədris ilində Ali Pedaqoji Kişi İnstitutunun 27 nəfərdən ibarət ikinci buraxılışı oldu. Ümumiyyətlə, üç buraxılışda(1923/24-cü ildə 28 nəfər; 1924/25-ci ildə 27 nəfər; 1925/26-cı ildə 56 nəfər) institutda 111 nəfər yüksək ixtisaslı müəllim kadrları hazırlanıb Xalq Maarif Komissarlığının sərəncamına göndərilmişdi. Məzunlardan 26-sı dil-ədəbiyyat, 46-sı təbiyyat, 39-u riyaziyyatçı idi.

1925/26-cı tədris ilində institutda tarix-ədəbiyyat, təbiyyat-aqronomiya və fizika-riyaziyyat şöbələri vardı. Həmin tədris ilinin əvvəlində tarix-ədəbiyyat şöbəsi iki müstəqil şöbəyə *ədəbiyyat* və *tarix* şöbələrinə ayrıldı. Tarix-ictimaiyyat şöbəsinin dekanı vəzifəsinə *prof.Əziz Ubaydulin,* Tarix-ədəbiyyat şöbəsinə *prof.İsmayıl Hikmət* təyin edilmişdi. Həmin dövrdə institutda tələbələrin sayı 172 nəfərə çatmışdı. Onlardan 119 nəfəri kəndli, 40 nəfəri fəhlə, 13 nəfəri isə ziyalı övladı idi.

İnstitutun pansionatında (yataqxanasında) yaşayan tələbələrin sayı ildən-ilə artırdı. 1925-ci ildə pansionatda yaşayan tələbələrdən 125-i Azərbaycandan,12-si Dağıstandan, 9-u Özbəkistandan, 3-ü Türkmənistandan, 2-si Şərqi Türkmənistan, 8-i Krımdan, 3-ü Ermənistandan, 1-i isə Gürcüstandan idi[34].

1925-1926-cı tədris ilində Ali Pedaqoji Qadın İnstitutunda 137 nəfər tələbə təhsil alırdı.

Həmin dövrdə institutda direktor vəzifəsində ***Şarif Əhmədzyanoviç Manatov*** çalışırdı.

***Şarif Əhmədzyanoviç Manatov***
*(1887-1936)*



*20 oktyabr 1887-ci ildə Orenburq quberniyasının Çelyabinsk vilayətinin Katay nahiyəsinin Manatovo kəndində (indi Kurqan vilayətinin Almenev rayonu ərazisində yerləşir) molla ailəsində anadan olub[35]. İlk təhsilini Ufa şəhərindəki "Haliyə" mədrəsəsində alıb, burada ərəb və fars dillərini, şəriət qayda-qanunlarını və Quran oxumağı öyrənib. Sonra təhsilini üç əsas və bir hazırlıq sinfindən ibarət olan Semipalatinski Müəllimlər Seminariyasında davam etdirib. 1910-cu ildə seminariyanı bitirib. Peterburq Psixonevroloji İnstitutunun Pedaqoji fakültəsinin Ümumi tarix ixtisasına daxil olub. Təhsil illərində tələbə dərnəklərinin fəal üzvü olub, bolşeviklərin"Ulduz"("Звез-*

[33] *АБюллетен официальных распоряжений и сообщений Наркомпроса Азерб.ССР, №6, стр.14*
[34] *Azərbaycan Ali Pedaqoji İnstitutu. 5 illik (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi **prof.F.A.Rüstəmov**). Bakı:Elm və təhsil, 2020, s.82*
[35] ***Rüstəmov F.*** *Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektorları. Bakı, Elm və təhsil, 2019, s.71-77*

*ða") qəzeti ilə əməkdaşlıq edib. 1914-cü ildə üçüncü kursda oxuyarkən təhsilini yarımçıq qoyaraq Ufada nəşr olunan "Həyat" ("Tormoş") qəzetində jurnalistlik fəaliyyətinə başlayıb. Ali təhsil almaq məqsədilə həmin il İstanbul Universitetinə qəbul olunub. Başqırdıstanın muxtariyyəti ilə bağlı mübarizə aparıb. Bu məqsədlə V.İ.Lenin və İ.V.Stalinlə görüşüb. 1917-ci ildə Başqırd hökumətinin sədri seçilib. V.İ.Leninin təklifi ilə RSFSR Xalq Komissarları Sovetinin nəzdində Rusiya müsəlmanlarının işləri üzrə komissarın sədr müavinlərindən biri olub. 1919-cu ilin yanvarında Kommunist Partiyasının yaradılmasına köməklik göstərmək məqsədilə İ.V.Stalin tərəfindən Türkiyəyə göndərilib. Ankara Kommunist Partiyasının rəyasət heyətinə seçilib, burada "Yeni dünya" qəzeti təsis edib və ona rəhbərlik edib. 1920-ci ilin payızında kommunizm ideyalarını təbliğ etdiyinə görə Ankarada həbs edilsə də, qaçmağa müvəffəq olub. Türkiyədən qayıdan Şarif Manatov Xalq Komissarları Sovetinin 21 dekabr 1920-ci il dekreti ilə Başqırdıstan MSSR-ə Millətlərin işi üzrə Xalq Komissarlığının səlahiyyətli nümayəndəsi təyin edilib.*

*1923-cü ilin mart ayında Türküstan Xalq Maarif Komissarlığının Dövlət Elm Şurasına rəhbər təyin olunub. 1923-cü ilin dekabrından 1925-ci ilin may ayınadək Başqırdıstan MSSR Xalq Maarif Komissarlığı yanında Akademik Mərkəzə rəhbərlik edib.*

*1924-cü ilin sentyabrında sovet müəssisələrinin "arzuolunmaz elementlərdən" təmizlənməsi kompaniyasında o da "millətçi" kimi işdən azad edilib. V.İ.Lenin və İ.V.Stalinlə şəxsi münasibəti nəticəsində ölüm təhlükəsindən xilas olub. Bir müddət Yaroslavl Pedaqoji İnstitutunda işləyib. Azərbaycan KP MK-nın dəvəti ilə Bakıya -Xalq Maarif Komissarlığına işə dəvət olunub. 1925-ci ildə Azərbaycan Dövlət Kişi Pedaqoji İnstitutuna direktor (rektor) təyin edilib. Bir müddət Azərbaycan KP MK-nın mətbuat şöbəsinin müdiri vəzifəsində çalışıb. Redaktorluğu ilə Bakıda "Məktəb məcmuəsi" jurnalı nəşr olunub. Dövri mətbuatda "Şuralar İttifaqının sənaye dövriyyəsi" ("Kommunist yolu",1925, №9-10),"Qızıl Şərq ölkələrində"("Dan ulduzu", 1926, №4, s.9-10),"Kəndin iki qüvvəsi" ("İqtisadi xəbərlər", 1927, №9-10, s.33-41),"Şuraların kütləvi işlərdəki təcrübəsi" ("İqtisadi xəbərlər",1927, №11-12, s.64-71) adlı məqalələrlə çıxış edib.*

*1925-1931-ci illərdə Zaqafqaziya Kommunist İnstitutunda "Bolşevizmin və leninizmin tarixi" fənnindən mühazirələr oxuyub, Zaqafqaziya Partiya Vilayət Komitəsinin təbliğat-təşviqat şöbəsinə rəhbərlik edib. 1926-cı il fevralın 26-dan martın 6-dək Bakıda keçirilən Birinci Türkoloji Qurultayın istirakçısı olub.*

*1931-ci ildə səhhətinin pisləşməsi səbəbindən Krıma köçmək məcburiyyətində qalır. Burada o, həm müalicə olunur, həm də Simferopol Ali Kommunist Məktəbində professor işləyir, həmçinin Tarix kafedrasına rəhbərlik edir. 1 oktyabr 1932-ci ildə ÜİK(b)P MK-nın göndərişi və məşhur rus şərqşünası, akademik S.F.Oldenburqun təqdimatı ilə SSRİ Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutunun aspiranturasının "Türkiyə tarixi" ixtisasına qəbul olunur və akademik İ.Y.Kraçkovski ona elmi rəhbər təyin edilir. 9 oktyabr 1933-cü ildə Siyasi kitabxananın elmi ədəbiyyat şöbəsinə yarım ştat baş kitabxanaçı təyin edilir.Həmin ilin noyabrından aspiranturaya qəbul olunduğu üçün Siyasi kitabxanadan işdən azad edilir.1933-cü ildə SSRİ EA-nın Şərqşünaslıq İnstitutunun arxivində araşdırdığı mövzu üzərində işləyir. Səhhətində yaranmış problemlər Ş.Manatova aspiranturada təhsilini davam etdirməyə imkan vermədiyinə görə, o, 1 may 1934 -cü ildə aspiranturadan azad olundu. Qırğızıstan Pedaqoji İnistitutuna professor vəzifəsinə işə dəvət olunan Ş,Manatov Frunze şəhərinə köçür və institutda "Ümumi tarix" fənnindən mühazirələr oxuyur. Frunzedə olarkən xəstəliyi şiddətləndiyindən 1935-ci ildə Başqırdıstana müalicə olunmağa qayıdır və bir ildən sonra vəfat edir.*

1926-cı ildə institutda təhsil alan tələbələrdən 162-si axşam, 8-i gündüz oxuyurdu ki, onlardan da 11 nəfəri ziyalı ailəsindən olanlar idi. Məktəbin pansionatında yaşayan tələbələr təhsil almaqla yanaşı, həm də ictimai təşkilatlarda (Kommunist Firqəsi özəyi, LKGİ özəyi, İcraiyyə Bürosu Yeni Əlifba Dostları cəmiyyəti, Beynəlxalq İnqilabçılara Yardım cəmiyyəti, Fəhlə fakültəsi nəzdində fəaliyyət göstərən dərnəklər, qiraətxana, Lenin guşəsi və s.) çalışırdılar.

Azərbaycan SSR Xalq Maarif Komissarlığının 1925-ci ilin yanvarına olan məlumata görə, hər iki pedaqoji institutda cəmi 256 tələbə təhsil alırdı. Həmin dövrdə ölkədə fəaliyyət göstərən 13 seminariyada isə 1704 tələbə oxuyurdu. Pedaqoji institutlarda 53, seminariyalarda isə 161 nəfər müəllim çalışırdı[36].

Ali təhsilli müəllim kadrları hazırlığının vəziyyəti aşağıdakı kimi idi.

| Ali pedaqoji təhsil müəssisələri | Müəllimlərin sayı | Tələbələrin sayı | O cümlədən | | | | |
|---|---|---|---|---|---|---|---|
| | | | cinsi | | təhsil illəri | | |
| | | | kişi | qadın | I | II | III |
| Ali Pedaqoji Kişi İnstitutu | 26 | 142 | 142 | - | 56 | 57 | 29 |
| Ali Pedaqoji Qadın İnstitutu | 27 | 114 | - | 114 | 40 | 51 | 23 |
| Cəmi | 53 | 256 | 142 | 114 | 96 | 108 | 52 |

Ali Pedaqoji Kişi İnstitutunun riyaziyyat şöbəsində 29, təbiyyat şöbəsində 90, ədəbiyyat şöbəsində 23, Ali Pedaqoji Qadın İnstitutunun 2 şöbəsində 114 nəfər tələbə təhsil alırdı.

1923-1927-ci illərində Azərbaycan Ali Pedaqoji İnstitutunun məzunlarının inkişaf dinamikası aşağıdakı kimi olmuşdur.

| Tədris illəri | Məzunlar | | |
|---|---|---|---|
| | Ümumi buraxılış | Kişi | Qadın |
| 1923-1924 | 47 | 28 | 17 |
| 1924-1925 | 28 | 28 | - |
| 1925-1926 | 55 | 55 | - |
| 1926-1927 | 78 | 62 | 16 |

1920-1927-ci illərdə Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsində 389, pedaqoji ali təhsil müəssisələrində (Ali Pedaqoji Kişi İnstitutu və Ali Pedaqoji Qadın İnstitutu) isə 198 nəfər ali təhsilli müəllim hazırlanmışdı[37]. 587 nəfər ali təhsilli müəllimdən 212 (36%) nəfəri azərbaycanlı idi ki, onların da 4,6 %-ni (27 nəfəri) azərbaycanlı qadınlar təşkil edirdi.

*[36] Azərbaycan Respublikasının Dövlət Arxivi. F.57, siy.1, iş.338, v.92*
*[37] Azərbaycanda xalq maarifi (1920-1927). Bakı, Azərbaycan XMK, 1928, s.24.*

1925-1926-cı tədris ilində Azərbaycan Dövlət Universitetində 2069 tələbənin təhsil-tərbiyəsi ilə 272, Ali Pedaqoji Kişi İnstitutunda 165 tələbənin təhsil-tərbiyəsi ilə 32, Ali Pedaqoji Qadın İnstitutunda 137 tələbənin təhsil-tərbiyəsi ilə 36 nəfər professor-müəllim məşğul olurdu[38].

1926-cı ilin dekabrın 1-nə olan məlumata görə, 2 ali pedaqoji institutda 302 tələbə təhsil alırdı ki, onlardan da 165-i kişi, 137-si qadın idi. Tələbələrin 95%-i azərbaycanlı idi.

Hər iki ali təhsil müəssisəsi Azərbaycan Dövlət Universitetinə birləşdirildikdən sonra tələbələrin ümumi sayı 1802 nəfərə çatdı ki, bu da Azərbaycan Politexnik İnstitutunda (indiki Azərbaycan Neft və Sənaye Universiteti) (2803 tələbə), Azərbaycan Dövlət Konservatoriyasında (524 tələbə), Ali Rəssamlıq Məktəbində (164 tələbə) (1927-ci ilin oktyabrında onun əsasında Azərbaycan rəssamlıq məktəbi təşkil olunmuşdu) oxuyan 5293 tələbələrin 34%-ni təşkil edirdi[39].

1925-1926-cı tədris ilində Ali Pedaqoji İnstitutun 53 nəfərdən ibarət üçüncü, 1926-1927-ci tədris ilində 76 nəfərdən ibarət dördüncü buraxılışı oldu. Sonuncu buraxılışın məzunlarının 18 nəfəri ədəbiyyat, 24 nəfəri təbiyyat, 17 nəfəri riyaziyyat, 16 nəfəri isə tarix-ictimaiyyat şöbəsini bitirmişdi. Bu, Ali Pedaqoji İnstitutun son buraxılışı oldu.

1926-1927-ci illərdə institutda direktor vəzifəsində ***Cəlil Məmmədzadə*** işləmişdir.



***Cəlil Məmməd oğlu Məmmədzadə***
*(1888-1934)*

*1888-ci ildə Şuşada tacir ailəsində anadan olub. 7 yaşında məhəllə məktəbinə gedən Cəlil Məmmədzadə (bəzi mənbələrdə Məhəmmədzadə yazılır, əslində onun ilk soyadı Sadıqov olub) iki il müddətində burada oxumağı, yazmağı və hesabı öyrənib, sonra təhsilini Şuşa realni məktəbində davam etdirib. Sonralar tərcümeyi - halında yazırdı:"Realni məktəbin 5-ci sinfində oxuyana qədər çox az dini bilgim, bir az da təsərrüfatla bağlı bacarığım var idi. 5-ci sinifdə oxuyanda özünətəhsillə məşğul olmağa başladım. Məqsədim Gəncə gimnaziyasında oxumaq idi. İki il Gəncə gimnaziyasında oxuduqdan sonra Kiyev gimnaziyasına köçürüldüm. Həmin illərdə ailəmizin maddi vəziyyəti kəskin şəkildə pisləşmişdi. Gimnaziyada oxuduğum 3 il müddətində onlar mənə maddi kömək edə bilmədilər. Müstəqil yaşamağa və işləməyə başladım". O dövrdə ailənin bütün çətinlikləri onun üzərinə düşmüşdü. Həyat yoldaşının, kiçik qardaşının və atasının Kiyevə -onun yanına göndərdiyi qohumlarının qayğısına qalmaq da ona həvalə olunmuşdu.*

*Kiyev gimnaziyasını bitirən C.Məmmədzadə Kiyev Politexnik İnstitutuna daxil olur. Burada o, mühəndis-texnoloq ixtisasına yiyələnməklə yanaşı, həm də fərdi dərslər verməklə pul qazanır. Onun 9 illik gimnaziya, 5 illik ali təhsili vardı.1920-ci ildə Bakıya gəlir, Azərbaycan SSR Siyasi İdarənin nəzdindəki mədəniyyət şöbəsinin müdiri vəzifəsində (iyun 1920 -dekabr 1920) çalışır. Eyni zamanda partiya kurslarının mühaziraçisi kimi 120 nəfərin siyasi hazırlıq keçməsində mühüm rol oynayır. Rus və ukrayna dillərini mükəmməl bildiyindən partiya siyasi kurslarında inqilab hərəkatının tarixindən, siyasi iqtisadın əsaslarından mühazirələr oxuyur. 17 iyul 1920-ci ildə bolşevik partiyası sıralarına qəbul edilir. 5 dekabr 1920-ci ildən 5 noyabr 1921-ci ilə kimi xalq ictimai təminat komissarının şəxsi katibi olur. 1921-ci ilin fevralında Rusiya ilə ictimai təminatla bağlı əlaqələri genişləndirmək məqsədilə Moskvaya, oradan isə ailəsini Bakıya gətirmək üçün Kiyevə ezam olunur. 1923-cü ildə*

[38] *Azərbaycan Respublikasının Dövlət Arxivi. F.57,siy.1,iş. 456,v.77*
[39] *Azərbaycan Respublikasının Dövlət Arxivi.F.57,siy.1,iş.423,v.88*

*Azərbaycan K(b)P MK-nın Bakı şöbəsinin katibinin müavini təyin edilir. Bir müddət Xalq Komissarları Sovetində işlər idarəsində çalışır. 1923-1928-ci illərdə Azərbaycan Xalq maarif komissarının müavini vəzifəsində çalışır. Həmin dövrdə onunla birlikdə Kiyevdə təhsil alan Mustafa Quliyev (o, Kiyev Müqəddəs Vladimir Universitetində oxumuşdu) Xalq maarif komissarı idi.*

*Azərbaycan Dövlət Universitetinə V.İ.Leninin adının verilməsi haqqında Xalq Maarif Komissarlığı kollegiyasının 23 yanvar 1924-cü ildə keçirilən növbədənkənar iclasının protokolunu Xalq maarif komissarının müavini kimi C.Məmmədzadə və kollegiyanın katibi O.Cəlalbəyov imzalamışdır. 1925-ci ildə Bakıda keçirilən Azərbaycan müəllimlərinin IV qurultayında I-II dərəcəli məktəblərdə latın əlifbasının tətbiqi ilə bağlı xalq maarif komissarının müavini kimi geniş məruzə etmişdir. 1924-1926-cı illərdə o, "Maarif və mədəniyyət" jurnalının məsul katibi (redaktoru), "Azərnəşr"in direktoru, teatr idarəsinin sədri olub. 1926-1927-ci illərdə Ali Pedaqoji İnstitutun direktoru olub. İnstitut ADU-nun Pedaqoji fakültəsinə birləşdiriləndən sonra həmin fakültənin dekanı olub.*

*1929-1932-ci illərdə Gəncə dairə Partiya Komitəsində təşkilat şöbə müdiri kimi şəhərdə gedən tikinti və yenidənqurma işlərinə rəhbərlik edib. 1932-1934-cü illərdə ASŞC MQQ -İKM ictimai-mədəni qrupun rəhbəri vəzifəsində və Şura Kontrolu Komissiyasının müvəkkili aparatında çalışıb.*

*1922-1924-cü illərdə Azərb.K(b)P Şəhər Komitəsinin üzvü, 1923-1928-ci illərdə Bakı Şurasının üzvü, 1932-ci ildən Azərb.K(b)P MK Plenumu və Prezidiumu, Azərbaycan Sovet Şuralar Cəmiyyəti Xalq Komissarları Şurasının, Xalq Maarif Komissarlığı Kollegiyasının üzvü olub.*

Həmin illərdə institutun formalaşdırılması, demək olar ki, başa çatmışdı. İldən-ilə instituta qəbul olunan tələbələrin və məzunların sayı artırdı. Bütün ixtisaslar üzrə mühazirə, seminar və laboratoriya məşğələləri aparmağa qabil pedaqoji heyət formalaşmışdı. Ali Pedaqoji İnstitutunun 1925/26-cı tədris ilində fizika-riyaziyyat şöbəsini 21, tarix-ədəbiyyat şöbəsini 15, təbiyyat-aqronomi şöbəsini 19 nəfər bitirmişdir.

| № | Adı və familiyaları | Hansı şöbənin məzunu olub | Hansı qəza və ya respublikadandır | Gündüz və ya axşam |
|---|---|---|---|---|
| 1 | Sahib Hüseynzadə | Fizika-riyaziyyat | Lənkəran | axşam |
| 2 | Həsən Həsənzadə | Fizika-riyaziyyat | Ağdam | " " |
| 3 | Mehdi Mehdizadə | Fizika-riyaziyyat | Cəbrayıl | " " |
| 4 | Mustafa Cabbarzadə | Fizika-riyaziyyat | Nuxa | " " |
| 5 | Mustafa İsmayılzadə | Fizika-riyaziyyat | Ağdaş | " " |
| 6 | Müseyib Qasımzadə | Fizika-riyaziyyat | Gəncə | " " |
| 7 | Hüseyn Həmidzadə | Fizika-riyaziyyat | Gəncə | " " |
| 8 | Rəsul Rəhimli | Fizika-riyaziyyat | Şamaxı | " " |
| 9 | Firidun Mahmudbəyli | Fizika-riyaziyyat | Şamaxı | " " |

| | | | | |
|---|---|---|---|---|
| 10 | Rizvan Kaşizadə | Fizika-riyaziyyat | Nuxa | “ “ |
| 11 | Əlişah Məhəmmədov | Fizika-riyaziyyat | Nuxa | “ “ |
| 12 | Səfər Ramazanov | Fizika-riyaziyyat | Lənkəran | “ “ |
| 13 | Tofiq Ağayev | Fizika-riyaziyyat | Şamaxı | “ “ |
| 14 | Kərim Kərimzadə | Fizika-riyaziyyat | Göyçay | “ “ |
| 15 | Hacıbala İsmayılzadə | Fizika-riyaziyyat | Göyçay | “ “ |
| 16 | Sadıq İbrahimzadə | Fizika-riyaziyyat | Göyçay | “ “ |
| 17 | Soltan Ağazadə | Fizika-riyaziyyat | Göyçay | “ “ |
| 18 | Bəhmən Məhəmmədzadə | Fizika-riyaziyyat | Şuşa | “ “ |
| 19 | Əli Əşrəf Hacızadə | Fizika-riyaziyyat | Nuxa | “ “ |
| 20 | Abasi Abbaszadə | Fizika-riyaziyyat | Təbriz | gündüz |
| 21 | Ziya Azaqbəyli | Fizika-riyaziyyat | Nuxa | “ “ |
| 22 | Məhəmmədbağır Əlizadə | Təbiyyat aqronomi | Göyçay | axşam |
| 23 | İdris Musazadə | Təbiyyat-aqronomi | Gəncə | “ “ |
| 24 | Hacı Hacızadə | Təbiyyat-aqronomi | Gəncə | “ “ |
| 25 | Əmin Abdullazadə | Təbiyyat-aqronomi | Şamaxı | “ “ |
| 26 | Yusif Məhəmmədzadə | Təbiyyat-aqronomi | Göyçay | “ “ |
| 27 | Yəhya İsmayılzadə | Təbiyyat-aqronomi | Göyçay | “ “ |
| 28 | Musa Əfəndizadə | Təbiyyat-aqronomi | Ağdaş | “ “ |
| 29 | Zahid Əlizadə | Təbiyyat-aqronomi | Nuxa | “ “ |
| 30 | Həsən Əfəndizadə | Təbiyyat-aqronomi | Nuxa | “ “ |
| 31 | Zahid Həmidzadə | Təbiyyat-aqronomi | Nuxa | “ “ |
| 32 | Ədhəm Əfəndizadə | Təbiyyat-aqronomi | Nuxa | “ “ |
| 33 | Əsəd Cəfərzadə | Təbiyyat-aqronomi | Naxçıvan | “ “ |
| 34 | Yusif Məhəmmədəlizadə | Təbiyyat-aqronomi | Ordubad | “ “ |

| | | | | |
|---|---|---|---|---|
| 35 | Ədhəm Mustafazadə | Təbiyyat-aqronomi | Nuxa | " " |
| 36 | Səfərəli Mustafazadə | Təbiyyat-aqronomi | Ağdaş | " " |
| 37 | Həsən Musazadə | Təbiyyat-aqronomi | Türküstan | " " |
| 38 | Həmid Osmanzadə | Təbiyyat-aqronomi | Krım | " " |
| 39 | Kəlam Əbdülhəmidzadə | Təbiyyat-aqronomi | Krım | " " |
| 40 | Kərim Kərimzadə | Təbiyyat-aqronomi | Ağdam | " " |
| 41 | Məhəmməd Əliəkbərzadə | Tarix-ədəbiyyat | Lənkəran | " " |
| 42 | Mikayıl Rzaquluzadə | Tarix-ədəbiyyat | Bakı | " " |
| 43 | Ağamirzə Axundzadə | Tarix-ədəbiyyat | Bakı | " " |
| 44 | Əli Hüseynzadə | Tarix-ədəbiyyat | Bakı | " " |
| 45 | Əhəd Məhəmmədyarlı | Tarix-ədəbiyyat | Quba | " " |
| 46 | Məhəmməd Teymurxanlı | Tarix-ədəbiyyat | Quba | " " |
| 47 | Hüseyn Körükçü | Tarix-ədəbiyyat | Krım | " " |
| 48 | Osman Toplu | Tarix-ədəbiyyat | Krım | " " |
| 49 | Şamil Vəzirov | Tarix-ədəbiyyat | Cəbrayıl | " " |
| 50 | Zülfüqar Abdullahzadə | Tarix-ədəbiyyat | Şuşa | " " |
| 51 | Saleh Məhəmədzadə | Tarix-ədəbiyyat | Ağdaş | " " |
| 52 | Bəktaş Heydərzadə | Tarix-ədəbiyyat | Daşkənd | " " |
| 53 | Məhəmməd Əkbərov | Tarix-ədəbiyyat | Türkmənistan | " " |
| 54 | Tələt Talıbzadə | Tarix-ədəbiyyat | Tiflis | gündüz |
| 55 | Cavad Axundzadə | Tarix-ədəbiyyat | Bakı | " " |

1924-1927-ci illərdə Pedaqoji İnstitutu 187 nəfər yüksək ixtisaslı müəllim bitirmişdir. Həmin məzunların xeyli hissəsi sonralar görkəmli elm və mədəniyyət xadimləri kimi şöhrət qazandılar.

Ali Pedaqoji İnstitutun nəzdində fəaliyyət göstərən A.Şaiq "Nümunə məktəbi" yüksək ixtisaslı müəllim kadrları hazırlığında mühüm rol oynamışdır.

## Ali Pedaqoji İnstitutun nəzdindəki A.Şaiq "Nümunə məktəbi"nin fəaliyyəti



*Nümunə məktəbinin müəllimlər şurası*

Azərbaycan Xalq Cümhuriyyəti dövründə milliyyətindən, dini mənsubiyyətindən və cinsindən asılı olmayaraq, bütün vətəndaşlara bərabər hüquq verildi, ümumi, pulsuz, icbari təhsil elan olundu. Hökumətinin 28 avqust 1918-ci il tarixli qərarına əsasən bütün məktəblərdə Azərbaycan dilinin məcburi tədrisi qanuniləşdirildi. O dövrdə Azərbaycanda ana dilində orta məktəb yox idi. Ana dili o dövrün orta təhsil ocağı sayılan realni məktəblərində həftədə bir-iki saat keçirilən məcburi olmayan fənn hesab olunurdu. İlk dəfə orta təhsilin milliləşdirilməsi Xalq Cümhuriyyəti dövründə həyata keçirildi ki, bu da A.Şaiqin adı ilə bağlıdır. Məhz onun təşəbbüsü ilə bütün dərslər rus dilində keçirilən Bakı I realni məktəbinin nəzdində Azərbaycan dili üzrə üç aylıq kurs açıldı. Bu kursu qurtaran şagirdlər üçün Bakı I realni məktəbində bütün dərslər Azərbaycan dilində keçirilən bir sinif (üçüncü sinif) təşkil olundu. Abdulla Şaiq, Camo Cəbrayılbəyli, Ağa Əli Qasımzadə, Qafur Rəşad və realni məktəbin məzunları Sadiq Quluzadə, Qulam Əli Həsənzadə və Abdulla Abaşidze iştirakı ilə realni məktəbin 8 sinfi (1 əlifba şöbəsi, 2 birinci ehtiyat şöbəsi, 2 ikinci ehtiyat şöbəsi, 2 birinci sinif, 1 ikinci sinif) milliləşdirildi. O dövrdə Bakı I realni məktəbin direktoru təcrübəli pedaqoq İvan Viktoroviç Denfer idi. A.Şaiq həmin məktəbin ana dili müəllimi idi. Təlimin ana dilində aparılacağı sinfin təşkili, ayrı-ayrı fənlərdən Azərbaycan dilində dərs deyə biləcək müəllimlərin tapılması A.Şaiqə həvalə olunmuşdu. 1919-cu ildə realni məktəbdə 9 Azərbaycan və 12 rus sinfi var idi. Bu siniflərin içərisində milliləşdirilən son üçüncü sinif "əxlaq və müvəffəqiyyətcə"[40] birincilik qazanmışdı. Müəllimlər şurasında çıxış edən sinif mürəbbisi Abdulla Şaiq III sinfin müvəffəqiyyəti haqqında danışdıqdan sonra dedi: "Əxlaqları haqqında (III sinfin şagirdləri nəzərdə tutulur) kimsədən bir şikayət eşitmədim. Tələbələrdən məmnun qalmayan müəllimlər varsa söyləsinlər". Fransız dili müəllimi Qaplanova, alman dili müəllimi Barzak da "biz bu sinfi nümunə görüyor və heç bir fənalığa təsadüf etmirik"- dedilər. Məktəbin müdiri və digər çıxış edənlər də Abdulla Şaiqin fikrini təsdiq etdilər. İlk milli sinif belə yarandı. Azərbaycan Xalq Cümhuriyyətini devirən bolşeviklər realni məktəbin

[40] *"Ali Pedaqoji İnstitutun salnaməsi" (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi **prof.F.A.Rüstəmov**). Bakı:Elm və təhsil, 2020, s.71*

binasını da müsadirə edərək əsgər kazarmasına çevirdilər. İlk milli məktəb (sinif) binasız qaldı. Abdulla Şaiqin və həmkarlarının ciddi səyi nəticəsində milli məktəb (sinif) müvəqqəti olaraq 4-cü qız məktəbinin binasına köçürüldü. Dərslər həmin məktəbdə nahardan sonra keçirilirdi. Məktəb orada bir il fəaliyyət göstərdi. Sovet hakimiyyətinin ilk illərində həmin məktəb iki yerə ayrıldı. Məktəbin aşağı sinifləri birinci dərəcəli məktəbə çevrilərək 9 saylı, III sinifdən yuxarılar isə II dərəcəli məktəbə çevrilərək 12 saylı məktəb statusu aldı.

1922-1923-cü tədris ilində 12 saylı məktəb Fətulla bəy Rzabəyli tərəfindən Ali Pedaqoji Kişi İnstitutunun binasına köçürüldü və burada Nümunə məktəbi kimi fəaliyyət göstərməyə başladı. 1924-cü ildə Xalq Maarif Komissarlığının Baş ictimai tərbiyə idarəsi tərəfindən məktəbə onun yaradıcısı və cəfakeşi A.Şaiqin adı verildi. İlk vaxtlar məktəbə A.Şaiq rəhbərlik edirdi. Sonra məktəbə coğrafiya və təbiət fənlərini tədris edən Qafur Əfəndizadə müdir təyin olundu.

**Qafur Sədrəddin oğlu Əfəndizadə**
**(Qantəmir)**
(1888-1937)



*1888-ci ildə Göyçay qəzasının Potu kəndində anadan olub. Mədrəsə müəllimi olan Qafurun atası Sədrəddin Əfəndi dövrünün tanınmış ziyalılarından biri olub. Sədi Salis təxəllüsü ilə şeirlər yazıb. Qafur ilk təhsilini atasının müəllim işlədiyi mədrəsədə alıb.1905-ci ildə Göyçaya gələrək təhsilini İbrahim Həqqinin yeni üsullu məktəbində davam etdirib. 1908-1910-cu illərdə Göyçayda müəllim işləyib.1910-1914-cü illərdə İstanbul Universitetinin Tarix-filologiya fakültəsində oxuyub. Qantəmir imzasını da Türkiyə mühitində yaşayarkən götürüb.1915-ci ildə Bakıya dönərək yeni açılan "İqbal" məktəbində müəllim işləyib. 1916-cı ildə "Nəşri-maarif" cəmiyyətinin Qubada açdığı məktəbə müdir təyin olunub. 1920-1921-ci illərdə Göyçayda müəllim hazırlamaq məqsədilə yaradılan qısamüddətli pedaqoji kurslara rəhbərlik edib. Ali Pedaqoji İnstitutun nəzdində fəaliyyət göstərən Şaiq adına II dərəcəli "Nümunə məktəbi"nə rəhbərlik edib. Nümunə məktəbi Abdulla Şaiq adına Pedaqoji Texnikuma çevriləndə onun direktoru təyin edilib. O, müəllimlikdən ayrılmadan Azərbaycan Dövlət Universitetinin Tibb fakültəsinə (diş həkimliyi) daxil olub və 1929-cu ildə oranı bitirib.30-cu illərdə Bakıda ictimai-siyasi həyatda və ədəbi aləmdə yersiz qarayaxmalar, qarşılıqlı ittihamlar, şərləmələr baş verəndə o, Ağsu rayonuna köçüb və burada diş həkimi kimi fəaliyyət göstərib."Ağıl dəryası"(1930),-"Şarlatan"(1934), "Kolxozstan"(1935),"Seçilmiş hekayələr" (1964, 1972)kitabları nəşr olunub.*

*16 fevral 1938-də həbs edilərək 8 il müddətinə Özbəkistanın Cizak vilayətinə sürgün edilib. 28 yanvar 1944-cü ildə sürgündə olarkən dünyasını dəyişib.*

"Nümunə məktəbi" Ali Pedaqoji İnstitutun tələbələrinin tədris laboratoriyası rolunu oynayırdı. Son kurs tələbələri "Nümunə məktəbi"ndə müəllimlərinin rəhbərliyi ilə sınaq dərsləri deyirdilər. Həmin məktəbdə sınaq dərsi keçən Hacıbala Hacıyev (sonralar ADPU-nun dosenti) xatirələrində yazırdı:"Tətbiqat –Şaiq məktəbi" canlı laboratoriya kimi ali təhsilli müəllim kadrlarının hazırlanmasında böyük rol oynayırdı"[41]. Bu məktəbin ali təhsilli müəllim kadrları hazırlığında mühüm xidmətləri olmuşdur.

A.Şaiq "Nümunə məktəbi" nin ilk buraxılışı 1924-cü ildə olub. Azərbaycan dilində II dərəcəli məktəbi bitirmək şərəfi ilk dəfə adları aşağıda göstərilən 27 nəfər şagirdə nəsib olub.

[41] *Hacıyev H. Üç fakültədən biri."Gənc müəllim" qəzeti, 29 aprel 1971*

| № | Adı və familiyaları | Hansı qəzadan və ya respublikadandır |
|---|---|---|
| 1 | Ağazadə Soltan | Göyçay |
| 2 | Əfəndizadə Azad | Şamaxı |
| 3 | Əfəndizadə Əli Fuad | Axısqa (Gürcüstan) |
| 4 | Əfəndizadə Adil | Axısqa (Gürcüstan) |
| 5 | İbrahimzadə Şirəli | Göyçay |
| 6 | İbrahimzadə Sadiq | Göyçay |
| 7 | İsmayılzadə Yəhya | Göyçay |
| 8 | Babazadə Əhməd | Bakı |
| 9 | Bədəlbəyli Əfrasiyab | Qarabağ |
| 10 | Bağırzadə Məhəmmədəmin | Bakı |
| 11 | Hacı oğlu Vəli | Bakı |
| 12 | Hüseynzadə Əbdülrəhman | Bakı |
| 13 | Süleymanzadə İsrafil | Bakı |
| 14 | Şıxəlizadə Murad | Göyçay |
| 15 | Salahlı Saleh | Bakı |
| 16 | Talıbzadə Talıb | Tiflis |
| 17 | Əlizadə Ağakazım | Bakı |
| 18 | Əlizadə Məhəmmədbağır | Göyçay |
| 19 | Aşurbəyli Davud | Bakı |
| 20 | Quluzadə Rəsul | Bakı |
| 21 | Kazımzadə Qasım | Bakı |
| 22 | Musabəyli Əmir | Şəki |
| 23 | Mustafabəyli Ədhəm | Bakı |
| 24 | Məhəmmədzadə Nəcəf | Bakı |
| 25 | Mirzəzadə Arslan | Bakı |
| 26 | Mirəhmədzadə Mir Əsədullah- | Göyçay |
| 27 | Yüzbaşıqlı Rəmzi | Şamaxı |

Məzunlardan 15-i kəndli, 7-si fəhlə və 5-i ziyalı ailəsinə mənsub idi. Həmin sinfi bitirənlərin arasında məşhur bəstəkar, musiqişünas Əfrasiyab Bədəlbəyli, istedadlı alim, cərrah Fuad Əfəndiyev, akademik Səftər Quliyev, dövlət xadimi Süleyman Vəzirov və b. vardı. Məktəbin ikinci buraxılışı 1925-ci ildə, üçüncü buraxılışı 1926-cı ildə olub. 1924-cü ildə "Nümunə məktəbi"nin quruluşu aşağıdakı kimi idi. Məktəb 4 sinifli II dərəcəli bir təhsil ocağı idi. 4 sinifdə oxuyan şagirdlərin ümumi sayı 129 nəfər idi. Bunlardan 42-si bakılı, 78-i Azərbaycanın ayrı-ayrı bölgələrindən, İrəvandan və Göyçə mahalından gələnlər idi. Kənardan gələn imkansız tələbələr Ali Pedaqoji İnstitutun pansionatında (yataqxanasında) yaşayırdı. Birinci sinifdə 40, ikinci sinifdə 36, üçüncü sinifdə 26 və dördüncü sinifdə 27 şagird oxuyurdu. Məktəbin Azərbaycan dili və ədəbiyyat müəllimləri Abdulla Şaiq və Hüseyn Sadıq idi. I-II siniflərdə Azərbaycan dili dərslərini Hüseyn Sadıq, rus dili dərslərini Səmədağa Qayıbov, III-IV siniflərdə Aleksandr Leplinski tədris edirdi. Tarix və ictimaiyyatı Süleyman Səlim, riyaziyyatı I-II siniflərdə Ziya Azaqbəyli, III-IV siniflərdə Kərim Qazıyev, triqonometriyanı son sinifdə Məhəmməd Əfəndizadə tədris edirdi. Yalnız III-IV siniflərdə tədris edilən psixologiya fənnini doktor Xəlil Fikrət, I-II siniflərdə təbiət fənnini Ali Pedaqoji İnstitutun təbiət şöbəsinin son kurs tələbəsi Neman Əfəndizadə, III-IV siniflərdə isə Məhəmməd Bayramzadə, "Hikmət" fənnini I sinifdə Xudaverdi Kələntərli (sonralar ADPU-nun professoru), II-IV siniflərdə İsmayıl Novruzi tədris edirdi. Məktəbin bütün siniflərində kimya Xudaverdi Kələntərli, coğrafiya Qafur Rəşad Mirzəzadə, alman dili İvan Viktoroviç Denfer, rəsm dərsi İvan Vasilyeviç Berinq tərəfindən tədris edilirdi. Zəruri təcrübələr Ali Pedaqoji İnstitutun laboratoriyalarında aparılırdı. Məktəbdə şagird komitəsi fəaliyyət göstərirdi. Bütün şagirdlərin iştirak etdiyi ümumi iclasda seçilən bu komitənin nəzdində ədəbiyyat, riyaziyyat və təbiət dərnəkləri fəaliyyət göstərirdi. Məktəbdə fəaliyyət göstərən Gənclər İttifaqı Ali Pedaqoji Kişi və Ali Pedaqoji Qadın institutlarının gənclər heyətilə birlikdə işləyirdi. Nümunə məktəbinin xüsusi təsərrüfat fəaliyyəti yox idi. Məktəbin bütün xərcləri (hətta müəllimlərin əmək haqqı da) Ali Pedaqoji İnstitutun təsərrüfat və maliyyə şöbəsi tərəfindən ödənilirdi.

Nümunə məktəbi 1925-ci ildə A.Şaiq adına Pedaqoji Texnikuma çevrildi. 1926-cı ildə Ali Pedaqoji İnstitutun 5 illik yubileyi münasibətilə buraxılan "Ali Pedaqoji İnstitut. 5 illik" adlı məcmuədə məktəbin müdiri Qafur Əfəndizadənin "Şaiq adına Pedaqoji Texnikum"[42] adlı məqaləsi verilib. Məqalədə yazılır: *"İki sənədən bəri pedaqoji təmayülü verilən məktəbimiz bu yıl üçüncü buraxılışını bayram ediyor. Bu yıl qurtaran 23 tələbə həm ali məktəbə girmək və həm də birinci dərəcəli məktəblərdə müəllimlik etmək haqqını haizdirlər. 4 sənədən bəri müqtədir müəllimlərinin rəhbərliyi altında ciddiyyətlə çalışan bu yavrular əcəba başqa bir mahiyyətə yeni bir hayata atılmağa hazırdırlarmı? Bu suala qısaca bir cavab verelim. Darülfünunmuzdan bizlərə qədər əks edən xəbərlərə görə Şaiq məktəbini ikmal edənlər orada birinciliyi qazanmışlardır. Tədrisat cəhətindən get-gedə təcrübəsini artıran məktəbimiz üçüncü qafilənin də orada birincilik qazanacağına iman edər. Birinci dərəcəli məktəblərdə dərs vermək*



*Nümunə məktəbinin müəllimləri və ilk məzunları*

[42] *Azərbaycan Ali Pedaqoji İnstitutu. (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi prof.F.A.Rüstəmov). Bakı:Elm və təhsil, 2020, s.80-81*

*cəhətinə gəlincə artıq 7 aydır ki, bu tələbələr şəhərimizin müxtəlif məktəblərində, müxtəlif siniflərində nümunəlik dərsi verirlər. Nümunə dərsləri müvəffəqiyyətli surətdə getmişdir"*

1926-ci ildə A.Şaiq adına Pedaqoji Texnikumu I dərəcəli məktəblərdə dərs demək hüququ qazanan 23 tələbə bitirmişdir:

| № | Adı və familiyaları | Hansı qəzadan və ya respublikadandır |
|---|---|---|
| 1 | Əsədzadə Əhməd | Salyan |
| 2 | Zərgərli Yunis | Salyan |
| 3 | Xanızadə Babazər | Salyan |
| 4 | Kərimzadə Bilal | Salyan |
| 5 | Kərim Cəmaləddin | Göyçə eli |
| 6 | Məhəmmədzadə Əliağa | Göyçə eli |
| 7 | Nəzərov Əbülqasım | Göyçə eli |
| 8 | Şirinzadə Şamil | Nuxa |
| 9 | Əhmədzadə Əli | İrəvan |
| 10 | Əbu Talibzadə Müzəffər | Ordubad |
| 11 | Aslanzadə Muxtar | Bakı |
| 12 | Bağbanzadə Cavad | İran |
| 13 | Şabanzadə Hacı Ağa | Bakı |
| 14 | Salahlı Məhəmməd Əmin | Bakı |
| 15 | Sadıqzadə Məhəmməd Sadıq | Bakı |
| 16 | Abdullazadə Cəfər | Naxçıvan |
| 17 | Abdullazadə Abdulla | Şamaxı |
| 18 | Qazizadə Marlen | İrəvan |
| 19 | Quluzadə Məhəmməd Ağa | Bakı |
| 20 | Kazımzadə Əhməd | Bakı |
| 21 | Məhəmmədzadə Rəhim | Bakı |
| 22 | Məhərrəmzadə Kərim | Şamaxı |
| 23 | Məhəmmədəli Kərimzadə | Bakı |

Həmin tələbələr ibtidai məktəblərdə dərs deməklə yanaşı, ali təhsillərini davam etdirə bilərdilər.

1926-1927-ci tədris ilində A.Şaiq adına Pedaqoji Texnikumda 123 tələbə[43] təhsil alırdı ki, bu da həmin dövrdə Azərbaycanda fəaliyyət göstərən 15 pedaqoji texnikumda oxuyan 2260 tələbənin 5,4%-ni təşkil edirdi. 1926-27-ci dərs ilində maliyyə və kadr çatışmazlığı, Ali Pedaqoji İnstitutun Azərbaycan Dövlət Universiteti ilə birləşdirilməsi nəticəsində A.Şaiq adına Pedaqoji Texnikum öz fəaliyyətini dayandırdı və yenidən II dərəcəli məktəbə çevrildi.

## Azərbaycan Ali Pedaqoji İnstitutunda tədrisin təşkili

20-ci illərdə Azərbaycan Ali Pedaqoji Kişi İnstitutunda 3 şöbə (fakültə) fəaliyyət göstərirdi:

1) Tarix-ədəbiyyat;

2) Təbiyyat-aqranomi;

3) Fizika-riyaziyyat.

**Tarix-ədəbiyyat** şöbəsində türk ədəbiyyatı tarixi, Qərb ədəbiyyatı tarixi, türk tarixi, Azərbaycan tarixi, orta əsrlər tarixi, mədəniyyət tarixi, fars dili və ədəbiyyatı, ərəb dili, ədəbiyyat və lisanı üsul tədrisi, psixologiya, pedaqogika, pedaqogika tarixi, didaktika, fəlsəfəyə giriş, tarixi materializm, rus dili və s. fənlər də tədris edilirdi. Tarix-ədəbiyyat şöbəsinin müdiri ***İsmayıl Hikmət*** idi. İsmayıl Hikmət İstanbul, Mirzə Möhsün İbrahimov Paris universitetinin məzunları idilər. İsmayıl Hikmət, əsasən, türk və Azərbaycan ədəbiyyatı fənlərini, M.M.İbrahimov isə fars dili və fars ədəbiyyatı tarixi fənlərini tədris edirdilər. İstanbul Universitetinin məzunlarından Tofiq Hikmət və Məhiyəddin, alman dili müəllimi B.Qarbulum, Kiyev Universitetinin məzunu, antropologiya və rus ədəbiyyatı müəllimi Davud Şərifli, Derped Universitetinin məzunu, alman dili müəllimi T.Qəribli də filoloji fənlərdən dərs deyirdilər. O zaman Azərbaycan ədəbiyyatı tarixinə dair Firidun bəy Köçərlinin “Azərbaycan ədəbiyyatı tarixi materialları” adlı əsərindən başqa heç bir sistemli mənbə və tədris materialı yox idi. F.Köçərlinin adı çəkilən əsəri 1925-1926-cı illərdə nəşr olundu. Lakin bu kitab da Azərbaycan ədəbiyyatı tarixini tam şəkildə əhatə etmirdi. Burada yer alan sənətkarlar daha çox XVIII-XIX əsrlərdə yaşayıb-yaradan şairlərimiz idilər. Bu sahədəki boşluğu və ehtiyacı görən İ.Hikmət bir neçə il ərzində 2 cilddən ibarət “Azərbaycan ədəbiyyatı tarixi” adlı fundamental, əhatəli və dəyərli dərslik meydana gətirdi. Bu, F.Köçərlidən sonra həmin sahədə ikinci böyük təşəbbüs idi. İlk sistemli ədəbiyyat tarixi dərsliyimiz olan “Azərbaycan ədəbiyyatı tarixi” 1928-ci ildə 2 cilddə nəşr edildi. Burada İ.Hikmət ədəbi şəxsiyyətlərlə bağlı oçerkləri tarixi-xronoloji ardıcıllıqla vermişdi. Ədəbiyyat tariximizi isə folklordan başlayıb XVII əsrə qədər oçerkçilik prinsipi ilə elmi şəkildə tədqiq və təhlil etmişdi.

1925-1926-cı tədris ilində Ali Pedaqoji İnstitutun fakültələrinin strukturunda dəyişikliklər edildi. Tarix-filoloji şöbə iki müstəqil şöbəyə ayrıldı:

1.Tarix-ictimaiyyat şöbəsi;

2.Tarix-ədəbiyyat şöbəsi.

Tarix-ədəbiyyat şöbəsinin dekanı ***İsmayıl Hikmət*** təyin olundu. Bu vaxta qədər Tarix-filoloji şöbənin dekanı prof. ***Əziz Übaydulin*** idi. Şöbə ayrılandan sonra o, Tarix-ictimaiyyat şöbəsinin dekanı təyin edildi. Tarix şöbəsində görkəmli rus alimləri P.P.Fridolin, P.Juze, A.Makovelski mühazirələr oxuyurdu. İki müstəqil şöbənin (fakültənin) yaradılmasında məqsəd, təbii ki, tədrisin keyfiyyətini daha da yüksəltmək, ixtisas fənlərinin sayını və saatlarını çoxaltmaq idi. Artıq bu illərdə ədəbiyyat şöbəsində həm tələbələrin sayı artmış, həm də təlim-tədris işlərinə bir sıra yeni və görkəmli filoloq mütəxəssislər cəlb edilmişdi. Bu illərdə B.V.Çobanzadə, İ.Hikmət, N.İ.Aşmarin, Y.V.Çəmənzəminli, H.Zeynallı, Ə.Haqverdiyev, A.Ş.Talıbzadə,

---

*[43] Azərbaycan Respublikasının Dövlət Arxivi.F.57,siy.1,iş.423,v.88*

M.K.Ələkbərli, A.Musaxanlı, M.M.İbrahimov ədəbiyyat şöbəsində çalışırdılar. Akademiklər N.Y.Marr, V.V.Bartold, A.N.Samoyloviç, İ.İ.Meşşaninov, habelə nüfuzlu professorlar Ə.S.Ubaydulin, P.K.Juze tarixçilərin və filoloqların ilk nəslinin hazırlanmasında əsl fədakarlıq nümayiş etdirirdilər.

Ədəbiyyat şöbəsində ilk illərdə ixtisasla bağlı aşağıdakı fənlər tədris edilirdi: Lisan tarixi (dil tarixi), onun şəkilləri, xüsusiyyətləri, ədəbiyyat tarixi, üsuli tədris, sərf və nəhv (morfologiya və sintaksis), üslubiyyat (stilistika), izahlı qiraət, nəzəriyati ədəbiyyə (ədəbiyyat nəzəriyyəsi), asar-i atiqə (ədəbiyyat tarixi, tarixi abidələr) və hürufiyat təhriyyatı (əlifba məsələləri).

1925-1926-cı illərdə tədris proqramında bir sıra dəyişikliklər edildi. 1 iyun 1926-cı ildə Tarix-ədəbiyyat şöbəsinin məzunu Məmməd Həmid oğlu Ələkbərova verilən 68 №-li Şəhadətnamədən aydın olur ki, təhsil illərində o, türk ədəbiyyatı tarixi, qərb ədəbiyyatı tarixi, türk tarixi, Azərbaycan tarixi, orta əsr tarixi, mədəniyyət tarixi, fars lisanı və ədəbiyyatı, ərəb lisanı, ədəbiyyat və lisanı üsul tədrisi, psixologiya, pedaqogika, pedaqogika tarixi, didaktika, fəlsəfəyə giriş, tarixi materializm və rus dili fənlərini keçmişdir. M.Ələkbərov tədris planı üzrə bütün təcrübə işlərini icra etdiyinə, nümunə dərslərini kafi dərəcədə verdiyinə, tədris planının bütün tələblərini yerinə yetirdiyinə görə, 1926-cı il may ayının 26-da İnstitut Pedaqoji Şurası ona ikinci dərəcə məktəblərdə (pedaqoji və sənaye texnikumları, fəhlə fakültələri, kəndli gənclər məktəbləri və s.) dərs demək hüququ verən Şəhadətnamə vermişdir.


*Əziz Ubaydulin (tarix-ictimaiyyat şöbəsinin dekanı)*

Göstərilən ixtisas fənlərindən əlavə ədəbiyyat şöbəsində bəzi başqa məcburi fənlər də keçilirdi. Ədəbiyyat ixtisasında praktika dərslərinin necə keçirilməsi barədə Ali Pedaqoji İnstitutun türk ədəbiyyatı tarixi və üsuli-tədris müdərrisi İsmayıl Hikmət bunları yazırdı: *”Nümunə dərsi verəcək olan ədəbiyyatçı verəcəyi dərsin konspektini hazırlamaq üçün sinif müəllimi ilə müzakirə ediyor və hazırladığı konspekti məsudə halında üsul tədrisi müəlliminə göstərərək tədqiq və islah edildikdən, izahati-lazimə alındıqdan sonra yüzünü ağartaraq hazırlayır və müəyyən zamanda konspekt üzrə dərsini veriyordu. Dərslər nəhayət, bulduqdan sonra iştirak edən bütün ədəbiyyatçılar institutun sair şöbələri əfəndilərindən arzu edənlər xaricdən dərsə iştirak edən müəllim, mürəbbi və maarif adamlarından istəyənlər, nümunə məktəbi sinif müəllimi və üsuli-tədris müəllimi hazır bulunduqları halda verilən nümunə dərsinin tənqidi və münaqişəsi yapılıyor. Dərs əsnasında görülən əksiklər söylənіyor, konspektin quruluşuna, tətbiq edilmiş, dideksiyona, üsula, müəllimin hərəkətinə, sairəyə dair iyi və fəna cəhətlər göstəriliyordu.Bu tənqidatın hazırlanacaq olan digər ədəbiyyatçılar üzərində iyi və ibrətli təsirlər buraxacağı pək təbiidir. Ədəbiyyatçılar gördükləri üsuliyyatın mövcudluğuna, ümumiliyinə rəğmən, verdikləri nümunə dərslərində müvəffəqiyyət göstəriyorlardı. Bunda da sırf şəxsi qeyrətlərinin həvəs və məslək aşiqinin böyük əsərləri (təsirləri –F.R.) vardı. Bu da gələcək üçün böyük ümidlər verə bilir. Verilən nümunə dərsləri arasında ikinci dərəcəli məktəblərdə tarix, ədəbiyyat dərsi, qiraət və izah*


*Məhəmməd Əfəndiyev (fizika-riyaziyyat şöbəsinin dekanı), İsmayıl Hikmət (tarix-ədəbiyyat şöbəsinin dekanı), Səlimə Osmanzadə (təbiyyat-aqranomi şöbəsinin dekanı)*

*dərsləri, fikrin və bədii qiymətin izahı, əski və yeni ədəbiyyatın ayrılıq nöqtələrinin izahı kimi mühümcə cəhətlərə fazlaca əhəmiyyət veriliyordu. Bilxassə verilən dərslərin elmi bir quruluşla təqib və tətbiqinə nəzər olunurdu"*[44].

İnstitutun 28 nəfər ilk məzununun 5 nəfəri Tarix-filoloji şöbəsini bitirənlər idi. Həmin tələbələr bunlardır: Bağırzadə Məhəmməd (Gəncə), Hüseynzadə Surxay (Şuşa), Şərəfəddin Seyidaləm (Türküstan-Daşkənd), Şahverdili Teymur (Lənkəran qəzası), Musaxanlı Atababa (Bakı). Bu məzunlardan A.Musaxanlı müəllim kimi institutda saxlanıldı, filologiyaya aid fənlərdən dərs deməyə başladı.

1924-1925-ci tədris ilində bir sıra fənn proqramlarında müəyyən dəyişikliklər edildi. Tədris planı bütün ixtisaslarda 4 illik oldu. Türk ədəbiyyatı tarixi, Azərbaycan ədəbiyyatı tarixi və Cahan (Dünya) ədəbiyyatı fənlərinə verilən saatların miqdarı artırıldı. Mövzularda xeyli dəyişikliklər edildi. Azərbaycan ədəbiyyatının tarixini nə vaxtdan başlamaq məsələsində də bir müəyyənlik hasil olundu. Bu işlərdə şöbənin dekanı İ.Hikmətin xüsusi rolu və əməyi var idi.

Tarix-ictimaiyyat şöbəsinin tədris planı üç hissədən ibarət idi. Birinci hissəyə ictimai həyatın dəyişməsini bildirən elmlər- *insaniyyat tarixi, türk tarixi,Azərbaycan tarixi, sənət tarixi, qədim və yeni Şərq tarixi, Şərq və Qərbdə inqilab hərəkatlarının tarixi, sosializm və kommunizm məfkurəsi və hərəkatları, tarixi təsərrüfat qurmaların tarixi, pedaqogika tarixi, ədəbiyyat tarixi* fənləri, ikinci hissəyə sosial və pedaqoji elmlər- *pedaqogika, didaktika, dialektik materializm, statistika, iqtisadi coğrafiya, etnoqrafiya,* üçüncü hissəyə dillər, *xüsusilə rus dili* daxil idi.

Şöbənin nəzdindəki "Tarix-ictimaiyyat" dərnəyi 1 və ya 2 həftədən bir toplanır, müəllimlərin və ya tələbələrin ictimai-tarixi məsələlərə dair məruzələri dinlənilirdi. Bütün dərslər Azərbaycan dilində aparılırdı. Şöbədə çalışanların 5 nəfəri ADU-nun müəllimləri idi. Təlim prosesində Bakı şəhərini dərindən öyrənmək məqsədilə tədris ekskursiyalarına və arxeoloji səyahətlərə üstünlük verilirdi.

Şöbənin nəzdində "Tarix və etnoqrafiya" muzeyi təşkil olunmuşdu. Muzeyin müdiri Atababa Musaxanlı idi. 1926/27-ci tədris ilində tarix-ictimaiyyat şöbəsini 16 nəfər: M.Hüseynov, İ.İlyasov, Nelyabyev, Şirinov, Xəlilov, Zülfüqarov, Hüseynov, Əli Məmmədov, Sutuyeva,Vəliyev, Qasımov, Həsənov, Kələntərov, Kərimov, Əsgərov və Nuriyev bitirmişdi. Həmin tələbələrə həm Ali Pedaqoji İnstitutun, həm də ADU-nun tanınmış professor-müəllimləri - prof. P.P.Fridolin, prof.Ə.Ubaydulin, prof.A.Qulyayev, prof. A.O.Makovelski, prof.B.B.Komarovski, prof. Javoronkov, Şapiro, prof.Spaski, prof.Çiçikalov, Ş.Manatov, A.S.Bukşpan, V.M.Xuluflu, A.Ağababova, Ələkbərova və b. dərs demişdir.

**Təbiyyat şöbəsi** (fakültəsi) Azərbaycan Ali Pedaqoji İnstitutun ilk fakültələrindən biri olmuşdur. Respublikada ilk kimya laboratoriyası bu fakültənin nəzdində təşkil edilmişdi. Onun yaradılmasında Sadıq Hüseynov, Xudaverdi Kələntərli və V.Q.Kutukov (laborant) iştirak etmişlər. İlk laboratoriya Pedaqoji İnstitut indiki 6 saylı məktəb-liseydə yerləşəndə qurulmuşdu. 1925-ci ildə kimya laboratoriyasında 874 ədəd cihaz var idi ki, onlardan da ikisi ən müasir mikroskop idi. 120 nəfər tələbə eyni vaxtda laboratoriyada işləyə bilərdi. 1927-ci ildə həmin laboratoriya Azərbaycan Dövlət Universitetinin binasına (ADPU-nun indiki əsas binasının 3-cü mərtəbəsindəki 12 saylı otağa) köçürüldü. Şöbənin nəzdində zəngin təbiət kabinəsi və laboratoriyası fəaliyyət göstərirdi.Təbiyyat fakültəsinin 1927-ci ilə kimi 4 buraxılışı olmuşdu:1924-cü ildə 14 nəfər, 1925-ci ildə 13 nəfər, 1926-cı ildə 19, 1927-cı ildə 34 nəfər.[45] İlk məzunlardan Vəli Axundov Şuşaya, Ağəli Əhmədbəyli Lənkərana, Əbdülrəşid Əfəndiyev və Məmməd Mədətov Şəkiyə, Hacıbala Hacıyev Gəncəyə, Mahmud Bayramov Qazaxa, Cameəkrəm Əbdizadə Qubaya, Əli Abdullayev Ağdama, Rza Rzazadə Şamaxıya, Həsən Cəfərov Göyçaya, Əbdülhəsən

[44] *Ali Pedaqoji İnstitutun salnaməsi (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi **prof.F.A.Rüstəmov**). Bakı:Elm və təhsil, 2020, s.89-90*

[45] ***Hacıyev H.** Üç fakültədən biri."Gənc müəllim" qəzeti, 29 aprel 1971*

Rəhimov və Qafur Qasımzadə Bakıya, Vahid Hacıyev Qaryaginə (Füzuli rayonuna), Neman Əfəndiyev isə Naxçıvana göndərildi. Sonralar Əbdülrəşid Əfəndiyev, Məmməd Mədətov və Hacıbala Hacıyev Xalq Maarif Komissarlığında inspektor-metodist vəzifəsinə irəli çəkildilər. Birinci buraxılışın məzunlarından Mahmud Bayramov S.Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda (indiki Azərbaycan Aqrar Universiteti), Məmməd Mədətov və Əli Abdullayev Azərbaycan Dövlət Universitetində, Hacıbala Hacıyev Azərbaycan Dövlət Pedaqoji İnstitutunda elmi-pedaqoji fəaliyyətlə məşğul olmuşlar.

İlk illərdə kimya və biologiyadan mühazirələr həm Azərbaycan, həm də rus dillərində oxunurdu. Moskva, Leninqrad və Rusiyanın başqa şəhərlərindən Bakıya dəvət edilmiş alimlər: SSRİ EA-nın müxbir üzvü K.A.Krasusski (üzvi kimya), prof. P.İ.Kuznetsov (qeyri-üzvi və analitik kimya), prof. V.İ.Tixomirov (fiziki kimya), prof.L.Q.Qurviç (kimya), prof.İ.D.Quttu (kimya), prof.A.M.Çernikov (insan və heyvan fiziologiyası) prof. N.A.Popov (insan və heyvan fiziologiyası), prof. P.Y.Rostovsev (insan və heyvan fiziologiyası), prof.A.A. Qrossheym (botanika), prof. B.S.Yelpatyevski (zoologiya) və b. mühazirələri rus dilində oxuyurdular. Laboratoriya məşğələlərini azərbaycanlı müəllimlər aparırdı. Uzun müddət kimya kafedrasına prof.P.İ.Kuznetsov rəhbərlik etmişdir.

20-ci illərdə Zoologiya kafedrasına B.S.Yelpatyevski və S.Y.Beysik, Fiziologiya kafedrasına A.M.Çernikov (1921), N.A.Popov (1922-1925) və P.Y.Rostovsev (1925-1927) rəhbərlik etmişdir. Azad Əmirov və Qasım Qənbər oğlu 1926-cı ildə Fiziologiya kafedrasına laborant qəbul edilmişdilər. Azad Əmirov 1930-1939-cu illərdə Fiziologiya kafedrasına rəhbərlik etmişdir. Respublikada fiziologiyanın Azərbaycan dilində tədrisi onların adı ilə bağlıdır.

Təbiyyat müəllimlərinin ilk dəstəsinin hazırlanmasında Fətulla bəy Rzabəyli, Mirəsədulla Mirqasımov, Sadıq Hüseynov, Səlimə xanım Osmanzadə, Azad Əmirov, Rəhim bəy Məlikov, Xudaverdi Kələntərli, Ə.İsmayılov, Abdulla Qarayev, Kamil Balakişiyev, Camo Cəbrayılbəyli, Zəhra Şahtaxtinskaya, Murtuza Əhmədli, Cümşüd Zülfüqarlı, Ə.Hacıyev, S.Quluzadə, Mirəli Axundov, Məhəmməd Mövsümzadə, Savalan Ocaqverdizadə və S.Ə.Əliyevin mühüm xidmətləri olmuşdur. Məhz bu alimlərin köməyi ilə kimya və biologiyadan ana dilində terminlər yaradıldı, botanika, kimya, zoologiya, bitki sistematikası, heyvan və insan fiziologiyası ilə bağlı ilk dərs vəsaitləri çap olundu. Fakültədə tələbələrə elmi istiqamət vermək məqsədilə biologiya dərnəyi təşkil edilmişdi. Dərnəkdə tələbələrin elmi məruzələri dinlənilir və müzakirə edilirdi.

**Fizika-riyaziyyat şöbəsi** (fakültəsi) Ali Pedaqoji İnstitutunun ilk üç şöbəsindən biri olub. Birinci tədris ilində bu şöbənin əsas fənn müəllimi Məmməd Əfəndiyev idi. İkinci tədris ilindən fizika müəllimi Rəhim Məlikov və təcrübə məşğələlərini aparmaq üçün H.V.Berq şöbəyə işləməyə dəvət olundular. Az sonra Peterburq Universitetinin Fizika-riyaziyyat fakültəsinin məzunu Bəhram Mirzəyev də Ali Pedaqoji İnstitutda pedaqoji fəaliyyətə başladı. Ali Pedaqoji İnstitutda fizikadan Azərbaycan dilində ilk mühazirəni Rəhim Məlikov və Bəhram Mirzəyev oxuyublar. Onların köməyi ilə formalaşan bu kiçik şöbə ilə respublikada fizika-riyaziyyat təhsilinin bünövrəsi qoyulub. Fizika-riyaziyyat fakültəsinin birinci buraxılışı (9 nəfər riyaziyyat-fizika müəllimi) 1924-cü ildə oldu. 3 illik tədris planında riyaziyyat ixtisasında pedaqoji və ictimai fənlərdən başqa aşağıdakı fənlərin tədrisi nəzərdə tutulurdu: kosmoqrafiya[46], cəbr, həndəsə, məsləsat[47] müstəvi və kürəvi, həndəsə-i halliyə[48], mexanika, kimya, hesab-i əsfər-i namütənahi, hesab-i təfazuli[49], hesab-i təmami, tarix, riyaziyyat, hikmət və riyaziyyatın metodikası. 1924/25-ci tədris ilində fakültə 4 illik tədris planına keçdi. Tədris planına yeni fənlər daxil edildi: analizə giriş, hesab-i tamami və hesab-i təfazulinin həndəsəyə tətbiqi, hesab-i nəzəri, əməli-i cəbr, riyazi qrafika.

---

[46] *kosmos və göy cisimlərinə aid elm*
[47] *üçbucaq*
[48] *layihə həndəsəsi*
[49] *diferensial hesab*

Fakültəni 1925-ci ildə 6 nəfər,1926-cı ildə 24 nəfər, 1927-ci ildə 17 nəfər bitirib.1926-1927-ci tədris ilində prof.A.G.Kovanko, prof.E.B.Lopuxin, prof. A.M.Ammosov, Y.Lopatinski və prof. V.İ.Tixomirov və A.A.Buxştab fakültədə dərs deməyə başladılar. İnstitutu yüksək müvəffəqiyyətlə bitirən tələbələrdən bir neçəsi riyaziyyat və fizika kafedralarında laborant saxlanıldı. Gənc milli elmi qüvvələrin təşəbbüsü ilə riyaziyyat və fizikaya aid ilk terminoloji lüğət hazırlandı. Məmməd Əfəndiyevin təklifi ilə 1921-ci ildə Yaxın Şərqdə işlənən riyazi rəqəmlərdən, elmi istilahlardan imtina edildi. İndi istifadə etdiyimiz rəqəmlərdən istifadə olunmağa başlandı. “Qütb”, “zaviyə”, “müsəlləs” kimi istilahların əvəzinə “radius”, “bucaq”, “üçbucaq” işlətmək qəbul edildi. Bu da təbii ki, təhsil və elmi əlaqələrin inkişafına təkan verdi. Ali məktəb üçün də qabaqcıl rus alimlərinin bir sıra kitabları tərcümə və çap edildi.

**Xarici dillərin tədrisi.** Ali Pedaqoji İnstitutda xarici dillərin öyrənilməsinə xüsusi diqqət yetirilirdi. Xalq Maarif Komissarlığı 1924-cü ilin aprel ayının 16-da “Xarici dil öyrənənlər üçün şəxsi kurslar haqqında əsasnamə” təsdiq etdi. Kursun əsas vəzifəsi xarici dil öyrənənlərə nəzəri bilik, praktik bacarıq vermək idi. Bir il sonra Azərbaycan Xalq Maarif Komissarlığı ölkədəki bütün ali məktəblərdə, o cümlədən Ali Pedaqoji İnstitutda Avropa dillərindən birinin öyrənilməsini vacib hesab etdi.

Ali Pedaqoji Kişi İnstitutunda fransız dilini Leninqrad Pedaqoji İnstitutunun məzunu Pismennaya, alman dilini Leninqradda pedaqoji xarici dil kursunu bitirmiş M.N.Borzuk tədris edirdi[50]. Ali Pedaqoji Qadın İnstitutunda oxuyan tələbələrin fransız və ya alman dillərindən birini seçmək hüququ vardı. Tədris planına görə I-II-III kurslarda həftədə 3 saat xarici dil dərsi keçilirdi.

## Azərbaycan Ali Pedaqoji İnstitutunda tələbə təşkilatları

Ali Pedaqoji İnstitutda müxtəlif tələbə təşkilatları və dərnəklər fəaliyyət göstərirdi. Tələbə təşkilatlarına ildə bir dəfə seçkilər keçirilirdi. 1926-cı ildə Tələbə İcraiyyə Bürosu 15 nəfərlik heyətdən ibarət idi. Onların da içərisindən 5 nəfər rəhbər seçilmişdi.

Təşkilatın strukturu aşağıdakı kimi idi:

1. Tələbə İcraiyyə Bürosu rəyasət heyəti -*sədr Məhiəddin Həmzəzadə;*

2. Mədəni-maarif komissiyası (3 nəfərdən ibarət) - *sədr Qənbər Əsgərzadə;*

3. Elm komissiyası (3 nəfərdən ibarət)- *sədr Hacıbala Əfəndizadə;*

4. Maarif xadimləri komissiyası (5 nəfərdən ibarət)- *sədr Qafar Əlimüvəffəq;*

5. Təsərrüfat komissiyası (3 nəfərdən ibarət) - *sədr Əbdüləli Sərdarlı;*

6. Təftiş komissiyası (3 nəfərdən ibarət)- *sədr İskəndər Bağbanlı;*

Mədəni-maarif komissiyasının ümumi rəhbərliyi ilə 8 dərnək təşkil olunmuşdu:

1. Ədəbiyyat dərnəyi (3 nəfərdən ibarət) - *sədr Məhəmmədiyə Əfəndizadə;*

2. Təbiyyat dərnəyi (3 nəfərdən ibarət) - *sədr Əsəd Cəfərzadə;*

3. Riyaziyyat dərnəyi (3 nəfərdən ibarət) - *sədr Rəsul Rəhimli;*

4. Pedaqogika dərnəyi (3 nəfərdən ibarət) - *sədr Ədhəm Mustafazadə;*

5. İctimaiyyat dərnəyi (3 nəfərdən ibarət) - *sədr İshaq Cəfərzadə;*

6. Həmkarlar İttifaqı dərnəyi (3 nəfərdən ibarət) - *sədr Qafar Alimzadə;*

7. İdman dərnəyi (3 nəfərdən ibarət) - *sədr Abdulla Təmrazlı.*

[50] *Azərbaycan Respublikasının Dövlət Arxivi. F.57, siy.1, iş.275, v.18*

8.Dram dərnəyi – Ali Pedaqoji İnstitutun binası fəhlə fakültəsi ilə bir yerdə olduğundan klub və teatr işi onlarla birlikdə təşkil edilirdi.

Pedaqoji İnstitutda ədəbiyyatla bağlı iki dərnək fəaliyyət göstərirdi: 1) Ədəbiyyat dərnəyi (sədr Atababa Musaxanlı); 2) Dram dərnəyi (sədr Şamil Vəzirzadə). Dərnəklərin işində bir məhsuldarlıq və fəallıq hiss olunurdu. Məsələn, Ədəbiyyat dərnəyi 1924-cü il ərzində 14 iclas keçirmiş,"Örnək" adlı divar qəzeti çıxarmış (həmin ildə qəzetin 12 nömrəsi çıxmışdı), müxtəlif ədəbi və pedaqoji mövzularda 3 mühazirə hazırlamış və onun müzakirəsini keçirmiş, tarixi abidələri görmək üçün səyahətlər təşkil etmişdi. Dram dərnəyi isə il ərzində 4-5 teatr tamaşası hazırlamışdı. Teatrın aktyor truppasına tələbələrdən ibarət həvəskar heyət cəlb edilmişdi.

Pedaqogika dərnəyinin üzvləri tərəfindən pedaqogikaya dair müxtəlif mövzularda mühazirələr oxunurdu. Məruzələr pedaqogika müəllimləri Xəlil Fikrət və B.B.Komarovskinin rəhbərliyi ilə hazırlanırdı. Mirzə Camalov tərəfindən dərnəyə pedaqogikaya dair bir neçə kitab hədiyyə edilmişdi.

Ali Pedaqoji İnstitutda təlim-tərbiyə işlərinin yüksək səviyyədə təşkilində partiya, həmkarlar və komsomol təşkilatları mühüm rol oynayırdı. Ali Pedaqoji İnstitutda müəllim və tələbələrin iştirakı ilə 1923-cü ilin yanvarında ilk partiya özəyi yaradılmışdı. İlk iclas 8 fevral 1923-cü ildə keçirilmişdi. İlk iclasda Hüseyn Qaibov, Məcid Məmmədov, Məmmmədbəşir Bəşirov, Feyzi Məmmədov, Həsən Cəfərov, Murad Tutayuq və İbrahim İbrahimzadə iştirak etmişdi. Sonrakı iclaslarda Məmməd Tahir və Süleymanzadə də iştirak etmişdi. Partiya özəyinin rəyasət heyətinə Məmməd Tahir, Məcid Məmmədov, Hüseyn Qayibov (katib) seçilmişdi. Partiya üzvlərinin və üzvlüyə namizədlərin sayı az olduğuna görə bu özəyin fəaliyyəti uzun sürmədi.

1925-1926-cı tədris ilində Pedaqoji İnstituta yeni qəbul olunan tələbələr arasında partiya üzvü və üzvlüyə namizədlərin olması partiya özəyi yaradılmasına imkan verdi.

1925-ci ilin oktyabr ayının 14-də partiya üzvlərinin Şarif Manatovun iştirakı ilə keçirilən müşavirəsində Səfər Ramazanov, Şarif Manatov, Əbdüləli Sərdalı və Müzəffər Əlizadənin Ali Pedaqoji İnstitutunda partiya özəyi yaradılması ilə bağlı Bakı Partiya Komitəsində danışıqlar aparması qərara alındı. Onların ciddi səyi və təşəbbüskarlığı nəticəsində şəhər dairə partiya komitəsinin məsul işçisi Vəliyevin iştirakı ilə 1925-ci ilin noyabr ayının 23-də Ali Pedaqoji İnstitutunda partiya özəyi yaradıldı və Bakı şəhər dairə komitəsi tərəfindən təsdiq edildi. *Səfər Ramazanov* özəyin məsul katibi təyin edildi. Özəyin 16 nəfər üzvündən 6 nəfəri partiya üzvü (onlardan da 2 nəfəri qadın idi), 10 nəfəri isə partiya üzvlüyünə namizəd idi. Partiyaçılar gənclər ittifaqının üzvləri ilə birlikdə "Leninçi pedaqoq" divar qəzeti çıxarırdılar. Məktəbdə mükəmməl "Lenin guşəsi" təşkil edilmişdi.

Ali Pedaqoji İnstitutda *Lenin Kommunist Gənclər İttifaqının* özəyi də fəaliyyət göstərirdi. 12 yanvar 1923-cü ildə təşkil olunan özəyin ilk vaxtlar 13 nəfər üzvü var idi. Özəkdə Ali Pedaqoji Kişi İnstitutunun, Ali Pedaqoji Qadın İnstitutunun və Şaiq nümunə məktəbinin tələbələri təmsil olunurdu. 1925-1926-cı tədris ilində 11 nəfərlik heyət tərəfindən idarə olunan özək xeyli genişlənmişdi. Özəyin 110 nəfər üzvü var idi ki, onlardan da 61-i üzv, 49-u namizəd idi. Özəkdə təmsil olunan qızlardan 19-u üzv və 12-si namizəd idi. Özək üzvlərinin 5-i kommunist partiyasını, 60-ı Maarif xadimləri ittifaqını təmsil edirdi. Özək üzvlərindən 28 nəfəri ictimai vəziyyətinə görə fəhlə, 49 nəfəri kəndli, 33 nəfəri qulluqçu idi. Özəyin məsul katibi *Əbdülcəlil Əsgərzadə* idi. Özəyin fəaliyyəti geniş idi. Onlar Ali Pedaqoji Qadın İnstitutunun, Şaiq adına "Nümunə məktəbi"nin və Bakı liman komsomolçularını himayə götürərək orada müxtəlif dərnəklər təşkil edir, savadsızlığı ləğv etmək üçün yorulmadan çalışırdılar. Təşkilatın işində sonralar görkəmli elm və təhsil işçiləri kimi tanınan Yusif Məmmədəliyev, Abasqulu Abaszadə, Maqsud Cavadov, T.Abdullayev kimi komsomolçular fəallıqları ilə seçilirdi.

1924-cü ildə Ali Pedaqoji İnstitutun nəzdindəki A.Şaiq "Nümunə məktəbi"ndə 35 nəfər üzvü olan pioner özəyi yaradılmışdı. Gənc pionerlər həftədə bir dəfə "Gənc nəsil" adlı divar qəzeti buraxırdılar.

Məktəbdə *təsərrüfat komitəsi* fəaliyyət göstərirdi. 5 nəfərdən ibarət olan komitə institutun bütün təsərrüfat işlərini idarə edirdi. Komitəyə direktor müavini, müəllimlərin, tələbələrin, texniki işçilərin hər



*Ali Pedaqoji İnstitutun Tələbə İcraiyyə Bürosu*



*A.Şaiq adına Pedaqoji məktəbin Tələbə İcraiyyə Bürosu*



*Ali Pedaqoji İnstitutun partiya komitəsinin üzvləri*

birindən seçilmiş 1 nümayəndə və iqtisadçı daxil idi.`Komitə institutun digər təsərrüfat işləri ilə yanaşı, həm də həftəlik yemək cədvəlini hazırlayır, bazardan zəruri ərzaq mallarının alınmasına, xörəklərin bişirilməsinə, tələbələrin qidalanmasına nəzarət edirdi.Xəstə tələbələr üçün həkimin nəzarəti altında südlü yeməklər hazırlanırdı. Xəstə tələbələrə, xüsusilə Göyçay və Ağdaş qəzalarından (həmin qəzalarda qızdırma xəstəliyi geniş yayılmışdı) gələnlərin sağlamlığına ciddi fikir verilirdi. Tələbələrə gündə 3 dəfə yemək verilirdi.

Təhsil müddətində həmin qəzadan gələn tələbələrə 30-adək iynə vurulurdu. Binanın daxilində dəlləkxana fəaliyyət göstərirdi. Ayda ən azı 2 dəfə tələbələr hamama aparılırdı.

Dövlət tərəfindən bütün tələbələrə ciddi qayğı göstərilirdi. İnstituta daxil olan tələbənin hər birinə iki cüt dəyişək, bir cüt ayaqqabı, mahuddan tikilmiş qış kostyumu, kətandan tikilmiş yay kostyumu, palto və papaq verilirdi. Bununla yanaşı, tələbələrin təminatında müəyyən çətinliklər də var idi. İnstitutun direktor müavini H.Mahmudbəyov[51] həmin çətinlikləri belə səciyyələndirirdi:1) ayaqqabı və kətandan tikilmiş kostyum yararsız hala düşdüyündən bir ilə yetmirdi; 2) yataqxanada yaşayan tələblərin qidalanması üçün gündə 45 qəpik vəsaitin ayrılması çox az idi. Belə ki, həmin dövrdə bütün təhsil müəssisələrinin (seminariya, ali məktəb) tələbələri üçün yemək xərci 45 qəpik nəzərdə tutulmuşdu. Ali Pedaqoji İnstitutda oxuyanların 90%-dən çoxunun yaş həddi 20-dən yuxarı idi. Onlar nahardan əvvəl 6-7 saat oxuyur, nahardan sonra isə 2-3 saat laboratoriyalarda işləyirdilər. 13-14 yaşlı seminariya tələbələrindən fərqli olaraq Pedaqoji İnstitutun tələbələrinin daha yüksək kalorili yeməklərə ehtiyacları vardı. 3) hər ay tələbənin müalicəsi üçün ayrılan 50 qəpik azlıq təşkil edirdi, belə ki, qızdırma xəstəliyi səbəbindən bu xərc xeyli artıq (1.25 qəpik) olurdu.4) yeməkxana qaranlıq və rütubətli zirzəmidə yerləşirdi; 5) auditoriyalar çatışmırdı; 6) tələbələr vaxtlı-vaxtında dəyişəklə, yorğan-döşək üzü ilə təmin edilmirdi; 7) istilik sistemi normal işləmirdi; 8) xəstəxana İçərişəhərin qala divarlarına bitişik tikildiyindən günəş işığı düşmürdü, qaranlıq və rütubətli olurdu.

[51] *Azərbaycan Ali Pedaqoji İnstitutu (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi **prof.F.A.Rüstəmov**). Bakı: Elm və təhsil, 2020, s.82-86*

## Azərbaycan Ali Pedaqoji İnstitutunun ilk himni və ya ”Gənclik marşı”

Ali Pedaqoji İnstitutda xor, A.Şaiq “Nümunə məktəb”ində musiqi dərnəyi fəaliyyət göstərirdi. Xorun və dərnəyin işində Ali Pedaqoji Kişi İnstitutunun, Ali Pedaqoji Qadın İnstitutunun, A.Şaiq “Nümunə məktəbi”nin, həm də həmin binada yerləşən Fəhlə fakültəsinin tələbələri iştirak edirdi. Musiqi müəllimi və bəstəkar Meyliyan rəhbərliyilə yaranan bu dərnəklər, dram dərnəyi ilə birlikdə həm institutda, həm də digər təhsil müəssisələrində musiqili tədbirlərdə iştirak edirdilər. Ali Pedaqoji İnstitutun himni - Ü.Hacıbəyovun “Gənclik marşı” da ilk dəfə həmin xorun ifasında səslənmişdi. Marşın sözlərini A.Şaiq 1921-ci ildə Ali Pedaqoji İnstitutun tələbələrinə yazmışdı. “Gənclik marşı” tələbələrin - bilik, nur və şan ordusunun, qaranlıqlarla çarpışan, onu qovan, elm, ürfan ordusunun kollektiv yürüşünü müşayiət etmək üçün nəzərdə tutulmuşdu.

**“Gənclik marşı”**

*Ali Pedaqoji İnstitutunun tələbələrinə*

Biz bilik, şan ordusu, Azərbaycan ordusu,
Qaranlıqlarla çarpışan elm, ürfan ordusu.
***
Köhnə, çürük qüvvələri parçalaylıb yıxan biz,
Şimşək kimi parıldayan, ildırım tək çaxan biz.
Daşqın, coşqun sellər kimi hər tərəfə axan biz
Bizik nurlu aləm quran azad insan ordusu.
***
Sevgi, ataş ocağıdır Azərbaycan ölkəmiz,
Şərqə, Qərbə işıq saçan, ataş yakan bizik, biz.
İgidlikdə, hər sənətdə ad çıxarmış nəslimiz,
Bizik bilik arxasınca gedən ön, şan ordusu.
***
Üstümüzdə dalğalanır nur saçaqlı bayrağımız,
Elmsizlik, istibdaddır bizim böyük yağımız.
Yorulmadan çarpışırıq ki, parlasın ocağımız
Bizik qaranlığı qovan, nur saçan dan ordusu.



*Ali Pedaqoji İnstitutun birləşmiş xor kollektivi*

## Azərbaycan Ali Pedaqoji İnstitutunun ilk yubileyi




*"Ali Pedaqoji İnstitut. Beş yıllıq" (1926)*

1926-cı ildə pedaqoji ictimaiyyətin iştirakı ilə Azərbaycan Ali Pedaqoji İnstitutunun ilk yubileyi keçirildi. Yubiley təşkilat komitəsinin sədri institutun direktoru Cəlil Məmmədzadə idi. Həmin dövrdə o, həm də Xalq maarif komissarının müavini idi. Onun təşəbbüsü ilə "Azərbaycan Ali Pedaqoji İnstitutu - 5 il (Beş illik və üçüncü buraxılış dolayısı ilə)"[52] (1926) yubiley məcmuəsi nəşr edilmişdi. Məcmuənin üz qabığında institutun yerləşdiyi binanın –indiki İqtisad Universitetinin əsas binasının şəkli verilmişdir. Mündəricatdan sonra V.İ.Leninin, N.Nərimanovun (institutun təşkilatçılarından biri kimi), Fizika-riyaziyyat şöbəsinin dekanı Məmməd Əfəndizadənin, Tarix-ədəbiyyat şöbəsinin dekanı İsmayıl Hikmətin, Təbiyyat-aqranomi şöbəsinin dekanı Səlimə Osmanzadənin, tarix-ictimaiyyat şöbəsinin dekanı Əziz Ubaydulinin şəkilləri verilmişdir. Məcmuədəki materiallar 3 bölməyə ayrılmışdı:

1) Ali Pedaqoji İnstitutun tarixçəsi;
2) idarə və təşkilati işlər;
3) xatirələr və duyğular.

Məcmuə institutun direktoru Cəlil Məmmədzadənin (Məhəmmədzadənin) *"Tədris və tərbiyə-5 il*" məqaləsi ilə açılır. Məqalədə Ali Pedaqoji İnstitutun 5 illik tarixinə qısa nəzər salınır, ikinci dərəcəli məktəblər, pedaqoji məktəblər, peşə və sənaye məktəbləri üçün ali təhsilli müəllim hazırlamaq məqsədi ilə açılan institutun ali məktəb kimi formalaşmasından bəhs edir. Sonra institutun ixtisasları, tədris laboratoriyaları, fənn kabinələri, kitabxana, tələbə kontingenti (cəmi 162 nəfər) haqqında məlumat verir. Məlum olur ki, institutda Kommunist Firqəsi Özəyi, LKGİ Özəyi, İcraiyyə Bürosu, Yeni Əlifba Dostları cəmiyyəti, Beynəlxalq İnqilabçılara Yardım cəmiyyəti, İşçi fakültəsi nəzdində fənni, ictimai və həmkarlar ittifaqları dərnəkləri, xüsusi qiraətxana, Lenin guşəsi fəaliyyət göstərir. İnstitutun fəaliyyətini təhlil etdikdən sonra C.Məmmədzadə yazır: *"Şuralar Azərbaycanının bu yolda 100% məqsədinə nail olduğunu iddia edə bilməriz, xeyr, görüləcək işlərimiz irəlidədir; bu beş yıl müddətində Darülfünun Pedaqoji fakültəsi adını qazanan Pedaqoji İnstitutunun qarşısında çox böyük və mühüm vəzifələr duruyor, bunlardan ən mühümü bu məktəbdə şura və proletar məfkurəsinin daha dərinləşməsi, tədris işlərinin qüvvətlənməsi və məktəbin fənn və ictimai həyatına aid təchizatın mükəmməlləşməsidir. Proletar və zəhmətkeş kəndli düşmənləri artıq əmin olmalıdırlar ki, bu binanın meyvələri ən yaxın bir zamanda yalnız Azərbaycan şura və zəhmət məktəblərini deyil, bəlkə Şuralar Azərbaycanına göz dikən Şərq Şura Cümhuriyyətlərinin məktəblərini də qırmızı müəllimlər ilə təmin edə biləcəkdir"*.

Məcmuədə Tarix-ədəbiyyat (İsmayıl Hikmət), Təbiyyat-aqranomi (S.Osmanzadə), Fizika-riyaziyyat (Məmməd Əfəndizadə), Tarix-ictimaiyyat (Ə.Ubaydulin) fakültələri (şöbələri), Qadın İnstitutu (S.Xuramoviç), Şaiq pedaqoji texnikumu (Q.Əfəndizadə) ilə bağlı məqalələr verilmişdir.

*"İdarə və təşkilat işləri"* bölməsində institutun təsərrüfat həyatı (Həbib bəy Mahmudbəyov), tələbə təşkilatları (M.Həmzəzadə), kommunist firqə təşkilatı (S.Ramazanov), Qadın İnstitutunda firqə işləri (Rəhimə Səlim) və komsomol təşkilatının (Ə. Əsgərzadə) 5 illik fəaliyyəti ümumiləşdirilir.

*"Xatirələr və duyğular"* bölməsində Xəlil Fikrətin müəllimlərə tövsiyələri, B.Çobanzadənin, A.Şaiqin, Ə.Novruzinin, M.İbrahiminin, E.Sərdarlının xatirə yazıları yer alıb.

Sonda isə Ali Pedaqoji İnstitutunun direktor müavini H.Mahmudbəyovun və Hüseynzadənin (katib) 1925/26-cı tədris ilində institutu bitirmiş məzunlarla bağlı tərtib etdikləri cədvəl verilmişdir.

[52] *Həmin məcmuə tərəfimizdən transliterasiya edilərək latın əlifbası ilə nəşr edilmişdir. Bax:Azərbaycan Ali Pedaqoji İnstitutu (Tərtib, transliterasiya, izahlar və ön sözün müəllifi* ***prof.F.A.Rüstəmov****). Bakı: Elm və təhsil, 2020*

Məcmuədə Xalq maarif komissarı Mustafa Quliyevin, vaxtsız vəfat etmiş ədəbiyyat şöbəsinin məzunları M.İ.Mirəhmədzadənin və Mirzə Əlinağı Rəcaninin (institutun II buraxılışı), Qadın İnstitutunun direktoru Sara xanım Xuramoviçin, Şaiq adına Pedaqoji Texnikumunun müdiri Qafur Əfəndizadənin, institutun direktor müavini Həbib bəy Mahmudbəyovun, institutun ilk direktoru Fətulla bəy Rzabəylinin, müəllim və tələbələrin 16 kollektiv şəkli verilmişdir.

Cəlil Məmmədzadə həmin məqaləsini daha geniş şəkildə "Mədəniyyət və maarif" jurnalının 1926-cı ilin 5-6 sayında nəşr etdirmişdir.

Ali Pedaqoji İnstitutun 5 il müddətində respublikada maarifin inkişafında, müəllim kadrları hazırlığında səmərəli fəaliyyət göstərməsinə, pedaqoji kadr hazırlığında elmi-pedaqoji mərkəzə çevrilməsinə baxmayaraq, bir il sonra institut Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsi ilə birləşdirildi.

## Azərbaycan Ali Pedaqoji İnstitutun ADU-nun Pedaqoji fakültəsi ilə birləşdirilməsi

1922-ci ildə Bakı Dövlət Universitetinin adı dəyişdirilərək Azərbaycan Dövlət Universiteti adlandırıldı və iki il sonra universitetdə Pedaqoji fakültə təşkil edildi. Bununla da pedaqoji təmayüllü ali təhsil müəssisələrinin Pedaqoji fakültəyə birləşdirilməsinin əsası qoyuldu. İlk dəfə Bakı Xalq Maarifi İnstitutu[53] Pedaqoji fakültə ilə birləşdirildi.[54] Bununla da Azərbaycanda ali təhsil quruculuğunda zərərli bir ənənənin əsası qoyuldu. Moskvanın 2-ci universitetinin Pedaqoji fakültə yaratmaqla bağlı təcrübəsi mexaniki olaraq Azərbaycanın yeganə universitetinə tətbiq edildi. Bu uğursuz layihə nəticəsində fənlərin nəzəri hissəsi xeyli ixtisar olundu, utilitarizmə və praqmatizmə istiqamətləndirilən məzmun kadr hazırlığının keyfiyyət göstəricilərinin aşağı düşməsinə səbəb oldu.

1926-cı il mayın 31-də Azərbaycan K(b)P MK-da müəllim hazırlanması işinin əsaslı şəkildə yenidən qurulması və yaxşılaşdırılmasına dair geniş proqram qəbul edildi. Qəbul edilmiş qərarda qadın və kişi pedaqoji institutlarının ayrı-ayrılıqda fəaliyyət göstərməsi məqsədəuyğun hesab edilmədi. Bu məsələni öyrənmək üçün MK-nın şöbə müdiri T.Hüseynovun rəhbərliyi altında yaradılan komissiyanın rəyi əsasında 1926-cı il iyulun 16-da Azərbaycan K(b)P MK və Xalq Komissarları Soveti "Pedaqoji İnstitutları yenidən təşkil etmək haqqında" qərar qəbul etdilər. Həmin qərara uyğun olaraq kişi və qadın pedaqoji institutları birləşdirildi və vahid Azərbaycan Pedaqoji İnstitutu yaradıldı. Partiya və hökumətin qəbul etdiyi qərar son nəticəyə müvafiq olaraq, yəni "Pedaqoji institutların birləşdirilməsi haqqında" qərar kimi formalaşdırılmalı idi. Birləşdirmə işi bununla yekunlaşmadı. 1926/27-ci tədris ilinin sonunda Ali Pedaqoji İnstitut V.İ.Lenin adına Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsi ilə birləşdirildi. Halbuki institutun Pedaqoji Şurası 26 may 1926-cı ildə keçirilən iclasında bir qərar çıxarmışdı: *"Zükür Pedaqoji İnstitutunun əldə etdiyi mütəxəssis müəllimlər qüvvəsini, təchiz olunmuş və gələcək tədris yılı üçün təşkil ediləcək kabinə və labaratuarlarını, tələbələrin bilikcə 80% müvəffəqiyyətlərini nəzərə alaraq 1926-27-cı yıl tədris planı əsasına Şuralar Rusiyası ali pedaqoji məktəblərinin tədris planını qoymalı və məktəbimizi artıq Azərbaycan Darülfünunu sırasına keçirməli*"[55].

Təəssüf ki, Universitet statusuna iddialı olan Pedaqoji İnstitut subyektiv mülahizələr əsasında fəaliyyətini dayandırmalı oldu. Birləşmədən sonra ADU-nun Pedaqoji fakültəsinə Cəlil Məmmədzadə, Tağı Şahbazi və prof. P.P.Fridolin rəhbərlik etdilər.

---

*[53] Bakı Xalq Maarifi İnstitutu 1922-ci ildə Frebel kurslarının əsasında yaradılmışdı. İnstitutun əsasnaməsi və tədris planı 1923-cü il aprelin 28-də Azərbaycan Xalq Maarif Komissarlığı tərəfindən təsdiq edilmişdi. İnstitut məktəbəqədər tərbiyə müəssisələrində və məktəbdənkənar uşaq müəssisələrində çalışan müəllimlərin ixtisasını təkmilləşdirməyi öz qarşısına məqsəd qoymuşdu.*

*[54] **Рзаев А.** Из истории высшего педагогического образования в Азербайджане. Баку: Азернешр, 1957, с.55*

*[55] Azərbaycan Ali Pedaqoji İnstitutu. Beş illik. (Tərtib, transliterasiya, izahlar, şərhlər və ön sözün müəllifi: **prof.F.A.Rüstəmov**). Bakı, Elm və təhsil, 2020, s.44*

Azərbaycan Dövlət Universitetinin Tibb fakültəsi istisna edilməklə bütün fakültələr II dərəcəli orta məktəblər, texnikumlar üçün müəllim kadrları hazırlığına istiqamətləndirildi. Həmin dövrdə savadsızlığın ləğv edilməsi, ümumi, icbari və pulsuz təhsilin həyata keçirilməsi mədəni inqilabın əsas şərti hesab olunurdu. Qəzalarda və kəndlərdə II dərəcəli məktəblərdə, pedaqoji kurslarda və texnikumlarda dərs deyəcək müəllimlər çatışmırdı.

Ali Pedaqoji İnstitut 3 ilə yaxın bir müddətdə Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsinin tərkibində fəaliyyət göstərsə də, öz təhsil ənənələrini qoruyub saxladı. 1924-1927-ci illərdə Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsini 389, 1928-1929-cu tədris ilində 183, 1929-1930-cu tədris ilində isə 394 nəfər bitirmişdi[56]. Həmin dövrdə Pedaqoji fakültənin tələbələri Bakı şəhərindəki II dərəcəli məktəblərdə pedaqoji təcrübə keçirdilər. Pedaqoji təcrübənin təşkili ilə bağlı təlimat xeyli təkmilləşdirilmiş, pedaqoji təcrübənin gedişinə nəzarət gücləndirilmişdi.

1927-1930-cu illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Pedaqoji fakültəsində müəllim hazırlığının inkişaf dinamikası aşağıdakı kimi olmuşdur.

| Tədris illəri | Tələbə sayı | O cümlədən | | Sosial-sinfi tərkibi | | | |
|---|---|---|---|---|---|---|---|
| | | Azərb. | rus | fəhlə | kəndli | qulluqçu | və b. |
| 1927/28 | 880 | 597 | 283 | 181 | 212 | 416 | 81 |
| 1928/29 | 916 | 393 | 533 | 268 | 65 | 437 | 46 |
| 1929/30 | 1345 | 731 | 614 | 470 | 424 | 331 | 120 |

Həmin dövrdə milli ziyalılar daha çox Pedaqoji fakültənin elmi qüvvələri sırasında yer almışdı. Universitetdə aparılan türkləşdirmə siyasəti azərbaycanlı tələbələrin, akademik işçilərin və Azərbaycan dilini bilənlərin sayının artması ilə nəticələndi. Cədvəldən də göründüyü kimi, Pedaqoji fakültədə milli dildə təhsil alanların sayı ildən-ilə artırdı. 1927/28-ci tədris ilində 880 tələbədən 597-si (67,8%), 1929/30-cu tədris ilində isə 1345 tələbədən 731 nəfəri (54,3%) Azərbaycan bölməsində təhsil alırdı.

## Azərbaycan Pedaqoji İnstitutunun yenidən təşkili uğrunda mübarizə

Az sonra unifikasiyanın - Ali Pedaqoji İnstitutun Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsinin tərkibinə verilməsinin müəllim kadrları hazırlığına ciddi zərbə vurduğu aydın oldu. Müəllim kadrları hazırlığının həm kəmiyyət, həm də keyfiyyət göstəriciləri aşağı düşdü. Hazırlanan müəllim kadrları ehtiyacı ödəmirdi.

Rəqəmlərə diqqət yetirək: Respublikada 1920/21-ci tədris ilində fəaliyyət göstərən 939 məktəbdə 79399 şagird, 1921/22-ci tədris ilində 1215 məktəbdə 89155 şagird, 1922/23-cü tədris ilində 1032 məktəbdə 88226 şagird, 1923/24-cü tədris ilində 1225 məktəbdə 114763 şagird, 1924/25-ci tədris ilində 1376 məktəbdə 137518 şagird, 1925/26-cı tədris ilində 1493 məktəbdə 160886 şagird, 1926/27-ci tədris ilində 1488 məktəbdə 163013 şagird, 1927/28-ci tədris ilində 1487 məktəbdə 171099 şagird təhsil alırdı[57]. Həmin illərdə II dərəcəli məktəblərin şəbəkəsi və orada təhsil alanların da sayı xeyli artmışdı. Belə ki, 1920-1921-ci tədris ilində 28, II dərəcəli məktəbdə 4480, 1922-

[56] *Обзор деятельности правительства АССР за 1929-1930 гг. Отчет VII Всеазербайд-жанскому съезду Советов.Баку, 1932, стр.248*
[57] *"Azərbaycan arxivi" məcmuəsi, Bakı,1971, № 1-2,s.140-141*

1923-cü ildə 38 II dərəcəli məktəbdə 6080, 1923-1924-cü ildə 45 II dərəcəli məktəbdə 7200, 1926-1927-ci illərdə 49 II dərəcəli məktəbdə 11974 şagird təhsil alırdı. Respublikada I-II dərəcəli məktəblərlə yanaşı digər ümumtəhsil məktəblərinin də sayı artmışdı. 1926-1927-ci tədris ilində 17 yeddiillik məktəbdə 4405 şagird, 6 kəndli-gənclər məktəbində 214 şagird, ayrı-ayrı yerlərdə təşkil edilmiş fəhlə fakültələrində 1824 nəfər oxuyurdu[58]. Birinci dərəcəli məktəblər üçün müəllim kadrları pedaqoji seminariyalarda həyata keçirilirdi.1924-cü ildə Azərbaycanda fəaliyyət göstərən 13 seminariyada (8-i kişi, 5-i qadın) 1704 nəfər tələbə təhsil alırdı. Azərbaycanda icbari ibtidai təhsilin həyata keçirilməsinə başlanılması bu prosesi sürətləndirmişdi.

İldən-ilə II dərəcəli məktəblərin sayının artması, yeni tip məktəblərin (texniki və sənaye məktəbi, fabrik-zavod şagirdliyi məktəbi, kəndli-gənclər məktəbi, fəhlə fakültələri və s.) yaradılması, seminariyaların bazasında dördillik pedaqoji texnikumların və “Evdə pedaqoji texnikum”ların təşkili ali pedaqoji təhsilli müəllim kadrlarına olan ehtiyacı kəskin şəkildə artırmışdı. Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsi milli məktəblərin müəllim kadrlarına olan tələbatı ödəmək iqtidarında deyildi. Bircə faktı qeyd edək ki, 1929-cu ildə Pedaqoji fakültənin nəzdində fəaliyyət göstərən 44 kafedradan yalnız 3-nə milli mütəxəssislər: professor Bəkir Çobanzadə, privat-dosent Ə.Zəkuzadə, Fətulla bəy Rzabəyli rəhbərlik edirdi.

Azərbaycan Pedaqoji İnstitutunun müstəqil institut kimi yenidən təşkili Azərbaycan K(b)P MK-da və Azərbaycan Xalq Maarif Komissarlığında Ali Pedaqoji İnstitutun nümayəndələrinin iştirakı ilə müzakirə olundu. Bu məsələdə daha çox fədakarlıq göstərən Azərbaycan SSR Xalq maarif komissarının müavini Pənah Qasımov idi. Elə buna görə də Azərbaycan SSR XMK-nın 1929-cu il 28 sentyabr tarixli 74 saylı əmri ilə yenidən təşkil edilən Ali Pedaqoji İnstitutuna ***Pənah Qasımov*** direktor, prof. B.B.Komarovski direktor müavini təyin olundu. Pənah Qasımov həmin dövrdə həm də yenicə təşkil edilən Xalq Maarifi Kadrlarının Təkmilləşdirmə İnstitutunun direktoru idi. O, ADU-nun Pedaqoji fakültəsinin əməkdaşlarının böyük əksəriyyətini yenidən təşkil edilən instituta işə dəvət etməklə institutda yüksək elmi-pedaqoji potensialın formalaşmasına nail oldu. Həmin dövrdə Azərbaycan K(b)P MK və Xalq Maarif Komissarlığı pedaqoji kadr hazırlığına xüsusi diqqət verirdi.


Şəhadətnamə

Свидетельство

*Məhəmmədzadə Bəhmən Qərim oğluna verilən Şəhadətnamə*


Şəhadətnamə

Свидетельство

*Məmməd Ələkbərzadəyə verilən Şəhadətnamə*

[58] **Mehdizadə M.** *Azərbaycanda sovet məktəbinin tarixinə dair xülasələr. Bakı: Azərtədris-nəşr, 1958, s.43.*



***Pənah Ələkbər oğlu Qasımov***
*(1881-1939)*

*1881-ci il iyul ayının 22-də Cəbrayıl qəzasının Qarğabazar kəndində anadan olub. İlk təhsilini Qarğabazarda molla məktəbində alıb, sonra kənddəki üçsinifli məktəbi bitirib.1901-1905-ci illərdə dövlət vəsaiti hesabına Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasının Azərbaycan şöbəsində, 1905-1907-ci illərdə isə Bakı müəllimlərinin xeyriyyə cəmiyyətinin vəsaiti hesabına Tiflisdə Aleksandrovski Müəllimlər İnstitutunda təhsil alıb. Qori və Tiflisdə aldığı təhsil onun dünyagörüşünün formalaşmasında mühüm rol oynayıb. Ali təhsilini başa vurduqdan sonra Lənkəran şəhər məktəbinə müəllim təyin edilib. 1907-1909-cu illərdə Lənkəran şəhər məktəbində, 1909-1920-ci illərdə Bakıdakı 6 sinifli şəhər məktəbində (bəzi mənbələrə görə, 6-cı rus-tatar məktəbində) və 3-cü ali ibtidai məktəbdə tarix müəllimi işləyib. 1917-ci ildə "Əkinçi" partiyasına, 1918-ci ildə "Hümmət" təşkilatına, 1920-ci ildə Kommunist (bolşevikər) Partiyasına üzv qəbul edilib.1920-ci ildə Bakı Kişi Müəllimləri Seminariyasına direktor təyin olunub. Məktəbə rəhbərlik etməklə yanaşı, o həm də ictimaiyyat fənnindən dərs deyib. 1926-cı ildə Bakıdakı kişi və qadın seminariyaları birləşdirilərək Bakı Müttəhid (Birləşmiş) Pedaqoji Texnikuma çevrildi. P.Qasımov məktəbin direktoru, C.Cəbrayılbəyli tədris işləri üzrə direktor müavini təyin olundu. 1926-ci ildə Bakıda keçirilən I Türkoloji qurultayda iştirak edən 19 nəfər azərbaycanlıdan biri olub. 1928-ci ildə Azərbaycan SSR Xalq Maarif Komissarının müavini vəzifəsinə irəli çəkilib. 1929-1930-cu illərdə yenidən təşkil edilən Ali Pedaqoji İnstitutun direktoru olub. 10 dekabr 1930-cu ildə vəzifəsindən azad edilərək Azərbaycan K(b)P MK-nın xüsusi tapşırığı ilə Zaqatala və Nuxa qəzalarında, Qarabağ dairəsində partiyanın kollektivləşdirmə ilə bağlı göstərişlərinin həyata keçirilməsinə cəlb edilib. 1920-1929 -cu illərdə Azərbaycan SSR Maarif İşçiləri Həmkarlar İttifaqının sədri olub. Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutunun 12 oktyabr 1929-cu il tarixində seçilmiş ilk 52 nəfər həqiqi üzvündən biri olub.1932-ci ildə həmin institutun bazası əsasında SSRİ Elmlər Akademiyası Zaqafqaziya filialının Azərbaycan şöbəsi təşkil edilib. 1935-ci ilin oktyabrında şöbə SSRİ EA Azərbaycan filialına çevrilib. SSRİ Xalq Komissarları Sovetinin 1945-ci il 23 yanvar tarixli qərarı ilə SSRİ EA Azərbaycan filialı Azərbaycan Elmlər Akademiyasına çevrilib.*

*Azərbaycan və Zaqafqaziya Mərkəzi İcraiyyə Komitələrinin, Azərbaycan K(b)P MK-nın və Bakı Komitəsinin üzvü, Bakı sovetinin deputatı olub. Partiya işindəki fəallığına görə 1935-ci ildə Azərbaycan K(b)P MK-nın Fəxri fərmanı ilə təltif edilib.*

*1926-1929-cu illərdə "Maarif işçisi"nin, 1935-1936-cı illərdə "Müəllimə kömək"jurnalının redaktoru olub. Repressiya illərində həbs olunub. Həbsdən azad edilsə də, çox yaşamayıb, 1939-cu ildə vəfat edib və Füzuli rayonunun Qarğabazar kəndində dəfn edilib.*

"Kommunist" qəzetinin 6 oktyabr 1929-cu il tarixli sayında Azərbaycan Ali Pedaqoji İnstitutunun açılması haqqında verilən məlumatda deyilirdi:"Bu il yeni təşkil edilən Azərbaycan Ali Pedaqoji İnstitutu oktyabrın 10-dan işə başlayacaqdır. İnstitut üçün 3 mərtəbəli yeni bina tikilmişdir. Bu il institutun I kursuna 120 tələbə qəbul edilmişdir. İnstitut üçün yaxşı qüvvələr çağırılmışdır."[59]

[59] *"Kommunist" qəzeti, 6 oktyabr 1929*

1930-cu ilin martın 30-da Azərbaycan K(b)P MK katibi Ağa Sultanovun və Xalq maarif komissarı Ayna Sultanovanın iştirakı ilə ali pedaqoji təhsillə bağlı xüsusi müşavirə çağırıldı. Müşavirədə Ali Pedaqoji İnstitutun təşkili ilə bağlı direktor Pənah Qasımovun məruzəsi, P.P.Fridolinin məlumatları dinlənilib müzakirə edildi və müəllim kadrları hazırlığının perspektivləri müəyyənləşdirildi. Qısa bir vaxtda ***Azərbaycan Pedaqoji İnstitutu öz inkişafının ikinci mərhələsinə qədəm qoydu, elmi-pedaqoji fikrin əsas mərkəzinə, bütün ixtisaslar üzrə müəllim kadrları hazırlayan ali pedaqoji təhsil ocağına çevrildi.*** 1924-cü ildən V.İ.Leninin adını daşıyan Azərbaycan Dövlət Universiteti ləğv edildiyindən, 1930-cu ildə V.İ.Leninin adı Azərbaycan Dövlət Pedaqoji İnstitutuna verildi.

***

Ali Pedaqoji İnstitutun təşkilatçıları və ilk müəllimləri qısa bir dövrdə (1921-1927 və 1929-30-cu illərdə) Azərbaycanda milli kadr hazırlığını həyata keçirən ali təhsil müəssisəsi yarada bildilər, institut üçün bina tapdılar, müəllim kollektivi formalaşdırdılar, laboratoriya, kitabxana, muzey təşkil etdilər. İnstitutun ilk buraxılış gecəsini təntənəli şəkildə keçirtdilər.

Ali Pedaqoji İnstitutun Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsinə birləşdirilməsi ilə bağlı yanlış qərarın Azərbaycan K(b)P MK-da və Azərbaycan Xalq Maarif Komissarlığında müzakirəsinə və həqiqətin bərpa olunmasına nail oldular.

Ali Pedaqoji İnstitutun ilk buraxılışı (1924) ilə bağlı xatirə yazısında məntiq müəllimi Abdulla bəy Əfəndizadə yazırdı:" *Biz istəyirik ki, məktəbimiz ümumtürk ellərinin hüsn-rəğbətini qazansın, bütün Şərq elmi üçün inqilab məşəli olsun... Oksford və Kembric darülfünunları kimi Şekspirlər, Nyutonlar, Miller və Darvinlər yetişdirməyə müvəffəq olsun*[60].

Onun arzu olaraq səsləndirdiyi bu fikirlər çox keçmədi ki, həqiqətə çevrildi. İnstitutun məzunları ictimai-siyasi və elmi-pedaqoji fəaliyyətləri ilə adlarını Azərbaycanın elm və təhsil tarixinə yazdılar.

***



*Prof.Məmməd Əfəndiyev mühazirə oxuyarkən*



*Prof. K.A.Krasuski Pedaqoji İnstitutun kimya laboratoriyasında elmi işçilərə məsləhət verərkən*

[60] *Ali Pedaqoji İnstitutun salnaməsi.(tərtib, transliterasiya, şərhlər və Ön sözün müəllifi: **prof.F.A.Rüstəmov**). Bakı:Elm və təhsil, 2020, s.122*

# II Fəsil

# Azərbaycan Dövlət Pedaqoji İnstitutunun müstəqil ali təhsil müəssisəsi kimi yenidən təşkili və elmi-pedaqoji fikir mərkəzinə çevrilməsi (1930-1941-ci illər)

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunun yenidən təşkili

1930-cu il yanvarın 14-də Bakı Opera Teatrının binasında Universitetin 10 illiyinə həsr olunmuş[61] möhtəşəm tədbir keçirildi. Yubiley tədbirində Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinin və Xalq Komissarları Şurasının sədri Qəzənfər Musabəyov, Azərbaycan KP MK-nın katibi Ruhulla Axundov, Xalq maarif komissarı Ağa Sultanov, partiya, həmkarlar və tələbə təşkilatlarının nümayəndələri iştirak edirdilər. Universitetin yubileyi ilə əlaqədar SSRİ-nin və xarici ölkələrin tanınmış elm və təhsil işçilərindən, dövlət və hökumət nümayəndələrindən xeyli təbrik məktubları gəlmişdi. Azərbaycanda elmin və təhsilin inkişafında müstəsna xidmətləri olan ilk Universitetin yubileyi çox yüksək səviyyədə keçirildi, görülən işlər ümumiləşdirildi, perspektivlər müəyyənləşdirildi. Çox təəssüf ki, az sonra Azərbaycan Dövlət Universiteti Azərbaycan Ali Pedaqoji İnstitutunun 1926/27-ci tədris ilindəki acı taleyini yaşamalı oldu.

Azərbaycan Dövlət Universitetinin 10 illik yubileyindən 5 ay sonra Azərbaycan SSR Xalq Komissarları Sovetinin 1930-cu il 10 iyun tarixli qərarı ilə universitetin ayrı-ayrı fakültələrinin bazasında aşağıdakı müstəqil sahə institutları yaradıldı:

1.İqtisadiyyat fakültəsinin bazasında **Ticarət-Kooperasiya İnstitutu**;

2.Pedaqoji fakültənin bazasında **Ali Pedaqoji İnstitut**;

3.Hüquq fakültəsinin bazasında **Sovet Quruculuğu və Hüquq İnstitutu**;

4.Tibb fakültəsinin bazasında **Azərbaycan Tibb İnstitutu**.

Universitetin sənaye-iqtisad şöbəsi isə Neft İnstitutuna verildi.

Azərbaycan Dövlət Universitetinin ləğv edilməsi milli dövlətçilik təfəkkürünün formalaşmasına vurulan ağır zərbə idi.

Azərbaycan Xalq Komissarları Sovetinin 19 iyun 1930-cu il tarixli "*Azərbaycan SSR ali məktəblərinin və ali texniki məktəblərinin yenidən təşkili və rayonlaşdırılması, onların müvafiq təsərrüfat idarələri və Xalq Komissarlıqları tərkibinə verilməsi haqqında*" qərarına uyğun olaraq ali təhsil müəssisələri ixtisas profillərinə uyğun quruldu. Həmin qərarın 4-cü bəndinə müvafiq olaraq ADU-nun Pedaqoji fakültəsi Ali Pedaqoji İnstitutun tərkibinə verildi və Azərbaycan Pedaqoji İnstitutu kimi yenidən təşkil olundu[62].

Azərbaycan SSR Dövlət Plan Komitəsinin 13 fevral 1930-cu ildə ZSFSR Dövlət Plan Komitəsinə ünvanladığı hesabatdan aydın olur ki, 1 dekabr 1929-cu ildə Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsində 1199 tələbə, Azərbaycan Pedaqoji İnstitutunda isə 146 tələbə oxuyurdu[63].

APİ-nin 4 şöbəsində (fakültəsində) və 2 birillik şöbələrdə (ədəbiyyat və təbiət) müəllim kadrları hazırlanırdı. İnspektor şöbəsində 25, fizika-kimya şöbəsində 22, təbiyyat şöbəsində 25, tarix-ictimaiyyat və ədəbiyyat şöbəsində 29, birillik ədəbiyyat şöbəsində 20, birillik təbiət şöbəsində 25 nəfər tələbə təhsil alırdı. Universitet ləğv olunanda Peda-

---

[61] *Ətraflı bax: "Azərbaycan arxivi" məcmuəsi. 1978, №1-2 (16-17), s.174-180*

[62] *"Azərbaycan arxivi" məcmuəsi. Bakı,1978, №1-2 (16-17), s.192*

[63] *Azərbaycan Respublikasının Dövlət Arxivi. F.796, siy.16, iş.214, v.12-14*

qoji fakültənin bütün tələbələri Pedaqoji İnstituta köçürüldü. Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsinin elmi və pedaqoji potensialından geniş istifadə olundu. Tanınmış alimlərin və müəllimlərin Azərbaycan Pedaqoji İnstitutuna cəlb edilməsi burada güclü elm və təhsil mühitinin yaranmasına səbəb oldu. ADU-nun Pedaqoji fakültəsinin I, II və III tədris ili tələbələri təhsillərini Pedaqoji İnstitutda tamamladılar. Tələbələrdən kimisi 3, kimisi 2, kimisi də 1 il Azərbaycan Pedaqoji İnstitutunda oxumalı oldu. Bu səbəbdən də adını millətin şərəf və şöhrət kitabına yazan bəzi məzunlarımızı (Heydər Hüseynov, Zahid Xəlilov, Məmmədağa Şirəliyev, Əşrəf Hüseynov, Həmid Araslı, Əbdüləzəl Dəmirçizadə, Muxtar Hüseynzadə və b.) BDU həm də öz yetirmələri hesab edir.

Azərbaycan SSR Xalq Komissarları Soveti 23 fevral 1930-cu ildə "Azərbaycan SSR ali məktəbləri haqqında əsasnamə[64], 4 ay sonra - 19 iyun 1930-cu ildə isə ali məktəbə yeni qəbul qaydaları ilə bağlı qərar[65] qəbul etdi. Həmin qərarda ayrı-ayrı institutlara qəbul olunacaq tələbələrin sayı və qəbul şərtləri öz əksini tapdı. Azərbaycan Pedaqoji İnstitutuna 600 tələbənin qəbulu planlaşdırılmışdı ki, onlardan da 450-si iyul ayında, 150-si isə yanvar ayında qəbul edilməli idi. Qəbul olunacaq tələbələrin sosial tərkibi aşağıdakı normalara uyğun olmalı idi:

1) fəhlə və fəhlə uşaqları – 40 %
2) muzdur və onun uşaqları– 10 %
3) kəndli və onun uşaqları – 25%
4) pedaqoji texnikumları bitirənlər – 15%
5) qulluqçu və onun uşaqları – 10%

Pedaqoji İnstituta yalnız türk (Azərbaycan) dilini bilənlər qəbul oluna bilərdi. İnstitutun I-II kurslarında türkləşdirmə başa çatdığına görə təlim Azərbaycan dilində aparılırdı. Bu məqsədlə Xalq Maarif Komissarlığı tərəfindən müəllimlər üçün 2 həftəlik kurs təşkil etmişdi.

1930-cu ildə ən çox tələbənin Neft İnstitutuna (1500 tələbə), ondan sonra isə Pedaqoji İnstituta (600 tələbə) qəbulu planlaşdırılmışdı. Belə ki, Ticarət-Kooperasiya İnstitutuna 100, Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna 370, Zaqafqaziya Pambıq İnstitutuna 200, Tibb İnstitutuna 320, Sovet Quruculuğu və Hüquq İnstitutuna 100 yer ayrılmışdı. Ümumi qəbul planının (3190 tələbə) 18,8%-i Pedaqoji İnstitut üçün nəzərdə tutulmuşdu.

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunun yeni tədris binası və ya Bakı Kommersiya Məktəbi necə yaranıb?

İnstitut yenidən təşkil ediləndə Azərbaycan Dövlət Universitetinin10 il fəaliyyət göstərdiyi keçmiş Bakı Kommersiya Məktəbinin binası (Pedaqoji Universitetin indiki əsas binası) bütövlükdə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna verildi. Dəniz kənarında yerləşən, memarlıq üslubuna görə şəhərə xüsusi yaraşıq verən həmin bina o dövrdə tədrisin yüksək səviyyədə təşkilinə imkan verən iki-üç binadan biri hesab olunurdu.

Bu və ya digər şəkildə Pedaqoji Universitetlə bağlı olanlar üçün müqəddəs məkana çevrilən ADPU-nun əsas binası (Səbail korpusu) nə vaxt və necə tikilib?

XIX əsrin axırlarında Rusiyada iqtisadi təhsilin düzgün təşkilini daxili və xarici ticarətin uğurlu inkişafının mühüm şərti hesab edənlər yeni tip ticarət məktəblərinin açılmasını vacib hesab edirdi. Rusiya Maliyyə Nazirliyinin ticarət və manufaktura departamentinin direktoru B.İ.Kovalevski tərəfindən hazırlanan, maliyyə naziri S.Y.Vitte tərəfindən təqdim olunan "Ticarət məktəbləri haqqında Əsasnamə"nin layihəsi 1896-cı ildə II Nikolay tərəfindən təsdiq edildi. Əsasnamənin təsdiqindən üç il sonra -1899-cu ilin oktyabr ayının 1-dən 4-ə kimi Maliyyə Nazirliyinin ticarət və manufaktura departamentinin direktoru B.İ.Kovalevski Bakıda işgüzar

---
[64] *"Azərbaycan arxivi" məcmuəsi. Bakı,1978, №1-2 (16-17), s.185-188*
[65] *"Azərbaycan arxivi" məcmuəsi. Bakı,1978, №1-2 (16-17), s.189-190*




səfərdə oldu. O, Kənd Təsərrüfatı və Dövlət Əmlakı naziri A.S.Yermolovu Tiflisdən Bakıya müşayiət edirdi. Onun 4 oktyabr 1899-cu ildə Bakıda sahibkarlarla və xeyriyyəçilərlə görüşü oldu. Görüş zamanı Bakıda kommersiya məktəbinin açılması ilə bağlı onun verdiyi təklif sahibkarlar tərəfindən rəğbətlə qarşılandı.

Bakıda yeni məktəb üçün torpaq sahəsinin alınması, binanın tikilməsi, zəruri avadanlıqlarla təchiz edilməsi üçün xeyli vəsait və vaxt lazım idi. Məktəbin açılması üçün binanın hazır olmasını gözləmək olmazdı. Bunun üçün müvəqqəti olaraq tədrisə yararlı bina tapılmalı idi. Təbii ki, həmin binaya kirayə haqqı ödənilməli idi. Bu məqsədlə vəsait toplanışına başlanıldı və qısa bir zamanda 170 min rubl toplandı ki, onun da 50 min rublunu məşhur mesenat H.Z.Tağıyev vermişdi. Xeyriyyəçilik məqsədilə M.Nağıyev və Ş.Əsədullayev də xeyli pul vermişdi. Məktəbə 2000 rubl ianə verən Fərrux bəy Vəzirov 1901-1902-ci illərdə məktəbin Qəyyumlar Şurasının üzvü olmuşdu. Bakıda fəaliyyət göstərən iri neft sənayesi şirkətləri və ayrı-ayrı cəmiyyətlər də məktəbə xeyli ianə vermişdilər. Nobel qardaşları 20 min rubl ödəmişdi. Nəzərdə tutulan vəsait toplandıqdan sonra məktəb üçün bina kirayələndi. Həmin bina ***Suraxanı küçəsi*** (Bir may, Dilarə Əliyeva, Çingiz Mustafayev) ilə ***Stanislav küçəsinin*** (Şərq xalqları, Lenin, Azadlıq) kəsişməsində (bina Mövsümov və ya Məsimov soyadlı sahibkara məxsus olub) yerləşirdi.

«Новости дня» qəzetinin 16 oktyabr 1901-ci il sayında belə bir məlumat verilib:"*Баку 15-го октября. Вчера открылось коммерческое училище с восьмилетним курсом, устроенное на средства бакинских нефтепромышленников - купцов, пожертвовавших на это пока 184 000 р.»*

Məktəbin Qəyyumlar Şurasının fəxri sədri *H.Z.Tağıyev* idi. O, 1901-1918-ci illərdə Bakı Kommersiya Məktəbinin fəxri qəyyumu olub. Əlimərdan bəy Topçubaşov da məktəbin qəyyumluq şurasının üzvü olub. Əhməd bəy Ağayev 1901-1909-cu illərdə, Nəriman Nərimanov 1906-cı ildə Kommersiya məktəbində ana dili və şəriət dərslərini tədris edib.

Kommersiya məktəbinin binası üçün ərazinin müəyyənləşdirilməsində və alınmasında məktəbin Qəyyumlar Şurasının mühüm xidmətləri olub. Qəyyumlar Şurası 1903-cü ildə Bakı şəhər Şurasına müraciət edərək ***Merkuryevski***[66]***, Birja***[67] və ***Kaspiyski***[68] küçələrinin kəsişməsindəki 2300 kv.sajen[69] torpağın Kommersiya məktəbi üçün ayrılmasını Dumada müzakirə etməyi xahiş etdi. Məktəbin Fəxri Qəyyumlar Şurası müraciətlərində aşağıdakı məsələləri nəzərə almağı xahiş edirdi:

-nəzərdə tutulan ərazi xeyli sayda şagird və müəllimin kompakt yerləşməsini təmin edə bilər;

-bu ərazi tələbələrin sağlamlığının qorunması üçün ən münasib yerdir;

-ərazi dənizin yaxınlığında yerləşdiyindən sağlamlıq və istirahət üçün daha yararlıdır.

Ərazi məktəb binasının tikintisi üçün bütün normaları ödəyirdi. Duma məktəbin tikintisinə icazə verdikdən sonra 1904-cü ilin fevralında Qəyyumlar Şurası İmperatorluğun Sankt-Perterburq Memarlar Cəmiyyətinə 800 nəfərlik Bakı Kommersiya Məktəbinin binasının layihəsi üçün müsabiqə elan etməyi xahiş etdi. Cəmiyyət aşağıdakı məzmunda müsabiqə elanı verdi.

---

*[66] Merkuryevski – Şaumyan – Azərbaycan, hazırda Zərifə Əliyeva küçəsi*
*[67] Birja – Azadlıq, hazırda Üzeyir bəy Hacıbəyli küçəsi*
*[68] Budaqov – Kaspiyski – Leytenant Şmidt, hazırda Rəşid Behbudov küçəsi*
*[69] 1 sajen = 7 fut = 3 arşın= 2,1135 m.*

**İmperatorluğun Sankt-Peterburq Memarlar Cəmiyyəti Bakı Kommersiya Məktəbinin Qəyyumlar Şurasının tapşırığı ilə Bakı şəhərində 800 nəfərlik Kommersiya Məktəbinin binasının layihəsinin aşağıdakı şərtlər daxilində hazırlanması üçün müsabiqə elan edir:**

2300 kv.saj. ölçüsündə 3 küçənin (***Merkuryevski***, ***Kaspiyski***, ***Birja***) kəsişməsində və döngə tərəfdən baş planda göstərildiyi kimi layihələndirilməlidir:

**A.** Məktəbin binası 2 və ya 3 mərtəbə ola bilər; siniflər üçün 3 mərtəbə olması daha məqsədəuyğundur.

**B.** Kimya laboratoriyası və laboratoriya əmlakı üçün ayrıca bina.

**V.** Direktor və inspektor üçün yaşayış binası. Bu binadan məktəb korpusuna keçid ola bilər.

**Q.** Xidmətçi heyət üçün bina.

**D.** Gimnastika zalı, əl əməyi emalatxanası ilə birlikdə.

Binalar elə yerləşdirilməlidir ki, 800 kv.saj. artıq geniş həyət alınsın.

**A**

Məktəb daxilində aşağıdakıların yerləşdirilməsi tələb olunur:

1.Əsas qapı tərəfdən giriş pilləkən yerləşən vestibül-foye, zirzəmi hissəsində 1000 nəfərlik üçün nəzərdə tutulan qarderob.

2.Şagirdlər üçün hər biri 26-28 kv saj. olan qarderoblu vestibül-foye

3.Uzunu 4,66 saj., eni 3,33 saj., hündürlüyü 2,08 saj. olan 22 sinif otağı.

4.Müəllimlər otağı – 18-20 kv saj.

5.Siqaretçəkmə otağı – 12 kv saj.

6.Direktorun kabineti – 9 kv saj.

7.Qəbul otağı – 9 kv saj.

8.Dəftərxana (1 və ya 2 otaq) - birlikdə 14-17 kv saj.

Axırıncı 3 otağın bir-biri ilə əlaqəsi olmalıdır.

Dəftərxana daxilində arxiv üçün otaq- 8 kv saj.

***Qeyd.*** *4,5,6,7 və 8-ci maddələrdə nəzərdə tutulan otaqlar I mərtəbədə yerləşdirilməlidir.*

9.II mərtəbədə inspektor otağı -7-8 kv saj.

10.Həkim üçün 2 otaq (onlardan biri müvəqqəti dincəlmə otağı) – birlikdə 12 kv saj.

***Bu binada xüsusi siniflər:***

11. İşığı şimal tərəfdən düşən rəsm çəkmə zalı (17 kv saj.) və rəsm ləvazimatı üçün otaq (9 kv saj.)

12. Amfiteatrlı fizika auditoriyası -22 kv saj.

13. Fizika müəllimləri üçün kabinet -7 kv saj.

14. Fizika kabineti - 20-22 kv saj.

15. Fizika kabinetinin tərkibində emalatxana - 4 kv saj.

16. Hər biri 14-16 kv saj. iç-içə olan coğrafiya və təbiət-tarix sinifləri.

17. Onların tərkibində təbiət-coğrafiya muzeyi və muzeyin əmlakı üçün yer - 40-44 kv saj.

18. Musiqi və nəğmə otağı -20-22 kv saj.

19. Əsaslı kitabxana -20-22 kv saj.

20. Ayrı-ayrı mərtəbələrdə yerləşən şagird kitabxana və qiraətxanası üçün hər biri 10-12 kv saj. olan iki otaq.

21. 300-400 nəfərlik xor və orkestr üçün səhnəsi olan akt zalı- 100 kv saj. Səhnənin arxasında iki tualet, hər biri 4-6 kv saj.

22. Zalda ayrıca qonaq otağı -12-15 kv saj.

***Qeyd.*** *Zal səhnəsi ilə birlikdə konsert və gecələr üçün nəzərdə tutulur.*

23. Hər mərtəbədə əl-üz yuma üçün daxilində su dolabları olan otaqlar (25 nəfərə dolabın bir su lüləyi nəzərdə tutulur).

24. Səhər yeməyi üçün geniş dəhlizi, bir-birilə əlaqəli bufeti və mətbəxi olan 350 nəfərlik yeməkxana.

**B**

25. Kimya auditoriyası – 20-22 kv saj.

26. Onun daxilində laborant üçün kabinet -7 kv saj.

27. Onun daxilində kimya laboratoriyası -30 kv saj.

28.Çəki otağı -6 kv saj.
29.Qablar və reaktivlər üçün otaq - 8 kv saj.
30.İyli qazlar üçün otaq -6 kv saj.
31.Üzvi maddələrin yerləşdirilməsi üçün otaq -6 kv saj.
32.Fotolaboratoriya - 6 kv saj.
33.Əmlakın saxlanılması üçün laboratoriya - 20-22 kv saj.

**V**

34.Direktor üçün yuxarı mərtəbədə 7-8 otaqlı ümumi sahəsi 90 kv saj. mənzil.
35.İnspektor üçün aşağı mərtəbədə 6-7 otaqlı mənzil. Mənzillərdəki otaqların hündürlüyü -6 arşın, qalereya və eyvan olmalı.

**Q**

36.Xidmətçilər (binanın nəzarətçisi, məktub aparan (kuryer), laborant, feldşer) üçün hər birinə 3 otaqlı mənzil.

***Qeyd:*** *Otaqların hündürlüyü 6 arşın, yaşayış sahəsi -30-33 kv saj.*

37.Xidmətçilər üçün 3 mətbəxi və 3 su dolabı olan 20 otaq.
38. Çamaşırxana və ütüləmə yeri.

**D**

Gimnastika zalı və ya pavilyon -90 kv saj, hündürlüyü 3 saj.

Onun daxilində: a) ayrıca girişi olan əl əməyi emalatxanası;
b) su dolabları olan tualet. Həyətə çıxışı olan gimnastika zalı.

***Ümumi şərtlər***

1) Məktəb binasının layihələndirilməsi zamanı tədris müəssisəsi tipinə uyğun olaraq siniflər qarşısında eni 8 arşın olan açıq istirahət dəhlizləri nəzərdə tutulmalıdır. Maddə 3-də göstərilən sinif otaqlarının pəncərələri şimal-şərqə baxmalı, onların xarici divarları döngə boyunca 4 sajendən az olmayaraq yerləşdirilməlidir. Xüsusi siniflərin pəncərələri digər tərəfə baxa bilər.

2) Məktəbin birinci mərtəbəsinin və yaşayış binasının döşəməsi yerin səthindən ən azı 0,50 saj hündür olmalıdır.

3) Binalar yerli əhəng daşı ilə tikilməli, üzlüyü kirəc daşı əhəngindən boz səhra rəngində olmalıdır. Dekorativ astar kərpicdən də ola bilər. Tikintinin üslubu layihənin müəllifinin öhdəsinə buraxılır.

4) Siniflərin və dəhlizlərin tavanları yanmayan materialdan olmaldır.

5) Layihə eskizli olmalı, miqyası isə: baş plan üzrə 1:500, mərtəbələrin incəliklərinə qədər 1:200, fasad və kəsiklər üçün 1:100 və aşağıdakı çertyojlardan ibarət olmalıdır:

a) baş plan;
b) bütün mərtəbələrin planları;
c) məktəbin küçəyə baxan fasadları;
ç) hər bina üçün ayrıca fasad;
d) binanın layihəsinin və kubik məzmununun müəyyənləşdirilməsi üçün zəruri olan kəsiklər olmalıdır, bu kəsiklərdən biri akt zalından keçməlidir.
e) otaqların faydalı sahəsinin və kubik məzmunu səkidən karnizədək olan hündürlük nəzərə alınmaqla qeyd edilməlidir. Bu qeydlər çertyojun uyğun yerlərində verilə bilər.

6) Hər bir yer planda öz adı ilə verilməli, bütün sahələrin ölçüləri və kvadrat sahəsi daş divarlar da daxil olmaqla sajenlə göstərilməlidir.

7) Çertyojların yerinə yetirilmə üsulu layihə müəllifinin ixtiyarına verilir.

8) Layihələr qovluqlarda (bağlama şəklində yox) devizlə təqdim olunmalıdır.

Layihəyə müəllifinin adı, familiyası, dərəcəsi və bütöv ünvanı göstərilən möhürlü zərflər əlavə edilməlidir.

9) Müsabiqədə yalnız Rusiyada daimi yaşayan memarlar iştirak edə bilər.

10) Layihənin ***İmperatorluğun Sankt-Peterburq Memarlar Cəmiyyətinə***

(Moyka, 83) təqdim edilmə müddəti 20 iyul 1904-cü il saat 3-də bitir.

İddiaçılar layihənin bu müddətdən gec olmayaraq təqdim edildiyini təsdiq edən poçt qəbzini təqdim etməlidirlər. Eyni zamanda layihə cəmiyyətin ünvanına teleqrafla göndərilməsi üçün poçta verilməlidir. Teleqramda layihənin hansı müsabiqə üçün və hansı devizlə göndərilməsi mütləq göstərilməlidir. Layihələr poçtla qeyd olunan vaxtdan bir həftə sonra göndərilərsə, baxılmayacaq.

11) Müsabiqə proqramının hər hansı maddəsinin aydınlaşdırılması ilə bağlı sorğular İmperatorluğun

Sankt-Peterburq Memarlar Cəmiyyətinə müsabiqə elan olunduqdan 2 həftə sonra göndərilməlidir. İzahatlar Cəmiyyətin orqanı olan “Memar” jurnalında dərc ediləcəkdir.

12) Cəmiyyət müsabiqə layihələrini “Memar” jurnalında nəşr edə bilər.

13) Mükafatların verilməsindən əvvəl və sonra layihələr Cəmiyyətin binasında nümayiş olunacaq.

14) Uğur qazanan 3 ən yaxşı layihəyə 2650 rubl verilir. Birinci mükafat 1100 rubl, qalan iki mükafatın məbləği münsiflər komissiyası tərəfindən müəyyənləşdirilir.

Bu zaman şura (münsiflər heyəti- F.R.) mükafatlandırılmayan hər hansı bir layihəni 400 rubl məbləğində əldə edə bilər.

15) Cəmiyyətin üzvü olanlardan mükafatın 10 %-i, kənar şəxslərdən 20%-i həcmində vəsait tutulur.



*Kommersiya məktəbinin tikntisi üçün nəzərdə tutulan ərazi Aşağıdan: Merkuryevski (indiki Z. Əliyeva) küçəsi (47,07 saj.), yuxardan Birja (indiki Ü.Hacıbəyli) küçəsi (47,07 saj), soldan Kaspiyski (indiki R.Behbudov) küçəsi (49,50 saj), sağdan döngə (47,60 saj).*

16) Mükafatlandırılan layihələr sifarişçinin mülkiyyətinə daxil edilir, mükafatlandırılmayanlar 20 sentyabr 1904-cü ildən tez olmadan müəllif tərəfindən alına bilməz, sonradan bu layihələr Cəmiyyətin mülkiyyətinə daxil edilir.



*“Gaudeamus” layihəsi (I yer)*



*Layihəyə görə Kommersiya Məktəbinin Birja (Ü.Hacıbəyli) küçəsindən görünüşü*



*Layihəyə görə Kommersiya Məktəbinin Merkuryevski (akademik Z.Əliyeva) küçəsindən görünüşü*



*Layihəyə görə Kommersiya Məktəbinin ümumi görünüşü (“22 №-li layihə”)*

17) Bu müsabiqə Cəmiyyət tərəfindən işlənib hazırlanmış memarlıq müsabiqələri qaydalarına uyğundur.

18) Münsiflər komissiyasının tərkibinə *Cəmiyyət tərəfindən* - L.N.Benua, Q.D.Qrimm, A.İ.fon Qoqen, O.R.Muns və P.L.Şestov, məktəb tərəfindən *Qəyyumlar Şurasının* bir nəfər üzvü daxil edilir.

Müsabiqənin şərtlərinə görə binanın layihəsi ilə bağlı Sankt-Peterburq Memarlar Cəmiyyətinə bir neçə sorğu daxil olmuşdu. İddiaçılardan birinin ”Bakı Kommersiya məktəbinin layihəsi müsabiqə”sinə göndərdiyi sorğuda deyilir: ”A, B, V, Q və D binaları hər biri ayrıca korpusdan ibarət olmalıdır, yoxsa 1, 2 və ya 3 ümumi korpusda birləşdirilə bilər?”

Cəmiyyət Kommersiya məktəbinin qəyyumlar şurası ilə əlaqə saxladıqdan sonra həmin suala belə cavab verir: “Məktəbin şurası teleqramla bəyan edir ki, binaların yerləşmə forması layihə müəllifinin ixtiyarına verilir. Bununla bərabər məktəbin şurası proqrama əlavə olaraq qeyd edir ki, binanın baş fasadı Merkuryevski küçəsinə baxmalıdır.”

Onu da qeyd edək ki, “Bakı Kommersiya Məktəbinin layihələri müsabiqəsi”nə xeyli sorğular göndərilmişdi.

Həmin sualların və cavabların bəzilərinə diqqət yetirək:

1. *Direktor, inspektor və xidməti heyətin (personalın) mənzilləri üçün ayrıca həyətlər lazımdırmı, yoxsa onlar şagirdlər üçün olan həyətdən istifadə edə bilərlər?*

Cavab: Şagirdlər üçün olan həyətdən istifadə edə bilərlər.

2.*Şagirdlər üçün girişdə nəzərdə tutulan hər iki qarderob 1-ci mərtəbədə yerləşdirilməlidir, yoxsa onlardan biri 2-ci mərtəbədə yerləşə bilər?*

Cavab: Hər iki qarderob 1-ci mərtəbədə yerləşdirimməlidir.

3.*26-28 kv.saj. 2 qarderob əvəzinə, hər biri ayrı-ayrı mərtəbədə yerləşən 3 qarderob olmazmı?*

Cavab: Proqramın tələbləri buna yol vermir.

4.*Akt zalının səhnəsi daimi, yoxsa zalın bir hissəsi kimi nəzərdə tutulmalıdır, yəni lazım olan anda səhnəyə uyğunlaşdırılsın?*

Cavab: Səhnə daimi olmalıdır.

5.*Tədbirlərə və konsertlərə toplaşan insanlar üçün xüsusi tualet olmalıdırmı? Bəlkə ümumi şagird su dolabları kifayətdir? Su dolablarında hər gözlüyə 25 şagird hesabı ilə hər mərtəbəyə 12-13 gözlük kifayət edərmi?*

Cavab: Tədbir iştirakçıları üçün su dolablarında xüsusi gözlüyün nəzərdə tutulmasına ehtiyac yoxdur, akt zalı mərtəbəsində gözlüklərin sayı layihə müəllifindən asılıdır.

6.*Əgər şimal-şərqə sinif otaqlarının pəncərələri deyil, digər otaqlar baxarsa, tələb edilən 4 saj. imtina etmək olarmı?*

Cavab: Proqramın qəti tələbi ilə bu sual gündəmdən düşür. 3-cü maddədə göstərildiyi kimi sinif otaqlarının pəncərələri mütləq şimal-şərq istiqamətinə layihələndirilməlidir.





*Layihəyə görə (III yer) Kommersiya Məktəbinin binasının görünüşü*

*7.Fasadın (üzlüyün) miqyası bir qədər (1:125 əvəzinə 1:100) kiçildilə bilərmi ki, çertyoju vatman kağızına yerləşdirmək mümkün olsun.*

Cavab: Miqyasın kiçildilməsindən söhbət gedə bilməz.

Müsabiqəyə 20 layihə təqdim olunur. Onlardan 19-u müsabiqə komissiyası tərəfindən dəyərləndirilir. 8 oktyabr 1904-cü ildə müsabiqəyə yekun vurulur.

Görkəmli Peterburq memar-mühəndislərinin (S.P.Qalenzovski, İ.V.Padlevski, K.Q.Skolimovski) “Gaudeamus” devizi ilə təqdim etdikləri layihəyə *birinci mükafat* (1100 rubl.), memar-mühəndis Q.T.Mikelovun “22№-li” devizi ilə təqdim etdiyi layihəyə *ikinci mükafat* (900 rubl), memar-mühəndis A.F.Bubıra və sonralar Dağüstü parkın və Bakının baş planının müəlliflərindən biri olan L.A.İlinin layihəsinə *üçüncü mükafat* (650 rubl.) verilir. Amma nədənsə, Bakı Kommersiya Məktəbinin tikintisi üçün 2-ci mükafata layiq görülmüş layihə məqbul sayılır. Bina həmin layihə əsasında tikilir. Araşdırma zamanı bu maraqlı və sirli sualın cavabına rast gəlmədik. Sadəcə, arxivdə saxlanılan memarlıq incisi olan digər iki layihənin Bakının başqa bir məkanında məktəb binası kimi reallaşdırılmamasına təəssüf etdik. Hesab edirəm ki, həmin layihələr əsasında tikilən məktəb binaları şəhərimizin gözəlliyini daha da artırmış olardı. 2-ci mükafatın sahibi Q.T.Mikelovun təqdim etdiyi layihə ətrafdakı tikililərdən fərqlənirdi. Kommersiya Məktəbinin binasının tikildiyi illərdə onunla üzbəüz olan boş sahədə, indiki Dövlət Təhlükəsizliyi Xidmətinin Mədəniyyət Mərkəzinin yerində Müqəddəs Bakirə Məryəm kilsəsinin (katolik kilsəsi) tikintisinə başlanmışdı. Belə fərziyyə var ki, yan-yana duracaq iki bina memarlıq üslubuna görə bir-birindən fərqlənməməli idi. Binanın ərsəyə gəlməsində tikinti mühəndisi və memar A.Y.Dubovun (bəzi tədqiqatçılar onu məktəbin layihəsinin həmmüəllifi hesab edirlər) və podratçı Hacı Qasımovun mühüm xidmətləri olub. Binanın



*Bakı Kommersiya Məktəbinin tikintisi zamanı (ortada iş icraçısı A.Y.Dubov)*

tikintisinə 1908-ci ildə başlanılması və 1913-cü ildə tamamlanması ehtimal edilir. A.Y.Dubovun şəxsi arxivində inşaatın gedişi prosesini əks etdirən bir neçə fotoşəkil saxlanılır. Həmin şəkillərin arxasında "Bakıda Kommersiya Məktəbinin tikintisi. Çınqılın yuyulması və betonun hazırlanması. 1909-1911-ci illər" yazılmışdır. M.S.Şapsovçin 1913-cü ildə nəşr etdirdiyi "Bakı və onun rayonları" adlı illik sorğu kitabında Bakı Kommersiya Məktəbinin ilk dəfə yeni ünvanı - Budaqova 14 (Binanın indiki R.Behbudov küçəsi tərəfdən də giriş qapısı olmuşdur) yazılmışdır.

1919-cu ildə Kommersiya məktəbinin binası Bakı Darülfünuna verildi. Bina hərbi kazarma kimi istifadə edildiyindən təmirə ciddi ehtiyacı vardı. Təmirdən sonra, 15 noyabr 1919-cu ildə binada ilk dərs günü oldu. Millətimizin tarixində *"yeni bir tərəqqi dövrünün açılmasının ibtidası olacaq bir gün"* baş verdi. "Mənəvi böyüklüyümüzün simvolu" olan təhsil və mədəniyyət məbədimizdə maarif işığı yandı. Universitet 1919-1930-cu illərdə həmin binada fəaliyyət göstərdi.






Böyük rus şairi V.V.Mayakovski Azərbaycanda olarkən iki dəfə (O, Bakıda cəmi 4 dəfə -1906, 1914, 1926 və 1927-ci illərdə olub) Azərbaycan Dövlət Universitetinin tələbələrinin qonağı olub, burada öz şeirlərini oxuyub. Bu səbəbdən də böyük şairə hörmət və ehtiram əlaməti olaraq Pedaqoji Universitetin yan fasadında 1966-cı ildə Azərbaycan və rus dillərində yazılmış mətn ilə V.V.Mayakovskinin xatirə lövhəsi vurulmuşdur: "*Böyük sovet şairi Vladimir Vladimiroviç Mayakovski burada, Azərbaycan Pedaqoji İnstitutunun böyük zalında dəfələrlə öz şeirlərini oxumuşdur*".



*Bakı Kommersiya Məktəbinin tikintisi zamanı*

## Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunun təşkili

20-ci illərin sonu, 30-cu illərin əvvəllərində respublikada ümumtəhsil məktəblərinin şəbəkəsi xeyli genişləndi. Savadsızlığın ləğvi, mədəni inqilabın və icbar ibtidai təhsilin həyata keçirilməsi istiqamətində ciddi işlər görüldü. Həyata keçirilən tədbirlərə baxmayaraq müəllim kadrlarına ciddi ehtiyac qalmaqda idi. Bu ehtiyacı ödəmək üçün tam ali təhsili olmayan, hazırlıqlı şəxslərdən də istifadə edilir, onların ixtisaslarını artırmaları üçün pedaqoji kurslar təşkil olunurdu. Bu tədbirlər bəzi hallarda demokratik proseslərin ləngiməsinə, peşəkarların nüfuzunun zəifləməsinə, qeyri peşəkarların məktəbə işə cəlb edilməsinə səbəb olsa da, məktəbləri müəllim kadrları ilə təmin etməyə istiqamətlənmişdi.

Azərbaycan Xalq Maarif Komissarlığında istehsalatdan ayrılmadan ali pedaqoji təhsil almanın ən yaxşı yolu kimi - qiyabi ali pedaqoji təhsilin yaradılması qərara alındı. Ali pedaqoji təhsilin təşkilində RSFSR-in təcrübəsindən[70] istifadə olundu. Xalq Maarif Komissarlığının təşəbbüsü ilə 1927-ci ildə ilk olaraq qiyabi pedaqoji məktəblər (texnikumlar) təşkil edildi. Qiyabi pedaqoji məktəbləri (texnikumları) bitirənlərin ali təhsil almalarını təmin etmək məqsədilə Azərbaycan Xalq Komissarları Sovetinin 1929-cu il 25 aprel tarixli qərarı ilə Azərbaycan Dövlət Universitetinin nəzdində qiyabi *Pedaqoji fakültə* yaradıldı. 21 may 1929-cu ildə Azərbaycan Xalq Maarif Komissarlığı tərəfindən həmin fakültənin əsasnaməsi təsdiq olundu[71].

Qiyabi Pedaqoji fakültənin nəzdində 4 şöbə fəaliyyət göstərirdi:1) məktəb inspektorları; 2) fiziki-texniki; 3) Azərbaycan dili və ədəbiyyatı; 4) rus dili və ədəbiyyatı[72].

Qiyabi Pedaqoji fakültəyə seçmək və seçilmək hüququ olan hər kəs sənəd verə bilərdi. Qiyabi Pedaqoji fakültənin Azərbaycan və rus bölmələrində məktəb inspektorları ilə bərabər məktəbəqədər, fizika-riyaziyyat, Azərbaycan dili və ədəbiyyatı, rus dili və ədəbiyyatı ixtisasları üzrə müəllimlər hazırlanırdı. 1930-cu ildə ADU-nun ayrı-ayrı fakültələrinin bazasında sahə institutları yarananda qiyabi Pedaqoji fakültə müstəqil *Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutuna* çevrildi. 1931/32-ci tədris ilində 1431 nəfər tələbə təhsil alırdı ki, onlardan da 1073-ü azərbaycanlı, 182 nəfəri rus, 176 nəfəri başqa millətlərin nümayəndələri idi. Tədris ilinin sonunda institutda daha üç yeni ixtisas üzrə şöbə yaradıldı, qiyabiçi tələbələrin sayı 3 mini keçdi[73]. İnstitutun yay sessiyaları ilk vaxtlar Gəncə, Şəki və Şuşa şəhərlərində keçirilirdi. Sonralar imtahan sessiyaları Bakı məktəblərində təşkil edildi. 1932-ci ildə Qiyabi Pedaqoji İnstitut Xalq Maarif Kadrlarının İxtisasını Artırma İnstitutunun tərkibinə daxil edildi. Hər iki institut isə 1933-cü ilin əvvəlində Azərbaycan Pedaqoji İnstitutuna birləşdirildi. Bundan sonra Azərbaycan Pedaqoji İnstitutunda bir sıra ixtisaslarla bağlı yeni şöbələr təşkil edildi. Qiyabi təhsil yolu ilə tarix, dil-ədəbiyyat, fizika-riyaziyyat, kimya-biologiya və ibtidai sinif müəllimlərinin yetişdirilməsi nəzərdə tutulurdu.

Qiyabi ali pedaqoji təhsil sistemində tez-tez təşkilati dəyişikliklərin baş verməsi onun normal fəaliyyətinə mane olurdu. Azərbaycan Xalq Maarif Komissarlığının 1936-cı il 8 avqust tarixli 66 saylı əmrinə əsasən qiyabi şöbə yenidən ADPİ-dən ayrılıb Xalq Maarif Kadrlarının İxtisasını Artırma İnstitutuna birləşdirildi. Lakin yerdəyişmə problemin həllinə o qədər də kömək etmədi. Çünki qiyabi şöbədə ixtisasların və tələbələrin sayı sürətlə artırdı. Tələbələrin sayının, ali pedaqoji təhsilə cəlb edilənlərin əhatə dairəsinin artması qiyabi pedaqoji təhsilin təşkilinin yeni formalarının yaranmasını şərtləndirdi.

1936-1937-ci tədris ilində qiyabi təhsilə cəlb olunan tələbələrin sayı 4 min nəfərə yaxın idi. Qiyabi pedaqoji təhsilə cəlb olunanların sayı əyani təhsilə cəlb olunanları xeyli qabaqlamışdı. Bu hal yalnız Azərbaycanda deyil, keçmiş İttifaqın digər respublikalarında da müşahidə olunurdu.

Ali qiyabi təhsili nizama salmaq məqsədilə SSRİ Xalq Komissarları Soveti 29 avqust 1938-ci ildə "Ali qiyabi təhsil haqqında" qərar qəbul etdi. Həmin qərardan az sonra ADPİ-nin nəzdində fəaliyyət göstərən qiyabi şöbə əsasında 1938-ci ildə müstəqil *Ali Qiyabi Pedaqoji İnstitut* yaradıldı. İkiillik Qiyabi Müəllimlər İnstitutu, Xalq Maarif Kadrlarının İxtisasını Artırma İnstitutu da yeni yaranan institutun tərkibinə verildi.

---

[70] *Rusiyada ilk qiyabi institut 1850-ci ildə açılıb. 1920-ci ildə ayrı-ayrı institutların nəzdin-də xeyli qiyabi kurslar təşkil edilmişdi. Sonralar həmin kurslar şöbələrə çevrildi. Şöbələrin əsasında qiyabi institutlar yaradıldı.*

[71] *Azərbaycan Respublikasının Dövlət Arxivi. F.57, siy.1, iş.619, v.83-84*

[72] *Yenə orada*

[73] *Yenə orada. F.796,siy.16, iş 379,v.16*

Maddi çətinlik səbəbindən ADPİ-də əyani oxuya bilməyən tələbələrdən 167 nəfəri Ali Qiyabi Pedaqoji İnstituta köçürüldü. Əyani oxumağa vaxtları olmayan, təhsillərini qiyabi davam etdirmək istəməyən 111 nəfər tələbə isə institutdan xaric edildi.

Həmin dövrdə Ali Qiyabi Pedaqoji İnstitutda 6 fakültə fəaliyyət göstərirdi:1) Tarix; 2)Dil-ədəbiyyat; 3) Fizika-riyaziyyat; 4) Coğrafiya; 5) Təbiyyat; 6) Məktəbəqədər. Fakültələrin nəzdində 22 kafedra fəaliyyət göstərirdi.

Sovet-alman müharibəsinin başlanması ilə təhsil ocaqlarının fəaliyyətində ciddi çətinliklər yarandı. İnstitutlar üçün nəzərdə tutulan maliyyə vəsaitləri xeyli azaldıldı. Bu səbəbdən də Azərbaycan SSR XMK-nın 30 avqust 1941-ci il tarixli əmri ilə Ali Qiyabi Pedaqoji İnstitut yenidən ADPİ-nin qiyabi şöbəsinə çevrildi. Sonra isə ADPİ ilə birlikdə ADU-nun tərkibinə daxil edildi. Müharibə şəraiti ilə əlaqədar olaraq qiyabi pedaqoji təhsil 3 il Azərbaycan Dövlət Universitetində təşkil edildi. 1944-cü ildə yenidən Ali Qiyabi Pedaqoji İnstitut kimi öz fəaliyyətini bərpa etdi.

İnstitutda 18 kafedra, marksizm-leninizmin əsasları, zoologiya, kimya, fizika, tarix, coğrafiya kabinetləri və 12 min kitab fondu olan kitabxana fəaliyyət göstərirdi. Müharibə dövrünün çətinliklərinə baxmayaraq, respublikanın ayrı-ayrı bölgələrində müəllim işləyən 1550 nəfər qiyabiçi tələbəni tədrisə cəlb etmək mümkün oldu. Həmin ilin yay semestrindən sonra təşkil edilən buraxılış imtahanında iştirak edən 65 nəfərdən 58 nəfəri müvəffəqiyyətlə imtahan verib diplom aldı. Qiyabiçi tələbələrin təhsil işlərinə 72 nəfər professor-müəllim cəlb edilmişdi ki, onlardan da 6 nəfəri professor, 42 nəfəri dosent idi. Ə.Dəmirçizadə, S.Cəfərov, M.Şirəliyev dilçilikdən, Ə. Sumbatzadə Avropa ölkələri tarixindən, S.Hüseynov kimyadan, Əlizadə fizikadan, M.Cavadov, C.Qasımov riyaziyyatdan, Əli Sultanzadə, M.A.Abdullayev Azərbaycan dilindən qiyabiçilər üçün tədris vəsaitləri hazırlamışdı. Pedaqoji texnikumları və ikiillik müəllimlər institutlarını bitirənlər üçün ali təhsil almağın ən səmərəli yolu qiyabi təhsil hesab olunurdu. Müharibədən sonra, ilk dəfə 1945/46-cı tədris ilində Ali Qiyabi Pedaqoji İnstituta tələbə qəbulunda müsabiqə vəziyyəti yarandı. Müsabiqəyə buraxılan 1231 nəfər iddiaçıdan yalnız 971 nəfəri seçildi, bilik səviyyələri aşağı olan 260 nəfər uğur qazana bilmədi. Sonrakı illərdə ali qiyabi pedaqoji təhsilə cəlb edilənlərin sayı xeyli artdı. Hər il Ali Qiyabi Pedaqoji İnstituta 1200-1500 nəfər tələbə qəbul edilirdi. Tələbələrin içərisində bir başa III kursa qəbul olunan müəllimlər institutlarının məzunları üstünlük təşkil edirdi. Məsələn, 1957-ci ildə instituta qəbul olunan 1500 tələbədən 1125-i (75%) ikiillik müəllimlər institutlarının məzunları idi. 1950-1957-ci illərdə institutun 5000 məzunu olmuşdur. Yalnız 1957-ci ildə Qiyabi Pedaqoji İnstitutu müxtəlif ixtisaslar üzrə 751 nəfər bitirmişdi.

1958/59-cu tədris ilində Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunun 7 fakültəsində 4772 nəfər təhsil alırdı[74].

| № | Fakültələrin adı | Tələbələrin sayı |
|---|---|---|
| 1 | Tarix | 473 |
| 2 | Dil-ədəbiyyat | 922 |
| 3 | Fizika-riyaziyyat | 1368 |
| 4 | Rus dili və ədəbiyyatı | 1293 |
| 5 | Təbiyyat | 382 |
| 6 | Coğrafiya | 278 |
| 7 | Məktəbəqədər tərbiyə | 56 |
| **Cəmi** | | **4772** |

[74] *Xasməmmədov T. Sovet Azərbaycanında qiyabi ali pedaqoji təhsilin inkişafına dair //Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunun Əsərləri, Bakı, 1958, V cild, s.7*


*Tələbələr kimya laboratoriyasında*


*Tələbələr fizika laboratoriyasında*

Azərbaycan Respublikası Nazirlər Sovetinin 26 may 1959-cu il "Azərbaycan ali pedaqoji məktəblərin profilləri haqqında" qərarına əsasən Azərbaycan Qiyabi Pedaqoji İnstitutu 1 iyul 1959-cu ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna birləşdirildi. İnstitutda təlim üç dildə (Azərbaycan, rus və erməni) dillərində aparılırdı. Tələbələrdən 3021 nəfəri Azərbaycan, 1550 nəfəri rus, 201 nəfəri erməni bölməsində təhsil alırdı.

Ali qiyabi təhsilə nəzarəti gücləndirmək məqsədilə institutda qiyabi şöbə üzrə prorektor (direktor müavini) vəzifəsi təsis olundu. *Məmmədsəlim Tahirli*[75] qiyabi şöbə üzrə prorektor təyin edildi. Birləşmə nəticəsində ADPİ-nin tələbələrinin sayı 3256-dan 7208-ə yüksəldi.

## Azərbaycan Dövlət Pedaqoji İnstitutu Azərbaycan Pedaqoji Akademiyasına niyə çevrilmədi?

30-cu illərdə Pedaqoji İnstitutun tədris və elmi həyatında böyük canlanma yarandı. İnstitut elmi-pedaqoji fikrin əsas mərkəzinə çevrildi. 1927-ci ildə ADU-ya verilən kimya, fizika laboratoriyaları, zəngin muzey və kitabxana yenidən gələcək müəllimlərin ixtiyarına verildi. ADU-nun fəaliyyətinin dayandırması səbəbindən universitetin tanınmış professor-müəllim heyəti institutda pedaqoji fəaliyyətə cəlb olundu.

Azərbaycan Xalq Maarif Komissarlığının 1930-cu il 18 yanvar tarixli əmri ilə professorlar M.Mirqasımov, B.Çobanzadə, Ə.Ubaydulin, B.B.Komarovski, dosentlər V.M.Xuluflu, Ə.K.Zəkuzadə, Ü.Hacıbəyov, Z.Qayıblı, S.C.Hüseynov, Z.M.Şahtaxtinskaya, S.X.Osmanzadə, müəllimlər A.Bukşpan, N.Xalfin, N.Xalfina, A.Şaiq, H.Zeynallı, A.Masaxanlı, Ə.Eyvazov, A.Teterev, Ə.Hacıyev, A.Kosıçkin, M.Abdullayev, A.Frenkel, T.Abdullayev, M.Şeydayev, C.Cəbrayılbəyli, M.Quliyev, V.Mustafayev, H.Əliyev, Ə.Xudaverdiyev, doktor Ə.Şahmalıbəyov Pedaqoji İnstituta müəllim təyin olundular.

Azərbaycan K(b)P MK-nın 1 yanvar 1931-ci il tarixli qərarı ilə ***Məmməd Abbas oğlu Bayramov*** Pedaqoji İnstituta direktor təyin edildi.

*[75] Məmmədsəlim Ələkbər oğlu Tahirli 30 mart 1908-ci ildə Şamaxıda böyük Azərbaycan şairi Mirzə Ələkbər Sabirin ailəsində anadan olub.Zaqafqaziya Hərbi-Hazırlıq Məktəbində və Azərbaycan Dövlət Pedaqoji İnstitutunda təhsil alıb. 1938-1940-cı illərdə Azərbaycan Dövlət Gənc Tamaşaçılar Teatrına rəhbərlik edib. Azərbaycan KP MK-da təlimatçı işləmişdir. "Uşaqgəncnəşr" nəşriyyatının yaradıcısı və rəhbəri olmuşdur (1945). Qiyabi Pedaqoji İnstitutun Dil-ədəbiyyat fakültəsinin dekanı (1949-1951), elm və tədris işləri üzrə direktor müavini (1951-1959), ADPİ-nin qiyabi işlər üzrə prorektoru (1959-1989) vəzifəsində çalışmışdır. 1973-cü ildə ona dosent elmi adı, 1978-ci ildə Əməkdar müəllim fəxri adı verilib. "Şərəf nişanı", "SSRİ maarif əlaçısı", "Azərbaycan SSR xalq maarif əlaçısı" döş nişanları ilə təltif olunub. 14 yanvar 1993-cü ildə Bakı şəhərində vəfat edib.*



**Məmməd Abbas oğlu Bayramov**
*(1898-1938)*

*1898-ci ildə Gəncə şəhərində (bəzi sənədlərdə Nərimanov rayonunun (indiki Göygöl rayonunun) Zurnabad kəndi göstərilir) muzdur ailəsində anadan olub. 1913-1917-ci illərdə Gəncə Müəllimlər Seminariyasında təhsil alıb. Bir müddət Gəncədə müəllimlik edib. 1918-1920-ci illərdə Milli Ordunun əsgəri olub. 1920-ci ilin iyun- dekabr aylarında Qızıl Orduda pulemyot dəstəsinə rəhbərlik edib.*

*1921-1922-ci illərdə Gəncədə Xalq Maarif Şöbəsinin inspektoru olub. 7 ay Gəncədəki hərbi hissədə məktəb işlərinə rəhbərlik edib. 1923-1928-ci illərdə Azərbaycan Dövlət Universitetinin Tarix-filologiya fakültəsinin tarix şöbəsində ali təhsil alıb. Təhsil illərində ictimai-siyasi və pedaqoji fəaliyyətini davam etdirib. 1924-1928-ci illərdə Azərbaycan diviziyasında məktəb işləri şöbəsinin rəisi vəzifəsində çalışıb. Ordudan tərxis olunduqdan sonra 1929-1930-cu illərdə Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutunun Rusiyada sinfi mübarizə tarixi kafedrasının dosenti olub, sinfi mübarizə tarixi ilə bağlı araşdırmalar aparıb.*

*Azərbaycan K(b)P MK-nın qərarı ilə 1 yanvar 1931-ci ildə Ali Pedaqoji İnstituta direktor təyin edilib. O, 1933-cü ilin mart ayına kimi həmin vəzifədə çalışıb. Bir müddət Tovuz rayon Xalq Maarif Şöbəsinə rəhbərlik edib. Xalq Maarif Komissarlığında pedaqoji kadr hazırlığı idarəsinin əməkdaşı olub. Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinin Rəyasət heyəti tərəfindən 26 sentyabr 1935-ci ildə Azərbaycan Mərkəzi Arxiv idarəsinin müdiri təyin edilib. 11 fevral 1937-ci ildə işdən azad edilib və xalq düşməni kimi həbs olunub.*

*3 iyul 1938-ci ildə Bakı şəhərində güllələnib.*

Onun ciddi səyi ilə qısa bir vaxtda stabil müəllim kollektivi formalaşdırıldı, struktur dəyişikliyi edildi, yeni fakültə və kafedralar yaradıldı. İnstituta ayrılan 1 milyon 668 min 645 manat vəsait maddi-texniki bazanın möhkəmləndirilməsinə, kitabxana fondunun yeniləşdirilməsinə, laboratoriyalar üçün yeni avadanlıqların alınmasına xərcləndi. İnfrastrukturun yenilənməsi təlimin səmərəli təşkilində mühüm rol oynadı.

Məmməd Bayramov müəllim kadrları hazırlığında institutun statusunun yüksəldilməsi istiqamətində xeyli tədbirlər həyata keçirtdi. Azərbaycan Pedaqoji İnstitutunun V.İ.Lenin adına ***Azərbaycan Pedaqoji Akademiyasına*** çevrilməsi ilə bağlı rəsmi orqanlar qarşısında vəsatət qaldırdı.

Bu məqsədə o, 15 sentyabr 1931-ci ildə ÜİK(b)P-nin Zaqafqaziya Vilayət katibi ***Kartvelişviliyə***, Azərbaycan K(b)P MK-nın katibi ***Ağa Sultanova***, Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri ***Dadaş Bünyadzadəyə,*** Xalq maarif komissarı ***Maqsud Məmmədova*** məktub ünvanlamışdır. İnstitut Partiya komitəsinin katibi S.Qəniyevin və Həmkarlar təşkilatının sədri H.Hüseynovun da imzaladığı həmin məktubda Azərbaycanda müəllim kadrları hazırlığında Azərbaycan Dövlət Pedaqoji İnstitutunun xidmətlərindən bəhs olunur, məzunların ibtidai, natamam orta (yeddiillik), doqquzillik məktəblərdə, pedaqoji texnikumlarda fədakarlıqla çalışdıqları bildirilir. Müəllim kadrları hazırlığını təkmilləşdirmək, tədrisi səmərəli təşkil etmək, tədrisin keyfiyyətini yüksəltmək məqsədilə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunu ***V.İ.Lenin adına Azərbaycan Pedaqoji Akademiyası*** kimi yenidən təşkil etməyi xahiş edir.

Məktubda yazılır: "*Böyük ictimai-siyasi əhəmiyyət daşıyan bu tədbir (Azərbaycan Pedaqoji*

*Akademiyasının yaradılması-R.F.) Şərqdə güclü pedaqoji təhsil mərkəzinin yaradılmasına səbəb olacağı şübhə doğurmur. İnstitutda 4485 tələbə təhsil alır ki, onlardan 680 nəfəri payız qəbulunda götürülmüşdür. Bu da nəzərdə tutulan planın 112 % yerinə yetirilməsidir. Qəbul olunanların sosial-siyasi vəziyyətləri belədir: -fəhlə 56 % (1930/31-ci tədris ilində 25,5 % olub), kolxozçu -15% (1930/31-ci tədris ilində 1 % olub), partiya və komsomol üzvü olanlar -68 % (1930/31-ci tədris ilində 40,5 % olub), türklər (azərbaycanlılar -F.R.) -95%, azsaylı xalqlar 5% (1930/31-ci tədris ilində 0,5 % olub). Qəbul olunanların 25 %-i türk (Azərbaycan - F.R.) qızlarıdır (1930/31-ci tədris ilində 15 % olub). Pedaqoji işçi fakültəsinə götürülən 354 nəfərdən 264 nəfəri azərbaycanlı (onlardan da 38 nəfəri azərbaycanlı* qız), *89 nəfəri azsaylı xalqların nümayəndələridir. İşçi fakültəyə qəbul olunanların hamısı ya fəhlə, ya da fəhlə və kəndlilərin övladlarıdır. Partiya və hökumətin türkləşdirmə siyasəti V.İ.Lenin adına ADPİ-də uğurla həyata keçirilir. Professor-müəllim heyətinin tərkibi əsasən kommunistlərdən ibarətdir.*

*1930/31-ci tədris ilində onlar akademik heyətin 6,4 %-ni təşkil etdikləri halda, 1931/32-ci tədris ilində 23,8 %-ə yüksəlmişdir. Tədris dili Azərbaycan dilidir. İnstitutun 200 nəfər elmi əməkdaşından 189 nəfəri ya türkdür, ya da türk dilini bilir. Fakültələrin tədris planları işlənərkən Azərbaycan SSR-in neft, pambıq, kənd təsərrüfatının kollektivləşdirilməsi siyasəti nəzərə alınmışdır. 1930/31-ci tədris ilində 578 məzunun hamısı rayonlara göndərilmişdir. Hər cür şovinizmə və millətçiliyə qarşı barışmaz olan V.İ.Lenin adına APİ-nin kollektivi Lenin milli siyasətinin həyata keçirilməsi istiqamətində var gücləri ilə çalışırlar. Bunları nəzərə alaraq V.İ.Lenin adına ADPİ-nin əsasında* ***V.İ.Lenin adına Ali Pedaqoji Akademiya*** *yaratmağınızı xahiş edirəm. Fəhlə və kəndlilərlə bir cəbhədə olaraq AK(b)P MK və Bakı Komitəsinin rəhbərliyi altında sinfi düşmənlərə, agentlərə, simasını gizlətmiş opportunistlərə qarşı bundan sonra da mübarizə aparacağıq*”[76].

Təəssüf ki, Məmməd Bayramovun bu təşəbbüsü reallaşmadı.

1931-ci il sentyabrın 29-da V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun rektorluğunun iclasında 28 kafedranın strukturu və professor-müəllim heyəti təsdiq edildi. Siyasi iqtisad kafedrasına *prof B.Həsənbəyov*, İqtisadi coğrafiya kafedrasına *dos.M.Çuvarlinski*, SSRİ tarixi kafedrasına *prof.B.Tixomirov*, Yaxın Şərq tarixi kafedrasına *prof.A.Bukşpan*, Azərbaycan tarixi kafedrasına *prof. V.Xuluflu,* Dialektik materializm kafedrasına prof *A.Çiçikalov,* Pedaqogika kafedrasına *dos.M.Rəhimli*, Qərb tarixi kafedrasına *prof.P.P.Fridolin*, Dil-ədəbiyyat kafedrasına *dos.Ə.Nazim*, Riyaziyyat kafedrasına *dos.M.Əfəndiyev*, Ümumi və qeyri-üzvi kimya kafedrasına *dos.S.Hüseynov*, Pedologiya kafedrasına *dos.S.Hacıyev*, Mineraloqiya və geologiya kafedrasına *prof.A.Vəzirzadə,* Zoologiya və təbiətşünaslığın metodikası kafedrasına *prof.F Rzabəyli,* bitki morfologiyası və sistematikası kafedrasına *prof.A.Qrossheyim,* Riyaziyyat metodikası kafedrasına *prof.A.Ammosov,* İctimaiyyat və tarixin metodikası kafedrasına *dos.A.Şapirov,* İnsan və heyvan fiziologiyası kafedrasına *dos.A.Əmirov,* Fizika kafedrasına *dos.R.Məlikov* müdir təyin olundu. Ayrı-ayrı kafedralarda professorlar H.B.Şahtaxtinski, Y.H.Məmmədəliyev, B.V.Çobanzadə, B.B.Komarovski, A.B.Baqri, Ə.S.Ubaydulin, dosentlər M.M.Mehdizadə, F.S.Qasımzadə, P.A.Qasımov, M.H.Bayramov və b. çalışırdı.



*Ali Pedaqoji İnstitutun binası (1930)*

[76] *Рапорт Азербайджанского педагогического инстита им.В.И.Ленина о своей работе. Газ.«Бакинский рабочий». № 2014, 15 сентября 1931*

1930/31-ci tədris ilində Pedaqoji İnstitutun yenidən təşkilindən sonra ilk buraxılışı oldu. Həmin buraxılışda Təbiyyat-kimya fakültəsini kimya ixtisası üzrə 31 nəfər (17 nəfər Azərbaycan bölməsi, 14 nəfər rus bölməsi) biologiya şöbəsini 14 nəfər, riyaziyyat şöbəsini isə 31 nəfər, İctimaiyyat-ədəbiyyat fakültəsinin tarix şöbəsini 106 nəfər (71 nəfər Azərbaycan bölməsini, 35 nəfər rus bölməsi), ədəbiyyat şöbəsini 25 nəfər bitirdi. Bir il sonra kimya-biologiya şöbəsindən 37, İctimaiyyat-ədəbiyyat fakültəsinin ədəbiyyat şöbəsindən 43 nəfər məzun oldu. Onlarla məzun az sonra Azərbaycan elmində və mədəniyyətində səlahiyyətli söz sahibinə çevrildi ki, onların da içərisində Azərbaycan EA-nın həqiqi üzvləri Heydər Hüseynov, Məmməd Cəfər Cəfərov, müxbir üzvləri Əzəl Dəmirçizadə, Heydər Əfəndiyev, prof.Mehdixan Vəkilov, prof. Ağarəfi Ağayev, prof.Əlyar Qarabağlı, Xalq şairi Mirvari Dilbazi və b. var idi.

1932/33-cü tədris ilində Pedaqoji İnstitutun 3 fakültəsində 1022 nəfər tələbə təhsil alırdı. Onlara dərs deyən 180 professor-müəllimdən 17 nəfəri professor, 46 nəfəri dosent idi[77].

Fakültələr və kurslar üzrə tələbələrin bölgüsü aşağıdakı kimi idi.

| Fakültələr | Kurslar | | | | |
|---|---|---|---|---|---|
| | I | II | III | IV | Cəmi |
| Təbiyyat-riyaziyyat | 179 | 178 | 131 | 20 | 508 |
| İctimaiyyat-ədəbiyyat | 136 | 128 | 48 | 19 | 331 |
| Pedaqogika | 158 | 62 | 44 | 24 | 288 |
| **Cəmi** | **473** | **368** | **223** | **63** | **1127** |

1930/31-ci tədris ilində Pedaqoji İnstitutda ***Müfəttiş-inspektor fakültəsi***, 1932/33-cü tədris ilində ***Siyasi maarif fakültəsi*** açıldı. 1932-ci ildə bütün fakültə və ixtisaslar üzrə rus və erməni şöbələri fəaliyyət göstərməyə başladı. Həmin illərdə institutda türkləşdirmə xətti, əsasən, başa çatdırıldı.

1931/32-ci tədris ilində ADPİ-də oxuyan tələbələrin 80%-i azərbaycanlılardan ibarət idi. 1931-1934-cü illərdə Pedaqoji İnstitutu bitirən 833 nəfərdən 764-ü azərbaycanlı idi[78]. Tədrisin keyfiyyətinin yüksəldilməsi, tələbələrin biliyinin obyektiv qiymətləndirilməsi istiqamətində səmərəli işlər görüldü, müəllim hazırlığına verilən tələblər artırıldı. Bircə faktı qeyd edək ki, 1932/33-cü tədris ilində ali məktəbə qəbul edilən 588 nəfər tələbədən yalnız 255 nəfəri (43,4%) ali məktəbi müvəffəqiyyətlə bitirə bildi. Pedaqoji İnstitutu uğurla bitirənlərin arasında sonralar görkəmli elm xadimləri kimi tanınan akademiklər: Məmmədağa Şirəliyev, Həmid Araslı, professor Mərdan Muradxanov, xalq yazıçıları İlyas Əfəndiyev, Mehdi Hüseyn, Süleyman Rəhimov, Məmməd Rahim, dramaturq Sabit Rəhman və b. vardı.

---
[77] *Azəbaycan Respublikasının Dövlət Arxivi. F.1656, siy.3, sax.vah.6, v.40*

[78] ***Paşayev N.*** *Sovet hakimiyyəti illərində Azərbaycanda ali təhsilli pedaqoji kadrların hazırlanmasna dair //Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunun Əsərləri, Bakı, 1958, V c.ild, s.67*

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunda tədrisin təşkili (1931-1941-ci illər)

30-cu illərin əvvəllərində Pedaqoji İnstitutda tədris və elmi işlərin keyfiyyətinin yüksəldilməsi məqsədilə həyata keçirilən tədbirlər öz bəhrəsini verdi. Pedaqoji İnstitutunun 1930/31-ci tədris ili üçün nəzərdə tutulan tədris planı əvvəlki illərin tədris planlarından əsaslı şəkildə fərqlənirdi. Bununla yanaşı qeyd edək ki, *ümumtəhsil fənləri* (rus dili, bədən tərbiyəsi və hərbi təlim), *ictimai-siyasi fənlər* (ÜİK(b)P-nin tarixi, siyasi iqtisad, Rusiyanın sinfi mübarizə tarixi, dialektik materializm, iqtisadi siyasət, SSRİ-nin siyasi iqtisadiyyatı, SSRİ-də sinfi mübarizənin tarixi), *pedaqoji və metodiki fənlər* (pedaqogika, pedaqogikaya giriş, pedologiyaya giriş, politexnizm nəzəriyyəsi və təcrübəsi, xalq təhsili siyasətinin əsasları) bütün fakültələrdə eyni idi. Bununla bərabər, tədris planında məşğələlər dekadalar üzrə bölünmüşdü. Ümumtəhsil fənləri – rus dili, bədən tərbiyəsi, hərbi təlim dekadada 8 saat, (ümumi saatların 16,6%), ictimai-siyasi fənlər (təşkilati-metodiki və ictimai-tarixi fakültələr istisna olunmaqla) hər dekadada 10-12 saat (ümumi saatların 20-22%) təşkil edirdi. Pedaqoji fənlərə gəldikdə isə hər fakültədə dekadada 12 saat nəzərdə tutulurdu, bunlardan 6-8 saatı praktik məşğələlərə ayrılırdı. Bu tədris planlarında pedaqoji fənlər 20-22% təşkil edirdi. Beləliklə, hər dekadada 48-50 saatdan 28-30 saatı ümumtəhsil, pedaqoji və siyasi fənlərə ayrılırdı. Xüsusi fənlərə 18-20 saat ayrılırdı. Bu da ümumi tədris yükünün 37-40%-ni təşkil edirdi. Tədris planında pedaqoji-psixoloji fənlərə ayrılan saatlar gələcək müəllimlərin peşə hazırlığı üçün tam kifayət edirdi.

1932-ci ildə 3 fakültə fəaliyyət göstərirdi: 1) Ədəbiyyat-ictimaiyyat; 2) Pedologiya-pedaqoji; 3) Təbiyyat-riyaziyyat[79]. Ayrı-ayrı kafedralarda B.B.Komarovski, A.O.Makovelski, Fuad İbrahimbəyov, Əhməd Seyidov kimi təcrübəli pedaqoqlarla bərabər gənc elmi qüvvələr - Mikayıl Rəfili, Əli Sultanlı, Mehdi Yerevanski, Mehdi Mehdizadə, Savalan Ocaqverdizadə, H.Dadaşov, Feyzulla Qasımzadə, Kamil Balakişiyev, Murtuza Əhmədli, Məmməd Mövsümzadə, Abdulla Qarayev çalışırdı.

1933-cü ilin avqust ayında Pedaqoji İnstitutda 26 kafedra fəaliyyət göstərirdi[80]. *Riyaziyyat* kafedrasında 10 (müdir Məmməd Əfəndiyev, dos. A.X.Usubbəyova, prof.Məmməd Əliyev, Bəhram Yusifzadə, Abdulla Tahirzadə, Tağı Namazzadə, Abdulla Təmrazlı, dos.Borisov və b.), *Fiziologiya* kafedrasında 4 (müdir dos. Əsəd Əmirov, dos. K.Balakişiyev, dos. Qənbər Qasımzadə, Abdulla Qarayev), *Geologiya - minerologiya kafedrasında* 2 (müdir prof. Aslan Vəzirzadə, Cəlil Xəlilov), *Zoologiya kafedrasında* 3 (prof. Elpatevski, Z.Şahtaxtinski, Adil Əlizadə), *Biologiya kafedrasında* 6 (müdir prof. FRzabəyli, Zəki Yaqub, Məlikheydər Rzayev, Hacı İsmayılzadə, Z.Əfəndiyeva və b.), *Qeyri-üzvi kimya kafedrasında* 7 (müdir dos.Sadıx Hüseynov, Murtuza Əhmədli, Məmməd Mövsümzadə, D.Əfəndiyev, Yaqub İsmayılzadə və b.), *Üzvü kimya kafedrasında* 7 (müdir dos. Əziz Əliyev, Qulu Mövsümzadə, Əli Hacıyev, Abbasqulu Sultanov və b.), *Fizika kafedrasında* 9 (müdir dos.Rəhim Məlikov, prof.V.İ.Tixomirov, dos. Mehdi Əliyev, dos.Mixaylovski, Rəhim Həsənov, Məmməd Abdullayev, *Bitki morfologiyası və sistematikası* 4 (müdir prof. Qrossheym, dos.Mirmusa Ağamirov, Yəhya İsayev və b.), *Təbiyyatşünaslıq və onun tədris metodikası* 4 (prof. F.Rzabəyli, dos.Xudaverdi Kələntərli, Hacıbala Hacıyev, Qeybulla Abbasov və s.), *Pedologiya kafedrasında* 6 (müdir Surxay Hacıyev, Veysəl Mustafayev, Əhməd Zəkuzadə, Fuad İbrahimbəyov, Hüseyn Ağayev və b.), *Qərb tarixi kafedrasında* 6 (müdir Kuzovenko, Əşrəf Quliyev, dos.A.Yusupov, Həmzə Qasımzadə, Əbülfəz Axundov və b.), *Zaqafqaziyda sinfi mübarizə tarixi kafedrasında* 3 (müdir prof.Xuluflu, dos.Ağamir Məmmədov, Həsən İmanov), *Dilçilik kafedrasında* 14 (müdir dos. A.Tağızadə, Feyzulla Qasımzadə, Lətifə Ömərova, dos.N.Vəzirova və b.), *İqtisadi nəzəriyyə və iqtisadi coğrafiya kafedrasında* 7 (müdir M.Cuvarlinski, dos.Hadı Əliyev, Müslüm Əliyev), *SSRİ tarixi kafedrasında* 3 (prof.Ə.Ubaydulin, dos.Salamzadə, dos.Gülnəzərov), *Yaxın Şərq tarixi kafedrasında*

---

[79] *ADPU-nun Arxivi. F.1, siy.1, sax.vah.10, v.23-27*

[80] *ADPU-nun Arxivi. F.1, siy.1, sax.vah.10, v.372-374.*

1 (prof.A.S.Bukşpan), *ÜİKP və leninizm kafedrasında* 7 (dos.Əli Yazıçı, Bəşir Bünyatov, Baba Əsgərov, dos.Bağırov və b.), *Dialektik materializm kafedrasında* 5 (İbrahim Əfəndiyev, dos.Əli Əlizadə, Seyfulla Şamilov, Əhməd Kazımov, Həmid Əfəndiyev), *Siyasi iqtisad kafedrasında* 8 (müdir prof.B.Həsənbəyov, Həsən Dadaşov, İsrafil Axundov, Abbas Nəbiyev), *Ədəbiyyat və dilçilik kafedrasında* 7 (müdir Əli Nazim, Mikayıl Rəfili, Məmməd Arif, prof.Bəkir Çobanzadə, Əli Sultanlı, dos.Qulam Bağırov, dos. Həsənov İdris), *Pedaqogika kafedrasında* 10 (müdir Mikayıl Rəhimli, Əbdülkərim Əfəndiyev, Mehdi Mehdizadə, Mövsüm İsmayılzadə, Qəmbər Əsgərov, Əhməd Seyidov, Rəcəb Əfəndiyev, Əfşan Qədimbəyova, Prupis), *Politexnizm kafedrasında* 6 (Ağa Axundov, Məmmədəli Əliyev, Səməndər Axundov, Seyid Rzayev, Hacıbaba Əliyev, Seyid Məmmədov), *riyaziyyatın tədrisi metodikası* kafedrasında 2 (müdir prof.A.Ammosov, Tahir Abdullayev və b.), *Bədən tərbiyəsi kafedrasında* 3 (müdir dos. Səlim Əliyev, Cavad), *Hərbi fənlər nəzəriyyəsi kafedrasında* 14 (müdir Hacı İbrahimbəyli, Həsən Məmmədbəyov, Əli Şərifov, Mustafa Hüseynov, Əhməd Hüseynov, Əbülfəs Sadıxov, prof.H.Şahtaxtinski, prof.Baqri və b.) professor-müəllim çalışırdı.

Həmin dövrdə Pedaqoji İnstitutun direktoru vəzifəsində ***Bəşir Nurəli oğlu Bünyatov*** çalışırdı.

***Bəşir Nurəli oğlu Bünyatov***
*(1895- 1967)*



*1895-ci ildə Gəncə quberniyasının Zəngəzur qəzasının Yuxarı Kiratağ kəndində (Qafan rayonu) yoxsul kəndli ailəsində anadan olub. 9-10 yaşında kənd uşaqları ilə birlikdə iş dalınca Bakıya gəlib. Mantaşev qardaşlarının Ramanadakı mədənlərində əmək fəaliyyətinə başlayıb. 1913-1915-ci illərdə Sabunçudakı ibtidai məktəbdə oxuyub. 1915-1917-ci illərdə pedaqoji kurslarda təhsil alıb. 1917-ci ilin aprelində Ramanı fəhlələri tərəfindən Bakı Sovetinə üzv seçilib. Həmin ilin iyun ayında Ramanı rayonu üzrə ərzaq komissarı təyin olunub. 1917-ci ilin iyul ayında bolşeviklər partiyasına daxil olub. Həmin ildə Ramanı rayon partiya komitəsinin katibi, 1918-ci ilin mart ayında isə Bakı qəzası kəndli Deputatları Şurası İcraiyyə Komitəsinə üzv seçilib. Suraxanı neft sənayesi işçiləri ittifaqının və Suraxanı "Hümmət" təşkilatının yaradıcılarından biri olub. 1919-1920-ci illərdə Suraxanı rayon "Hümmət" təşkilatının məsul katibi, Suraxanı fəhlə klubunun sədri olub. 1920-ci ilin fevralında gizli şəkildə keçirilən Azərbaycan Kommunist Partiyasının I qurultayının iştirakçısı olub. 1921-1923-cü illərdə Bakı Sovetində inzibati şöbənin rəisi, 1923-1925-ci illərdə Şuşa qəza İcraiyyə Komitəsinin sədri vəzifəsində çalışıb. AK(b)P MK Azərbaycan SSR Xalq Komissarları Soveti yanında "Savadsızlığı ləğvetmə komitəsi"nin üzvü olub. 1924-1925-ci illərdə Azərbaycan SSR XMK Baş siyasi maarif idarəsinin müdiri vəzifəsində çalışıb. 8 mart 1924-cü ildə Azərbaycan SSR XMK Baş siyasi maarif idarəsinin savadsızlığı ləğv etmək sahəsində gördüyü işlər haqqında məruzə edib. 1926-ci ildə Azərbaycan KP MK-nın birinci katibi L.Mirzoyan tərəfindən Şuşa qəza İcraiyyə Komitəsinin sədri vəzifəsindən azad olunub. 1926-1927-ci illərdə Zaqatala qəza partiya komitəsinin katibi vəzifəsində işləyib. Azərbaycan SSR Xalq Maarif Komissarlığında təşkilat şöbəsinin müdiri olub. 1930-cu ildə Azərbaycan Dövlət Universitetinin Sovet hüququ şöbəsini bitirib. Azərbaycan Dövlət Pedaqoji İnstitutun direktoru, Azərbaycan Həmkarlar İttifaqları Şurasında mədəniyyət şöbəsinin müdiri (1934), Azərbaycan KP MK -da təlimatçı (1935), Baş Ət Birliyi idarəsində rəis (1936-1939) vəzifələrində işləyib.1939-1941-ci illərdə Partiya Arxivində baş elmi işçi kimi fəaliyyət göstərir.*

*"Lenin" və "Qırmızı Əmək Bayrağı" ordenləri, 8 medalla təltif olunub, Əməkdar müəllim fəxri adına layiq görülüb. Ümumittifaq dərəcəli fərdi təqaüdçü olub.*

*1967-ci il aprelin 13-də Bakı şəhərində vəfat edib və Fəxri Xiyabanda dəfn olunub*[81].

[81] *Ətraflı bax:* ***Rüstəmov F.*** *Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektorları. Bakı: Elm və təhsil, 2019, s.105-109*

Bəşir Bünyatov instituta cəmi 5 ay rəhbərlik etdi. 1933-cü ilin dekabrın 7-də Azərbaycan K(b) P MK-da Azərbaycan Pedaqoji İnstitutunda pedaqoji kadr hazırlığı məsələləri müzakirə olundu və "Ali Pedaqoji İnstitut haqqında" xüsusi qərar qəbul edildi. Siyasi motivlər əsasında verilən qərarda göstərilirdi ki, *institutda 3 il müddətində 806 nəfər məzun buraxmışdır ki, onun da 701 nəfəri azərbaycanlıdır. Ali məktəbə külli miqdarda türk (Azərbaycan) qadınları və azlıqda qalan millətlər cəlb edilmişdir. Buna baxmayaraq, APİ hələ Azərbaycanda mədəni inqilabın ən mühüm manevelasına çevrilməmiş, institutda ixtisaslı və məfkurəcə sınaqdan çıxmış akademik əməkçilərin toplanması və möhkəmlənməsi ilə əlaqədar olan zəruri işləri hələ genişləndirə bilməmişdir. APİ müdiriyyəti və firqə təşkilatı müəllim kadrlarının hazırlığı keyfiyyətinə lazımınca diqqət yetirməmişdir. Təlimin aşağı keyfiyyətli olduğu, kafedra işləri və əmək intizamının pis qurulduğu, sosializm yarışı və zərbəçiliyin zəif genişləndirildiyi hələ bu vaxtadək nəzərə çarpmaqdadır"*[82].

Daha sonra qərarda aşağıdakılar vurğulanırdı:

*-APİ-də sinfi sayıqlığın kütləşməyi nəticəsində Lenin milli siyasəti təhrif olunmuşdur;*

*-hakim millətçilik və yerli millətçilik görüntüləri ilə qəti mübarizə aparılmamışdır;*

*-erməni və rus qruplarına istər təlimin quruluşu, istərsə də məfkurəvi rəhbərlik cəhətdən ciddi diqqət yetirilməmişdir;*

*-firqə təşkilatı və müdiriyyət millətçi ünsürlərin çıxışlarına layiqincə cavab verməmişdir;*

*-firqə təşkilatı ayrı-ayrı müəllim və tələbələrin antişura və antifirqə çıxışlarına çox vaxt cavab verməmişdir;*

*-Xalq Maarif Komissarlığı APİ-yə ciddi diqqət yetirməmiş, ona konkret və operativ rəhbərlik etməmiş, APİ və onun professor-müəllim heyəti üçün əlverişli maddi şəraitin vücuda gətirilməsi qayğısına qalmamışdır*[83].

Qərarda Voroşilov rayon partiya və komsomol təşkilatları da ciddi tənqid olunur, hətta fəaliyyətsizlikdə ittiham olunur. Nöqsanların aradan qaldırılması üçün Azərbaycan K(b) MK qərara alır:

-rəhbər və akademik heyət nəzərdən keçirilsin, daha bacarıqlı akademik işçilər APİ-yə təhkim olunsun və onlara fərdi maaş verilsin;

-Voroşilov rayon firqə təşkilatı və LKGİ tərəfindən APİ-də firqə və komsomol işlərinə rəhbərlik gücləndirilsin;

-institutda aspirantların tərkibinə, sosial vəziyyətinə və firqə mənsubluğuna xüsusi diqqət yetirilsin;

-rus və erməni qruplarında təlimin keyfiyyətinin yüksəldilməsi müdiriyyətin diqqətinə çatdırılsın;

-tələbələrin ideya-siyasi, vətənpərvərlik tərbiyəsi gücləndirilsin və s.

Azərbaycan K(b)P MK-nın bu qərarı APİ-də pedaqoji prosesin səmərəliliyinin yüksəldilməsinə, pedaqoji kadr hazırlığının təkmilləşdirilməsindən daha çox siyasi məzmun kəsb edirdi. Erməni tələbələrininin Verdiyan və Gevorqyanın APİ-nin erməni dilində olan divar qəzetində yazılmış şeirlərinə sərt reaksiya ilə bağlı idi.

Qərarda həm də aşağıdakılar nəzərdə tutulmuşdu:1) institut əməkdaşlarının Bakıdan kənarda təsərrüfat və siyasi kampaniyalara cəlb edilməsinə qadağa qoyulması; 2) əməkdaşların elmi-tədqiqat işlərinin çap edilməsi üçün institutda xüsusi məcmuənin nəşri; 3) institut tələbələri üçün yataqxananın tikintisinin sürətləndirilməsi; 4) APİ-də işləməyənlərin instituta aid olan ümumi evlərdən köçürülməsi.

Azərbaycan K(b) MK-nın bu qərarından sonra institutun rəhbərliyi dəyişdirildi. Bəşir Bünyatov Azərbaycan Həmkarlar İttifaqları Şurasında mədəniyyət şöbəsinin müdiri vəzifəsinə təyin olundu. İnstituta rəhbərlik direktor müavini *Əbülfəz Axundova* həvalə edildi.

1933-cü ilin dekabr ayında Azərbaycan K(b)P MK-nın büro iclasında ***Mirzə Sultan oğlu Məmmədov*** Azərbaycan Pedaqoji İnstitutuna direktor təyin edildi.

---

[82] *"Kommunist" qəzeti, 23 dekabr 1933*

[83] *Yenə orada*



***Mirzə Sultan oğlu Məmmədov***
*(1901- 1938)*

*1901-ci ildə Bakıda anadan olub. 1914-1918-ci illərdə Bakıda ali ibtidai məktəbdə oxuyub. 1917-ci ildə fevral inqilabı ərəfəsində inqilabi hərəkata qoşulub. 1918-ci ildə Bakı Politexnik Məktəbinə daxil olub. 1920-ci ildə ”Ədalət”, “Hümmət” və RK(b)P ilə sıx əməkdaşlıq edib. Azərbaycan sovetləşdirildikdən sonra AK(b)P-nin Zığ rayon komitəsinin katibi və Bakı komitəsinin hərbi şöbəsində təlimatçı işləyib. Ali təhsil almaq məqsədilə 1920-ci ildə Moskvaya, Sverdlov adına Universitetə göndərilib. Burada cəmi 6 ay oxuyub. 1921-ci ildə Moskvada Şərq Zəhmətkeşləri Kommunist Universiteti təşkil edildiyinə görə digər şərq xalqlarının nümayəndələri ilə birlikdə həmin instituta köçürülüb. Universitetdə partiya işlərinin təşkili ona həvalə edilib. 1923-cü ildə partiya özəyinin katibi seçilib. 1924-cü ildə Bakıya qayıdıb və Azərbaycan K(b)P Qala-Maştağa rayon komitəsinin katibi təyin olunub. 1926-cı ildə Azərbaycan K(b)P Bakı komitəsinin üzvü seçilib. 1926-1931-ci illərdə Moskva şəhərində yaşayıb, 1926-1927-ci illərdə Şərq Zəhmətkeşləri Kommunist Universiteti partiya komitəsinin katibi olub. 1927-1931-ci illərdə həmin universitetin aspiranturasında təhsil alıb. 1931-1932-ci illərdə Azərbaycan K(b)P MK-da mədəniyyətin təbliği şöbəsinin müdir müavini və nəşriyyat şöbəsinin müdiri olub. 1932-1933-cü illərdə AK(b)P-nin Nuxa rayon komitəsinə rəhbərlik edib. 1933-cü ilin dekabr ayında Azərbaycan K(b)P MK-nın büro iclasında Azərbaycan Pedaqoji İnstitutuna direktor təyin edilib. 14 may 1936-cı ilə kimi Azərbaycan Pedaqoji İnstitutunun direktoru vəzifəsində çalışıb. 14 may 1936-cı ildə Azərbaycan KP(b)P MK-nın qərarı ilə Azərbaycan Pedaqoji İnstitutunun partiya komitəsinin katibi seçildiyinə görə direktor vəzifəsindən azad edilib. Onun yerinə ADPİ-nin direktoru vəzifəsinə Azərbaycan Partiya Nəşriyyatının direktoru Mirzə Davud Rəsulzadə təyin olunub.*

*Mirzə Məmmədov 1937-ci ildə əks-inqilabi fəaliyyətdə, casusluqda, anti-sovet təbliğatı aparmaqda şübhəli bilinərək həbs olunub. 3 iyul 1938-ci ildə trotskiçi, millətçi, ziyankar, casus və terrorçu kimi günahkar bilinərək Bakıda güllələnib.*

1934/35-ci tədris ilində institutda təhsil alan tələbələrin təlim nailiyyətləri xeyli yüksəldi. Belə ki,həmin dövrdə institutda təhsil alan tələbələrin 96 faizi təqaüdlə təmin edilirdi. Ailəli tələbələr üçün yüksək təqaüd müəyyən olunmuşdu. 1934-cü ildə institutun ümumi yataqxanasının birinci hissəsi tikilib istifadəyə verildi və orada 300 tələbə yerləşdirildi.

Azərbaycan Pedaqoji İnstitutu müəllim kadrları hazırlığında xidmətlərinə görə nəinki respublika, həm də SSRİ ali məktəbləri arasında fərqlənirdi. Bir neçə dəfə ali pedaqoji təhsilin inkişafındakı nailiyyətlərinə görə Ümumittifaq və respublika birinciliyinin qalibi olmuşdu. Bunu demək kifayət edər ki, Pedaqoji İnstitutun kollektivi, yalnız 1933-36-cı illərdə 8 keçici Qırmızı bayraq və birinci dərəcəli mükafata layiq görülmüşdü[84].

İnstitutda humanitar və ictimai fənlərin tədrisinin səmərəsinin yüksəldilməsində və gənc mütəxəssislərin vətənpərvər ruhda tərbiyəsində humanitar fakültələr mühüm rol oynayırdı.

30-cu illərin əvvəllərində ali pedaqoji təhsil müəssisələrində ictimai elmlərin tədrisi gücləndirildi. İctimai elmlərin tədrisinə ayrılan saatların həcmi ciddi surətdə artırıldı. Bu tədbirlər təbii ki, ixtisaslar üzrə mütəxəssis hazırlanmasına mənfi

[84] *V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu -25. Bakı:1946, s.27*

təsir göstərirdi. Bunu aydın görmək üçün APİ-nin məktəbəqədər şöbəsinin tədris planına diqqət yetirmək kifayətdir. Burada fənlər və onlara ayrılan saatlar aşağıdakı kimi nəzərdə tutulmuşdu: dialektik materializm - 100 saat, ÜİK(b)P Kominterinin tarixi - 90 saat, siyasi iqtisad - 120 saat, Leninizm - 80 saat, Türk (Azərbaycan) dili - 60 saat, Türk dili üzrə praktikum - 50 saat, rus dili - 360 saat, ədəbiyyat - 100 saat, pedaqogika - 220 saat, məktəbəqədər pedaqogika - 390 saat, pedaqoji praktika - 780 saat, xarici dil - 240 saat, bədii söz və uşaq kitabçası -90 saat. İxtisas üçün nəzərdə tutulan 2670 saat ümumi yükün yalnız 1480 saatı (55 %) pedaqoji fənlərə və pedaqoji təcrübəyə ayrılmışdı. Azərbaycan dilinin tədrisinə cəmi 60 saat, rus dilinin tədrisinə isə 350 saat vaxt nəzərdə tutulmuşdu.

1930/31-ci tədris ilində Pedaqoji İnstitutda 950 tələbə oxuduğu halda, 1934/35-ci tədris ilində onların sayı 1316 nəfərə çatmışdı. Tələbələrdən 300 nəfərinin (23%) yataqxanada yaşaması üçün hər cür şərait yaradılmışdı.

1933-cü ildə Dil-ədəbiyyat, 1934-cü ildə Tarix fakültələri təşkil edildi. Respublikada rus dili müəllimlərinə olan ehtiyacı ödəmək məqsədilə Dil-ədəbiyyat fakültəsinin nəzdində qeyri-rus məktəblərində rus dili fənnini tədris edəcək müəllim hazırlamaq məqsədilə rus dili və ədəbiyyatı şöbəsi açıldı. Həmin şöbədə 118 nəfər təhsil alırdı.[85] Rus bölməsində prof. Baqri, dos.A.Mudrov, dos.Şerbinina, dos. Pleşunov səmərəli elmi və pedaqoji fəaliyyət göstərirdilər.

ÜİK(b)P MK və SSRİ Xalq Komissarları Sovetinin "İbtidai və orta məktəbdə coğrafiyanın tədrisi haqqında" 16 may 1934-cü il tarixli qərarına əsasən Pedaqoji İnstitutda Coğrafiya şöbəsi fəaliyyətə başladı. Ümumi coğrafiya kafedrasına *prof. Aleksandr Nikolayeviç Djavaxişvili*[86] müdir vəzifəsinə dəvət olundu. Bir il sonra Coğrafiya kafedrasına məşhur kartoqraf Məmməd Əliyev müdir təyin edildi. 1938-ci ildə respublikada ali təhsilli coğrafiya müəllimlərinin ilk buraxılışı oldu. İlk məzunların cərgəsində sonralar Əməkdar elm xadimi, coğrafiya elmləri doktoru, professor Nurəddin Kərimov da var idi. Pedaqoji İnstitutda və digər ali təhsil ocaqlarında uzun müddət səmərəli fəaliyyət göstərən F.Əhmədov, M.Zülfüqarov, S.Şükürov, H.Sadıxlı və İ.Osmanov fakültənin ilk məzunlardan idi.

Respublikada müəllim kadrları hazırlığındakı pərakəndəliyi aradan qaldırmaq məqsədilə 1935-ci ildə ikiillik Müəllimlər İnstitutu Pedaqoji İnstitutun tərkibinə daxil edildi.

1935-ci ilin 5 iyulunda Pedaqoji İnstitutda möhtəşəm buraxılış gecəsi təşkil edildi. Buraxılış gecəsində institutun direktoru *Mirzə Məmmədov* geniş məruzə ilə çıxış etdi. Azərbaycanda sosializm quruculuğu sahəsində uğurlardan danışan M.Məmmədov Xalq Maarif Komissarlığının Azərbaycan Pedaqoji İnstitutu qarşısında qoyduğu vəzifələri səciyyələndirərək demişdi: *"Xalq Maarif Komissarlığının hesablamalarına görə yaxın vaxtlarda 4500 ali təhsilli müəllim kadrları hazırlamalıyıq. Bu sahədə ciddi nailiyyətlərimiz var. Bu il Azərbaycan məktəbinə 182 yüksək ixtisaslı müəllim yola salırıq. Onların əksəriyyəti yekun imtahandan "əla" və "yaxşı" qiymət alıb. APİ-də ilk dəfə 150 nəfər tələbə diplom işi müdafiə edib. Məzunlarımız pedaqoji fəaliyyətə başlamazdan əvvəl politexnik məktəblərdə yaxşı təcrübə toplayıblar. Onlar əvvəlki məzunlardan fərqli olaraq həm ixtisas fənlərini, həm də ictimai-iqtisadi bloka daxil edilən fənləri (leninizm və dialektik materializm) daha yüksək nailiyyətlərlə başa vurublar"*[87].

1935-ci ildə institutu bitirən 182-i nəfərin 33-ü riyaziyyat, 25-i tarix, 13-ü ədəbiyyat, 11-i təbiyyat, 42-si kimya, 15-i pedoloq, 13-ü pedaqogika, 8-i məktəbəqədər iş, 23-ü fizika ixtisaslarının məzunları idi.[88] Məzunlardan 22 nəfəri Kommunist partiyasının, 86 nəfəri Kommunist Gənclər İttifaqının üzvü idi. Kommunist tələbələr Aslan Quliyev və Vahid Əsgərov diplom işi müdafiəsində "əla"qiymət almışdılar. Vahid Əsgərov Cəbrayıl rayon xalq maarif

---

[85] *Azərbaycan Respublikası Dövlət Arxivi. F.1556,siy.3, iş 24,v.65*

[86] ***Aleksandr Nikolayeviç Djavaxişvili** (1875-1973) -görkəmli gürcü coğrafiyaçısı və antropoloqu, coğrafiya elmləri doktoru (1937), professor (1920), Gürcüstan EA-nın həqiqi üzvü, SSRİ Coğrafiyaçıları Cəmiyyətinin prezidentinin müavini (1924-1940), Əməkdar elm xadimi (1941). Gürcüstan Coğrafiyaçıları Cəmiyyətinin Prezidenti (1940-1970).*

[87] *Azərbaycan Respublikasının Dövlət Arxivi.F.1656, siy.4, iş 7, v.24-26*

[88] *Yenə orada*

şöbəsinə müdir vəzifəsinə təyinat almışdı. İnstitutu uğurla başa vuran tələbələrdən 45 nəfərini azərbaycanlı qızlar təşkil edirdi ki, onlardan da O.Axundova və V.İ.Mailova təhsil zərbəçiləri idi. Məzunların 17 nəfəri azsaylı xalqların (ləzgi, tat, talış, yəhudi və b.) nümayəndələri idi. Tatar qızı Fatma Şərifova diplom işindən "əla" qiymət almışdı. Ümumiyyətlə, diplom işi müdafiə edən 188 nəfərin[89] 39 –u "əla", 59-u "yaxşı", 44-ü kafi qiymət almışdı. 13 nəfər xəstə olduğuna görə diplom işini müdafiə edə bilməmiş, 12 nəfərə üzürlü səbəbə görə diplom işini sentyabr ayında müdafiə etməyə icazə verilmişdi. 21 nəfər isə "qeyri-kafi" qiymət almışdı. Diplom işindən "qeyri-kafi" qiymət alanlara baxmayaraq, əvvəlki illərlə müqayisədə müəllim kadrları hazırlığında Pedaqoji İnstitutda xeyli nailiyyətlər əldə edilmiş, ixtisas fənlərinə və pedaqoji təcrübəyə ayrılan saatlar xeyli artırılmışdı.

Mirzə Məmmədovdan sonra instituta ***Mirzə Davud Məsim oğlu Rəsulzadə***, ***Hüseyn Məmməd oğlu Musayev***, ***Aqil Qasım oğlu Salayev***, ***Camal Əhməd oğlu Əiyev*** rəhbərlik etdilər.

**Mirzə Davud Məsim oğlu Rəsulzadə**
*(1899-1943)*



*1899-cu ilin aprel ayında Gəncədə ruhani ailəsində anadan olub. 1908-1914-cü illərdə Gəncə 6 sinifli şəhər məktəbində, 1914-1918-ci illərdə isə Tiflisdəki orta ixtisas texniki məktəbində təhsil alıb. 1918-ci ildə Tiflis Politexnik İnstitutunun hidromexanika fakültəsinə daxil olub. 1921-ci ilə kimi Tiflisdə həm ali təhsil alıb, həm də su təsərrüfatı idarəsində (1917-1919), Azərbaycanın Gürcüstandakı diplomatik nümayəndəliyində (1920-1921) işləyib. Azərbaycan SSR-in Ankarada səlahiyyətli nümayəndəsinin katibi (1921-1922) təyin olunduğundan diplom işini təqdim edə bilməyib. Tiflisdə Azərbaycan dilində nəşr olunan "Yeni fikir" (1924), "İşıq yolu" (1927-1928) və "Yeni kənd" (1930) qəzetlərinin redaktoru olub. 1932-1933-cü illərdə Zaqafqaziya Kommunist Universitetinin tədris işləri üzrə prorektoru və Partiya quruculuğu və leninizm kafedrasının müdiri olub. Zaqafqaziya Elmi Tədqiqat İnstitutunda direktor müavini vəzifəsində çalışıb.1927-ci ildə Gürcüstan Xalq Maarif Komissarlığının ixtisas komissiyası tərəfindən ona dosent adı verilib. 1931-ci ildə Zaqafqaziya Kommunist Universitetində çalışarkən professor vəzifəsinə seçilib.*

*1920-ci ildən ömrünün sonuna kimi partiya işində çalışıb. Ayrı-ayrı vaxtlarda Zaqafqaziya Diyar Partiya Komitəsinin kəndlərlə iş şöbəsinin müdiri, təbliğat-təşviqat şöbəsinin müdir müavini və Gürcüstan K(b)P MK-nın üzvü olub (1928). Axalkalakidə qəza İcraiyyə Komitəsinin sədr müavini (1924-1925), Borçalıda İcraiyyə Komitəsinin sədri (1925-1926), Azərbaycan SSR Naxçıvan Vilayət Partiya Komitəsinin məsul katibi (1931-1932) olub. 9 fevral 1933-cü ildə Zaqafqaziya Diyar Komitəsi tərəfindən Azərbaycan K(b)P MK-nın sərəncamına göndərilib. Azərbaycan hökuməti onu ev və maşınla təmin edib. Elə həmin ildə Azərbaycan K(b)P Salyan rayon komitəsinin katibi seçilib. 1934-cü ildə Azərbaycan Partiya Nəşriyyatına direktor təyin edildi. 14 may 1936-cı ildən 31 fevral 1937-ci ilə kimi Azərbaycan Pedaqoji İnstitutunun direktoru olub. Azərbaycan Xalq Maarif Komissarlığının*

[89] *Diplom işi müdafiə edənlərin 6 nəfəri əvvəlki illərin tələbələri idi.*

*23 avqust 1936-cı il tarixli 765 saylı əmri ilə Azərbaycan Elmi-Tədqiqat Pedaqogika İnstitutu Azərbaycan Pedaqoji İnstitutunun nəzdinə verildiyindən Mirzə Davud Rəsulzadə həm də Azərbaycan ETPEİ-nin (indiki Təhsil İnstitutu) əvəzçiliklə direktoru olub. Azərbaycan SSR Xalq Komissarları Sovetinin incəsənət işləri komitəsinin sədri vəzifəsində çalışan Mirzə Davud Rəsulzadə 22 dekabr 1937-ci ildə əmlakı müsadirə olunmaqla həbs edilərək sürgünə göndərilmişdir.*

*1943-cü ildə Xabarovsk diyarının Olski rayonunun Omçak qəsəbəsindəki həbs düşərgəsində ürək tutmasından vəfat edib.*

1936-cı ildə Pedaqoji fakültənin məktəbəqədər şöbəsi müstəqil fakültəyə çevrildi. Fakültənin dekanı vəzifəsinə *dos.Dilrubə Mustafayeva*[90] təyin olundu. Həmin il fakültənin nəzdində yaradılan Məktəbəqədər pedaqogika kafedrasına *Əfşan Qədimbəyova*[91] müdir təyin olundu. Fakültə 1941-ci ilə kimi müstəqil fəaliyyət göstərə bildi. Həmin illərdə fakültəyə 120 nəfər tələbə qəbul edilmişdi.

30-cu illərdə Pedaqoji fakültədə ibtidai məktəb müəllimi hazırlığında da müəyyən nailiyyətlər qazanıldı.İbtidai məktəb müəllimi ixtisasını 1931/32-ci tədris ilində 19,1932/33-cü tədris ilində 39, 1934/35-ci tədris ilində 30, 1935/36-cı tədris ilində 38, 1936/37-ci tədris ilində 10, 1938/39-cu tədris ilində 7, 1939/40-cı tədris ilində isə 26 nəfər bitirmişdi[92].

Orta məktəblərdə ixtisaslı müəllim kadrlarına olan ehtiyacı nəzərə alan Azərbaycan Xalq Maarif Komissarlığı “Respublikanın qeyri-rus məktəblərində rus dilinin öyrədilməsinin icbariliyi haqqında” qərar qəbul etdi. Respublikada 2995 milli məktəb fəaliyyət göstərdiyi halda cəmi 440 rus dili və ədəbiyyatı müəllimi var idi. Azərbaycan məktəbləri üçün ən azı 2 minə yaxın rus dili və ədəbiyyatı müəllimi hazırlanmalı idi.

1938-ci il martın 13-də ÜİK(b)P MK-nın və SSRİ XKS-in “Milli respublikaların və vilayətlərin məktəblərində rus dilinin məcburi öyrənilməsi haqqında” qərarına müvafiq olaraq, 1938/39-cu tədris ilində V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunda və Azərbaycan Dövlət Universitetində rus dili və ədəbiyyatı şöbələri açıldı. ADPİ-nin Dil və ədəbiyyat fakültəsinin nəzdində yaradılan şöbəyə ilk dəfə 118 tələbə qəbul edildi.

Azərbaycan Xalq Maarif Komissarlığının 2 noyabr 1938-ci il tarixli əmri ilə Pedaqoji İnstitutun nəzdindəki ikiillik Müəllimlər İnstitutunu ayırıb müstəqil instituta çevirdi[93].

Faktiki olaraq həmin dövrdə ADPİ-də iki ali məktəb fəaliyyət göstərirdi:1) təhsil müddəti 4 il olan Pedaqoji İnstitut; 2) təhsil müddəti bir və ya iki il olan Müəllimlər İnstitutu.

1937/38-ci ildə ADPİ-nin nəzdindəki Müəllimlər İnstitutunun tələbə kontingenti aşağıdakı kimi idi.

---

[90] ***Mustafayeva Dilrubə Mustafa qızı*** *(1909-1975) Qazax rayonunun Dağkəsəmən kəndində anadan olub. Dağkəsəmən kənd məktəbini, Qazax Müəllimlər Seminariyasını, Azərbaycan Pedaqoji İnstitutunu bitirib. Seminariyanı bitirdikdən sonra 2 il Qubada müəllim işləyib. “Abdulla Şaiqin pedaqoji fəaliyyəti və ədəbi yaradıcılığında uşaqların tərbiyəsi haqqında fikirləri” (1949) mövzusunda namizədlik dissertasiyası müdafiə edib. ADPİ-də və ADU-da müəllim işləyib. 2 hissəlik “Pedaqogika” (1941) tədris vəsaitinin əsas müəlliflərindən biri olub. Bir neçə kitabın və elmi-pedaqoji məqalənin müəllifidir.*

[91] ***Əfşan Ələkbər qızı Qədimbəyova*** *(1915-1980) İrəvan şəhərində anadan olub. 1929-cu ildə İrəvan Pedaqoji Texnikumunu bitirib. 1931-1935-ci illərdə Azərbaycan Pedaqoji İnstitutunda təhsil alıb. Moskvada Pedaqoji İnstitutunda aspirantura hazırlığı keçib. 1942- 1946-cı illərdə Azərbaycan Gənclər İttifaqının üçüncü katibi vəzifəsində çalışıb. Azərbaycan Dövlət Tibb İnstitutunun partiya komitəsinin katibi, Azərbaycan KP MK-da şöbə müdirinin müavini vəzifələrində çalışıb. 1949-1956-cı illərdə Azərbaycan Dövlət Xarici Dillər İnstitutunun rektoru işləyib. 1953-cü ildə Azərbaycan SSR Ali Soveti sədrinin müavini seçilib. “1920-1941-ci illərdə Azərbaycanda məktəbəqədər tərbiyənin inkişafı mövzusunda” (1965) namizədlik dissertasiyası müdafiə edib. Azərbaycan Ali Sovetinin deputatı olub. 1968- 1978-ci illərdə Azərbaycan Pedaqoji İnstitutunda kafedra müdiri vəzifəsində çalışıb.*

[92] *ADPU-nun Arxivi.F.1,siy.2,iş 6, v.17-20*

[93] *ADPU-nun Arxivi. F.1, siy.1, sax.vahidi 10, v.22*

| Fakültələr | Qəbul | Kontingent | Buraxılış |
|---|---|---|---|
| Ədəbiyyat | 56 | 255 | 169 |
| Tarix | - | 73 | 73 |
| Təbiyyat-coğrafiya | 73 | 125 | 52 |
| Fizika-riyaziyyat | 55 | 164 | 109 |
| **Cəmi** | **184** | **617** | **403** |

30-cu illərin ikinci yarısında Pedaqoji İnstitutun strukturunda müəyyən dəyişiklik edildi, yeni kafedralar təşkil edildi. Məsələn, Dil-ədəbiyyat kafedrasının bazasında üç müstəqil kafedra: 1) Azərbaycan ədəbiyyatı tarixi (müdir dos.Əli Nazim[94]); 2) Linqvistika (müdir prof.Bəkir Çobanzadə); 3) Ümumi ədəbiyyat tarixi (müdir dos.Hacıbaba Nəzərli[95]) yaradıldı.

1939-cu ildə Riyaziyyat kafedrasının əsasında Riyazi analiz və Həndəsə kafedraları yaradıldı.

**Hüseyn Məmməd oğlu Musayev**
*(1889-1956)*

*19 oktyabr 1889-cu ildə Şamaxı şəhərində anadan olub. Şamaxı şəhər məktəbini bitirib. Quba qəzasının ayrı-ayrı kəndlərində müəllimlik edib. 1905-1910 -cu illərdə Şamaxıda fəaliyyət göstərən maarif cəmiyyətinin üzvlərindən biri kimi xeyriyyə tədbirlərində fəal iştirak edib. 1911-1918-ci illərdə Quba qəzasının (indiki Qusar rayonu) Uqur, Xəzri məktəblərində müdir və müəllim, 1918-1921-ci illərdə Qusar rayonunun ibtidai məktəblərində müəllimlik edib. 1921-1924-cü illərdə Quba qəza xalq maarif şöbəsinə rəhbərlik edib.1921-ci ildə Quba qəzasının nümayəndə heyətinin tərkibində Moskvada -Xalq Komissarları Sovetinin sədri V.İ.Leninlə görüşüb.*



[94] ***Əli Nazim*** *(Mahmudzadə Əliəkbər Mahmud oğlu) 1906-cı ildə Cənubi Azərbaycanın Təbriz şəhərində dünyaya gəlmişdir. Bakıda pedaqoji texnikumu bitirib Leninqrad İnstitutuna daxil olmuşdur (1925). Moskva Kommunist Akademiyasında aspirant, elmi işçi, SSRİ xalqları ədəbiyyatı və incəsənəti bölməsinin elmi katibi olmuşdur (1927-1932). Azərbaycan Elmi-Tədqiqat İnstitutunun ədəbiyyat şöbəsinin müdiri və Ali Pedaqoji İnstitutda kafedra müdiri vəzifələrində çalışmışdır. Orta məktəbin yuxarı sinif şagirdləri üçün ədəbiyyat müntəxəbatı tərtib etmiş, Hənəfi Zeynallı ilə şərikli dərslik yazmışdır (1936). O, "Ədəbiyyat ensiklopediyası"nın redaktoru, Azərbaycan Sovet Yazıçıları İttifaqı İdarə Heyətinin və əbədi mətbuat orqanı redaksiya heyətinin üzvü olmuşdur.1937-ci ildə həbs olunmuş, 10 il müddətinə həbs cəzasına məhkum edilmiş, 1941-ci il avqustun 22-də həbsxanada vəfat etmişdir. 1957-ci ildə bəraət almışdır.1979-cu ildə Bakıda "Seçilmiş əsərləri" nəşr olunmuşdur.*

[95] ***Hacıbaba Nəzərli*** *(Nəzərli Hacıbaba Hacı Ələsgər oğlu) 1895-ci il martın 22-də Şamaxı şəhərində anadan olmuşdur. M.Ə.Sabirin "Ümid" məktəbində oxumuş (1908-1911), Göy-çayda yeni üsullu ikisinifli məktəbi bitirmişdir (1917). Bakıda hərbi piyada məktəbində (1920), Moskvada Qırmızı Professura İnstitutunda təhsil almışdır (1930-1933). Yaradıcılığa 1925-ci ildə publisistika ilə başlayıb. "Qızıl əsgər" qəzetinin redaktoru, Yazıçılar Cəmiyyətinin məsul katibi (1929–1930) olmuşdur. Azərbaycan Sovet Yazıçıları İttifaqı təşkilat komitəsinə sədrlik etmiş (1933-1934), 1934-cü ildən 1937-ci ilə qədər Azərbaycan Dövlət Dram Teatrının direktoru işləmişdir. Həmin illərdə o, həm də ADPİ-nin Ümumi ədəbiyyat tarixi kafedrasına rəhbərlik etmiş, Qərbi Avropa ədəbiyyatından mühazirələr oxumuşdur. H.Nəzərli günahsız yerə repressiya olunmuş, əksinqilabi, burjua-millətçi təşkilatının üzvü kimi həbs edilərək, 8 yanvar 1938-ci ildə güllələnmişdir*

*1924-1926-cı illərdə Azərbaycan Xalq Maarif Komissarlığının sosial tərbiyə idarəsinin müdiri olub. AK(b)P-nin Naxçıvan Partiya Komitəsinin 28 oktyabr 1926-cı ildə keçirilən Plenumunda (protokol 4) Həmid Sultanovun yerinə Naxçıvan Xalq Komissarları Sovetinin sədri təyin olunub. Həmin vəzifədə 10 mart 1928-ci ilə kimi işləyib. Azərbaycanı Tədqiq və Tətəbbö Cəmiyyətinin Naxçıvan şöbəsinin üzvü kimi Naxçıvan Respublikasının maddi mədəniyyət abidələrinin, etnoqrafiyasının, tarix və ədəbiyyatının, iqtisadiyyat və təbiətinin öyrənilməsində iştirak edib. 1926-cı ildə Bakıda keçirilən I Türkoloji qurultayın işində Naxçıvan MİK-in təmsilçisi kimi iştirak edib. Azərbaycan Xalq Maarif Komissarlığında Siyasi Maarif Baş İdarəsinin (1928-1930) və Maarif işçiləri Mərkəzi İdarəsinin sədri (1930-1931) olub. 1931-1932-ci illərdə Azərbaycan Respublikasının Dövlət Plan Komitəsinin sədri olub. 1932-1934-cü illərdə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun direktoru vəzifəsində çalışıb. 1934-1936-cı illərdə Kənd Təsərrüfatı Komissarlığında kadr hazırlığı şöbəsinə rəhbərlik edib.*

*Azərbaycanda ictimai-siyasi vəziyyətin kəskinləşdiyi, repressiyanın tüğyan etdiyi 1937-ci ildə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutuna direktor təyin edilib. 10 aya yaxın bir müddətdə instituta rəhbərlik edib. 1937-ci ildə həbs edilib. 16 sentyabr 1937-ci ildən 16 sentyabr 1942-ci ilə kimi sürgündə olub.*

*1943-1947-ci illərdə Xalq Maarif Komissarlığının evlər idarəsinin rəisi, 1947-1954-cü illərdə Zağulba uşaq sümük-vərəm sanatoriyasının direktoru vəzifəsində çalışıb.*

*15 iyun 1956-cı ildə ağır sürən xəstəlikdən sonra vəfat edib.*

İnstitutun maddi-texniki bazasının möhkəmləndirilməsinə hökumət xüsusi qayğı göstərirdi. 1933/34-cü tədris ilində institutda kadr hazırlığına və təsərrüfat işlərinə 2 milyon 186 min 869 manat vəsait ayrıldığı halda, 1936/37-ci tədris ilində bu məbləğ üç dəfəyə yaxın artırılıb, 6 milyon 775 min 414 manata çatdırılmışdı. Bu, institutun genişlənib böyüməsinə, infrastrukturun yaxşılaşdırılmasına, professor-müəllim və tələbə heyətinin sayının artmasına səbəb oldu. 1936/37-ci tədris ilində institutda 1512 nəfər təhsil alırdı.

1932-1937-ci illərdə Pedaqoji İnstitutda tələbə kontingentinin artım dinamikası aşağıdakı kimi idi:

| Tədris illəri | Qəbul | Tələbələrin sayı | Buraxılış |
|---|---|---|---|
| 1932/33 | 550 | 823 | 63 |
| 1933/34 | 416 | 1300 | 165 |
| 1934/35 | 482 | 1288 | 213 |
| 1935/36 | 682 | 1192 | 164 |

Azərbaycan Dövlət Pedaqoji İnstitutunda tələbələrin sayı artdıqca ayrı-ayrı ixtisaslar üzrə kadr hazırlığı da genişlənirdi. İnstitutda 10-dan artıq ixtisas üzrə kadr hazırlandı. 1937/38-ci tədris ilində Pedaqoji İnstitutda 1533 tələbə təhsil alırdı ki, onlardan da 560-ı I kurs tələbəsi idi[96]. Bir il sonra tələbələrin ümumi sayı 1934-ə çatdı ki, onlardan da 670 nəfəri I kursda oxuyurdu[97]. Həmin tələbələrdən 851-i azərbaycanlı idi[98].

Pedaqoji İnstitutda 1930-1941-ci illərdə ümumi tələbə kontingentinin inkişaf dinamikası aşağıdakı kimi olmuşdur:

[96] *Azərbaycan Respublikası Dövlət Arxivi. F.1556,siy.3, iş 24,v.73*
[97] *Yenə orada*
[98] *Azərbaycan Respublikası Dövlət Arxivi. F.1556,siy.2, iş 19,v.182*

| Tədris illəri | Tədris ilinin əvvəlində tələbə kontingenti | Qəbul | Buraxılış |
|---|---|---|---|
| 1930/31 | 1039 | 350 | 126 |
| 1931/32 | 1531 | 455 | 265 |
| 1932/33 | 921 | 555 | 256 |
| 1933/34 | 1015 | 500 | 63 |
| 1934/35 | 1339 | 800 | 224 |
| 1935/36 | 1867 | 960 | 389 |
| 1936/37 | 2154 | 1030 | 365 |
| 1937/38 | 1533 | 560 | 218 |
| 1938/39 | 1934 | 1050 | 334 |
| 1939/40 | 2045 | 600 | 261 |
| 1940/41 | 2035 | 600 | 571 |

| Fakültələr | İllər | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | 1930/31 | 1931/32 | 1932/33 | 1933/34 | 1934/35 | 1935/36 | 1936/37 | 1937/38 | 1938/39 | 1939/40 | 1940/41 | Cəmi |
| Tarix | 21 | - | 64 | 44 | 13 | 12 | 29 | 3 | 3 | 2 | 1 | 192 |
| Ədəbiyyat | 42 | 43 | 67 | 56 | 14 | 43 | 43 | 28 | 71 | 66 | 171 | 644 |
| Xarici dillər | | | | | | | | | | | 108 | 108 |
| Fizika-riyaziyyat | 39 | 55 | 58 | 62 | 43 | 38 | 32 | 26 | 41 | 58 | 67 | 519 |
| Təbiyyat | 24 | 96 | 68 | 58 | 46 | 31 | 21 | 31 | 5 | 89 | 66 | 535 |
| Coğrafiya | - | - | - | - | - | - | - | 27 | 10 | - | 60 | 97 |
| Pedaloji-pedaqoji | - | 19 | 40 | 36 | 31 | 38 | 11 | - | 8 | 26 | 15 | 224 |
| Cəmi: | 126 | 213 | 297 | 256 | 147 | 162 | 136 | 115 | 138 | 241 | 488 | 2319 |



**Aqil Qasım oğlu Salayev**
(1900-1973)

*1900-cü ilin mart ayının 10-da Lənkəran qəzasının Olxovka kəndində anadan olub. Valideynləri kənd təsərrüfatı və balıqçılıqla məşğul olub. İlk təhsilini mollaxanada alıb. 1922-ci ilə qədər kənddə təsərrüfat işləri ilə məşğul olub. 1922-1928-ci illərdə hərbi xidmətdə olub, sıravi əsgərdən rotanın siyasi rəhbəri vəzifəsinədək yüksəlib. 1928-ci ildə işçi fakültəsində oxuyub. Bakı işçi fakültəsinin 1929-cu ildə ona verdiyi göndəriş əsasında Universitetə qəbul olunub. 1932-ci ildə institutun Fizika-riyaziyyat fakültəsini, 1935-ci ildə isə aspiranturasını bitirib.*

*1935-1937-ci illərdə Azərbaycan Pedaqoji İnstitutunun Fizika-riyaziyyat fakültəsinin dekan müavini, 1937-1939-cu illərdə direktoru, 1939-1942-ci illərdə dekanı vəzifələrində işləyib. ADPİ-nin direktoru olarkən Azərbaycan Xalq Maarif Komissarının müavini Allahverdiyevin 2443/73 saylı 15 oktyabr 1937-ci il tarixli əmri ilə həm də Azərbaycan Dövlət Pedaqoji İnstitutunun nəzdində fəaliyyət göstərən Azərbaycan Elmi-Tədqiqat Pedaqogika İnstitutuna rəhbərlik edib. 1942-1944- cü illərdə Bakının Oktyabr (indiki Yasamal) rayon xalq maarif şöbəsinə, 1944-1947-ci illərdə Bakı şəhər xalq maarif şöbəsinə rəhbərlik edir. 1947-1965-ci illərdə ADPİ-nin Cəbr, həndəsə və astronomiya kafedrasında baş müəllim işləyib.*

*1973-cü ilin aprel ayının 10-da vəfat edib.*

Tələbələrin sayının artmasında institutda təşkil edilən illik, altıaylıq və üçaylıq hazırlıq kurslarının mühüm rolu oldu. Kurslarda 850 nəfərə qədər gənc oxuyurdu. Kursu bitirənlər müsabiqə yolu ilə Pedaqoji İnstituta qəbul olunurdular.

Ümumiyyətlə, Pedaqoji İnstitutun tarixində ilk dəfə 1938/39-cu tədris ilində tələbə qəbulunda müsabiqə şəraiti yaranmışdır.



***Camal Əhməd oğlu Əliyev***
*(1902- 1982)*

*1902-ci ildə Gəncə qəzasının Mollavələdli (indiki Goranboy rayonunun Şəfəq kəndi) kəndində anadan olub. Atası beş yaşında vəfat etdiyindən 2 il (1905-1907) əmisinin, 3 il (1907-1910) digər qohumunun himayəsində yaşayıb. 1911-ci ildə böyük qardaşı onu öz yanına, Zabrata gətirib. 3 illik şəhər rus məktəbində və Sabunçuda 4-cü şəhər ikiillik məktəbin 3-cü sinfində (1914-1916) təhsil alıb. Maddi çətinlik ucbatından təhsilini yarımçıq qoymalı olub. 1916-1917-ci illərdə Zabratdakı qazanxanada telefonçu köməkçisi işləyib.*

*İctimai-siyasi vəziyyətin dəyişməsi, fəhlələrin ara verməyən tətilləri onu və qardaşını kəndə qayıtmağa məcbur edir. 1917-1924-cü illərdə doğma kəndlərində təsərrüfatla məşğul olub. 1921-ci ildə komsomol*

*sıralarına daxil olub. 1923-1924-cü illərdə kənddəki komsomol özəyinə rəhbərlik edib. 1924-cü ildə Qırmızı Ordu sıralarına hərbi xidmətə çağırılır. Azərbaycan diviziyasının I polkunda xidmətə başlayır. 1924-1926-cı illərdə Azərbaycan diviziyasının I polkunda ştatdankənar müəllim işləməklə yanaşı, əsgərlərə siyasi dərs verib, polkun partiya kollektivinin texniki katibi olub. 1926-1927-ci illərdə polkda ştatlı müəllim kimi fəaliyyət göstərib, siyasi maarif kabinetinə rəhbərlik edib, 1-ci rotanın siyasi rəhbəri (ştatdankənar) olub. 1925-1927-ci illərdə hərbi xidmətdə ola-ola Bakı Xalq Maarif Şöbəsinin nəzdindəki ikiillik Fəhlə fakültəsinin pedaqoji bölməsinin axşam şöbəsində təhsil alıb. 1927-ci ildə Zaqafqaziya Qırmızı Ordu Siyasi İdarəsinin göndərişi ilə oxumağa göndərilib.*

*1927-1931-ci illərdə Zaqafqaziya Kommunist Universitetində təhsil alıb. 1931-1933-cü illərdə Zaqafqaziya Kommunist Universitetinin Fəlsəfə şöbəsinin aspiranturasında oxuyub. 1928-1931-ci illərdə Tbilisi şəhərindəki Azərbaycan pedaqoji texnikumunda leninizm kursundan dərs deyib. Gürcüstan azərbaycanlıların mədəni həyatında mühüm rol oynayan Nəriman Nərimanovun adını daşıyan həmin texnikum 1925-ci ildə təşkil edilmişdi. 1931-1932-ci illərdə Gürcüstan Kommunist Universitetinin Azərbaycan şöbəsində, Zaqafqaziya partiya fəallarının və kolxozçuların kurslarında dərs deyib. 1933-cü ildə ÜİP(b)P-nin Zaqafqaziya komitəsi tərəfindən Kirovabad (Gəncə) Kənd Təsərrüfatı İnstitutuna müəllim göndərilib. 1933-1934-cü illərdə həmin institutda o, leninizmdən, dialektik materializmdən dərs deyib, İqtisadiyyat fakültəsinə rəhbərlik edib. 1934-cü ildə Tiflisə -Zaqafqaziya Ali Kommunist Kənd Təsərrüfatı Məktəbinə müəllim dəvət olunub. Həmin illərdə Zaqafqaziya Rabitə Mühəndisliyi İnstitutunda dialektik materializm fənnini tədris edib. 1935-ci ildə "Marks və Leninin materialist nəzəriyyəsi" mövzusunda dissertasiya işi üzərində işləmək məqsədilə 3 aylıq Moskvaya - ÜİK(b)P MK yanında Təkmilləşdirmə İstitutuna elmi ezamiyyətə göndərilib.*

*1936-cı ildə ÜİK(b)P MK tərəfindən Azərbaycan K(b)P MK-nın sərəncamına göndərilir. Partiya fəalları respublika kursunun (1936-1937), təbliğatçılar kursunun (1937) müdiri, Marksizm-Leninizm İnstitunun direktoru və ÜİK(b)P tarixi və leninizm kafedrasının müdiri (1937), Bakıda yerləşən Azərbaycan Ali Kommunist Kənd Təsərrüfatı İnstitutunda müəllim və tədris hissə müdiri (1936-1938) işləyib.*

*ÜİK(b)P MK 14 noyabr 1938-ci ildə "ÜİK(b)P tarixinin qısa kursu"nun nəşri ilə əlaqədar olaraq daimi partiya təbliğatı qrupunun yaradılması haqqında qərar qəbul etdi. Həmin qərara uyğun olaraq Azərbaycanda da təbliğat qrupu yaradıldı. Azərbaycan KP MK-nın 28 dekabr 1938-ci il tarixli qərarı ilə Azərbaycan KP MK-nın təbliğat və təşviqat şöbəsinə mühazirəçi təyin olunmuşdur. Bir il sonra - Azərbaycan KP MK-nın 25 noyabr 1939-cu il tarixli iclasında Azərbaycan Pedaqoji İnstitutunda beynəlmiləl tərbiyənin vəziyyəti müzakirə olundu. İnstitutda azərbaycanlı tələbənin münaqişə nəticəsində erməni tələbəni döyməsi beynəlmiləlçiliyə əməl edilməməsi kimi dəyərləndirildi və bunun da nəticəsində institutun rəhbərliyi dəyişdirildi. Camal Əliyev Azərbaycan Pedaqoji İnstitutuna direktor təyin olundu. O, bu vəzifədə 14 mart 1940-cı ilə kimi işləyib. Pedaqoji işdən ayrıldıqdan sonra təqaüdə çıxana kimi Bakı şəhər Partiya Komitəsində ideoloji şöbədə çalışıb.Bakı şəhər sovetinin deputatı olub.*

*12 sentyabr 1982-ci ildə Bakıda vəfat edib.*

1939/40-cı tədris ilində Pedaqoji İnstitutda 31 kafedra var idi. Marksizm-leninizm kafedrasına *dos.Heydər Hüseynov,* SSRİ tarixi kafedrasına prof.vəzifəsini icra edən *M.Q.Əsriyan,* Siyasi iqtisad kafedrasına prof.əvəzi *T.A.Petrosyan,* Qədim və orta əsrlər tarixi kafedrasına dos.*Ə.S.Sumbatzadə*, Yeni tarix kafedrasına *F.S.Qrin,* Pedaqogika kafedrasına *N.P.Asatur,* Məktəbəqədər pedaqogika kafedrasına *Ə.Qədimbəyova*, Ümumi ədəbiyyat kafedrasına dos. *A.M.Mudrov*, Azərbaycan dili kafedrasına dos.

*M.Ə.Şirəliyev,* Azərbaycan ədəbiyyatı kafedrasına dos.*F.Qasımzadə*, Rus dili kafedrasına dos.*A.K.Lukyanova*, Rus ədəbiyyatı kafedrasına *A.V.Popov*, erməni dili və ədəbiyyatı kafedrasına prof.əvəzi.*A.Q.Ter-Matevosyan,* Alman dili kafedrasına dos. *M.L.Rax,* İngilis dili kafedrasına *T.Akopova*, Fransız dili kafedrasına *Y.Z.Qrişqorn*, Riyazi analiz kafedrasına dos.*M.Əfəndiyev*, Həndəsə kafedrasına dos. *B.Yusifzadə*, Eksperimental fizika kafedrasına dos. *P.Q.Həsənov*, Qeyri-üzvi kimya kafedrasına dos. *M.Q.Əhmədli*, Üzvi kimya kafedrasına *Ş.Əliyev*, Botanika kafedrasına dos.*M.D.Ağamirov*, Zoologiya kafedrasına dos. *Z.Şahtaxtinskaya*, Fizika kafedrasına *Zorkin*, İqtisadi coğrafiya kafedrasına prof.*Q.A.Koçaryan,* Fiziki coğrafiya kafedrasına *İ.İbrahimbəyli*, Geologiya kafedrasına prof.*A.Vəzirzadə*, Darvinizm kafedrasına dos.*M.A.Axundov*, Fiziologiya kafedrasına *S.P.Ocaqverdizadə*, Hərbi hazırlıq kafedrasına *B.A.Matskeviç,* Bədən tərbiyəsi kafedrasına *B.A.Saxatski* rəhbərlik edirdilər.

Müharibə ərəfəsində Pedaqoji İnstitutda kafedra, professor-müəllim və tələbələrin sayı ildən-ilə artmışdı. 1940/41-ci tədris ilində Pedaqoji İnstitutda 1387 nəfər tələbə təhsil alırdı ki, onların da təhsil-tərbiyəsi ilə 240 nəfər professor-müəllim məşğul olurdu. Professor-müəllimlərdən 8-i elmlər doktoru, professor, 57-si elmlər namizədi, dosent, 131-i baş müəllim, 44-ü assistant və müəllim idi[99]. Əməkdaşlardan 109 nəfəri (45,4%) azərbaycanlı idi.

| Fakültələr | Tələbələrin sayı | Milli və cinsi tərkibi | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | | Azərb. | | erməni | | rus | | digər millət | |
| | | kişi | qadın | kişi | qadın | kişi | qadın | kişi | qadın |
| Tarix | 179 | 28 | 5 | 86 | 47 | 4 | 13 | 9 | 7 |
| Dil-ədəbiyyat | 484 | 152 | 123 | 39 | 58 | 22 | 64 | 8 | 18 |
| Fizika riyaziyyat | 218 | 64 | 14 | 68 | 40 | 14 | 10 | 3 | 7 |
| Təbiət-kimya | 160 | 32 | 25 | 6 | 59 | 3 | 24 | 7 | 4 |
| Coğrafiya | 119 | 35 | 12 | 38 | 27 | 1 | 8 | 1 | 2 |
| Məktəbəqədər | 37 | - | 21 | - | 5 | - | 8 | - | 3 |
| Xarici dillər | 190 | 22 | 24 | 5 | 28 | 8 | 24 | 9 | 10 |
| Cəmi: | 1387 | 331 | 324 | 217 | 264 | 52 | 151 | 37 | 111 |

İnstitutda tədris-tərbiyə işlərini gücləndirmək, müəllim kadrları hazırlığında ciddi irəliləyişə nail olmaq məqsədilə institutda kadr dəyişikliyi baş verdi, Azərbaycan K(b)P MK bürosunun 11 mart 1940-cı il tarixli qərarı ilə ADPİ-nin direktoru Camal Əliyev vəzifəsindən azad olundu, onun yerinə ***Ələsgər Mahmud oğlu Həşimov*** təyin edildi.

[99] **Məmmədov Y.** *Azərbaycan Dövlət Pedaqoji Universiteti-90.Bakı, Təhsil, 2012, s.68*



***Ələsgər Mahmud oğlu Həşimov***
*(1904-1976 )*

*1904-cü ildə Bakı quberniyasının Göyçay qəzasının Alpoud kəndində anadan olmuşdur. Atası xırda ticarətlə məşğul olub. Uşaq olarkən ailəsi ilə birlikdə Şamaxı şəhərinə köçüblər. 1911-1914-cü illərdə Şamaxı şəhər rus-tatar məktəbində, 1914-1916-cı illərdə "Üxüvvət" məktəbində, 1916-1917-ci illərdə ali ibtidai məktəbdə təhsil alıb. 1917-ci ildə ailə yenidən Alpoud kəndinə qayıtdığına görə ali ibtidai məktəbi bitirə bilməyib. Atası 1918-ci ildə, evdar qadın olan anası 1920-ci ildə vəfat etmişdir. 1919-1923-cü illərdə Zaqafqaziya Dəmir Yolunun Müsüsli stansiyasında yerləşən un dəyirmanında yağdəyişdirici işləyib. Bakıya gələrək Qala-Maştağa rayonunun Maştağa kəndində icraiyyə nümayəndəliyində iş icraçısı işləyib. 1927-ci ildə Qala Maştağa rayonunda partiya sıralarına daxil olub. Həmin vəzifə ləğv edildiyindən 1926-1927-ci illərdə kənd klubunun müdiri vəzifəsində işləyib. 1923-1924-cü illərdə Maştağa kəndində su nasos stansiyasında çilingər, 1924-1925-ci illərdə elektrik stansiyasında çilingər, 1925-1926-cı illərdə iş icraçısı, 1927-1928-ci illərdə kənd təsərrüfatı anbarının müdiri işləyib. 1928-1929-cu illərdə un dəyirmanında yağ dəyişdirici işləyib. 1929-cu ilin mart ayında Azərbaycan K(b)P MK-da işlər müdiri təyin olunur. Sonra partiyanın göstərişi ilə rayon icraiyyə komitəsinə işə göndərilib. 1931-ci ilin yanvar ayından noyabr ayına kimi Azərbaycan K(b)P Qala-Maştağa rayonunda şöbə müdiri vəzifəsində işləyib. 1931-ci ildə Azərbaycan K(b)P MK-nın göndərişi ilə Azərbaycan Kommunist Universitetinin tədris şöbəsinin katibi təyin edilib. 1932-ci ildə Zaqafqaziya Xalq Komissarları Sovetinin İqtisadi-Tədqiqatlar İnstitutuna təhsil almaq üçün göndərilib. 2 sentyabr 1932-ci ildə Marksizm-leninizm İnstitutuna dəyişdirilib. Həmin institutu 1937-ci ildə bitirib. 5 sentyabr 1948-ci ildə ÜİK(b) MK-nın Marksizm-leninizm İnstitutunun Azərbaycan filialında ona verilən arayışda bildirilir ki, institutu bitirdikdən sonra o, Partiya Tarixi İnstitutuna elmi işçi göndərilib. 1938-1940-cı illərdə partiya kurslarının direktoru olub.*

*1935-1937-ci illərdə S.M.Kirov adına Azərbaycan Dövlət Bədən Tərbiyəsi İnstitutunda siyasi-iqtisad fənnini tədris edib.1 sentyabr 1937-ci ildən 23 fevral 1938-ci ilədək A.Zeynallı adına Azərbaycan Dövlət Konservatoriyasında Sosial-iqtisadi fənlər kafedrasının müdiri olub. 1 sentyabr 1937-ci ildən 1 sentyabr 1939-cu illərdə S.M.Kirov adına Azərbaycan Dövlət Bədən Tərbiyəsi İnstitutunda Siyasi-iqtisad kafedrasında dosent vəzifəsində çalışıb. 1 sentyabr 1946-cı ildən 25 avqust 1947-ci ilə kimi Azərbaycan Dövlət Xalq Təsərrüfatı İnstitutunda siyasi-iqtisad müəllimi işləyib. 15 mart 1940-ci ildən 16 dekabr 1941-ci ilə qədər Pedaqoji İnstitutun rektoru olub. 29 oktyabr 1941-ci ildən 8 aprel 1943-cü ilə qədər Xalq Maarif Komissarlığının müavini olub.1943-1944-cü illərdə Pedaqoji İnstitutda direktor müavini və müəllim olub.1944-1947-ci illərdə Azərbaycan SSRİ Xalq Komissarları Sovetinin nəzdindəki Dövlət Plan Komitəsinə Mədəniyyət və səhiyyə şöbəsinin müdiri olub. 1948-1951-ci illərdə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunda və Azərbaycan Pedaqoji Xarici Dillər İnstitutunda müəllim işləyib. 16 fevral 1949-cu ildə Marksizm-leninizm kafedrasının müdir vəzifəsinin icrası həvalə olunub. 11 aprel 1949-cu ildə Azərbaycan SSR Maarif Nazirliyinin əmri ilə İnstitutun Elmi Şurasının tərkibinə daxil edilib. 23 sentyabr 1949-cu ildə kafedra müdiri vəzifəsindən azad olunub, həmin kafedrada siyasi-iqtisad müəllimi saxlanılıb. 12-18 may 1950-ci ildə Şamxor, Gədəbəy, Tovuz, Ağstafa, Qazax rayonlarında şagirdlər arasında ali məktəbə hazırlıqla bağlı söhbət aparmaq üçün məzuniyyətdə olub. 7 fevral 1950-ci ildə Qiyabi Pedaqoji İnstitutda*

*işləməsi ilə əlaqədar olaraq 0,5 ştata keçirilib. 18 may 1951-ci ildə Azərbaycan Pedaqoji Xarici Dillər İnstitutunda Marksizm-leninizm kafedrasının baş müəllim vəzifəsinə təyin olunub və ömrünün sonuna kimi həmin kafedrada işləyib. "Azərbaycanın pambıqçılıq kolxozlarında saxlaqçılıq hərəkatının inkişafı" mövzusunda dissertasiya üzərində çalışıb. İnstitutda marksizm-leninizm klassiklərinin əsərlərinin öyrənilməsi ilə bağlı seminar təşkil edib, siyasi dərnəyin rəhbəri olub. Azərbaycan SSR Ali Sovetinin 1 çağırış deputatı olub.*

*1976-cı ildə Bakı şəhərində vəfat edib.*

Yeni direktor Ələsgər Həşimovun qarşısına ali pedaqoji təhsilli müəllim kadrları hazırlığı ilə bağlı xeyli vəzifələr qoyulmuşdu. Çox təəssüf ki, az sonra Vətən müharibəsinin başlaması müəllim kadrları ilə bağlı nəzərdə tutulan işlərin reallaşmasına imkan vermədi. Müəllimlərin və tələbələrin bir qismi cəbhəyə, digər qismi isə əhali arasında təbliğat və təşviqat işlərinə səfərbər olundu. İnstitutun professor-müəllimləri elm və təhsil müəssisələrində, hospitallarda, hərbi komissarlıqlarda, sənaye və kənd təsərrüfatı müəssisələrində müharibə əleyhinə məruzələr oxuyur, əhalini mübarizəyə ruhlandırır, faşizmə nifrətlərini ifadə edirdilər. Obyektiv səbəblərdən Pedaqoji İnstitutun maliyyələşdirilməsində və kadr potensialında ciddi çətinliklər yaratmışdı. İnstitut müharibə dövrünün tələblərinə və qanunlarına uyğun fəaliyyət göstərirdi. Müharibənin törətdiyi çətinliklər tədris prosesinin pozulmasına, dərsdən yayınma hallarının artmasına, bəzi tələbələrin isə təhsilini yarımçıq qoyaraq istehsalata getmələrinə səbəb oldu. Tədris plan və proqramları müharibənin tələblərinə uyğunlaşdırıldı, hərbi təlim məsələlərinin tədrisinə diqqət artırıldı.

Tədrisin təşkilində və tələbələrin dərsə davamiyyətində yaranan ciddi problemlərlə bağlı institutun direktoru Ələsgər Həşimovun Azərbaycan K(b)P MK-nın partiya təbliğatı şöbəsinə ünvanladığı məlumatlar həmin dövrün sərt reallıqlarını əks etdirir. Məlumatdan aydın olur ki, 1940/41-ci tədris ili üçün V.İ.Lenin adına ADPİ-də 106 tələbə qrupu nəzərdə tutulsa da, tələbələrin Qiyabi Pedaqoji İnstituta və digər ali məktəblərə köçürülmələri nəticəsində cəmi 83 qrup qalmışdır. Bəzi şöbələrdə (təbiyyat, coğrafiya, xarici dil) tələbələrin sayı hətta 4 nəfərə qədər azalmışdı. O, məktubunda bəzi ixtisasların (riyaziyyat-fizika) birləşdirilməsini, bəzilərinin ADU-ya verilməsini (tarix və təbiyyat), bəzilərinin isə eksternat formasına (fransız dili) keçirilməsini, Məktəbəqədər tərbiyə fakültəsinin ləğv edilməsini, əvəzinə M.F.Axundov adına Müəllimlər İnstitutunun nəzdində məktəbəqədər tərbiyə müəssisələri işçilərinin hazırlığı şöbəsinin açılmasını təklif edirdi[100].

Tələbə sayının az olduğu qrupların saxlanılması xeyli vəsait tələb edirdi. Dövlət isə büdcədə ciddi dəyişiklik etmişdi: sosial-mədəni tədbirlər arxa plana keçirilmiş, ali məktəblərin büdcəsi xeyli azaldılmışdı.Bir sıra ali məktəblərin bağlanması və ya nisbətən böyük ali məktəblərin tərkibinə birləşdirilməsi zərurəti yaranmışdı. Müqayisə üçün qeyd edək ki,1940-cı ildə Xalq Maarif Komissarlığına kadr hazırlığı üçün dövlət büdcəsindən 46 mln.244 min rubl, 1941-ci ildə isə 25 mln.574 min rubl., 1942-ci ildə isə cəmi 15 mln.829 min rubl. ayrılmışdı. 3 il müddətində xalq maarifinə ayrılan vəsait 33% azalmışdı.

Elə bu səbəbdən də müharibə illərində bəzi ali məktəblərin tədris və elmi həyatı pozuldu, onların müstəqil institut kimi fəaliyyətinə son qoyuldu. Azərbaycan Xalq Komissarları Sovetinin 5 sentyabr 1941-ci il qərarı ilə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutu Pedaqoji İnstitutun qiyabi şöbəsinə, Xarici Dillər İnstitutu müvəqqəti olaraq Xarici dillər fakültəsinə çevrildi. 1941-ci ilin iyul ayında Pedaqoji İnstitutun Xarici dillər fakültəsində 190 nəfər tələbə təhsil alırdı ki, onlardan da 24 nəfəri azərbaycanlı qadın idi[101].

Müharibə əməliyyatları genişləndikcə Pedaqoji İnstitutun maddi imkanları tükənir, professor-müəllim heyətinin vəziyyəti ağırlaşırdı. Bütün çətinliklərə

[100] *Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. F.1.,siyahı 26, sax.vah.713,v.70*

[101] ***Sadıqov Ş., Əzimov H.,Salahov M. V.İ.Lenin*** *adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu 50 ildə. Bakı, ADPİ,1972, s.47*

baxmayaraq, institutun kollektivi əsl vətənpərvərlik nümunəsi göstərirdilər. İnstitut əməkdaşları SSRİ Müdafiə Fonduna xeyli vəsait toplayıb verdilər. Müdafiə Fonduna institutun direktoru Ələsgər Həşimov 500, Ağaməmməd Abdullayev 1000, Feyzulla Qasımzadə 500 rubl, Abasqulu Abaszadə 2500 rublluq, Dil-ədəbiyyat fakültəsinin dekanlığı 1000 rublluq istiqraz vərəqəsi bağışladı. Dosent Cəfər Xəndan Müdafiə Fonduna 2000 rubl. pul vermiş, müharibə qələbə ilə başa çatanadək hər ay 4 günlük əmək haqqının bu fonda verilməsini xahiş etmişdi.

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunda Xarici dillər fakültəsinin təşkili

Orta məktəblərdə xarici dillərin tədrisinin məcburi fənlər sırasına daxil edilməsi orta təhsili başa vuran şagirdlərin daha geniş dünyagörüşünə malik olmasında mühüm rol oynadı. Həmin illərdə Azərbaycan Pedaqoji İnstitutunda da xarici dillərin tədrisi genişləndi. Almaniyanın Avropanın inkişaf etmiş ölkələri sırasına çıxması Azərbaycanda da alman dilinin öyrənilməsinə marağı artırdı. 1931/32-ci tədris ilində Azərbaycan Pedaqoji İnstitutunun Ədəbiyyat, Tarix-ictimaiyyat, Riyaziyyat və Təbiyyat fakültələrində II-III kursda tələbələr 40 saat xarici dil (alman dili) dərsi keçirdilər.

ADPİ-nin Metodik Şurasının 4 yanvar 1932-ci il tarixli iclasının qərarı ilə alman dilinə ayrılan saatların həcminin 6 dəfə artırılaraq 240 saata çatdırılması qərara alındı[102]. Pedaqoji İnstitutda xarici dillərin tədrisi məsələsi Dillər kafedrasının 24 aprel 1932-ci ildə keçirilən iclasında geniş müzakirə olundu. Prof.A.V.Baqrinin təklifi ilə xarici dil müəllimlərinin yeni tədris ilindən ayrı-ayrı fakültələrə təhkim olunması qərara alındı. Tələbələrin müstəqil şəkildə dil öyrənmələrinə hər cür şərait yaradılırdı.1933-cü ilin martın 8-də ADPİ üzrə təsdiq edilmiş tədris planında I-II kurslarda hər semestr tələbənin alman dilini öyrənməsi üçün 40 saat müəllimlə işləməyə, 80 saat müstəqil işə, III kursda isə 100 saat vaxt ayrılmışdı. Riyaziyyat və Təbiyyat fakültələrində isə alman dilinin öyrənilməsinə I-II kurslarda 120 saat, III-IV kurslarda 60 saat vaxt nəzərdə tutulmuşdu.

Xarici dillərin öyrənilməsinin dövlət siyasəti səviyyəsinə qaldırılması nəticəsində aspirantların da tədris planlarında xarici dillərin tədrisinə geniş yer verildi. İnstitutda riyaziyyat, zoologiya, üzvi kimya ixtisasları üzrə təhsil alan aspirantlar 1933/34-cü tədris ilində 100 saat alman dili keçmişdilər. Sonrakı illərdə xarici dillərin öyrənilməsinə ayırılan saatların həcminin 300 saata qədər artırılması nəzərdə tutulmuşdu.[103]

Xarici dillərin öyrənilməsi orta məktəblərdə, pedaqoji texnikumlarda, ali məktəblərdə tədris fəaliyyətinin vacib bir hissəsinə çevrilmişdi. Lakin bu vacib missiyanın öhdəsindən gələ biləcək müəllim kadrları, xüsusilə də milli kadrlar yox idi. Həmin dövrdə xarici dil müəllimlərinin çatışmazlığı yalnız Azərbaycan ali məktəbləri üçün deyil, həm də digər Cənubi Qafqaz respublikaları üçün də xarakterik idi. Ona görə də bu məsələ Zaqafqaziya Sosialist Federativ Sovet Respublikaları XKS-ın 1934-cü il iyul ayının 11-də Qəzənfər Musabəyovun sədrliyi ilə keçirilən iclasında geniş müzakirə edildi və *"Pedaqoji təhsilin yaxşılaşdırılması tədbirləri haqqında"* qərar qəbul edildi. Qərarda deyilirdi:

1. ZSFSR-də pedaqoji kadrların hazırlanmasında aşağıdakı sistem tətbiq edilsin: a)orta məktəb üçün 4 illik təhsil sistemi ilə pedaqoji kadrlar hazırlayan ali pedaqoji məktəblər.

2. Pedaqoji İnstitutda aşağıdakı fakültələr təşkil edilsin: a) Tarix-ədəbiyyat; b) Fizika-riyaziyyat; c) Təbiyyat; ç) pedoloji-pedaqoji[104].

Qərarda Tarix-ədəbiyyat fakültəsinin nəzdində 4 şöbənin yaradılması planlaşdırıldı: a) tarix; b) ana dili və ədəbiyyatı; c) rus dili və ədəbiyyatı; ç) xarici

[102] *Azərbaycan Respublikası Dövlət Arxivi. F.1656,siy.3, iş 3,v.160*
[103] ***Tahirov A.*** *Kafedra-fakültə-institut."Gənc müəllim",28 noyabr 1981*
[104] *Azərbaycan Respublikası Dövlət Arxivi. F.1656,siy.3, iş 16,v.4*

dili və ədəbiyyatı. Bununla yanaşı, həm də ikiillik pedaqoji institutların təşkili məsələsi də müzakirə olunmuşdu.

18 dekabr 1934-cü ildə "Pravda" qəzetində "Xarici dillərin öyrədilməsi uğrunda" adlı baş məqalə nəşr olundu. Ölkədə xarici dillərin öyrədilməsi sahəsində böyük canlanma yarandı və mühüm təşkilati işlər həyata keçirildi. ADPİ-nin Dillər kafedrasının dosenti B.P.Yablonko həmin məqalə ilə bağlı geniş təkliflərlə çıxış etdi.



*Tələbə adını qazananlar*

Azərbaycan XMK Pedaqoji İnstitutda xarici dil və ədəbiyyatı şöbəsinin açılması ilə bağlı "Pedaqoji təhsilin yaxşılaşdırılması tədbirləri haqqında" qərar qəbul etdi.

1935-ci ilin yanvarın 5-də Pedaqoji İnstitutda xarici dillərin tədrisi vəziyyəti müzakirə olundu. Müzakirədə tədris hissə müdiri M.Mehdizadə, Dillər kafedrasının müdiri, prof.B.Çobanzadə, kafedranın əməkdaşları B.P.Yablonko, N.Novrotskaya, Q.Neff, P.Kromm, Pedaqoji fakültənin dekanı Ə.Seyidov, İctimaiyyətşünaslıq fakültəsinin dekanı M.Axundov, Fizika-riyaziyyat fakültəsinin dekanı M.Abdullayev iştirak edirdi. Ciddi müzakirələrdən sonra vəziyyətdən çıxış üçün iki yol müəyyənləşdirildi:1) milli xarici dil müəllimi hazırlamaq məqsədilə xarici dil şöbəsinin yaradılması; 2) Pedaqoji İnstitutda fəaliyyət göstərən xarici dil müəllimlərinə Azərbaycan dilini öyrətmək məqsədilə dərnəklərin təşkil edilməsi.

1936/37-ci tədris ilində Dillər kafedrasının bazasında üç müstəqil kafedra: Azərbaycan dili kafedrası; Rus dili kafedrası və Xarici dillər kafedrası yaradıldı. Milliyyətcə alman olan Otto Heff Xarici dillər kafedrasına müdir təyin olundu. Kafedranın əməkdaşları da (M.Yusupova, P.Kromm, N.Novorotskaya, V.Rikqof) alman dili mütəxəssisləri idi. P.İ.Kpomm- Ədəbiyyat və Məktəbəqədər tərbiyə fakültəsində, N.L.Novrotskaya – Tarix fakültəsində, Q.X.Neff – Fizika -riyaziyyat fakültəsində, V.A.Riqkof - Təbiyyat fakültəsində, M.M.Yusupova - Coğrafiya fakültəsində 29 qrupda 536 tələbəyə dərs deyirdi.

Həmin tədris ilində fakültələrdə fransız və ingilis dilini öyrənmək istəyən tələbələrin sayını öyrənmək məqsədi ilə aparılan sorğu zamanı məlum oldu ki, fransız dili ilə bağlı bir neçə qrup yaratmaq mümkün olduğu halda, ingilis dili ilə bağlı qrup yaratmaq mümkün deyil. Tələbələr arasında ingilis dilini öyrənməyə marağın çox aşağı olması müəyyənləşdirilmişdi.

Orta məktəblərdə xarici dil fənlərini tədris edən yüksəkixtisaslı müəllimlər hazırlamaq üçün ADPİ-də Xarici dillər fakültəsinin açılması ilə bağlı Xalq Maarif Komissarlığı Azərbaycan SSR Xalq Komissarları Sovetinə müraciət etdi. Hökumət 1937-ci il oktyabr ayının 9-da "Azərbaycan Pedaqoji İnstitutunda Xarici dillər fakültəsinin təşkil edilməsi haqqında" qərar qəbul edildi[105]. 1937/38-ci tədris ilindən Pedaqoji İnstitutda Xarici dillər (ingilis, fransız, alman) fakültəsinin açılmasına və hər il 200 nəfər tələbənin qəbul edilməsinə icazə verildi.

Azərbaycan XMK-nın 1937-ci il 5 mart tarixli 171 saylı "Xarici dillər fakültəsinin təşkili haqqında" əmrindən dərhal sonra Pedaqoji İnstitutda təşkilati işlər həyata keçirildi və dekanlıq yaradıldı. P.İ.Kpomm fakültənin ilk dekanı təyin olundu. Bir il sonra -

[105] *Azərbaycan Respublikası Dövlət Arxivi. F.57,siy.1, iş 1247,v.17*

1938-ci ilin oktyabrın 10-da Y.Qirşqom Xarici dillər fakültəsinə dekan seçildi. Həm Pedaqoji İnstitutda, həm də onun nəzdində fəaliyyət göstərən Müəllimlər İnstitutunda Xarici dillər fakültəsi yaradıldı. Xalq Maarif Komissarlığı tərəfindən ikillik Müəllimlər İnstitutuna 200 nəfərin, Pedaqoji İnstituta isə 150 nəfərin qəbul edilməsi planlaşdırıldı. Xarici dillər fakültəsinə və istehsalatdan ayrılmaqla qısa müddətli kurslara qəbul olunmuş şəxslərə ayda 200-250 manat təqaüd müəyyənləşdirildi.

1939-cu ildə fakültənin Xarici dillər kafedrası əsasında üç yeni kafedra yaradıldı:1) Alman dili kafedrası (müdiri İ.Rax); 2) Fransız və latın dilləri kafedrası (Y.Qirşqom); 3) İngilis dili kafedrası (müdir T.Akopova).

Xarici dillər fakültəsinə daha bacarıqlı gəncləri seçmək məqsədilə fakültənin nəzdində Xalq Maarif Komissarlığının razılığı ilə hazırlıq kursları təşkil edilmişdi. Həmin kursların müdavimləri instituta imtahansız qəbul edilirdi. Hazırlıq kursuna ilk dəfə 59 nəfər cəlb olunmuşdu. Fakültəyə 200 nəfərin qəbulu planlaşdırılsa da, ilk tədris ilində cəmi 175 nəfər tələbə adı qazanmışdı. Onlardan 46 nəfəri Azərbaycan bölməsinə, 129 nəfəri rus bölməsinə qəbul olunmuşdu. 1941-ci ildə həmin tələbələrdən yalnız 95 nəfəri diplom ala bildi.

| Şöbə | Azərbaycan bölməsi | Rus bölməsi | Cəmi |
|---|---|---|---|
| İngilis | 9 | 50 | 59 |
| Alman | 33 | 59 | 92 |
| Fransız | 4 | 20 | 24 |
| Cəmi | 46 | 129 | 175 |

Xarici dil müəllimlərinin ilkin dəstəsinin hazırlanmasında Əli Xudaverdiyevlə yanaşı milli kadrlar Rüxsarə Qayıbova, Cəfər Cəfərov, Nəzakət Ağazadə və Sara Aşurbəyli-Salamovanın mühüm xidmətləri olmuşdur.

Yeni yaranmış fakültə tədris uğurları ilə digər fakültələrdən fərqlənirdi. Məsələn, 1937/38-ci tədris ilinin sonunda Xarici dillər fakültəsi ADPİ-nin 6 fakültəsi arasında imtahan sessiyasının yekunlarına görə Coğrafiya fakültəsindən sonra ikinci yeri tutmuşdu. 145 tələbədən 116 nəfəri müvəffəq qiymət almışdı ki, bunlardan da 18 nəfəri əlaçı idi. Sonrakı illərdə fakültədə tədrisin keyfiyyətinin yüksəldilməsi nəticəsində fakültə birinci yerə yüksəlmişdi.

V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru Ələsgər Həşimovun 6 noyabr 1940-cı il tarixli 164 saylı əmrdə yazılır: ”*Tədris planının 100 faiz doldurulmasına, imtahan sessiyalarının yaxşı təşkil edilməsi və yaxşı nəticələr verməsinə, ictimai işlərin nümunəvi quruluşu və yüksək əmək intizamının yaradılmasına görə institutun* ***keçici Qızıl Bayrağı*** *Xarici dillər fakültəsinə verilsin. Dekan Kpomm yoldaşa, partiya təşkilatçısı Qornı yoldaşa, fakültənin KGİ təşkilatçısı Butiter yoldaşa təşəkkür elan edilsin.*

II Dünya müharibəsi başlandıqdan sonra xarici dil mütəxəssislərinə ehtiyac artdığından Azərbaycan SSR XKS-in 1940-cı ilin oktyabrında “Azərbaycan SSR-in ali və orta məktəblərində alman, fransız və ingilis dillərinin tədrisi haqqında” qəbul etdiyi qərara müvafiq olaraq ADPİ-nin Xarici dillər fakültəsi 1941/42-ci tədris ilindən Pedaqoji Xarici Dillər İnstitutuna çevrildi[106].

İnstitutun I kursuna 150 nəfər tələbənin qəbul edilməsi planlaşdırıldı. Pedaqoji İnstitutun Xarici dillər fakültəsinin tələbələri Pedaqoji Xarici Dillər İnstitutunun müvafiq kurslarına köçürüldülər.

[106] *Yeni yaranan instituta rəhbərlik Azərbaycan XMK-nın 1139 saylı əmri ilə ADPİ-nin direktoru Ələsgər Həşimova həvalə edilmişdi.*

Lakin 1941-ci ildə Böyük Vətən müharibəsinin başlanması ilə əlaqədar olaraq institut yalnız təşkilatlanma prosesini həyata keçirə bildi və XMK-nın əmri ilə sentyabr ayının 1-dən yenidən ADPİ-nin fakültəsi kimi öz fəaliyyətini davam etdirdi. İkiillik xarici dillər kursu da yenidən Pedaqoji İnstitutun nəzdində öz fəaliyyətini davam etdirməli oldu.

19 sentyabr 1941-ci ildə Pedaqoji İnstitut Azərbaycan Dövlət Universiteti ilə birləşdiriləndə Xarici dillər fakültəsi universitetin nəzdində müstəqil fakültə kimi fəaliyyətini davam etdirdi. Pedaqoji İnstitutun Xarici dillər fakültəsinin bütün müəllim və tələbələri universitetə köçürüldülər. İngilis dili kafedrasının assistenti Revekka Yuliyevna Barsuk ADU-da Xarici dillər fakültəsinin dekanı təyin olundu.

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunda elmi mühit (1931-1941-ci illərdə)

Azərbaycanda ayrı-ayrı elm sahələrinin inkişafını təmin edən əsas amillərdən biri elmi-pedaqoji kadr hazırlığıdır. Azərbaycanda elmi-pedaqoji kadr hazırlığının ilkin mərhələsi 20-ci illərin II yarısına təsadüf edir. 1926-cı ilin may ayında Azərb.K(b)P MK Xalq Maarif Komissarlığına respublikanın ali məktəblərində aspirantura təşkil etməyi tapşırdı. Ancaq bu dövrdə elmi-pedaqoji kadr hazırlığının qaydasını, formalarını və müddətini dəqiq müəyyən edən normativ sənədlər yox idi. ”Elmi əməkdaş”, ”elmi işçi”, ”aspirant” kimi anlayışlar arasında dəqiq fərq qoyulmamışdı, onların hüquq və vəzifələri göstərilməmişdi. Elmi işçilər hazırlanması üçün maliyyə vəsaiti ayrılmamışdı. İlk dəfə Azərbaycan Dövlət Universitetində və Azərbaycan Politexnik İnstitutunda (indiki Neft və Sənaye Universitetində) aspirantura şöbələri yaradıldı[107].1929-cu il mayın 18-də respublika XMK nəzdində Dövlət Elm Şurası elmi işçilər hazırlamaq haqqında ”Əsasnamə” təsdiq etdi[108] Bu əsasnamədə göstərilirdi ki, aspiranturada təhsil müddəti 3 ildir. Aspirant həmin müddət ərzində elmi işini hazırlamalı və fakültənin açıq iclasında onu müdafiə etməlidir. Aspirant elmi işlə yanaşı, təhsil illərində rus dilini, azərbaycanlı olmadığı təqdirdə Azərbaycan dilini, həm də milliyətindən asılı olmayaraq xarici dillərdən birini öyrənməli idi. İki il müddətində aspirant xüsusi proqram və fərdi plan əsasında fəlsəfəni öyrənməli, 1-2 sınaq mühazirəsi oxumalı, ixtisası üzrə 2 məruzə hazırlamalı idi. Aspiranturanın ikinci tədris ilinin sonunda o, dövlət aspirantura imtahanı verməli, üçüncü tədris ilində dissertasiyanı müzakirəyə təqdim etməli idi. Aspirantın dissertasiya mövzusu birinci tədris ilinin sonu, ikinci tədris ilinin əvvəlində təsdiq olunurdu.

Milli elmi kadrlar hazırlamaq məqsədilə 1929-cu ildə ADU-da ”İrəli çəkilmiş tələbələr institutu” təşkil edildi. Həmin institutun fəaliyyətini tənzimləyən “Əsasnamə”də yazılırdı: *“Tələbələrin proletar hissəsindən daha hazırlıqlı olanlarını əvvəlcədən müəyyən edib irəli çəkmədən və onlara hələ tələbəlik skamyasından başlayaraq tədricən elmi işə hazırlamaq üçün faktik imkan yaratmadan, elmi işçi kadrlarının planlı surətdə komplektləşdirilməsi kifayət dərəcədə yaxşı aparıla bilməz. Bu vəzifəni yerinə yetirmək məqsədilə ali məktəblərin nəzdində “irəli çəkilmiş tələbələr institutu yaradılır*”[109]. Belə bir təşəbbüsün həyata keçirilməsi - ”irəli çəkilmiş tələbələr institutu”nun yaradılması bilavasitə aspirantura vasitəsilə Azərbaycanda milli elmi-pedaqoji kadr hazırlığına xidmət edirdi. Təsadüfi deyil ki, 1930-cu ildə ADPİ-də Pedaqogika kafedrası yaradılarkən həmin ”institut”un qabaqcıl

---

[107] ***Mehdizadə M.**və b. Azərbaycanda xalq maarifinin sürətli inkişafı. Bakı: Maarif, 1980, s.232*

[108] *Развитие высшей школы в советском Азербайджане. Баку: Маариф, 1984, s.144*

[109] **Маковельский А.С.** *Первое десятилетие АГУ им. В.И.Ленина (1919-1929 гг.). Баку, 1930, с.12*

tələbələri Əhməd Əhmədzadə, Mirhəbibi Seyidov, Dilruba Mustafazadə, Əşrəf Hacıyev kafedraya işə dəvət olunmuşdular[110].

ÜİK(b)P MK-nın ”Elmi kadrlar haqqında” 26 iyun 1929-cu il tarixli qərarı və MK-nın noyabr plenumu elmi kadr hazırlığını nizama saldı və bu sahədə ciddi dönüş yaratdı. Plenumun qətnaməsində *“fəhlə və kəndlilərin içərisindən gənc elmi qüvvələrin irəli çəkilməsi, elmi-pedaqoji kadrların keyfiyyətinin yaxşılaşdırılması və sayının artırılması”* məqsədilə ciddi və təxirəsalınmaz tədbirlərin görülməsi planlaşdırıldı.

1932-ci ildə Pedaqoji İnstitutda aspirantura şöbəsi yaradıldı[111]. Əşrəf Quliyev Pedaqoji İnstitutun aspirantura şöbəsinə müdir təyin edildi. Sonrakı illərdə şöbəyə ***Hacıbaba Nəzərli, Q.Qorski, Mircəlal Paşayev*** rəhbərlik etdilər. 17 fevral 1932-ci ildə aspiranturaya ilk qəbul keçirildi. Müsabiqə nəticəsində ayrı-ayrı ixtisaslar üzrə 29 nəfər aspiranturaya[112] qəbul edildi. 1932/33-cü tədris ili üçün ADPİ üzrə verilən 15 oktyabr 1932-ci tarixli əmrdə ***kimya*** ixtisası üzrə 4 nəfər (İsakov Mamed,Tağızadə Baba, Məmmədov Şamxal, Hüseynzadə Hüseyn), ***fizika-riyaziyyat*** ixtisası üzrə 4 nəfər (Orucov Mənsur, Əhmədov Bəhram, Rzayev Riza, Salayev Aqil), ***zoologiya və botanika*** ixtisası üzrə 3 nəfər (Səfərov Kamal, Hüseynov Məmməd, Şükürzadə Canal), ***ədəbiyyat*** ixtisası üzrə 2 nəfər (Hacıyev Cəfər (Cəfər Xandan), Əhliman Axundov), ***pedologiya və pedaqogika*** ixtisası üzrə 3 nəfər (Mustafayeva Dilrubə, Rzayev Ağa, Hacıyev Əmiraslan), ***dialektik materializm və leninizm*** ixtisası üzrə 2 nəfər (Əsgərov Əziz, Məmmədov Məmməd) aspiranta təqaüd verilməsi nəzərdə tutulurdu. Həmin əmrin 2-ci bəndində dərslərdə müntəzəm iştirak etmədiyinə görə 7 nəfərin (Kilasov İlyas, Qəmbərov Kamal, Nağızadə Salavat, Səmədzadə Məmmədiyə, Şirəliyev Müseyib, Şirəliyev Xudadat, Əlizadə Zahid) aspiranturadan xaric edilməsi göstərilirdi. 19 may 1932-ci ildə aspirant Ziyad Xəlilova təqaüd verilməsi ilə bağlı əlavə əmr verilmişdir. 1933-cü ilin əvvəllərində Həmid Araslı[113], 7 mart 1933-cü ildə İsmayıl Qazıyev, Prunis, Zümrüd Axundova, Mehdi Mehdizadə, Əhməd Seyidov, Mircəlal Paşayev[114], 16 mart 1933-cü ildə Səməd Vəkilov[115] Pedaqoji İnstitutun aspiranturasına qəbul olunub. Burada bir məsələni qeyd edək ki, Əhməd Seyidov və Mehdi Mehdizadə 1931-ci ildə əvvəlcə Azərbaycan DETİ-nin aspiranturasına qəbul olunmuş, 1932-ci ildə Azərb.DETPEİ-nin (indiki Təhsil İnstitutu) aspiranturasına, oradan da Pedaqoji İnstitutun aspiranturasına köçürülmüşdülər. Həmin dövrdə Pedaqoji İnstitutda təhsil alan aspirantların sayı 30 nəfər idi.[116] Bir il sonra aspirantların sayı xeyli artdı.13 yanvar 1934-cü ildə institut üzrə verilən əmrdə[117] *dilçilik* ixtisası üzrə aspirantlar İsmayıl Əfəndiyev, M.Hüseynzadə, Məmmədağa Şirəliyev prof B.Çobanzadəyə, *riyaziyyat* ixtisası üzrə aspirantlar İsa Kazımov, Rza Rzayev dos.Məmməd Əfəndiyevə, Aqil Salayev prof.Ammosova, *ədəbiyyat* ixtisası üzrə aspirantlar Səməd Vəkilov, Cəfər Hacıyev, Mircəlal Paşayev, Həmid Araslı dos.Əli Nazimə, *fizika* ixtisası üsrə aspirantlar Zahid Əliyev, Z.Qasımzadə, H.Xudaverdiyev prof. Tixinova, *üzvi kimya* ixtisası üzrə aspirantlar S.Quluzadə, Şamxal Məmmədov prof.K.A.Krassusskiyə, *qeyri-üzvi* kimya ixtisası üzrə aspirant Z.Zəhrabəyov prof. V.Tixomirova, *geologiya* ixtisası üzrə aspirant Ə.Əsgərov prof.A.Vəzirzadəyə, *zoologiya* ixtisası üzrə aspirant K.Qəmbərzadə prof.Elpatevskiyə, *biologiya* ixtisası üzrə aspirant M.Hüseynov prof.F.Rza-

---

107 ***Mehdizadə M.*** *və b. Azərbaycanda xalq maarifinin sürətli inkişafı. Bakı: Maarif, 1980, s.232*
108 *Развитие высшей школы в советском Азербайджане. Баку: Maариф, 1984, s.144*
109 ***Маковельский А.С.*** *Первое десятилетие АГУ им. В.И.Ленина (1919-1929 гг.). Баку, 1930, с.12*
110 ***Rüstəmov F.*** *Azərbaycan pedaqogikaşünaslığı. Bakı, Elm və təhsil, 2016, s.658-659*
111 *İndiyə qədərki araşdırmalarda Pedaqoji İnstitutda aspirantura şöbəsinin 1933-cü ildə yaradıldığı bildirilir. Bu fikir yanlışdır. Arxiv sənədləri sübut edir ki, aspiranturaya qəbul 1932-ci ildə keçirilib. 1933-cü ildə qəbul edilən aspirantlarla bağlı təqaüd əmri verilib. Ola bilər ki, tədqiqatçılar həmin tarixi əsas götürüblər.*
112 *ADPU-nun Arxivi. F.1, siy.1. sax vah. 1 a, v.3.*
113 *ADPU-nun Arxivi. F.1, siy.1. sax vah. 1 a, v.58*
114 *ADPU-nun Arxivi. F.1, siy.1. sax vah. 1 a, v.98*
115 *ADPU-nun Arxivi. F.1, siy.1. sax vah. 1 a, v.117*
116 *ADPU-nun Arxivi. F.1, siy.1. sax vah. 1 a, v.99*
117 *ADPU-nun Arxivi. F.1, siy.1, sax.vah. 10, v.50*

bəyli, *pedaqologiya* ixtisası üzrə aspirant Osman Əfəndiyev prof.A.O.Makovelskiyə, *pedaqogika* ixtisası üzrə aspirantlar A.Nəsirov, D.Mustafayeva, Z.Axundova, İ.Qazıyev dos.M.Rəhimliyə təhkim olundu. Həmin ilin oktyabr ayında Əzəl Dəmirçizadə, Muxtar Hüseynzadə, Həsən Abdullayev, Şamil Əliyev, İmran Babayev, Salman Quluzadə və b. aspiranturaya qəbul olundular.

Aspirantura şöbəsinin təşkili Pedaqoji İnstitutda elmi-pedaqoji fikrin inkişaf etməsinə, ayrı-ayrı elm sahələri üzrə yüksəkixtisaslı elmi və elmi-pedaqoji kadr hazırlığına geniş şərait yaratdı, milli kadrların hazırlanması perspektivlərini müəyyənləşdirməyə imkan verdi.

Sonrakı illərdə təlim uğurları ilə seçilən məzunlardan elmi işə marağı və həvəsi olanlar aspiranturada saxlanıldı. Əsəd İbrahimov, Zəkəriyyə Mehdizadə, Xanmurad Mirzəyev, Məmmədiyyə Əfəndiyev təhsildə fərqləndikləri üçün aspiranturada saxlanıldılar.

Qeyd etmək lazımdır ki, 30-cu illərin əvvəllərində Pedaqoji İnstitutda ayrı-ayrı ixtisaslar üzrə kifayət qədər elmi-pedaqoji potensial toplanmışdı. İldən-ilə professor-müəllim heyətinin tərkibində keyfiyyət və kəmiyyət dəyişikliyi baş verirdi. Əsas problem professor-müəllim heyətinin tərkibində milli kadrların azlığı ilə bağlı idi. Elə ixtisaslar var idi ki, həmin sahədə ümumiyyətlə, elmi dərəcəsi və elmi adı olan milli kadrlar yox idi. Aspirantura vasitəsi ilə milli elmi-pedaqoji kadr hazırlığı bu problemin aradan qaldırılmasının ən yaxşı yolu hesab edilirdi.

Aşağıdakı cədvəldə 1930-1941-ci illərdə Pedaqoji İnstitutda professor-müəllim heyətinin (o cümlədən milli elmi kadrların) inkişaf dinamikası verilmişdir.

| Tədris illəri | Prof.-müəl. heyəti | O cümlədən | | | | | |
|---|---|---|---|---|---|---|---|
| | | Azərb. | digər millətdən olanlar | Prof. | Dos.və ya dos. əvəzi | B/m | Assistent və müəl. |
| 1930/31 | 164 | 76 | 88 | 19 | 57 | 49 | 39 |
| 1931/32 | 178 | 87 | 91 | 17 | 46 | 50 | 65 |
| 1932/33 | 173 | 93 | 80 | 14 | 34 | 45 | 79 |
| 1933/34 | 186 | 101 | 85 | 12 | 36 | 42 | 108 |
| 1934/35 | 190 | 96 | 94 | 10 | 39 | 47 | 104 |
| 1935/36 | 198 | 102 | 96 | 13 | 42 | 51 | 105 |
| 1936/37 | 201 | 114 | 83 | 16 | 35 | 63 | 103 |
| 1937/38 | 208 | 106 | 102 | 10 | 16 | 76 | 96 |
| 1938/39 | 197 | 97 | 100 | 13 | 58 | 65 | 59 |
| 1939/40 | 241 | 109 | 132 | 8 | 45 | 123 | 58 |
| 1940/41 | 240 | 109 | 131 | 8 | 57 | 131 | 44 |

Pedaqoji İnstitutda 1930/31-ci tədris ilində tələbələrin sayı 1039 nəfər olduğu halda, 1940/41-ci tədris ilində 2055 nəfər olmuşdur. Qəbul planı 350-dən 600-ə, məzunların sayı 126 nəfərdən 571 nəfərə yüksəlmişdi.

10 il müddətində professor-müəllimlərin də sayında ciddi dəyişikliklər olmuşdur. Belə ki, professor-müəllimlərin sayı 164-dən 240-a, o cümlədən azərbaycanlıların sayı 88-dən 131-ə yüksəlmişdir. Əgər 1934-1939-cu illərdə cəmi 5 nəfər namizədlik dissertasiyası müdafiə etmişdisə, 1939-1941-ci illərdə dissertasiya müdafiə edənlərin sayı 23 nəfər olmuşdur.

30-cu illərdə Pedaqoji İnstitutun böyük fakültələrindən biri ***Dil və ədəbiyyat*** fakültəsi idi. Uzun müddət Tarix-ədəbiyyat, 1931-ci ildən isə Dil və ədəbiyyat fakültəsi kimi fəaliyyət göstərirdi. Fakültənin nəzdində yeni kafedraların təşkili tədris prosesinin və elmi-tədqiqat işlərinin keyfiyyətinin yüksəlməsinə səbəb oldu. Azərbaycan ədəbiyyatı tarixi, Azərbaycan folkloru, Azərbaycan dilinin tarixi, Azərbaycan dialektologiyası və Müasir Azərbaycan dili fənlərinin ilk proqram və dərslikləri burada hazırlanmışdır. Ədəbiyyatımızın və dilimizin tarixi ilə əlaqədar bir çox problemlər burada aparılan elmi fikir mübadilələri sayəsində dolğunlaşmış, yeni bir istiqamət kimi formalaşmışdır. Yeni elmi araşdırmaların aparılmasında tanınmış filoloq alimlərlə bərabər gənc və istedadlı tədqiqatçılar: Ə.Ə.Sultanlı, H.M.Araslı, M.H.Rəfili, M.Ə.Dadaşzadə, M.Ş.Şirəliyev, F.S.Qasımzadə, M.Ə.Paşayev, Ə.M.Dəmirçizadə, C.Z.Hacıyev (C.Xəndan), İ.R.Əfəndiyev, M.Ə.Hüseynzadə, C.F. Bağırov və b. mühüm xidmətləri olmuşdur.

Azərbaycan dilçiliyi elminin ilk rüşeymləri daha əvvəlki dövrlərə aid olsa da, bu elm, bir sistem halında əsasən, Pedaqoji İnstitutunun auditoriyalarında, Azərbaycan dilçiliyi kafedrasında təşəkkül tapmışdır. 1921-1946-cı illərdə bu kafedranın adı 3 dəfə dəyişdirilmişdir: 1) Dil-ədəbiyyat kafedrası; 2) Dillər kafedrası; 3) Azərbaycan dilçiliyi kafedrası. Kafedranın inkişaf tarixini Ə.Dəmirçizadə[118] iki yerə bölürdü.

*Birinci dövrdə* İnstitutda dil və ədəbiyyat fənlərini əhatə edən

Dil-ədəbiyyat kafedrası adlı bir ümumi kafedra olmuş və bu kafedrada keçilən fənlər içərisində Azərbaycan dilçiliyinin mövzuları, adətən, rüşeym halında əhatə və tədris olunmuşdur. Bu ümumi kafedrada daha ziyada türk-tatar lisaniyyatında yer verilmiş, Azərbaycan dili isə ancaq bir müqayisə obyekti kimi qeyd edilmişdir. 1931-1932-ci tədris ilindən *ikinci dövr* başlanmış, yəni bu kafedra Dillər kafedrası və Ədəbiyyat kafedrası olmaq üzrə ikiyə ayrılmışdır. Lakin belə bölünmə kafedranın məzmunca dəyişməsinə o qədər təsir etməmişdir.

1933-cü ildə Pedaqoji İnstitutda açılmış aspiranturaya dillər kafedrası üzrə aspirantların qəbul edilməsi, ibtidai və orta məktəblər üçün stabil dərsliklərin yaradılması kafedranın işində əsaslı dönüşün yaranmasına səbəb oldu. Kafedra iclaslarında ibtidai və orta məktəblərin ana dili proqram və dərsliklərinin müzakirə edilməsi, Azərbaycan dilinin qrammatikası ilə bağlı müzakirələrin aparılması kafedranın elmi istiqamətini dəyişdirdi.

1936/37-ci tədris ilində Dillər kafedrası üç müstəqil (Rus dili, Xarici dillər və Türk (Azərbaycan) dili) kafedraya bölündü.

Həmin illərdə Türk (Azərbaycan) dili kafedrasının əməkdaşları Azərbaycan dialektlərinin öyrənilməsi sahəsində xeyli işlər gördü. Qazax, Şamaxı, Zaqatala ləhcələri öyrənildi. Həmin materiallar əsasında dialektologiya ilə bağlı mühazirə mətnləri hazırlandı. 1936-1937-ci dərs ilində Azərbaycan dili kafedrası üzrə aspiranturanı bitirən İ.Əfəndiyev, M.Hüseynov, M.A.Şirəliyev və Ə.Dəmirçizadə kafedrada elmi-tədqiqat və tədris işlərinə cəlb edildilər. Onların araşdırmaları Azərbaycan dilçiliyi elminin formalaşmasına dəyərli töhfə oldu.Ə.Dəmirçizadənin Azərbaycan ədəbi dili tarixinə dair nəşr etdirdiyi mühazirə mətnləri məşhur şərqşünaslar (S.E.Malov, H.K.Dmitriyev, E.Ə.Bertels) tərəfindən Azərbaycan dilçiliyi elminin ilk təməl daşı kimi qiymətləndirildi. Fakültənin əməkdaşlarından İ.Q.Həsənovun "Dil və təfəkkür", Z.N.Tağızadənin "Azərbaycan dilinin morfoloji

[118] ***Dəmirçizadə Ə.*** *Azərbaycan dilçiliyi kafedrası.Bax:Rüstəmov F.Azərbaycan Dövlət Pedaqoji Universitetinin inkişafının ikinci mərhələsi. Bakı:Elm və təhsil, 2021, s.140-146*

əsasları", Ə.M.Dəmirçizadənin "Azərbaycan ədəbi dilinin tarixi oçerkləri" (1938) M.Ə.Hüseynzadənin "Qrammatika" (1939), M.İ.Şirəliyevin "Azərbaycan dialektologiyası" (1940), Ə.Cəfərin "Müasir Azərbaycan dilçiliyinin oçerkləri" (1940) əsərləri nəşr edildi.

Həmin dövrdə fakültədə Azərbaycan və dünya ədəbiyyatı ilə bağlı maraqlı elmi axtarışlar aparılırdı. Prof.M.H.Rəfilinin "Nizami (həyat və yaradıcılığı)" (1939), "Taras Şevçenko" (1939), "Qədim Azərbaycan ədəbiyyatı" (1940), dos.F.S.Qasımzadənin "M.F.Axundov (həyat və yaradıcılığı)", dos. C.M.Hacıyevin (Xəndan)" Nizaminin estetik görüşləri", "Sabir", "XX əsr Azərbaycan ədəbiyyatı (sovet dövrü)" (1939), M.C.Cəfərovun "M.Y.Lermontovun həyat və yaradıcılığı", M.A.Dadaşzadənin "Lenin və Plexanov rus ədəbiyyatının xəlqiliyi haqqında", Ümumi ədəbiyyat kafedrasının müdiri A.M.Mudrovun "İ.Q.Çernışevski və Qərbi Avropa yazıları", P.V.Litvinovun "Q.Floberin "Madam favori" əsərində obrazlar" (1939), N.H.Ağazadənin "XVIII əsrin sonunda alman klassik balladası (Şiller və Hötenin əsasında)" (1939) əsərləri nəşr edildi.

Dilçilərdən dosent İsmayıl Əfəndiyev, dosent Muxtar Hüseynzadə, dosent Ağaməd Abdullayev, Səlim Cəfərov, Ə.Abasov öz elmi tədqiqat işləri ilə bərabər, orta məktəblər üçün proqram və dərs kitabları tərtib etdilər.

1939/40-cı tədris ilində fakültənin nəzdində 7 kafedra:1) Ümumi ədəbiyyat (müdir dos.A.M.Mudrov); 2) Azərbaycan dili (müdir dos. M.Ş.Şirəliyev); 3) Azərbaycan ədəbiyyatı (müdir dos.F.S.Qasımzadə); 4) Rus dili (müdir dos.A.V.Lulyanova); 5) Alman dili (müdir dos.M.İ.Rax); 6) Fransız dili (müdiri dos.Y.Z.Qrişqorn); 7) erməni dili və ədəbiyyatı (müdir prof.əvəzi A.Q.Termatevosyan) fəaliyyət göstərirdi.

1940/41-ci dərs ilində Pedaqoji İnstitutun Azərbaycan dili kafedrasının əməkdaşı Məmmədağa Şirəliyev tərəfindən yazılan "Bakı dialekti" adlı dissertasiya və "Dialektologiya" kitabı Azərbaycan dilçiliyinə dəyərli töhfə oldu.

***Fizika-riyaziyyat fakültəsi*** 1930-cu ildə yenidən təşkil edildi. 1922-1934-cü illərdə dos. R.M.Məlikovun rəhbərlik etdiyi Fizika kafedrasına 1934-1936-cı illərdə prof.V.İ.Tixomirov, 1936-1937-ci ildə dos.A.Q.Alfimov rəhbərlik etdilər. Kafedranın əməkdaşları - prof.S.N.Usatıy, prof. E.B.Lopuxin, prof.V.P.Juze və dos.N.N.Popov fizika sahəsində gənc milli elmi-pedaqoji qüvvələrin (B.R.Mirzəyev, M.S.Əliyev, Z.İ.Əlizadə, A.A.Axundov, M.H.Ramazanzadə, A.Q.Abaszadə, R.Q.Həsənov, M.Q.Abdullayev və b.) yetişməsində mühüm rol oynadılar. Fizika üzrə tədqiqatların aparılması üçün zəmin hazırlandı. A.Q.Abaszadə 1937-ci ildə "Xəzər dənizinin istilik tutumu və buxarlanma əmsalının tədqiqi" mövzusunda namizədlik dissertasiyası müdafiə etdi.

Prof.Y.B.Lopuxinin "Dəmir və poladın gərilməsi prosesində maqnit hadisələri" (1936), Y.P.Lopuxin, N.N.Popov və A.Q.Abbaszadənin "Radimin əsasında Bakı rayonlarının neftinin tədqiqi" (1936), M.N.Ramazanzadənin "Xəzər dənizi sularının temperatur sıxlığının müəyyən edilməsi" və B.R.Mirzəyevin "Molekulyar fizika" (1933), "Fizikadan praktikum" (1935) adlı dərs vəsaitləri nəşr olundu.

1938/39-cu tədris illərində kafedranın müdiri, dos A.Q.Abaszadə SSRİ EA-nın Xəzər dənizini Öyrənən Komissiyasının tapşırığı ilə tədqiqatlar aparırdı. Nəticədə Xəzər dənizi sularının fiziki tərkibi öyrənildi, onun istilik keçiriciliyi, elektrikkeçirmə qabiliyyəti və istilik əmsalı müəyyən edildi. Tədqiqatın yekunları 1938-1939-cu illərdə SSRİ EA-nın Azərbaycan filialının əsərlərində dərc olundu. A.Q.Abaszadənin "Mayelərin daxili sürtünməsinin müasir metodları" (Z.İ.Əlizadə ilə birlikdə, 1939), "Aşağı temperaturda neft məhsullarının özlüyünün tədqiqi" monoqrafiyalarının nəşri Azərbaycanda fizika elminin o dövrdəki mühüm nailiyyəti idi.

Fizika-riyaziyyat fakültəsinin Riyaziyyat kafedrasında professorlar: A.S.Kovanko, A.A.Bukspan, A.A.Ammosov, M.R.Əfəndiyev kimi təcrübəli riyaziyyatçılarla birlikdə perspektivli gənc dosentlər: Z.İ.Xəlilov, Ə.İ.Hüseynov, M.Ə.Cavadov, İ.İ.İbrahimov, H.İ.Əmirxanov, M.İ.Rəsulov, C.N.Qasımov, T.H.Abdullayev, B.M.Yusifzadə, H.İ.Rzayev, B.Ə.Ağayev və M.A.Şeydayev çalışırdılar.

Həmin dövrdə prof.M.R.Əfəndiyevin "Riyaziyyatdan məsələlər" (1932), prof.A.M.Ammosovun "Riyaziyyatdan əyani vəsait" (1936) çap

edildi. 1939/40-cı tədris ilində riyaziyyat kafedrası iki yerə: Riyazi analiz (müdiri prof.M.R.Əfəndiyev) və Həndəsə (müdiriV.M.Əfəndiyev) kafedralarına bölündü.

30-cu illərdə ***Təbiyyat fakültəsinin*** maddi bazası möhkəmləndirildi, tələbə və müəllimlərinin sayı xeyli artdı. 1931-ci ildə fakültənin laboratoriyalarının zəruri avadanlıqlarla təchizi xeyli yaxşılaşdı. Fakültə nəzdində təşkil olunmuş botanika-zoologiya, üzvi kimya, qeyri-üzvi kimya, təhlili kimya, geologiya laboratoriyaları tədrisin keyfiyyətinin yüksəldilməsinə xeyli kömək etdi. Tələbələrin təlim prosesində istifadə etdikləri laboratoriyalardan müəllimlər isə öz elmi-tədqiqat işlərini aparmaq üçün istifadə edirdilər. Fiziologiya və darvinizm kafedrasının nəzdində zəngin *bioloji muzey* fəaliyyət göstərirdi. Botanika, Zoologiya, İnsan və heyvan fiziologiyası, Biologiya, Geologiya, Təbiətşünaslıq kafedralarında görkəmli alimlər çalışırdılar.

*Botanika kafedrası* elmi potensialına görə fərqlənirdi. Kafedraya 1930-1935-ci illərdə görkəmli rus alimi, akademik A.A.Qrossheym, 1936 -cı ildə prof.A.A.Şutov, 1937-1941-ci illərdə isə dos.M.M.Ağamirov başçılıq etmişdir. Kafedrada habelə dos. S.X.Osmanzadə, M.Hacıyev, Y.M.İsayev və b. elmi axtarışlarla məşğul idilər. Kafedranın əməkdaşları tədris prosesi və laboratoriya məşğələlərini təmin etmək üçün herbari fondu yaratmaqla bərabər, respublikanın zəngin bitki aləmini öyrənir, Azərbaycan dilində ilk dərs vəsaitlərinin hazırlanmasında, elmi və elmi-metodiki ədəbiyyatın tərcümə edilməsi və tərtibində yaxından iştirak edirdilər. İnstitutun bioloq-alimləri aktual problemlərin həllində və tətbiqində fəallıq göstərir, səmərəli elmi-tədqiqat işlərini ümumiləşdirib çapına nail olurdular.

Prof. F.Ə.Rzabəylinin yazdığı "Ümumi biologiya" (1931), "Biologiya terminləri lüğəti" (1934), akademik A.A.Qrossheymin hazırladığı dörd cilddən ibarət "Qafqazın florası" (1924-1934), onun ümumi redaktəsi altında meydana gələn "Abşeron bitkilərinin təyinatı" (1939) və üçcildlik "Azərbaycan florası" (1934-1936) kimi fundamental əsərlər dövrün ən böyük elmi nailiyyəti idi və Azərbaycanda biologiya elminin inkişafı tarixində bu gün də mühüm əhəmiyyət kəsb edir.

*Zoologiya kafedrasına* professorlar: F.Ə.Rzabəyli (1930-1932), V.S.Yelpatevski (1933-1936), S.Y.Veysiq (1936-1937), Z.M.Şahtaxtinskaya (1937-1977) rəhbərlik etmişdir. Kafedrada təcrübəli elmi-pedaqoji qüvvələr: Ə.M.Əlizadə, K.K.Qəmbəroğlu, M.A.Hüseynov, A.Ə.Şirinov, V.M.Hacıyev və b. çalışırdılar. Uzun müddət kafedraya rəhbərlik edən Z.M.Şahtaxtinskayanın "Onurğasızlar zoologiyasının qısa kursu" (1937), "Darvinizmdən terminlər" (1939) adlı tədris vəsaitləri nəşr olundu.

İnsan və heyvan fiziologiyası kafedrasına 9 il (1930-cu ildə təşkil edilmişdir) görkəmli fizioloq-alim, prof.A.A.Əmirov başçılıq etmişdir. O, respublikada fiziologiya sahəsində yeni milli elmi məktəbin əsasını qoymuş, məşhur fizioloqlar nəsli yetişdirmişdir. Akademik A.İ.Qarayev, professorlar: K.Ə.Balakişiyev, S.R.Ocaqverdizadə, M.Q.Mustafayev, dos.Z.A.Muğanlinskaya kimi tədqiqatçılar məhz onun rəhbərliyi altında elmi cəhətdən formalaşmış və respublikada fiziologiya elminə böyük nüfuz və şöhrət gətirmiş, İttifaq və dünya miqyaslı elmi məclislərdə Azərbaycanı ləyaqətlə təmsil etmişlər. Fizioloqların 1935-ci ildə keçirilən XV Ümumdünya konqresində respublikanı 5 fizioloq alim təmsil edirdi. Onlardan 4-ü kafedranın əməkdaşları (professorlar: P.Y.Rostovstev, A.A.Əmirov, S.R.Ocaqverdizadə, A.İ.Qarayev və M.Q.Mustafayev) idi. Prof.A.A. Əmirovun "Qanda və əzələlərdə şəkərlə qlükogen arasında qarşılıqlı əlaqələr", A.İ.Qarayevin "Diafraqmanın fiziologiyası məsələsinə dair"), "Əzələlərin elektrikləşməməsində karbohidratların əhəmiyyəti" S.R.Ocaqverdizadənin "İstiqanlı heyvanların əzələ fəaliyyətinə şəkərin təsiri" əsərləri uğurlu elmi axtarışların nəticəsi idi.

Üzvi və qeyri-üzvi kimya kafedralarının (1930-cu ildə yenidən təşkil edilmişdir) əməkdaşları tədrisin keyfiyyətini yaxşılaşdırmağa çalışmaqla yanaşı, elmi-tədqiqat işlərinin genişləndirilməsinə də səy göstərirdilər. Bu illərdə Qeyri-üzvi kimya kafedrasının müdiri prof. S.C.Hüseynovun təşəbbüsü və köməyi ilə M.K.Əhmədli, X.Ş.Kələntərli "Neft destilatlarındakı solventlərin selektiv edilməsi nəticəsində alınmış karbohidrogenlərin hava ilə oksidləşməsi yolu ilə karbon turşuların alınması" mövzusunda dissertasiya müdafiəsinə görə

qeyri-üzvi kimya sahəsində ilk elmlər namizədi alimlik dərəcəsinə layiq görüldü.

Üzvi kimya kafedrasına 1933-1937-ci illərdə SSRİ EA-nın müxbir üzvü, prof.K.A.Krassusski (1867-1937) başçılıq etmişdir. Onun rəhbərliyi altında M.M.Mövsümzadə, Ş.Ə.Məmmədov, Ş.B.Əliyev, V.M.Hacıyev, S.N. Quluzadə kimi tanınmış görkəmli alimlər yetişmişdir. Prof. K.A.Krassuski kimyadan bir sıra dərslik və dərs vəsaitinin müəllifi idi. Kimya-biologiya fakültəsinin kimya şöbəsində çalışan prof. P.P.Kuznetsov (1888-1938) kimyaçı kadrların hazırlanmasına böyük əmək sərf etmişdir. Onun rəhbərliyi altında fakültənin məzunları P.F.Rzazadə, İ.H.Əlizadə, A.Q.Misgərli, S.A.Ələkbərova və b. ciddi elmi axtarışlara başladılar və sonralar görkəmli kimyaçı alim kimi tanındılar. Ümumi kimya kafedrasının əməkdaşları mühüm elmi və təcrübi əhəmiyyətli problemlər üzərində çalışırdılar. Məhz kafedranın elmi axtarışları nəticəsində respublikada ilk dəfə olaraq 1932-ci ildə “Böyük Şor sularından yodun alınması”na nail olundu. Üzvi kimya kafedrasının üzvləri isə çöküntülərin tərkibinin tədqiqi ilə bağlı maraqlı elmi nəticələr əldə etdilər.

Qeyri-üzvi kimya kafedrasına prof.S.X.Hüseynov rəhbərlik edirdi. Onun “Qeyri-üzvi kimya terminləri” (1931), “Üzvi kimya terminləri” (1936), “Ümumi kimya praktikumu” (1936) “Azərbaycan kimya terminologiyası” (1937) kimi dərslik və tədris vəsaitləri kimyaçı müəllim kadrlarının hazırlanmasında mühüm rol oynadı.

1936/37-ci tədris ilində Pedaqoji İnstitutun elmi həyatında ən mühüm hadisə institutun əməkdaşlarının - Abdulla Qarayevin “Diafraqmanın fiziologiyası haqqında məsələlərə dair” (1936), Şamxal Məmmədovun “Alfa qlikollar haqqında” (1937), Zəhra Şahtaxtinskayanın “Azərbaycanın gövşəyən heyvanlarının parazit infuzorları” (1937) mövzusunda institutun Elmi Şurasında namizədlik dissertasiyası müdafiə etmələri oldu. 1936-cı ildə Zoologiya kafedrasının müdiri, dos.S.Y.Veysiq Leninqrad Universitetinin Biologiya fakültəsinin Elmi Şurasında “Qafqazın su mikrofaunası və onun zooloji –coğrafi təhlili” mövzusunda doktorluq dissertasiyası müdafiə etdi.

30-cu illərdə Pedaqoji İnstitutda ***tarix və coğrafiya*** ilə də bağlı müəyyən elmi araşdırmalar aparıldı**.** Respublikada coğrafiya sahəsində ilk kadrlar Pedaqoji İnstitutun coğrafiya şöbəsində hazırlanırdı. Şöbədə bir neçə kafedra fəaliyyət göstərirdi. İqtisadi coğrafiya kafedrasına dos. M.Q.Cuvarlinski rəhbərlik edirdi. İlk vaxtlar elmi-pedaqoji kadrlar az olduğundan Gürcüstandan akademik A.N.Cavaxaşvili (1934-cü ildə), prof. A.F.Lyaster Pedaqoji İnstitutda işləməyə dəvət olundular.

Fakültədə tədrisin və elmi işlərin təşkilində professorlarY.S.Nikolayev, V.M.Zummer, V.M.Xuluflu, A.P.Kuzevenko, E.A.Poxomov, P.P.Fridolin, Y.A.Rathauzer, N.N.Pçelin, H.İ.Abdullayev, M.Ə.Mahmudov, M.M.İrəvanlı, C.Ə.Rəhimov, K.Əbdülrəhimov, M.S.Səlimov, Ş.R.Əliyev, M.X.Şərifli, Ə.N.Şükürzadə, baş müəllimlər - S.Ə.Əyyubova, H.İ.Sultanova, H.Q.Qasımzadə və b. mühüm rol oynayırdılar.

Tarix fakültəsini 1935-1937-ci illərdə Nəzər Paşayev, Kərim Əbdürrəhimov, Əhməd Cəfərov, Yunis Ələsgərov, Həmzə Bineyev, Ədəbiyyat fakültəsini Mirzəağa Quluzadə, Mirdavud Seyidov bitirdilər. Sonralar onlar tanınmış alim kimi ayrı-ayrı təhsil müəssisələrində fəaliyyət göstərdilər.

Tarix fakültəsinin 30-cu illər məzunları ictimai-siyasi fəallıqları ilə seçilirdi. 40-cı illərdə Azərbaycan ali məktəblərində və dövlət qurumlarında çalışan - Nazirlər Şurası nəzdində Siyasi maarif işləri komitəsinin sədri Süleyman Rəhimov, “Kommunist” qəzetinin redaktoru Əli Vəliyev, Füzuli rayon partiya komitəsinin birinci katibi Safa İmanov, Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunun Ümumi tarix kafedrasının müdiri İlyas Bağırov, SSRİ tarixi kafedrasının müdiri Nəsib Əlizadə, Gəncə Pedaqoji İnstitutunun Tarix kafedrasının müdiri Əbdülrəhimov, SSRİ tarixi kafedrasının müdiri Yunis Ələskərov, Azərbaycan Dövlət Universitetinin Partiya komitəsinin katibi M.Məmmədov, Tarix fakültəsinin dekanı Şıxlı Məmməd, ADPU-da çalışan Qəni Bəxşəliyev, Baba Məmmədov və Mehdixan Vəkilov, M.Hüseynov (Mehdi Hüseyn), S.Mahmudov (Sabit Rəhman), İsmayıl Şıxlı, S.N.İmanzadə, Ə.Ə.Cəfərov, İsmayıl Hüseynov, İ.Q.Şükürzadə Tarix fakültəsini 30-cu illərdə bitirmişdilər.

Azərbaycan tarixinin tədqiqi sahəsində səmərəli elmi-tədqiqat işləri aparılırdı. Dos.Ə.S.Sumbatzadənin "Quba əyalətində 1837-ci il kəndli üsyanı" əsəri xüsusilə maraq doğururdu.

İnstitutda ÜİK(b)P tarixi kafedrasına dos. M.Ə.Məmmədov, Dialektik materializm kafedrasına prof.A.B.Çiçikalov, Fəlsəfə kafedrasına görkəmli Azərbaycan filosofu, akademik H.İ.Hüseynov, Siyasi iqtisad kafedrasına prof. B.B.Həsənbəyov başçılıq edirdilər.

30-cu illərdə ***pedaqoji-psioxoloji*** tədqiqatlar əsasən Pedaqoji İnstitutun Pedaqogika (müdir dos. Mikayıl Rəhimli) və Psixologiya (müdir dos. Surxay Hacıyev) aparılırdı. 1931-ci ilin iyul ayının 1-də dos.Surxay Hacıyev yeni yaradılan Azərbaycan Elmi Tədqiqat Pedologiya İnstitutuna direktor təyin olunduğundan Pedologiya kafedrası Pedaqogika kafedrasına birləşdirildi. Psixologiya fənni Pedaqogika kafedrasının əməkdaşları tərəfindən tədris olunmağa başlandı. Pedaqogika kafedrasına 1931-1937-ci illərdə dos.Mikayıl Rəhimli, 1937-1941-ci illərdə Nəsir Asatur rəhbərlik etdi. Kafedra 1 professor (Boris Borisoviç Komarovski), üç dosent (Əşrəf Hacıyev, Mikayıl Rəhimli, Əhməd Kərədi Zəkuzadə) və yeddi assistentlə (Mehdi Mehdizadə, Əbdülkərim Əfəndiyev, İbrahim Əfəndiyev, Qənbər Əsgərov, Əhməd Seyidov, Rəcəb Əfəndiyev, Gülrux Qədimbəyova) və bir laborantla (Məmmədsəlim Tahirli) fəaliyyətə başladı. 30-cu illərdə İsmayıl Qaryağdı, Mövsüm İsmayılzadə (1932), Əli İsgəndərzadə (1933), Saleh Xəlilov (1934), Seyid Əliyev (1934), Nəsir Asatur, Dilruba Mustafayeva, Zümrüd Axundova (1936), Məmməd Əlizadə (1936), İsrafil Hacıyev (1937), Surxay Hacıyev (1939), Əmir Tağıyev (1940) bu kafedrada pedaqoji fəaliyyətə başladılar və uzun müddət səmərəli elmi-pedaqoji fəaliyyət göstərdilər. Əhməd Seyidov 1939-cu ildə S.M.Kirov adına ADU-da "Abbasqulu ağa Bakıxanovun pedaqoji fikirləri" mövzusunda namizədlik dissertasiyası müdafiə etdi. İki il sonra Mehdi Mehdizadə "Azərbaycan məktəblərində ana dilində savad təliminin inkişaf tarixi" mövzusunda namizədlik dissertasiyası müdafiə etdi.

1941-ci ildə başlanan sovet - alman müharibəsi Azərbaycan xalqına da fəlakət və ölüm gətirdi, insanların yaradıcı əməyi pozuldu. Yenicə formalaşmaqda olan gənc elmi-pedaqoji qüvvələr (Mehdi Mehdizadə, Mərdan Muradxanov, Əliş Həsənov, Veysəl Mustafazadə və b.) hərbi səfərbərliyə alındı. Gənc müəllim kadrlarının hazırlanması müvəqqəti olaraq ADU-da mərkəzləşdi, aspiranturalar bağlandı.

İnstitutun Pedaqoji fakültəsi respublikada elmi-pedaqoji fikrin əsas mərkəzlərindən biri idi. Burada professorlar A.O.Makovelski, H.B.Şahtaxtinski, dosentlər M.Ə.Rəhimli, Ə.K.Zəkuzadə, Ə.Y.Seyidov, F.Ə.İbrahimbəyli, V.L.Arxarova, baş müəllimlər Ə.R.Qaraşov, S.H.Hacıyev, V.İ.Mustafayev, D.Ş.Mustafazadə və b. pedaqogika, psixologiya, fəlsəfə və məntiq fənlərindən dərs deyirdilər.

Psixologiya, pedaqogika nəzəriyyəsi və tarixi ilə bağlı ilk dərs vəsaitləri 20-ci illərdə hazırlanmışdı. Məhiyəddinin "Psixologiya" (1923), Xəlil Fikrətin "Tərbiyə və tədris tarixi" adlı iki hissədən ibarət (1924;1926) dərs vəsaiti, Abdulla bəy Əfəndizadənin "Fənni-tərbiyə" (1924), B.B.Komarovskinin "Pedaqojinin ümumi əsasları" (1930) dərs vəsaitləri çap olunmuşdu. Sonrakı illərdə Saleh Xəlilovun iki hissəlik "Pedaqogika tarixi" (1939; 1940) hazırlamışdır. M.Mehdizadə, S.Xəlilov və D.Mustafayevanın 2 hissəlik "Pedaqogika" (1941; 1942) dərs vəsaitləri nəşr olundu.

Pedaqogika kafedrasının əməkdaşları tədris prosesinin təşkili, proqramların hazırlanması kimi sırf təlim məsələləri ilə bağlı maraqlı elmi-tədqiqatlar aparırdılar. Pedaqogika kafedrasının müdiri M.Ə.Rəhimlinin "Pedaqogikaya dair" (1932), "Azərbaycanda ali pedaqoji təhsil" (1934) "Azərbaycanda ali pedaqoji təhsil" (1934) "Azərbaycanda politexnik məktəblərin inkişafı" (1935); Ə.Y.Seyidovun "Tarix dərslərində xronologiyanın yeri və rolu" (1936), "A.A.Bakıxanovun pedaqoji görüşləri" (1939), M.M.Mehdizadənin "Politexnik məktəblərdə təlimin əsas prinsipləri" (1932), "Azərbaycan məktəblərində ana dilində savad təliminin inkişafı tarixi (1936) S.X.Xəlilovun "1918-1920-ci illərdə Azərbaycanda xalq maarifi" (1939), F.Ə.İbrahimbəylinin "Pedaqoji baxışlar" (1938) əsərləri Azərbaycanda pedaqoji fikrin inkişafına dəyərli töhfə oldu. Z.Q.Axundova M.Ə.Sabirin pedaqoji baxışları, M.Ə.Muradxanov Nizaminin pedaqoji fikirləri, M.M.Mehdizadə Azərbaycan məktəblərində tədrisin təşkili və inkişaf

tarixi, Ə.K.Zəkuzadə “Uşaqlarda məntiqi təfəkkürün inkişafı, D.M.Mustafayeva N.K.Krupskayanın tərbiyə ilə bağlı fikirləri haqqında araşdırmalar apardılar.

ÜİK(b)P MK və SSRİ XKŞ-nın 23 iyun 1936-cı il qərarında ali məktəblər üçün stabil proqramların olmamasını ciddi tənqid etdi. Bu qərarın tələblərinə uyğun olaraq kafedra əməkdaşları Moskvada hazırlanmış “Pedaqogika” və “Pedaqogika tarixi” proqramlarını Azərbaycan dilinə tərcümə etdilər. Tərcümə zamanı proqrama milli təhsil-tərbiyə ənənələri ilə bağlı bəzi mövzular daxil edildi. ÜİK(b)P MK 4 iyul 1936-cı il “Xalq Maarif komissarlığı sistemində pedoloji təhriflər haqqında” qərarı əsasında pedaqoji proqramlarda köklü dəyişikliklər edildi. ÜİK(b)P MK-nın qərarında pedologiya elmə zidd hesab edildi. Bununla da uşağın taleyinə irsiyyətin və sosial amillərin təsiri inkar edildi. Ciddi eksperimental işlərə son qoyuldu. Süni bərabərlik ideyası ortaya atıldı. Tərbiyənin rolu həddən artıq şişirdildi. Azərbaycanda Marksist Pedaqoqlar Cəmiyyətinin yaradılması uşaqlar haqqında marksist elminin yaradılmasını vacib məsələ kimi ortaya atdı. Pedologiya burjua elmi adlandırıldı. Pedaqogika proqramlarında pedalogiya elminin tənqidinə geniş yer ayrıldı və uşaq şəxsiyyətinin formalaşdırılmasında tərbiyənin rolu ilə bağlı marksist ideya önə çəkildi. Pedaqogika proqramlarında didaktikanın və tərbiyə nəzəriyyəsinin mühüm məsələləri layiqli yerini tutdu. Bununla əlaqədar olaraq psixologiya proqramlarında da böyük dəyişikliklər edildi, şəxsiyyətin formalaşdırılması haqqında xarici ölkə alimlərinin təlimləri tənqid edildi. Pedologiya ilə bağlı ADPİ-də aparılan tədqiqatlara son qoyuldu. Akademik A.O.Makovelskinin “Pedoloji” (1930) kitablarından istifadəyə qadağa qoyuldu.

30-cu illərdə Xarici dillər kafedrasının əməkdaşları tərəfindən orta və ali məktəblərdə ***xarici dillərin tədrisi*** ilə bağlı maraqlı araşdırmalar aparıldı. Həmin illərdə, demək olar ki, xarici dil (alman, fransız) mütəxəssisləri, əsasən, Pedaqoji İnstitutda toplanmışdı. Burada çalışmaqla yanaşı onlar (prof.Tumbil, N.Ağazadə, Cəfərov, Paşayev, Reçitskaya, Mdivani, Qriqorn, Şirvanzadə, Sokolova, Abbasova, Barsuk və b.) həm də digər ali məktəblərdə əvəzçiliklə çalışırdılar. Alman dilinə aid ilk tədris resursları (dərslik,dərs vəsaiti, lüğət, oxu materialları) qeyri-ixtisas qrupları üçün Q.Neff, M.Yusupova, N.Novrotskaya, P.Kpomm,V.Rikqof tərəfindən hazırlanmışdır. Tələbələr I-II kurslarda Q.Neffin, yuxarı kurslarda isə Ryajskayanın “Alman dili” (1935) kitabından istifadə edirdilər. Xarici dillər fakültəsinin təşkilindən sonra bu sahədə tədqiqatlar intensiv xarakter aldı. İxtisas (müasir xarici dil, dil tarixi, nəzəri qrammatika, fonetika, leksikologiya, dilçiliyə giriş, dili öyrənilən ölkənin ədəbiyyat tarixi, metodika, marksizm-leninizmin əsasları, siyasi iqtisad, latın dili, pedaqogika, psixologiya, rus dilinin nəzəriyyəsi) və ümumi fənlər (hərbi hazırlıq, fiziki hazırlıq) üzrə metodiki araşdırmalar meydana gəldi. İxtisasla bağlı tədqiqatların mövzuları müxtəlif idi. R.Qayıbova “İngilis dilində adlıq halın sakson forması”, A.Mdivani ”İngilis dili tələffüzünün işlənilməsi metodikası”, C.Cəfərov ”Lüğət ehtiyatı haqqında”, İ.Rax “Xarici dillərin tədrisində metodiki nöqsanlar haqqında”, S.Aşurbəyli-Salamova “Fransız diftonqları haqqında”, Ə.Xudaverdiyev “Alman dilində artikl, onun əmələ gəlməsi və funksiyaları”,”Azərbaycan qruplarında alman sözönlərinin işlənilmə metodikası”, A.Potalova “Molyerin dili” mövzularında elmi-tədqiqat işləri yazmışdı. Fakültənin müəllimləri Qayıbova və Reçitskaya “Azərbaycan bu gün”, “Nümunəvi ingilis dərsləri məcmuəsi”, dosent E.Z.Qriqorn “Sərf dərslərinin aparılması üsulu” və “Qiraət kitabı” kimi dərsliklər nəşr etdirdilər. Müharibə illərində fakültənin müəllimləri Reçitskaya və Qirşqorn dissertasiya müdafiə edərək filologiya elmləri namizədi alimlik dərəcəsi almışdılar. “Alman dilinin öyrənilməsi prosesində ana dilinin artikulyasiya vərdişləri ilə əlaqədar olaraq əmələ gələn nöqsanlar və onların aradan qaldırılması metodları”, “Azərbaycanda xarici dillərin düzgün tələffüz edilməsi metodlarının axtarılması” mövzularında kompleks tədqiqatlar aparılmışdır. İngilis dili kafedrasında prof.L.B.Şerbanın ümumi rəhbərliyi ilə “İngilis -Azərbaycan dillərində idiomatik ifadələrin məcmuəsi” tərtib edilmişdi.

Alman dili qruplarında İ.Raxın iki hissəlik “Alman dili” (1932;1933) kitabından istifadə edilirdi. Həmin kitab rus və gürcü dillərinə də tərcümə edi-

lərək nəşr olunmuşdu. İ.Rax 1940-cı ildə S.M.Kirov adına ADU-nun Elmi Şurasında "Alman dilinin orta məktəblərdə tədrisi metodikası" mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdi.

1939-cu ildə Azərbaycan Pedaqoji İnstitutunda respublika məktəbləri içərisində ilk dəfə fevral ayının 26-dan mart ayının 2-nə kimi institutun professor-müəllimlərinin elmi-tədqiqat işlərinin yekunlarına həsr olunmuş elmi sessiya keçirildi. Elmi sessiyada M.Əhmədlinin "Neftdən alınan yüksək molekulyar karbohidrogenlər", A.Abaszadənin "Aşağı temperaturda qatı məhsulların yeni ölçü metodları", A.Əsgərovun "Azərbaycanın şimal-şərq rayonlarında mineral su mənbələri", S.Ocaqverdizadənin "Mədəaltı vəzlərin funksiyasına karbohidrogenlərin təsiri", M.C.Paşayevin "Füzuli poeziyası", C.Hacıyevin (Xəndan) "M.Ə.Sabir və 1905-ci il inqilabı", A.V.Popovun "N.Q.Çernışevski və folklor" mövzularında məruzələri dinlənildi.

***

30-cu illərin ikinci yarısında elmlər namizədi alimlik dərəcəsi almaq üçün müvəffəqiyyətlə dissertasiya müdafiə edənlərin sayı xeyli artdı. Məsələn, əgər beş il ərzində (1934/35-1939/40-cı tədris illərində) V.İ.Lenin adına APİ-də 19 nəfər namizədlik dissertasiyası müdafiə etmişdirsə, 1939/40-1940/41-ci tədris illərində onların sayı 23 nəfər olmuşdu. Bunların arasında sonradan görkəmli alimlər olan A.Abaszadə (fizika), Y.Əmənzadə (nəzəri mexanika), A.Seyidov, M.Mehdizadə (pedaqogika), Ə.Sultanlı (filologiya) və digərləri vardı.

APİ-də 1940-1941-ci ilin statistikasına görə 8 professor, 57 dosent, 175 nəfər baş müəllim, müəllim və assistent fəaliyyət göstərirdi. İnstitutda işləyən 240 nəfər professor-müəllim heyətinin ancaq 109 nəfəri azərbaycanlı, 131 nəfəri rus, erməni və başqaları idi. İnstitutun 31 kafedrasından 14-nə qeyri millətin nümayəndələri rəhbərlik edirdi.

Azərbaycan Pedaqoji İnstitutunda professor-müəllim heyətindən ibarət pedaqoji kollektiv formalaşdırmaq mümkün oldu. Onların səyləri tədris prosesinin təkmilləşdirilməsinə, mütəxəssislərin hazırlıq keyfiyyətinin yüksəldilməsinə yönəldildi. Azərbaycan Pedaqoji İnstitutuna qəbul qaydalarında, tədris vaxtının və tədris işinin təşkili sahəsində, möhkəm nizam-intizam yaranmış, elmi cəhətdən əsaslandırılmış plan və proqramlardan istifadə edilməyə başlanmışdı.

Pedaqoji İnstitutda ayrı-ayrı elm sahələri və fənlərin tədrisi metodikası ilə bağlı elmi-tədqiqat işlərinin aparılması üçün zəngin kitabxana, kimya və fizika laboratoriyaları fəaliyyət göstərirdi. İnstitutun kitabxanası 30-cu illərdə yenidən quruldu, fondları yeni tədris ədəbiyyatı və elmi-tədqiqat əsərləri ilə zənginləşdirildi. 1940/41-ci tədris ilində Pedaqoji İnstitutun kitabxanasında 150 min nüsxə kitab vardı. Kitabxananın ayrı-ayrı fondlarından 2177 oxucu istifadə etmişdi.

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunun "Lenin tərbiyəsi uğrunda" qəzeti

"Lenin tərbiyəsi uğrunda" qəzeti Azərbaycan Dövlət Universitetinin orqanı kimi 1929-cu ildə nəşrə başlayıb, bir il sonra ADU-nun ləğvindən sonra fəaliyyətini dayandırıb. 1947-ci ildən S.M.Kirov adına Azərbaycan Dövlət Darülfünunun partiya bürosu, rektorluq, komsomol komitəsi və həmkarlar komitəsinin orqanı kimi yenidən fəaliyyətini bərpa edib. Qəzetlə bağlı BDU-nun nəşrlərində aşağıdakı məlumatlar verilib:"*Əsası 1929-cu ildə qoyulan "Bakı Universiteti" qəzeti 1947-ci ildən mütəmadi olaraq nəşr olunur. 1990-cı ilə qədər "Lenin tərbiyəsi uğrunda" adı ilə Azərbaycan və rus dillərində işıq üzü görən qəzetə müxtəlif illərdə Rəsul Rüstəmov, İsrafil Cahangirov, Yusif Yusifov, Seyfulla Əliyev, Nüsrət Bağırov, Aslan Aslanov, Vəli Məmmədov, Eldar Əliyev, Ağamusa*


API - da' rəhbərin gəstərişini syrə'tlə realizə etmək ycyn bytyn imkanlar vardьr

Qejməti 5 qəp. Bytyn əlkələrin proletarlarь birləşiniz!

Lenin TƏRBIJƏSI UQRUNDA

1934-il 3-mart | API direqsijasь, firqə qolleqtivi və birləşmiş həmkar-qomitəsinin orqanь | № 5

Sijasi təhsilin bolşevik dəjərləri uqrunda!

«Nihajət, daha bir faqtь, lakin mənfi xareqterli bir faqtь qejd etmək lazьmdьr. Bu, elə bir halь nəzərdə tuturam ki, bizim pedaqozi və tibb «fakultələrimiz» hələ də unudulmuş vəzijjətdədir. Bu, dəvlət mənafe'ni pozmaqla həmhydud olan bəyyk bir nəqsandьr. Bu nəqsana mytləq nihajət verməks lazьmdьr. Bu nə qədər tez edilərsə bir o qədər jaqşьdьr.»
(STALIN joi. 17-nçi firqə qurultajьndakь mə'ruzəsindən).

## Sijasi məşqələ'ajə çiddi diqqət!

## Proqula aman verilməməli

Tarix içt. şə'bəsinin VII-sem. II-çi qrupu bu vaqta kibi əldə etdiji myvəffəqijjətlərə baqmajaraq imdi təmamilə biabrcь proqula mejdan vermişdir. 2-çi qruppun qolleqtivi əz adlarьnь qьrmьzь lәvhədən silinərək biabrcь proqulcu qruplar icərisində olmasьna səbəb olan proqulculara qarşь ən qət'i əlcylər qəbul etməlidyr.

Təhsil zərbəcilərindən ƏLIJEV ƏSKƏR joldaş.

Qrupun 5-gyn icərisində 33-saat yzyrsyz proqulu olmuşdur. Bundan Çəlil Əlijev 4-saat, Jysif Hacь zadə 12-saat, Əli Səlimov 4-saat, Mynəvvər 4-saat yzyrsyz proqul etmişlərdir.

Qrup bunlarь deqanat və əzəjə ... izlə praqu'culuqun izini qrupdan təmamilə məhv etmək ycyn proqulla mybarizəni kytləvi hala cevirməli və proqulcularьnь bytyn Institut qarşьsьnda biabьr etməlidir.

Qont. Post: ƏLIJEV K.

„API" təjjarəsi fondunu gyclәndirəlim

## Biz 500 manat jazьldьq və sizi də caqьrьrьq

API. Aspirantura həmkarlar təşkilatь «API» təjjarəsь fonduna para toplamaq ətrafьnda bytyn aspirant qyvvələrini cəlb edərək 500. manat təhvil verir və API Pedolozu – Pedoqozu, içt. ədəb. fakultələrinin həmkar təşkilatlarьnь bu işdə nymunəvi iştiraka caqьrьr.

ASPIRANTURA YZRƏ HƏMKARLAR TƏŞKILATЬ MYVƏKKILI: I. QAZIJEV.

## Çavab verin!

«API» təjjarəsi təşkili fonduna təqaydymdən 20- manat verərək aşaqьdakь joldaşlarь bu işə qoşulmaqa də'vət edirəm:

Mamadov I. Əlijev., Təqijev, H., Məhəmmədov

Ped - peddən: Şərifi M. Ə., Əhmədov F, Abdullajeva Bikə.

Ədəbijjat Içtimaijat fakultəsindən Əlijev Məhərrəm, Hacьjev B. Əsgərov V.

Təb. Rijazijat Fakultəsindən Həsənov Ə. Ibrahimov I.

PED - PED Fakultəsi VI-SEM. tələbəsi: Məhəmməd Əli Məhərrəmov

Quiruqda syrynmək-opportunizmdir

## Jerli qomitə juqudan ojanmalьdьr

API aspiranturasь nymunəvi olmalь

## Jenə aspirantura haqqьnda

*"Lenin tərbiyəsi uğrunda" qəzeti*

*Zeynalov, Bayram Hüseynzadə, Haqverdi Rzayev kimi jurnalistlər redaktorluq edib."* Verilən məlumatdan belə məlum olur ki, 17 ilə yaxın bir müddətdə qəzet nəşr edilməyib.

Araşdırma zamanı məlum oldu ki, "Lenin tərbiyəsi uğrunda" qəzeti Ali Pedaqoji İnstitutun direktorluğunun, partiya komitəsinin və birləşmiş həmkarlar komitəsinin orqanı kimi Azərbaycan, erməni və rus dillərində 1934-1940-cı illərdə nəşr olunub. Qəzetin Azərbaycan dilində 171, erməni dilində 166, rus dilində 166 nömrəsi işıq üzü görüb. Ayda 4 nömrəsi çıxan qəzetin ilk məsul redaktoru Ə.Nəsirov olub. Qəzetin ilk müxbirləri Nəsib Əlizadə, Kamal Əliyev, Səxavət İsmayılova olub. Sonrakı dövrlərdə qəzetə M.Şıxlı, N.Məmmədov, Yusif Rzayev, R.Rəsullu, Z.İbrahimov, N.Namazov, İ.Bağırov,Y.Məmmədov, C.Hüseynov, H.Səmədzadə (məsul redaktoru əvəz edib) rəhbərlik edib.

1940-cı ilin sonunda qəzet öz fəaliyyətini yenidən dayandırmalı olub. Qəzetin son nömrələri Əli Zəbunun redaktorluğu ilə nəşr edilib.

21 yanvar 1947-ci ildə "Lenin tərbiyəsi uğrunda" qəzeti 1947-ci ildən 1990-cı ilə kimə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin orqanı kimi nəşr olunub.

Qəzet o dövrdə Pedaqoji İnstitutun tədris, elm və təsərrüfat həyatının güzgüsü olub. Qəzetdə dərsə gecikən, yaxşı oxumayan, nizam-intizamı pozan, imtahan sessiyasında uğur qazanmayan tələbələr ciddi tənqid olunub, nümunəvi tələbələr haqqında oçerklər verilib. Həmin dövrdə bütün fakültələrdə tələbələr tərəfindən "Bülletenlər" (divar qəzetləri) çıxarılırdı ki, onların fəaliyyəti də "Lenin tərbiyəsi uğrunda"da müzakirə edilirdi. Qəzetdə tələbələrlə yanaşı işinin öhdəsindən gələ bilməyən müəllimlər də tənqid edilirdi. Bu xüsusda H.Araslının yazısı (şeir parçası divar qəzetindən götürülmüşdü) maraq doğurur. O yazırdı:

Əziziyəm ay gələr,
Gün dolanar ay gələr,
Müəllim var dərsinə,
İldə beşcə ay gələr.

Qəzetin səhifələrində institutun direktoru Mirzə Məmmədovun, ayrı-ayrı vaxtlarda tədris və elmi işlər üzrə direktor müavini olan Mehdi Mehdizadənin, Əli Sultanlının, partiya komitəsinin katibi Cəfər Cəfərovun, həmkarlar komitəsinin sədri Bünyadovun, qiyabi şöbənin müdiri Əşrəf Quliyevin, aspirantura şöbəsinin ictimai əsaslarla dekanı Ə.Əsgərovun, tələbə kooperativinin sədri A.Salayevin, M.Rəhimli, Ə.Seyidov, M.Rəfilinin, İ.Həsənovun, A.Lukyanovanın, M.Əhmədlinin xeyli yazıları, tələbələrin və müəllimlərin şeir yaradıcılığından nümunələr, Azərbaycan, Avropa və rus ədəbiyyatının və pedaqoji fikrinin klassikləri ilə bağlı tədqiqatçı alimlərin məqalələri verilmişdir.

"Lenin tərbiyəsi uğrunda" qəzetində yalnız Pedaqoji İnstitutun deyil, ölkə üçün ictimai-siyasi və elmi əhəmiyyət kəsb edən hadisələr öz əksini tapırdı.

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunun ilk "Elmi əsərlər"i

30-cu illərdə institut əməkdaşları müxtəlif fənlərin tədrisinin səviyyəsinin yüksəldilməsi və elmin ayrı-ayrı sahələrinin aktual problemləri ilə bağlı maraqlı araşdırmalar aparırdılar. Həmin dövrdə bir neçə elmi, pedaqoji və metodik jurnal nəşr edilirdi. Bəzi ali təhsil müəssisələrinin müstəqil "Elmi əsərlər"i olsa da, yüksək elmi və pedaqoji potensiala malik olan Pedaqoji İnstitutda heç bir elmi nəşr yox idi. Əməkdaşlar elmi araşdırmalarının nəticələrini SSRİ EA-nın Zaqafqaziya filialının Azərbaycan şöbəsinin "Elmi əsərlər"ində, ADU-nun "Xəbərləri"ndə, "Kommunist tərbiyəsi uğrunda" və "Müəllimə kömək" məcmuələrində nəşr etdirirdilər. Vəsait ayrılmadığına görə İnstitutun "Elmi əsərləri"ni nəşr etmək mümkün olmamışdı.

1933-cü ildə institutda erməni tələbələrinin divar qəzetində nəşr etdirdikləri millətçi şeirlərə görə V.İ.Lenin adına ADPİ-də kadr hazırlığının vəziyyəti Azərbaycan K(b)P MK-da müzakirə olundu və institutun rəhbərliyi dəyişdirildi. Həmin qərarda pedaqogikanın tədrisini və pedaqoji kadr hazırlığını yaxşılaşdırmaq məqsədilə periodik olaraq *elmi məcmuənin* nəşrinə icazə verildi.1935-ci ildə institutun direktoru Mirzə Məmmədovun məsul redaktorluğu ilə *"Azərbaycan Pedaqoji İnstitutunun Xəbərləri"*nin ilk sayının nəşr edilməsi institutun elmi həyatında mühüm hadisə oldu. "Azərbaycan Pedaqoji İnstitutunun Xəbərləri"nin I buraxılışı (cəmi 80 səhifə) 1935-ci ilin iyul ayında işıq üzü gördü. Məcmuə Azərbaycan və rus dillərində verilən "Redaksiyadan" adlı ön sözlə açılır. Burada Pedaqoji İnstitutda elmi-tədqiqat işlərinin geridə qalmasının əsas səbəbi kimi *"elmi işləri çap edə bilmək üçün mətbu orqanın olmaması"*[119] göstərilirdi. Əsaslandırılırdı ki, bu isə müəlliflərin haqlı olaraq narazı qalmalarına səbəb olaraq, vəd etdikləri elmi-tədqiqat mövzularını hazırlayarkən intensivliyi aşağı salırdı. İnstitutun periodik olaraq "APİ Xəbərləri" nəşr edildikdən sonra elmi-tədqiqat işlərinin inkişaf işindəki bu mühüm məmaniət (maneçilik, əngəl-F.R.) aradan qaldırılır, çünki redaksiya tədqiqat işlərini oxucu kütlələrinə çatdırmağı öz qarşısına əsas vəzifə qoymuşdur[120].

Redaksiya heyəti məcmuədə ali məktəblə bağlı hökumətin qərar və göstərişlərini, ibtidai və orta məktəblər, fəhlə fakültələri və texnikumlarla bağlı nəzəri məlumatları, professor-müəllim heyətinin elmi məqalələrini, ayrı-ayrı elm sahələri ilə bağlı yenilikləri və biblioqrafik məlumatları çap etməyi planlaşdırmışdı.

Məcmuədə aşağıdakı bölmələr nəzərdə tutulmuşdu:

1) Elmi tədqiqat işləri;

2) Ali Pedaqoji İnstitutda tədris prosesinin səmərəliləşdirilməsi problemləri;

3) Ayrı-ayrı kafedralar və fənlər üzrə tədris metodik işlərin təcrübələrinin mübadiləsi;

4) İbtidai və orta məktəblərdə, işçi fakültələrində və texnikumlarda tədris-tərbiyə işləri;

5) Ayrı-ayrı fənlər üzrə elmi nailiyyətlərin xülasəsi;

6) Biblioqrafiya.

Məcmuənin ilk və son sayında "Keçmiş türk ədəbiyyatı haqqında bəzi notlar" (dos.Əli Nazim), "Azərbaycanın müstəmləkə əsarəti və istila edilməsi tarixindən bir parça" (A.Məmmədov), «Академик Н.Я.Марр как арменист лингвист» (A.Ter-Matevosyan), "Dərsdə uşaqları diqqətləndirmək barəsində" (dos.Ə.K.Zəkuzadə), "Fiziologiyada yeni ixtiralar" (Abdulla Qarayev), "Dillər kafedrasının əyani vasitələr yaratmaq xüsusundakı təcrübələri" (prof.Ə.Dəmirçizadə), «Научно исследовательская работа в АПИ имени В.И.Ленина» ( Китушин A.H) məqalələr verilmişdir:

Təəssüf ki, Azərbaycan K(b)P MK-nın xüsusi qərarı ilə 1935-ci ildə nəşr edilən "APİ Xəbərləri"nin yalnız 1 sayı işıq üzü görmüşdür. Uzun fasilədən sonra məcmuənin 1946-cı ildə yenə cəmi 1 sayı nəşr edilmişdir. Elmi məcmuənin periodikliyini yalnız 1953-cü ildən sonra təmin etmək mümkün olmuşdur.

---

[119] *"APİ Xəbərləri" (Известия АПИ). I Buraxılış. İyul 1935,s.7*

[120] *"APİ Xəbərləri" (Известия АПИ). I Buraxılış. İyul.1935,s.7*

## Məkrli erməni siyasəti: Azərbaycan Dövlət Pedaqoji İnstitutunda erməni şöbəsinin təşkili

Azərbaycanda məkrli erməni siyasətinin həyata keçirilməsində S.Şaumyandan sonra Levon Mirzoyan böyük rol oynayıb. O, 1920-1925-ci illərdə Azərbaycan Həmkarlar İttifaqının sədri, sonra Azərbaycan SSR Əmək xalq komissarı, Azərbaycan KP Bakı komitəsinin katibi, 1925-1929-cu illərdə Azərbaycan KP MK-nın katibi olub. Moskvada –Kremldə işləyən ermənipərəst qüvvələrin, xüsusilə də A.İ.Mikoyanın dəstəyi ilə Levon Mirzoyan Azərbaycan K(b)P MK -da sözü keçən simalardan birinə çevrilib. Qısa zamanda erməni millətçilərini ətrafına toplayaraq milli ziyalıları sıxışdırıb, Azərbaycan dövlətinə və dövlətçiliyinə qarşı xəyanətkar mövqedə dayanıb. Onun Azərbaycana rəhbərliyi dövrü öz qohum-əqrəbasına, yaxınlarına himayəçiliyi və ermənilərin yüksək vəzifələrə təyin edilməsi ilə xatırlanır. Özünə vurğunluğu ilə seçilən Mirzoyan bir çox hallarda mütləq hakimliyini sübut etmək üçün Moskvanı məlumatlandırmadan müstəqil qərarlar qəbul edib. Onun bu fəaliyyətindən narazı qalan Stalin onu Azərbaycandakı vəzifəsindən uzaqlaşdırıb.

O, Ural vilayət Partiya Komitəsinin II katibi, Qazaxıstan KP MK-nın I katibi (1933-1938) olanda da Azərbaycanın partiya, sovet, inzibati-təsərrüfat orqanlarında, maarif, elm, təhsil sistemində, o cümlədən ali məktəblərdə ermənilərin yüksək və məsul vəzifələrinə irəli çəkilməsinə dəstək verib.

1932/33-cü tədris ilində ADPİ-nin bütün fakültələrində erməni şöbəsinin açılması bu məkrli siyasətin nəticəsi idi. Erməni şöbələrinin təşkili institutun tələbə və professor –müəllim heyəti tərkibində ermənilərin ildən-ilə sayının artmasına, onların təşkilatlanmasına və mövqelərinin möhkəmlənməsinə səbəb oldu.

1937-1938-ci illərdə ***kütləvi repressiyalar*** zamanı ADPİ-nin kafedralarına rəhbərlik edən istedadlı və təcrübəli milli elmi-pedaqoji qüvvələrlə yanaşı, Azərbaycan xalqının tarixini və mədəniyyətini yüksək qiymətləndirən görkəmli rus alimlərinin də bir qrupu (A.N.Cavaxaşvili, A.B.Çiçikalov, A.S.Kovanko, V.S.Yelpatevski, A.F.Lyaster, N.S.Nikolayev, S.Y.Veysiq, P.İ.Kuznetsov, A.P.Kuzovenko, prof. A.S.Bukşpan, V.İ.Tixomirov, prof. Boris Tixomirov) sıradan çıxarıldı.

ÜK(b)P MK-nın qurultayında (23 fevral 3 mart 1937) İ.Stalin sosializm quruculuğu yolunda sinfi mübarizəni kəskinləşdirmək doktrinasını inkişaf etdirərək "Partiya işindəki çatışmazlıqlar və trotskiçilərlə, ikiüzlülərin aradan qaldırılması barədə" məruzə ilə çıxış etdi. Bundan sonra isə kütləvi repressiyalara start verilir. Trotskiçilikdə, müsavatçılıqda və casusluqda ittiham olunan onlarla görkəmli ziyalı həbs olundu. "Sovet hökumətinə qarşı silahlı mübarizə mövqeyində dayandığına və elmi cəbhədə ziyankarlıq işi apardığına görə" Pedaqoji İnstitutun xeyli əməkdaşı repressiyanın qurbanı oldu. Həbs edilənlərin (prof.Vəli Xuluflu, prof.Fətulla bəy Rzabəyli, Atababa Musaxanlı[121], Abdulla Şərifov[122], Y.V.Çəmənzəminli, prof.Əziz

[121] ***Atababa Daşdəmir oğlu Musaxanlı*** *1905-ci ildə Bakı şəhərində anadan olub. İbtidai təhsilini rus –tatar məktəbində alıb. 1921-1924-cü illərdə Ali Pedaqoji İnstitutun Dil və ədəbiyyat şöbəsini fərqlənmə diplomu ilə bitirib. Sonradan Bakı Pedaqoji Texnikumunda dil və ədəbiyyat müəllimi kimi çalışıb. Pedaqoji İnstitutda müəllim olub. 17 dekabr 1937-ci ildə həbs edilib, 31 dekabr 1937-ci ildə güllələnməyə məhkum olub. Sonradan güllələnmə sürgün cəzası ilə əvəz olunub. 1941-ci il avqustun 14-də sürgündə olarkən vəfat edib. İlk ədəbi tənqidçilərdən və "Kitabi – Dədə Qorqud"un tədqiqatçılarından biri olub. 2008-ci ildə Azərbaycan Yazıçılar Birliyinin Natəvan klubunda ədəbiyyatşünas və tənqidçi Atababa Musaxanlının 100 illiyi qeyd olunub.*

[122] ***Abdulla Məhəmməd oğlu Şərifov*** *1893-cü ilin noyabrında Orenburq vilayətinin Troutski şəhərində anadan olmuşdur. İlk təhsilini atası Məhəmmədin müəllim işlədiyi məhəllə məktəbində almış, sonra şəhərdəki rus-tatar məktəbində və İstanbulda (1908-1914) oxumuşdur. 1921-ci ilin martında Tümen quberniya rəhbərinin milli məsələlər üzrə müavini təyin edilmişdir. Həmin ilin payızında vəzifəsindən istefa verərək Tomsk Universitetinin İctimai fənlər fakültəsinə qəbul olunmuşdur.Həmin institutun bağlanması səbəbindən 1923-1928-ci illərdə ADU-da təhsil almışdır. 1929-cu ildə universitetin aspiranturasına qəbul olunmuşdur. 1929-1932-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Dil və ədəbiyyat kafedrasında müəllim və kafedra müdiri işləmişdir. 1933-cü ilin fevralın 15-dən SSRİ Elmlər Akademiyasının Azərbaycan filialında kiçik elmi işçi kimi çalışmışdır. "Türk-tatar dillərinin sinqarmoniyası haqqında", "Türk dili qrammatik kateqoriyalarının təsnifat prinsipləri haqqında", "Azərbaycanın Şamaxı dialekti. (Şamaxı rayonuna iki illik ekspedisiyanın yekunları)", İdris Həsənovla birlikdə iki cildlik "Orta məktəblər üçün türk dilinin qrammatikası") və b. əsərlərini yazmışdır. O, həm də M.İ.Menşikovun, akademik Marrın kitablarını Azərbaycan dilinə tərcümə edərək 1932-ci ildə nəşr etdirmişdir. 1937-ci ildə həbs edilmiş, uzun müddətli sorğu-sualdan sonra -3 iyul 1938-ci ildə güllələnmişdir.*

Ubaydulin, dos.Əli Nazim, Mikayıl Rəfili, prof. İdris Həsənov, prof.Abdulla Tağızadə, Həmzə Qasımzadə, dos. Mikayıl Rəhimli[123], X.L.Xalfin və b.) xeyli hissəsi dərhal güllələndi və ya Sibirə sürgün edildi. Repressiya olunanların içərisində ayrı-ayrı vaxtlarda Pedaqoji İnstituta rəhbərlik etmiş Fətulla bəy Rzabəyli, Şarif Manatov, Pənah Qasımov, Məmməd Bayramov, Mirzə Məmmədov, Mirzə Davud Rəsulzadə, Hüseyn Musayev və Siyasi iqtisad kafedrasının müdiri olmuş prof. Balabəy Həsənbəyov da (*həbs olunanda o, ADU-nun rektoru idi*) var idi. Onların həbsi pedaqoji kollektivdə geniş "müzakirə" edilmişdi. Müzakirədə fəallıq göstərən erməni müəllim və tələbələr onları əksinqilabçı və antisovet qüvvə hesab etmişlər.

Bu baxımdan Ali Pedaqoji İnstitutun orqanı olan "Lenin tərbiyəsi uğrunda" qəzetdə" verilən "***APİ-də xalq düşmənlərinin kökünü axıra qədər kəsməli***" məqaləsini həyəcansız oxumaq mümkün deyil. Məqalədə yazılırdı:" *İnstitutun sabiq rəhbərlərinin bolşevik sayıqlığının kütləşməsi və kontrrevolyunistlərə liberalcasına yanaşması nəticəsində APİ-yə soxulmuş rəzil kontrrevolyunistlərin, mənfur xalq düşmənlərinin kökünü hələ də kəsə bilməmişik. İllər uzunu institutda kafedralarımızı əllərinə alıb, "dərs" verən kontrrevolyuner Nikolayev, Tixomirov, Həsənbəyov, Xuluflu, Vanendesi, Çiçikalov, Buqşpan və başqa bu kimi əclafların "işi" nəticəsiz qalmamışdır....Avetesyan Serop, Süleymanov, Əlizadə Həsən, Aqabekyan S. və başqaları antisovet daşnaq və müsavatçı qruplar təşkil edərək kontrrevolyusion fəaliyyətdə bulunmuşlar"*[124]. SSRİ tarixi kafedrasının müdiri Bayramovu, Xuluflunu ciddi şəkildə tənqid edən müəllif (məqalənin sonunda ad göstərilmir) İsrafil Axundovun (o Həsənbəyovun yaxın dostu olduğuna görə tənqid edilirdi) hələ də ifşa edilməməsindən təəssüf hissi keçirərək daha sonra yazılırdı: *"Müsavat partiyasının üzvü Miralayevin qaynı Əhməd Seyidov pedaqoji kafedra rəhbəri Rəhimli tərəfindən müdafiə olunur. Seyidovun simasını yaxşı tanıyan Mehtiyev isə susmuşdur. Bir neçə illər əzində institumuzda məsul vəzifədə olan Mirzə Məmmədov öz sinfi sayıqlığını itirmiş və bir çox hallarda kontrrevolyusion elementləri müdafiə etmişdir. Bunun nəticəsidir ki, institutun təsərrüfat idarəsi və kitabxanasında oturan ziyankar, antisovet elementlər (Xatyanovski, Muxtarov, Abbasov və b.) öz yerlərini çox dinc hiss etmişlər. Abbasov kimdir? Köhnə tacir, məişətcə pozğun, xalq əmlakını dağıdan bu adam, alçaq xalq düşmənləri Vəli Xuluflu və H. Zeynallının qəddar agentidir ki, bolşevik simasını itirmiş M.Məhəmmədovun yardımı ilə institutumuzun qəlbi olan kitabxanamıza soxulmuşdur. ..Vaxtilə antisovet millətçi "ədəbi görüşləri" üzrə ifşa edilib, müəllimlikdən qovulan "professor" Baqri kafedraya qayıtdıqdan sonra Abbasovun müdafiəçisi sifəti ilə onu aspiranturaya soxmaq və ondan da Pleşşunov kimi özü qədər antisovet millətçi və xalturaçı bir kadro hazırlamağa çalışır.Düşmən öz agentlərini aspiranturaya soxmağa çalışmış və nəticədə Həsənbəyovun arvadı və həmfikri Blinova, M.Qriqoryan və Fərzəlibəyli kimi adamların vasitəsilə sovet aspirantı kimi şərəfli adın ləkələnməsinə səbəb olmuşdur. Təəccüblü orasıdır ki, ifşa edilmiş Fərzəlibəyli aspiranturaya daxil olarkən pedaqoji kafedrasının rəhbəri M.Rəhimlidən zəmanət ala bilmişdir... Bakı pedtexnikumunun direktoru Yusif Abbasov Nəsirovu, Avanesovu və M.Qriqoryanı öz qanadı altına alıb, pedtexnikumda işlətməkdədir.*

*İnstitutun müəllimləri və tələbələri xalq düşmənləri və onların quyruqlarına qarşı amansız olmalıdır. Biz hələ onların hamısını meydana çıxara bilməmişik. Düşməni tanımaq məharətini öyrənməli, onun masqasını yırtmağı bacarmalı və xalq düşmənlərinin kökünü kəsməklə, institutumuzu*

---

*[123] **Mikayıl Cəbrayıl oğlu Rəhimli** (1907-1937) Bakı quberniyasının Pirşağı kəndində anadan olmuşdur. İbtidai və orta təhsil almış, altısinifli Alekseyev hərbi məktəbini, yerquruluşu texnikumunu və ali pedaqoji kurs bitirmişdir. 1920-1922-ci illərdə ordu sıralarında xidmət etməklə yanaşı, həm də Azərbaycan Dövlət Universitetində təhsil almışdır. O, "Kommunist tərbiyəsi" və "Müəllimə kömək" elmi-pedaqoji jurnallarının redaktoru olmuş, məktəblilərin ictimai –siyasi tərbiyəsi, pedaqoji "sol" opportunizmin metodoloji kökləri, pedaqoji təhsilin məzmunu, proqramların və stabil tədris kitablarının hazırlanması ilə bağlı silsilə məqalələrlə çıxış etmişdir. ADPİ-nin Pedaqogika kafedrasında assistent (1927), dosent (1929) və müdir (1930-1937) vəzifələrində çalışmışdır. Pedaqogika və Azərbaycan tarixi ilə bağlı 5 dərslik, 50-dən artıq elmi məqalənin müəllifidir.*

*[124] "APİ-də xalq düşmənlərinin kökünü axıra qədər kəsməli"// "Lenin tərbiyəsi uğrunda" qəzeti, 11 fevral 1937*

*Stalin epoxasının xoşbəxt gəncliyinin tərbiyəçiləri olan, pedaqoqlar yetişdirən və böyük Lenin adını şərəflə daşıyan instituta çevirməliyik.”*[125]

İnstitutda çalışan tanınmış azərbaycanlı və rus alimlərinin həbsindən sonra kafedralarında məsul vəzifələrə maneəsiz olaraq ermənilər yerləşdirildi. Nəticədə ADPİ-nin SSRİ tarixi kafedrasına rəhbərlik etmək heç bir elmi dərəcəsi olmayan M.Q.Əsriyana tapşırıldı. O, professor vəzifəsini icra etmək hüququna malik oldu. Eləcə də Siyasi iqtisad kafedrasına T.A.Petrosyan müdir təyin edildi və professor elmi adına layiq bilindi. 40-cı illərin əvvəlində İngilis dili kafedrasına rəhbərlik tədris və elmi yaradıcılıq işində heç bir səriştəsi, təcrübəsi və elmi dərəcəsi olmayan T.O.Akopavoya tapşırıldı. Sonrakı illərdə İqtisadi coğrafiya kafedrasına T.A.Koçaryan, Marksisizm-leninizm kafedrasına Q.A.Simonyan müdir təyin edildi. Həmin dövrdə Ümumi tarix kafedrasında S.P.Ağayan, A.A.Paidikyan, A.S.İonesyan, Sov. İKP tarixi kafedrasında Q.S.Aslanyan, Dialektik və tarixi materializm kafedrasında A.A.Balayan, Pedaqogika və psixologiya kafedrasında N.Asatur, Q.Q.Karamyan, Tevosyan, Fiziologiya kafedrasında N.A.Mandelyan, Rus dili kafedrasında V.Z.Keramyan, Dil-ədəbiyyat fakültəsində A.A.Qəribyan və A.A.Balayan çalışırdılar. S.Abramova uzun müddət institut Partiya komitəsinin katibi olmuşdur.

Demək olar ki, ermənilər Pedaqoji İnstitutu zəbt etmişdilər. Həm mərkəzdə, həm də respublikada ermənilər mühüm vəzifələr tutduğundan onlara qarşı açıq mübarizə aparmaq da çətinlik törədirdi. Digər tərəfdən, onlara qarşı ən xırda təzyiq millətçilik hesab edilirdi.

Arxiv sənədləri içərisində 1941-ci ilin oktyabr ayında Bakı şəhər Partiya Komitəsinin katibi *Sadıxovun* Azərbaycan Dövlət Pedaqoji İnstitutunda ermənilərin həyasızlıqları ilə bağlı Azərbaycan K(b)P MK-ya ünvanladığı məktubu (arayışı) həyəcansız oxumaq mümkün deyil. ***Bu, sadə bir məktub deyil, ermənilərin bir institutun timsalında Azərbaycan millətinin başına açdığı oyunların real təsviridir.***

Azərbaycan K(b)P MK Azərbaycan Dövlət Pedaqoji İnstitutunda kadrların yerləşdirilməsi ilə bağlı anonim məktubu yoxlanılmaqdan ötrü Bakı şəhər Partiya Komitəsinə göndərir. Yoxlama zamanı dəhşətli mənzərə ilə qarşılaşan komissiya üzvləri Azərbaycan K(b)P MK-nın katibinə ünvanladıqları məktub- arayışda bildirirlər ki, göstərilən faktların əksəriyyəti öz təsdiqini tapmışdır. ***Azərbaycan Pedaqoji İnstitutunda direktorluğun və partiya komitəsinin yerli millətin nümayəndələrini – azərbaycanlıları rəhbər vəzifələrə irəli çəkməklə bağlı fəaliyyətləri tamamilə yarıtmazdır.*** *Bunun da nəticəsində Pedaqoji İnstitutda rəhbər işlərdə işləyənlərin böyük **əksəriyyəti erməni millətinin** nümayəndələridir.*

*- İnstitut partiya bürosuna seçilən 11 nəfərdən 4-ü azərbaycanlı, **5-i erməni,** 2-si rusdur. **Partiya təşkilatının katibi Aşumov** seçilib. Hazırda 5 nəfər büro üzvü qalıb ki, onlardan da **3-ü erməni**, 1-i azərbaycanlı, 1-i rusdur.Digərləri müharibəyə səfərbər olunub və ya başqa işə keçirilib. Hazırda partiya komitəsi katibinin işini onun müavini **Asatur Nəsirov** (erməni-F.R.) icra edir, baxmayaraq ki, o, yeni katib seçilənə kimi bu vəzifəyə təsdiq olunmayıb.*

*-Yerli komitənin sədri **T.Simonyan**dır ki, o, ümumiyyətlə, komitəyə seçkilərdə iştirak etməyib. Seçim zamanı APİ-nin partiya təşkilatı və respublika Həmkarlar İttifaqı komitənin tərkibində daha bacarıqlı azərbaycanlılar olduğuna diqqət verməyib.*

*-Azərbaycan Pedaqoji İnstitutunda komsomol işi **Osipyana** həvalə olunmuşdur. Osipov APİ-nin komsomol bürosunun üzvü deyil, institutla heç bir əlaqəsi yoxdur. Osipov Xalq Təsərrüfatı İnstitutunda oxuyur və şəxsi münasibətlərinə görə Azərbaycan LKGİ-nin Bakı şəhər katibi **Akopyan** tərəfindən göndərilmişdir.*

*- Həmkarlar komitəsinin sədri **Bedjanyan** seçilib.*

*- İnstitutun **elmi katibi Kazancyanın** yerinə daha nüfuzlu elmlər doktoru, professor və ya dosentin seçilməsi daha məqsədəuyğundur.*

*-İnstitutun kitabxanasının müdiri **Mirzoyanın** fəaliyyəti də qənaətbəxş deyil, kitabxananın 18 nəfər işçisindən **13 nəfəri erməni**, 2 nəfəri*

[125] *Yenə orada*

*azərbaycanlı, 3 nəfəri digər millətin nümayəndələridir.*

*- Uzun müddət yataqxana müdiri vəzifəsində çalışan Ələsgərovun yerinə bu işdə heç bir təcrübəsi olmayan* ***Sarkisov*** *təyin olunub.*

*-Tarix fakültəsinin dekanı* ***Petrosyan,*** *qiyabi üzrə müavini isə* ***Petrosovdur.***

Komissiya üzvləri yalnız yoxlama aparmaqla kifayətlənməyib, İlyas Bəşirovun institut partiya komitəsinin katibi seçilməsi, yerli komitəyə, həmkarlar komitəsinə azərbaycanlıların təyin edilməsi, komsomol təşkilatının katibi Osipovun vəzifəsindən uzaqlaşdırılması, Tarix fakültəsinin qiyabi şöbəsinin dekan müavinin dəyişdirilməsi, kitabxana işinə azərbaycanlıların cəlb edilməsi ilə bağlı təklif veriblər.

1946-cı ildə Azərbaycan KP MK-ya ADPİ-nin tədris və elmi həyatı ilə bağlı göndərilən hesabatı həyəcansız oxumaq mümkün deyil. Təsəvvür edin ki, ADPİ-də təhsil alan 1530 nəfər tələbənin 543 nəfəri azərbaycanlı, 583 nəfəri erməni, 236 nəfəri rus, 168 nəfəri digər millətin nümayəndələri olub[126]. Ermənilərin apardığı mənfur siyasətin yekunu göz qabağındadır. Erməni tələbələrin sayının azərbaycanlılardan çoxluğu sonralar Azərbaycana sahib çıxmaq ideyasının mayasında duran məkrli tədbirlərdən biri idi.

Pedaqoji İnstitutun 25 illiyi münasibəti ilə nəşr edilən məcmuədə dos. S.S.Barxudaryan “APİ-nin erməni bölməsi” məqaləsində yazırdı*:”1932-ci ildə İnstitutun beş fakültəsi yanında erməni bölməsi yaradılmışdır. Bu müddət ərzində institutun erməni bölməsi tərəfindən erməni orta məktəbləri üçün 600 müəllim hazırlanmışdır”*[127]. Erməni bölməsində dərs demək üçün ilk vaxtlar İrəvan Pedaqoji İnstitutundan müəllimlər dəvət olunurdu. Onlara Bakıda yaradılan şəraitdən məmnun qalan erməni mütəxəssislər burada məskunlaşır, dövlətin hesabına evlə təmin edilirdilər. 1945/1946-cı tədris ilində erməni bölməsində 20 nəfər elmləri namizədi, dosent vardı ki, onların da 6 nəfəri institutun erməni bölməsinin keçmiş tələbələri idi.[128] Tarix fakültəsində 60-a qədər erməni oxuduğuna görə, Aşot İonesyan fakültənin dekan müavini idi.

Pedaqoji İnstitutda “isti yuva” quran ermənilərin sayı artdıqca onların əsl simaları üzə çıxırdı. 1933-cü ildə institutda erməni millətindən olan tələbələrin -Verdiyan və Gevorqyanın institutun divar qəzetində nəşr etdirdikləri millətçi şeirlərə görə böyük narahatlıq yarandı. Hadisə o qədər böyüdüldü ki, nəticədə V.İ.Lenin adına ADPİ-də kadr hazırlığının vəziyyəti Azərbaycan K(b)P MK-da müzakirə olundu. Pedaqoji İnstitutun rəhbərliyi dəyişdirildi, institut Partiya komitəsi, Voroşilov Rayon Partiya Komitəsi, Xalq Maarif Komissarlığı haqsız yerə günahlandırıldı. İnstitutla bağlı Azərbaycan K(b)P MK 7 dekabr 1933-cü ildə “Ali Pedaqoji İnstitut haqqında” xüsusi qərar qəbul etdi. Həmin qərarda institutda pedaqoji kadr hazırlanmasında əldə edilən nailiyyətlər göstərilməklə yanaşı, nöqsanlar ciddi tənqid olundu. Tələbə kollektivinin möhkəmləndirilməsi, müəllim heyətinin tərkibinin sağlamlaşdırılması, aspirantların siyasi mövqeyinin yoxlanılması, kollektivin tərkibinin kommunistlərin hesabına gücləndirilməsi, beynəlmiləl tərbiyənin ön plana çəkilməsi vacib hesab edildi.

40-cı illərin ikinci yarısında dos.*Əhməd Seyidov* instituta direktor təyin olunduqdan sonra erməni millətçilərinin mövqeyi nisbətən zəiflədi. Azərbaycan SSR Nazirlər Sovetinin Pedaqoji İnstitutla bağlı qəbul planında ciddi dəyişiklik edildi. 1944-cü ildə Maarif Nazirliyindən instituta göndərilən qəbul planında göstərilirdi ki, növbəti tədris ilində ADPİ-yə 30% azərbaycanlı, 60% erməni və 10% rus qəbul olmalıdır. Bu ədalətsiz bölgüyə etiraz edən Əhməd Seyidov onu aşağıdakı kimi düzəldir: instituta 70% azərbaycanlı, 15% erməni və 15% rus qəbul edilsin.

Ermənilər Əhməd Seyidovu millətçi kimi aradan götürmək məqsədilə Azərbaycan K(b)P MK-ya, Xalq Daxili İşlər Komissarlığına, Voroşilov rayon Partiya Komitəsinə şikayət edirlər. Əlacsız qalan Maarif naziri Mirzə İbrahimov Əhməd Seyidovun Elmi-Tədqiqat Pedaqoji Elmlər İnsti-

---

[126] *Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. F.1,siy. 31, sax.vah.484*
[127] *V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu- 25 il. Bakı:1946, s.41*
[128] *Yenə orada*

tutuna dəyişdirilməsinə çalışır. Əhməd Seyidov buna qəti etiraz edir. Məsələ Azərbaycan K(b)P MK-nın bürosunda müzakirəyə çıxarılır. Problemdən xəbərdar olan Mircəfər Bağırov deyir: “Seyidov, nə üçün millətçilik edirsən?”. O qorxmadan cavab verir ki, Nazirlər Sovetindən instituta qəbulla əlaqədar belə bir kağız gəlmişdi ki, cari tədris ilində instituta 30% azərbaycanlı, 60% erməni və 10% rus qəbul olunsun. Mən belə hesab etdim ki, ermənilərin də bizim kimi respublikası var. Bizim məktəblərdə müəllim kadrları çatmadığı halda biz nə üçün ermənilərə kadr hazırlamalıyıq. Mən Nazirlər Sovetinin kağızındakı bu rəqəmin səhv olduğunu düşünüb 70% azərbaycanlı, 15% erməni və 15% rus qəbul olunması şəklində düzəliş etdim”. Bu faktı eşidən Mircəfər Bağırov hücum hədəfini Nazirlər Sovetinə yönəldir və Əhməd Seyidova deyir: “Kişi, qayıt APİ-yə, get öz bildiyin kimi işlə”.

İnstituta qayıdan Əhməd Seyidov erməni fakültəsini ləğv edir, onu şöbəyə çevirir, vəzifədə olan xeyli ermənini azərbaycanlı ilə əvəz edir. Onun təşəbbüsü ilə, erməni şöbəsində Azərbaycan dilinin tədrisinə ayrılan saatların miqdarı artırılır.

Yeri gəlmişkən, qeyd edək ki, Pedaqoji İnstitutda ermənilərin millətçilik işlərinin qarşısını sonrakı illərdə də almaq mümkün olmamışdır. Riyaziyyat fakültəsində X.O.Qayamova, A.A. Kartaşyan, S.A.Xaçiyan, E.S.Qriqoryan, Fizika kafedrasında S.S.Baqdasaryan, T.A.Qakisov, Botanika kafedrasında V.M.Vartanov və millətçiliyə köklənən siyasi ambisiyalarını gizlində gerçəkləşdirməyə can atırdılar. Fəlsəfə kafedrasının dosenti Sarkisov uzun müddət institut Partiya təşkilatının katibi olmuşdu. O, 70-ci illərin əvvəlində institutun Xankəndi filialının direktoru, 80-ci illərin başlanğıcında isə Xankəndi Pedaqoji İnstitutunun rektoru təyin edilmişdi. Ermənilər təkcə Azərbaycanın bir ali məktəbinin bu qədər mühüm işlərini əllərində cəmləşdirib faydalanmalarına, həmişə ön cərgələrə çəkilmələrinə baxmayaraq, sonralar nankorluqla bütün dünyaya bağırdılar ki, Azərbaycanda “əzilir”, “sıxışdırılırlar”...

## V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun yeni nizamnaməsi

SSRİ Nazirlər Soveti yanında Ali Məktəb İşləri üzrə Ümumittifaq Komitəsi tərəfindən 29 aprel 1939-cu ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun yeni Nizamnaməsi[129] təsdiq olundu. Nizamnamənin şərtlərinə görə Azərbaycan Dövlət Pedaqoji İnstitutu tam orta məktəblər üçün tarix, riyaziyyat, fizika, təbiyyat, coğrafiya, Azərbaycan dili və ədəbiyyat, rus dili və ədəbiyyat, ingilis dili, fransız dili, alman dili müəllimləri, həmçinin məktəbəqədər tərbiyə müəssisələri üçün işçilər hazırlamalı idi.

Pedaqoji İnstitutun məqsəd və vəzifələrinin şərhi ilə başlayan Nizamnamənin strukturu aşağıdakı kimi idi:

*“Tələbələr”* adlı I bölmədə göstərilir ki, Azərbaycan Dövlət Pedaqoji İnstitutunda 17 yaşdan 35 yaşa kimi orta təhsil haqqında attestatı olan və ya yaşlılar üçün orta məktəbi bitirən sosial vəziyyətindən, dinindən, cinsindən və milliyyətindən asılı olmayaraq bütün SSRİ vətəndaşlarının pulsuz oxumaq hüququ vardır.

Qəbul üçün aşağıdakı fənlərdən imtahan verməlidirlər:1) ana dili (inşa, qrammatika, ədəbiyyat); 2) rus dili (inşa, qrammatika, ədəbiyyat); 3) SSRİ xalqları tarixi və SSRİ Konstitusiyası; 4) riyaziyyat; 5) kimya; 6) fizika; 7) xarici dil (daxil olanın arzusuna uyğun olara ingilis, alman və fransız dillərinin birindən).

Nizamnaməyə görə tələbələrin əksəriyyəti dövlət tərəfindən təqaüdlə təmin edilirdi. Təqaüd tələbələrin təlim müvəffəqiyyətlərinə uyğun olaraq ADPİ-nin direktoru tərəfindən verilirdi. Bütün imtahanları “əla” və “yaxşı” qiymətlərlə verən, dövlət imtahanından “əla” alan tələbəyə fərqlənmə

[129] *Устав Азербайджанского государственного педагогического института им.В.И.Лени-на. Баку,1939,19 с.*

diplomu verilirdi. Fərqlənmə diplomu alan tələbələr təhsil müəssisələrində və elmi-tədqiqat institutlarında işə düzələndə xeyli üstünlüklərə malik idilər.

*"Tədris işlərinin təşkili"* adlı II bölmədə institutda tədris prosesinin təşkilində mühazirə, praktik və laborator məşğələlərin, tələbələrin müstəqil işinin və pedaqoji təcrübəsinin təşkili, məsləhət saatlarının keçirilməsi qaydası müəyyənləşdirilir.

Azərbaycan SSR Maarif Nazirliyinin təqdimatı ilə SSRİ Nazirlər Soveti yanında Ali məktəb işləri üzrə Ümumittifaq Komitəsi tərəfindən təsdiq olunan tədris planının məzmunu verilir. Tədris ili 2 semestrə bölünürdü:- payız (1 sentyabr- 24 yanvar) və yaz (7 fevral -30 iyun).

Tələbələrə ildə iki dəfə tətil verilirdi:1) 25 yanvar-6 fevral; 2) 1 iyul-31 avqust. Tələbələrin biliyi 5 balla qiymətləndirilirdi: 5 (əla), 4 (yaxşı),3 (orta), 2 (qeyri-müvəffəq).

*"Kafedralar"* adlı III bölmədə institutda tədris prosesinin təşkilində kafedraların rolundan və kafedra müdirinin funksiyalarından bəhs olunur.

*"Elmi-pedaqoji kadr və tədris köməkçi heyət"* adlı IV bölmədə institutda kafedra müdiri, professor, dosent, baş müəllim, müəllim yerlərini tutmaqla bağlı keçirilən müsabiqələr haqqında məlumat verilir. Kafedra müdirləri ilə bağlı seçkinin nəticələri SSRİ Nazirlər Soveti yanında Ali məktəb işləri üzrə Ümumittifaq Komitəsi tərəfindən V.İ.Lenin adına ADPİ-nin direktorunun Azərbaycan SSR Maarif Nazirliyi vasitəsi ilə verdiyi təqdimat əsasında təsdiq olunurdu.

Professor və dosentlərlə bağlı seçkinin nəticələri direktorun təqdimatı əsasında Azərbaycan SSR Maarif Nazirliyi tərəfindən təsdiq olunurdu. Assistentlər və laborantlar kafedra müdirinin təqdimatı əsasında direktor tərəfindən təsdiq olunurdu.

*"Struktur və rəhbərlik"* adlı V bölmədə Pedaqoji İnstitutun strukturu və rəhbərliyi haqqında məlumat verilirdi:

**1) Fakültələr**

1.1.Tarix
1.2.Fizika-riyaziyyat
1.3.Coğrafiya
1.4.Təbiyyat
1.5.Məktəbəqədər
1.6.Xarici dillər (alman, fransız, ingilis)
1.7.Dil və ədəbiyyat (Azərbaycan dili və ədəbiyyatı, rus dili və ədəbiyyatı, erməni dili və ədəbiyyatı).

**2) Kafedralar**

2.1.Siyasi iqtisad
2.2.Marksizm-leninizm
2.3.Ümumi tarix
2.4.SSRİ xalqları tarixi
2.5.Azərbaycan tarixi
2.6.Azərbaycan ədəbiyyatı
2.7.Rus dili
2.8.Rus ədəbiyyatı
2.9.Ümumi ədəbiyyat
2.10.Pedaqogika
2.11.Riyazi analiz
2.12.Həndəsə və cəbr
2.13.Eksperimental fizika
2.14.Nəzəri fizika
2.15.Üzvi kimya
2.16.Qeyri-üzvi kimya
2.17.Darvinizm və genetika
2.18.Botanika
2.19.Zoologiya
2.20.Minerologiya və geologiya
2.21.İnsan və heyvan fiziologiyası
2.22.Fiziki coğrafiya
2.23.İqtisadi coğrafiya
2.24.Erməni ədəbiyyatı
2.25.Hərbi fənlər
2.26.Fiziki tərbiyə

**3) Tədris-köməkçi bölmə**

3.1.laboratoriya
3.2.kabinet
3.3.kitabxana
3.4.tədris-təsərrüfat və s.

Fakültələr, şöbələr, kafedralar SSRİ Nazirlər Soveti yanında Ali məktəb işləri üzrə Ümumittifaq Komitəsi tərəfindən, tədris-köməkçi bölmə isə Azərbaycan SSR Maarif Nazirliyi tərəfindən yaradılır və ya ləğv edilirdi. İnstitut özü yalnız SSRİ Xalq Komissarları Soveti tərəfindən ləğv edilə bilərdi.

Nizamnamədə institutun direktorunun, tədris və elmi işlər üzrə direktor müavinininin, inzibati-təsərrüfat işləri üzrə köməkçinin, dekanların, institutun Elmi Şurasının (VI bölmə) və ictimai təşkilatların funksiyaları (VII bölmə) müəyyənləşdirilir, institutun daxili nizam-intizam qaydaları (VIII bölmə), əmlakı və vəsaitlərindən istifadə (IX bölmə), sonda isə Nizamnamənin təsdiqi qaydaları (X bölmə) şərh olunur.

Yeni Nizamnamə təsdiq edildikdən sonra V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu 1940/41-ci tədris ili üçün aşağıdakı fakültələr üzrə tələbə qəbulu həyata keçirtdi:1) Tarix; 2) Ədəbiyyat və dil; 3) Fizika-riyaziyyat; 4) Təbiyyat; 5) Coğrafiya; 6) Məktəbəqədər tərbiyə; 7) Xarici dillər. Bu, müharibədən əvvəl keçirilən axırıncı qəbul oldu.

***

30-cu illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutu tədris işlərinin yenidən təşkilini başa çatdırmaqla, yüksək ixtisaslı pedaqoji və elmi-pedaqoji kadr hazırlığı sahəsində respublikada əsas və aparıcı ali pedaqoji təhsil müəssisəsinə çevrildi. Pedaqogika, psixologiya və ayrı-ayrı fənlərin tədrisi metodikası bir elm sahəsi kimi məhz burada təşəkkül taparaq sürətlə inkişaf etdi. Pedaqoji-psixoloji araşdırmalar ümumtəhsil, orta ixtisas və ali məktəblərin ehtiyaclarına istiqamətləndirildi.

Ümumtəhsil məktəbləri üçün yeni müəllimlər nəsli formalaşdırıldı. 1939/40-cı tədris ilində Azərbaycan məktəblərində çalışan 21310 müəllimin 4386 nəfərinin ali təhsili vardı ki, bunun da böyük bir hissəsini ADPİ-ni bitirənlər təşkil edirdi. İnstitutun məzunları yalnız Azərbaycanda deyil, həm də Ermənistan, Gürcüstan və Mərkəzi Asiya respublikalarında pedaqoji fəaliyyətlə məşğul olurdular.

Kütləvi repressiya və həbslər dövrünün sərt reallıqları şəraitində fəaliyyət göstərən Pedaqoji İnstitut bütün çətinliklərə baxmayaraq, elmi-pedaqoji elitanı qoruyub saxladı, daha peşəkar müəllimləri tədris prosesinə cəlb etməklə Azərbaycanda pedaqoji kadr hazırlığına və ayrı-ayrı elm sahələrinin inkişafına mühüm töhfə verdi.



*Tələbələr kimya laboratoriyasında*



*Tələbələr fiziologiya kabinetində*



*Tələbələr kimya laboratoriyasında*



*Kimya laboratoriyasında*

# III Fəsil

# Azərbaycan Dövlət Pedaqoji İnstitutu 1941-1991-ci illərdə

## Pedaqoji İnstitutun müharibə dövrünün tələblərinə uyğun təşkili: birləşməni və ayrılmanı zəruri edən səbəblər

1941-ci il iyunun 22-də Hitler Almaniyasının qəflətən SSRİ-yə hücumu nəticəsində respublikamızda dinc quruculuq işləri müvəqqəti olaraq dayandırıldı. Azərbaycan xalqı da silaha sarılaraq faşist işğalçılarına qarşı mübarizəyə başladı. Cəbhəyə kömək etmək üçün bütün imkanlar səfərbərliyə alındı. Azərbaycanın ali məktəb tələbələri də partiyanın çağırışına səs verərək cəbhəyə səfərbər olundular.

Müharibə Azərbaycana sosial-iqtisadi çətinliklər və mənəvi məhrumiyyətlər gətirdi. Ölkənin iqtisadi potensialı, təsərrüfat və mədəni həyatı ağır vəziyyətə düşdü. Ali məktəblərin maddi-texniki bazası zəiflədi, təhsil prosesinin ahəngi pozuldu. Müharibə illərində respublikanın ali məktəblərinin öhdəsinə düşən mühüm vəzifələrdən biri sənaye, kənd təsərrüfatı, elm, təhsil və mədəniyyət sahələri üçün ixtisaslı kadrlar hazırlamaq idi. Ümumtəhsil, orta ixtisas, texniki-peşə məktəblərini müəllim kadrları ilə təmin etmək vacib məsələlərdən biri idi. Bu məqsədlə ali təhsil müəssisələri öz fəaliyyətlərini müharibənin tələblərinə uğyunlaşdırmalı oldu. İnstitutların iş rejimində, tədris və elmi fəaliyyətində cəbhənin ehtiyaclarına və hərbi dövrün tələblərinə uyğun yenidənqurma işləri aparıldı, bir sıra təşkilati-struktur dəyişiklikləri həyata keçirildi[130].

Ali məktəblərə dövlət büdcəsindən ayrılmalar azaldıldı. Digər ali təhsil müəssisələrində olduğu kimi, Pedaqoji İnstitutun da fəaliyyətində yaranan çətinliklər gün-gündən dərinləşdi. Müharibə başlanan günün səhəri Azərbaycan K(b)P MK Bakıdakı bir neçə binanın, o cümlədən Pedaqoji İnstitutun binasının hərbi hospitala verilməsi haqqında qərar qəbul etdi. Bina müharibənin tələblərinə uyğunlaşdırılaraq 1543 №-li *hərbi hospitala* çevrildi. Pedaqoji İnstitutun müvəqqəti olaraq Voroşilov (indiki Səbail) rayonunun Mədəniyyət Sarayında yerləşdirilməsi qərara alındı.

Pedaqoji İnstitutda tədris və elmi fəaliyyətin müharibənin tələblərinə uyğun qurulması istiqamətində xeyli işlər görüldü. V.İ.Lenin adına ADPİ-də görülən və planlaşdırılan işlər haqqında institutun direktoru Ələsgər Həşimovun 24 iyun 1941-ci ildə Azərbaycan K(b)P MK-nın katibi Məmmədova ünvanladığı məktubda ətraflı məlumat verilir. Məktubda qeyd olunur ki, Molotovun alman faşistlərinin ölkəmizə hücumu ilə bağlı radioda çıxışından dərhal sonra ADPİ-də aşağıdakı tədbirlər həyata keçirilmişdir:

-1000 nəfər tələbə, müəllim və texniki heyətin iştirakı ilə iki yerdə - həm tədris korpusunda, həm də yataqxanada mitinq keçirilmişdir. Mitinq zamanı çıxışçılardan birinin iştirakçıları tibb bacısı kursuna yazılmağa çağırması nəticəsində 61 nəfər həmin kursa yazılıb;

-tələbələr institutun Stalin (indiki Səbail) rayonundakı Mədəniyyət sarayına köçürülməsi üçün səfərbər edilib;

-iyun ayının 23-ü səhər tezdən 20 nəfər kommunist rayon hərbi qeydiyyat şöbələrində çağırış vərəqələrini paylamaq üçün rayon Partiya Komitəsinin sərəncamına göndərilib;

-16 nəfər təbliğat işləri ilə bağlı Kommunist Gənclər İttifaqının rayon şöbəsinə göndərilib.

Məktubda planlaşdırılan digər işlər haqqında da məlumat verilir. Qeyd edilir ki, 600 nəfər tələbənin kənd təsərrüfatı sahəsində işləmələri üçün kənd ra-

---

[130] *Həmin dövrdə respublikanın 16 ali təhsil müəssisəsində 14.612 tələbə təhsil alırdı.*

yon Partiya Komitələrinin, 200 nəfər IV kurs tələbəsinin isə iyul ayında dövlət imtahanından sonra Xalq Maarif Komissarlığının sərəncamına göndərilməsi planlaşdırılır. Tibb bacısı kursuna yazılan 61 nəfərdən başqa yerdə qalan tələbələr institutun köçürülməsi ilə məşğul olacaq. Köçürülmə başa çatdıqdan sonra həmin tələbələr və 150 nəfər professor-müəllim, laborant Sizin göstərişinizə uyğun hərəkət edəcək”[131].

İnstitutun tədris binası hospital üçün nəzərdə tutulduğundan institut müvəqqəti olaraq Voroşilov (indiki Səbail) rayonunun Mədəniyyət Sarayına köçürüldü. Saray 9 yanvar (indiki Xaqani küçəsi, 45) küçəsi ilə Kirov (Bülbül prospekti, 22) prospektinin kəsişməsində yerləşirdi.

Azərbaycan Xalq Komissarları Sovetinin 5 sentyabr 1941-ci il tarixli əmri ilə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutu Azərbaycan Dövlət Pedaqoji İnstitutunun qiyabi şöbəsinə çevrildi. Azərbaycan Xarici Dillər İnstitutu müvəqqəti olaraq APİ-nin Xarici dillər fakültəsinə çevrildi. Beləliklə, APİ-nin tərkibində ingilis, fransız, alman dilləri şöbələri fəaliyyətə başladı.

1941-ci ilin sentyabrın 1-nə olan məlumata görə Azərbaycanda pedaqoji kadr hazırlığının dinamikası aşağıdakı kimi idi.

| Pedaqoji kadr hazırlayan ali məktəblər | Tələbələrin sayı | Məzunlar |
|---|---|---|
| Azərbaycan Dövlət Universiteti | 1842 | 225 |
| Azərbaycan Pedaqoji İnstitutu | 1476 | 397 |
| Xarici Dillər İnstitutu | 256 | - |
| **Cəmi:** | **3574** | **622** |

Maliyyə və kadr potensialı ilə bağlı yaranmış çətinliklər Pedaqoji İnstitutun müstəqil fəaliyyət göstərməsinə imkan vermədi. Azərbaycan Xalq Komissarları Sovetinin və Azərbaycan K(b)P MK-nın 19 sentyabr 1941-ci il tarixli *“V.İ.Lenin adına APİ-nin S.M.Kirov adına ADU ilə birləşdirilməsi haqqında”* qərarı ilə Pedaqoji İnstitut müvəqqəti olaraq Azərbaycan Dövlət Universitetinə birləşdirildi. Qiyabi Pedaqoji İnstitut, Xarici Dillər İnstitutu Pedaqoji İnstituta birləşdirildikdən sonra böyük kontingenti olan (3 minə qədər) APİ-nin yenidən ADU-ya birləşdirilməsi 30-cu illərin ayrılma və birləşdirmə kimi zərərli təcrübəsinin yeni şəraitdə təkrarı idi. Pedaqoji İnstitut bir ildən artıq Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsinin tərkibində fəaliyyət göstərdi.

Müharibə ilə əlaqədar olaraq Ali Məktəb üzrə Ümumittifaq Komitəsi 1941/42-ci tədris ilindən ali və orta ixtisas tədris müəssisələri üçün qısaldılmış tədris planları təsdiq etdi, tədris planlarında xeyli ixtisarlar aparıldı. Ali pedaqoji məktəblərdə təhsil müddəti 4 ildən 3 ilə endirildi. İmtahan sessiyası, yay tətili qısaldıldı, qış tətili isə ləğv edildi. Dövlət imtahanlarında nəzərdə tutulmuş fənlərin sayı 5-dən 3-ə endirildi. Qiyabiçi tələbələrə imtahanları tədris ilində semestrlər üzrə deyil, il boyu, uyğun hesab etdikləri vaxtda verməyə icazə verildi. Pedaqoji və müəllimlər institutlarının qiyabi şöbələri üçün də yeni tədris planları təsdiq edildi. Həftə ərzində tələbələrin tədris yükü 36 saatdan 42 saata qədər artırıldı. Müharibə dövründə gənc müəllimlərə kömək məqsədilə tədris-metodik ədəbiyyat və biblioqrafik sorğu-göstərişlər nəşr edildi.

Akademik heyət və tələbələr arasında əmək intizamını möhkəmləndirmək üçün tədbirlər görüldü. Onların qarşısında daha ciddi tələblər qoyuldu. Tədrisin keyfiyyəti, tələbələrin müstəqil işi üzərində nəzarət gücləndirildi. Əksər fənn proqramları yeni tədris planının tələblərinə uyğun olaraq dəyişdirildi. Dərs materialları ixtisar olundu, proq-

---

[131] *Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. F.1., siy.26, sax.vah.713, v.75-76*

ramlara həmin dövr üçün daha aktual olan mövzular daxil edildi. Tələbələrin vətənpərvərlik tərbiyəsinə və hərbi hazırlığına diqqət artırıldı. Özünümüdafiə qrupları, ehtiyat üçün tibb bacısı məktəbləri yaradılırdı. Pedaqoji İnstitutun hərbi komissarlıq, hərbi hissə, hospital, müdafiə orqanları, kolxoz və sovxozlarla himayəçilik əlaqələri genişləndi. Pedaqoji İnstitutda elmi-tədqiqat işlərinin istiqamətləri dəyişdirildi, fizika, kimya, biologiya, riyaziyyatla bağlı aparılan tədqiqatlar hərbi işlə, tarix, ədəbiyyat, pedaqoji-psixoloji araşdırmalar məktəblilərin və tələbələrin hərbi vətənpərvərlik və ideya-siyasi tərbiyəsi ilə əlaqələndirildi. Pedaqoji İnstitut əhali arasında elmi-pedaqoji, siyasi və hərbi-vətənpərvərlik üzrə biliklərin təbliğat mərkəzinə çevrildi. Ölkə hərbi düşərgəyə çevrilsə də, pedaqoji təhsilin təşkili dövlətin diqqət mərkəzində idi. Müəllim kadrları ilə bağlı çatışmazlığı aradan qaldırmaq məqsədilə 6-10 aylıq pedaqoji kursların təşkilinə icazə verildi. Hətta hökumətin göstərişi ilə yerli xalq təhsili şöbələri orta məktəbin onuncu sinif şagirdlərindən müəllim hazırlamaq məqsədilə fakültativ hazırlıq kursları da təşkil edə bilərdi. Bu vəziyyət uzun müddət davam etmədi. Sovet Ordusunun cəbhədəki uğurlu hərbi əməliyyatlarından sonra müəllim kadrları hazırlığına verilən tələblər artırıldı.

1943-cü ilin oktyabr ayının 1-də Azərbaycan Pedaqoji İnstitutu ADU-dan ayrılaraq öz fəaliyyətini yenidən bərpa etdi. ***Ağamməd Səməd oğlu Abdullayev*** instituta direktor təyin edildi.

***Ağamməd Səməd oğlu Abdullayev***
*pedaqoji elmlər doktoru, professor*
*(1909-1979)*



*15 mart 1909-cu ildə Bakı şəhərində dəmirçi ailəsində anadan olmuşdur. Bakı şəhərindəki 44 №-li orta məktəbi (1921), Bakı Pedaqoji Texnikumunu (1926), Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Dil və ədəbiyyat fakültəsini (1930) bitirmişdir. 1926-1929-cu illərdə Bakı şəhərindəki 29№-li məktəbdə, 1929-1932-ci illərdə Bakı Pedaqoji Texnikumunda Azərbaycan dili və ədəbiyyatı müəllimi, 1932-1939-cu illərdə Azərbaycan KP MK-nın nəzdindəki Azərbaycan Kommunist Universitetində baş müəllim və kafedra müdiri işləmişdir. 1935-1936-cı illərdə Bakı Partiya Komitəsinin birillik kursunda oxumuş, Bakı şəhər Xalq Maarif şöbəsində metodist (1935-1939), Azərbaycan Dövlət Pedaqoji İnstitutunda baş müəllim, Dil və ədəbiyyat fakültəsinin dekanı (1939-1941), Azərbaycan Dövlət Universitetində baş müəllim (1941-1942), M.F.Axundov adına Azərbaycan Müəllimlər İnstitutunun direktoru (1942-1943) işləmişdir. Ağamməd Abdullayevin həyatının mühüm bir hissəsi Azərbaycan Dövlət Pedaqoji İnstitutu ilə bağlıdır. O, burada direktor (1943-1944), kafedra müdiri (1944-1945; 1949-1953; 1970-1979), elmi işlər üzrə prorektor (1966-1969) vəzifələrində çalışıb.*

*1944-1949-cu illərdə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunda əvəzçiliklə müəllim, 1946-1949-cu illərdə isə Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunda baş elmi işçi və elmi katib, 1966-1970-ci illərdə M.F.Axundov adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru vəzifəsində çalışıb. 1942-ci ildə "Orta məktəbdə Azərbaycan dili tədrisi metodikası" mövzusunda namizədlik, 1958-ci ildə "Azərbaycan dilinin tədrisi tarixi" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. Respublikamızda fənlərin tədrisi metodikası üzrə ilk elmlər doktorudur. 1958/59-cu*

*tədris ilində ADPİ-də Azərbaycan dili və onun tədrisi metodikası kafedrasını yaratmış, ömrünün sonuna kimi həmin kafedraya rəhbərlik etmişdir. 27 nəfərin namizədlik dissertasiyasının elmi rəhbəri, 10 nəfərin namizədlik və doktorluq dissertasiyasının rəsmi opponenti olmuşdur.1960-1975-ci illərdə "Azərbaycan dili və ədəbiyyat tədrisi" məcmuəsinin redaktoru olmuşdur.*

*Bədii yaradıcılığa "Dəfinələr adası" əsəri ilə başlayıb. Azərbaycan dilinin tədrisi metodikası ilə bağlı 150-dən artıq dərslik, dərs vəsaiti, kitab, kitabça və elmi məqalə nəşr etdirmişdir. "Ədəbiyyat müntəxəbatı" (1936), "Azərbaycan dili" (1938), "Oxu kitabı" (1938), "Qiraət kitabı" (1944), "Ana dili" (1950), "Əlifba" (1963) kitabları ölkəmizdə dərslik yaradıcılığının inkişafında mühüm rol oynamışdır. "Rus məktəblərində Azərbaycan dili tədrisinin metodikası" (1960;1971), "Üslubiyyat məşğələlərinin metodikası" (1961), "İbtidai məktəbdə Azərbaycan dilinin tədrisi metodikası" (1962), "Orta məktəbdə Azərbaycan dili tədrisi metodikası" (1964), "Azərbaycan dilinin tədrisi tarixindən" (1966), "İbtidai siniflərdə ana dili tədrisinin metodikası" (1968), "Nitq mədəniyyəti və natiqlik məharəti haqqında" (1968), "Orta məktəbdə Azərbaycan dilinin tədrisi metodikası" (1968;1978) adlı dərslik və dərs vəsaitlərinin müəllifidir.*

*Azərbaycan KP Bakı Komitəsi rayon plenumunun üzvü, rayon məhkəməsində xalq iclasçısı, ADPİ-nin partiya komitəsinin katibi olub. 1948, 1967 və 1969 -cu illərdə Bakı şəhər Zəhmətkeş Deputatlar Sovetinə seçilib, "Qafqazın müdafiəsi uğrunda" (1946), "1941- 1945-ci illərdə Böyük Vətən müharibəsində şərəfli əməyə görə" (1945) medalları, Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı və "SSRİ maarif əlaçısı" (1977) döş nişanı ilə təltif edilib.*

*1979 -cu ildə Bakı şəhərində vəfat etmişdir.*

*1999-cu ildə onun haqqında "Ağamməd Abdullayev-90" kitabı nəşr olunub, 2010-cu ildə 100 illik yubileyi ADPU-da təntənəli şəkildə qeyd olunub.*

Xarici dillər fakültəsi də öz fəaliyyətini yenidən Pedaqoji İnstitutda davam etdirdi. *Əli Xudaverdiyev*[132] Xarici dillər fakültəsinə dekan təyin edildi. İngilis dili kafedrasına R.Ə.Qayıbova, Alman dili kafedrasına N.H.Ağazadə, Fransız dili kafedrasına M.V.Qeylikman müdir təyin edildilər. Həmin dövrdə fakültədə 113 tələbə təhsil alırdı ki, onlardan da 24-ü azərbaycanlı idi. 1943/44-cü tədris ilində fakültəyə 137 nəfər tələbə qəbul olundu ki, onlardan da 33-ü azərbaycanlı idi. Tələbələr tədris uğurları ilə digər fakültələrin tələbələrindən seçilirdi. Həmin dövrdə 200 nəfərdən artıq tələbəsi olan fakültənin tələbələrindən 4 nəfərinin Stalin təqaüdçüsü olması çox yüksək göstərici idi. Tələbələrin təhsil-tərbiyəsi ilə 3 dosent, 11 baş müəllim, 16 müəllim məşğul olurdu. 1947/48-ci tədris ilində həm tələbələrin, həm də müəllimlərin sayı artdı. Belə ki, həmin illərdə fakültədə 256 nəfər tələbə təhsil alırdı ki, onların da təhsil-tərbiyəsi ilə 1 professor, 4 dosent, 16 baş müəllim və 20 müəllim məşğul olurdu.

Ön cəbhədə qazanılan qələbə ali pedaqoji təhsili genişləndirməyə imkan yaratdı. İşləyən müəllimlərin ümumtəhsil səviyyəsini artırmaq üçün SSRİ Xalq Komissarları Soveti 18 dekabr 1943-cü ildə "Qiyabi pedaqoji təhsilin möhkəmləndirilməsi tədbirləri haqqında" qərar qəbul etdi. Həmin qərara uyğun olaraq ADU-nun qiyabi şöbəsində ali pedaqoji təhsil alanların sayı artırıldı.

Pedaqoji İnstitutda ilk vaxtlar tələbə kontingentini stabilləşdirmək mümkün olmadı. İnsanlara aclıq, səfalət və ölüm gətirən müharibə hələ də davam edirdi. Müəllimlərin və tələbələrin müharibəyə səfərbərliyi davam edirdi. Pedaqoji İnstitutun

[132] *Ə.Xudaverdiyev "Alman-Azərbaycan lüğət" (1937), "Azərbaycan-alman dillərində lüğət" (1938), "Azərbaycan və alman dillərində sadə nəqli cümlənin söz sırası" (1939), "Alman və Azərbaycan dillərində sual və inkar cümlələrinin söz sırası" (1940) kitablarının müəllifi olub.1948-ci ildə Pedaqoji İnstitutun Xarici dillər fakültəsi və kafedrası əsasında Xarici Dillər İnstitutu yenidən yaradılanda o, Pedaqoji İnstitutda qalmış, Xarici dillər kafedrasının müdiri kimi ixtisası xarici dil olmayan fakültələrdə tədrisin yüksək səviyyədə qurulmasında mühüm rol oynamışdır.*

tələbələrinin sayı gündən-günə azalırdı. Əgər 1943-1944-cü tədris ilində institutda 936 tələbə oxuyurdusa, tədris ilinin sonunda onların sayı 610 nəfərədək azaldı[133]. 1944/45-ci tədris ilinin əvvəlində institutda 756 tələbə oxuduğu halda, tədris ilinin axırında onların sayı 550 nəfərədək azaldı. 1943/44-cü tədris ilində institutda təhsil alan tələbələrin 50,5 %-i, 1944/45-ci tədris ilində isə 44%-i azərbaycanlı idi. Ali pedaqoji təhsilə cəlb edilən qadınların 33 %-ni azərbaycanlı qızlar təşkil edirdi. Müharibənin törətdiyi dağıntı və çətinliklər institut həyatının bütün sahələrində özünü əks etdirdi. Tələbələrin sayının azalması bir tərəfdən gənclərin cəbhəyə səfərbər edilməsi, digər tərəfdən isə müharibə şəraitində əhalinin yaşayış şəraitinin çətinləşməsi ilə bağlı idi. İşləmək qabiliyyəti olan gənclərin qazancına ailələrdə böyük ehtiyac yaranmışdı. Təhsilini yarımçıq qoyan tələbələrin çoxu öz doğma şəhər və kəndlərinə gedərək, ata və analarını, kiçik bacı və qardaşlarını dolandırmaq üçün əmək cəbhəsində çalışırdılar. Müharibə şəraitinin doğurduğu maddi çətinlikləri çoxuşaqlı və böyük ailələr daha ağır keçirirdi. Məhz bu səbəbdən institutu buraxıb gedən tələbələrin böyük əksəriyyətini respublikanın müxtəlif rayonlarından gələn və böyük ailələrdən olan azərbaycanlı gənclər təşkil edirdi. 1944-cü ilin oktyabrında Pedaqoji İnstituta qəbul edilən 340 nəfər tələbədən cəmi 160 nəfəri, 1944/45-ci tədris ilinin axırında institutda təhsil alan 550 tələbədən yalnız 150 nəfəri azərbaycanlı idi.

Pedaqoji İnstituta 1945-ci ilin yanvar-iyun aylarında ***Məmməd Həmid oğlu Ələkbərov*** rəhbərlik etdi.

***Məmməd Həmid oğlu Ələkbərov***
*(1899- 1959)*



*1899-cu ildə İranın Lisar kəndində anadan olub. 1905-ci ildə, 6 yaşı olanda ailəsi ilə birlikdə Lənkəran şəhərinə köçüb. Bibisinin himayəsində yaşayıb, əvvəlcə kənd məktəbində (molla yanında), sonra Lənkərandakı "Behcət" rus-tatar (Azərbaycan) məktəbində təhsil alıb. 1920-ci ildə pedaqoji kurs bitirərək Astraxanbazardakı (indiki Cəlilabad) I dərəcəli məktəbə müəllim göndərilib. 1921- 1923-cü illərdə Lənkəran şəhər 5 nömrəli məktəbdə işləyib. 1923- 1926-cı illərdə Ali Pedaqoji İnstitutda oxuyub. 1926-1928-ci illərdə Quba qəza xalq maarifi şöbəsinin müdiri olub. 1928-ci ildən Azərbaycan Xalq Maarif Komissarlığında metodist, məsul icraçı, ibtidai və orta məktəb idarəsi rəisinin müavini vəzifələrində çalışmaqla yanaşı, Azərbaycan Dövlət Elmi Tədqiqat Məktəblər İnstitutunda, Azərbaycan Dövlət Pedaqoji İnstitutunda əvəzçiliklə dərs deyib. 1939-1942-ci illərdə Müəllimləri Təkmilləşdirmə İnstitutunun direktor müavini olub. Xalq Maarif Komissarlığında kadrlar idarəsinin rəisi, Azərbaycan Xalq maarif komissarının müavini və Xalq maarif komissarı (1946-1952) olub. 1955-1956 -cı illərdə Nazirlər Soveti sədrinin müavini, Azərbaycanın ilk Mədəniyyət naziri olub.*

*"Natamam orta və orta məktəblərdə yazı işləri" (1940), "Nizami Gəncəvi haqqında. İbtidai məktəblərin III və IV sinifləri üçün oxu kitabı" (1940), "Orta məktəbdə ədəbi oxu haqqında" (1940), "İbtidai məktəbdə oxu metodikası" (1940), "İbtidai məktəbdə nağıl yazdırmaq üçün materiallar" (1940) kitabları nəşr edilib. Elmi redaktorluğu ilə 30-dan çox dərslik və tədris vəsaiti işıq üzü görüb. Azərbaycan dili və ədəbiyyatın tədrisi metodikası ilə bağlı xeyli məqalələr yazıb.*

[133] *Амрахов М.И. Народное образование в Азербайджане в годы войны (1941-1945 гг.). Баку: АГПУ, 2004, с.116*

*5 iyun 1947-ci ildə "Nizami Gəncəvi və Azərbaycan folkloru" mövzusunda filologiya elmləri namizədi elmi dərəcəsi almaq üçün dissertasiya müdafiə edib. 21 avqust 1942-ci ildə Əməkdar məktəb müəllimi fəxri adına layiq görülüb.*

*Azərbaycan K(b)P MK-nın üzvü, Bakı şəhər sovetinin IV çağırış deputatı, Sov.İKP MK-nın XIX qurultayının nümayəndəsi olub. SSRİ-nin müxtəlif orden və medalları ilə təltif olunub.*

*1959-cu ildə Bakı şəhərində vəfat edib.*

Pedaqoji İnstitutun əvvəlki tədris binasında (indiki Səbail korpusu) 1543 №-li hərbi hospital yerləşdiyindən təhsil müəssisəsi bir müddət indiki "Səadət Sarayı"nda (Murtuza Muxtarovun evində) yerləşdirildi.

Respublikada müəllim kadrları hazırlığında ciddi dönüş yarandı. 1943-cü ilin 1 oktyabrında Kirovabad (Gəncə) ikiillik Müəllimlər İnstitutunun bazasında Kirovabad (Gəncə) Dövlət Pedaqoji İnstitutu yaradıldı. Kirovabad (Gəncə) Pedaqoji İnstitutunda tədrisin və elmi fəaliyyətin təşkili məqsədilə Azərbaycan Pedaqoji İnstitutunun bir qrup əməkdaşı - Muxtar Hüseynzadə, Hüseyn Əfəndiyev, Saleh Xəlilov, İsgəndər Kərəvəliyev, Əli Sultanlı, Məmməd Əfəndiyev, Məmmədağa Şirəliyev və Sadiq Hüseynov Gəncəyə ezam olundu. Yeni yaranan ali təhsil ocağına Pedaqoji İnstitutun ilk məzunlarından olan *Hacıbala Hacıyev* direktor təyin olundu.

Həmin dövrdə Naxçıvan, Quba, Ağdam, Şuşa, Nuxa (Şəki), Qazax şəhərlərində fəaliyyət göstərən ikiillik müəllimlər institutlarının[134] da direktorları və pedaqoji kollektivin əksər hissəsi Pedaqoji İnstitutun məzunları idi.

1944-cü ildə institutun yerləşdiyi bina - "Səadət Sarayı" yeni yaranmış Azərbaycan SSR Xalq Xarici İşlər Komissarlığına verildiyindən institut Voroşilov (indiki Səbail) rayonunun Mədəniyyət Sarayına köçürüldü. Həmin dövrdə instituta ilk azərbaycanlı pedaqoq-alim ***Əhməd Yusif oğlu Seyidov*** rəhbərlik edirdi.



***Əhməd Yusif oğlu Seyidov***
*pedaqoji elmlər doktoru, professor*
*(1882-1977)*

*1892-ci ildə mart ayının 31-də Gəncə quberniyasının Qazax qəzasının Aslanbəyli kəndində anadan olub. Yazıb-oxumağı Hacı Mahmud Əfəndinin kənddə açdığı hücrədə öyrənib. Əhməd Ağa Mustafayevin məktəbində oxuyub. Müəlliminin təşəbbüsü ilə 1911-1917-ci illərdə Qori Müəllimlər Seminariyasında təhsil alıb. Pedaqoji fəaliyyətə Aslanbəylidə öz evində məktəb açmaqla başlayıb. 1920-ci ildə Qazax kənd məktəblərinin inspektoru təyin olunub. 1921-1925-ci illərdə Aslanbəyli, Qaymaqlı, Musaköy və Kəmərlidə müəllim və məktəb direktoru işləyib. 1925-ci ilin sentyabrında Azərbaycan Respublikası Xalq Maarif Komissarlığı kollegiyasının qərarı ilə Lənkəran Qəza Xalq Maarif şöbəsinə müdir təyin olunub. 1926-1930-cu illərdə*

*[134] 1943/44-cü tədris ilində Quba, Ağdam və Qazax və digər şəhərlərində müəllimlər institutu açıldı. Nuxa Müəllimlər İnstitutunda 197 nəfər, Quba Müəllimlər İnstitutunda 175 nəfər, Qazax Müəllimlər İnstitutunda 226 nəfər, Naxçıvan Müəllimlər İnstitutunda 150 nəfər, Şuşa Müəllimlər İnstitutunda 345 nəfər, Ağdam Müəllimlər İnstitutunda 97 nəfər, ümumilikdə 6 müəllimlər institutunda 1091 nəfər təhsil alırdı. 50-ci illərin əvvəllərində həmin institutları müstəqil ali məktəblərə və ya ADPİ-nin filiallarına çevirmək əvəzinə, yanlış olaraq bağladılar.*

*dəmir yolu məktəbləri üzrə inspektor vəzifəsində işləyib. Həmin dövrdə o Azərbaycan Dövlət Universitetində qiyabi ali təhsil alıb.*

*1930-cu ildə Azərbaycan Dövlət Universitetini bitirib. Pedaqoji fəaliyyətə Azərbaycan Pedaqoji İnstitutunda başlayıb. 1931-ci ildə Azərbaycan Elmi-Tədqiqat İnstitutunun aspiranturasına qəbul olunub, 1932-ci ildə Pedaqoji İnstitutun aspiranturasına köçürülüb. 1931-1932-ci illərdə Pedaqogika kafedrasında assistent kimi fəaliyyət göstərib. 1932-ci ildə dosent vəzifəsinə seçilib. 1934-1936-cı illərdə ADPİ-də Pedologiya-pedaqoji fakültənin dekanı vəzifəsində çalışıb. 1940-cı ildə V.İ.Lenin adına APİ-nin Pedaqogika və psixologiya kafedrasının müdiri seçilmiş, 30 ildən artıq bir müddətdə o kafedraya rəhbərlik etmişdir. 1939-1943-cü illərdə əvəzçiliklə həm də S.M.Kirov adına Azərbaycan Dövlət Universitetində pedaqogika tarixi və nəzəriyyəsindən mühazirələr oxumuşdur.*

*1939-cu ildə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetində "Abbasqulu Ağa Bakıxanovun pedaqoji görüşləri" mövzusunda namizədlik, 1947-ci ilin 11 dekabrında RSFSR PEA-nın Pedaqogikanın Nəzəriyyəsi və Tarixi Elmi-Tədqiqat İnstitutunun Elmi Şurasında "XIX əsrdə Azərbaycanda pedaqoji fikrin əsas nümayəndələri" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. 1947-ci ilin iyul ayında Ali Attestasiya Komissiyası Əhməd Seyidovun yazdığı doktorluq dissertasiyasını təsdiq etmiş və ona professor elmi adı vermişdir.*

*17 yanvar 1944-cü ildə Azərbaycan SSR Maarif Komissarlığının əmri ilə V.İ.Lenin adına ADPİ-nin elmi işlər üzrə direktor müavini (prorektor), həmin ilin iyun ayında isə direktoru (rektoru) vəzifəsinə təyin edilib. 1950-ci ilə qədər V.İ.Lenin adına APİ-nin direktoru (rektoru) vəzifəsində çalışıb. 1950-1973-cü illərdə V.İ.Lenin adına ADPİ-nin Pedaqogika kafedrasına rəhbərlik edib. Kafedranın inkişafı, pedaqoji və elmi-pedaqoji kadr hazırlığı mərkəzinə çevrilməsi onun adı ilə bağlıdır. 1973-cü ilin 1 sentyabrında öz ərizəsi ilə kafedra müdiri və professor vəzifəsindən azad edilərək professor-məsləhətçi vəzifəsinə keçirilib.*

*Azərbaycanda məktəb və pedaqoji fikir tarixinin tədqiqi sahəsində elmi məktəb yaradan prof.Ə.Seyidov həm də təlim və tərbiyə nəzəriyyəsinin mühüm problemləri ilə bağlı araşdırmalar aparmış, 200-ə yaxın kitab, kitabça, monoqrafiya və elmi məqalə nəşr etdirmişdir. "Türk əlifbası" (H.Sanılı ilə birlikdə) (1927), "Kitab üzərində necə işləməli" (1946), "Pedaqogika tarixi" (1959-1960; 1968), "Azərbaycanda pedaqoji fikrin inkişaf tarixindən" (1958), "Azərbaycanda pedaqoji fikrin inkişaf tarixindən" (1987), "Pedaqogika və psixologiya terminləri lüğəti"nin (1956,1958), Moskvada nəşr olunan 4 cildlik "Pedaqoji ensiklopediya"nın, 2 cildlik "Pedaqoji lüğət"in, "SSRİ xalqlarının məktəb və pedaqoji fikir tarixi oçerkləri" adlı çoxcildlik əsərlərin əsas müəlliflərindən biri olmuş, "Sovetskaya pedaqogika" jurnalında müntəzəm çıxış etmiş, xalqımızın pedaqoji fikir korifeylərinin pedaqoji irsinin təbliğində böyük əmək sərf etmişdir.*

*Elmi rəhbərliyi və rəsmi opponentliyi ilə 70-ə qədər pedaqoji elmlər namizədi yetişmişdir. O, həm də Şimali Qafqaz, Orta Asiya respublikaları üçün elmi - pedaqoji kadr hazırlığında yaxından iştirak etmişdir.*

*"Qafqazı müdafiəyə görə" (1944), "1941-1945-ci illərdə əmək igidliyinə görə" (1945) medalı, Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri fərmanları (1960, 1964, 1972), "Qırmızı Əmək Bayrağı ordeni" (1960), "Əmək igidliyinə görə"(1970) medalı, "Əmək veteranı" medalı (1976), "SSRİ maarif əlaçısı" (1977) döş nişanı ilə təltif olunmuşdur. 1969-cu ildə Əməkdar elm xadimi fəxri adına layiq görülmüşdür. Onun adı məktəb və pedaqoji fikir tarixinə ilk azərbaycanlı pedaqoq-alim, Zaqafqaziyada pedaqoji fikir tarixinin tədqiqi sahəsinin pioneri kimi daxil olmuşdur.*

*1 oktyabr 1977-ci ildə vəfat etmiş, öz vəsiyyətinə görə doğma kənd qəbiristanlığında dəfn edilmişdir.*

İnstitut hələ "Səadət Sarayı"nda yerləşəndə institutun direktoru Əhməd Seyidova məlumat verilir ki, institutda 3 nəfər hərbi paltarda naməlum şəxs gəzir, məqsədləri binanın 3 otağını almaqdır. O, həmin adamları yanına çağırır, məzəmmət edərək deyir ki, tələbələri yerləşdirməyə, dərs keçməyə yerimiz yoxdur, siz də otaq istəyirsiniz. Heç bir otaq verə bilmərik. Gələnlər Əhməd Seyidovun dediklərini Azərbaycan K(b)P MK-nın katibi M.C.Bağırova çatdırırlar. M.C.Bağırov Maarif naziri Mirzə İbrahimova zəng edib deyir ki, Seyidov sabah saat 12-də sənin yanında olsun. Onunla danışmaq istəyirəm. Mirzə İbrahimov pərişan halda axşam Əhməd müəllimə zəng edir: "Ay Əhməd, bu nədir? Dövlət adamlarını pis qarşılamısan. Bağırov sabah səni saat 12-də telefona çağırır. Səhər mənim yanımda ol". Həm Əhməd müəllim, həm ailə üzvləri, həm də Mirzə İbrahimov böyük təlaş keçirir. O dövrdə hamı Bağırovun qəzəbinə düçar olmağın nə ilə qurtaracağını yaxşı bilirdi. Səhərisi gün Əhməd müəllim Mirzə İbrahimovun kabinetində oturub həyəcanla zəng gözləyir. Saat 12-də dövlət telefonu çalınır. Dəstəyi Mirzə İbrahimov götürür. Bu, Bağırov idi. Seyidov ordadırmı? Mirzə İbrahimov sakitcə dəstəyi Əhməd müəllimə verir. Bağırov telefonda "Yoldaş Seyidov, bizim adamları qovmusunuz". Əhməd müəllim qayıdır ki, yox, yox, yoldaş Bağırov, qovmamışam. İstəyir ki, izahat versin. Bağırov onun sözünü kəsərək deyir: "Yaxşı etmisən, əsl sahib öz evinin



*Azərbaycan Pedaqoji İnstitutu 1943-1944-cü illərdə bu binada yerləşmişdir*



*prof.Əhməd Seyidov iclas aparарkən*

qədrini bilməlidir. Zaqafqaziya Dəmir Yolu Həmkarlar İttifaqı bizim respublikada fəaliyyət göstərəcək. Bu respublikamız üçün şərəfdir. Xahiş edirəm, onlara 3 otaq ayır. Söz verirəm ki, müharibə qurtarandan sonra APİ-nin binasını sizə verəcəyəm. Dua et ki, müharibə tez qurtarsın".

Bağırov bununla Seyidovun seyidliyinə işarə edirdi. Əhməd Seyidovun oğlu prof.Fikrət Seyidov danışırdı ki, bir neçə təşkilat, xüsusilə də Tibb İnstitutu binanı almaq istəyirdi. Burada hərbi hospital fəaliyyət göstərirdi. Tibb İnstitutunun ölüxanası da binanın həyətində yerləşirdi. Tibb İnstitutu binanın boşaldılmasını gözləyirdi. Bakıda o zaman ali məktəblər üçün yararlı bina çox az idi. Müharibədən az sonra hərbi hospitalı binadan köçürtdülər. Bununla da binada gözü olanlar hərəkətə gəldilər. O zaman Azərbaycanda yüksək vəzifəlilərin və tanınmış insanların uşaqları Tibb İnstitutunda oxuyurdular. Onların hamısı Pedaqoji İnstitutun binasının Tibb İnstitutuna verilməsinin tərəfdarı idilər. Əsas dəlil də bu idi ki, Pedaqoji İnstitutun həyətində Tibb İnstitutunun ölüxanası var, indiki vəziyyətlə onu heç yerə köçürmək olmaz. İnstitutun direktoru Əhməd Seyidov öz həyatını təhlükəyə ataraq Pedaqoji İnstitutun binası uğrunda mübarizə aparırdı, binanı heç kəsə güzəştə getmək fikrində deyildi. Baxmayaraq ki, oğlu İsmayıl Tibb İnstitutunun tələbəsi idi. Bina ilə bağlı Əhməd Seyidovu Azərbaycan KP MK-nın büro iclasına çağırırlar. Büro iclasını aparan MK-nın II katibi Teymur Yaqubov böyük bir hospitalın Bakıdan köçürüldüyünü bildirir. Boşaldılmış bina ilə bağlı büro üzvlərinin fikirlərini soruşur. Əvvəlcədən öyrədilmiş adamlar



*prof.F.İbrahimbəyli, dos. M.Mehdizadə, prof.Ə.Zəkuzadə, F.Əliyev və aspirant A.Abdullayev*

binanın Tibb İnstitutuna verilməsini təklif edirlər. Elə bu vaxt Bağırovun katibəsi Novikova qapıdan Ə.Seyidova bir kağız verir. Orada yazılmışdı: "Yoldaş Seyidov, Bağırov Moskvaya gedəndə mənə dedi: sizə çatdırım ki, sizin razılığınız olmadan binanı heç kəsə verə bilməzlər". Ə.Seyidov dillənmir. Onu heyrətləndirən M.C.Bağırovun dəyanəti idi. Ə.Seyidovun dillənmədiyini görən T.Yaqubov "Siz nə deyirsiniz?"- deyə, ondan soruşur. O da cavabında qayıdır ki, "Siz katibsiniz, verirsiniz verin, ancaq mən razı deyiləm". Bu həlledici kəlməni eşidən Teymur Yaqubov hirslənərək: "Siz bilirsinizmi hardasınız?" Ə.Seyidov deyir: "Bəli, bilirəm, hirslənmək nə üçün? Siz vəzifə sahibisiniz. Verirsiniz, verin. Ancaq bu bina Pedaqoji İnstitutun olduğu üçün binanın ona da verilməsinə razıyam". Ə.Seyidovun "razı deyiləm" sözü T.Yaqubovu özündən çıxartmışdı. Bütün bunlara baxmayaraq o, Bağırovun qorxusundan binanı Tibb İnstitutuna verə bilmədi və beləliklə də bina Pedaqoji İnstituta qaldı.

Pedaqoji İnstitut bərpa edilərkən burada 5 fakültə və 25 kafedra təşkil olunmuşdu:

**I. Tarix fakültəsi** (dekan *Səlimə Əfəndiyeva*, az sonra baş müəllim *Cəfər İbrahimov*).

1) Ümumi tarix kafedrası (müdir dos.Ə.Sumbatzadə);

2) Azərbaycan tarixi kafedrası (müdir dos.İ.Hüseynov).

**II.Dil-ədəbiyyat fakültəsi** (dekan prof.*M.Rəfili*, az sonra baş müəllim *C.F.Bağırov*).

1) Azərbaycan dili kafedrası (dos. İ.R.Əfəndiyev, az sonra baş müəllim S.A.Cəfərov),

2) Azərbaycan dilçiliyi kafedrası (müdir prof. Ə.Dəmirçizadə),

3) Azərbaycan ədəbiyyatı kafedrası (müdir prof.M.Rəfili),

4) Rus dili kafedrası (müdir B/m.Jukov),

5) Rus ədəbiyyatı kafedrası (müdir dos. A.Lokinov),

6) Ümumi ədəbiyyat kafedrası (müdir dos. Ə.Sultanlı),

7) Erməni dili və ədəbiyyatı kafedrası (müdir dos.Q.Antonyan).

**III.Xarici dillər fakültəsi** (dekan dos.*Ə.Xudaverdiyev*)

1) İngilis dili kafedrası (müdir b/m. R.A.Qayıbova),

2) Alman dili kafedrası (müdir b/m.N.Q.Ağazadə),

3) Fransız dili kafedrası (müdir b/m.M.A.Qeylikman).

**IV.Təbiyyat fakültəsi** (dekan dos.*M.A.Qasımov*)

1) Üzvi kimya kafedrası (müdir prof.Ş.V.Əliyev),

2) Qeyri-üzvi kimya kafedrası (müdir dos. X.Ş.Kələntərli),

3) Zoologiya kafedrası (müdir Z.M.Şahtaxtinskaya),

4) Botanika kafedrası (müdir dos.M.A.Qasımov),

5) Geologiya kafedrası (müdir dos.M.A.Hacınski)

**V.Fizika-riyaziyyat fakültəsi** (dekan dos. *Abaszadə A.*)

1) Riyaziyyat kafedrası (müdir dos.B.M.Yusifzadə),

2) Fizika kafedrası (müdir dos.A.Q.Abaszadə).

**VI. Ümuminstitut kafedraları**

1) Marksizm-leninizm kafedrası (müdir dos. Ə.S.Əlizadə),

2) Pedaqogika kafedrası (müdir müdir dos. Ə.Y.Seyidov),

3) Psixologiya kafedrası (müdir dos.Ə.K.Zəkuzadə),

4) Xüsusi fənlər metodikası kafedrası (müdir dos.A.S.Abdullayev),

5) Hərbi hazırlıq kafedrası (müdir podpolkovnik K.Y.Babayev)

6) Bədən tərbiyəsi kafedrası (müdir b/m. H.A.Mirzəyev).

Kafedraların nəzdində dil və ədəbiyyat, botanika, fizika və riyaziyyat, biologiya, coğrafiya, tarix kabinələri, kimya və fizika laboratoriyaları təşkil edilmişdi.

Pedaqoji İnstitutun yeni strukturunun və tələbə kollektivinin formalaşdırılmasında SSRİ Xalq Komissarları Sovetinin 20 avqust 1945-ci il tarixli "Müəllim hazırlığı işinin yaxşılaşdırılması haqqındakı" qərarı mühüm rol oynadı. Həmin qərara görə:

1) orta təhsili olmayan şəxslərdən müəllim kadrları hazırlanması təcrübəsi ləğv edildi;

2) sabit professor-müəllim və tələbə kontingentinin yaradılması üçün tədbirlər planının işlənməsi tövsiyə olundu;

3) pedaqoji institutlarda aspirantura şöbəsi genişləndirildi, təhsilini müvəffəqiyyətlə başa vuran məzunların ali məktəbdə fəaliyyət göstərmələri üçün bir illik xüsusi hazırlıq keçmələrinə icazə verildi;

4) yerli zəhmətkeş deputatları Sovetinə pedaqoji institutların tədris-maddi bazasının möhkəmləndirilməsinə, tələbələrin mədəni-məişət xidmətinin yaxşılaşdırılmasına köməklik göstərmələri təklif olundu.

SSRİ Xalq Komissarları Soveti yanında Ali məktəblər üzrə Ümumittifaq Komitəsi tərəfindən 1945-ci ilin dekabr ayında pedaqoji institutlarda təhsilin keyfiyyətinin yüksəldilməsi məqsədi ilə bir sıra tədbirlərin həyata keçirilməsi qərara alındı:1) ali pedaqoji məktəblərdə təhsil müddətinin 5, müəllimlər institutlarında 3 il olması; 2) qiyabi şöbələrə yeni qəbul olunanlar üçün ilk istiqamətverici sessiyasının müddətinin 30 gün olması; 3) qiyabi şöbələrə fasiləsiz qəbul təcrübəsinin ləğv edilməsi; 4) məsləhət məntəqələri şəbəkəsinin genişləndirilməsi; 5) qiyabiçi tələbələrin maddi təminatının yaxşılaşdırılması və s.

Qərarda birinci və ikinci kateqoriyalı pedaqoji institutlarda 6, üçüncü kateqoriyalı institutlarda 3 fakültənin yaradılmasına icazə verilirdi.Müəllimlər institutları 3 fakültədən (Tarix-filoloji, Fizika-riyaziyyat və Təbiət elmləri və coğrafiya) ibarət ola bilərdi. İnstitutlarda kafedra, laboratoriya və kabinetlərin yaradılması ilə də bağlı limit müəyyənləşdirilmişdi.

| Tədris ili | Qəbul | Ümum tələbə sayı | Kişi | Qadın | O cümlədən | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | | | | Azərb. kişi | Azərb. qadın | Ümumi tələbə sayı | Buraxılış |
| 1943/44 | - | 936[1] | 273 | 663 | 253 | 473 | 610[2] | 33 |
| 1944/45 | 340 | 756 | 112 | 644 | 164 | 337 | 551 | 46 |

Azərbaycanda tarix elminin inkişafında və tarix müəllimlərinin hazırlanmasında 1943-cü ildə ADPİ-də təşkil edilən *Azərbaycan tarixi kafedrası* mühüm rol oynadı. Kafedrada istedadlı tarixçi alimlər: İsmayıl Hüseynov (kafedra müdiri), Zülfəli İbrahimov, Y.A.Tokarjevski, Məmməd Əmin Qazıyev, Məmmədəli Şərifli, Cəfər İbrahimov, Şamil Məmmədbəyli fəaliyyət göstərirdi.

Respublikada müharibənin çətinlikləri ilə əlaqədar olaraq ümumtəhsil məktəb şəbəkəsində və

[135] *İlin əvvəlində tələbələrin ümumi sayı*
[136] *İlin əvvəlində tələbələrin ümumi sayı*



Sağdan prof.E.A.Tokarjevski, prof.A.İ.Qarayev, Z.İbrahimov Sadıqzadə, İ.V.Striqunov, Mirhadıyev və b.

şagird kontingentində də azalma baş vermişdi. 1940/1941-ci tədris ilində respublikada 3575 məktəb olduğu halda, 1943/44 -cü tədris ilində onların sayı azalaraq 3159 -a, o cümlədən ibtidai məktəblərin sayı isə 1668 - dən 1372 -yə enmişdi[137]. Şagirdlərin sayında da azalma baş vermişdi. 1940/1941-ci tədris ilində ümumtəhsil məktəblərində 654902 nəfər şagird oxuyurdusa, 1943/1944-cü tədris ilində onların sayı 454195 nəfər olmuşdu. Müvafiq olaraq ibtidai məktəblərdə də şagirdlərin sayı 406153 - dən 288418 - ə enmişdi[138].

1945/46-cı tədris ilinin əvvəlində Pedaqoji İnstitutda oxuyan 879 nəfər tələbədən cəmi 389 nəfəri (44,2 %) azərbaycanlı idi. Milli məktəblərdə ali təhsilli müəllim kadrlarına ehtiyac yaranmışdı. Ali pedaqoji məktəblərdə müəllimlik peşəsinə tələbə qəbulu planı kəsrlə yerinə yetirilirdi.



Mehdi Hseyinzadə

Ümumtəhsil məktəbləri üçün coğrafiya müəllimləri çatışmırdı. Odur ki, bu sahədəki geriliyi aradan qaldırmaq üçün təsirli tədbirlər görmək lazım idi. Bu məqsədlə 1944/45-ci tədris ilinin əvvəlində Pedaqoji İnstitutda Coğrafiya fakültəsi yaradıldı. Bir il sonra Pedaqoji İnstitutun nəzdində Azərbaycan şöbəsi üçün hazırlıq kursu təşkil edildi. Kursa ilk dəfə 230 nəfər cəlb olundu.

Müharibənin qalibiyyətlə başa çatması nəticəsində Azərbaycan xalqı dinc quruculuq işlərinə başlamaq imkanı əldə etdi. 1946/47-ci tədris ilində instituta qəbul olunmaq üçün 1080 nəfər gənc ərizə verdi. Seçim əsasında onlardan 608 nəfəri instituta qəbul edildi. Qəbul olunan tələbələrin 487 nəfərini azərbaycanlı oğlan və qızlar təşkil edirdi. Həmin il institutun bütün fakültələrində qəbul planı tam yerinə yetirildi. Sonrakı illərdə də bu tendensiya qorunub saxlanıldı. 1947/48-ci tədris ilində Pedaqoji İnstituta 655, 1948/1949-cu tədris ilində 600, 1949/1950-ci tədris ilində 600 tələbə qəbul edildi.

Müharibəyə səfərbər olunmuş müəllim və tələbələrin bir qismi öz həyatlarını (Z.Qasımzadə, Ə.Həsənov və b.) döyüş tapşırıqlarını yerinə yetirərkən itirsə də, sağ qalanlar (İ.Əfəndiyev, M.Rəcəbov, B.Sultanov, A.Salayev, M.Mahmudov, M.Muradxanov, M.Mehdizadə, M.Hacıyev, A.Əliyev, İ.Qasımov, Ə.Əliyeva, A.Təmrazlı) yenidən Pedaqoji İnstituta qayıtdılar. Faşistlərə qarşı döyüşlərdə igidliyinə görə Pedaqoji İnstitutun yetişdirmələri - əfsanəvi partizan **Mehdi Hüseynzadə, Fariz Səfərov, Xıdır Mustafayev** və Fizika-riyaziyyat fakültəsinin 3-cü kursundan cəbhəyə getmiş olan **Səlahəddin Kazımov** Sovet İttifaqı Qəhrəmanı kimi yüksək ada layiq görüldülər.

SSRİ XKS-nin 2 fevral 1946-cı il sərəncamı və Azərbaycan SSR XKS-nin 15 may 1946-cı il qərarına uyğun olaraq *Azərbaycan Dövlət ikiillik Müəllimlər İnstitutu* təşkil edildi[139]. İnstitut milli

[137] ***Mehdizadə M.M.*** *Azərbaycanda sovet məktəbinin tarixinə dair xülasələr. Bakı: Azərnəşr, 1958, 328 s.*
[138] *Yenə orada*
[139] *Азербайджанский педагогический институт русского языка и литературы им. М.Ф.Ахундова (1946-1996). Баку: Мутарджим, 1996, с.8*


*Xıdır Mustafayev*


*Fariz Səfərov*

məktəblər üçün rus dili və ədəbiyyatı müəllimləri hazırlamalı idi. İnstituta dosent A.S.Loqinov direktor, Q.K.Məmmədov isə direktor müavini təyin olundular. 1946-1947-ci tədris ilində instituta 108 nəfər qəbul edildi.

SSRİ Nazirlər Soveti 1947-ci il oktyabrın 4-də "Xarici dil müəllimlərinin hazırlanması haqqında" qərar qəbul etdi. Pedaqoji institutların mövcud şəbəkəsinin xarici dil müəllimlərinə olan ehtiyacı ödəmədiyindən müstəqil institutların yaradılması qərara alındı. Azərbaycan SSR Nazirlər Soveti 1947-ci ilin 10 dekabrında Bakıda müstəqil Xarici Dillər İnstitutunun açılması haqqında qərar qəbul etdi. Həmin ilin dekabrın 26-da Azərbaycan SSR Maarif Nazirliyinin Kollegiyasında bu məsələ geniş müzakirə edildi. 1948-ci ilin iyun ayının 28-*də "Bakı şəhərində Pedaqoji Xarici Dillər İnstitutunun açılması haqqında"* Azərbaycan SSR Maarif Nazirliyi 193 saylı əmr verdi[140]. Beləliklə, 1948/49-cu tədris ilindən Bakı şəhərində V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Xarici dillər fakültəsinin bazasında Pedaqoji Xarici Dillər İnstitutu təşkil olundu. Pedaqoji İnstitutun Xarici Dillər fakültəsinin tələbə və müəllimləri yeni yaranan instituta köçürüldü. Fakültəyə aid olan ədəbiyyat fondu və kafedraların avadanlıqları da Xarici Dillər İnstitutuna verildi. İnstitutun ilk direktoru (rektoru) Pedaqoji İnstitutun Xarici dillər fakültəsinin məzunu, müəllimi və dekan müavini olmuş *Heybət Paşayev*[141] təyin edildi.


*Səlahəddin Kazımov*

1947/48-ci tədris ilində institutda Dil-Ədəbiyyat fakültəsinin nəzdində Azərbaycan dili, məntiq - psixologiya şöbəsi açıldı. Bu şöbənin açılması Azərbaycanda psixologiya üzrə kadr hazırlığına güclü təsir göstərdi. Tanınmış psixoloq alimlər Muxtar Həmzəyev, Arif Məmmədov və b. həmin şöbənin məzunları olmuşlar. Şöbə 1953-cü ilə kimi fəaliyyət göstərmişdir.

1948/49-cu tədris ilində Pedaqoji İnstitutda *Rus dili və ədəbiyyatı fakültəsi*, 1949/50-ci tədris ilində *Bədən tərbiyəsi fakültəsi* yaradıldı. Həyata keçirilən tədbirlər (yeni fakültələrin yaradılması, müharibə dövründə xaric olunan tələbələrin bərpası, ikiillik müəllimlər institutunun məzunlarının institutun III tədris ilinə qəbul edilməsi və s.) nəticəsində tələbələrin sayı xeyli artdı.

1949-1950-ci illərdə ADPİ-də tələbələrin sayı, tərkibi, tələbə qəbulu və buraxılışı aşağıdakı kimi olmuşdur:

---

[140] ***Əliyev Ə.*** *Azərbaycan Dillər Universitetinin tarixi. Bakı:Azərnəşr, 2005, 618 s.*

[141] ***Heybət Salman oğlu Paşayev*** *(1913-1984) Quba şəhərində anadan olub. 1931-1934-cü il-lərdə Neft texnikumunda təhsil alıb, 1937-ci ilin iyul ayına qədər Elmi-Tədqiqat Neft İnstitutunda texnik işləyib.1937-1941-ci illərdə APİ-nin Xarici dillər fakültəsində təhsil alıb, alman dili ixtisasına yiyələnib. Hələ III kurs tələbəsi ikən Bakı şəhərindəki Xəzər Ali Hərbi-Dəniz məktəbində müəllimlik fəaliyyətinə başlayıb, 1943-cü ildən Azərbaycan Tibb İnstitutunun müəllimi olub. H.Paşayev həmin illərdə eyni zamanda APİ-nin xarici dillər fakültəsində də alman dilini tədris etmişdir. 1946-1948-ci illərdə Xarici dillər fakültəsinin dekan müavini olub. 1948-ci ildə Maarif nazirinin əmrilə yeni açılmış APXDİ-yə müvəqqəti direktor təyin olunub. 1949-1955-ci illərdə APXDİ-nin Alman dili kafedrasında baş müəllim, 1955-1957-ci illərdə Xalq Təsərrüfatı İnstitutunda baş müəllim, 1957-1964-cü illərdə Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunda müəllim işləyib. İnşaat Mühəndisləri İnstitutunda Xarici dillər kafedrasının müdiri (1957- 1984) işləyib. "Almanca-azərbaycanca lüğət", "Alman dilində sözönü və Azərbaycan dilində onların ekvivalenti", "Alman dilində sözönlərin inkişafı tarixi","Azərbaycan dilində müasir alman dili sözönlərinin tədrisi haqqında" əsərləri nəşr olunub. 1984-cü il aprelin 26-da vəfat edib.*

| Tədris ili | Qəbul | Cəmi (ilin əvvəli) | O cümlədən | | | Cəmi (ilin sonu) | Məzun |
|---|---|---|---|---|---|---|---|
| | | | Azərb. | Qadın | Azərb. qadın | | |
| 1945/46 | 340 | 879 | 389 | 651 | 236 | 647 | 53 |
| 1946/47 | 608 | 1168 | 727 | 700 | 325 | 861 | 171 |
| 1947/48 | 655 | 1497 | 1006 | 788 | 422 | 1396 | 176 |
| 1948/49 | 600 | 1532[3] | 1050 | 681 | 344 | 1468 | 200 |
| 1949/50 | 600 | 1858 | 1245 | 758 | 473 | 1720 | 337 |

1944-cü ildə V.İ.Lenin adına ADPİ-də aspirantura şöbəsi bərpa olundu. Həmin il instituta 5 nəfər aspirant qəbul edildi. Sonrakı illərdə aspiranturada ixtisasların sayının artması nəticəsində qəbul planı da xeyli artırıldı.

1944-1950-ci illərdə V.İ.Lenin adına ADPİ-də aspirantların inkişaf dinamikası aşağıdakı kimi olmuşdur[143].

| Tədris ili | Qəbul | Cəmi | O cümlədən | | | |
|---|---|---|---|---|---|---|
| | | | Azərb. qadın | Qadın | Azərb. qadın | Buraxılış |
| 1944/45 | 5 | 5 | 5 | 1 | 1 | |
| 1945/46 | 7 | 12 | 11 | 2 | 2 | |
| 1946/47 | 8 | 20 | 19 | 8 | 8 | 1 |
| 1947/48 | 11 | 30 | 30 | 6 | 6 | 4 |
| 1948/49 | 12 | 32 | 32 | 7 | 7 | 5 |
| 1949/50 | 14 | 34 | 34 | 10 | 9 | 7 |

SSRİ Ali Təhsil Nazirliyinin "Aspirantura yolu ilə elmi-pedaqoji kadrların hazırlanmasının yaxşılaşdırılması tədbirləri haqqında" 1948-ci il 4 iyun tarixli qərarı Pedaqoji İnstitutda yeni elmi-pedaqoji qüvvələrin yerləşdirilməsinə güclü təsir göstərdi. İnstitutun ən fəal tələbələrinin aspiranturaya qəbul edilməsi, təhsilini fərqlənmə diplomu ilə başa vuran aspirantların pedaqoji prosesə cəlb edilməsi istiqamətində mühüm addımlar atıldı. Məsələn, 1948-ci ildə Pedaqoji İnstitutun aspiranturasını müvəffəqiyyətlə bitirmiş 4 nəfərin hamısı institutda saxlanıldı və pedaqoji prosesə cəlb olundu. Onlardan E.Tahirzadə Azərbaycan dilçiliyi, Nazim Axundov Azərbaycan ədəbiyyatı tarixi, Şa-

[142] *Bundan başqa 1948-ci ilin oktyabr ayında Ermənistandan deportasiya olunmuş İrəvan Pedaqoji İnstitutunun Azərbaycan bölməsinin 124 tələbəsi Pedaqoji İnstituta köçürülmüşdü.*
[143] ***Ş.Sadıqov, H.Əzimov, M.Salahov.****V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu 50 ildə. Bakı, 1972,s.57*

mil Məmmədbəyli Azərbaycan tarixi və Y.Dilbazi Azərbaycan ədəbiyyatı ixtisasları üzrə dərs deyirdilər. Gənc müəllimlərin institutda saxlanılması onların ayrı-ayrı ixtisaslar üzrə təkmilləşdirilməsinə, elmi-tədqiqat işlərinin keyfiyyətinin yüksəldilməsinə, nəticədə isə elmi dərəcəlilərin sayının artmasına səbəb oldu. Professor-müəllim heyətinin tərkibinə yeni elmi qüvvələrin cəlb edilməsi nəticəsində 1948-ci ilin iyulunda Pedaqoji İnstitutda əvəzçiliklə işləyən müəllimlərin sayı 90 nəfərdən 40 nəfərə endi.

1947/48-ci tədris ilində Pedaqoji İnstitutda tədrisin keyfiyyətini yüksəltmək, ayrı-ayrı fənlərin tədrisini təkmilləşdirmək və inkişaf etdirmək məqsədilə 4 yeni kafedra yaradılmışdı:

1) Dil- ədəbiyyatın tədrisi metodikası;
2) Fizika və riyaziyyatın tədrisi metodikası;
3) Təbiyyatın tədrisi metodikası;
4) Xarici dillərin tədrisi metodikası.

Bununla da Pedaqoji İnstitutda kafedraların sayı 30-a çatdı[144].

1947/48-ci tədris ilində Pedaqoji İnstitutun **Dil-ədəbiyyat** (dekan dos.Əli Sultanlı), **Tarix** (dekan dos.Cəfər İbrahimov), **Fizika-riyaziyyat** (prof. Məmməd Əfəndiyev), **Təbiyyat** (dos.Zəhra Şahtaxtinskaya), **Xarici dillər** (dos.Ə.Xudaverdiyev) fakültələrinə rəhbərlik edənlərin hamısının elmi dərəcəsi vardı. 30 kafedradan 9 -na elmlər doktoru, professor, 16-na isə elmlər namizədi, dosentlər başçılıq edirdilər. 1946/1947-ci tədris ilində Botanika kafedrasına dos.*Müzəffər Abutalıbov* (sonralar AMEA-nın həqiqi üzvü) rəhbərlik edirdi.

40-cı illərin ikinci yarısında Pedaqoji İnstitutda çalışan professor-müəllim heyətinin tərkibində xeyli dəyişiklik baş verdi. Milli elmi-pedaqoji kadrların sayının artırılması istiqamətində aparılan məqsədyönlü siyasət öz bəhrəsini verdi. 1946-cı ilin yanvar ayı üçün əvəzçiliklə işləyənlər də daxil olmaqla Pedaqoji İnstitutda dərs deyən 156 nəfər müəllimdən 71-i (45,5%) azərbaycanlı idisə, 1949/50-ci tədris ilində 160 nəfərdən 101- ni (63,1%) azərbaycanlılar təşkil edirdi[145]. Elmlər doktorlarının (5 nəfər) hamısı, 42 nəfər elmlər namizədindən isə 26 -sı azərbaycanlı idi.

1943-1950-ci illərdə Pedaqoji İnstitutun professor-müəllim heyətinin inkişaf dinamikası aşağıdakı kimi olmuşdur:

| Tədris illəri | Cəmi | Professor | O cümlədən elmlər doktoru | Dosent | Elm. doktoru, dos. | Elm. namizədi,dos. | B/müəllim | Elm.namizədi | Assistent və müəllim |
|---|---|---|---|---|---|---|---|---|---|
| 1943/44 | 161 | 10 | 5 | 45 | 1 | 33 | 73 | - | 28 |
| 1944/45 | 137 | 10 | 6 | 41 | - | 34 | 70 | 20 | 4 |
| 1945/46 | 156 | 10 | 7 | 41 | - | 34 | 69 | 20 | 36 |
| 1946/47 | 202 | 11 | 9 | 42 | - | 35 | 64 | 17 | 85 |
| 1947/48 | 208 | 12 | 10 | 42 | - | 36 | 81 | 24 | 79 |
| 1948/49 | 200 | 9 | 8 | 41 | - | 37 | 86 | 26 | 64 |

[144] *S.Sadıqov, H.Əzimov, M.Salahov.V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu 50 ildə. Bakı:ADPİ,1972*
[145] *Yenə orada, s.65*

Müharibə dövrünün bütün çətinliklərinə baxmayaraq, həmin illərdə Pedaqoji İnstitutun əməkdaşlarından 3 nəfəri doktorluq, 18 nəfəri namizədlik dissertasiyası müdafiə etmişdi. Pedaqoji İnstitutdan müharibəyə səfərbər olan Mərdan Muradxanov 1943-cü ildə Stalinqrad cəbhəsində sovet ordusunun uğurlu döyüşündən sonra Azərbaycan Dövlət Universitetinin dəvəti ilə bir neçə günlüyə Bakıya gələrək dekabrın 30-da universitetin böyük Elmi Şurasında "Nizaminin pedaqoji görüşləri" mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdi.

1943/44-cü tədris ilində institutun əməkdaşlarından 3 nəfəri doktorluq, 8 nəfəri namizədlik dissertasiyası müdafiə etdi. Ağamməd Abdullayev 1942-ci ilin mayın 7-də "Orta məktəblərdə Azərbaycan dilinin tədrisi metodikası", iyulun 30-da Vera Arxarova "1851-1861-ci illərdə Çernışevski, Dobrolyubov və Piraqovun didaktik ideyaları" mövzusunda namizədlik dissertasiyası müdafiə etdilər.

1943-1950-ci illərdə namizədlik və doktorluq dissertasiyası müdafiə edənlərin sayı ilbəil artdı. 7 il ərzində institut əməkdaşlarından 9 nəfəri doktorluq, 42 nəfəri namizədlik dissertasiyası müdafiə etdi. Bu illər ərzində ən çox (11 nəfər) dissertasiya müdafiəsi 1943/44-cü tədris ilinə təsadüf edir ki, bu da dövlətin elmi-pedaqoji kadr hazırlığı ilə bağlı həyata keçirdiyi siyasətin nəticəsi idi. Aspirantlara prof.M.Rəfili, prof.B.B.Komarovski, prof.Ə.Dəmirçizadə, prof.Ə.K.Zəkuzadə kimi görkəmli mütəxəssislər rəhbərlik edirdilər.

Uğurlar çox olsa da, nöqsanlar da yox deyildi. Pedaqoji İnstitutun direktorlarının tez-tez dəyişilməsi institutda tədris və elmi fəaliyyətin təşkilinə mənfi təsir göstərirdi.

Pedaqoji İnstitutu direktoru tez-tez dəyişən ali məktəblər kateqoriyasına aid etmək olar. 1930-1950-ci illərdə institutun direktorları 12 dəfə (Pənah Qasımov, Məmməd Bayramov, Bəşir Bünyadov, Mirzə Məmmədov, Davud Rəsulzadə, Hüseyn Musayev, Aqil Salayev, Camal Əliyev, Ələsgər Həşimov, Ağamməd Abdullayev, Məmməd Ələkbərli, Əhməd Seyidov) dəyişdirilmişdi. Bir neçə dəfə Pedaqoji İnstitutda tədris və elmi fəaliyyətin təşkili, gələcək müəllimlərin ideya-siyasi və beynəlmiləl tərbiyəsi məsələləri Azərbaycan K(b)P MK-da siyasi rəhbərlik səviyyəsində müzakirə edilmişdi. Direktorların tez-tez dəyişdirilməsi stabil pedaqoji kollektivin formalaşdırılmasına və institutda sağlam mənəvi-psixoloji mühitin yaranmasına mane olurdu.

Belə dəyişikliklərin müxtəlif səbəbləri var idi:

1) direktorların daha məsul vəzifələrə irəli çəkilməsi;

2) kadrların bəzilərinin direktor kimi səriştəsizliyi, yəni öz vəzifələrinin öhdəsindən gələ bilməməsi;

3) pedaqoji kollektivdə normal mənəvi-psixoloji mühitin olmaması, yəni direktor vəzifəsini tutmaq istəyənlərin hakimiyyət orqanlarına "şikayətləri";

4) hakimiyyət orqanlarının direktorun (rektorun) iş üslubundan narazılığı;

5) o zamankı ictimai-siyasi şəraitdə kadrların siyasi cəhətdən etibarlı olmasına xüsusi diqqətlə yanaşılması;

6) ermənilərin və ermənipərəst qüvvələrin azərbaycanlı kadrları sıradan çıxarmaq üçün yazdıqları anonim məktublar;

7) direktorların repressiyaya məruz qalması və s.

Pedaqoji İnstitutun məzunu Səfa İmanov 1948 –ci ildə, Rüstəm Səfərəliyev 1949-cu ildə təsərrüfat sahəsində göstərdikləri yüksək nailiyyətlərə görə Sosialist Əməyi Qəhrəmanı fəxri adına layiq görüldülər.



*Rüstəm Səfərəliyev*



*Səfa İmanov*

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 25 illik yubileyi niyə keçirilmədi?

1981-ci ildə ADPİ-nin 60 illik yubileyi münasibəti ilə nəşr edilən “Azərbaycanın ilk ali pedaqoji institutu”[146] adlı kitabda göstərilir ki, Respublikada maarif işçilərinin hazırlanmasında yüksək rol oynayan Pedaqoji İnstitutun 25 illik yubileyi pedaqoji ictimaiyyətin iştirakı ilə geniş qeyd edilmişdir. Araşdırmalar zamanı, təəssüf ki, bunun tam əksinin şahidi olduq. Məlum oldu ki, V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun 25 illik yubileyinin keçirilməsi ilə bağlı Azərbaycan K(b)P MK -nın təşəbbüsü ÜİK(b)P MK tərəfindən dəstəklənməmiş, institutun qabaqcıl müəllimlərinin SSRİ-nin orden və medalları ilə təltif edilməsi ilə bağlı SSRİ Ali Soveti Rəyasət Heyəti qarşısında vəsatət qaldırılmamışdır.

Lakin yubileyin keçirilməsi ilə bağlı Azərbaycanda xeyli hazırlıq işləri görülmüşdür. Pedaqoji İnstitutun 25 illik yubileyinin keçirilməsi məsələsi Azərbaycan K(b)P MK -nın təşəbbüsü ilə Nazirlər Sovetində geniş müzakirə edilərək 23 maddədən ibarət olan qərar layihəsi hazırlanmışdır. Qərarın bütün maddələri institutun elmi və tədris fəaliyyətini yüksəltmək məqsədilə maddi-texniki bazanın gücləndirilməsinə istiqamətləndirilmişdi.

Layihədə aşağıdakılar nəzərdə tutulmuşdu:

1) 1 iyun 1946-cı ildən gec olmayaraq Pedaqoji İnstitutun 800 nəfərlik yataqxana ilə təmin edilməsi[147];

2) Pedaqoji İnstitutun binasının əsaslı şəkildə təmir edilməsi.

Bu məqsədlə yataqxananın təmirinə 1 milyon, fizika və kimya laboratoriyalarının yenidən qurulmasına 0,7 milyon, bioloji muzeyin, insan anatomiyası və fiziologiyası kabinetinin, bitki fiziologiyası laboratoriyasının yenidən qurulmasına 0,8 milyon, Təbiyyat fakültəsinin tələbələrinin istifadə edəcəyi təcrübə və biologiya stansiyasının təşkilinə 0,5 milyon, əlavə korpusun tikintisinə 100 min rublun ayrılması nəzərdə tutulmuşdu. Tədris binasının və yataqxananın təmirinə ayrılan 1,7 milyon rublun 1 milyon rublunu Maarif Nazirliyi, 450 min rublunu Bakı şəhər İcraiyyə Komitəsi, 250 min rublunu Pedaqoji İnstitut ayırmalı idi.

3) elm, tədris və təsərrüfat üçün avadanlıqların alınması; Bu məqsəd üçün 1,5 milyon, elmi-tədqiqat işlərinin aparılmasına 0,5 milyon vəsaitin ayrılması nəzərdə tutulurdu. Həmin vəsaitin ayrılması Maliyyə Nazirliyinə həvalə edilmişdi.

Bunlardan əlavə olaraq, 1946-cı ildə Pedaqoji İnstituta aşağıdakıların verilməsi planlaşdırılmışdı:

- 2 yük maşını, bir avtobus, bir minik maşını, mazut daşımaq üçün çənli yük maşını;
- institutun şəhər ətrafındakı təsərrüfatı üçün 2 at və 3 inək;
- 40 ton mazut və hər ay 10 kub metr odun;
- mətbəə üçün “Amerikanka” tipli çap maşını;
- 1 stasionar kinoaparat;
- kabinet və auditoriyalar üçün 1000 stul, zal üçün 600 nəfərlik oturacaq, 200 stol, 50 sinif lövhəsi, 50 şkaf və 5 ton çap, 1 ton yazı kağızı.

Xarici ölkələrdən zəruri avadanlıqların, tədris ədəbiyyatının alınması üçün 100 min dollar vəsaitin Pedaqoji İnstitut üçün ayrılması ilə bağlı SSRİ Xarici Ticarət Nazirliyi qarşısında vəsatət qaldırılması nəzərdə tutulurdu.

Layihədə Pedaqoji İnstitutda həftəlik *“Lenin tərbiyəsi uğrunda*” adlı qəzetin və *“V.İ.Lenin adına ADPİ-nin Əsərləri”*nin (ildə 4 sayı) nəşrinə icazə verilirdi.

Azərbaycan Ticarət Nazirliyi institutun rəhbər işçiləri və tədris-köməkçi heyəti üçün quru yeməyin, 1946-cı ilin sentyabrından 1000 tələbə üçün ikinci isti yeməyin verilməsini təmin etməli, tələbə və aspirantların dəri ayaqqabılar alması üçün 50

---

[146] ***Курбанов А.М., Садыхов Ш.А., Салахов М.Н.*** *Первый педагогический институт Азербайджана.Баку,1981,с.52*

[147] *Pedaqoji İnstitutun əsas binası kimi, Bakıxanov küçəsində yerləşən yataqxanası da mü-haribə dövründə hərbi hospitala çevrilmişdi. Müharibədən sonra da yataqxana kimi istifadə edilən həmin binanın bir hissəsi 70-ci illərdə tədris korpusu kimi istifadə edilirdi. Pedaqoji fakültənin nəzdində musiqi şöbəsinin açılması ilə əlaqədar olaraq yataqxananın əksər hissəsi tədris otaqlarına çevrildi. 90-cı illərin əvvəllərində isə yataqxana bötövlükdə tədris korpusuna çevrildi. Burada Pedaqoji fakültə, Məktəbəqədər tərbiyə fakültəsi, Mühəndis-pedaqoji və bədii qrafika fakültələri yerləşirdi. 2011-ci ildə Coğrafiya və gənclərin çağırışaqədərki hazırlığı fakültəsi də həmin binaya köçürülmüşdü. 2015-ci ildə bina söküldü və yerində park salındı.*

min, tikmə məhsullar alması üçün 200 min, yun parçalar alması üçün 80 min rubl. ayırmalı idi.

Birləşmə nəticəsində Pedaqoji İnstitutun universitetin kitabxanasına verdiyi kitabların ən azı 80%-nin geri qaytarılması ADU-nun rektoru A.Qarayevə həvalə olunmuşdu.Tələbələrin pedaqoji təcrübə keçmələri üçün Maarif Nazirliyi Bakı şəhərindəki bir orta məktəbi Pedaqoji İnstitutun nəzdinə verməli idi.

Pedaqoji İnstitutda 1946/47-ci tədris ilindən etibarən 250 nəfərdən ibarət *hazırlıq şöbəsinin* fəaliyyət göstərməsinə icazə verilməsi də qərar layihəsində öz əksini tapmışdı.

Arxiv sənədləri[148] göstərir ki, Azərbaycan K(b)P MK-nın 1946-cı ilin may ayının əvvəlində keçirilən iclasında "*V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun 25 illik yubileyi haqqında*" məsələ müzakirə edilmiş, institutun 25 illik fəaliyyəti yüksək dəyərləndirilmiş, yubileyin keçirilməsi ilə bağlı hazırlanan layihənin ilkin variantı geniş müzakirə olunmuşdu.

Layihədə oxuyuruq: "*Azərbaycan Hökumətinin 1 iyul 1921-ci il tarixli dekreti ilə 1921-ci ilin oktyabrında təşkil edilən V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutu 25 illik mövcudluğu ərzində gənc nəslin təlim-tərbiyə məsələlərini uğurla həll edən 7400 ali təhsilli müəllim kadrı hazırlamaqla respublikada yüksəkixtisaslı maarif və mədəniyyət işçiləri yetişdirən mərkəzə çevrilmişdir. Azərbaycan Pedaqoji İnstitutunun məzunlarının bir çoxu ali təhsil müəssisələrində və elmi tədqiqat institutlarında elmi-pedaqoji fəaliyyətlə məşğul olur, partiya və sovet orqanlarında və respublikanın ictimai təşkilatlarında rəhbər vəzifələrdə çalışırlar*".

Layihənin sonunda institutun yubileyinin keçirilməsi ilə bağlı aşağıdakı təşkilati məsələlər qərara alınmışdı:

I.V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun 25 illik yubileyi 26 oktyabr 1946-cı ildə qeyd edilsin.

II.Azərbaycan Pedaqoji İnstitutunun 25 illik yubileyinin hazırlanması və keçirilməsi üçün aşağıdakı tərkibdə dövlət yubiley komissiyası yaradılsın:

**1. İbrahimov M.** – Azərbaycan SSR Maarif naziri (sədr)

**2. Əliyev M.M.** – Azərbaycan K(b)P MK ali və orta məktəb şöbəsinin müdiri

**3. Quliyev A.** – Respublika Ali Məktəb və Elmi Müəssisə İşçilərinin Həmkarlar Komitəsinin sədri

**4. Seyidov Ə.Y**. – Azərbaycan Pedaqoji İnstitutunun direktoru

**5. Əfəndiyev M.R.** – Azərbaycan Pedaqoji İnstitutunun professoru

**6. Kələntərli X.Ş**[149]

Azərbaycan K(b)P MK-nın Büro iclasında Dövlət Plan Komitəsinə və Maliyyə Nazirliyinə yubileyin keçirilməsi üçün Maarif Nazirliyinə zəruri vəsaitlərin ayrılması tapşırılmışdı. Pedaqoji İnstitutun fərqlənən professor-müəllimlərinin siyahısının hazırlanması isə Azərbaycan SSR Maarif Nazirliyinə (Mirzə İbrahimov) və Azərbaycan K(b)P MK ali və orta məktəb şöbəsinə ( M.Əliyev) həvalə edilmişdi.

Maraqlıdır ki, 1946-cı ilin may ayının sonunda Pedaqoji İnstitutun 25 illik yubileyinin keçirilməsi Azərbaycan K(b)P MK-nın Büro iclasında yenidən müzakirə olundu və 6 maddədən ibarət qərar qəbul edildi. Yubiley komissiyasının tərkibində müəyyən dəyişiklik edildi. Təsdiq edilən yeni layihədə göstərilirdi:

I.V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun 25 illik yubileyi 26 oktyabr 1946-cı ildə qeyd edilsin.

II.Azərbaycan Pedaqoji İnstitutunun 25 illik yubileyinin hazırlanması və keçirilməsi üçün aşağıdakı tərkibdə yubiley komissiyası yaradılsın:

**1. İbrahimov M.** – Azərbaycan SSR Maarif naziri (sədr)

**2. Allahverdiyev H.** – Azərbaycan SSR Nazirlər Soveti sədrinin müavini

**3. Əliyev M.M**. – Azərbaycan K(b)P MK ali və orta məktəb şöbəsinin müdiri

**4. Seyidov Ə.Y**. – Azərbaycan Pedaqoji İnstitutunun direktoru

**5. Abramova S.A.** – Azərbaycan Pedaqoji İnstitutunun partiya komitəsinin katibi

---

[148] *Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. siyahı F.1, siy.31, sax.vah.484*

[149] *X.Ş.Kələntərli – Azərbaycan Pedaqoji İnstitutunun dosenti idi.*

**6. Əsgərova İ.** – Azərbaycan LKGİ-nin katibi

**7. Rəhimli** Azərbaycan K(b)P Bakı şəhər Partiya Komitəsinin katibi

**8. Quliyev A.** – Respublika Ali Məktəb və Elmi Müəssisə İşçilərinin Həmkarlar Komitəsinin sədri

**9. Kərimov Q.** – İbtidai və orta məktəb işçilərinin Həmkarlar Komitəsinin sədri

Qərarda yubiley ilə əlaqədar olaraq institutun maddi-texniki bazasının möhkəmləndirilməsi, xüsusi nəşrlərin (yubiley məcmuəsinin və əməkdaşların elmi əsərlərinin) çapı, respublika qəzetlərində, xüsusilə "Azərbaycan müəllimi" qəzetində Pedaqoji İnstitutun yubileyi ilə bağlı materialların çap edilməsi nəzərdə tutulmuşdu.

Arxiv sənədləri sübut edir ki, institutun yubileyinin keçirilməsi Pedaqoji İnstitutda, Maarif Nazirliyində, Azərbaycan SSR Nazirlər Sovetində və Azərbaycan KP MK-da dəfələrlə müzakirə edilərək bəyənilmişdi. Hətta Pedaqoji İnstitutun 25 illik yubileyinin keçirilməsi ilə bağlı Azərbaycan K(b)P MK katibi ***M.C.Bağırov*** ÜİK(b)P MK-nın katibi A.A.Jdanova bununla bağlı məktub[150] ünvanlamışdır.

***ÜİK(b)P MK-nın katibi***
***yoldaş A.A.Jdanova***

*Azərbaycan K(b)P MK və Azərbaycan SSR Nazirlər Sovetinin 16 iyul 1946-cı il qərarı ilə respublikamızın ən böyük ali məktəblərindən birinin- Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 25 illik yubileyinin keçirilməsi nəzərdə tutulur. ÜİK(b)P MK-nın təbliğat və təşviqat idarəsinin və SSRİ Ali Təhsil Nazirliyinin tələbi ilə əlaqədar olaraq Sizə institutun 25 illik fəaliyyəti ilə bağlı məlumat verərək aşağıdakı məsələlərin həyata keçməsi üçün Sizin köməyinizi xahiş edirik:*

*1. Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 25 illik yubileyi ilə əlaqədar olaraq* ***Qırmızı Əmək Bayrağı ordeni*** *ilə, institutun fərqlənən əməkdaşlarının isə SSRİ-nin orden və medalları ilə təltif edilməsini (siyahı əlavə olunur);*

*2. Azərbaycan Dövlət Pedaqoji İnstitutunun tələbələri üçün əlavə 12 Stalin təqaüdünün verilməsini;*

*3. Azərbaycan Dövlət Pedaqoji İnstituta xarici ölkələrdən kitab almaq üçün valyuta fondundan vəsait ayrılmasını.*

***M.C.Bağırov***
***Azərbaycan K(b)P MK-nın katibi***

Azərbaycan K(b)P MK-nın katibi M.C.Bağırovun məktubu ilə bərabər ÜİK(b)P MK- ya Pedaqoji İnstitutun 25 illik fəaliyyəti ilə bağlı geniş arayış göndərilmişdi. Pedaqoji İnstitutun direktoru Ə.Seyidovun Maarif Nazirliyinə göndərdiyi məlumatlar əsasında nazir Mirzə İbrahimovun hazırladığı 7 oktyabr 1946-cı il tarixli arayış Azərbaycan K(b)P MK-nın Bürosunda müzakirə edildikdən sonra Azərbaycan K(b)P MK-nın katibi Qəzənfər Məmmədovun məktubu ilə birlikdə 26 oktyabr 1946-cı ildə ÜİK(b)P MK-nın katibi A.A.Jdanova göndərilmişdi. Arayışda Azərbaycanda pedaqoji və elmi-pedaqoji kadr hazırlığında Pedaqoji İnstitutun fəaliyyəti hərtərəfli araşdırılmış, onun 25 illik yubileyinin dövlət səviyyəsində keçirilməsi əsaslandırılmışdı.

Yubileylə əlaqədar olaraq Pedaqoji İnstitutun xeyli əməkdaşının yüksək dövlət mükafatına təqdim edilməsi də nəzərdə tutulmuşdu. Arxiv sənədlərindən məlum olur ki, 21 oktyabr 1946-cı ildə Maarif nazirinin müavini Teyfur Xasməmmədov Pedaqoji İnstitutun dövlət mükafatına təqdim edilən əməkdaşlarının siyahısını məktubla nazir Mirzə İbrahimova təqdim etmişdir. Maarif naziri Mirzə İbrahimov isə həmin siyahını 7 iyul 1946-cı ildə Azərbaycan K(b)P MK-nın ali və orta məktəblər şöbəsinin müdiri M.M.Əliyevə ünvanlamışdır.

Siyahıda Pedaqoji İnstitutun adları aşağıda göstərilən əməkdaşlarının mükafatlandırılması nəzərdə tutulurdu:

[150] *Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. F.1, siy.31, sax.vah.484*

1. **Seyidov Əhməd Yusif oğlu** (direktor) - “Lenin” ordeni

2.**Əfəndiyev Məmməd Rəşid oğlu** - “Lenin” ordeni

3.**Astafeva Aleksandra İvanovna**- “Qırmızı Əmək Bayrağı” ordeni

4.**Mehdizadə Mehdi Məmməd oğlu**- “Qırmızı Əmək Bayrağı” ordeni

5.**Ağayev Bəylər Əbdülrəhim oğlu** - “Şərəf Nişanı” ordeni

6.**Qaibova Rüxsarə Əli qızı** - “Şərəf Nişanı” ordeni

7.**Əbdüləzəl Məmməd oğlu Dəmirçizadə** - “Şərəf Nişanı” ordeni

8.**İbrahimov Cəfər Məmməd oğlu** - “Şərəf Nişanı” ordeni

9.**Kələntərli Xudaverdi Şahbaz oğlu** - “Şərəf Nişanı” ordeni

10.**Abaszadə Abasqulu Ağabala oğlu -** “Əmək şücaətinə görə” medalı

11.**Mahmudov Müseyib Hüseyn oğlu** - “Əmək şücaətinə görə” medalı

12.**Yusifzadə Bəhram Mamed oğlu** - “Əmək şücaətinə görə” medalı

13.**Xudaverdiyev Əli Mürsəl oğlu-** “Əmək şücaətinə görə” medalı

14.**Ağazadə Nəzakət Həsən qızı -** “Əməkdə fərqləndiyinə görə” medalı

15.**Novruzova Balacaxanım Alxan qızı** - “Əməkdə fərqləndiyinə görə” medalı

Azərbaycan KP MK-nın tapşırığına əsasən respublika mətbuatda Azərbaycan Pedaqoji İnstitutun 25 illik yubileyi ilə bağlı materialların nəşri planlaşdırılsa da, yalnız “Azərbaycan müəllimi” qəzetinin 10 oktyabr 1946-cı il (prof.Ə.Dəmirçizadənin “Azərbaycan dilçiliyi kafedrası”) və 17 oktyabr 1946-cı il (dos.A.Abaszadənin “Fizika elminin inkişafı uğrunda”) saylarında “Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 25 illiyi” rubrikası altında 2 məqalə və “V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu (1921-1946)” kitabı nəşr edilmişdir. Kitabda Ə.Seyidov (direktor), M.Mehdizadə (direktor müavini), Ə.Sultanlı, İ.Əfəndiyev, Ə.Dəmirçizadə, Ə.Xudaverdiyev, R.Qayıbova, C.İbrahimov, A.Abaszadə, Z.Şahtaxtinskaya, X.Kələntərli və b. Azərbaycan Pedaqoji İnstitutunun və onun ayrı-ayrı fakültələrinin inkişafı ilə bağlı məqalələri verilmişdir..

İlk baxışdan təəccüblü görünən odur ki, Azərbaycan K(b)P MK-nın katibi M.C.Bağırovun siyasi nüfuzunun yüksək olduğu 1946-cı ildə Pedaqoji İnstitutun yubileyi nə üçün keçirilməyib? M.C.Bağırovun Moskvaya- ÜİK(b)P MK-nın katibi A.A.Jdanova ünvanladığı məktub olmasa idi, fikirləşə bilərdik ki, siyasi rəhbərlik buna icazə verməyib. Siyasi rəhbərlik icazə verməsə idi, bu məsələ dəfələrlə müxtəlif dövlət, hökumət və partiya orqanlarında müzakirə edilə bilməzdi.

İnstitutun yubileyinin keçirilməsinin səbəbi, fikrimizcə, SSRİ Nazirlər Sovetinin və ÜİK(b)P MK-nın 10 aprel 1941-ci ildə qəbul etdiyi “*Yubileylərin keçirilməsi haqqında*” 886 saylı qərarla bağlı olmuşdur. Həmin qərarda böyük nailiyyətləri olan təhsil müəssisələrinin 20 illik, 50 illik və 100 illik yubileylərinin keçirilməsi nəzərdə tutulurdu. Yubileylərin keçirilməsi və bu məqsədlə vəsaitlərin ayrılması yalnız SSRİ Nazirlər Sovetinin və ÜİK(b)P MK-nın icazəsi ilə ola bilərdi.

Fikrimizcə, Pedaqoji İnstitutun 25 illik yubileyinin keçirilməməsinin yeganə səbəbini burada axtarmaq lazımdır. SSRİ Nazirlər Soveti və ÜİK(b)P MK 1941-ci ildə birgə qəbul etdikləri qərarı 5 ildən sonra pozaraq Azərbaycan Dövlət Pedaqoji İnstitutun 25 illik yubileyinin keçirilməsinə icazə verə bilməzdi. Azərbaycanla bağlı belə bir qərarın verilməsi SSRİ miqyasında yersiz söz-söhbətin yaranmasına, digər müttəfiq respublikalardan da eyni məzmunlu təqdimatların meydana gəlməsinə səbəb ola bilərdi.



## 50-60-cı illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunda pedaqoji kadr hazırlığı

Müharibədən sonra ölkənin iqtisadi-təsərrüfat və elmi-mədəni həyatında böyük canlanma yarandı. 50-ci illərdə təsərrüfat və mədəni quruculuq sahəsində yeni vəzifələr müəyyənləşdirildi. 1946-1950-ci illərlə müqayisədə 1951-1955-ci illərdə pedaqoji kadr hazırlığını həyata keçirən institutlarda tələbə qəbulunun 45% artırılması nəzərdə tutuldu.

1950-1951-ci tədris ilində Pedaqoji İnstitutda ***Tarix, Dil-ədəbiyyat, Fizika-riyaziyyat, Təbiyyat-kimya, Rus dili və ədəbiyyatı, Coğrafiya*** fakültələri vardı. *Bədən tərbiyəsi* şöbəsinin tələbələrinin sayı (cəmi 32 nəfər) az olduğuna görə Coğrafiya fakültəsi ilə birləşdirilmişdi.

SSRİ Nazirlər Sovetinin 24 iyun 1952-ci il tarixli qərarı ilə M.F.Axundov adına Azərbaycan Müəllimlər İnstitutu orta məktəblər üçün rus dili və ədəbiyyatı müəllimləri hazırlayan dördillik təhsil müddətli pedaqoji instituta çevrilməsi ilə əlaqədar olaraq ADPİ-nin Rus dili və ədəbiyyatı fakültəsi M.F.Axundov adına Rus dili və Ədəbiyyatı İnstitutunun tərkibinə verildi.

Əvvəlki illərdə olduğu kimi, 50-ci illərdə də Pedaqoji İnstitutun direktorları tez-tez dəyişdirilirdi. 12 il müddətində institutun direktoru 5 dəfə dəyişdirildi. 1950-ci ilin may -avqust aylarında ***Cəfər Hacıyev***, 1950-ci il avqust ayından 1951 -ci ilin dekabr ayına kimi ***Mehdi Mehdizadə***, 1951-ci il dekabr ayından 1954-cü ilin iyun ayına kimi ***Həmid Qədirov***, 1954-cü ilin iyun ayından 1956-cı ilin dekabr ayına kimi ***Cəbrayıl Ələsgərov***, 1956-cı il dekabr ayından 1962-ci ilin sentyabr ayına kimi ***Mehdixan Vəkilov*** Pedaqoji İnstituta rəhbərlik etdi.



***Cəfər Xəndan Zeynal oğlu Hacıyev***
*filologiya elmləri doktoru, professor*
*(1910-1961)*

*8 may 1910-cu ildə İrəvan şəhərində anadan olub. 1918-ci ildə İrəvan şəhərində ermənilərin fitnə-fəsadından qorunmaq məqsədilə ailəsi ilə birlikdə Gəncəyə köçüb. Gəncədə valideynləri vəfat edib. O, kiçik qardaşı Rəşid və azyaşlı bacısı Leyla ilə 1922-ci ilədək Gəncə uşaq evində yaşayıb. 1922-1925-ci illərdə Gəncə Pedaqoji Texnikumunda oxuyub. Ali təhsil almaq məqsədi ilə Bakıya gəlib və Ali Pedaqoji İnstitutun dil-ədəbiyyat şöbəsinə daxil olub. 1925-1929-cu illərdə Fəhlə fakültəsində müəllimlik edib. Ali Pedaqoji İnstitut ADU-ya birləşdirildiyindən 1930-cu ildə universiteti bitirib. ADU ləğv edildiyindən aspirantura təhsilini Ali Pedaqoji İnstitutda alıb. 17 fevral 1932-ci ildə institutun aspiranturasına qəbul olunan 29 nəfərdən biri olub. 1932-1941-ci illərdə Azərbaycan Pedaqoji İnstitutunda assistent, müəllim, dosent, kafedra müdiri vəzifələrində işləməklə yanaşı ədəbi prosesdə fəal iştirak edib, "Ədəbiyyat qəzeti"nin məsul katibi, "Gənc işçi" qəzetinin ədəbiyyat şöbəsinin müdiri vəzifələrində çalışıb. 1938-ci ildə Azərbaycan Yazıçılar İttifaqına üzv qəbul edilib.*

*M.F.Axundov adına Müəllimlər İnstitutunda Dil və ədəbiyyat fakültəsinin dekanı, Azərbaycan EA-nın Dil və Ədəbiyyat İnstitutunda şöbə müdiri, Azərbaycan Yazıçılar İttifaqının təşkilatı işlər üzrə katibi vəzifələrində çalışıb. 1939-cu ildə namizədlik dissertasiyası müdafiə edib. Həmin illərdə "Azərbaycan ədəbiyyatı (sovet dövrü)" (1939) dərsliyi, "Sabir (həyat və yaradıcılığı)" (1940) monoqrafiyası nəşr olunub.*

*1944-1946-cı illərdə Cənub - Qərb, Şimali Qafqaz, Zaqafqaziya cəbhələrində siyasi şöbənin baş təlimatçısı, cəbhə qəzetlərində məsul redaktorun müavini olub. 1944-1946-cı illərdə Təbrizdə "Vətən yolunda" qəzetində çalışıb, Təbriz şairlər məclisinin fəal iştirakçılarından biri olub. "Vətən yolunda", "Şəfəq", "Qızıl siniflər" qəzet və jurnallarda Azərbaycan ədəbiyyatı ilə bağlı maraqlı elmi yazıları dərc olunub.*

*XX əsr Cənubi Azərbaycan ədəbiyyatının ən məşhur tədqiqatçılarından biri hesab olunur. 1947-ci ildə "1906-1946-cı illərdə Cənubi Azərbaycan xalqının milli azadlıq mübarizəsi və onun ədəbiyyatda inikası" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 1949-cu ildə ona professor elmi adı verilib.*

*1948-1950-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru, 1950-1954-cü illərdə Azərbaycan Dövlət Universitetinin rektoru, 1952-1961-ci illərdə isə həmin universitetin Azərbaycan ədəbiyyatı tarixi kafedrasının müdiri vəzifələrində işləyib. Elmi rəhbərliyi ilə 30 nəfər filologiya üzrə elmlər namizədi və doktoru yetişib.*

*"XX əsr Azərbaycan ədəbiyyatı" (1951), 2 hissəlik "Sovet ədəbiyyatı" (1952), "Cəfər Cabbarlının həyat və yaradıcılığı" (1954), "XX əsr Azərbaycan ədəbiyyatı tarixi oçerkləri" (1955), "Mikayıl Müşfiq" (1956), "Molla Nəsrəddin" (1956), "Mir Cəlal" (1958), "M.Ə.Sabir haqqında" (1958), "Şairin həyatı" (1961), "Sabir yaradıcılığının sənətkarlıq xüsusiyyətləri" (1962) adlı kitabları çapdan çıxıb. 3 cildlik "Azərbaycan ədəbiyyatı tarixi"nin (1957) üçüncü cildinin müəlliflərindən biri olub. Şair, tənqidçi, tərcüməçi kimi də maraqlı bir yaradıcılıq yolu keçib. "Bəyaz gecələr" (1936), "Cəbhə şeirləri" (1942), "Qafqaz" (1942), "İlk ayrılıq" (1944), "Mübarizə yollarında" (1946) kitabları nəşr olunub. Nizami Gəncəvinin "Lirika" (1940), M.F.Axundovun "A.S.Puşkinin ölümünə Şərq poeması" (1962), Heyran Xanımın "Qəzəllər" (1975) kitabını fars dilindən tərcümə edib.*

*"Qırmızı ulduz" (1942), "Qırmızı Əmək Bayrağı" (1946) ordenləri, "Qafqazın müdafiəsinə görə", "Almaniya üzərində qələbəyə görə" medalları ilə təltif olunub.*

*10 avqust 1961-ci ildə Bakı şəhərində vəfat etmişdir. Bakı şəhərindəki küçələrdən biri onun adını daşıyır*



***Mehdi Məmməd oğlu Mehdizadə***
*SSRİ PEA-nın həqiqi üzvü,*
*pedaqoji elmlər doktoru, professor,*
*Əməkdar elm xadimi*
*(1903-1984)*

*5 yanvar 1903-cü ildə Cəbrayıl qəzasının Daşkəsən kəndində anadan olub. 1919-cu ildə kəndlərindəki rus-tatar (Azərbaycan) məktəbini bitirib. Əmək fəaliyyətinə kənddə qiraət komasının müdiri kimi başlayıb. Cəbrayıl qəza mərkəzindəki altıaylıq pedaqoji kursu bitirdikdən sonra kəndlərindəki I dərəcəli məktəbdə (ibtidai məktəbdə) müəllim işləyib. 1923-cü ildə qəza məktəblərindən yaxşı işinə görə mükafatlandırılan 6 nəfər gənc müəllimdən, 1923-cü ilin mayında Cəbrayıl qəzasından Bakıya üç aylıq pedaqoji kursa göndərilən yeddi*

*nəfərdən biri olub. Pedaqoji kursu bitirdikdən sonra Qəza Xalq Maarif Şöbəsinin göndərişi ilə Azərbaycan Ali Pedaqoji Kişi İnstitutunun hazırlıq kursuna göndərilib. 1924-cü ildə hazırlıq kursunu bitirib və institutun Fizika-riyaziyyat fakültəsinə qəbul olunub. Ali təhsilini uğurla başa vuran Mehdi Mehdizadə Qaryagin (indiki Füzuli) şəhərindəki II dərəcəli məktəbə fizika-riyaziyyat müəllimi təyin olunub. Müəllimlik fəaliyyəti ilə yanaşı, qəza metodiki mərkəzə sədrlik etmək də rəsmi olaraq ona tapşırılıb. 1930-cu ilin martında Azərbaycan Xalq Maarif Komissarlığının İctimai Tərbiyə Baş İdarəsinin elmi katibi və Xalq maarif komissarının birinci müavini Ayna Sultanovanın köməkçisi təyin olunub. 1931-ci ildə SSRİ Elmlər Akademiyasının Azərbaycan filialı nəzdində təşkil edilmiş aspiranturaya (pedaqogika ixtisası üzrə) qəbul olunub, az sonra Azərbaycan ETPEİ-nin, sonra isə Pedaqoji İnstitutun aspiranturasına köçürülüb. 1934-cü ildə Pedaqoji İnstitutda yeni təşkil edilən Pedaqoji fakültənin dekanı vəzifəsinə təyin olunub. Bir illik səmərəli elmi-pedaqoji fəaliyyət və idarəetmə qabiliyyəti onun daha məsul vəzifəyə irəli çəkilməsinə səbəb olub.1934-1942-ci illərdə ADPİ-də və ADU-da direktor müavini vəzifəsində çalışıb. 1941-ci ildə "Azərbaycan məktəblərində savad təlimi tarixi" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. 1942-ci ilin sentyabr ayından 1946-cı ilin iyun ayına kimi sovet-alman müharibəsində iştirak edib. 1946-1951-ci illərdə ADPİ-də elmi-pedaqoji fəaliyyətini davam etdirib. 1950-1951-ci illərdə Pedaqoji İnstitutda direktor vəzifəsində çalışıb.*

*1951-ci ilin noyabrında Bakı Şəhər Soveti İcraiyyə Komitəsi sədrinin müavini, 1952-ci ilin mart ayında isə Azərbaycan SSR Maarif naziri vəzifəsinə təyin edilib. O, bu vəzifədə cəmi üç il işləyib və 1954-cü ildə yenidən ADPİ-yə qayıdıb. 1956-cı ildə "Azərbaycan sovet məktəbinin tarixinə dair xülasələr" mövzusunda doktorluq dissertasiyası müdafiə edərək pedaqoji elmlər doktoru alimlik dərəcəsi alıb. Bir il sonra pedaqogika kafedrasına professor vəzifəsinə seçilib. 1959-cu ilin sentyabrında o, Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Komitəsi sədrinin birinci müavini vəzifəsinə təyin olunub. 1960-cı ildə Azərbaycan Kommunist Partiyasının XXIV qurultayında Azərbaycan KP Mərkəzi Komitəsinin üzvlüyünə namizəd seçilib, həmin ilin mart ayında yenidən Azərbaycan SSR Maarif naziri vəzifəsinə təyin olunub. Bir il sonra Azərbaycan KP Mərkəzi Komitəsinin üzvü seçilib.*

*1961-1965-ci illərdə YUNESKO-nun Yaşlıların Təhsili üzrə Məsləhət Komitəsinin daimi üzvü olmuş, Polşa, Hollandiya, Fransa və Afrika ölkələrdə rəsmi səfərlərdə olub.*

*Pedaqogikanın tarixi və nəzəriyyəsi ilə bağlı fundamental və sistemli tədqiqatların müəllifidir. 1941, 1958-1959-cu illərdə onun iştirakı və həmmüəllifliyi ilə iki hissədən ibarət "Pedaqogika" dərs vəsaiti nəşr olunub. "Azərbaycan sovet məktəbinin tarixinə dair xülasələr" (1958), "Orta məktəb şagirdlərinin əmək tərbiyəsi haqqında" (1960), "Azərbaycan məktəbləri yenidənqurma yollarında" (1960), "Məktəbdə təlim-tərbiyə işlərinin yenidən qurulması" (1961) "Azərbaycan xalq maarifi yeni yüksəlişdə" (1967), "Müasir dərsə verilən tələblər" (1971), "Dərsin təkmilləşdirilməsi yolları" (1979), "Azərbaycan xalq maarifinin sürətli inkişafı" (1980) "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin yolları" (1982) kitabları, Azərbaycanda və xaricdə nəşr edilən onlarla məqalənin müəllifidir. Onun 10 cildlik "Azərbaycan Sovet Ensiklopediyası"nda, Moskvada nəşr olunan 4 cildlik "Pedaqoji Ensiklopediya"da, 2 cildlik "Pedaqoji lüğət"də, "SSRİ xalqlarının məktəb və pedaqoji fikir tarixi" çoxcildliyində milli təhsil və pedaqoji fikir tarixi, təhsil-tərbiyənin nəzəri və praktik məsələləri ilə bağlı xeyli məqaləsi nəşr olunub.*

*9 avqust 1967-ci ildə SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü (akademiki) seçilən ilk və son azərbaycanlı alimdir. Yüksəkixtisaslı elmi-pedaqoji kadrların hazırlanmasında böyük xidmətləri olub. Rəhbərliyi və rəsmi opponentliyi ilə Moskva, Tbilisi, Bakıda onlarla namizədlik və doktorluq dissertasiyaları müdafiə olunub. SSRİ Pedaqoji Elmlər Akademiyasının müxtəlif komis-*

*siyalarına rəhbərlik edib. Maarif naziri kimi Azərbaycan müəllimlərinin 3 qurultayının (VII, VIII və IX) təşkilatçısı olub.*

*24 fevral 1980-ci ildə öz ərizəsinə əsasən Azərbaycan SSR Maarif naziri vəzifəsindən azad edilərək, Azərbaycan Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutuna (indiki Təhsil İnstitutu) elmi məsləhətçi təyin edilib. Burada o, "Mühüm pedaqoji problemlər" mövzusunda elmi-nəzəri seminara rəhbərlik edib.*

*"Lenin" ordeni, üç dəfə "Qırmızı Əmək Bayrağı" ordeni (1966, 1972, 1976), dörd dəfə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif edilib, beş dəfə (III, V, VI, VII, VIII çağırışlar) Azərbaycan SSR Ali Sovetinə deputat seçilib, Azərbaycan Respublikasının Əməkdar elm xadimi (1981) fəxri adına, SSRİ PEA-nın təsis etdiyi "N.K.Krupskaya" medalına və "Əmək veteranı" medalına layiq görülüb.*

*1 may 1984-cü ildə Bakı şəhərində vəfat etmiş, İkinci Fəxri Xiyabanda dəfn olunmuşdur.*

*Bakı şəhərindəki küçələrdən birinə, Gəncə şəhərindəki məktəblərdən birinə, Cəbrayıl rayonundakı 1 nömrəli orta məktəbə, Beyləqan rayonundakı 3 nömrəli şəhər orta məktəbinə akademik Mehdi Mehdizadənin adı verilib və məktəbin qarşısında büstü qoyulub. Azərbaycan Müəllimlərinin Yaradıcı İttifaqı 1995-ci ildə akademik Mehdi Mehdizadə adına mükafat təsis edib.*

***Həmid Musa oğlu Qədirov***
*Əməkdar elm xadimi,professor*
*(1909-1990)*



*1909-cu ildə Şamaxı şəhərində anadan olub. 1923-1927-ci illərdə pedaqoji təmayüllü 18 №-li məktəbdə təhsil alıb. 1927-ci ildə Azərbaycan Politexnik İnstitutunun[151] kənd təsərrüfatı fakültəsinə qəbul olunub, sonra Daşkənd şəhərindəki Orta Asiya Pambıqçılıq İnstitutunun III kursuna köçürülüb. 1931-ci ildə həmin institutu sahə aqronomu ixtisası üzrə bitirib. Orta Asiya Pambıqçılıq İnstitutunu bitirdikdən sonra 29 mart 1932–ci ildən 1 iyul 1932-ci ilə kimi Türkmənistanda Seraxs MTS -də sahə aqronomu işləyib. Səhhəti ilə əlaqədar olaraq öz ərizəsi ilə işdən ayrılaraq Azərbaycana qayıdıb. 20 iyul 1932-ci ildən 4 aprel 1933-cü ilə kimi Azsovxoztrestdə əmək iqtisadiyyatı sektorunun rəhbəri və əmək məsələləri üzrə iqtisadçı vəzifələrində çalışıb. 4 aprel 1933-cü ildən 4 oktyabr 1933-cü ilə kimi Salyan rayonuna ezam olunub. Salyan MTS- də aqronom işləyib. Sonra Bakıya qayıdıb və SSRİ EA Azərbaycan filialının Botanika İnstitutunda əmək fəaliyyətinə başlayıb. 1935-ci ildə həmin institutun aspiranturasına qəbul olunub. 1940-cı ildə "Kür-Araz ovalığının şimal-qərb hissəsinin yaşıllaşdırılması" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. Ali məktəblər üzrə Ümumittifaq Komitəsinin nəzdində fəaliyyət göstərən AAK tərəfindən ona 1941-ci ildə bitki coğrafiyası ixtisası üzrə dosent elmi adı verilib. Botanika İnstitutunda böyük elmi işçi, şöbə müdiri və Nəbatət bağının direktoru (1943-1949-cu illər) vəzifələrində çalışıb.*

---

*[151] Əslində o, qəbul olunarkən Bakı Politexnik İnstitutu adlanırdı. 1928-ci ildə Azərbaycan Politexnik İnstitutu adlandırıldı. Sonralar Azərbaycan Neft və Kimya İnstitutu kimi məşhurlaşdı. İndiki Azərbaycan Politexnik Universiteti həmin institutun üç fakültəsi əsasında 1950-ci ildə yaradılmışdır.*

*Aspiranturada təhsil aldığı illərdə Bakının Əmircan kəndində, sonralar isə şəhərin Oktyabr (indiki Yasamal) rayonundakı yaşlılar üçün axşam məktəbində coğrafiya müəllimi, tədris hissəsi müdiri və məktəb direktoru vəzifələrində işləyib. 1937-1940-cı illərdə əvəzçiliklə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutda baş müəllim kimi fəaliyyət göstərib.*

*Botanika İnstitutunda işləyərkən həmkarlar təşkilatının sədri, ilk partiya təşkilatının katibi və elmi işçilərin siyasi seminarının rəhbəri olub. 1946-1948-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Botanika kafedrasında dosent vəzifəsində çalışıb. 1950-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Botanika kafedrasına müdir təyin olunur və həmin vəzifədə 34 il çalışır. 1951-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun tədris və elmi işlər üzrə direktor müavini işləyir. 3 aprel 1952-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna rektor təyin olunur. O, bu vəzifədə 29 iyun 1954-cü ilə kimi çalışır. Həmid Qədirov rektor vəzifəsindən azad olunduqdan sonra yenidən tədris və elmi işlər üzrə direktor müavini təyin olunur və o, həmin vəzifədə 1964-cü ilə kimi uğurla çalışır, Mehdixan Vəkilov ADPİ-nin rektoru vəzifəsindən azad olunanda (14 sentyabr 1962-ci il) o, bir müddət rektor vəzifəsini icra edir. 1967-ci ildə Botanika kafedrasına professor vəzifəsinə seçilir. 19 iyun 1968-ci ildə SSRİ Ali Attestasiya Komissiyası onun elmi adını təsdiq edir. 1988-ci ilə kimi həmin kafedrada professor və professor-məsləhətçi kimi fəaliyyət göstərir.*

*Onun 16 dərslik və dərs vəsaiti, 100-ə yaxın elmi məqaləsi nəşr olunmuşdur. 2 mart 1973-cü ildə ona Əməkdar elm xadimi fəxri adı verilib. "Şərəf Nişanı" və "Qırmızı Əmək Bayrağı" ordenləri və 4 müxtəlif medalla, "Qabaqcıl maarif işçisi" döş nişanı ilə təltif edilib.*

*1990-cı ilin dekabrın 25- də Bakı şəhərində vəfat edib.*



***Cəbrayıl Ağaəli oğlu Ələsgərov***
*pedaqoji elmlər namizədi, dosent*
*(1907-1969)*

*1907-ci ildə Şamaxıda anadan olub. Bakıdakı I dərəcəli 76 nömrəli məktəbi bitirib. 1928-ci ildə Sənaye texnikumunu əla qiymətlərlə bitirib.1928-1932-ci illərdə Məşədi Əzizbəyov adına Politexnik İnstitutunun (indiki Azərbaycan Neft və Sənaye Universitetinə) dağ mühəndisi ixtisasında oxuyub. 1932-1935-ci illərdə V.V.Kuybışev adına Azərbaycan Elmi Tədqiqat Neft İnstitutunda (AETNİ) elmi işçi vəzifəsində çalışıb. 1924-cü ildə komsomol, 1931-ci ildə partiya sıralarına daxil olub. 1936-cı ildə Neft Texnikumunda müəllim və direktor müavini işləyib. 1937-ci ildə həmin texnikuma direktor vəzifəsinə təyin olunub. 1937-ci ilin noyabr ayından 21 iyun 1941-ci ilə kimi S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin rektoru vəzifəsində çalışıb. 1941-ci il iyun ayının 22-də rektor vəzifəsini təhvil verərək tələbələri ilə birlikdə cəbhəyə yola düşüb. 1943-cü ilin fevralında mayor Cəbrayıl Ələsgərov Şimali Qafqaz cəbhəsində döyüşlərdə iştirak edən qardaşları Ağabala və Mikayılın döyüşlərdə ölməsi xəbərini alıb. M.C.Bağırovun təklifi ilə 1943-cü il avqustun 23-də Azərbaycan K(b)P MK-nın partiya kadrları şöbəsinin bölmə müdiri - ikinci müavin vəzifəsinə təyin olunub. Bir müddət Azərbaycan KP MK-da məktəb və elm şöbəsində çalışıb. 1944-cü ilin yanvarında Azərbaycan Maarif komissarının müavini vəzifəsinə təyin olunub.*

*Azərbaycan K(b)P MK Bürosunun qərarı ilə 1944-cü ilin aprelində İran Respublikasının Təbriz şəhərinə ezam olunub, burada baş konsulluqda çalışıb. Cənubi Azərbaycanda təhsil quruculuğunda mühüm xidmətlər göstərib, orta məktəb direktoru kimi fəaliyyət göstərib. Bakıya qayıtdıqdan sonra Azərbaycan KP MK-da kadrlar üzrə iş şöbəsinin müdir müavini təyin olunub. 1944-cü ilin yanvar ayında Azərbaycan Xalq maarif komissarının kadrlarla iş üzrə müavini Məmməd Arif Dadaşzadə Ədəbiyyat və Dil İnstitutunun direktoru vəzifəsinə təyin edildiyindən, onun yerinə Cəbrayıl Ələsgərov Xalq maarif komissarının müavini təyin olunub.1 may 1947-ci ildən 16 iyun 1951-ci ilə kimi həmin vəzifədə çalışıb. Təhsil təşkilatçılığı sahəsindəki uğurlu fəaliyyətini nəzərə alaraq yenidən Azərbaycan KP MK-ya işə dəvət olunub. 1951-1952-ci illərdə Azərbaycan KP MK-nın məktəblər şöbəsinə rəhbərlik edib. 23 fevral 1952-ci ildə Azərbaycan Dövlət Universitetinin Elmi Şurasında "Cənubi Azərbaycanda xalq maarifinin inkişafı" mövzusunda dissertasiya müdafiə edərək pedaqoji elmlər namizədi elmi dərəcəsi alıb. 14 mart 1953-cü ildə onun elmi dərəcəsi SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyi yanında AAK tərəfindən təsdiq olunub.*

*16 mart 1952-ci ildən 16 mart 1954-cü ilə kimi Bolqarıstan Xalq Respublikasında Maarif nazirinin müşaviri vəzifəsində çalışıb. Bakıya qayıtdıqdan sonra V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutuna direktor təyin olunub.*

*Azərbaycan K(b)P MK -nın 1954-cü il 4 may tarixli 14 nömrəli qərarında deyilir: "V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru haqqında. Ələsgərov Cəbrayıl Ağəli oğlu, 1931-ci il noyabr ayından Sov.İKP üzvü, partiya bileti N1470389, V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun direktoru təsdiq edilməklə, H.M.Qədirov yoldaş həmin vəzifədən azad olunaraq institutun elmi işlər üzrə direktor müavini işinə keçirilsin. Sov.İKP MK-dan xahiş olunsun ki, bu qərarı təsdiq etsin.*

*Azərbaycan KP MK katibi Mustafayev İ."*

*Azərbaycan K(b)P MK -nın qərarına müvafiq olaraq 23 iyun 1954-cü ildə Azərbaycan SSR maarif naziri M.Məmmədovun əmri ilə V.İ.Lenin adına APİ-nin direktoru vəzifəsinə təyin olunub və bu vəzifədə 1 yanvar 1957-ci ilə kimi işləyib. 1957-1958-ci illərdə Azərbaycan SSR Siyasi və Elmi Bilikləri Yayan Cəmiyyətin İdarə Heyətinin məsul katibi vəzifəsində çalışıb.*

*1958-1969-cu illərdə ADU-nun Pedaqogika və psixologiya kafedrasında dosent vəzifəsində çalışıb. Onun təhsil, partiya və sovet orqanlarında səmərəli fəaliyyəti dövlət və hökumət tərəfindən yüksək qiymətləndirilib. "Qırmızı Əmək Bayrağı", "Şərəf Nişanı" ordenləri, "Qafqazın müdafiəsinə görə", "Böyük Vətən müharibəsində şərəfli əməyinə görə", "Almaniya üzərindəki qələbəyə görə" medalları ilə təltif olunub, Bakı Şəhər sovetinin deputatı seçilib.*

*1969-cu ildə Bakı şəhərində vəfat etmişdir.*

50-ci illərdə Pedaqoji İnstitutun professor-müəllimləri pedaqoji kadr hazırlığında xeyli uğurlara imza atmışdılar. Onlar nəinki respublikamızda, həm də Bolqarıstanın ali məktəblərində uğurla çalışır, kafedralara rəhbərlik edir, dərslik və dərs vəsaitləri yazır, mühazirə və seminar məşğələləri aparırdılar. Dost ölkədə uğurla çalışan 200 nəfər professor-müəllimin xeyli hissəsi Pedaqoji İnstitutun təmsilçiləri idi. Əməkdaşlığın digər forması kimi Bolqarıstanlı tələbələrin Azərbaycanın ali məktəblərində təhsil almasına üstünlük verilirdi. 1951-1957-ci illərdə 18 bolqarıstanlı tələbə Pedaqoji İnstitutun müxtəlif fakültələrində təhsil almış, ölkələrində təhsil və elm xadimləri kimi tanınmışlar.

Pedaqoji İnstitutda 50-ci illərdə təhsil alan bolqar tələbələrinin rəhbəri Mamed Mamedov, Bolqarıstan EA-nın əməkdaşı Çingiz Xakov, kimya müəllimi Rəsmiyyə Naimova 80-ci illərdə dogma institutda olarkən ADPİ-nin adını şərəflə qoruduqlarını bildirmişdilər[152].

---
[152] *"Gənc müəllim" qəzeti 23 may 1980*

Pedaqoji İnstitutda 1954-cü ilin oktyabr ayında müstəqil ***Bədən tərbiyəsi*** fakültəsi yaradıldı. 1956/57-ci tədris ilindən etibarən pedaqoji institutların 5 illik təhsil müddətinə (Bədən tərbiyəsi fakültəsi istisna edilməklə) keçilməsi ilə əlaqədar olaraq fakültələrin kadr hazırlama imkanları genişləndi. Həmin dövrdə institutda ***Tarix-filologiya, Fizika-riyaziyyat, Təbiyyat-coğrafiya*** *və* ***Bədən tərbiyəsi*** fakültələri fəaliyyət göstərirdi. Bu tədbirlərin həyata keçirilməsi nəticəsində institutu bitirən gənclər təhsil müddəti ərzində iki ixtisas qazanmaq imkanı əldə etdilər. Bununla yanaşı, institutda politexnik təlim üzrə müəllimlər hazırlanmasına başlanıldı.

1958/1959-cu tədris ilindən ibtidai sinif müəllimi hazırlayan ***İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsi*** açıldı. Həmin ildə fakültəyə 200 tələbə qəbul olundu. Fakültənin nəzdində *İbtidai təhsil pedaqogikası və metodikası kafedrası* yaradıldı.

1951-1958-ci illərdə V.İ.Lenin adına ADPİ-də tələbələrin inkişaf dinamikası aşağıdakı kimi olmuşdur:

| Tədris ili | Cəmi (ilin əvvəli üçün) | Qəbul | Buraxılış |
|---|---|---|---|
| 1950/1951 | 1987 | 600 | 370 |
| 1951/1952 | 2057 | 600 | 407 |
| 1952/1953 | 2230 | 700 | 478 |
| 1953/1954 | 2509 | 807 | 690[4] |
| 1954/1955 | 2490 | 800 | 387 |
| 1955/1956 | 2662 | 625 | 478 |
| 1956/1957 | 2734 | 628 | 681 |
| 1957/1958 | 2623 | 675 | 91[5] |
| 1958/1959 | 3256 | 775 | 621 |

Cədvəldən də göründüyü kimi, 50-ci illərdə Pedaqoji İnstituta qəbul olunan tələbələrin və məzunların sayı ildən-ilə artmışdır. 1950/51-ci tədris ilində institutda 1987 tələbə oxuduğu halda, 1958/59-cu tədris ilində tələbələrin ümumi sayı 3256 nəfər olmuşdu. Məzunların da sayı 370-dən 621 nəfərə yüksəlmişdi[155].

Müharibədən sonrakı illərdə ümumtəhsil məktəb şəbəkəsinin genişlənməsi müəllim kadrlarına olan ehtiyacı kəskin şəkildə artırmışdı. Müqayisə üçün qeyd edək ki, 25 il müddətində (1921-1946-cı illərdə) Pedaqoji İnstitutu 7000 nəfər bitirdiyi halda, 1947-ci ildən (bərpa olunduqdan sonra ilk buraxılış ili) 1958-ci ilə kimi institutun 4466 nəfər məzunu olmuşdu. Onlardan da 3338 nəfəri Azərbaycan (74,6%), 509 nəfəri rus (11,4%), 619 nəfəri erməni (14%) bölməsinin məzunları idi.

1953-1955-ci illərdə Pedaqoji İnstitutun Təbiət və Fiziki-riyaziyyat fakültələrində tələbələrin politexnik təhsilinin gücləndirilməsi məqsədilə tədris planında bir sıra dəyişikliklər edildi.

1951-1958-ci illərdə ayrı-ayrı fakültələr və bölmələr üzrə tələbə buraxılışı aşağıdakı kimi olmuşdur:

[153] *Pedaqoji İnstitutun nəzdindəki Müəllimlər İnstitutunun 1954-cü il məzunlarının sayı da buraya əlavə olunmuşdur.*
[154] *Məzunların sayının azalması ali pedaqoji təhsilin 5 illik olması ilə bağlı idi. 91 nəfər Tarix fakültəsinin rus bölməsinin və Bədən tərbiyəsi fakültəsinin məzunları idi.*
[155] *Azərbaycan Respublikasının Dövlət Arxivi F.1656, siy.2,iş.164,v.6*

| Fakültə/ bölmə | 1951 | 1952 | 1953 | 1954 | 1955 | 1956 | 1957 | 1958 |
|---|---|---|---|---|---|---|---|---|
| **I.Tarix** | | | | | | | | |
| 1.Azərbaycan | 70 | 56 | 49 | 43 | 56 | 48 | 51 | - |
| 2.Rus | - | - | - | - | - | - | - | 32 |
| 3.Erməni | 24 | - | - | 28 | - | - | 25 | - |
| **Cəmi** | **94** | **56** | **49** | **71** | **56** | **48** | **76** | **32** |
| **II.Dil** və ədəbiyyat | | | | | | | | |
| 1.Azərbaycan | | | | | | | | |
| 2.Rus | 104 | 69 | 86 | 62 | 89 | 117 | 127 | - |
| 3.Erməni | 58 | 113 | 152 | - | - | - | - | - |
| | - | 25 | 29 | 1 | 26 | 23 | - | - |
| **Cəmi** | **162** | **207** | **267** | **63** | **115** | **140** | 127 | - |
| **III.Fizika-riyaziyyat** | | | | | | | | |
| 1.Azərbaycan | 28 | 43 | 42 | 58 | 94 | 139 | 196 | - |
| 2.Rus | - | - | - | - | - | - | 42 | - |
| 3.Erməni | 10 | 11 | 21 | 20 | 18 | 15 | 19 | - |
| **Cəmi** | **38** | **54** | **63** | **78** | **112** | **154** | **257** | |
| **IV.Təbiyyat-kimya** | | | | | | | | |
| 1.Azərbaycan | 32 | 36 | 43 | 46 | 38 | 45 | 53 | - |
| 2.Rus | - | - | - | - | - | - | - | - |
| 3.Erməni | - | 18 | - | 28 | - | - | 23 | - |
| **Cəmi** | **32** | **54** | **43** | **74** | **38** | **45** | **76** | **-** |
| **V.Coğrafiya** | | | | | | | | |
| 1.Azərbaycan | 44 | 36 | 35 | 23 | 46 | 50 | 49 | - |
| 2.Rus | - | - | - | - | - | - | - | - |
| 3.Erməni | - | - | 21 | - | - | - | 26 | - |

| | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| **Cəmi** | **32** | **54** | **43** | **74** | **38** | **45** | **76** | **-** |
| **V.Coğrafiya** | | | | | | | | |
| 1.Azərbaycan | 44 | 36 | 35 | 23 | 46 | 50 | 49 | - |
| 2.Rus | - | - | - | - | - | - | - | - |
| 3.Erməni | - | - | 21 | - | - | - | 26 | - |
| **Cəmi** | **44** | **36** | **56** | **23** | **46** | **50** | **75** | **-** |
| VI.Bədən tərbiyəsi | | | | | | | | |
| VII.Müəllimlər | - | - | - | 20 | 20 | 41 | 70 | 59 |
| institutu | | | | | | | | |
| | - | - | - | 361 | - | - | - | - |
| **Ümumi cəm:** | **370** | **407** | **478** | **690** | **387** | **478** | **681** | **91** |

Cədvəldən də göründüyü kimi, 1951-1958-ci illərdə Pedaqoji İnstitutu bitirən 3454 tələbədən 2646 nəfəri (76,6%) Azərbaycan bölməsini, 397 nəfəri (11,5%) rus bölməsini, 411 nəfəri erməni bölməsini (11,9) bitirmişdir.

1956/1957-ci tədris ilində Pedaqoji İnstitutda 23 kafedra fəaliyyət göstərirdi. Kafedraların kadr potensialı aşağıdakı kimi idi.

1.*Sov.İKP tarixi kafedrası* - 12 nəfər (müdir dos.Mehdixan Vəkilov, 2 dosent, 8 müəllim, 2 assistent);

2.*Dialektik və tarixi materializm kafedrası* - 7 nəfər (müdir dos. Q.Simonyan, 3 dosent, 3 baş müəllim, 1 müəllim);

3.*Pedaqogika və psixologiya kafedrası* - 16 nəfər (müdir prof.Əhməd Seyidov, 3 professor, 5 dosent, 5 baş müəllim, 3 müəllim);

4.*Siyasi iqtisad kafedrası* - 6 nəfər (müdir dos.Z.Cahangirov,1 dosent, 5 müəllim);

5.*Azərbaycan dili və onun tədrisi metodikası kafedrası*- 12 nəfər (müdir prof.Əbdüləzəl Dəmirçizadə, 1 professor, 4 dosent, 3 baş müəllim, 4 müəllim);

6.*Ədəbiyyat və ədəbiyyatın tədrisi metodikası kafedrası* - 7 nəfər (müdir prof.Mikayıl Rəfili, 1 professor, 5 dosent, 1 baş müəllim);

7.*Rus dili kafedrası* - 15 nəfər (müdir baş müəllim İ.Yudkin, 5 baş müəllim, 5 müəllim, 5 assistent);

8.*Erməni dili və ədəbiyyatı kafedrası* -13 nəfər (müdir prof.Q.Antonyan, 1 professor, 2 dosent, 1 baş müəllim, 9 müəllim);

9.*SSRİ tarixi kafedrası*-8 nəfər (müdir dos.Cəfər İbrahimov, 3 dosent, 5 baş müəllim);

10.*Ümumi tarix kafedrası* -5 nəfər (müdir baş müəllim Məmməd Şıxlı, 1 dosent, 4 baş müəllim);

11.*Ümumi fizika kafedrası*- 12 nəfər (müdir prof.A.Abaszadə, 1 professor, 3 dosent, 2 baş müəllim, 1 müəllim, 5 assistent);

12.*Nəzəri fizika və mexanika kafedrası*- 12 nəfər (müdir dos.Y.Məmmədov, 2 dosent, 2 baş müəllim, 1 müəllim, 1 assistent);

13.*Ali cəbr və həndəsə kafedrası*- 10 nəfər (müdir dos.Bəhram Yusifzadə, 2 dosent, 2 baş müəllim, 3 müəllim, 3 assistent);

14.*Riyazi analiz kafedrası*- 11 nəfər (müdir prof.İ.İbrahimov, 1 professor, 5 dosent, 3 baş müəllim, 2 assistent);

15.*Elementar riyaziyyat, fizika və riyaziyyatın metodikası kafedrası* - 20 nəfər (müdir dos.B.Şəfizadə, 5 dosent, 7 baş müəllim, 3 müəllim, 5assistent);

16.*Kimya kafedrası*- 9 nəfər (müdir prof. Ş.Məmmədov, 1 professor, 4 dosent, 4 assistent);

17.*Botanika kafedrası* – 10 nəfər (müdir dos. Həmid Qədirov, 1 professor, 5 dosent, 1 baş müəllim, 1 müəllim, 2 assistent);

18.*Zoologiya kafedrası*- 10 nəfər (müdir prof. Zəhra Şahtaxtinskaya, 1 professor, 4 dosent, 1 baş müəllim, 1 müəllim, 3 assistent);

19.*İnsan və heyvan fiziologiyası kafedrası* - 8 nəfər (müdir dos.T.Qayıbov, 4 dosent, 3 baş müəllim, 1assistent);

20.*Fiziki və iqtisadi coğrafiya kafedrası* - 9 nəfər (müdir dos.S.Şükürov, dosent, 3 baş müəllim, 1 müəllim);

21.*Bədən tərbiyəsi kafedrası* -12 nəfər (müdir baş müəllim H.Mirzəyev, 4 baş müəllim, 8 müəllim);

22.*Bədən tərbiyəsinin nəzəriyyə və metodikası kafedrası* -16 nəfər (müdir baş müəllim İ.Ə.Aslanov, 6 baş müəllim, 10 müəllim);

23.*İstehsalat əsasları kafedrası* -14 nəfər (müdir dos.A.Mustafayev, 4 dosent, 3 baş müəllim, 3 müəllim, 4 assistent).

Pedaqoji İnstitutun 248 nəfər əməkdaşından 11 nəfəri professor, 69 nəfəri dosent, 64 nəfəri baş müəllim, 67 nəfəri müəllim, 37 nəfəri assistent idi.

Pedaqoji İnstitutda ildən-ilə tələbə qəbulunun və məzunların sayının artması ümumtəhsil məktəblərində çalışan ali təhsilli müəllimlərin sayının artmasında mühüm rol oynadı. 1946-cı ilə kimi Pedaqoji İnstitutda 7000 nəfərə yaxın müəllim kadrları hazırlanmışdı. O dövrdə respublikanın 454 orta məktəbində dərs deyən tam ali təhsilli müəllimlərin 80 faizindən çoxu, pedaqoji məktəblərdə dərs deyənlərin 90 faizindən çoxu ADPİ-nin yetirmələri idi[156]. Sonrakı illərdə onların sayı daha da artdı. 1946/47-ci tədris ilində ümumtəhsil məktəblərində işləyən müəllimlərin cəmi 10,5 % -nin ali təhsili vardısa, 1955/56-cı tədris ilində bu rəqəm 27,9 %-ə yüksəlmişdi.

***1946-1956-ci illərdə ümumtəhsil məktəblərində fəaliyyət göstərən müəllimlərin təhsillilik səviyyəsi***

| İllər | Cəmi | O cümlədən | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | Ali təhsillilər | | Nataman ali təhsillilər | | Orta pedaqoji təhsillilər | | Orta təhsillilər | | Orta təhsili olmayanlar | |
| | | Sayı | Faizlə | Sayı | Faizlə | Sayı | Faizlə | Sayı | Faizlə | Sayı | Faizlə |
| 1946/47 | 21873 | 2288 | 10,5 | 3764 | 17,2 | 11511 | 52,7 | 3116 | 14,2 | 1194 | 5,4 |
| 1947/48 | 22645 | 2467 | 10,9 | 4354 | 19,2 | 12718 | 56,2 | 2300 | 10,2 | 806 | 3,5 |
| 1948/49 | 23626 | 2913 | 12,3 | 4616 | 19,5 | 13461 | 57 | 2100 | 8,9 | 536 | 2,3 |
| 1949/50 | 24394 | 3187 | 13,1 | 5457 | 22,3 | 13315 | 54,6 | 2016 | 8,3 | 419 | 1,7 |
| 1950/51 | 25377 | 3976 | 15,7 | 6156 | 24,3 | 13268 | 52,2 | 1656 | 6,5 | 321 | 1,3 |
| 1951/52 | 26397 | 4793 | 18,1 | 7170 | 27 | 12637 | 47,9 | 1526 | 5,8 | 271 | 1,1 |
| 1952/53 | 27745 | 5670 | 20,3 | 8093 | 29,1 | 12286 | 44,3 | 1424 | 5,1 | 272 | 1 |

[156] **Rüstəmov F.** *Azərbaycan Dövlət Pedaqoji Universitetinin inkişafının ikinci mərhələsi (1930-1946). Bakı: Elm və təhsil, 2021, s.108*

| | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| 1953/54 | 30037 | 6867 | 22,9 | 9502 | 31,6 | 12342 | 41,1 | 1079 | 3,6 | 247 | 0,8 |
| 1954/55 | 32438 | 8017 | 25 | 10447 | 32,2 | 12701 | 39,1 | 1060 | 3,2 | 213 | 0,5 |
| 1955/56 | 33916 | 9456 | 27,9 | 10164 | 30 | 13219 | 39 | 889 | 2,6 | 188 | 0,51 |

50-ci illərdə respublikada aspirantura yolu ilə yüksəkixtisaslı elmi-pedaqoji kadr hazırlığına, professor-müəllim heyətinin sıralarının elmi dərəcəlilərin hesabına gücləndirilməsinə, elmi-tədqiqat işlərinin nəzəri və praktik əhəmiyyətinin artırılmasına xüsusi əhəmiyyət verilirdi.

1952/53-cü tədris ilində Pedaqoji İnstitutda 15 kafedra üzrə 40 nəfər aspirant təhsil alırdı ki, onların da əksəriyyəti institutun məzunları idi. Aspirantura yolu ilə elm kadr hazırlığına xüsusi fikir verilirdi. 1950-1959-cu illərdə ADPİ-də aspirantların inkişaf dinamikası aşağıdakı kimi olmuşdur:

| Tədris illəri | Cəmi | Qəbul | Buraxılış |
|---|---|---|---|
| 1950-1951 | 36 | 15 | 9 |
| 1951-1952 | 36 | 11 | 7 |
| 1952-1953 | 40 | 14 | 13 |
| 1953-1954 | 36 | 11 | 12 |
| 1954-1955 | 35 | 9 | 11 |
| 1955-1956 | 30 | 10 | 15 |
| 1956-1957 | 30 | 10 | 12 |
| 1957-1958 | 30 | 11 | 11 |
| 1958-1959 | 30 | 10 | 12 |



***Mehdixan Yusif oğlu Vəkilov***
*tarix elmləri doktoru, professor,*
*Əməkdar elm xadimi*
*(1902-1973)*

*1902-ci il iyun ayının 15-də Qazax qəzasının Yuxarı Salahlı kəndində anadan olub. 1910-1914-cü illərdə dörd sinifli kənd məktəbində, 1914-1917-ci illərdə Cənubi Qafqaz müftisi Hüseyn əfəndi Qayıbzadənin Tiflisdə yoxsullar üçün təsis etdiyi pansion tipli məktəbdə oxuyub. 1924-cü ildə Qazax Müəllimlər Seminariyasını bitirib. Gəncə qəza məktəblərində müfəttiş (1924-1925), Quba qəza maarif şöbəsində müdir (1925-1926) və Şuşa şəhərində təşkil olunmuş müəllimlər kursunda müdir (1926) vəzifələrində çalışıb. 1931-ci ildə Azərbaycan*

*Pedaqoji İnstitutunun Tarix şöbəsini bitirib. 1927-1929-cu illərdə Balaxanı, Suraxanı fabrik-zavod məktəblərində, 1929-1930-cu illərdə Kooperativ Texnikumunda ictimaiyyat fənnindən dərs deyib, Qəbələdə (1931) tarix müəllimi işləyib. Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda, pedaqoji məktəbdə, partiya məktəbində (1931-1933), Bakı kolxoz məktəbində (1933-1934) ictimai fənlərdən dərs deyib, 1934-1938-ci illərdə Xalq Maarif Komissarlığında müfəttiş, 1938-1941-ci illərdə Respublika Xalq Komissarları Soveti yanında İncəsənət işləri idarəsində teatr şöbəsinin müdiri və SSRİ EA-nın Azərbaycan filialının Tarix İnstitutunun şöbə müdiri (1940-1942) vəzifələrində çalışıb.*

*Azərbaycan KP MK tərəfindən 40-cı illərin əvvəllərində Təbriz şəhərinə ezam olunmuşdur. 1941-ci ilin sentyabr ayından 1942-ci ilin may ayına kimi Təbrizdə nəşr edilən "Vətən yolunda" qəzetində (redaktoru Mirzə İbrahimov) və "Azərbaycan" (redaktoru İsmayıl Şəms) qəzetlərində çalışıb. 1942-ci ildə Təbrizdən Qazaxa qayıdaraq az bir müddətdə Qazax Rayon Zəhmətkeş Deputatları Soveti İcraiyyə Komitəsinin sədri işləyib. 1942-ci ilin noyabr ayından 1945-ci ilin may ayına qədər Ağstafa rayon Partiya Komitəsinə rəhbərlik edib. Sonrakı illərdə Azərbaycan SSR Xalq Komissarları Sovetinin Poliqrafiya və nəşriyyat işləri idarəsinə rəhbərlik edib (1945-1949), S.M.Kirov adına Azərbaycan Dövlət Universitetində və Ü.Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyasında ictimai fənlərdən dərs deyib (1946-1956). 30 iyun 1954-cü ildə S.M.Kirov adına ADU-nun Elmi Şurasında "Kommunist Partiyasının Azərbaycanda mədəni quruculuq tədbirləri (1921-1925-ci illər)" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. 14 aprel 1956 -cı ildə SSRİ Ali Təhsil Nazirliyi yanında AAK tərəfindən ona Marksizm-leninizm kafedrası üzrə dosent elmi adı verilib. 1956-cı ilin dekabr ayından 1962-ci ilin oktyabr ayına kimi Azərbaycan Dövlət Pedaqoji İnstitutunda rektor vəzifəsində çalışıb.*

*12 dekabr 1969-cu ildə ADU-nun Elmi Şurasında "Kommunist Partiyası Azərbaycanda mədəni inqilabın təşkilatçısıdır" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 7 aprel 1971-ci ildə ona SSRİ tarixi kafedrası üzrə professor elmi adı verilib. Uzun müddət SSRİ tarixi kafedrasının müdiri olub.*

*Azərbaycan Kommunist Partiyasının XXII qurultayında Təftiş Komissiyasının üzvü seçilib, uzun müddət Azərbaycan KP MK-nın ştatdankənar mühazirəçisi kimi fəaliyyət göstərib. Bakı şəhər sovetinin (1959-1960) üzvü olub. V çağırış Azərbaycan SSR Ali Sovetinin deputatı, 1959-1963-cü illərdə Azərbaycan SSR Ali Sovetinin sədr müavini olub. 2 dəfə "Şərəf nişanı" ordeni (1943, 1964), "Birinci dərəcəli Böyük Vətən müharibəsi ordeni" (1944), müxtəlif medallarla və Azərbaycan SSR Ali Sovetinin Fəxri fərmanları ilə təltif olunub. Azərbaycan SSR Ali Sovetinin qərarı ilə ona Əməkdar elm xadimi (1973) fəxri adı verilib. "Qabaqcıl maarif xadimi" (1973) döş nişanı ilə təltif olunub.*

*"Minin və Pojarski" (1941), "Cavanşir" (1941,1943,1992), "Azərbaycanda mədəniyyətin çiçəklənməsi" (1955), "Ömür dedikləri bir karvan yolu"(1986),"Anadillər" (1991), "Cavanşir" (Təbriz, 2004), "Anadillər" (Təbriz, 2004), "Azərbaycanda mədəni inqilab: 1920-1940-cı illər" (2005) adlı elmi və bədii kitabları, 40-dan artıq elmi məqaləsi nəşr olunub.*

*18 oktyabr 1975-ci ildə Bakı şəhərində vəfat etmiş və II Fəxri Xiyabanda dəfn olunmuşdur.*

50-ci illərdə yalnız Pedaqoji İnstitutda deyil, respublikanın digər ali pedaqoji məktəblərində də tələbələrin sayı xeyli artmışdı. 1957-ci ildə respublikanın ali pedaqoji məktəblərində təhsil alan 9306 tələbənin təhsil-tərbiyəsi ilə 483 professor-müəllim məşğul olurdu ki, onlardan da 187 nəfərinin elmi dərəcəsi və elmi adı var idi.

| İnstitutların adı | Tələbələrin sayı | Müəllimlərin sayı | Elmi dərəcəsi və elmi adı olanlar |
|---|---|---|---|
| V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutu | 2734 | 201 | 99 |
| M.F.Axundov adına Azərbaycan Rus dili və Ədəbiyyatı Pedaqoji İnstitutu | 1004 | 87 | 31 |
| Azərbaycan Xarici Dillər İnstitutu | 612 | 64 | 15 |
| H.Zərdabi adına Kirovabad Pedaqoji İnstitutu | 1120 | 78 | 21 |
| Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutu | 3836 | 53 | 21 |
| **Yekun** | **9306** | **463** | **187** |

Respublika Nazirlər Soveti 1959-cu il mayın 26-da “Azərbaycan ali pedaqoji məktəblərin profilləri haqqında” qərar qəbul etdi. Qərarın qəbul edilməsində əsas məqsəd müəllim kadrları hazırlığının keyfiyyətini yaxşılaşdırmaq idi. Həmin qərara uyğun olaraq Azərbaycan Qiyabi Pedaqoji İnstitutu bütünlüklə, Kirovabad Pedaqoji İnstitutunun Tarix-filologiya fakültəsi isə həmin ilin (1959-cu ilin) iyul ayının 1-də ADPİ-yə birləşdirildi. Ali qiyabi təhsilə nəzarəti gücləndirmək məqsədilə ADPİ-də qiyabi şöbə üzrə prorektor vəzifəsi yaradıldı. Heç bir praktik əhəmiyyət kəsb etməyən, institutlarda tədris həyatının pozulmasına səbəb olan birləşdirmə və ayrılma tendensiyaları davam etdirildi. Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Bədən tərbiyəsi fakültəsi Azərbaycan Dövlət Bədən Tərbiyəsi İnstitutuna, Coğrafiya fakültəsi isə Azərbaycan Dövlət Universitetinə verildi. Kirovabad (Gəncə) Pedaqoji İnstitutunun Tarix fakültəsinin Pedaqoji İnstituta, Pedaqoji İnstitutun Coğrafiya fakültəsinin ADU-ya verilməsi yanlış addım idi. Bu birləşmələr onu göstərir ki, həmin dövrdə Azərbaycanda pedaqoji ali təhsilin inkişafı strategiyası işlənib hazırlanmamışdı. 20-ci illərdə əsası qoyulan birləşdirmə və ayrılma tendensiyası, təəssüf ki, sonralar da davam etdirildi.

ADPİ-nin yenidən qurulması onun maddi-texniki bazasının xeyli möhkəmlənməsinə, tələbələrin sayının artmasına imkan verdi. Əgər 1958/59-cu tədris ilində institutda cəmi 3256 nəfər tələbə oxuyurdusa, 1959/60-cı tədris ilində birləşdirmə nəticəsində burada təhsil alanların sayı 7208 nəfərə çatdı. 1958/59-cu tədris ilində institutu 552 nəfər bitirmişdisə, 1959/60-cı tədris ilində respublikanın orta məktəbləri üçün 962 nəfər müəllim hazırlanmışdı.

60-cı illərdə xüsusi məktəblər üçün müəllim kadrlarının (defektoloq ların) hazırlanması vacib məsələlərdən biri idi. Pedaqoji İnstitutda zəruri infrastruktur və mütəxəsiss olmadığından Azərbaycan məktəbləri üçün defektoloq ixtisası üzrə mütəxəsiss hazırlığının Moskva Dövlət Pedaqoji İnstitutunda həyata keçirilməsi nəzərdə tutulmuşdu. 1964-cü ildə Moskva Dövlət Pedaqoji İnstitutunda Azərbaycan Dövlət Pedaqoji İnstitutu tərəfindən göndərilən 8 tələbə - Mənsur Abbasov (I kurs), Vaqif Məmmədov (II kurs), Cahangir Məmmədzadə (II kurs), Tofiq Hüseynov (II kurs), Roza İsrafilzadə (II kurs), Elmira Mirzəyeva (II kurs), Rəhilə Mirzəyeva (II kurs), Sona Nüsrət qızı (II

kurs) təhsil alırdı. ADPİ üzrə 3 iyun 1964-cü il 114 №-li əmrə görə, həmin tələbələrin təqaüdləri Pedaqoji İnstitut tərəfindən ödənilmişdir.

30 yanvar 1968-ci ildə ümumuniversitet kafedrası olan Fəlsəfə və elmi kommunizm kafedrasının bazasında Fələsəfə və Elmi kommunizm kafedraları təşkil edildi. Fəlsəfə kafedrasına rəhbərlik dos.Mürsəl Əliyevə, Elmi kommunizm kafedrasına rəhbərlik Oqtay Rəhimova həvalə edildi.

SSRİ Ali və Orta İxtisas Təhsil Nazirliyi 15 iyun 1962-ci ildə ali məktəblərin yeni Əsasnaməsini təsdiq etdi. Həmin Əsasnamənin tələblərinə uyğun olaraq 4 dekabr 1968-ci ildə ADPİ-nin rektoru, prof.Ş.S.Ağayevin imzaladığı 527 saylı əmrlə Tarix-filologiya fakültəsinin (dekan dos.H.Qasımzadə) bazasında Tarix və Filologiya, Fizika-riyaziyyat fakültəsinin (dekan dos.T.Xasməmmədov) bazasında Fizika və Riyaziyyat, Kimya və biologiya fakültəsinin (dos.F.Əliyev) bazasında Kimya və Biologiya-coğrafiya fakültələri yaradıldı.

Filologiya fakültəsinə Azərbaycan ədəbiyyatı və onun tədrisi metodikası kafedrasının dosenti Mürsəl Həkimov, Fizika fakültəsinə Elementar riyaziyyat və onun tədrisi metodikası kafedrasının dosenti Sadıq Sadıqov, Eksperimental və nəzəri fizika kafedrasının dosenti Əlisa Əhmədov, Riyaziyyat fakültəsinə Riyazi analiz kafedrasının dosenti Şəmistan Məmmədov, Eksperimental və nəzəri fizika kafedrasının baş müəllimi Vəli Nağıyev, Biologiya- coğrafiya fakültəsinə Ümumi coğrafiya kafedrasının baş müəllimi Vasif Nəbiyev dekan müavinləri təyin edildilər.

16 dekabr 1968-ci ildə ADPİ Elmi Şurasının qərarı ilə Zoologiya kafedrasının əsasında Zoologiya və Biologiyanın tədrisi metodikası yaradıldı. Biologiyanın tədrisi metodikası kafedrasına pedaqoji elmlər namizədi, dosent Firudin Əliyev təyin olundu. Kafedranın 8 nəfər əməkdaşı (dos.Ə.Ə.Salahov, b/m. T.R.Tahirzadə, b/m.H.O.Hacıyev, b/m. R.Y.Ayriyeva, b/m.T.Rüstəmov, b/m.Ə.Quliyev, assistentlər G.S.Məmmədova və Ə.M.Hacıyeva) vardı

1970-ci illərin əvvəllərində Pedaqoji İnstitutda əyani şöbədə 9, qiyabi şöbədə 6, axşam şöbəsində isə 2 fakültə fəaliyyət göstərirdi.

Əyani şöbənin 9 fakültəsində 8200 tələbə təhsil alırdı[157]

**Biologiya** fakültəsində 216 tələbənin təhsil-tərbiyəsi ilə 46 nəfər professor-müəllim (5 elmlər doktoru, professor, 15 elmlər namizədi, dosent) məşğul olurdu. Təlim Azərbaycan və rus dillərində aparılan fakültədə 4 kafedra fəaliyyət göstərirdi:1) Zoologiya (kafedra müdiri prof.Zəhra Şahtaxtinskaya); 2) Botanika (kafedra müdiri prof.Həmid Qədirov); 3) İnsan və heyvan fiziologiyası (kafedra müdiri prof.Rza Səfərov); 4) Biologiyanın tədrisi metodikası (kafedra müdiri dos. Firidun Əliyev). 1972-ci ildə fakültənin cəmi 48 nəfər məzunu olmuşdur.

**Tarix** fakültəsində 702 tələbənin təhsil-tərbiyəsi ilə 40 nəfər professor-müəllim (5 elmlər doktoru, professor, 15 elmlər namizədi, dosent) məşğul olurdu. Təlim Azərbaycan və rus dillərində aparılan fakültədə 3 kafedra fəaliyyət göstərirdi: 1) SSRİ tarixi (kafedra müdiri prof Cəfər İbrahimov); 2) Ümumi tarix (kafedra müdiri dos.Məmməd Şıxlı); 3)Azərbaycan tarixi (kafedra müdiri prof Nəzər Paşayev). Fakültə 1921-1972-ci illərdə 2300 yüksək ixtisaslı tarix müəllimi hazırlamışdı.

**Riyaziyyat** fakültəsində 1885 nəfər tələbə təhsil alırdı. Təlim Azərbaycan, rus və erməni dillərində aparılan fakültədə 6 kafedra fəaliyyət göstərirdi:1) Cəbr və ədədlər nəzəriyyəsi (kafedra müdiri prof.Mais Cavadov); 2) Riyazi analiz (kafedra müdiri dos.Əli Cəfərov); 3) Həndəsə (kafedra müdiri dos.Bəhram Yusifzadə); 4) Elementar riyaziyyat və onun tədrisi metodikası (kafedra müdiri dos. Əsəd İbrahimov); 5)Ümumi riyaziyyat (kafedra müdiri dos.Şamil Vəkilov); 6) Hesablama riyaziyyatı və ehtimal nəzəriyyəsi (dos. Hüseyn Əliyev). 1972-ci ildə fakültənin 546 nəfər məzunu olmuşdur.

**Filologiya** fakültəsində 1229 nəfər tələbənin təhsil-tərbiyəsi ilə 160 nəfər professor-müəllim (o cümlədən, 1 nəfər Azərbaycan EA-nın həqiqi üzvü, 1 nəfər müxbir üzvü, 4 elmlər doktoru, professor) məşğul olurdu. Təlim Azərbaycan, rus və erməni dillərində aparılan fakültədə 6 kafedra fəaliyyət göstərirdi: 1)Azərbaycan ədəbiyyatı və onun tədrisi

[157] *V.İ.Lenin adına Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutu. Bakı,1972, s.8*

metodikası (kafedra müdiri akademik Feyzulla Qasımzadə); 2) Azərbaycan dilçiliyi (kafedra müdiri Azərbaycan EA-nın müxbir üzvü, prof.Əbdüləzəl Dəmirçizadə); 3) Azərbaycan dili və onun tədrisi metodikası (kafedra müdiri prof.Ağaməd Abdullayev); 4) Rus dili (kafedra müdiri dos. Tamrus Əliyeva); 5) Xarici dillər (pedaqoji elmlər namizədi Arif Tahirov); 6) Erməni dili və ədəbiyyatı (prof.Qurgen Antonyan). 1972-ci ildə fakültənin180 nəfər məzunu olmuşdur.

**Fizika** fakültəsi 1968-ci ildə Fizika-riyaziyyat fakültəsinin əsasında yaranmışdı. Fakültədə 843 tələbə təhsil alırdı.1970/71-ci tədris ilində fakültəni 228 nəfər,1971/72-ci tədris ilində 246 nəfər bitirmişdi. Təlim Azərbaycan, rus və erməni dillərində aparılan fakültədə 3 kafedra fəaliyyət göstərirdi:1) Eksperimental və nəzəri fizika (kafedra müdiri dos.Albert Qılmanov); 2) Ümumi fizika və astronomiya (kafedra müdiri dos Absəddin Məmmədov); 3) Fizikanın tədrisi metodikası (kafedra müdiri dos.Teyfur Xasməmmədov).

**Coğrafiya** fakültəsində 1265 tələbənin təhsil-tərbiyəsi ilə 44 professor-müəllim (1 elmlər doktoru, professor, 30 elmlər namizədi, dosent) məşğul olurdu. Coğrafiya fakültəsi 1934-cü ildə Tarix fakültəsinin şöbəsi kimi təşkil edilmişdi. 1936-1937-ci illərdə müstəqil fakültə kimi fəaliyyət göstərmişdir. O zaman fakültədə 150 nəfər tələbə oxuyurdu. Azərbaycanda ilk coğrafiya müəllimləri Pedaqoji İnstitutda hazırlanmışdır.1938-ci ildə fakültəni ilk dəfə olaraq 38 məzun bitirmişdir. 1959-cu ildə fakültə ADU-nun Coğrafiya fakültəsi ilə birləşdirilmişdir. 1966-cı ildə Pedaqoji İnstitutun Biologiya fakültəsinin nəzdində yaradılan coğrafiya şöbəsi üç il sonra müstəqil fakültəyə çevrildi. Təlimin Azərbaycan və rus dillərində aparıldığı fakültədə iki ixtisas kafedrası fəaliyyət göstərirdi:1)Fiziki coğrafiya (müdir prof.Nurəddin Kərəmov); 2) İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası (müdir prof.N.Allahverdiyev).

**İbtidai təhsilin pedaqogikası və metodikası** fakültəsində 256 tələbənin təhsil-tərbiyəsi ilə 45 professor-müəllim məşğul olurdu. 1972-ci ilə kimi fakültədə 1520 nəfər ali təhsilli ibtidai sinif müəllimi və məktəbəqədər tərbiyə işçiləri hazırlamışdır. Fakültə 1958/59-cu tədris ilində təşkil edilmişdi. Fakültənin ilk tədris planı və fənn proqramları Moskva və Leninqrad Pedaqoji İnstitutlarının müvafiq fakültə və kafedralarının əməkdaşları ilə birlikdə hazırlanmışdı. Təlimin Azərbaycan və rus dillərində aparıldığı fakültədə 4 kafedra fəaliyyət göstərirdi:1)İbtidai təhsilin pedaqogikası və metodikası (kafedra müdiri dos.Mərdan Muradxanov); 2) Məktəbəqədər pedaqogika (kafedra müdiri dos. Əfşan Qədimbəyova); 3) Rəsm və musiqinin tədrisi metodikası (dos.Paşa Hacıyev); 4) Riyaziyyatın ibtidai kursunun tədrisi metodikası (dos.Nüsrət Sadıqov).

**Kimya** fakültəsində 629 tələbənin təhsil-tərbiyəsi ilə 50 professor-müəllim (2 elmlər doktoru, professor, 12 elmlər namizədi, dosent) məşğul olurdu. 1968-ci ilin dekabrına kimi Kimya fakültəsi Təbiyyat fakültəsinin şöbəsi olub. Təlimin Azərbaycan və rus dillərində aparıldığı fakültədə 3 kafedra fəaliyyət göstərirdi:1) Analitik və fiziki kimya (müdiri prof.Allahverdi Verdizadə); 2) Üzvi kimya və kimya texnologiyası (müdir prof.İsmayıl Hüseynov); 3) Ümumi kimya və kimyanın tədrisi metodikası (dos.Rəcəb Əliyev).

**Ümumi texniki fənlər** fakültəsində 700 tələbə təhsil alırdı. Fakültə 1971/72-ci tədris ilində əvvəllər fizika-riyaziyyat və fizika fakültələrinin nəzdində olan şöbənin əsasında yaradılmışdı.

Fakültədə iki ixtisas kafedrası vardı:1) İstehsalatın əsasları (dos.Səməd Əlai); 2) Ümumi texniki fənlər (müdiri dos.Aslan Məmmədov). 1971 və 1972-ci illərdə fakültənin 100-ə yaxın məzunu olmuşdur. Fakültədə ümumi texniki fənlər, əmək və fizika, rəsmxət, rəsm və əmək ixtisasları üzrə müəllim hazırlanırdı.

Ümumiyyətlə, 1972/73-cü tədris ilində Pedaqoji İnstitutda aşağıdakı ixtisaslar üzrə qəbul həyata keçirilmişdi:1) ana dili və ədəbiyyat (Azərbaycan bölməsi); 2) riyaziyyat (Azərbaycan və rus bölməsi); 3) fizika (Azərbaycan, rus və erməni bölməsi); 4) filologiya (Azərbaycan bölməsi); 5) coğrafiya (Azərbaycan və rus bölməsi); 6) tarix (Azərbaycan və rus bölməsi); 7) ümumi texniki fənlər və fizika (Azərbaycan və rus bölməsi); 8) ibtidai təhsil pedaqogikası və metodikası (Azərbaycan və rus bölməsi); 9) məktəbəqədər pedaqogika və psixologiya ( Azərbaycan bölməsi); 10) kimya (Azərbaycan və rus bölməsi); 11) kimya və

əlavə biologiya (Azərbaycan və rus bölməsi); 12) rəsmxət, rəsm və əmək (Azərbaycan və rus bölməsi).

Əvvəldə qeyd etdiyimiz kimi, Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunun ləğvi (1959) ilə əlaqədar olaraq tələbələr Pedaqoji İnstitutda yaradılan qiyabi şöbələrə köçürüldü. İstehsalatdan ayrılmadan ali pedaqoji təhsil almaq istəyənlərin arzusunu gerçəkləşdirmək məqsədilə institutda qiyabi şöbə ilə bərabər axşam şöbəsi də yaradıldı. Qiyabi şöbədə 6 fakültə (***Biologiya, Coğrafiya, Tarix, Riyaziyyat, Pedaqogika, Filologiya***), axşam şöbəsində isə 2 fakültə ***(Fizika-riyaziyyat, Pedaqogika***) fəaliyyət göstərirdi. Bu fakültələr az bir müddətdə həm ümumtəhsil məktəb müəllimləri, məktəbəqədər və məktəbdənkənar müəssisələrin tərbiyəçiləri, həm də digər təhsil işçiləri üçün ixtisasartırma mərkəzlərinə çevrildi.

1972-ci ildə institutun qiyabi və axşam şöbələrində 6186 tələbə təhsil alırdı. O dövrdə istehsalatdan ayrılmadan təhsil almanın zəngin ənənələri, forma və yolları var idi. Bu təhsil forması ilə istehsalatda çalışan gənclərin əməyini təhsillə əlaqələndirmək mümkün idi. Pedaqoji İnstitutda onlara istehsalatdan ayrılmadan ali təhsil almalarına şərait yaradılırdı. İldən ilə qiyabi şöbədə təhsil alanların sayı artırdı. 70-ci illərin sonu, 80-ci illərin əvvəlində institutun qiyabi şöbəsində 3997 nəfər tələbə[158] təhsil alırdı.

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunda elmi-tədqiqat işlərinin təşkili (40-50-ci illər)

Müharibə və müharibədən sonrakı dövrün bütün çətinliklərinə baxmayaraq, Pedaqoji İnstitutda elmi-tədqiqat işlərinin aparılması davam etdirildi. Tədqiqat işləri ayrı-ayrı elm sahələrinin müxtəlif problemlərinin araşdırılmasına, namizədlik və doktorluq dissertasiyalarının müdafiəsinə istiqamətləndirilmişdi.

***Filologiya*** fakültəsinin əməkdaşlarının yazdıqları elmi-tədqiqat işləri respublika ictimaiyyəti tərəfindən böyük rəğbətlə qarşılanırdı. ADU-nun Filoloji fakültəsinin Elmi Şurasında İ.Ə.Babayev “Füzulinin yaradıcılığı və Azərbaycan ədəbiyyat tarixində onun yeri” (1945), Ümumi ədəbiyyat kafedrasının müdiri, dos Ə.Sultanlı isə “Azərbaycan dramaturgiyasının inkişaf tarixi” (1946) mövzularında doktorluq dissertasiyası müdafiə etdilər. Ə.Sultanlının əsərində Azərbaycan dramaturgiyasının 1850-1932-ci illəri əhatə edən böyük bir dövrü ilk dəfə tədqiq edilib ümumiləşdirildi. Z.X.Tağızadə “XIX və XX əsrlərin əvvəllərində Azərbaycan nəsrində tabeli mürəkkəb cümlə” (1949), B.M.İbrahimov isə “Mərəzə rayonunun şivələri” (1949) mövzularında namizədlik dissertasiyaları müdafiə etdilər.

Azərbaycan EA-nın nəşr etdiyi “Azərbaycan dilinə aid tədqiqlər” (1947) kitabında “Fonetika” və “Sifət” bəhslərini institutun Azərbaycan dilçiliyi kafedrasının müdiri prof.Ə.Dəmirçizadə, “Fel” bəhsini Dil və ədəbiyyat fakültəsinin dekanı, dos. İ.Əfəndiyev yazdı. Prof.Ə.M. Dəmirçizadənin “Müasir Azərbaycan dili” (1947) dərsliyi nəşr edildi. Bu, Azərbaycan dilinin sintaksisinə aid ilk elmi kitab idi, dilçilik sahəsində yaranmış boşluğu qismən doldurmağa xidmət edirdi. Alimin həmin il “Azərbaycan dilinin tarixi” dərs vəsaitinin I cildi tələbələrin istifadəsinə verildi.

40-cı illərdə nəşr edilən prof.M.Ş.Şirəliyevin “Bakı dialekti” (1949), prof.M.H.Rəfilinin “Ədəbiyyat nəzəriyyəsi”, prof.Ə.A.Sultanlının “Antik dünyada estetika və ədəbiyyatşünaslıq məsələləri” (1946), A.S.Abdullayevin “Orta məktəbdə Azərbaycan dili” kitabları dəyərli mənbələr kimi indi də elmi əhəmiyyətini saxlayır.

Filologiya fakültəsində yaranan ənənə sonrakı illərdə də davam etdirildi. M.H.Rəfilinin “M.F.Axundov”, ”Görkəmli inqilabçı və yazıçı Nəriman Nərimanov”, ”Mirzə Şəfi dünya ədəbiyyatında”,

[158] ***Курбанов А.*** *и др. Первый педагогический институт Азербайдхана.Баку, «Азернешр», 1981,с.98*

F.S.Qasımzadənin “Nəcəf bəy Vəzirov”(1945), ”XIX əsr Azərbaycan ədəbiyyatı” (1956), ”Abbasqulu Ağa Bakıxanov (Qüdsi)” (1956) monoqrafiya və dərslikləri nəşr olundu. Ş.Q.Qurbanovun “Puşkin və Azərbaycan poeziyası”, F.S.Qasımzadənin “A.S.Puşkin və M.F.Axundov”, A.M.Məmmədovun “M.Qorki və Azərbaycan ədəbiyyatı” əsərləri nəşr olundu. İ.Q.Şıxlı “Mehdi Hüseynin nəsri”, Ş.Q.Qurbanov “Puşkin və Azərbaycan poeziyası”, P.Ş.Əfəndiyev “Koroğlu Azərbaycan xalqının qəhrəmanlıq eposudur”, A.M.Hüseynov “Vartaşen rayonu şivələri”, A.A.Məhərrəmov “Sovet dövründə Azərbaycan mətbuatında ədəbi dilin başlıca məsələlərinin (əlifba, orfoqrafiya, terminologiya) müzakirəsi”, B.M.Rəhimova “Müasir Azərbaycan dilində tamamlıq” və M.M.Rzazadə “M.P.Vaqifin qoşma, deyişmə və təcnislərinin leksikası” mövzularında namizədlik dissertasiyaları müdafiə etdilər.

Prof.Ə.M.Dəmirçizadənin “Azərbaycan ədəbi dilinin inkişaf yolları” (1958), “Kitabi-Dədə Qorqud” dastanlarının dili” (1959) monoqrafiyaları meydana gəldi. 1957-ci ildə “Azərbaycan dili” (I cild) (İ.R.Əfəndiyev, B.M.İbrahimov, H.Abdullayev), “Orta məktəbdə Azərbaycan dili metodikası” (A.S.Abdullayev), 1958-ci ildə isə “Azərbaycan dialektologiyası” (A.M.Hüseynov) dərslikləri çap edildi.

***Tarix*** fakültəsinin əməkdaşlarının dissertasiya mövzuları əsasən, Azərbaycan tarixinə, xalqımızın mütəfəkkir nümayəndələrinin irsinin öyrənilməsinə həsr olunmuşdu. C.M.İbrahimov ADU-nun Elmi Şurasında “Gülüstan sülh müqaviləsi və Azərbaycan xalqının tarixi taleyində onun əhəmiyyəti” (1945) mövzusunda namizədlik, Azərbaycan tarixi kafedrasının müdiri, dos.İ.A.Hüseynov MDU-nun Elmi Şurasında “Azərbaycanda sovet hakimiyyətinin qələbəsi” (1947) mövzusunda doktorluq dissertasiyaları müdafiə etdilər. İ.A.Hüseynov tarix elmləri doktoru alimlik dərəcəsi alan ilk azərbaycanlı alim idi. Marksizm-leninizm kafedrasının müdiri H.Əfəndiyev “SSRİ-də kəndli sinfinin ictimai təbiətinin dəyişilməsi” (1947) və M.M.Ağamirov “M.Ə.Sabirin ictimai-siyasi görüşləri” (1947), Ə.Əhmədli “Hipoteza və elmin inkişafında onun rolu” (1950) mövzularında namizədlik dissertasiyaları müdafiə etdilər. Prof. İ.A.Hüseynov ADPİ-nin Azərbaycan tarixi kafedrasının müdiri işlədiyi dövrdə xalqımızın tarixinin bir sıra mühüm məsələlərinə dair qiymətli tədqiqat əsərləri yazıb nəşr etdirdi. Onun “1918-ci ildə Azərbaycanda kəndli üsyanı” (1946), “1917-1918-ci illərdə Azərbaycanda sovet hakimiyyəti uğrunda mübarizə tarixindən” (1947), “Bakı 1918-ci ildə ingilis imperialistlərinin işğalçılıq planında” (1949) və digər kitabları o dövr tarixini öyrənmək baxımından dəyərlidir.

Ümumi tarix kafedrasının müdiri, dos. Ə.S.Sumbatzadənin “Azərbaycanın Rusiyaya birləşdirilməsi, onun iqtisadi və mədəni sahədə nəticələrinə və XIX əsrdə Azərbaycan iqtisadiyyatına təsiri”, dos. C.M.İbrahimovun “XV əsrdə Azərbaycanda feodal dövlətlərinin tarixi”, Y.Y.Ələsgərovun “XIX əsrdə Zaqatala vilayətinin ictimai-iqtisadi vəziyyəti” əsərləri də həmin dövrdə böyük aktuallıq kəsb edirdi.

40-cı illərdə olduğu kimi, 50-ci illərdə də fakültənin əməkdaşları Azərbaycan tarixi, siyasi iqtisad və fəlsəfəyə aid maraqlı mövzularda tədqiqat işləri apardılar. Dos.M.R.Qasımov “1906-1917-ci illərdə “Molla Nəsrəddin” jurnalının ictimai-siyasi ideyaları”, M.N.Şıxlı “1871-1921-ci illərdə Sovet-İran münasibətləri”, dos.M.Y.Vəkilov və N.A.Paşayev “Azərbaycanda mədəni quruculuğun inkişafı tarixi”, Ş.Ə.Sadıqov “Zaqafqaziya federasiyasının Qafqaz xalqlarının iqtisadi və mədəni inkişafında rolu”, S.S.İbrahimov “İkinci beşillik illərində kənd təsərrüfatında sosializm yarışının təşkili”, Ə.P.Əliyev “Neft sənayesində sosializm yarışı”, İ.Q.Şükürzadə “Böyük Vətən müharibəsi illərində arxa cəbhədə təşkilatçılıq işi”, H.Z.Əliyev “İkinci Dünya müharibəsindən sonra Türkiyədə amerikan ekspansiyası”, Ə.K.Dilbazi “Bərpa dövründə Azərbaycanın kənd təsərrüfatı” mövzularında apardıqları elmi araşdırmaları az sonra dissertasiya kimi müdafiə etdilər.

***Təbiyyat*** fakültəsinin əməkdaşları S.C.Hüseynov “Embriologiya kursu”, M.Ə.Axundov “Darvinin həyat və yaradıcılığı”, S.X.Osmanzadə “Bitkilər sistematikası” adlı dərs vəsaitləri hazırladılar. Dos. Z.M.Şahtaxtinskayanın rəhbərliyi altında Zoologiya kafedrasında heyvanların parazit faunasını öyrənmək sahəsində tədqiqat işləri aparılırdı. O, bu sahədə apardığı elmi araşdırmalarını ümumiləşdirərək 1953-

cü ilin mayında ADU-nun Elmi Şurasında “Azərbaycan ev və çöl quşlarının helmint faunası” mövzusunda doktorluq dissertasiyası müdafiə etdi.

Botanika kafedrasında dos.Həmid Qədirovun rəhbərliyi ilə dos.R.Q.Qayıbov, Q.İbadzadə, T.Nəsirli və başqaları elmi-tədqiqat işləri aparırdı.

1951-ci ildə yenidən təşkil olunan Fiziologiya kafedrasında elmi araşdırmalar kafedra müdiri dos.T.D.Qayıbovun rəhbərliyi ilə aparılırdı. Kafedrada dos.R.Z.Qafarova, biologiya elmləri namizədi K.X.Əzizbəyova, tibb elmləri namizədi İ.M.Süleymanov və başqa tanınmış mütəxəssislər çalışırdılar. Kafedranın əməkdaşları, əsasən, yaş fiziologiyası probleminə dair tədqiqat işi aparırdılar.

Kimya kafedrasında 40-cı illərin sonu və 50-ci illərdə akademik M.F.Nağıyev, prof.X.Ş.Kələntərli, prof.M.Q.Əhmədli, prof.Ş.Ə.Məmmədov, dos. Ə.M.İsmayılzadə, dos.S.N.Quluzadə, dos.A.Ə.Verdizadə, dos. Ə.Ö.Əbdürəhmanov kimi tanınmış mütəxəssislər dərs deyir, kimyanın aktual problemləri ilə bağlı araşdırmalar aparırdılar. Apardıqları elmi araşdırmalar əsasında A.Ə.Verdizadə “Sulfat turşusu mühitində yodun üzvi həlledicilərinin iştirakı ilə üçvalentli dəmirin mikroyodometrik təyini” (1945), Üzvi kimya kafedrasının müdiri, dos M.Əhmədli “Katalizin polyarizasiya nəzəriyyəsi baxımından birnüvəli və ikiqat əlaqəli karbohidrogenlərin qarışıq katalizator mühitinə hidrogenləşməsi” (1947), Y.Məmmədov “Neft məhsullarının daxili sürtünmə əmsalının və xüsusi çəkisinin dərinlik və yataqdan asılı olaraq tədqiqi” (1948) mövzusunda namizədlik dissertasiyası müdafiə etdilər. Aspiranturanı uğurla başa vuran R.Y.Əliyev, B.H.Həsənov və İ.O.Nəsibov dissertasiya müdafiəsindən sonra kafedrada pedaqoji fəaliyyətə cəlb olunmuşdular.

Ümumi kimya kafedrasına 1946-1956-cı illərdə X.Ş.Kələntərli rəhbərlik edirdi. 1956-cı ildə prof. Ş.Ə.Məmmədov onun yerinə kafedraya müdir təyin olundu. Bundan sonra bir sıra mühüm mövzularda elmi-tədqiqat əsərləri, elmi-metodiki kitablar, dərs vəsaitləri hazırlandı. Dos.Ə.Ə. Əbdürrəhimovun “Kimya məsələlərinin həlli üsulu” (1954), ”Kimya tədrisi üsulu” (1959), ”Yeddinci sinifdə kimya təcrübələrinin qoyuluşu” (1953), dos.A.Ə.Verdizadənin “Yarım mikrokimyəvi analiz” (1958) adlı dərs vəsaitləri, prof.X.Ş.Kələntərlinin qeyri-üzvi kimya kurslarında katalizə dair elmi araşdırmaları kimya elminin inkişafında mütərəqqi rol oynadı.

O.Osmanov “Kür-Araz ovalığının fizika coğrafiyası” (1947), S.Ş.Şükürov “Qutqaşen-Vartaşen (Qəbələ-Oğuz) rayonlarının iqtisadi coğrafiyası” (1949), M.Ə.Axundov “Ağdam rayonunun iqtisadi coğrafiyası” (1949), H.Ə.Sadıxlı “Orta məktəblərdə Azərbaycan coğrafiyasının tədrisində əyanilik” (1950), S.M.Süleymanov (1947) və M.N.Rəcəbov (1949) namizədlik dissertasiyaları müdafiə etdilər.

***Riyaziyyat-fizika*** fakültəsinin Riyazi analiz kafedrasının müdiri, dos.İ.İ.İbrahimovun Moskvada Steklov adına Riyaziyyat İnstitutunun Elmi Şurasında “Analitik funksiyaların bəzi interpolyasiya və aproksimasiya problemləri” (1948) mövzusunda doktorluq dissertasiyası müdafiə etməsi mühüm elmi hadisə idi. 14 nəfər aspirant funksiyalar nəzəriyyəsi ilə bağlı öz namizədlik dissertasiyasını Prof.İ.İbrahimovun rəhbərliyi altında Riyazi analiz kafedrasında hazırlamışdır. Fizika və riyaziyyatın tədrisi metodikası kafedrasının müdiri B.A.Ağayev “Natamam orta məktəblərdə cəbrin tədris edilməsi məsələsinə dair” (1949) mövzusunda namizədlik dissertasiyası müdafiə etdi. O, Azərbaycanda riyaziyyatın tədrisi metodikasına aid dissertasiya müdafiə etmiş ilk mütəxəssis idi. Az sonra Ə.Y.İbrahimov, M.Ə.Məmmədov riyaziyyatın tədrisi metodikası üzrə namizədlik dissertasiyası müdafiə etdilər. Pedaqoji İnstitut respublikada riyaziyyat və fizikanın tədrisi metodikası üzrə dissertasiya müdafiə edilən yeganə tədris və elmi müəssisə idi.

Fizika kafedrasının müdiri, dos.A.Abaszadə müharibədən sonrakı illərdə molekulyar və istilik fizikası sahəsində bir çox mühüm nəticələr əldə etdi. Onun “Termodinamikası” (1948) dərsliyi nəşr olundu. Dos.A.Abaszadə 1953-cü ilin mart ayında M.V.Lomonosov adına MDU-da fizika-riyaziyyat elmləri doktoru elmi dərəcəsi almaq üçün dissertasiya müdafiə etdi. Fizika kafedrasında (A.Əmiraslanov, P.A.Paşayev, M.Ü.İsmayılov, Ə.Xəlilov) neft və mayelər fizikasının inkişafı ilə bağlı səmərəli elmi araşdırmalar aparıldı.

Fizika və riyaziyyatın tədrisi metodikası sahəsində tədqiqat işləri 1946-cı ildə təşkil edilən

Fizika və riyaziyyatın tədrisi metodikası kafedrasında aparılırdı. B.Şəfizadə, B.Sultanov, S.Osipov, T.Xasməmmədov, M.Əfəndiyev və C.Xələfov prof.A.Abbaszadənin rəhbərliyi altında fizikanın tədrisi metodikasının aktual məsələlərinə dair dissertasiya müdafiə etdilər.

Fakültə əməkdaşlarından B.M.Yusifzadənin "Həndəsənin əsasları" (1947), A.Abbaszadənin Y.Ə.Əmənzadə ilə birlikdə yazdığı "İstilikkeçirmə nəzəriyyəsinə giriş (I hissə)" (1955), İ.İbrahimovun "Ədədlər nəzəriyyəsinin əsasları" (1956), B.Ə.Ağayevin "İbtidai məktəbdə hesabdan metodik vəsait", "Orta məktəbdə riyaziyyat tədrisinin ümumi metodikası" (1951), B.M.Şərifzadənin "Fizikanın təlimində politexnik təlimin keçirilməsi yolları", B.Ş.Sultanovun "Orta məktəbdə optika kursunun tədrisində politexniki təlim elementlərinin verilməsi" dərslik və dərs vəsaitləri gələcək fizika və riyaziyyat müəllimlərinin hazırlığında mühüm əhəmiyyətə malik oldu.

40-cı illərdə ***pedaqogika və psixologiya*** sahəsində sistemli elmi araşdırmalar meydana gəldi. Ə.K.Zəkuzadə "IX-XI əsrlərdə Şərqdə fəlsəfə və psixoloji təlim tarixindən" (1947), dos.Ə.Y.Seyidov "XIX əsrdə Azərbaycan-da pedaqoji fikrin əsas nümayəndələri" (1947) mövzusunda doktorluq dissertasiyaları müdafiə etdilər. Pedaqoji-psixoloji elmlər sahəsində ilk doktorluq dissertasiyalarının müdafiəsi respublikada pedaqogika və psixologiya elminin inkişafında mühüm elmi hadisə idi.

Pedaqogika və psixologiya kafedrasının üzvlərindən dos. M.Ə. Muradxanovun "A.S.Makarenkonun pedaqoji irsi və ondan istifadə edilməsi yolları" (1955), T.İ.Əfəndiyevin "Müəllim və komsomol təşkilatı" (1955), prof.Ə.Y.Seyidov, prof. Ə.K.Zəkuzadə, dos.M.Ə.Muradxanov və dos. Ş.S.Ağayevin "Pedaqogika və psixologiya terminləri lüğəti" (1958), Ə.Seyidov və Ə.Tağıyevin "Pedaqogika tarixi" (1958), H.Əhmədovun "İbtidai məktəb şagirdlərinin kommunist tərbiyəsində nümunənin rolu" (1958) əsərləri xüsusi əhəmiyyət kəsb edirdi. Elmi-tədqiqat işlərinin bir hissəsini namizədlik və doktorluq dissertasiyaları təşkil edirdi.

40-cı illərin sonu, 50-ci illərinin əvvəllərində psixologiya sahəsində bir canlanma yarandı. M.R.Abbasov "Gəncəvinin psixoloji görüşləri" (1945), A.K.Abdullayev "İbtidai məktəblinin I-II sinif şagirdlərində idrak maraqlarının inkişafı" (1953), M.N.Mustafayeva "Böyük bağça yaşlı azərbaycanlı uşaqlarında söz ehtiyatlarının inkişafı" (1949) Ş.S.Ağayev "Fikri məqsədin xarakterindən asılı olaraq görmə qavrayışının dinamikası" (1954), M.Ə.Həmzəyev "İbtidai məktəbin ikinci sinif şagirdlərində samitlər üzrə yazı vərdişlərinin təşəkkül etməsi və inkişafının psixoloji xüsusiyyətləri" (1955) mövzularında namizədlik dissertasiyası müdafiə etdilər. Az sonra Ş.S.Ağayev (1965), Ə.S.Bayramov (1967), M.Ə.Həmzəyev (1968), Ə.Ə.Qədirov (1974), Ə.Ə.Əlizadə (1975) doktorluq dissertasiyası müdafiə etdilər.

Pedaqogika və psixologiya ilə bağlı yeni dərslik və dərs vəsaitləri nəşr olundu. Mehdi Mehdizadə, Mərdan Muradxanov, Tələt Əfəndiyev və İsfəndiyar Vəlixanlının 2 hissəlik "Pedaqogika" (1958; 1959), Əhməd Seyidovun 3 hissəlik "Pedaqogika tarixi" (1959;1960), Ə.K.Zəkuyev, A.K. Abdullayev, Ş.S.Ağayev, M.Mustafayevin 2 hissəlik "Psixologiya" (1960;1961), "Yaş və pedaqoji psixologiya məsələləri" (1974), "Yaş və pedaqoji psixologiya" (1977) dərslik və dərs vəsaitləri nəşr olundu.

50-ci illərdə dos.M.Mehdizadə "Azərbaycan SSR-də məktəb quruculuğu tarixinin xülasələri" (1957) və dos.A.S.Abdullayev "Azərbaycan dilinin tədrisi tarixi" (1958) mövzusunda doktorluq dissertasiyaları müdafiə etdilər. Respublikada pedaqogika sahəsində prof.Ə.Y.Seyidovdan sonra ikinci elmlər doktoru dos.M.Mehdizadə, üçüncüsü isə dos. A.S.Abdullayev oldu. Dos.A.S.Abdullayev Azərbaycan dilinin tədrisi metodikası ixtisası üzrə doktorluq dissertasiyası müdafiə edən ilk alim oldu.

Pedaqoji İnstitutda elmi işlər üzrə direktor müavini vəzifəsinin yaradılması (1957) elmi-tədqiqat işlərinin keyfiyyətinin yaxşılaşdırılmasına, mühüm nəzəri və təsərrüfat əhəmiyyətli problemlərin işlənib hazırlanmasına imkan yaratdı. Prof.A.Abaszadə institunun elmi işlər üzrə ilk direktor müavini oldu. Sonralar həmin vəzifədə prof.T.D.Qayıbov və prof.A.S.Abdullayev fəaliyyət göstərdilər. 1969-ci ildən isə həmin vəzifədə prof.R.Ə.Rəcəbov çalışdı.

60-cı illərdə institutun professor-müəllim heyətinin tərkibində əsaslı kəmiyyət və keyfiyyət dəyişiklikləri baş verməsi, yeni fakültə, şöbə və kafedraların təşkili, xarici dillərin intensiv tədrisi, Xarici dillər kafedrasının yenidən təşkili, Pedaqogika və psixologiya kafedrasının bazasında iki müstəqil kafedranın (Pedaqogika və Psixologiya) yaradılması ayrı-ayrı fənlərin tədrisi keyfiyyətinin yüksəldilməsinə, ixtisas sahələri üzrə dərslik, dərs vəsaitlərinin yaradılmasına, elmi-tədqiqat işlərinin genişlənməsinə müsbət təsir göstərməklə yanaşı, bu sahədə elmi-pedaqoji kadr hazırlığına güclü təkan verdi. Müəllim kadrları hazırlığında keyfiyyət önə çəkildi. Qoşa ixtisaslar ləğv olundu, təlim müddəti 5 illikdən 4 illiyə endirildi.

İnstitutda yüksəkixtisaslı müəllim kadrlarının hazırlanması, səmərəli elmi-tədqiqat işlərinin aparılması, sağlam təhsil mühitinin yaradılması istiqamətində xeyli işlər görüldü. Həmin illərdə instituta ***Mehdi Sadıq oğlu Əliyev*** və ***Şövqi Süleyman oğlu Ağayev*** rəhbərlik edirdi.



***Mehdi Sadıq oğlu Əliyev***
*Əməkdar elm xadimi, professor*
*(1907- 1972)*

*21 dekabr 1907-ci ildə Gəncə şəhərində anadan olmuşdur. 1920-1924-cü illərdə Gəncə Müəllimlər Seminariyasında oxumuşdur. Bir ilə yaxın Gəncədə müəllimlik etmişdir. 1925-1930-cu illərdə Azərbaycan Dövlət Universitetinin Fizika-riyaziyyat fakültəsində təhsil almışdır. 1931-1935-ci illərdə ADPİ-də Fizika-riyaziyyat fakültəsinin dekanı vəzifəsində çalışmışdır. 1933-cü ildə elmi uğurlarına görə ona dosent elmi adı verilmişdir. ADU yenidən təşkil ediləndə (1934) elmi-pedaqoji fəaliyyətini orada davam etdirmiş, Fizika-riyaziyyat fakültəsinin dekanı vəzifəsinə seçilmişdir. 1941-ci ilin iyun ayında tələbələrlə birlikdə könüllü olaraq ön cəbhəyə getmişdir. 1942-ci ilin may ayında hərbiyə uyğun gəlmədiyinə görə ordudan tərxis olunmuşdur. 1944-cü ildə yenidən ADU-nun Fizika-riyaziyyat fakültəsinin dekanı vəzifəsinə seçilmişdir. 1952-ci ildə ADU-nun tədris işləri üzrə prorektoru vəzifəsinə təyin olunmuşdur. 1962-1965-ci illərdə ADU-da dosent vəzifəsində çalışmışdır.*

*1949-cu ildə "Bərk cisimlərin bərkliyinin rəqs üsulu ilə təyini" mövzusunda dissertasiya müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi almışdır. Fizikanın müxtəlif problemləri ilə bağlı məqalələri xarici ölkələrin nüfuzlu elmi jurnallarında nəşr olunmuş, beynəlxalq konfranslarda Azərbaycan elmini ləyaqətlə təmsil etmişdir. Azərbaycan dilində yazılmış ilk "Optika" dərsliyinin (prof.Niftalı Quliyevlə birlikdə) müəllifi olmuşdur. A.F.İoffenin "Molekulyar fizika kursu"nun Azərbaycan dilinə tərcüməsi də onun adı ilə bağlıdır.Əməkdar elm xadimi, Əməkdar müəllim fəxri adlarına layiq görülmüş, "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif olunmuşdur.*

*1972-ci il may ayının 4-də dünyasını dəyişib.*

Elmi-pedaqoji kadr hazırlığında Pedaqoji İnstitutun Elmi Şurasının (dissertasiyalar ilk vaxtlar fakültə və institut Elmi Şuralarında müdafiə olunurdu) və institutun nəzdində yaradılan Müdafiə şuralarının böyük rolu oldu.1966/67-ci tədris ilində Pedaqoji İnstitutda ayrı-ayrı ixtisaslar üzrə elmlər namizədi elmi dərəcəsi almaq üçün 4 ixtisaslaşdırılmış Müdafiə Şurası yaradıldı. Qısa bir müddətdə 180 nəfər tədqiqatçı həmin müdafiə şuralarında dissertasiya müdafiə edərək elmlər namizədi elmi

dərəcəsi aldı. Onlardan 61 nəfəri Pedaqoji İnstitutunun aspirantları və əməkdaşları, 119 nəfər isə başqa elmi müəssisələrindən və digər respublikalardan gələnlər idi.70-ci illərdə dissertasiya müdafiə edənlərin sayı xeyli artdı. APİ-də dissertasiya müdafiə edən aspirant və gənc tədqiqatçıların sayı 240 nəfəri keçdi.

Həmin illərdə Pedaqoji İnstitutun dosentləri: C.M.İbrahimov, N.A.Paşayev, A.Ə.Verdizadə, Ş.Ə.Sadıqov, Ş.A.Haqverdiyev, A.A.Mustafayev, M.C.Cavadov, Z.X.Tağızadə, T.S.Vəliyev, R.Z.Qafarova, N.K.Kərimov, Ş.S.Ağayev, A.M.Qurbanov, F.Q.Fərhadov, Ə.S.Bayramov, M.Y.Vəkilov, R.Ə.Rəcəbov və C.S.Quliyevin doktorluq dissertasiyaları, M.Ə.Qarayev, Z.H.Cahangirov, A.Roşal, H.Ağazadə, C.Cəbrayılbəyli, M.Mustafayeva, V.Hacıyev, N.Terentyeva isə namizədlik dissertasiyası müdafiə etdilər.

60-cı illərin ikinci yarısında respublikada pedaqoji elmlər üzrə elmi-pedaqoji kadr hazırlığında ixtisaslaşdırılmış müdafiə şuralarının yaradılması və ADU-nun müdafiə şurasına pedaqoji elmlərin müvafiq problemləri üzrə ayrı-ayrı hallarda doktorluq dissertasiyalarının müdafiəsini təşkil etmək hüququnun verilməsi pedaqoji elmlərin inkişafını şərtləndirən əsas amillərdən birinə çevrilməklə, respublikanın elmi-pedaqoji həyatında böyük canlanma yaratdı, elmi-pedaqoji kadr hazırlığının yeni sistemi formalaşmağa başladı.

Azərbaycanda pedaqoji elmlər üzrə Müdafiə Şurası təşkil edilənə kimi ADPİ-nin Elmi şurasında 1949-1967-ci illərdə pedaqoji - psixoloji elmlər üzrə 46 nəfər namizədlik dissertasiyası müdafiə etmişdir. Müdafiə olunan əsərlərin 23-ü pedaqogikanın nəzəri məsələlərinə, 8-i pedaqogika tarixinə, 2-si məktəbəqədər tərbiyə problemlərinə,11-i psixologiyaya, 2-si kitabxanaçılığa həsr olunmuşdu. İnstitutun əməkdaşlarından 6 nəfəri namizədlik dissertasiyalarını ADU-nun Müdafiə Şurasında, 3 nəfər Moskvanın və 1 nəfər Tbilisinin müvafiq təhsil ocaqlarının nəzdindəki Dissertasiya Şuralarında müdafiə etmişdi. Ümumiyyətlə, Müdafiə Şurasında 240 nəfərdən artıq aspirant və dissertant namizədlik dissertasiyası müdafiə etmişdir.

1 avqust 1967-ci ildə RSFSR Pedaqoji Elmlər Akademiyasının SSRİ Pedaqoji Elmlər Akademiyasına çevrilməsi pedaqoji kadr hazırlığına güclü təkan verdi. Pedaqoji İnstitutun məzunu, müəllimi, direktor müavini və direktoru işləmiş Mehdi Mehdizadə həmin akademiyanın ilk və son azərbaycanlı həqiqi üzvü (akademiki) seçildi.

Pedaqoji İnstitutda elmi mühitin zənginləşdirilməsi istiqamətində xeyli tədbirlər həyata keçirildi. Elmi Şurada "İnstitut Tələbə Elmi Cəmiyyətinin fəaliyyətinin daha da yaxşılaşdırılması haqqında" məsələ müzakirə olundu. ADPİ üzrə 2 aprel 1968 - ci il tarixli, 125 №-li əmrlə Tələbə Elmi Cəmiyyətinin işinə müntəzəm elmi-metodik rəhbərlik etmək və yardım göstərmək məqsədilə xüsusi şura yaradıldı.

Şuranın tərkib aşağıdakı kimi təsdiq edildi:

1) prof.İ.M.Həsənov (sədr)

2) dos.A.M.Qurbanov (sədr müavini)- humanitar elmlər üzrə


БП-1223/5

(личная подпись владельца удостоверения)

Избран 9 августа 1967г.

Моск. печ. ф-ка Гознака. 1967. Зак. 22596.

АКАДЕМИЯ ПЕДАГОГИЧЕСКИХ НАУК СССР

УДОСТОВЕРЕНИЕ № 40

Предъявитель сего тов. Мехти-Заде Мехти-Мамед оглы

является действительным членом (академиком) Академии педагогических наук СССР.

Президент Академии педагогических наук СССР

Выдано 15 апреля 1976 года.

*M.Mehdizadənin SSRİ PEA-nın həqiqi üzvülüyü vəsiqəsi*

3) dos.Ə.S.Rzayev (sədr müavini)- təbiətşünaslıq elmləri üzrə

4) b/m.M.M.Mirsəlimov (üzv)

5) dos.Q.Ə.Quliyev (üzv)

6) b./m.K.D.Hüseynov (elmi katib)

7) b./m.A.C.İmanov (üzv)

8) dos.İ.B.Musayev (üzv).

1 mart 1968-ci ildə Elmi şurada tələbələrlə aparılan tərbiyəvi işlərin səviyyəsinin yüksəldilməsi məsələsi müzakirə olundu və tərbiyə işləri üzrə prorektorluq yaradıldı. Həmin vəzifəyə İbtidai təhsil pedaqogikası və metodikası kafedrasının dosenti, pedaqoji elmlər namizədi Soltansəlim Axundov təyin edildi.

1968 və 1972-ci illərdə SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyinin müvafiq əmri ilə Pedaqoji İnstitutun nəzdində pedaqogikanın nəzəriyyəsi və tarixi üzrə ixtisaslaşdırılmış Müdafiə Şurası təşkil olundu. Həmin şura 54 nəfər tədqiqatçıya yüksək səviyyəsi, nəzəri və praktik əhəmiyyəti ilə seçilən elmi əsərlərinə görə pedaqoji elmlər namizədi alimlik dərəcəsi verdi. Müdafiə olunmuş dissertasiyaların 27-si pedaqogikanın nəzəri məsələlərini, 12-si pedaqogika tarixini, 3-ü məktəbəqədər tərbiyə problemlərini, 11-i psixologiyanı, 1-i kitabxanaçılıq ixtisaslarını əhatə edirdi. İlk müdafiə şurasının tərkibinə Əhməd Seyidov (sədr), Rafiq Rəcəbov (müavin), Ağamməd Abdullayev, Şövqi Ağayev, Bəşir Əhmədov, Hüseyn Əhmədov, Əkbər Bayramov, Muxtar Həmzəyev, Cahid Quliyev, Nurəddin Kazımov, Əyyub Tağıyev (elmi katib), Mehdi Mehdizadə, Mərdan Muradxanov, Ağahəsən Rzayev, Əbdül Əlizadə kimi tanınmış pedaqogika və psixologiya alimləri daxil edildi. Müdafiə Şurasının yaradılması 70-ci illərdə pedaqoji elmin inkişafına kömək etməklə yanaşı, yüksəkixtisaslı kadr hazırlanmasına, elmi problemlərin daha dərindən, daha mükəmməl işlənməsinə şərait yaratdı.

Aspirantura yolu ilə elmi potensialın artırılmasına xüsusi diqqət yetirildi, Azərbaycan KP MK-nın birinci katibi H.Ə.Əliyevin *“Biz aspiranturaya münasibəti kökündən dəyişməli, ona elmin tələbləri ilə, kadrlar hazırlanması vəzifələri ilə heç bir əlaqəsi olmayan mülahizələrə görə qəbul hallarını aradan qaldırmalıyıq. Dissertasiya işlərinə tələbkarlıq xeyli artırılmalıdır, elə etmək lazımdır ki, elmə yalnız onu həqiqətən zənginləşdirməyə, irəlilətməyə qabil olan adamlar gəlsinlər”*-fikri elmi-pedaqoji kadr hazırlığının əsas istiqamətini təşkil etməyə başladı.

İxtisaslı professor-müəllim kadrları hazırlığının formalarından biri də elmlər namizədi olan müəllimlərin doktorluq dissertasiyaları yazmaları üçün iki il müddətinə pedaqoji işdən azad edilməklə *elmi işçi vəzifəsinə keçirilmələri* oldu. SSRİ Nazirlər Sovetinin hələ 1961-ci il 13 iyul tarixli qərarına əsasən müəyyən edilən bu qayda çox əlverişli idi. Çünki diqqətin konkret olaraq dissertasiya işi üzərinə cəmlənməsi imkanı yaranır, elmi tədqiqatın səmərəsi artırdı. Bu imkandan pedaqoqlardan dos. Hüseyn Əhmədov istifadə etdi. Onun doktorluq dissertasiyası yazması üçün elmi işçi vəzifəsinə keçirilməsinin əməli yekunu belə oldu ki, iki il müddətində Moskva, Leninqrad, Bakı, Həştərxan, Tbilisi, İrəvan dövlət arxivlərində ciddi axtarışlar apardı, XIX əsrdə Azərbaycanda məktəb təhsilinin inkişaf tarixini araşdırdı, məktəb tariximiz üçün qiymətli olan xeyli sənədləri aşkara çıxardı, pedaqoji məsələləri tarixi fakt və hadisələrin fonunda tədqiqat obyektinə çevirdi və beləliklə də, “XIX əsrdə Azərbaycanda məktəb təhsilinin inkişaf tarixi” adlı doktorluq dissertasiyasını başa çatdırdı.



***Şövqi Süleyman oğlu Ağayev***
*psixologiya elmləri doktoru, professor*
*(1926-1975)*

*23 mart 1926-cı ildə Şamaxı qəzasının İsmayıllı nahiyəsinin Diyallı kəndində müəllim ailəsində anadan olmuşdur. Orta təhsilini 1933-1942-ci illərdə Bakı şəhərindəki 173 №-li məktəbdə almışdır. 1941-1942-ci illərdə fizika-riyaziyyat müəllimi hazırlayan birillik kursda oxumuşdur. Kursu bitirdikdən sonra Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutunun III kursuna qəbul olunsa da, təhsilini davam etdirməmişdir. 1942-1947-ci illərdə Azərbaycan Tibb İnstitutunun Müalicə-profilaktika fakültəsində oxumuşdur. Azərbaycan EA-nın Təbabət İnstitutunun aspiranturasına qəbul olunsa da, institut ləğv edildiyindən təhsilini davam etdirə bilməmişdir. 1948-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun psixologiya ixtisası üzrə aspiranturasına qəbul olunmuşdur. 1954-cü ildə "Fikri məqsədin xarakterindən asılı olaraq təlim prosesində görmə qavrayışının dinamikası" mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir.*

*28 sentyabr 1960-cı ildə ADPİ-nin İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsinin qiyabi şöbəsinə dekan vəzifəsinə təyin olunmuşdur. 14 noyabr 1962-ci ildə ADPİ-nin tədris işləri üzrə prorektoru vəzifəsinə irəli çəkilmişdir. 6 fevral 1964-cü ildə o, həm də Psixologiya kafedrasına müdir vəzifəsinə təyin olunmuşdur. 11 fevral 1965-ci ildə Ali və Orta İxtisas Təhsili Komitəsinin əmri ilə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna rektor təyin olunmuşdur. 1967 -ci ildə "Əmək, tərbiyə və inkişaf" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. 24 oktyabr 1969-cu ildə SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyinin yanında fəaliyyət göstərən AAK tərəfindən ona psixologiya elmləri doktoru elmi dərəcəsi verilmişdir. 14 iyul 1970-ci ildə "tərcümeyi halının şərhində qeyri səmimilik təzahürünə" görə vəzifəsindən azad edilmişdir. 12 noyabr 1970-ci ildə ona professor elmi adı verilmişdir.*

*Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyi Kollegiyasının 13 noyabr 1974-cü il tarixli qərarına müvafiq olaraq Psixologiya kafedrasının bazası əsasında iki kafedra - Ümumi psixologiya və Yaş və pedaqoji psixologiya kafedraları yaradıldı. Yaş və pedaqoji psixologiya kafedrasına müdir vəzifəsinə təyin olunan prof.Şövqi Ağayev ömrünün sonuna kimi həmin vəzifədə çalışıb.*

*"Uşaqlarda mədəni vərdiş və adətlərin tərbiyəsi" (1961), "Ruh varmı?" (1962), "Ailədə uşağın nitqinin inkişaf etdirilməsi" (1962),"Uşaq psixologiyası məsələlərinə dair" (qiyabiçilər üçün tədris vəsaiti) (1966), "Əmək, tərbiyə və inkişaf" (1967), "Yaş və pedaqoji psixologiya" (Z. Mehdizadə və İ. Fərəcovla birlikdə) (1977) kitabları və onlarla elmi məqaləsi nəşr edilmişdir.*

*1960-1961-ci illərdə nəşr edilən 2 hissəlik "Psixologiya", "Yaş və pedaqoji psixologiya məsələləri" (1974), "Yaş və pedaqoji psixologiya" (1977) dərslik və dərs vəsaitlərinin hazırlanmasında mühüm xidmətləri var. Bakı, Tbilisi, və İrəvanda keçirilən Zaqafqaziya psixoloqlarının I-VI konfranslarının iştirakçısı, Bakı şəhər sovetinin X və XI çağırış deputatı, Azərbaycan Kommunist Partiyasının XXVII qurultayının, Azərbaycan müəllimlərinin V qurultayının, "Bilik" cəmiyyətinin V qurultayının nümayəndəsi və Azərbaycan Psixoloqlar Cəmiyyətinin Rəyasət heyətinin üzvü olub.*

*23 oktyabr 1975-ci ildə Bakı şəhərində vəfat edib. 1996-cı ildə ADPU-da anadan olmasının 70 illiyi təntənə ilə qeyd edilib*

## Elmi tədqiqatlara yeni nəfəs:
## “ADPİ -nin Elmi əsərləri”nin nəşrə başlaması



АЗӘРБАЙЧАН ССР МААРИФ НАЗИРЛИЙИ
МИНИСТЕРСТВО ПРОСВЕЩЕНИЯ АЗЕРБАЙДЖАНСКОЙ ССР

В. И. ЛЕНИН адына АЗӘРБАЙЧАН ДӨВЛӘТ ПЕДАГОЖИ ИНСТИТУТУНУН
ӘСӘРЛӘРИ

ТРУДЫ
АЗЕРБАЙДЖАНСКОГО ГОСУДАРСТВЕННОГО ПЕДАГОГИЧЕСКОГО ИНСТИТУТА им. В. И. ЛЕНИНА

Том I чилд



БИРЛӘШМИШ НӘШРИЙЯТ
ОБ'ЕДИНЕННОЕ ИЗДАТЕЛЬСТВО

Бакы 1953 Баку

“ADPİ-nin Elmi əsərləri”nin 1953-cü ildə I cildinin çapdan çıxması institutda tədqiqat işlərinin nəşrinə və təbliğinə müsbət təsir göstərirdi. İlk cild təbiət elmlərinə həsr edilmişdi. Burada B.A.Şəfizadənin “Fizika tədrisində sinifdənxaric məşğələlər”, Y.H.Məmmədovun “Neftin daxili sürtünməsinin və xüsusi çəkisinin dərinlikdən asılı olaraq tədqiqi”, H.B.Şahtaxtinski və A.A.Verdizadənin ”Üçvalentli dəmirin mikronodometrik təyini”, Z.M.Şahtaxtinskayanın “К фауне паразитических червей охотничъе-промысловых птиц Азербайджана“, X.Ş.Kələntərlinin “Состав смеси высокомолекулярных кислот, полученных окислением петролатума”, A.Abaszadənin “Результаты измерения теплопроводности паров в зависимости от температуры и давления”, S.M.Qasımovun “Проекция на экран опытов, диапозитивов в незатемненных помещениях (а также возможность в этих условиях микро и эпипроекции) məqalələri verilmişdir.

1955-ci ildə “ADPİ-nin Elmi əsərləri”nin II cildi, 1957-ci ildə III cildi, 1958-ci ildə isə IV, V və VI cildləri işıq üzü gördü. Sonrakı illərdə “Elmi əsərlər”in nəşri sistemli xarakter aldı. Təbiət və humanitar elmlər ayrı-ayrılıqda nəşr olundu. Cildlərə institutun professor-müəllim və aspirantlarının müxtəlif elm sahələrinə aid dəyərli tədqiqat işləri daxil edilirdi.

## Pedaqoji İnstitutun güzgüsü: “Gənc müəllim” qəzeti

Azərbaycan Dövlət Pedaqoji İnstitutunun “Lenin tərbiyəsi uğrunda” adlı ilk qəzəti 1934-1940-cı illərdə nəşr olunub. Ayda 4 nömrəsi çıxan qəzetin Azərbaycan dilində 171, erməni dilində 166, rus dilində 166 nömrəsi işıq üzü görüb. 1940-1957-ci illərdə institutun partiya bürosu və rektorluğunun rəsmi orqanı olmayıb.[159]

1957-ci ildə Azərbaycan Pedaqoji İnstitutunun rektoru Mehdixan Vəkilov institutun partiya bürosu və rektorluğun rəsmi orqanı kimi “Gənc müəllim” qəzetinin nəşrinə icazə verilməsi ilə bağlı Maarif Nazirliyinə müraciət edib. ADPİ-də “Gənc müəllim” qəzetinin nəşrinin vacibliyini nəzərə alan Maarif Nazirliyi bununla bağlı Azərbaycan KP MK-ya müraciət edib. Azərbaycan KP MK -nın 7 yanvar 1958-ci il tarixli iclasında (protokol 128) ADPİ-də “Gənc müəllim” qəzetinin nəşri ilə bağlı məsələ müzakirə edilərək 20 yanvar 1958-ci ildən institutun partiya təşkilatının və rektorluğun orqanı olan “Gənc müəllim” qəzetinin ayda iki dəfə 1500 tirajla nəşr edilməsi qərara alınıb.

27 yanvar 1958-ci ildə ADPİ-nin Elmi şurasında “Gənc müəllim” qəzetinin aşağıdakı tərkibdə redaksiya heyəti yaradılıb: 1) prof.Abasqulu Abaszadə; 2) dos.Əyyub Tağıyev (partiya təşkilat katibi); 3) müəllim Cahid Quliyev; 4) dos.Şərif Haqverdiyev; 5) dos.Həmid Əfəndiyev; 6) Qulu Xəlilov (aspirant), 7) dos. Osman Osmanov; 8) İsmayıl Məlikov, 9) tarix elmləri namizədi Şükür Sadıqov; 10) Tofiq Bayram (tələbə), 11) Şükür Şükürov (tələbə),12) Dilənçi Xıdırov (aspirant), 13) f.-r.e.n. Minəvvər Əfəndiyeva. Qəzetə redaktorluq institutun nəşriyyatının direktoru C.Quliyevə, məsul katiblik isə müvəqqəti olaraq M.Həsənova həvalə edilib.

---

[159] *“Lenin tərbiyəsi uğrunda” qəzeti 1991-ci ilə kimi Azərbaycan Dövlət Universitetinin partiya bürosu və rektorluğunun orqanı kimi nəşr edilib.*



КӘНҸ МҮӘЛЛИМ

В. И. Ленин адына Азәрбайҹан Дөвләт Педагожи Институту партия бүросу вә директорлуғунун органы

№ 1—Шәнбә, 1 феврал 1958-ҹи ил.—Гиймәти 10 гәп.

Профессор, мүәллим вә тәләбә йолдашлар! Дәрс илинин икинҹи ярысына ҹидди һазырлашын, институтда тәлим-тәрбийә ишләринин кейфиййәтини даһа да йүксәлтмәк үчүн мөвҹуд олан имканлардан баҹарыгла истифадә эдин.

Кәнҹлийин яхын көмәкчиси

СӘМИМИ АРЗУЛАР

Qəzetin ilk sayı 1 fevral 1958-ci ildə (şənbə günü) işıq üzü görüb. ADPİ-nin həyatında mühüm hadisə olan "Gən müəllim" qəzetinin ilk sayında Azərbaycan SSR Maarif naziri Mirzə Məmmədov, institutun yetirməsi akademik Abdulla Qarayev, institutun məzunu Stalin mükafatı laureatı, Əməkdar incəsənət xadimi və qabaqcıl maarif xadimi Məmməd Rahim, Kutaisi Pedaqoji İnstitutunun direktoru Çelidze, H.Zərdabi adına Kirovabad Pedaqoji İnstitutunun direktoru Məmmədov, "Azərbaycan məktəbi" jurnalının, "Azərbaycan müəllimi" və "Azərbaycan gəncləri" qəzetinin redaksiya heyətləri adından təbrik məktubları verilib.

Redaksiya məqaləsində qəzetin məramı belə ifadə olunub: *"Gənc müəllim" qəzeti yüksəkixtisaslı müəllim kadrlarının hazırlanmasında özünün kollektiv təbliğatçılıq, təşviqatçılıq və təşkilatçılıq rolunu yerinə yetirəcək, bu işdə institutun direktorluğunun və partiya təşkilatının ən yaxın köməkçisi olacaqdır. Qəzetin səhifələrində təlim-tərbiyə işləri sahəsindəki müvəffəqiyyətlərimiz, qabaqcıl müəllim və professorlarımızın zəngin iş təcrübəsi oxuculara çatdırılacaq, təhsildə və institutun ictimai həyatında fəal çalışan tələbələr haqqında maraqlı yazılar dərc ediləcəkdir. Bununla bərabər qəzet institutun təlim-tərbiyə işləri sahəsindəki nöqsanları, kəsir və çatışmayan cəhətləri tənqid atəşinə tutacaqdır*[160].

Qəzetin ilk sayında institut həyatı ilə bağlı maraqlı yazılar, elmi məlumatlarla yanaşı, Tarix-filologiya fakültəsinin tələbəsi Tofiq Bayramovun qəzetin nəşri ilə bağlı "Gənc müəllimə"[161] şeiri verilmişdir.

Uğurlar diləyir sənə qəlbimiz
Xoş gəldin deyirik xoş gəlişinə.
Bu birinci cığır, bu birinci iz
Qoy ilk pillə olsun yüksəlişinə.

Daim alnı açıq, sən üzü ağ ol
Gəlişin təzədir, arzumuz təzə.
Doğma APİ-mizdə nurlu mayaq ol,
Səndən işıq alaq gözlərimizə.

Həvəslə, ürəklə təhsil alanlar
Hər təbrik sözünlə dönsün bir dağa
Dərsində büdrəyib yıxılan da var
Elə silkələ ki, dursun ayağa.

Keçəcək fəsillər, ötəcək illər
Sənin gül açacaq arzun, muradın.
Ağ saçlı olacaq gənc müəllimlər
Sənin "Gənc müəllim" qalacaq adın.

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunun filialları

### Naxçıvan filialı

Keçən əsrin 60-cı illərində ali təhsil ocağı olmayan yeganə Muxtar Respublika Naxçıvan idi. Azərbaycan KP Naxçıvan Vilayət Partiya Komitəsinin birinci katibi Hacağa İbrahimov, Vilayət Partiya Komitəsinin üçüncü katibi Qənbər Qurbanov, Naxçıvan MSSR Ali Soveti Rəyasət Heyətinin sədri Səkinə Əliyeva, Naxçıvan MSSR Nazirlər Sovetinin sədri Ramazan İsmayılov, onun birinci müavini Səfəralı Babayev və başqaları Naxçıvanda ali məktəb açılması təşəbbüsü ilə çıxış

---

[160] *"Gənc müəllim" qəzeti, 1 fevral 1958-ci il*
[161] *Yenə orada*

etdilər. Azərbaycan KP MK və Nazirlər Sovetinin 11 oktyabr 1966-cı il tarixli 564 nömrəli qərarına uyğun olaraq Azərbaycan SSR Ali və Orta İxtisas Təhsil Nazirliyinin 5 noyabr 1965-ci il tarixli 323 nömrəli əmrində Azərbaycan Pedaqoji İnstitutunun 1967/68-ci tədris ilində Naxçıvan şəhərində filialının açılması nəzərdə tutuldu. 1967-ci ildə Pedaqoji İnstitutun Naxçıvan filialı fəaliyyətə başladı. İlk tədris ilində Azərbaycan dili və ədəbiyyatı (51 nəfər), tarix (29 nəfər) və riyaziyyat (25 nəfər) ixtisasları üzrə tələbə qəbulu həyata keçirildi. İctimai əsaslarla Ümumi tarix, Dil və ədəbiyyat və Riyaziyyat kafedraları təşkil edildi. İlk vaxtlar ştatda cəmi 3 müəllim: tarix elmləri namizədi, dosent Əli Əliyev, filologiya elmləri namizədi, dosent Yavuz Axundov və Mahmud Mahmudov var idi. 1968-ci ildə riyaziyyat ixtisası üzrə qiyabi şöbəyə tələbə qəbulu həyata keçirildi. Bir il sonra Azərbaycan dili və ədəbiyyat və tarix ixtisaslarının qiyabi şöbəsi açıldı.1970-ci ildə filialda 3 yeni kafedra (Pedaqogika və psixologiya, İctimai elmlər, Rus dili və xarici dillər) fəaliyyətə başladı. Filiala 1967-1970-ci illərdə Əli Əliyev, 1970-1972-ci illərdə Səfəralı Babayev rəhbərlik etdi. 1972-ci ildə filialın 5 fakültəsində (Tarix, Ədəbiyyat, Riyaziyyat, Fizika, Coğrafiya) əyani şöbəsində 605, qiyabi şöbəsində (Dil-ədəbiyyat, Tarix, Riyaziyyat) 313 nəfər tələbə təhsil alırdı. Filial qısa bir müddətdə bölgə və ətraf rayonlar üçün müəllim kadrları hazırlığında böyük uğurlara imza atdı. Məzunların bir neçəsi ali pedaqoji təhsil müəssisəsində işləməklə yanaşı, elmi araşdırmalara başladılar, namizədlik və doktorluq dissertasiyaları müdafiə etdilər.

Filialın inkişafı Pedaqoji İnstitutun rəhbərliyinin həmişə diqqət mərkəzində olub. Naxçıvan filialında yerəşən məsləhət məntəqəsinə mütəmadi olaraq Pedaqoji İnstitutun əməkdaşları ezam olunurdu. Məsələn, 13-16 dekabr 1968 –ci ildə dos. Abbas İsmayılov, dos.Saleh Məcidov, b./m.Rza Tofiqi, dos.Əli Fərəcov, dos.Əhəd Hüseynov, dos. Əsgər Süleymanov, dos.Qardaşxan Qasımov,dos. Buta Sadıqov, b./m. Ağali Əliyev, Nuru Cavadov və Hamlet Məmmədov Naxçıvan məsləhət məntəqəsinə ezam olunmuşdular.



***Əli İbrahim oğlu Əliyev***

*tarix elmləri namizədi, dosent*

*(1904-1997)*

*Naxçıvan Muxtar Respublikasının Şərur rayonunda anadan olub. Təhsilini Yaycı kəndindəki “üsuli-cədid” məktəbində, Mahmudkənd və Cəlilkənd məktəblərində alıb. 1925-ci ildə Bakıda birillik kurs bitirib. Şərur qəzasının Yenicə nahiyə komsomol komitəsinin katibi vəzifəsində çalışıb. 1927-1928-ci illərdə ordu sıralarında xidmət edib. 1932-ci ildə Tiflis Zaqafqaziya Kommunist Universitetini bitirib. 1933-cü ildə N.Y.Marr adına Moskva Şərqşünaslıq İnistitutuna daxil olub. Maddi çətinliklər səbəbindən təhsilini yarımçıq qoyub Naxçıvana qayıdaraq Naxçıvan Pedaqoji Texnikumunun direktoru (1934-1935 və 1941-1942) vəzifəsində çalışıb. 1938-1941 ci illərdə M.V. Lomonosov adına Moskva Dövlət Universitetində akademik A. M. Pankratovanın rəhbərliyi altında aspirantura hazırlığı keçib. “Azərbaycanda kəndli hərəkatı” mövzusunda namizədlik dissertasiyası müdafiə edib. Naxçıvan MSSR Maarif naziri (1941-1947), Naxçıvan ikiillik Müəllimlər İnstitutunda müəllim (1947-1952), Naxçıvan MSSR Ali Soveti Rəyasət Heyətinin katibi (1951-1967) vəzifəsində çalışıb. 1944-cü ildə Ermənistandan gəlmiş sahibsiz uşaqlar üçün Baş Noraşendə uşaq evi açıb.1953-cü ildən “Bilik” Maarifçilik Cəmiyyətinin Naxçıvan vilayəti üzrə fəxri sədri olub. 1967-1970-ci illərdə Azərbaycan*

*Dövlət Pedaqoji İnstitutun Naxçıvan filialının təşkilatçısı və ilk direktoru, 1970-1980-ci illərdə Naxçıvan Pedaqoji İnistitutunun Tarix kafedrasının müdiri olub. 300-dən artıq elmi məqalənin müəllifidir. II-VII çağırış Naxçıvan MR Ali Sovetinin deputatı olub. "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif edilib.*

Həmin il filialın əyani şöbəsinə 224 tələbə qəbul edilmişdi. Filialın inkişafına ADPİ tərəfindən hər cür elmi-pedaqoji və metodik kömək həyata keçirilirdi. Filialın müəllim kollektivinin komplektləşdirilməsinə ciddi fikir verilirdi, təkcə 1972-ci ildə filiala 2 dosent, 5 baş müəllim yeri verilmişdi. Hər il filial üçün 2 məqsədli aspirant yeri ayrılırdı.1971-1972-ci illərdə filiala 7 min manatlıq kitab və əyani vəsait alınmışdır. Filial üçün nəzərdə tutulan Lenin təqaüdünə Dil-ədəbiyyat fakültəsinin III kurs tələbəsi Səkinə Hüseynova layiq görülmüşdü.



***Səfəralı Yaqub oğlu Babayev***
*AMEA-nın müxbir üzvü,*
*coğrafiya elmləri doktoru, professor*
*(1923-2003)*

*Naxçıvan Muxtar Respublikasının Babək rayonunun Əznəbürd-Təzəkənd kəndində anadan olmuşdur. Babək rayonu Xıncab kənd 7illik məktəbində müəllim (1937-1938), Azərbaycan LKGİ Naxçıvan Vilayət Komitəsinin katibi (1948 )işləmişdir. Azərbaycan KP MK yanında İkiillik Partiya məktəbinin dinləyicisi (1950-1952) olmuşdur. Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutun Coğrafiya fakültəsini (1954) bitirib. 1952-1955-ci illərdə Naxçıvan MSSR Maarif Nazirliyində məktəb inspektoru, Naxçıvan rayon Partiya komitəsinin təbliğat-təşviqat şöbəsinin müdiri, 1957-ci ildə Naxçıvan MR Maarif nazirinin müavini, 1968-ci ildə Muxtar Respublikanın Maarif naziri vəzifəsində işləmişdir. 1963-cü ildə Azərbaycan KP Naxçıvan rayon komitəsinin birinci katibi olmuşdur. 1965-ci ildə Naxçıvan MR Nazirlər Soveti yanında Radio və Televiziya verilişləri Komitəsinin sədri olmuşdur. 1965-1970-ci illərdə Naxçıvan MR Nazirlər Soveti sədrinin birinci müavini seçilmişdir. 1972-ci ildə Azərbaycan Pedaqoji İnstitutu Naxçıvan filialının direktoru vəzifəsində çalışmışdı. 1972-ci ildən başlayaraq Naxçıvan Pedaqoji İnstitutunda Coğrafiya kafedrasının müdiri, dekan və dosent vəzifələrində işləmişdir. 1996-cı ildən ömrünün sonuna qədər Y.Məmmədəliyev adına Naxçıvan Dövlət Universitetinin Coğrafiya kafedrasının müdiri olmuşdur. 1959-2003-cü illərdə Azərbaycan Respublikası Coğrafiya Cəmiyyəti Naxçıvan filialının sədri olmuşdur. 1959-cu ildən 3 çağırış Naxçıvan Muxtar Respublikası Ali Sovetinin deputatı seçilmişdir. Azərbaycan EA Coğrafiya İnstitutunun aspiranturasını (1959) bitirmiş, 1968-ci ildə "Naxçıvan MSSR-in təbii şəraiti və landşaftı" mövzusunda namizədlik, 2002-ci ildə isə "Naxçıvan MR-da Dədə-Qorqud toponimləri" mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. AMEA-nın müxbir üzvü seçilmişdir. "Şöhrət" ordeni ilə təltif edilmişdir (2003). Naxçıvan MR Ağsaqqallar Şurasının sədri olmuşdur.*

13 aprel 1972-ci ildə Pedaqoji İnstitutda *Naxçıvan filialı günləri* keçirildi. Görüşü institutun rektoru Həşim Ağayev açaraq filialın nümayəndələrinə institutun strukturu, 50 illik şərəfli tarixi, pedaqoji

və elmi-pedaqoji kadr hazırlığındakı ximətləri ilə bağlı ətraflı məlumat verdi.Tədbirdə Azərbaycan KP Naxçıvan şəhər partiya komitəsinin katibi C.M.Musayev, filialın direktoru S.Y.Babayev, ADPİ-nin Filologiya fakültəsinin dekan müavini dos.M.Həkimov, komsomol komitəsinin katibi Rəcəb Əliyev, dos.Oqtay Rza çıxış etdi.

4 oktyabr 1972-ci ildə Azərbaycan KP MK-nın I katibi Heydər Əliyev Naxçıvanda olarkən filialın əməkdaşları ilə görüşündə regionda müstəqil institutun yaradılmasının vacibliyi məsələsini irəli sürdü.

20 iyun 1972-ci ildə Heydər Əliyevin sədrliyi ilə keçən Azərbaycan KP MK-nın Büro iclasında (protokol №41) 7-ci məsələ "Naxçıvan Pedaqoji İnstitutunun təşkili haqqında" adlanırdı. Büroda Azərbaycan SSR Nazirlər Sovetinin Naxçıvan Pedaqoji İnstitutunun təşkili ilə bağlı təklifi müzakirə olundu. Azərbaycan SSR Nazirlər Soveti tərfindən Büroya təqdim edilən arayışda bildirilirdi: 1967-ci ildə Naxçıvanda V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun filialı açılıb. Hazırda orada 39 nəfər ştatda olan müəllim çalışır ki, onlardan da 7-si elmlər namizədədir, 4 nəfər dosentdir. Əyani şöbədə 614 tələbə 5 ixtisas (dil-ədəbiyyat, tarix, coğrafiya, fizika, riyaziyyat) üzrə təhsil alır. Qiyabi şöbədə 3 ixtisas üzrə (dil-ədəbiyyat, tarix, riyaziyyat) 311 tələbə oxuyur. Filialda 2 kafedra, 3 laboratoriya,4 kabinet və kitabxana fəaliyyət göstərir. Filial 900 kv.m. sahəsi olan məktəb binasında yerləşir.1970/71-ci tədris ilinin sonunda dil-ədəbiyyat, tarix və riyaziyyat ixtisasları üzrə ilk məzun olan 82 nəfər gənc müəllim respublikanın kənd məktəblərinə yola salınıb. Filial yalnız Naxçıvan MSSR üçün deyil, həm də digər rayonlar və Ermənistandakı Azərbaycan məktəbləri üçün də müəllim kadrları hazırlayır. Filialın inkişafı respublikanın Naxçıvana yaxın olan cənub-qərb rayonları üçün müəllim kadrları hazırlığında rolunu artırır.

Azərbaycan KP Naxçıvan Vilayət Komitəsi, Naxçıvan MSSR Nazirlər Soveti, Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyi V.İ.Lenin adına APİ-nin Naxçıvan filialının müstəqil instituta çevrilməsi haqqında təkliflə çıxış etmişlər. Naxçıvanda müəllim kadrlarının sayının artırılması planlaşdırılır. 1972-ci ildə 400 nəfər tələbə qəbul edildiyi halda, cari ildən qəbul planının 600-700 nəfər olması nəzərdə tutulur. Filialın müstəqil institut kimi təşkili onun gələcək inkişafı üçün perspektivlər açır, kimya və biologiya müəllimləri hazırlığı üçün yeni kafedra və laboratoriyaların yaradılmasını, müəllim hazırlığında axşam şöbəsinin fəaliyyətinin genişləndirilməsini nəzərdə tutur.

Naxçıvan MSSR Nazirlər Soveti Naxçıvan Pedaqoji İnstitutunun tədris auditoriyaları və laboratoriyaları üçün sahəsi 3440 kv.m. olan bina və müəllimlər üçün sahəsi 350 kv.m. olan 10 mənzil ayırmalıdır.

Hazırda institut üçün tədris korpusunun və hər biri 400 nəfər olan iki yataqxananın tikintisinin layihə-smeta sənədləri hazırlanır."[162]


*İ.Həbibbəyli*


*H.Qədirzadə*


*H.Səfərli*


*İ.Əliyev*

[162] *Наука и образование в Азербайджане постановления бюро и секретариата ЦК КП Азербайджана (июль 1969 - ноябрь 1982 гг.). Том 1 (июль 1969 - декабрь 1976 гг.) (Ответственный составитель:* ***Э.С.Алекперова****).Баку,2019,с.185*


*H.Cəfərov*


*M.Rzayev*


*A.İmanov*


*L.Qasımova*

Arayışda SSRİ Nazirlər Sovetinin 22 yanvar 1969-cu il tarixli 64 №-li əmri ilə pedaqoji institutların təşkili müttəfiq respublikaların Nazirlər Sovetinə həvalə edildiyi bildirilir.

Azərbaycan KP MK-nın I katibi Heydər Əliyevin və Azərbaycan SSR Nazirlər Sovetinin sədri Əli İbrahimovun imzaladıqları qərar[163] əsasında Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Naxçıvan filialı 1972-ci ildə müstəqil Naxçıvan Pedaqoji İnstitutuna [164] çevrildi.

1972-ci ilin may ayında Pedaqoji İnstitutun Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Naxçıvan filialı bölgədə təhsil və mühitinin yaradılmasında, ziyalılar nəslinin formalaşmasında, bir neçə nəsil yüksəkixtisaslı müəllim kadrlarının və onlarla tanınmış alimlərin yetişməsində mühüm rol oynamışdır. Qısa bir müddətdə fəaliyyət göstərən filialı bitirənlərin böyük əksəriyyəti sonralar Azərbaycan elminə, təhsilinə və ictimai fikrinə dəyərli töhfələr verən ziyalılar olmuşdur. Məzunlardan 8 nəfəri doktorluq dissertasiyası müdafiə etmişdir ki, onlardan da 1 nəfəri AMEA-nın həqiqi üzvü, 2 nəfəri isə AMEA-nın müxbir üzvü seçilmişdir.

***1) Həbibbəyli İsa Əkbər oğlu (1949)*** - Azərbaycan Milli Elmlər Akademiyasının vitse-prezidenti (2013), filologiya elmləri doktoru (1996), professor (1997), Azərbaycan Respublikasının Əməkdar elm xadimi (1999), AMEA-nın həqiqi üzvü (2003), Naxçıvan Dövlət Universitetinin rektoru (1996-2013), Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun direktoru (2013-cü ildən), Atatürk



*APİ-nin Naxçıvan filialının Dil-ədəbiyyat fakültəsinin məzun kitabçası*

---
[163] *Yenə orada,s.186*
[164] *29 dekabr 1990-cı ildə Naxçıvan Pedaqoji İnstitutu Azərbaycan SSR Nazirlər Sovetinin qərarı ilə Naxçıvan Dövlət Universitetinə çevrildi.*

Kültür, Dil və Tarix Qurumunun müxbir üzvü, Azərbaycan Yazıçılar Birliyi və Azərbaycan Jurnalistlər Birliyinin üzvü, I və II çağırış Naxçıvan Muxtar Respublikasının Ali Məclisinin deputatı, III, IV və V çağırış Azərbaycan Milli Məclisinin millət vəkili olmuşdur. Hal-hazırda VI çağırış Azərbaycan Respublikası Milli Məclisinin deputatıdır. "Şöhrət"(2007), "Şərəf" (2009) ordenləri ilə təltif olunub.

***2) Qədirzadə Hacı Qadir İbrahim oğlu (1948-2018)-*** AMEA-nın müxbir üzvü (2007), tarixçi-etnoqraf, tarix elmləri doktoru (2005), AMEA Naxçıvan bölməsinin Tarix, Etnoqrafiya və Arxeologiya İnstitutunun elmi işlər üzrə direktor müavini (2003-2018).

***3) Səfərli Hacıfəxrəddin Yəhya oğlu (1949)-*** AMEA-nın müxbir üzvü (2017), tarix elmləri doktoru (2004), professor (2010), Azərbaycan Respublikasının Əməkdar elm xadimi, AMEA Naxçıvan Bölməsinin Tarix, Etnoqrafiya və Arxeologiya İnstitutunun direktoru (2007-ci ildən).

***4) Əliyev İsmayıl İsrafil oğlu (1950)-*** pedaqogika elmləri doktoru (2003), professor (2005), "Naxçıvan" Universitetinin rektoru (1999-2019), Naxçıvan Muxtar Respublikası Ali Məclisinin deputatı.

***5) Cəfərov Həmzə Rza oğlu (1949-2013)*** - tarix elmləri doktoru, professor, Naxçıvan MR Təhsil naziri (2002-2005)

***6) Rzayev Məmməd Hüseyn oğlu (1952) -*** fəlsəfə elmləri doktoru (2007), professor, Azərbaycan Respublikasının Əməkdar müəllimi (2009), Beynəlxalq Turizm Akademiyasının həqiqi üzvü.

***7) İmanov Akif Kazım oğlu (1948)-*** filologiya elmləri doktoru (2010), professor

***8) Qasımova Ləzifə Nağı qızı (1948)*** -pedaqoji elmlər doktoru, professor, BDU-nun Pedaqogika kafedrasının müdiri.

## Xankəndi filialı

Pedaqoji İnstitutun Xankəndi filialı 1968/69-cu tədris ilində yaradılmışdı. Filialın təşkilində əsas məqsəd Azərbaycanın qədim və əzəli torpağı olan Qarabağ bölgəsindəki Azərbaycan və erməni məktəblərini yüksəkixtisaslı müəllim kadrları ilə təmin etmək idi. İlk vaxtlar Filologiya, Tarix və Fizika-riyaziyyat fakültələrində 8 ixtisas (Azərbaycan dili və ədəbiyyatı, erməni dili və ədəbiyyatı, riyaziyyat, riyaziyyat əlavə fizika, fizika, tarix, ümumi texniki fənlər və əlavə fizika) ixtisasları üzrə kadr hazırlanırdı. İlk tədris ilində filiala 245 tələbə qəbul olundu. Təlim Azərbaycan və erməni dillərində aparılırdı. 1972-ci ildə 4 fakültədə, 30 qrupda 720 nəfər tələbə təhsil alırdı. Onların təhsil-tərbiyəsi ilə 50-yə yaxın müəllim məşğul olurdu. Pedaqoji İnstitutun professor-müəllim heyəti müntəzəm olaraq Xankəndi filialına tələbə qəbulu aparmağa, mühazirə oxumağa, dövlət imtahanlarında iştirak etməyə ezam olunurdu. Filialın müəllim və tələbələri Pedaqoji İnstitutla sıx əlaqə saxlayır, müxtəlif konfranslarda və tədbirlərdə iştirak edirdilər.

Pedaqoji İnstitutun yarıməsrlik yubileyi münasibəti ilə 5-7 aprel 1972-ci ildə institutda Xankəndi filialı günləri keçirilmişdi[165]. Tədbirdə institutun rektoru prof.Həşim Ağayev, institut partiya komitəsinin katibi İ.Süleymanov, Filologiya fakültəsinin dekanı, prof.Afad Qurbanov, institut komsomol komitəsinin katibi Rəcəb Əliyev çıxış edərək institutun 50 ildə qazandığı tədris və elmi uğurlarından bəhs etmişlər. Filialın direktoru hesabat məruzəsi ilə çıxış etmişdir.

28 noyabr 1973-cü ildə filialın bazasında müstəqil Xankəndi Pedaqoji İnstitutu təşkil edildi. İnstitutda Azərbaycan, erməni və rus dillərində müəllim kadrları hazırlığı həyata keçirilirdi. 1973-1988-ci illərdə Xankəndi Pedaqoji İnstitutunda 3 minə yaxın müəllim hazırlanmışdır. 1974-1988-ci illərdə prof.Nəcəf Quliyev institutun prorektoru

[165] *İnstitutda Xankəndi filialı günləri."Gənc müəllim" qəzeti, 12 aprel 1972*

vəzifəsində çalışmışdır. 1988-ci ildə Xankəndi Pedaqoji İnstitutunda 10 kafedrada 102 nəfər müəllim çalışırdı ki, onlardan da 4 nəfəri elmlər doktoru, professor, 36 nəfəri elmlər namizədi, dosent idi. Aspirantura hazırlığı keçən 17 nəfər gənc tədqiqatçı dissertasiya müdafiəsi ərəfəsində idi.

1988-ci ildə Qarabağda baş verən erməni qiyamının ilk zərbəsi Xankəndi Pedaqoji İnstitutunun Azərbaycan şöbəsinin pedaqoji kollektivinə dəydi. 1988-ci ilin may ayının 16-da institutun Azərbaycan şöbəsinin müəllim və tələbələri Xankəndindən qovuldu...

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 50 illik yubileyi

50-60-cı illərdə Pedaqoji İnstitutun maddi-texniki bazası möhkəmləndirildi, qəbul planı artırıldı, qiyabi şöbənin fəaliyyəti yenidən quruldu, ali pedaqoji təhsilin məzmunu yeniləşdirildi, professor-müəllim heyətinin tərkibi elmi dərəcəlilərin hesabına xeyli artdı, dissertasiya üzərində işləyənlərlə bağlı stimullaşdırıcı tədbirlər həyata keçirildi, elmlər doktoru dissertasiyası yazanların iş yeri və əmək haqqı saxlanılmaqla elmi işçi vəzifəsinə keçirilmələrinə icazə verildi.

Yubiley ərəfəsində institutda filiallarla birlikdə əyani, qiyabi və axşam şöbələrində 14709 tələbə təhsil alırdı.

| Fakültə | Əyani şöbə | | | Qiyabi şöbə | | | Axşam şöbəsi |
|---|---|---|---|---|---|---|---|
| | Bakı | Naxçıvan filalı | Xankəndi filialı | Bakı | Naxçıvan filialı | Xankəndi filialı | Bakı |
| **Dil-ədəbiyyat** | 1110 | 156 | 130 | 1121 | 113 | 152 | 54 |
| **Riyaziyyat** | 1913 | 150 | 152 | 720 | 79 | 106 | 105 |
| **Fizika** | 861 | 74 | 79 | - | - | - | 51 |
| **Biologiya** | 207 | - | - | 437 | - | - | 49 |
| **Coğrafiya** | 1075 | 126 | - | 167 | - | - | 45 |
| **İbt.təh.ped. və metodikası** | 332 | - | - | 1343 | - | 129 | 422 |
| **Məktəbəqədər ped. və psix.** | - | - | - | 251 | - | - | 172 |
| **ÜTF və fizika** | 443 | - | - | - | - | - | 194 |
| **Kimya (əlavə biologiya)** | 576 | - | - | - | - | | - |
| **Tarix** | 689 | 104 | - | 490 | 86 | - | - |
| **Hazırlıq şöbəsi** | 225 | - | - | - | - | - | - |
| **Yekun** | 7432 | 610 | 381 | 4529 | 278 | 387 | 1092 |

1970-ci ilin yay aylarında-qəbul imtahanı ərəfəsində institutun rəhbərliyi dəyişdirildi. Azərbaycan SSR EA-nın Riyaziyyat və Mexanika İnstitutunun diferensial tənliklər şöbəsinin müdiri ***Həşim Nizam oğlu Ağayev*** 14 iyul 1970-ci ildə Pedaqoji İnstituta rektor təyin edildi. Prof.Şükür Sadıqov institutun tədris işləri üzrə prorektor, prof.Nurəddin Kazımov isə elmi işlər üzrə prorektor, dos.Məmmədsəlim Tahirli axşam və qiyabi işlər üzrə prorektor vəzifəsinə təyin edildilər. Dos.İsmayıl Süleymanov institut partiya komitəsinin katibi seçildi. Həşim Nizam oğlu Ağayev 5 avqust 1981-ci ilədək instituta rəhbərlik etdi.

***Həşim Nizam oğlu Ağayev***
*fizika-riyaziyyat elmləri doktoru, professor*
*(1916-1988)*



*1916-cı il sentyabr ayının 12-də Lənkəran şəhərində anadan olub. Orta təhsilini Lənkəran şəhərindəki 3 №-li orta məktəbdə alıb. 1936-1941-ci illərdə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin Fizika-riyaziyyat fakültəsində oxuyub. Maştağa rayonundakı 129 №-li tam orta məktəbdə direktor işləyib. 1943-cü ilin mart ayında SSRİ EA-nın Azərbaycan filialının fizika bölməsinin riyaziyyat şöbəsinə kiçik elmi işçi təyin olunub. 1944-1947-ci illərdə həmin şöbənin aspiranturasında oxuyub. 1947-ci ildə namizədlik dissertasiyası müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi elmi dərəcəsi alıb. 1948-1953-cü illərdə Azərbaycan SSR EA-nın Fizika və Riyaziyyat İnstitutunun riyaziyyat şöbəsində baş elmi işçi vəzifəsində çalışıb. 1948-1950-ci illərdə Azərbaycan Qiyabi Pedaqoji İnstitutunun Cəbr kafedrasına rəhbərlik edib. Bolqarıstana ezam olunan Həşim Ağayev 1953-1954-cü illərdə Sofiya Universitetinin Riyazi analiz kafedrasına rəhbərlik edib. Həmin dövrdə onun tərəfindən Sofiya Universitetinin türk şöbəsi üçün riyazi terminlər lüğəti tərtib edilib. 1954 -1957-ci illərdə Fizika və Riyaziyyat İnstitutunun riyaziyyat şöbəsinin müdiri, 1957-1959-cu illərdə elmi hissə üzrə direktor müavini vəzifələrində çalışıb. Azərbaycan SSR Nazirlər Sovetinin 1959-cu il 27 aprel tarixli 319 №-li qərarı ilə Azərbaycan SSR EA Fizika və Riyaziyyat İnstitutunun riyaziyyat şöbəsinin əsasında müstəqil Riyaziyyat və Mexanika İnstitutu yaradıldıqdan sonra 1959-1963-cü illərdə həmin İnstitutun elmi hissə üzrə direktor müavini vəzifəsində çalışıb. 1964-1967-ci illərdə Riyaziyyat və Mexanika İnstitutunun direktoru vəzifəsini icra etməklə yanaşı, həm də Diferensial tənliklər şöbəsinə rəhbərlik edib.*

*14 iyul 1970-ci ildən 5 avqust 1981-ci ilədək V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) rektoru olub.*

*SSRİ Nazirlər Şurası yanında AAK tərəfindən ona 1972-ci il may ayının 19-da professor elmi adı verilib. 1975-ci ildə ADU-nun Müdafiə Şurasında "О разрешимости некоторых стационарных и нестационарных нелинейных операторных уравнений в абстрактных пространствых " mövzusunda doktorluq dissertasiyası müdafiə edib. Qeyri-xətti operator tənliklərinin tədqiqinə həsr olunmuş silsilə işləri onun doktorluq dissertasiyasının əsasını təşkil edir. Onun elmi işləri, əsasən kvazixətti tənliklər və müxtəlif tipli xüsusi törəməli tənliklər sistemi, qeyri-xətti operator və diferensial-operatorlu tənliklər, ortoqonal funksiyalar sistemi nəzəriyyəsi kimi riyaziyyatın aktual məsələlərinə həsr olunmuşdur. Həşim Ağayevin əsərlərində kəsilən əmsallı yüksək tərtibli kvazixətti, elliptik və parabolik tipli tənliklər üçün sərhəd məsələlərin həllinin təyin edilməsində (qurulmasında)*

*Zere-Şauder prinsipinin tətbiq edilməsinə dair bir sıra mühüm nəticələr vardır. O, riyaziyyat elminin fəlsəfi, tarixi və metodoloji məsələlərinə və onun təbliğinə böyük əhəmiyyət verirdi. Onun "Həqiqi ədədlər və limitlər" adlı kitabı və "Riyazi təkliflər (hökmlər) və isbatlar" adlı kitabları bu məsələlərə həsr olunub. O, uzun müddət Riyaziyyat və Mexanika İnstitutunda təbiətşünaslığın (təbiət elmlərinin) fəlsəfi məsələlərinə həsr olunmuş elmi seminara rəhbərlik edib. 1944-cü ildən ömrünün sonuna qədər Həşim Ağayev respublikanın ali məktəblərində - Bakı Dövlət Universitetində, Azərbaycan Pedaqoji İnstitutunda, texniki institutlarda mühazirələr oxuyub, ixtisas seminarları aparıb, diplom işlərinə və aspirantlara rəhbərlik edib. "Riyaziyyatın mahiyyəti haqqında", "Riyaziyyata yeni baxış" məqalələri bu elmin inkişaf tarixinə və fəlsəfi problemlərinə həsr olunmuşdur. 1981-ci ildən ömrünün sonuna kimi Riyaziyyat və mexanika institutunun "Qeyri-xətti operator tənliklər" şöbəsinə rəhbərlik edib.*

*Riyazi terminlərin elmi əsaslarının yaradılmasında da onun mühüm xidmətləri olmuşdur. Azərbaycan SSR Elmlər Akademiyası, Fizika və Riyaziyyat İnstitutu tərəfindən akademik Z.Xəlilovun redaktorluğu ilə çap edilən "Riyaziyyat terminləri lüğəti"nin (1954) ərsəyə gəlməsində Həşim müəllimin böyük əməyi olub. Respublikada riyaziyyat elminin və riyazi təhsilin inkişafında mühüm xidmətləri olan Həşim Ağayev V çağırış Bakı Şəhər Sovetinin deputatı, Bakı Şəhər Partiya Komitəsinin, Respublika Dövlət Mükafatı Komissiyasının, ali təhsil müəssisələri və elmi idarələrin Həmkarlar İttifaqının Rəyasət Heyətinin üzvü kimi geniş ictimai-siyasi fəaliyyət göstərib. Prof. H.Ağayevin müasir riyaziyyatın müxtəlif problemləri ilə bağlı 3 kitabı, Azərbaycanda və xarici ölkələrdə nəşr olunmuş 70-dən çox elmi məqaləsi nəşr edilib. Onun elmi rəhbərliyi ilə 15 nəfər namizədlik dissertasiyası müdafiə edib.*

*2 avqust 1988-ci ildə Bakı şəhərində vəfat edib.*

1971-ci ilin dekabrında Pedaqoji İnstitutun kommunistlərinin ümumi yığıncağı keçirildi. Azərbaycan KP MK-nın birinci katibi *Heydər Əliyevin* də iştirak etdiyi ümumi yığıncaqda institut partiya komitəsinin katibi İ.Süleymanov "Azərbaycan KP MK-nın Oktyabr plenumu və Azərbaycan Pedaqoji İnstitutunun partiya təşkilatının qarşısında duran vəzifələr" mövzusunda məruzə etdi. Sov.İKP XXIV və Azərbaycan KP-nın XXVIII qurultaylarının qərarlarının həyata keçirilməsi sahəsində respublika ali məktəblərinin kommunistləri və bütün kollektivin qarşısında duran vəzifələri geniş təhlil edən Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev dedi:"*Ali məktəblərə qəbulun təşkilini yaxşılaşdırmaq və ali məktəblərdə təlim-tərbiyə işini təkmilləşdirmək sahəsində müəyyən işlər görülmüşdür. Lakin bu sahədə hələ çox işlər görmək lazımdır. Biz çalışmalıyıq ki, hər bir ali məktəb müəllimi nümunəvi mütəxəssis olsun, son dərəcə təmiz və əqidəli bir insan olsun. Elə insan ki, tələbələr onun kimi olmağa çalışsınlar, ondan nümunə götürsünlər.*"

Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyevin məruzəsi kollektivin qüvvəsinin institutda tədris və elmi işlərin keyfiyyətini yüksəltməyə, yüksəkixtisaslı müəllim kadrları hazırlamağa, tələbələrin təhsil-tərbiyəsini günün tələbləri səviyyəsində qurmağa, institutda mənəvi-psixoloji mühiti yaxşılaşdırmağa istiqamətləndirilməsində mühüm rol oynadı.

Həmin il institutun 1500 yerlik tələbə yataqxanası istifadəyə verildi. Tələbələr üçün əmək, məişət və istirahət şəraiti yaradıldı. 116 nəfər tələbə respublikamızın və SSRİ-nin ayrı-ayrı regionlarında yerləşən istirahət evləri və sanatoriyalarında dincəlib müalicə olundular. 61 nəfər tələbə dostluq qatarı ilə SSRİ-ni səyahət etdi.[166] Kimya, biologiya, fizika tədris laboratoriya və emalatxanaları zəruri avadanlıqla təchiz olundu.

1970/71-ci tədris ilində SSRİ tarixi kafedrasının bazasına Azərbaycan tarixi, Riyazi analiz və hesablama riyaziyyatı kafedrasının əsasında Ümumi riyaziyyat, İstehsalatın əsasları və ehtimal nəzəriyyəsi kafedrasının əsasında Ümumi texniki fənlər kafedraları təşkil edildi.

[166] ***Əliyev H.*** *Yeni vəzifələr qarşısında."Gənc müəllim", 20 aprel 1972*

1972/73-cü tədris ilində Ümumi tarix kafedrasının bazasında Tarix və ictimaiyyatın tədris metodikası kafedrası, Azərbaycan ədəbiyyatı və onun tədrisi metodikası kafedrasının bazasında Rus və xarici ölkələr ədəbiyyatı kafedrası, Ümumi texniki fənlər kafedrasının əsasında Elektrotexnika kafedrası yaradıldı. Tibbi hazırlıq və mülki müdafiə kurslarının birləşdirilməsi nəticəsində yeni kafedra - Mülki müdafiə və tibbi hazrlıq kafedrası fəaliyyətə başladı. Bu kimi sistemli və kompleks tədbirlərin həyata keçirilməsi nəticəsində Pedaqoji İnstitut pedaqoji və elmi-pedaqoji kadr hazırlığında böyük uğurlara imza atdı.

70-ci illərin əvvəllərində Pedaqoji İnstitutda yubiley əhvali-ruhiyyəsi hökm sürürdü. 1969-cu il noyabrın 1-də Azərbaycan Dövlət Universitetinin yaradılmasının 50 illiyi münasibəti ilə indiki Dövlət Təhlükəsizliyi Xidmətinin Mədəniyyət Mərkəzində yubiley tədbirinin keçirilməsi Pedaqoji İnstitutun 50 illik yubileyinin keçirilməsinə münbit zəmin yaratmışdı.

22 oktyabr 1971-ci ildə Pedaqoji İnstitutun rektoru Həşim Ağayev institutun 50 illik yubileyinin keçirilməsi ilə bağlı Azərbaycan KP MK-nın elm və təhsil şöbəsinin müdiri A.Həsənova xidməti məktub göndərmişdi. 2 fevral 1972-ci ildə Azərbaycan KP MK Büro iclasında (protokol №29) Pedaqoji İnstitutun 50 illik yubileyinin keçirilməsi məsələsi müzakirə olundu. Gündəlikdə müzakirə üçün 34 məsələ nəzərdə tutulmuşdu. 9-cu məsələ “Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 50 illiyi haqqında” idi. Azərbaycan KP MK-nın elm və təhsil şöbəsinin müdiri, Ali və orta ixtisas təhsili naziri və b. çıxış edərək institutun yubileyinin keçirilməsinin vacibliyini əsaslandırdılar. İclasda Ali və Orta İxtisas Təhsili Nazirliyinin 1972-ci ilin mayında ADPİ-nin 50 illiyinin keçirilməsi ilə bağlı təklifi qəbul edildi. Heydər Əliyevin təklifi ilə aşağıdakı tərkibdə yubiley komissiyası yaradıldı:[167]

**Hüseynov Kamran** (sədr) – Azərbaycan SSR Nazirlər Soveti sədrinin müavini

**Məmmədov Əlağa** – Azərbaycan KP MK-nın elm və təhsil şöbəsinin müdiri

**Qafarova Elmira** – Azərbaycan KP MK-nın mədəniyyət şöbəsi müdirinin müavini,

**Əliyev Qurban** – Azərbaycan SSR Ali və orta ixtisas təhsili naziri

**Mehdizadə Mehdi** – Azərbaycan SSR Maarif naziri

**Ağayev Həşim** - ADPİ-nin rektoru (sədr müavini)

**Süleymanov İsmayıl** – ADPİ-nin partiya təşkilat katibi

**Qasımzadə Feyzulla** – ADPİ-nin kafedra müdiri, professor

**Muradxanov Mərdan** – ADPİ-nin kafedra müdiri, professor

Yubiley komissiyasına 1 ay müddətinə Pedaqoji İnstitutunun 50 illik yubileyinin yüksək səviyyədə keçirilməsi ilə bağlı təkliflər hazırlamaq tapşırıldı.

1946-cı ildə Pedaqoji İnstitutun 25 illik yubileyinin keçirilməsi ilə bağlı Azərbaycan KP MK-nın Moskvaya ünvanladığı məktubun cavabsız qaldığını yaxşı bilən Heydər Əliyevin təkidli tələbləri və qətiyyəti nəticəsində institutun 50 illik yubileyi yüksək səviyyədə keçirildi.

Yubiley komissiyasının təkliflərinə uyğun olaraq V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun yarıməsrlik yubileyi münasibəti ilə 1 mart 1973-cü ildə institutun böyük akt zalında “Azərbaycan SSR-də ali təhsilin inkişafı Lenin milli siyasətinin təntənəsidir” mövzusunda elmi sessiya keçirildi[168].

Elmi sessiyanı giriş sözü ilə institutun rektoru, professor Həşim Ağayev açdı. Azərbaycan SSR Ali və orta ixtisas təhsil naziri Qurban Əliyev Azərbaycanda ali məktəbin inkişafı ilə bağlı məruzə etdi. Sessiyada ADU-nun rektoru prof.F.M.Bağırzadə, Azərbaycan Politexnik İnstitunun rektoru, prof. P.Ə.Bədəlov, Azərbaycan Dövlət Konservatoriyasının prorektoru dos.B.M.Məmmədova, Azərbaycan Xalq Təsərrüfatı İnstitutunun rektoru, prof. Səlvər Aslanov, Azərbaycan Tibb İnstitutunun rektoru, prof.Zəhra Quliyeva, M.F.Axundov adına Azərbaycan Pedaqoji İnstitutunun rektoru Ə.Məm-

[167] *Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. F.1, siy.59, iş 16*
[168] *Azərbaycan Respublikası Prezidentinin*

mədov, Ali və Orta İxtisas Təhsili Nazirliyinin şöbə müdiri O.Babayev məruzələrlə çıxış etdilər. Pedaqoji İnstitutun prorektoru prof.Rafiq Rəcəbov institutun bazası əsasında yaranan M.F.Axundov adına Azərbaycan Pedaqoji İnstitutu, Kirovabad (Gəncə) Pedaqoji İnstitutu, Naxçıvan Pedaqoji İnstitutu, Bədən Tərbiyəsi İnstitutu və Xankəndi filialı haqqında məlumat verdi.

Yubileyə kimi Pedaqoji İnstitutun 50 illiyi ilə bağlı xeyli görüşlər, elmi sessiyalar və konfranslar keçirilmişdi. 1972-ci ilin mayın 19-da C.Məmmədzadə adına Naxçıvan Dövlət Musiqili Dram Teatrında ADPİ-nin 50 illik yubileyi ilə bağlı elmi sessiya keçirildi.[169]. Sessiyada ADPİ-nin Naxçıvan filialının direktoru S.Babayev, Azərbaycan KP Naxçıvan Vilayət Komitəsinin birinci katibi Q.Qurbanov, Azərbaycan LKGİ Naxçıvan Vilayət Komitəsinin birinci katibi V.Hüseynova, Naxçıvan Maarif nazirinin müavini Ə.Hüseynov, Azərbaycan SSR Yazıçılar İttifaqı Naxçıvan filialının məsul katibi M.Nəsirli təbrik nitqi ilə çıxış etdilər. ADPİ-nin partiya komitəsinin katibi İ.Süleymanov "V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 50 illiyi", Tarix fakültəsinin dekanı, dos.H.Qasımzadə "İnstitutun Tarix fakültəsinin 50 illik fəaliyyəti" Azərbaycan ədəbiyyatı tarixi və onun tədrisi metodikası kafedrasının dosenti A.Alməmmədov "İnstitutun Filologiya fakültəsi 50 ildə" mövzularında məruzə etdilər. ADPİ-nin məzunu Ə.Yusifli "50 yaşın mübarək" şeirini oxudu.

V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 50 illiyi şərəfinə təntənəli yığıncaq 2 mart 1973-cü ildə indiki Dövlət Təhlükəsizliyi Xidmətinin Mədəniyyət Mərkəzində keçirildi.

Tədbiri giriş sözü ilə yubiley komissiyasının sədri, Azərbaycan SSR Nazirlər Sovetinin sədrinin müavini Kamran Hüseynov açdı. Azərbaycan KP MK-nın I katibi Heydər Əliyev kollektivi Qırmızı Əmək Bayrağı ordeni alması münasibəti ilə Azərbaycan KP MK, Azərbaycan SSR Ali Soveti Rəyasət Heyəti və Azərbaycan SSR Nazirlər Soveti adından təbrik edərək dedi:

"*Bu gün institutun yarıməsrlik yoluna yekun vurarkən biz... sovet hakimiyyəti illərində Azərbaycan mədəniyyətinin qazandığı çox böyük müvəffəqiyyətləri iftixar hissi ilə qeyd edirik. Sizin institutunuz böyük və şanlı yol keçmişdir. Nəriman Nərimanovun imzaladığı dekretdə deyildiyi kimi, pedaqoji institutun məqsədi "vahid əmək məktəbinin ideyalarını həyata tətbiq etməyə" qabil olan müəllim kadrları hazırlamaq idi. İnstitutun tarixi Azərbaycanda xalq maarifinin təşəkkülü və inkişafı, onun sosialist mədəniyyətinin tərəqqisi tarixindən ayrılmazdır. Onun kollektivi Azərbaycanda ümumtəhsil məktəbinin inkişafına böyük xidmət göstərmiş, xalq maarifi üçün yüksəkixtisaslı kadrlar ocağına çevrilmişdir. Yarım əsr bundan əvvəl institutda o qədər az tələbə var idi ki, onlarla cəmi 7 müəllim məşğul olurdu. İndi sizin institutunuz ölkənin ən böyük ali məktəblərindən biridir. Onun 15 fakültəsində təqribən 15 min tələbə oxuyur, professor-müəllim heyəti isə 800 nəfərdən ibarətdir. Öz varlığı ərzində institut təqribən 40 min müəllim, xalq maarifi və elmi idarə işçisi hazırlamışdır. Sizinlə birlikdə fəxr edirik ki, institutun yetirmələri arasında SSRİ EA-nın müxbir üzvləri, Azərbaycan EA-nın həqiqi və müxbir üzvləri, Sovet İttifaqı Qəhrəmanları, Sosialist Əməyi Qəhrəmanları, xalq yazıçıları və şairləri, yüzlərlə elmlər doktoru və namizədi vardır. V.İ.Lenin adına APİ-nin minlərlə yetirməsi respublikamızın elm və mədəniyyətinin bütün sahələrində və onun hüdudlarından kənarda səmərəli çalışır, Vətən qarşısında öz borcunu şərəflə yerinə yetirir... İnstitut təkcə Azərbaycan SSR üçün deyil, həm də digər respublikalar üçün bir çox ixtisaslar üzrə pedaqoji kadrlar hazırlayan tanınmış mərkəzə çevrilmişdir. Burada Gürcüstan, Ermənistan, Özbəkistan, Türkmənistan, Tacikistan sovet sosialist respublikaları, Dağıstan, Kabara-Balkar, Çeçen-İnquş muxtar sovet sosialist respublikaları üçün pedaqoji və elmi-pedaqoji kadrlar yetişdirilmişdir.*

*Biz xüsusi razılıq hissi ilə qeyd edirik ki, institut iri elmi mərkəzdir. Burada Azərbaycan ədəbiyyatşünaslığı və dilçiliyi, pedaqogika tarixi sahəsində və başqa fənlər üzrə qiymətli əsərlər yaradılmışdır. Klassik rus pedaqoji təfəkküründən yaradıcılıqla istifadə edilməklə yazılan bu əsərlər Azərbaycan sovet məktəbinin təcrübəsini zənginləşdirmişdir. İnstitutun alimləri bir çox pedaqoji fənlər üzrə*

[169] *Yubiley sessiyası."Gənc müəllim" qəzeti, 25 may 1972*

*Azərbaycan dilində orijinal dərsliklər, iri monoqrafiyalar və dərs vəsaitləri yazmışlar*”.[170]

Pedaqoji və elmi-pedaqoji kadr hazırlığında rus və azərbaycanlı müəllimlərin əməyini yüksək qiymətləndirən Heydər Əliyev daha sonra dedi: ”*Gələcək müəllim kadrlarının elmi hazırlıq və peşə ustalığı səviyyəsini əzmlə yüksəltmək... institutun professor-müəllimlərinin müqəddəs borcudur. İnstitut çalışmalıdır ki, onun məzunları daim öz üzərlərində işləməyə və təkmilləşməyə, biliklərini artırmağa və təzələməyə, ixtisaslarını yüksəltməyə tələbat hiss etsinlər”*.[171]

Azərbaycan KP MK-nın I katibi Heydər Əliyev çıxışının sonunda V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Qırmızı Əmək Bayrağı ordeni ilə təltif edilməsi haqqında SSRİ Ali Soveti Rəyasət Heyətinin Fərmanın mətni ilə yubiley iştirakçılarını tanış edərək gurultulu alqışlar altında ordeni Pedaqoji İnstitutun bayrağına sancdı.




**V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Qırmızı Əmək Bayrağı ordeni ilə təltif edilməsi haqqında SSRİ Ali Soveti Rəyasət Heyətinin FƏRMANI**

Müəllim kadrları hazırlamaq və pedaqogika elmini inkişaf etdirmək sahəsində qazandığı müvəffəqiyyətlərə görə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu ***Qırmızı Əmək Bayrağı*** ordeni ilə təltif edilsin.

SSRİ Ali Sovetinin Rəyasət Heyətinin Sədri
SSRİ Ali Sovetinin Rəyasət Heyətinin Katibi
*Moskva, Kreml, 26 may 1972*

**V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 50 illik yubileyi**



[170] *Yüksək məqsəd, nəcib vəzifə. “Azərbaycan müəllimi” qəzeti, 7 mart 1973*
[171] *Yenə orada*



*Ulu öndər H.Əliyev APİ-nin 50 illik yubiley tədbirində*





*Ulu öndər H.Əliyev APİ-nin 50 illik yubiley tədbirində*





*Ulu öndər H.Əliyev APİ-nin 50 illik yubiley tədbirində*

Ulu öndər Heydər Əliyev çıxışının sonunda müəllim kadrları hazırlanmasında xidmətlərinə görə institutun professor-müəllimlərinin bir qrupuna Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fərmanı ilə fəxri adların və Fəxri Fərmanların verildiyini bildirərək dedi: *"İcazə verin, institutun professsorlarını, müəllimlərini, tələbələrini, bütün əməkdaşlarını yarıməsrlik yubiley, yüksək hökumət mükafatı ilə bir daha təbrik edim və əziz yoldaşlar, sizə möhkəm cansağlığı, səadət və xoş güzəran, yeni müəllim kadrlarının hazırlanmasında və tərbiyə edilməsində böyük yaradıcılıq müvəffəqiyyəti arzulayım*".[172]

Respublikada müəllim kadrlarının hazırlanmasındakı xidmətlərinə görə V.İ.Lenin adına Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 50 illiyi ilə əlaqədar olaraq Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin 2 mart 1973-cü il tarixli Fərmanı ilə institut əməkdaşlarından 7 nəfərə ***Əməkdar elm xadimi*** fəxri adı verildi:

**1. Vəkilov Mehdixan Yusif oğlu** – Sov.İKP tarixi kafedrasının professoru

2. **Dəmirçizadə Əbdüləzəl Məmməd oğlu** – Azərbaycan dilçiliyi kafedrasının müdiri

**3. İbrahimov Cəfər Məmməd oğlu** – Sov.İKP tarixi kafedrasının müdiri

**4. Qədirov Həmid Musa oğlu** – Botanika kafedrasının müdiri

**5. Qafarova Roza Zeynal qızı** – Biologiya fakültəsinin dekanı

**6. Muradxanov Mərdan Əsədulla oğlu** – İbtidai təhsilin pedqogikası və metodikası kafedrasının müdiri

7. **Antonyan Qurken Kerosimoviç** – Erməni dili kafedrasının müdiri.

Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin 2 mart 1973-cü il tarixli Fərmanı ilə institut əməkdaşlarından 1 nəfərə - Siyasi iqtisad kafedrasının müdiri *Cahangirov Zülqədər Həsən oğluna* ***Əməkdar iqtisadçısı***, 11 nəfər əməkdaşa isə ***Əməkdar müəllim*** fəxri adı verildi:

1. Əliyev Firudin Cahangir oğlu – Biologiyanın tədrisi metodikası kafedrasının müdiri

2. Əhmədov Əlif İsmayıl oğlu – Fizikanın tədrisi metodikası kafedrasının dosenti

3. Bartanov Vartan Minosoviç – Botanika kafedrasının baş müəllimi

4. Hacıyev Hacıbala Allahverdi oğlu – Biologiyanın tədrisi metodikası kafedrasının baş müəllimi

5. Rüstəmova İncixanım Ağası qızı – İbtidai təhsil pedaqogikası və metodikası kafedrasının baş müəllimi

6. Sadıqov Sadıq Hacalı oğlu – Elementar riyaziyyat kafedrasının dosenti

7. Stepanov İvan Petrovski – Sov. İKP tarixi kafedrasının dosenti

8. Sultanov Bəhram Şəfi oğlu – Fizikanın tədrisi metodikası kafedrasının dosenti

9. Təmrazıl Abdulla Fərəc oğlu – Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının baş müəllimi

10. Tahirzadə Tərlan Rəsul qızı – Biologiyanın tədrisi metodikası kafedrasının dosenti

11. Əfəndiyeva Səlimə Əhməd qızı – Məktəbəqədər pedaqogika kafedrasının baş müəllimi.

Müəllim kadrları hazırlanmasında müvəffəqiyyətlərinə, uzun illər səmərəli işlərinə görə institutun 42 nəfər əməkdaşı **Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı** ilə təltif edildi:

1.Abbasova Həmidə Kabı qızı – İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsinin dekanı

2.Ağayev Həşim Nizam oğlu – rektor

3.Əlizadə Nəsib İsmayıl oğlu –SSRİ tarixi kafedrasının professoru vəzifəsini icra edən

4.Aslanov Qriqori Samsonoviç – Sov.İKP tarixi kafedrasının dosenti

5.Axundov Mirzağa Əbdülhüseyn oğlu – Biologiya və coğrafiya fakültəsinin dekanı (qiyabi üzrə)

5.Axundov Soltansəlim Həsən oğlu – İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti, institutun partiya komitəsinin katibi

6.Baqsdasyan Qurken Xaçaturoviç – Xankəndi filialının baş müəllimi

7.Balayev Vladimir Hüseyn oğlu – mətbəə müdiri

---

[172] *Yenə orada*

8.Bıkobskaya Valentina Alekseyevna – kitabxanaçı

8.Verdizadə Allahverdi Əmənulla oğlu – Analitik kimya kafedrasının müdiri

9.Hacıyev Mürsəl Hacı oğlu – Sov.İKP tarixi kafedrasının baş müəllimi

10.Qasımova Güllübəyim Abbas qızı – süpürgəçi

11.Əhmədov Əlisa Heydər oğlu – Fizika fakültəsinin dekanı

11.Hüseynov Azər Əliş oğlu – Azərbaycan dilçiliyi kafedrasının dosenti

12.Hüseynov Hüseynəli Gülbala – Rəsm və musiqi kafedrasının baş müəllimi

13.Hüseynov İsa Salman oğlu – İstehsalatın əsasları kafedrasının baş müəllimi

14.Hüseynov Cəlal Kərim oğlu – Siyasi iqtisad kafedrasının dosenti

15.Zeynalova Xanımana Şahpələng qızı – paltarsaxlayan

16.Qarayev Rasim Şirin oğlu – Siyasi iqtisad kafedrasının dosenti

17.Qasımzadə Feyzulla Səməd oğlu – Azərbaycan ədəbiyyatı və onun tədrisi metodikası kafedrasının müdiri

18.Qasımzadə Həmzə Qasım oğlu – Tarix fakültəsinin dekanı

19.Qasımov Qasım Səftər oğlu – Naxçıvan Pedaqoji İnstitutunun İctimai fənlər və tarix kafedrasının baş müəllimi

20.Klimova Anna Nikitiçna – Rus dili kafedrasının dosenti

21.Məmmədov Absəddin Ağabala oğlu – Ümumi fizika və astronomiya kafedrasının müdiri

22.Paşayev Nəzər Abdulla oğlu – Azərbaycan tarixi kafedrasının müdiri

23.Rəhimov Oqtay Süleyman oğlu – Elmi kommunizmin əsasları kafedrasının müdiri

24.Seyidov Əhməd Yusif oğlu – Pedaqogika kafedrasının müdiri

25.Smelyavskaya Vera Danilov – Fizikanın tədrisi metodikası kafedrasının müəllimi

26.Sultanov Çingiz İmamverdi oğlu – IV kurs tələbəsi

27.Tağiyev Əyyub Səməd oğlu – İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsinin dekanı (qiyabi üzrə)

28.Tarverdiyeva Kövsər Məmməd qızı – Azərbaycan ədəbiyyatı kafedrasının dosenti

29.Fərəcov Əli Abbas oğlu – Filologiya fakültəsinin dekanı (qiyabi üzrə)

30.Fərhadov Fərhad Qulu oğlu – Azərbaycan ədəbiyyatı kafedrasının professoru

31.Xasməmmədov Teyfur Qədir oğlu – Fizikanın tədrisi metodikası kafedrasının müdiri

32.Xaçıyan Sergey Aruşonoviç – Elementar riyaziyyat və onun tədrisi metodikası kafedrasının dosenti

33.Şərifzadə Behbud Aslan oğlu – Fizikanın tədrisi metodikası kafedrasının dosenti

34.Şahtaxtinskaya Zəhra Mustafa qızı – Zoologiya kafedrasının müdiri

35.Şıxlı İsmayıl Qəhrəman oğlu – Xarici ədəbiyyat kafedrasının müdiri

36.Şıxlı Məmməd Nadir oğlu – Ümumi tarix kafedrasının müdiri

37.Əfəndiyev Həmid Əhməd oğlu – Fəlsəfə kafedrasının dosenti

38.Yusifzadə Bəhram Murad oğlu – Həndəsə kafedrasının dosenti[173]

Yubiley tədbirində kollektiv adından rektor, prof.Həşim Ağayev, institutun ilk müəllimlərindən olan prof.Zəhra Şahtaxtinskaya və tələbə Fəridə İsmayılova çıxış edərək kollektivin öz qüvvəsini və biliyini yüksəkixtisaslı müəllim kadrları hazırlanmasına, xalq maarifi işinin inkişafına həsr edəcəyini bildirdilər.

Qonaqlardan V.İ.Lenin adına Moskva Pedaqoji İnstitutunun prorektoru K.B.Paşkanq, V.V.Mayakovsi adına Qırğızıstan Pedaqoji İnstitutunun direktoru H.X.Əbdüləzizova, Türkmənistan Universitetinin rektoru S.H.Muradov, A.S.Puşkin adına Tbilisi Pedaqoji İnstitununu partiya komitəsinin katibi R.A.Donidze, Dağıstan Pedaqoji İnstitutunun rektoru M.Ə.Maqomedov və Azərbaycan EA-nın prezidentinin müavini M.A.Dadaşzadə, Azərbaycan SSR Maarif naziri M.M.Mehdizadə, S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin rektoru

---

[173] *Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. F.1,siy.60, iş 22, v.299-301*

F.M.Bağırzadə, Azərbaycan Yazıçılar İttifaqının birinci katibi, Xalq yazıçısı Mirzə İbrahimov, SSRİ Ali Sovetinin deputatı Q.M.Süleymanova, Sosialist Əməyi Qəhrəmanı Şaban Rzayev, Azərbaycan LKGİ MK-nın ikinci katibi Q.A.Orlov, Azərbaycan SSR Ali və orta ixtisas təhsili naziri Q.H.Əliyev 50 illik yubiley və yüksək hökumət mükafatı münasibəti ilə Pedaqoji İnstitutun kollektivini təbrik etdilər.

## Əməkdar elm xadimi fəxri adı ilə təltif olunanlar


*M.Vəkilov*


*Ə.Dəmirçizadə*


*C.İbrahimov*


*H.Qədirov*


*R.Qafarova*


*M.Muradxanov*

## Əməkdar müəllim fəxri adı ilə təltif olunanlar


*F.Əliyev*


*Ə.Əhmədov*


*H.Hacıyev*


*İ.Rüstəmova*


*S.Sadıqov*


*B.Sultanov*


*A.Təmrazlı*


*S.Əfəndiyeva*


*Z.Cahangirov*
Əməkdar iqtisadçı

Yığıncaqda SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyindən, SSRİ Maarif Nazirliyindən, ÜİLKGİ MK-dan V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun adına gələn təbrik məktubları oxundu. Həmin dövrdə "Gənc müəllim" qəzetində Pedaqoji İnstitutun məzunlarından dos.Hacıbaba Hacıyevin[174], Sovet İttifaqı Qəhrəmanı Səlahəddin Kazımovun[175], Dövlət Mükafatı laureatı, Azərbaycan SSR Xalq artisti Səid Rüstəmovun[176], dos.Nəsib Əlizadənin[177] təbrik məktubları və məqalələri nəşr olunmuşdu.

30-cu illərdə Pedaqoji İnstitutun elmi və tədris həyatını real lövhələrlə təsvir edən ***İsmayıl Şıxlının "Daha parlaq olsun***" xatirə yazısını olduğu kimi verməyi məqsədəuyğun hesab edirəm*:"Üstü sarı kirəmitli, üç mərtəbəli bu bina o zaman Azərbaycanın ucqar rayonlarından gəlmiş tələbələrin nəzərində ən böyük, ən müqəddəs bina idi. Bu binanın geniş foyeləri bizi işıqlı mühazirə otaqlarına, böyük iclas salonlarına, zəngin kitabxanalara aparıb çıxarırdı. Nağıllarda olduğu kimi hər qapını açdıqca yeni, sehrli bir aləmlə qarşılaşırdıq. O zaman APİ-nin özü də, müəllimləri də gənc idi. Lakin bu gənc müəllimlər məşəl kimi alovlanır, bizim qəlbimizə, zehnimizə işıq saçırdılar. Əli Sultanlı şagirdi Əkbər Ağayevlə birlikdə bizi əfsunlayıb antik dünyanın əfsanəvi qəhrəmanlıq diyarında gəzdirirdi. Həmid Araslı Dədə Qorqud kimi saz tutub, söz qoşur, tələbələrini Qıratın yel qanadlarında Çenlibelə aparırdı. Dəmirçizadə ədəbi dilimizin dərin laylarını qaldırır. Əkrəm Cəfər dillərin mənşəyindən elə sehrli söhbətlər açırdı ki, biz onun ədəbiyyatçı, yoxsa dilçi olduğunu ayırd edə bilmirdik. Məmməd Arif öz cavan həmkarı Məmməd Cəfər müəllimlə köməkləşərək rus ədəbiyyatının ağır qapılarını aralayır, bizi Yevgeni Oneginlə, Peçorinlə, Nexlyudovla, Bazarovla, "altı nömrəli palata" ilə, fırtına quşları və Qriqori Nelexovla tanış edirdi. Feyzulla Qazımzadə ilə bərabər XIX əsrə gedir, Mikayıl Rəfili ilə Nizami dünyasının dolaşır, Cəfər Xəndanla birlikdə Sabir tipləri ilə tanış olurduq. Əhməd Seyidov isə cəmiyyətdəki insanların yetişməsində tərbiyənin oynadığı böyük roldan söhbət açırdı. Müəllimlərimiz bizi ədəbi aləmdən pedaqoji aləmə, oradan da idrakın daha cazibədar sahəsinə aparırdılar. Qarşımızda yeni bir dünya, fəlsəfə dünyası açılırdı. Bu yolların bələdçisi isə Həmid Əfəndiyev idi.*

*Biz elmlərin sehrli dünyasından ayrılmaq istəmirdik. Lakin ayırdılar. Mən müharibənin başlaması xəbərini də APİ-də eşitdim. Yoldaşlarımla cəbhəyə də buradan getdik. Qələbədən sonra da yenidən buraya gəldik.*

*İndi APİ bir az toxtamışdır. Onun əlli yaşı tamam olur. İyirmi-otuz il burada dərs deyən cavanlar artıq professor, akademik adını almışlar. Nəsilləri nəsillər əvəz edir.*

*İllər keçir, ancaq Azərbaycanın ilk maarif ocaqlarından biri olan APİ-nin yandırdığı məşəllər sönmür, əksinə çoxalır və getdikcə daha da uzaqlarda alovlanır"*[178]

Pedaqoji İnstitutun 50 illik yubileyi ilə bağlı ədəbi-bədii və publisistik yazıların hamısını xülasələndirmək mümkün olmasa da, hesab edirəm ki, 2 mart 1973-cü ildə "Azərbaycan müəllimi" qəzetində çap edilən ***"Sən elə anasan ki..."***[179] şeiri yazılanların leytmotivini təşkil edir:

Əlli bahar ötüşür şərəfli ad günündən
Ömrünü ömürlərə calayıb ucalmısan.
Sən işıq həvəslisən, səadət carçısısan,
İlhamını xalqımın ilhamından almısan.
Büdrəmədən bir an da elmin çətin yolunda,
Sinəni bəzəyibdir Qızıl Əmək Bayrağı.
Arzuların od kimi, qəlbimizdə yanıbdır.
Laləzara çevirdin sən bu ana torpağı
Neçə diyardan gəlir, əziz mehriban səsin
Şaxələnib budağın yayılıbdır hər yana.
Sən elə anasan ki, isti, ılıq nəfəsin
Əbədi bir məşəldir doğma Azərbaycana!

[174] **Hacıyev H.** *Mənim tələbəlik illərim. "Gənc müəllim".26 fevral 1973*
[175] **Kazımov S.** *Təbrik edirəm, doğma institut. "Gənc müəllim", 26 fevral 1973*
[176] **Rüstəmov S.** *Bayramın mübarək. "Gənc müəllim", 26 fevral 1973*
[177] **Əlizadə N.** *Fəxr edirəm. "Gənc müəllim" qəzeti, 26 fevral 1973*
[178] **Şıxlı İsmayıl.** *Daha parlaq olsun."Gənc müəllim" qəzeti, 26 fevral 1973*
[179] **M.Şokət.** *Sən elə anasan ki... "Azərbaycan müəllimi" qəzeti, 2 mart 1973*

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunda hazırlıq və ixtisasartırma şöbələrinin təşkili

20 avqust 1969-cu ildə Sov.İKP MK və SSRİ Nazirlər Soveti "Ali təhsil müəssisələrində hazırlıq şöbələrinin yaradılması" haqqında qərar qəbul etdi. Fəhlə və kəndli gənclərin ümumtəhsil hazırlıq səviyyəsini yüksəltmək və onların ali təhsil müəssisələrinə qəbul olunmasında vacib şəraitin yaradılması üçün ali təhsil müəssisələrinin nəzdində, təhsili gündüz, axşam və qiyabi formalarda almaqda, hazırlıq şöbələrinin açılması məqsədəuyğun hesab edildi (istehsalatdan ayrılmaqla – 8, istehsalatdan ayrılmamaq şərti ilə – 10 ay) gənclərin bu şöbələrə seçilməsi və göndərilməsi bilavasitə müəssisə, tikinti, nəqliyyat və rabitə, sovxoz, kolxoz rəhbərləri, hərbi hissə komandanlığı, partiya, komsomol, həmkarlar təşkilatlarının zəmanəti ilə həyata keçirilirdi. Bu hazırlıq şöbələrini bitirən və buraxılış imtahanlarını müvəffəqiyyətlə verən şəxslər qəbul imtahanları vermədən institutların I kursuna daxil olurdular.[180]

1970-1971-ci illərdə SSRİ-nin pedaqoji institutlarında 100-dən çox hazırlıq şöbələri fəaliyyət göstərirdi. Həmin il Pedaqoji İnstitutda hazırlıq şöbəsi açıldı, coğrafiya, fizika, riyaziyyat və kimya ixtisaslarına 119 nəfər dinləyici qəbul edildi. 1971/72-ci tədris ilində tarix və ədəbiyyat ixtisasları üzrə də dinləyici qəbul olundu.

1970-1975-ci illərdə həmin şöbəyə dos.*Rafik Yəhyayev,* 1975-1989-cu illərdə dos.*Zeynəb Vəliyeva*, 1989-1992-ci illərdə prof.*Sərdar Quliyev* rəhbərlik etmişdir.

1971/72-ci tədris ilində hazırlıq şöbəsinin buraxılış imtahanında iştirak edən 84 dinləyicidən 75 nəfəri, 1972/73-cü ildə 147 dinləyicidən 128 nəfəri müvəffəqiyyətlə imtahan verərək Pedaqoji İnstitutun tələbə ailəsinin üzvünə çevrildilər[181]. 1973-cü ildə hazırlıq şöbəsinə 6 ixtisas üzrə 150 nəfər dinləyici qəbul olunmuşdu. 1970-1980-ci illərdə hazırlıq şöbəsində oxuyan 1639 dinləyicidən 1542 nəfəri (94 %) müvəfəqiyyətlə buraxılış imtahanı verərək institutun I kursuna qəbul olundu.

Bu kompaniya ali məktəblərdə kadr hazırlığının keyfiyyət göstəricilərinin aşağı düşməsinə səbəb oldu. Orta məktəbi çətinliklə qurtaran, amma istehsalatda 2-3 il işləyən gənclərin güzəştli şərtlərlə ali məktəblərə qəbul edilməsi yüzlərlə gəncin ali təhsildən kənarda qalmasına səbəb olurdu. Təhsilə belə yanaşma *"bilik yeganə meyardır"* prinsipini pozurdu.

1970-1981-ci illərdə Pedaqoji İnstitutda hazırlıq şöbəsinin inkişaf dinamikası aşağıdakı kimi olub:

| Tədris illəri | Qəbul | Ümumi kontingent | Buraxılış | Partiya vəziyyti | | | Sosial vəziyyəti | | | Hərbi xidmətdən gələnlər |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | | | Partiyaçı | Komsomolçu | Bitərəf | Sənaye fəhlə | Kolxozcu və fəhlə | Sovxoz fəhlə | |
| 1970/71 | 44 | 119 | 44 | 7 | 109 | 3 | 27 | 60 | 17 | 15 |
| 1971/72 | 125 | 150 | 123 | 19 | 124 | 7 | 34 | 53 | 28 | 10 |
| 1972/73 | 150 | 150 | 145 | 18 | 123 | 9 | 42 | 66 | 34 | 8 |

[180] *Народное образование в СССР. Общеобразовательная школа. Сб. документов 1917-1973, Москва: Педагогика, 1974, 440 с.*
[181] ***Yəhyayev R.*** *Hazırlıq şöbəsinin uğurlu addımları."Gənc müəllim" 13 sentyabr 1973*

| | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| 1973/74 | 145 | 145 | 145 | 21 | 111 | 9 | 37 | 46 | 32 | 48 |
| 1974/75 | 175 | 175 | 158 | 14 | 148 | 13 | 33 | 74 | 56 | 12 |
| 1975/76 | 175 | 146 | 126 | 15 | 105 | 6 | 31 | 46 | 25 | 24 |
| 1976/77 | 175 | 133 | 117 | 13 | 104 | 16 | 22 | 40 | 28 | 27 |
| 1977/78 | 175 | 175 | 146 | 33 | 134 | 8 | 29 | 51 | 64 | 31 |
| 1978/79 | 175 | 194 | 167 | 24 | 136 | 7 | 37 | 43 | 64 | 23 |
| 1979/80 | 200 | 178 | 175 | 25 | 145 | 5 | 36 | 57 | 46 | 37 |
| 1980/81 | 200 | 197 | 197 | 26 | 164 | 7 | 51 | 55 | 71 | 20 |



*Hazırlıq şöbəsi (1988)*

1974-cü ildə Azərbaycan SSR Nazirlər Sovetinin qərarı ilə S.M.Kirov adına ADU-da və bir neçə pedaqoji təmayüllü institutda ümumtəhsil məktəb müəllimlərinin ixtisasartırma fakültəsinin təşkili nəzərdə tutuldu. Azərbaycan SSR Ali və Orta İxtisas Təhsil Nazirliyi və Azərbaycan SSR Maarif Nazirliyinin birgə əmri ilə 1973-cü ildə Azərbaycan Pedaqoji İnstitutunda ***İxtisasartırma fakültəsi*** (dekan dos.Hüseyn Əhmədov) yaradıldı.

Ümumtəhsil məktəb müəllimlərinin üç ixtisas (Azərbaycan dili və ədəbiyyat, riyaziyyat, biologiya) üzrə təkmilləşdirilməsinə başlanıldı. Fakültədə ilk məşğələ 11 yanvar 1974-cü ildə keçirildi. İlk mühazirələrə Azərbaycan EA-nın həqiqi üzvü, prof.F.Qasımzadə, Azərbaycan EA-nın müxbir üzvü, prof.Ə.Dəmirçizadə, professorlar Həşim Ağayev (institutun rektoru), Əhməd Seyidov, Mərdan Muradxanov, Roza Qafarova, Ağaməd Abdullayev, Afad Qurbanov, Fərhad Fərhadov, Məmməd



*Dekan dos.H.Əhmədov*

Məmmədov, Maqsud Cavadov, Həmid Qədirov dəvət edildi. Fakültə Naxçıvan MSSR, DQMV, Bakı, Sumqayıt, Mingəçevir, Əli Bayramlı, Lənkəran, Naftalan şəhər orta məktəblərinə və 26 kənd rayonunun orta məktəb müəllimlərinin ixtisasartırmasını təşkil etməli idi. Kursların müddəti istehsalatdan ayrılmaq şərti ilə bir ay müəyyənləşdirilmişdi, yanvar-may və sentyabr-dekabr aylarında keçirilirdi. 1974-1977-ci ildə 7696 nəfər müəllim təkmilləşdirilmişdi ki, onlardan

da 4023-ü Azərbaycan dili və ədəbiyyat müəllimi idi. İxtisasartırma fakültəsinə 1974-1979-cu illərdə *prof. Hüseyn Əhmədov*, 1979-1982-ci illərdə *dos. Tağı Xalisbəyli* rəhbərlik etdi.

60-70-ci illərdə institutda professor-müəllim heyətinin tərkibinin elmi dərəcəlilərin hesabına yaxşılaşdırılması ilə bərabər, onların Bakının və SSRİ-nin ən yaxşı ali və elmi tədqiqat müəssisələrində ixtisaslarının təkmilləşdirilməsinə imkan yaradıldı. 1976-1980-ci illərdə institutun əməkdaşları Moskva, Kiyev, Leninqrad və Kazandakı ali təhsil müəssisələrində, SSRİ PEA-nın müvafiq elmi-tədqiqat institutlarında ixtisasartırma kurslarına cəlb olundu. Hər il yüzdən artıq əməkdaş öz ixtisasını artırmaq məqsədilə nüfuzlu elm və təhsil müəssisələrinə ezam olunurdu. 1976-cı ildə institutun 698 əməkdaşından 104 -ü, 1977-ci ildə 673 nəfərdən 121-i, 1978-ci ildə 670 nəfərdən 134 -ü, 1979 -ci ildə 676 nəfərdən 127-si, 1980-ci ildə 660 nəfərdən 192-si ixtisasartırma kurslarına cəlb edilmişdi. Həmin illərdə institutda çalışan elmi dərəcəlilərin sayı artdı. İnstitutun 660 nəfər professor- müəllim heyətinin 46 nəfəri (7%) elmlər doktoru, professor, 340 nəfəri (51,5 %) fəlsəfə doktoru, dosent idi.

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunda elmi-tədqiqat işlərinin təşkili (70-80-ci illərdə)

70-ci illərdə Pedaqoji institutda elmi tədqiqat işlərinin məndəricəsi xeyli genişləndi, məzmunu dərinləşdi. İnstitut kollektivinin aldığı elmi nəticələrin tətbiqi sahəsi genişləndi. Elmi-tədqiqat işinin səmərəliliyini artırmaq məqsədilə müəllimlərə verilən 3 və 6 aylıq elmi yaradıcılıq məzuniyyətlərinin imkanlarından geniş istifadə olundu.

70-ci illərdə elmi işlər üzrə prorektor vəzifəsində *prof.Rafiq Rəcəbov* (1967-1974) və *prof.Nurəddin Kazımov* (1976-1982) çalışırdı.



Əməkdaşların elmi səviyyəsinin yüksəldilməsinə, onların müəyyənləşdirilən vaxtda namizədlik və doktorluq dissertasiyaları müdafiə etmələrinə ciddi fikir verilirdi. 1971-1981-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun nəzdində fəaliyyət göstərən 5 ixtisaslaşdırılmış Müdafiə Şurasında institut əməkdaşlarından 167 nəfər namizədlik, digər ali məktəblərin və elmi-tədqiqat institutlarının Müdafiə Şuralarında isə 47 nəfər namizədlik, 24 nəfər doktorluq dissertasiyası müdafiə edilmişdi[182].

Elmi pedaqoji kadr hazırlığında əsas yol aspirantura hesab olunurdu.1970-1980-ci illərdə ADPİ-nin aspiranturasında istehsalatdan ayrılmadan 153 aspirant təhsil alırdı ki, onlardan da 26-sı dissertasiyasını vaxtında müdafiə etmişdi. 69 nəfər isə dissertasiya işini tamamlayaraq ilkin müzakirə üçün kafedraya təqdim etmişdi. Aspirantlara Azərbaycan EA-nın 2 nəfər həqiqi üzvü, 26 nəfər elmlər doktoru, professor rəhbərlik etmişdi.

1977-ci ildə aspiranturaya daxil olanların 42,8%-i fərqlənmə diplomu ilə bitirdikləri halda, 1980-ci ildə onların sayı xeyli artaraq 75%-ə çatmışdı. Aspirantların əksəriyyətinin elmi məqalələri nəşr olunmuşdu. İnstitut yalnız öz ehtiyaclarına görə deyil, həm də Gəncə, Naxçıvan, Xankəndi, Rus dili və Ədəbiyyatı, Xarici Dillər pedaqoji ins-

[182] ***Курбанов А.М.,Садыхов Ш.А.,Салахов М.Н.*** *Первый педагогический институт Азербайджана. Баку,1981,с.110*

titutları üçün də yüksəkixtisaslı elmi-pedaqoji kadr hazırlayırdı. Hər il institutda aspirantların və gənc tədqiqatçıların elmi işlərinin yekunlarına həsr edilmiş konfranslar keçirilirdi.

15 iyun 1972-ci ildə Pedaqoji İnstitutda prof. Kamal Hüseynovun rəhbərlik etdiyi ***elmi-tədqiqat şöbəsi*** yaradıldı. Şöbə təsərrüfathesablı müqavilələr əsasında işləyirdi.1976-1980-ci illərdə elmi-tədqiqat şöbəsində 1 milyon 56 min dəyəri olan 56 təsərrüfathesablı müqavilə başa çatdırıldı. 1981-ci ildə şöbə tərəfindən 300 min rubl. dəyəri olan müqaviləyə Mexanika və molekulyar fizika, Elektrik və optika, Elektroradiotexnika, Hesablama riyaziyyatı və ehtimal nəzəriyyəsi, Ümumi kimya, Cəbr və hesab nəzəriyyəsi kafedrasının əməkdaşları (professor M.Cavadov, K.Məmmədov, Ə.Kərimov, A. Quliyev, R.Yəhyayev, Ə.Rüstəmov, K.Hüseynov, dosentlər E.Eyvazov, B.Quliyev, B.Haqverdiyev, İ.Nəsibov, X.Xəliov, B.Ağayev, T.Əliyev və b.) və 105 tələbə cəlb olunmuşdu.

Pedaqoji İnstitutun tələbələri hər il keçirilən ali



*Yarımkeçiricilərin fiziki xassələrinin tədqiqi*

məktəblərarası tələbə elmi konfransında iştirak edirdilər. O dövrdə institutun ***Tələbə Elmi Cəmiyyətinə dos.Vaqif Nəsirov*** rəhbərlik edirdi. Bütün fakültələrdə TEC-in şöbələri fəaliyyət göstərirdi. 54 dərnək və elmi seminarda 2500 tələbə elmi tədqiqat işlərinə cəlb olunmuşdu. TEC-in üzvləri Moskva, Leninqrad, Kiyev, Tbilisi, Poltava, Mahaçqala, Krosnadar və b. şəhərlərdə keçirilən tələbə elmi konfranslarında və elmi sessiyalarda iştirak edirdilər. 1972-ci ildə ən yaxşı tələbə işlərinin müsabiqəsi keçirilmişdi. 1973-cü ildə Bakıda ilk dəfə Respublika ali məktəb tələbələrinin I konfransı keçirildi. Pedaqoji İnstitutun 22 nəfər tələbəsi I-II-III dərəcəli diplomlara layiq görüldü. 1973-cü ilin mart ayında Pedaqoji İnstitutda arxeologiya ilə bağlı Regional tələbə elmi konfransı keçirildi. 29-30 sentyabr 1975-ci ildə V.İ.Lenin adına ADPİ-nin bazasında respublikalararası elmi-nəzəri konfrans keçirildi. Konfransda SSRİ-nin 27 ali məktəbindən nümayəndələr iştirak edirdi. 1975-ci ildə Bakıda keçirilən III Respublika elmi konfransında Pedaqoji İnstitutun 25 tələbəsi I-II-III dərəcəli diplomlara layiq görüldü. 1977-ci ildə keçirilən Respublika elmi konfransında Pedaqoji İnstitutun 8 tələbəsi uğurlu çıxışına görə Moskva-Kiyev marşurutu ilə səyahət etmək üçün putyovka qazandı.1976-cı ildə keçirilən konfransda 20 tələbə fərqləndi. Onlardan 7 nəfəri I-II-III dərəcəli diplomla mükafatlandırıldı. Sonrakı illərdə respublika elmi konfranslarında çıxış edən tələbələrin sayı artdı. 26-27 may 1980-ci ildə ADPİ-də keçirilən institutlararası elmi-nəzəri konfransda 287 tələbə (ondan 60-ı rektorluq tərəfindən rəğbətləndirilmişdi), 1981-ci ilin mayında keçirilən konfrasda 450 tələbə çıxış etmişdi. 1982-ci ildə tələbələrin Respublika elmi konfransı keçirildi.

Lenin təqaüdü ilə oxuyan SSRİ ali məktəb tələbələrinin Bakıda Azərbaycan Pedaqoji İnstitutunda Ümumittifaq konfransı keçirildi. Tədbirdə Pedaqoji



*TEC-in sədri dos.Vaqif Nəsirov tədqiqatçı tələbələrlə*

İnstitutun tələbələri adından Pedaqoji fakültənin IV kurs tələbəsi Fərrux Rüstəmov çıxış etdi.

Həmin illərdə ümuminstitut, fakültə kafedralarında sistemli elmi-tədqiqat işləri aparılırdı.

70-80-ci illərdə Pedaqoji İnstitutda 8 ***ümuminstitut kafedrası*** fəaliyyət göstərirdi ki, onlardan 4-ü ictimai elmlərə (SSRİ tarixi kafedrası; Fəlsəfə kafedrası; Siyasi iqtisad kafedrası; Elmi Kommunizmin əsasları), 1-i pedaqoji (Ümumi pedaqogika kafedrası), 1-i psixoloji (Ümumi psixologiya), 1-i bədən tərbiyəsi və idmana, 1-i isə mülki müdafiə və tibbi biliklərə aid idi.

*SSRİ tarixi kafedrasına* 1967-1974-cü illərdə prof.Z.B.Şıxlinski, 1974-1979-cu illərdə prof.S.Aslanov, 1979-1984-cü illərdə prof.H.İ.Hüseynov rəhbərlik etmişdir. Kafedra əməkdaşları (professorlar: M.Vəkilov, R.Rəcəbov, Ş.Haqverdiyev, H.Hüseynov, dosentlər: S.İbrahimov, X.Köçərli, Q.Ağayev, H.Əzimov, İ.Qasımov, H.Əliyev, M.Hacıyev, N.Saniyev, S.Əmiraslanov, baş müəllimlər: M.Hacıyev, A.Əliyev, Ə.Kərimov, B.Quliyev, S.Hacıbabayev, Ə.Əliyeva və b.) tərəfindən Azərbaycanda yeni cəmiyyət quruculuğu, insanlarda əmək fəallığının yüksəldilməsi, təhsil və mədəniyyətin inkişafı və partiya quruculuğu ilə bağlı tədqiqatlar aparılırdı. Həmin illərdə Novruz Hüseynov (1972), Səfər İbrahimov (1975), Hacıbaba Əzimov (1981) doktorluq, Həsən Əliyev (1973), S.Hacıbabayev (1980) namizədlik dissertasiyaları müdafiə etdilər.



*Rektor prof.H.Ağayev iclas apararkən*

*Fəlsəfə kafedrasına* 1957-1964-cü illərdə dos.Həmid Əliyev, 1964-1972-ci illərdə dos.M.Əliyev, 1972-1978-ci illərdə Cahid Quliyev 1978-1980-ci illərdə dos.Sərafəddin Salmanov, 1980-1982-ci illərdə dos.Aydın Mikayılov, 1983-1985-ci illərdə dos.Ş.Ə.Ələkbərov, 1985-1990-cı illərdə dos. Yasin Qaraməmmədli rəhbərlik edib. Kafedranın əməkdaşları (dosentlər M.Əliyev, H.Əfəndiyev, M.Axundov, Ş.Ələkbərov, P.Landesman, N.Mikayılov, A.Mikayılov, B.Yusifov, Ş.Salmanov, S.Məmmədov, F.Mirzəxanov, M.Rəşidov, M.İsmayılov, H.Musayev, Ş.Hacıyev, S.Salahov, baş müəllimlər: Ə.Məhərrəmov, Ə.Əliyev, A.Şirinov, O.Əliyeva, H.Əhmədli, A.Əliyev və b.) tərəfindən cəmiyyətin mənəvi inkişaf qanunauyğunluqlarını və dialektik materializmin mühüm problemləri ilə bağlı tədqiqatlar aparılmışdır. Kafedra əməkdaşlarından Q.Əhmədli (1973), A.Şirinov (1973), S.Xəlilov (1976) tədqiqatlarının nəticələri əsasında namizədlik dissertasiyası müdafiə etdilər. P.A.Landesman, Ş.Salmanov, A.Mikayılov, M.Balayev və S.Xəlilovun fəlsəfə ilə bağlı monoqrafiya və dərs vəsaitləri meydana gəldi.

*Siyasi iqtisad kafedrasına* 1945-1974-cü illərdə Zülqədər Cahangirov, 1974 -1997-ci illərdə Rasim Qarayev rəhbərlik etmişdir. Kafedra əməkdaşları (R.Qarayev, N.Nərimanov, C.Hüseynov, A.Əbilov, H.Fazili, M.Cəfərov, S.Rzayeva və b.) tərəfindən cəmiyyətin inkişafının iqtisadi problemləri araşdırılmış, 50-dən artıq monoqrafiya, dərs vəsaiti və metodik göstəriş nəşr edilmişdi. Həmin illərdə kafedra əməkdaşları T.Vəliyev və Q.Sadıqov tərəfindən doktorluq dissertasiyaları hazırlanmışdır.

*Elmi kommunizm kafedrasına* 1968-1978-ci illərdə Oqtay Rəhimov, 1978-1991-ci illərdə Cahid Quliyev rəhbərlik etmişdir. Kafedra əməkdaşları (C.Quliyev, S.Paşayev, R.Bayramov, A.Mənsimov, H.Əliyev, O.Qüdrətov, R.Balayev, M.Rəşidov və b.) tərəfindən Azərbaycan incəsənətində humanizm ideyaları, sovet insanının mənəvi aləmi, şəxsiyyət və kollektiv, əxlaq tərbiyəsinin nəzəri məsələləri araşdırılmışdı.

*Ümumi pedaqogika kafedrasına* prof.Əhməd Seyidov (1943-1950 və 1956-1974), prof.Mehdi Mehdizadə (1950-1951), prof.Mərdan Muradxanov (1951-1956), professorlar Bəşir Əhmədov, Nurəddin Kazımov, Sabir Şəfiyev (1974-1977), prof. H.Əhmədov (1977-2013) rəhbərlik etmişdir.

Kafedrada elmi-tədqiqat işləri üç istiqamətdə aparılırdı:1) Azərbaycan məktəb və pedaqoji fikir tarixinin tədqiqi; 2) ali məktəbdə təlim-tərbiyə işlərinin təkmilləşdirilməsi; 3)məktəbli şəxsiy-

yətinin formalaşdırılmasının pedaqoji-psixoloji əsasları.

Kafedra respublikada pedaqogikanın nəzəriyyəsi və tarixi ixtisası üzrə elmi-pedaqoji kadr hazırlığının mərkəzinə çevrilmişdi. 70-ci illərdə kafedra əməkdaşlarından H.Əhmədov, A.Kərimov, Y.Talıbov doktorluq dissertasiyası müdafiə etdilər. H.Əhmədov, N.Kazımov, Ə.Tağıyev, Y.Talıbov, A.Kərimov, B.Əhmədov, S.Quliyev, V.Mustafazadə, Ə.Hüseynova, M.Həsənov, H.Novruzov, B.Abdullayev, B.Bəşirov, S.Nəbiyev, İ.Musayev, H.Kazımov, S.Şəfiyev, A.İsmayılov, S.Babayeva, Y.Atakişiyev, R.Dərziyeva və X.Mehdizadənin pedaqogikanın aktual problemləri ilə bağlı elmi məqalələri, kitab və kitabçaları nəşr olundu.

Kafedranın təşkilatçılığı ilə 1979-cu ildə Zaqafqaziya Müəllimlər Seminariyasının 100 illik yubileyi ilə bağlı konfrans keçirildi. İttifaq pedaqoq-alimlərinin də iştirak etdiyi həmin konfransın materialları toplu şəklində nəşr olunmuşdur. Kafedra əməkdaşları (M.Muradxanov, H.Əhmədov, Ə.Tağıyev, Ə.Yəqubi) tərəfindən “Azərbaycanda məktəb və pedaqoji fikir tarixi”adlı xüsusi kursun proqramı hazırlandı,V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunda, Y.Məmmədəliyev adına Naxçıvan Pedaqoji İnstitutunda, A.S.Puşkin adına Tbilisi Pedaqoji İnstitutunda prof.Hüseyn Əhmədov tərəfindən sınaqdan keçirildi.

1975-ci ildə kafedranın nəzdində “Şagirdlərin peşəyönümü” elmi-tədqiqat laboratoriyası təşkil olundu. Laboratoriyada 5 nəfər kiçik elmi işçi (Bilal Nuriyev, Kamal Əlizadə, Kamil Məcidov, Lalə Abbasova, Kəmalə Quliyeva), 1 nəfər laborant (Tərlan Əsgərova), 1 nəfər preparator (Gülsüm Əliyeva) fəaliyyət göstərirdi. Laboratoriyanın ilk müdiri ictimai əsaslarla dos.Əhməd Əhmədov olmuşdur. Elmi tədqiqat laboratoriyasında “Şagirdlərin peşə seçməyə istiqamətləndirilməsində məktəbdənkənar müəssisələrin rolu” (1975-1980), “Şagirdlərin məktəblərarası, tədris-istehsalat kombinatlarında öyrədilən əmək təlimi profillərini seçməyə hazırlanması” (1980-1985), “Məktəbdə pedaqoji peşəyönümü sistemi” (1985-1990) mövzularında tədqiqat işləri aparılmışdır.

*Ümumi psixologiya kafedrasına* 1964-1975-ci illərdə prof.Şövqi Ağayev, 1975-2013-cü illərdə prof.Əbdül Əlizadə rəhbərlik etmişdir. Kafedra əməkdaşları (Ş.Ağayev, Ə.Bayramov, M.Həmzəyev, Ə.Əlizadə, Z.Mehdizadə, A.Abdullayev, A.Məmmədov, E.Quliyev, İ.Fərəcov, Q.Əzimov və b.) tərəfindən ümumi, yaş və pedaqoji psixologiyanın aktual problemləri öyrənilmişdir. Ə.Əlizadə (1975) doktorluq, Q.Əzimov (1970), Ə.Baxşəliyev (1973), İ.Məmmədov (1973), M.Əbdülov (1973), N.Cavadov (1974) namizədlik dissertasiyası müdafiə etdilər. Kafedra əməkdaşlarının “Uşaq pedaqoji psixologiyası” (1974), “Yaş və pedaqoji psixologiya” (1974,1978,1981) dərs vəsaitləri nəşr olundu.

Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyi Kollegiyasının 13 noyabr 1974-cü il tarixli qərarına müvafiq olaraq Psixologiya kafedrasının bazası əsasında iki kafedra – Ümumi psixologiya (müdir prof. Şövqi Ağayev) və Yaş və pedaqoji psixologiya (müdir dos.Zəkəriyya Mehdizadə) kafedraları yaradıldı.

*Bədən tərbiyəsi kafedrasına* Azərbaycan SSR bədən tərbiyəsi və idman xadimi Həmdulla Mirzəyev, dos. Rəhim Rəsulov, Səlim Ağayev rəhbərlik etmişdir. Kafedra əməkdaşlarının tədqiqatları məktəblilərin və gələcək müəllimlərin fiziki sağlamlığının inkişafına, tələbələrin fiziki mədəniyyətinin yüksəldilməsinə həsr olunmuşdu.

*Mülki müdafiə və tibbi biliklər kafedrasında* (müdir İsmayıl Sadıxov) ali pedaqoji məktəblərin tələbələrinin mülki müdafiə və tibbi biliklərlə bağlı tədris ədəbiyyatının hazırlanmasına xüsusi diqqət yetirilirdi.

70-80-ci illərdə Pedaqoji İnstitutun 6 fakültəsinin nəzdində fəaliyyət göstərən ixtisas kafedralarında dil-ədəbiyyat, kimya, biologiya, fizika, riyaziyyat, tarix, rus dili, xarici dillər və onların ümumtəhsil və ali məktəblərdə tədrisi ilə bağlı intensiv araşdırmalar aparılırdı.

**Filologiya fakültəsi.** Fakültəyə 1968-1981-ci illərdə prof.Afad Qurbanov, 1981-1984-cü illərdə prof.Fərhad Fərhadov,1984-1986-cı illərdə prof. Paşa Əfəndiyev, 1986-1989-cu illərdə dos.Bilal Muradov rəhbərlik etmişdir.

*Azərbaycan dilçiliyi kafedrasına* 1943-1979-cu illərdə prof. Ə.Dəmirçizadə, 1979-2009 -cu illərdə prof.A.Qurbanov rəhbərlik etmişdir. Kafedrada (dosentlər İ.Əfəndiyev, B.İbrahimov, A.Hüseynov,

A.Məhərrəmov, H.Mirzəyev, B.Sadıqov, C.Cəfərov, N.Namazov, A.Hacıyeva, Ə.Şükürov, Q.Bağırov, Q.Kazımov, Y.Məmmədov, P.Həsənov, H.Məmmədov, N.Xudiyev, B.Əhmədov, A.Bəşirova və b.) Azərbaycan dilçiliyinin müxtəlif sahələri üzrə tədqiqatlar aparılırdı. Kafedra əməkdaşları ümumtəhsil və ali məktəblər üçün dilçiliyin müxtəlif sahələrinə aid xeyli dərslik və dərs vəsaiti nəşr etdirmişdi. Kafedranın əməkdaşı Nizami Xudiyev 1978-ci ildə namizədlik dissertasiyası müdafiə etmişdi.

*Azərbaycan ədəbiyyatı və onun tədrisi metodikası kafedrasına* Azərbaycan EA-nın həqiqi üzvü Feyzulla Qasımzadə (1959-1976), prof. Məmməd Məmmədov (1976-1982), prof.Paşa Əfəndiyev (1982-1998) rəhbərlik etmişdir. Kafedra əməkdaşları professorlar F.Qasımzadə XIX əsr Azərbaycan ədəbiyyatı, M.Təhmasib Azərbaycan folklorşünaslığı, F.Fərhadov “Koroğlu” dastanı, prof.M.Məmmədov M.Ə.Sabir və Azərbaycan demokratik mətbuatı ilə bağlı araşdırmalar apardılar. Azərbaycan və rus ədəbiyyatı klassiklərinin və müasir ədəbiyyatın problemləri də kafedra əməkdaşları (dosentlər İ.Babayev, X.Məmmədov, P.Əfəndiyev, M.Tahirli, M.Mustafayev, Ə.Hüseynov, M.Həkimov, A.Alməmmədov, K.Tarverdiyeva, M.Seyidov, K.Qəhrəmanov, Ə.Bağırov, M.Cavadova, M.Həyatzadə, A.Hacıyev, D.Məmmədov) tərəfindən öyrənilmişdi. Kafedranın dosenti İsmayıl Şıxlı elmi araşdırmalarla yanaşı, bədii yaradıcılıqla da ciddi şəkildə məşğul olurdu.. Kafedranın əməkdaşları P.Əfəndiyev (1973), X.Məmmədov (1981) doktorluq, T.Xalisbəyli (1973), H.Qasımov (1974), T.Salehov, Ə.Tağıyev, Ə.Əliyev, H.Məmmədov, N.Qasımova, X.Süleymanova namizədlik dissertasiyası müdafiə etdilər.



*Fakültə Elmi Şurası*

1972-ci ildə təşkil olunan *Rus və xarici ölkələr ədəbiyyatı* kafedrasına dos.İsmayıl Şıxlı (1972-1977) və prof.Alməmməd Alməmmədov (1977-1984) rəhbərlik etmişdir. Kafedrada (İ.Şıxlı, A.Alməmmədov, A.Bağırov, İ.Mustafayev, H.Qasımzadə) rus ədəbiyyatı, rus-Azərbaycan ədəbi əlaqələri və Azərbaycan sovet ədəbiyyatı ilə bağlı tədqiqatlar aparılırdı. A.Alməmmədov (1976) doktorluq dissertasiyası, N.Qasımova (1978) namizədlik dissertasiyası müdafiə etdi.

1973-cü ildə yaradılan *Ədəbiyyat və onun tədrisi metodikası kafedrasına* 1973-1988-ci illərdə prof.Fərhad Fərhadov, 1989-2005-ci illərdə Aydın Hacıyev rəhbərlik etmişdir. Kafedranın əməkdaşları (A.C.Hacıyev, R.Ə.Məmmədov, D.Y.Məmmədov, N.Ə.Məmmədov) ədəbiyyatın tədrisi metodikası, uşaq ədəbiyyatı, ifadəli oxu fənləri ilə bağlı araşdırmalar aparmış, xeyli dərslik və dərs vəsaiti hazırlanmışdır.

1958-ci ildə yenidən təşkil edilən *Azərbaycan dili və onun tədrisi metodikası kafedrasına* prof.



Ağammәd Abdullayev (1958-1979) vә dos. Hәsәn Balıyev (1979-1999) rәhbәrlik etmişdir. Kafedrada (A.S.Abdullayev, H.B.Balıyev, N.K.Abbasova, N.C.Abdullayeva, Ə.A.Fәrәcov, Ə.M.Əhmәdov, İ.O.Bayramov, M.M.Hәsәnov, N.Ə.Abdullayev, N.H.Əhmәdov, Z.T.Mәmmәdov) Azәrbaycan dilinin orta mәktәblәrdә tәdrisi metodikası ilә bağlı araşdırmalar aparılır, dәrslik, dәrs vәsaiti vә metodik tövsiyәlәr hazırlanırdı. Əli Fәrәcov (1972), Nәmidә Abbasova (1974), Nabat Abdullayeva (1979) doktorluq dissertasiyası, Q.Tahirov (1972), S.Qasımova (1975), T.Babayeva (1975), T.Cabbarov (1981) namizәdlik dissertasiyası müdafiә etdilәr.

*Rus dili kafedrasında* (müdir dos.T.Əliyeva) 42 nәfәr әmәkdaş tәrәfindәn tәlәbәlәrin rus dili ilә bağlı yazılı vә şifahi nitqinin inkişafı, dil bacarıqlarının vә elmi әdәbiyyatdan istifadә bacarıqlarının artırılması ilә bağlı tәdqiqatlar aparılırdı. Kafedrada ali pedaqoji mәktәblәrin Azәrbaycan qrupları üçün 3 hissәlik "Rus dilindәn vәsait" hazırlandı. Kafedra әmәkdaşlarının (T.H.Əliyeva, R.S.Bobrova, A.N.Klimova, C.A.Sultanov, O.H.Cәlalova, A.M.Quliyeva, F.Cәbrayılova vә b.) hazırladığı vәsaitin I hissәsi 1978, II hissәsi 1979, III hissәsi 1981-ci ildә nәşr edildi. Kafedra әmәkdaşlarından E.Abbaszadә (1974), H.Mәmmәdov (1972), H.Əbdülzadә (1974), S.Abdullayeva (1972), A.Əzimova (1973), R.Mәmmәdova (1981) namizәdlik dissertasiyası müdafiә etdilәr.

*Xarici dillәr kafedrasına* (ingilis, alman vә fars dillәrini özündә birlәşdirәn kafedra 1962-ci ildә yenidәn bәrpa olunmuşdu) Kafedraya M.Əsgәrzadә, L.A.Skobeleva, dos.Arif Tahirov rәhbәrlik etmişdir. Hәmin illәrdә A.Tahirov, Ə.Yәqubi vә D.Qafarovun ali vә orta mәktәblәr üçün dәrsliklәri nәşr edildi. Kafedranın 37 nәfәr әmәkdaşı alman, ingilis vә fars dilinin müxtәlif problemlәri ilә bağlı araşdırma aparırdı.

**Tarix fakültәsi.** Fakültәyә dos.Hәmzә Qasımzadә (1968-1974), prof. Əbdürrәhman Şahmirov (1974-1980), prof.Yusif Yusifov (1981), prof.Dәrgah Qüdrәtov (1981-1995) rәhbәrlik etmişdir. Fakültәnin nәzdindә SSRİ tarixi, Azәrbaycan tarixi, Ümumi tarix, İctimaiyyatın vә tarixin tәdrisi metodikası kafedraları fәaliyyәt göstәrirdi.

*SSRİ tarixi kafedrasına* ayrı-ayrı vaxtlarda prof.Cәfәr İbrahimov (1945-1974), prof.İsmayıl Hәsәnov (1974-1978), Şükür Sadıqov (1981-1994) rәhbәrlik etmişdir. Kafedrada prof.C.M.İbrahimov XV әsrdә Azәrbaycan әrazisindә feodal dövlәtlәri, prof.İ.M.Hәsәnov XIX әsr vә XX әsrin әvvәllәrindә Azәrbaycanda aqrar münasibәtlәr, prof.Ş.Ə.Sadıqov Zaqafqaziya respublikalarının әmәkdaşlığı, N.Əlizadә, Ə.Şahmirov, Y.Əlәsgәrov, İ.Şükürzadә D.Qüdrәtov, Ə.Süleymani vә M.Salahov Azәrbaycan tarixinin müxtәlif problemlәrinә hәsr olunmuş tәdqiqatlar aparmışdır. D.Qüdrәtov (1970), Ə.Şahmirov (1974) doktorluq, K.Ş.İbrahimov(1978) namizәdlik dissertasiyası müdafiә etmişdir.

*Azәrbaycan tarixi kafedrasına* 1971-1988-ci illәrdә prof.Nәzәr Paşayev rәhbәrlik etmişdir. Prof. N.A.Paşayev Azәrbaycanda sosialist mәdәniyyәtinin inkişafı, prof.Y.B.Yusifov Elamın ictimai-iqtisadi quruluşu, Q.Ə.Mәtәtov Azәrbaycan vәtәn müharibәsi illәrindә mövzularında elmi araşdırmalar aparmışlar. Ö.Osmanlı, C.Hüseynov, S.Mәmmәdov Azәrbaycan tarixinin müxtәlif problemlәrini araşdırmışlar. Kafedra әmәkdaşlarından R.İ.Əliyev (1973), G.N.Qayıbova (1974), Ə.Ş.Haqverdiyev (1979) namizәdlik dissertasiyası müdafiә etmişdir.



*Fakültә Elmi Şurası*

*Ümumi tarix kafedrasına* dos.Mәmmәd Şıxlı (1959-1971), Yusif Yusifov (1971-1998) rәhbәrlik etmişdir. Kafedrada Y.M.Mahmudov, İ.Bağırov, H.Qasımzadә, N.Paşayev, M.Hәsәnov vә A.Sәfәrov tarix elminin müxtәlif problemlәri ilә bağlı tәdqiqatlar aparmışdır.

1972-ci ildә tәşkil olunan *İctimaiyyatın vә tarixin tәdrisi metodikası* kafedrasına dos.N.Paşayev rәhbәrlik etmişdir. Respublika mәktәblәrindә tarixin tәdrisi metodikası ilә bağlı ilk sistemli araş-

dırmalar bu kafedrada aparılmış, dərs vəsaitləri hazırlanmışdır.

**Riyaziyyat fakültəsi.** Fakültəyə dos.Əli Cəfərov (1969-1971) dos.Qardaşxan Orucov (1971-1974) dos.Əlif Məmmədov (1974-1978), prof. Şamil Vəkilov (1978-1980), dos. Firudin Abdullayev (1980-1984), dos.Cəfər Süleymanov (1984-1994) rəhbərlik etmişdir.

*Riyazi analiz kafedrasına* dos.Əli Cəfərov, prof.S.Yaqubov, prof.Qardaşxan Orucov rəhbərlik etmişdir. Kafedrada funksiyalar nəzəriyyəsinin xüsusi məsələləri və diferensiallanan funksiyalar sinfi və onların tətbiqi (Ə. Cəfərov, Ş.Məmmədov, Y.Salmanov,R.Abbasov, M.Cəbrayılov), həqiqi və kompleks funksiyaların sırasının tədqiqi (Ə.Cəfərov, Q.Orucov, A.Mahmudov, H.İbrahimov, A.Adgözəlov, H.Cəfərov, K.Əliyeva və b.), adi və xüsusi törəməli diferensial tənliklərin tədqiqi (T.Zamanov, Q.Mustafayev, C.Süleymanov, E.Cəbrayılova, V.Musayev, S.Əsədov) və inteqral tənliklər sahəsində (Ə.Babayev, İ.Xəlilov) elmi araşdırmalar aparılmışdır.

*Hesablama riyaziyyatı və ehtimal nəzəriyyəsi kafedrasına* dos.Hüseyn Əliyev (1971-1981), prof. Əlif Məmmədov (1981-1996) rəhbərlik etmişdir. Kafedrada kibernetikanın riyazi məsələləri və hesablama riyaziyyatının təcrübi üsulları üzrə (Z.Əliyeva, Ə.Məmmədov, A.Yaqubzadə, V.Cabbarzadə, Ş.Talıbova, E.İbrahimova və b.) elmi araşdırmalar aparılmışdır. Həndəsə kafedrasında diferensial həndəsə, qeyri-evklid həndəsəsi ilə də bağlı araşdırmalar aparılmışdır. Kafedranın müdiri dos.H.Əliyevin təşəbbüsü ilə fakültədə Hesablama riyaziyyatı



*Fakültə Elmi Şurası*

laboratoriyası yaradıldı və kiçik həcmli hesablama maşınları ilə bərabər,”Nairi-2” elektron hesablama maşını ilə təmin edildi.

1970-ci ildə Ali cəbr və həndəsə kafedrasının əsasında 2 müstəqil kafedra yaradıldı:1) Cəbr və ədədlər nəzəriyyəsi; 2) Həndəsə.

*Cəbr və ədədlər nəzəriyyəsi kafedrasının* (müdir dos.Mais Cavadov) əməkdaşları L.Abdulkərimov, Ş.Əliyev, A.Zeynalova, H.Həşimov, F.Abdullayev) cəbrin müasir üsullarından istifadə edərək kiçik parametrdən asılı xüsusi törəmələrin diferensial tənliklər üçün qoyulmuş sərhəd məsələlərini araşdırmışdılar. Kafedranın müdiri M.H.Cavadov M.V.Lomonosov adına MDU-da “Öz-özünə qoşma olmayan diferensial operatorların məxsusi funksiyalarının bir hissəsinin tamlığı və onun riyazi fizikanın bəzi məsələlərinə tətbiqi” mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdi.

*Həndəsə kafedrasına* dos.Bəhram Yusifzadə, Qardaşxan Qasımov, dos. Rəhim Abbasov rəhbərlik etmişdir. Kafedrada B.Yusifzadə, M.Hacıyev, S.Axundov, Q.Qasımov, Q.Şahrza oğlunun ”Həndəsə əsasları”,”Ali cəbr məsələləri”, “Ali həndəsədən məsələlər” kitabları nəşr olunmuşdu. Kafedranın dosentləri S.Məmmədova, Ə.Quliyev, K.Xudaverdiyeva, baş müəllim P.Göyüşov həndəsənin mühüm məsələləri ilə bağlı araşdırma aparmışlar.

*Ümumi riyaziyyat kafedrasının* dosentlərindən Şamil Vəkilov (kafedra müdiri), E.Aslanov, V.Həsilov, A.İmanova, M.Əfəndiyeva, F.Səlimov, baş müəllimlərdən X.Babayev, A.Məmmədov, A.Allahquluyev, R.Qəmərli, R.Babayev və Ş.Məmmədov diferensial və inteqral tənliklər nəzəriyyəsinin xüsusi məsələləri, funksiyalar nəzəriyyəsinin problemləri sahəsində elmi-tədqiqat işləri aparmışdılar. Kafedranın professoru H.Ağayev (rektor) diferensial tənliklər nəzəriyyəsi və funksional analizlə bağlı ciddi elmi araşdırmaların müəllifi olmuşdur.

*Elementar riyaziyyat və riyaziyyatın tədrisi metodikası* kafedrasına dos.Əsəd İbrahimov (1959-1974), Sadıx Sadıxov (1974-1987), Tinatin Əliyeva (1987-2003) rəhbərlik etmişdir. Kafedra əməkdaşları (Ə.İbrahimov, A.Kreymer, S.Sadıqov, K.Əsgərov, S.Nəsibov) elementar riyaziyyat və riyaziyyatın tədrisi metodikasının mühüm məsələlərinə həsr olunmuş elmi-tədqiqat işi aparmış, dərslik və dərs

vəsaitləri çap olunmuşdur. Kafedra əməkdaşları B.İmranov (1974), A.Adıgözəlov (1975), A.Sadıxov (1981) namizədlik dissertasiyası müdafiə etmişlər.

**Fizika fakültəsi.** Fakültəyə ayrı-ayrı vaxtlarda dos.Teyfur Xasməmmədov (1968-1971), dos.Əlisa Əhmədov (1971-1975), prof.Ələkbər Kərimov (1975-1981), prof.Kamal Hüseynov (1981-1984), dos.Mikayıl Əliyev (1984-1987), prof.Edil Eyvazov (1988-1989), prof.İsgəndər Cəfərov (1989-1995) rəhbərlik etmişdir. Fakültədə 5 elmlər doktoru, 44 elmlər namizədi, aspirant və dissertant elmi-tədqiqat işləri aparırdı.

1971-ci ildə fakültənin nəzdində 3 kafedra (Eksperimental və nəzəri fizika, Ümumi fizika və astronomiya, Fizikanın tədrisi metodikası) fəaliyyət göstərirdi. 1977-ci ildə Eksperimental və nəzəri fizika və Ümumi fizika və astronomiya kafedralarının bazasında yeni kafedralar (Mexanika və molekulyar fizika, Elektrik və optika, Nəzəri fizika və astronomiya) təşkil olundu.

*Eksperimental və nəzəri fizika kafedrasına* 1969-1974-cü illərdə dos.Albert Qılmanov, 1976-1981-ci illərdə prof.Ələkbər Kərimov rəhbərlik etmişdir. Kafedra əməkdaşları (H.Əmirbəyov, M.İsmayılov, B.Haqverdiyev, A.Əmiraslanov, P.Paşayev, Ə.Əhmədov, K.Hüseynov, S.Axundov, M.Əfəndiyev, A.Bəşirov, M.Bəşirov, C.Cavadov, P.Mustafayev, R.Qarayev, A.Veyisov) tərəfindən suyun, fərdi karbohidrogenlərin, normal spirtlərin istilik xassələri geniş temperatur və təzyiq intervalında araşdırılmış, bəzi mayelərin istilik keçirməsi, daxili sürtünməsi, xüsusi istilik tutumu və səthi gərilmə əmsalının temperatur və təzyiqdən asılılığı məsələləri öyrənilmişdir. Prof.Ə.Kərimov, dosentlər Z.Səmədova, K.İbrahimov, Y.Paşabəyova, E.Eyvazov, M.Məmmədov, Y.Abbasov, elmlər namizədləri Y.Qasımzadə, B.Məmmədov, T.Apayev, İ.Abutalıbov fizikanın aktual məsələləri ilə bağlı tədqiqat işləri aparırdılar.




*Ümumi fizika və astronomiya kafedrasının* (müdir dos.Absəddin Məmmədov) əməkdaşları (dosentlər A.Məmmədov, R.Yəhyayev, A.Məlikov A.Əmiraslanov, B.Quliyev, V.Yusifov, Q.Səfərəliyev, M.Murğuzov, Ə.Rüstəmov, P.Məmmədova, İ.Bənənyarlı, baş müəllimlər M.Bağırzadə, M.Əliyev) mayelərin molekulyar istilik parametrlərinin xassələri, nüvə və yarımkeçiricilər fizikası, kimya texnologiyasının əsasları üzrə tədqiqat işi aparırdılar.

*Fizikanın tədrisi metodikası kafedrasına dos.* Behbud Şəfizadə (1955-1970), Teyfur Xasməmmədov (1971-1973), Sədi İmanov (1976-2004) rəhbərlik etmişdir. Kafedranın əməkdaşları (dosentlər B.A.Şəfizadə, T.K.Xasməmmədov, B.Ü.Sultanov, Z.Osmanov, S.Ş.İmanov, Ə.Əhədov, Ə.Axundov, baş müəllim T.S.Vahidov) fizikanın tədrisi metodikasının müxtəlif sahələrinə aid tədqiqatla məşğul olmuşlar. S.Ş.İmanov (1973) doktorluq, Ə.A.Axundov (1971), T.S.Vahidov (1972), F.M.Rəştiyev (1973), Ş.H.Əliyev (1974), K.M.Həsənov (1981) namizədlik dissertasiyası müdafiə etdilər.

1976/77-ci tədris ilindən fəaliyyət göstərən *Elektrik və obtika kafedrasına* dos.Absəddin Məmmədov (1977), prof.Kərim Məmmədov (1978-1982) və prof. Mirzəli Murğuzov (1982-2016) rəhbərlik etmişdir. Kafedra əməkdaşları (K.P.Məmmədov, X.Y.Xəlilov, Q.İ.Səfərəliyev, Ş.İ.Dadaşov, Ə.H.Rüstəmov, M.İ.Murğuzov, M.M.Əliyev, M.V.Nağıyev,

B.A.Haqverdiyev, V.V.Yusifov, D.M.Cavadov, V.İ.Nəsirov, İ.P.Bənənyarlı, B.B.Quliyev və M.Y.Bəşirov) tərəfindən fizikanın ümumi məsələlərinə və kafedranın profilinə uyğun araşdırmalar aparılmış, monoqrafiya, dərslik və dərs vəsaitləri hazırlanmışdır.

*Nəzəri fizika və astronomiya kafedrasının* ilk müdiri dos.Rafiq Yəhyayev olmuşdur. Onun rəhbərliyi ilə dosentlər İ.M.Abutalıbov, Y.M.Qasımzadə, S.Əzimov və baş müəllim K.Əliyev tərəfindən nəzəri fizika və astronomiya sahəsində tədqiqatlar aparılmışdır.

**Ümumi texniki fənlər fakültəsi.** Fakültəyə dos.Saleh Abdullayev (1972-1977), prof. Əbülfət Rüstəmov (1977-1981), dos.İzzət Bənənyarlı (1982-1988) rəhbərlik edib. Fakültə yeni təşkil ediləndə burada 2 kafedra ( Ümumi texniki fənlər, Materiallar texnologiyası və əmək təliminin metodikası) fəaliyyət göstərirdi. *Ümumi texniki fənlər kafedrasına* dos.Aslan Məmmədov (1971-1975), prof. Ələkbər Kərimov (1975-1976), prof.Arif Quliyev (1976-1981) rəhbərlik etmişdir. *Materialların texnologiyası və əmək təliminin metodikası kafedrasına* 1971-1977-ci illərdə Səməd Əlai, 1977-1982-ci illərdə dos.Murad Seyidov, 1984-1986-cı illərdə dos.Şəfiqə Əhmədova, 1986-1994-cü illərdə Saleh Abdullayev rəhbərlik etmişdir. 1974-cü ildə fakültənin nəzdində *Elektrotexnika kafedrası* yaradıldı. Kafedraya 1974-1983-cü illərdə dos.Ədnan Ağalarov, 1983-1999-cu illərdə prof. Həşim Həşimov rəhbərlik etmişdir. 1972-ci ildə 19 nəfər müəllimlə fəaliyyətə başalayan fəaliyyətdə 1980-ci ildə 3 nəfər elmlər doktoru, professor, 25 nəfər elmlər namizədi, dosent, xeyli baş müəllim və müəllim çalışırdı.

Fakültə əməkdaşları (A.M.Məmmədov, S. Əlai, P.Əfəndiyev, A.M.Quliyev, L.Axundov, S.İ.Abdullayev, Ş.Məmmədov, İ.Hüseynov, S.Əliyeva, S.Salamov, M.F.Hüseynov, N.X.Məhərrəmov, B.Qədirov, H.İsmayılov, S.S.Rzayev, B.Ş.Qədirova, Ə.M.Ağalarov, S.O.Məmmədov, K.A.Abbasov, T.H.Əliyev, N.B.Qasımov, N.A.Xəlilzadə, M.İ.Nəsirov, P.S.Şirinova, F.A.Rzayev, S.M.Qasımova, B.D.Məmmədov, A.Qarayev, M.M.Əliyeva, F.D.İsmayılova və b.) kafedraların profilinə uyğun elmi-tədqiqat işi aparırdılar. Fakültənin nəzdində müasir avadanlıqlarla təchiz edilmiş 22 tədris laboratoriyası, kabinet və emalatxana fəaliyyət göstərirdi.

1981-ci ildə institutda aparılan struktur dəyişikliyinə uyğun olaraq rəsm, rəsmxət, əmək ixtisası əsasında ***Bədii qrafika fakültəsi*** yaradıldı. Həmin fakültəyə müxtəlif illərdə dos.Tofiq Məmmədov (1981-1988), dos.Məmməd Yüzbaşıyev (1989-



*Heykəltəraşlıq kabineti*



*Materiallar müqaviməti laboratoriyası*



*Boyakarlıq kabineti*

1999) rəhbərlik etmişdir. Fakültənin nəzdindəki 3 kafedrada (Rəsm, heykəltəraşlıq və boyakarlıq, Təsviri incəsənət və onun tədrisi metodikası, Rəsmxət və onun tədrisi metodikası) elmi-tədqiqat işləri aparılırdı. Rəsm, heykəltəraşlıq və boyakarlıq kafedrasına 1981-1995-ci illərdə prof.İbrahim Zeynalov, Rəsmxət və onun tədrisi metodikası kafedrasına 1981-1993-cü illərdə Nəriman Məhərrəmov, Təsviri incəsənət və onun tədrisi metodikası kafedrasına 1981-1988-ci illərdə dos.Hüseyn Hüseynov, 1988-1993-cü illərdə dos.Çingiz Rüstəmov rəhbərlik etmişdir.

**Fiziki tərbiyə fakültəsi.** Fakültənin ilk dekanı dos.Rafiq Baxşəliyev olmuşdur. O, 1979-1989-cu illərdə fakültəyə rəhbərlik etmişdir. Məqsəd ümumtəhsil məktəbləri üçün hərbi müəllim kadrları hazırlamaqdan ibarət idi. İlk vaxtlar fakültənin nəzdində 2 kafedra (Hərbi kafedra və İdman fənləri) fəaliyyət göstərirdi.

**Kimya fakültəsi.** Fakültəyə 1968-1972-ci illərdə dos. Rəcəb Əliyev, 1972-1975-ci illərdə dos. Reyhan Əbdürrəhimova, 1975-1981-ci illərdə dos. Telman Ağdamski rəhbərlik etmişdir.

*Ümumi kimya kafedrasına* 1969-1983-cü illərdə dos.Rəcəb Əliyev rəhbərlik etmişdir. Kafedrada kompleks birləşmələr və yarımkeçirici maddələrin sintezi və tədqiqinə, nadir torpaq elementlərinin fotometrik təyini üsuluna və kimyanın tədrisi metodikasının aktual məsələlərinə (R.Əliyev, Ə.Xəlilov, İ.Nəsibov, R.Əbdürrəhimova, B.Həsənov, B.Mardaxayev, Ə.Əbdürrəhimov, İ.İ.Hüseynov, N.Seyidova, S.Şükürov, F.İmamverdiyeva, T.Sultanov, M.Hüseynov, İ.O.Nəsibov və b.) dair araşdırmalar aparılırdı.

*Analitik və fiziki kimya kafedrasına* 1969-1973-cü illərdə prof.Allahverdi Verdizadə, 1976-2017-ci illərdə prof.Nailə Verdizadə rəhbərlik etmişdir. Kafedrada periodat üsulu ilə elementlərin miqdarının təyini istiqamətində araşdırmalar (Telman Ağdamski, Nailə Verdizadə, Ələkbər Qurbanov, M.Mehdiyev və b. ) aparılırdı.

*Üzvi kimya və kimya texnologiyası kafedrasına* dos.Əbdülməcid Rzayev (1966-1972), prof.İsmayıl Hüseynov (1972-1978), prof.Rafik Ələkbərov (1979-2004) rəhbərlik etmişdir. Kafedra əməkdaşları (dosentlər Ə.Rzayev, R.Ələkbərov, X.Şamilov,




N.Mehmandarova, T.Rəsulbəyova, Ə.Vətənxah, M.Nəsirova və b.) polimer, təbabət və kənd təsərrüfatı üçün bioloji aktiv maddələrin sintezi və tədqiqi problemləri üzərində işləyirdilər.

Fakültədə 70-80-ci illərdə R.Ə.Əbdürəhmanova (1973) doktorluq, S.A. Şükürov (1971), F.B.İmamverdiyeva (1972), T.İ.Sultanov (1972), M.M.Əliyeva (1974), A.C.Quliyev (1975), M.Şahbazov (1976), N.Verdizadə (1970), Ə.Qurbanov (1971), M.İsgəndərov (1975), S.Şirəliyev (1975), T.İbrahimov (1980), N.D.Şükürov (1972), P.K.Məmmədova (1973), F.Z.Abdullayev (1976), S.N.Quliyev (1980) namizədlik dissertasiyası müdafiə etdilər.

1971-1981-ci illərdə xarici ölkələrdə keçirilən konfranslarda Pedaqoji İnstitutun 20 əməkdaşı iştirak etmişdi ki, onların da sırasında kimyaçılar üstünlük təşkil edirdi.

**Biologiya fakültəsi.** Fakültəyə 1968-1981-ci illərdə prof.Roza Qafarova rəhbərlik etmişdir. 1981/82-ci tədris ilində Kimya və Biologiya fakültələrinin əsasında Kimya-biologiya fakültəsi yaradıldı. Prof.Roza Qafarova yeni yaradılan fakültənin



*Fiziologiyadan təcrübə məşğələsi*

dekanı vəzifəsinə seçildi. O, bu vəzifədə 1997-ci ilə kimi çalışdı.

Fakültənin nəzdində Botanika, Zoologiya, İnsan və heyvan fiziologiyası, Məktəb gigiyenası, Biologiyanın tədrsi metodikası kafedraları fəaliyyət göstərirdi.

*Botanika kafedrasına* 1950-1984-cü illərdə prof.Həmid Qədirov, 1984-2011-ci illərdə prof. Yusif Əhmədov rəhbərlik etmişdir. Kafedra əməkdaşları (Z.Qayıbov, Ə.İsayev, Ə.Hüseynov, Q.Əliyev, Ə.Salamzadə, B.Vahabov, F.Xəlilova, T.Əliyev, F.Cəfərova) Azərbaycanda yayılan dekorativ ağac və kolların fizioloji xüsusiyyətləri, dekorativ bitkilərin fitonsid xassəsi və onlarda yayılan patogen göbələklərin öyrənilməsi ilə bağlı araşdırmalar aparırdılar. Y.K.Əhmədov (1973), O.D.Cərrahova (1973), F.A.Əliyeva (1973) namizədlik dissertasiyası müdafiə etmişdir.

*Zoologiya kafedrasına* prof.Zəhra Şahtaxtinskaya (1937-1977), prof. Sadıx Əliyev (1977-1990), dos. Zeynəb Vəliyeva (1990-1992) rəhbərlik etmişdir. Kafedra əməkdaşları (Z.Şahtaxtinskaya, S.Əliyev, C.Sailov, B.Ağayev, M.Əliyeva, S.Əliyeva, R.Sadıqov, S.Nağıyeva, Z.Vəliyeva, Z.Dadaşova və b.) Azərbaycanın ev və ov sənaye quşlarının helmint faunası, Qızılağac dövlət qoruğu şəraitində balıqyeyən quşların helmint faunası və onun ekoloji analizi, parazit və sorucu qurdların biologiyası, respublikanın faunası və onun ekoloji coğrafi təhlili istiqamətində araşdırmalar aparmışlar. Kafedranın əməkdaşı Sadıx Əliyev 1971-ci ildə doktorluq dissertasiyası müdafiə etmişdir.

*İnsan və heyvan fiziologiyası kafedrasına* 1967-1994-cü illərdə prof. Rza Səfərov rəhbərlik etmişdir. Kafedra əməkdaşları (K.Əzizbəyova, X.Məmmədova, N.Axundov, L.Məmmədova, M.Qarayev, Ə.Fərəcov) yaş fiziologiyası və təhsilin fizioloji əsasları ilə bağlı araşdırma aparırdılar. Kafedra əməkdaşlarından X.Məmmədova (1971), M.M.Nəsibov (1971) namizədlik dissertasiyası müdafiə etmişdir.

*Məktəb gigiyenası kafedrası* 1971-ci ildə təşkil olunmuşdur. Kafedranın ilk müdiri dos.İsmayıl Süleymanov (1971-1972) olmuşdur.1972-1992-ci illərdə kafedraya Tamilla Feyzullayeva rəhbərlik edib. Kafedra əməkdaşları (İ.Süleymanov, T.Feyzullayeva, Ş.Əliyeva, R.A.Cəbiyeva, E.M. Şahbazbəyova, F.R.Rəhimova, B.Ş.Bayramova) yaş fiziologiyası və məktəb gigiyenası ilə bağlı tədqiqat aparırdılar.

*Biologiyanın tədrisi metodikası kafedrasına* 1969-1982-ci illərdə prof.Firudin Əliyev, 1982-1988-ci illərdə prof. Əbdüləziz Salahov, 1988-1998-ci illərdə dos.Tofiq Rüstəmov rəhbərlik etmişdir. Kafedranın əməkdaşları (F.Əliyev, Ə.Ə.Salahov, T.Tahirzadə, T.Rüstəmov, Ə.Quliyeva, H.Hacıyev) ümumtəhsil və ali məktəblərdə biologiyanın tədrisi üsullarının təkmilləşdirilməsi, yeni nəsil dərslik və dərs vəsaitlərinin hazırlanması istiqamətində işləmişlər.

**Pedaqoji fakültə.** Fakültəyə 1970-1976-cı illərdə prof.Nəmidə Abbasova, 1976-1989-cu illərdə dos.Musa Həsənov rəhbərlik etmişdir. Fakültənin nəzdində İbtidai təhsilin pedaqogika və metodikası, Məktəbəqədər pedaqogika,Yaş və pedaqoji psixologiya, Musiqi və onun tədrisi metodikası, Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedraları fəaliyyət göstərirdi.

*İbtidai təhsilin pedaqogika və metodikası kafedrasında* prof.Mərdan Muradxanov (1960-1979), dos.Əyyub Tağıyev (1979-1992) rəhbərlik etmişdir. Kafedra əməkdaşları (M.Muradxanov, İ.Vəlixanlı, S.Axundov, M.İsmixanov, S.Nəbiyev, S.Məcidov, M.Babayev, X.Fətəliyev və b.) ibtidai təhsil pedaqogikasının aktual problemlərini araşdırıb. Həmin illərdə kafedra əməkdaşlarından S.P.Nəbiyev (1971), M.A.Babayev (1971), X.Q.Fətəliyev (1974) namizədlik dissertasiyası müdafiə etmişdir.

*Məktəbəqədər pedaqogika kafedrasına* dos.Əfşan Qədimbəyova (1968-1978), dos.Nazimə Rüstəmova (1980-1989) rəhbərlik etmişdir. Kafedra




əməkdaşları (Ə.Qədimbəyova, N.Rüstəmova, P.Paşayeva, R.Mursaqulova və b.) məktəbəqədər yaşlı uşaqların təhsil-tərbiyəsi ilə bağlı tədqiqatlar aparmış, namizədlik dissertasiyaları (Z.Vəliyeva, R.Mursaqulova, S.Axundova) müdafiə etmişlər.

*Yaş və pedaqoji psixologiya kafedrasına* 1974-1988-ci illərdə prof. Zəkəriyyə Mehdizadə rəhbərlik etmişdir. Kafedrada (dosentlər Ə.Əlizadə, E.Quliyev, Q.Əzimov, İ.Fərəcov, baş müəllimlər Ə.Abdullayev, N.Cavadov, müəllim L.Süleymanova) yaş və pedaqoji psixologiyanın aktual problemləri ilə bağlı tədqiqatlar aparılmış, dərslik və dərs vəsaitləri hazırlanmışdır.

Həmin dövrdə *Psixologiya kafedrasında* Ş.S.Ağayev (1965), Ə.S.Bayramov (1967), M.Ə.Həmzəyev (1968), Ə.Ə.Qədirov (1974), Ə.Ə.Əlizadə (1975) doktorluq dissertasiyası, Ə.T.Bəxşəliyev (1973), E.Ə.Quliyev (1968), Q.E.Əzimov (1970), M.Ş.Əbdülov (1972), A.Ü.Məmmədov (1965), B.İ.Rzayev (1989), İ.A.Fərəcov (1968), N.A.Cavadov (1974), Z.A.Orucov (1985), S.F.Şabanov (1986) və başqaları namizədlik dissertasiyaları müdafiə etdilər.

1973-cü ildə Pedaqoji fakültənin nəzdində fəaliyyət göstərən *Musiqi və rəsm kafedrası* iki yerə bölündü. Müstəqil *Musiqi və onun tədrisi metodikası kafedrası* təşkil olundu. Kafedraya 1974-1982-ci illərdə dos.Sabir Quliyev rəhbərlik etdi. 1982-ci ildə həmin kafedranın bazasında 2 kafedra təşkil olundu:1)Musiqi alətləri; 2) Musiqi fənləri və onun tədrisi metodikası.

Musiqi alətləri kafedrasına 1982- 2001-ci illərdə dos.Sabir Quliyev, Musiqi fənləri və onun tədrisi metodikası kafedrasına 1982-1998-ci illərdə dos. Nəcməddin Məlikməmmədov rəhbərlik etmişdir. Kafedra əməkdaşları tərəfindən ümumtəhsil məktəbləri üçün musiqi dərslikləri hazırlanaraq nəşr olunmuşdur.

*Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasına* 1966-1994-cü illərdə prof.Nüsrət Sadıqov rəhbərlik etmişdir. Kafedra əməkdaşları (N.Sadıqov, N.Kazımov, S.Həmidov, S.Süleymanov, A.Təmrazlı, M.Əzizov və b.) ibtidai siniflərdə riyaziyyatın tədrisi məsələləri ilə bağlı araşdırma aparmışlar. Kafedranın əməkdaşları N.Kazımov (1975), S.Həmidov (1972), S.Süleymanov (1980) namizədlik dissertasiyası müdafiə etmişdir.

**Coğrafiya fakültəsi.** Fakültəyə 1970-1974 - cü illərdə dos.Saleh Məmmədov, 1974-1976-cı illərdə prof.Nizaməddin Allahverdiyev rəhbərlik edib. 1976-1981-ci illərdə fakültə Biologiya-kimya fakültəsinin tərkibinə verilib. 1981-ci ildə Coğrafiya fakültəsi yenidən müstəqil fəaliyyət göstərməyə başlayıb. Həmin illərdə fakültəyə dos.Əsəd Əsədov (1981-1989), prof.Şahəli Həsənov (1989-1991), prof.Xostan Vəliyev (1992-1996) rəhbərlik edib.



*Coğrafiya fakultəsinin əməkdaşları*

70-ci illərin əvvəllərində fakültənin nəzdində 3 kafedra (Fiziki coğrafiya, İqtisadi coğrafiya, Coğrafiyanın tədrisi metodikası) fəaliyyət göstərirdi. 1980-ci ildə kafedraların sayı dəyişməsə də, kafedraların birləşməsi və ayrılması nəticəsində yeniləri (Fiziki coğrafiya, Ümumi coğrafiya, İqtisadi coğrafiya və onun tədrisi metodikası) yaranmışdı.

*Fiziki coğrafiya kafedrasına* prof.Nurəddin Kərəmov (1966-1973), prof. Ramazan Tarverdiyev (1973-1983), dos.Vasif Nəbiyev (1984-1989) rəhbərlik etmişdir. Prof. N.K.Kərəmov Azərbaycanda fiziki coğrafiyanın, xüsusilə landşaftşünaslıq elminin inkişafında mühüm xidmətləri olub. Prof.R.Tarverdiyevin tədqiqatları Azərbaycanın gölləri və su anbarlarının hidroloji xüsusiyyətləri ilə bağlı olmuşdur. Kafedranın dosentlərindən O.Osmanov, M.Rəcəbov, S.Məmmədov, Ə.Hüseynov, V.Nəbiyev, O.Rzayev, B.Cəfərov, P.Mirzəyev, Z.Əfəndiyev, M.Hacıyev, M.Mirzəyev, T.Zülfüqarov, A.İbrahimov, A.Məmmədov, F.Hüseynova, T.Xəlilova, O.Bəşirov, B.N.Nəbiyeva, F.Q.Bahmalova Azərbaycan fiziki coğrafiyası ilə əlaqədar araşdırmalar aparmışlar. Kafedrada R.Tarverdiyev (1975) doktorluq, D.İ.İslamov (1980), N.S.Süleymanova (1981) namizədlik dissertasiyası müdafiə etmişdir.

*Ümumi coğrafiya kafedrasına* 1974-1977-ci illərdə dos.Pullu Mirzəyev, 1978-1991-ci illərdə prof. Şahəli Həsənov rəhbərlik etmişdir. Kafedra əməkdaşları (Ş.H.Həsənov, P.S.Mirzəyev, O.M.Rzayev, O.U.Osmanov, C.B.Məmmədov, Z.M.Əfəndiyev, X.A.Vəliyev, A.Məmmədov, A.İ.Əzizbəyova, X.Xəlilova və b.) Lənkəran -Talış, Quba-Xaçmaz, Abşeron-Qobustan fiziki-coğrafi xüsusiyyətləri, təbii ehtiyatlarının tədqiqi ilə məşğul olmuşlar.

*İqtisadi coğrafiya və onun tədrisi metodikası kafedrasına* prof.Nizaməddin Allahverdiyev (1970-1980), prof.Həsən Sadıxlı (1980-1990) rəhbərlik etmişdir. Kafedra əməkdaşları tərəfindən (N.N.Allahverdiyev, H. Sadıxlı, A.S.Əsədov, N.İ.Nəsibli, D.Ələsgərov, T.A.Mirzəyeva, S.R.Qaramollayev, C.M.Rəşidov) respublikanın müxtəlif təsərrüfat sahələrinin ərazi təşkili problemləri tədqiq edilmişdir. Kafedra əməkdaşlarından U.M.Əsədov (1974), A.A.Qurbanov (1974), D.M.Ələsgərov (1976), Ç.M.Rəşidov (1976), A.M.Mirzəyev (1980) namizədlik dissertasiyası müdafiə etmişdir.

70-ci illərdə kafedralarda çalışan elmi dərəcəlilərin sayı artdı. İnstitutun 660 nəfər professor-müəllim heyətinin 46 nəfəri (7%) elmlər doktoru, professor, 340 nəfəri (51,5 %) fəlsəfə doktoru, dosent idi.

**Elmi əlaqələr.** 70-80-ci illərdə Pedaqoji İnstitutun SSRİ-nin digər respublikalarının ali təhsil müəssisələri və Elmlər Akademiyalarının institutları ilə, Avropa ölkələri (Bolqarıstan, Ruminiya, Macarıstan, Polşa, ADR) və ABŞ universitetləri ilə elmi əlaqələri genişləndi. Ali məktəblərarası əməkdaşlığa, qarşılıqlı şəkildə mühazirələrin oxunmasına, elmi stajirovkaya, beynəlxalq konfranslarda iştiraka üstünlük verildi. 1971-1981-ci illərdə institutun 20 əməkdaşı beynəlxalq konfranslarda iştirak etmək və ya elmi təcrübəni öyrənmək məqsədilə xarici ölkələrdə olmuşdu. 1974-cü ildə Eksperimental və nəzəri fizika kafedrasının əməkdaşları A.B.Bəşirov və M.Y.Bəşirov Varna şəhərində keçirilən “Polimerlər-71” elmi seminarda



*ADPİ-də keçirilən beynəlxalq konfransın iştirakçıları*




*ADPİ-də keçirilən beynəlxalq konfransın iştirakçıları*

lama riyaziyyatı və ehtimal nəzəriyyəsi kafedrasının dosentləri H.Əliyev Macarıstanın Budapeşt şəhərində E.Loranda adına Riyaziyyat və Texnika Universitetində, R.A.Abbasov Varşava Universitetində, Analitik və fiziki kimya kafedrasının müdiri A.Verdizadə 1981-ci ildə Praj Universitetində, Kimyəvi Reaktivlər İnstitutunda, Qeyri-üzvi kimya İnstitutunda (Slovakiya) elmi ezamiyyətdə olmuşdu.

Elektrik və optika kafedrasının dosenti V.İ.Nəsirov 1977-ci ilin noyabrından 1978-ci ilin avqustuna kimi Paris Universitetinin fiziki kimya laboratoriyasında elmi stajirovkada olmuşdu. Orada apardığı elmi tədqiqatlarının nəticələri ilə bağlı Fransada nəşr olunan "Fizika-kimya" jurnalında çap etdirmiş, Fransanın Fiziki kimya Cəmiyyətinin üzvü seçilmişdi.

məruzə etdilər. 1976-cı ildə Elektrik və optika kafedrasının üzvləri B.B.Quliyev, F.A.Qənbərov və E.Z.Zeynalova Çexoslovakiyada keçirilən beynəlxalq konfransda məruzə ilə çıxış etdilər. B.B.Quliyev 1972-1973-cü illərdə 10 ay ABŞ-da elmi stajirovkada oldu. Ali riyaziyyat kafedrasınn müəllimi A.F.Mütəllibov 1978-1981-ci illərdə Əlcəzair Xalq Demokratik Respublikasının Bumerdes şəhərində Yüngül Sənaye İnstitutunda müəllim, V.Nəsirov isə 1983-1987-ci illərdə həmin institutun Fizika kafedrasının müdiri vəzifəsində işləmişdir.

1978-ci ildə Mexanika və molekulyar fizika kafedrasının əməkdaşı E.Ə.Eyvazov Çexoslavakiyanın Karlova Universitetinin Materiallar fizikası kafedrasında stajirovkada oldu. 1971-ci ildə Cəbr və ədədlər nəzəriyyəsi kafedrasının müdiri M.Cavadov M.V.Lomonosov adına MDU-nun Mexanika-riyaziyyat fakültəsində, 1974-cü ildə Berlin, Leypsiq və Drezden universitetlərində mühazirə oxumağa dəvət olundu.1976-cı ildə o, MDU-da akademik İ.Q.Petrovskinin yubileyinə həsr edilmiş konfransda, 1977-ci ildə Qazaxıstanda diferensial tənliklərlə bağlı Ümumittifaq konfransında məruzə ilə çıxış etdi.

1979-cu ildə Riyazi analiz kafedrasının dosentləri Ə.S.Cəfərov və L.İ.Süleymanov SSRİ və Çexoslovakiya riyaziyyatçılarının 6-cı elmi-praktik konfransında məruzə etdilər.1980-ci ildə Hesab-

Elmi əlaqələr qarşılıqlı olub. Belə ki, tanınmış alimlər: M.V.Lomonosov adına MDU-nun professoru A.İ.Busev, B.K.Kərimov,V.A.Sadovniçi, M.İ.Vişkin, B.A.Qorin, Y.A.Sayşkin, N.K.Krupskaya adına Moskva Vilayət Pedaqoji İnstitutunun rektoru V.F.Nozdrev, V.İ.Lenin adına Moskva Dövlət Pedaqoji İnstitutunun professorları B.M.Yavorskiy, P.V.Qora, V.Q. Tyukavkin, Moskva Energetika İnstitutunun professoru Y.A.Dubinski, Kiyev Dövlət Universitetinin professorları A.Z.Qolik, A.F.Skrışevski və b. ayrı-ayrı vaxtlarda Azərbaycan Pedaqoji İnstitutunun professor-müəllim heyətinin qonağı olub, burada elmi məruzələrlə çıxış ediblər.

Pedaqoji İnstitutda fəaliyyət göstərən müdafiə şuraları ayrı-ayrı ixtisaslar üzrə elmi-pedaqoji kadr hazırlığında mühüm rol oynayırdı. SSRİ Nazirlər Sovetinin yanında Ali Attestasiya Komissiyasının 16 iyun 1982-ci ildə 3/242 №-li əmri ilə ADPİ-nin nəzdində Sov.İKP tarixi və SSRİ tarixi ixtisasları üzrə tarix elmləri namizədi dərəcəsi verən ixtisaslaşdırılmış Müdafiə şurası fəaliyyət göstərirdi. Müdafiə şurasının sədri prof. Şükür Sadıqov, sədr

müavini prof.Səlvər Aslanov, elmi katib dos.Süleyman Məmmədov idi. Müdafiə şurasının 17 nəfər (prof.Yusif Yusifov, prof.Dərgah Qüdrətov, prof. Aslan Atakişiyev, prof.Şərif Haqverdiyev, prof. Cahid Quliyev,prof. Novruz Hüseynov, prof.Sabir İbrahimov, prof. Qaraş Mədətov, prof.Ruhulla Orucov, prof. Nazar Paşayev, prof.Əbdürrəhman Şahmirov, prof. Rafiq Rəcəbov, dos. Oqtay Rəhimov) üzvü var idi.

SSRİ Nazirlər Soveti yanında Ali Attestasiya Komissiyasının 14 iyul 1982-ci il 3/348 №-li əmri ilə ADPİ-nin nəzdində sovet ədəbiyyatı, SSRİ xalqları ədəbiyyatı, SSRİ xalqları dilləri ixtisasları üzrə fəaliyyət göstərən Müdafiə şurasının sədri prof.Afad Qurbanov, sədr müavini prof.Paşa Əfəndiyev, elmi katib Zahid Xəlilov idi. Müdafiə şurasının 18 nəfər (f.e.d.,dos.Nabat Abdullayeva, prof.Alməmməd Alməmmədov, prof. Həbib Babayev, prof.İnayət Bəktaşi, prof.Zərifə Budaqova, prof.Məmməd Məmmədov, prof.Kamran Məmmədov, f.e.d.,dos. Həsən Mirzəyev, dos.İsmayıl Şıxlı, prof.Qulu Xəlilov, prof. Fərhad Fərhadov, prof.Yusif Seyidov, prof.Abbas Hacıyev) üzvü var idi.

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunda ictimai təşkilatların fəaliyyəti

70-ci illərdə Pedaqoji İnstitutunun tədris və elmi həyatında partiya və komsomol komitəsi mühüm rol oynayırdı. 1973-cü ilin noyabr ayında institut partiya komtəsinin yeni heyəti seçildi.[183] Yeni tərkibə H.H.Ağayev (rektor), S.H.Axundov (partiya komitəsinin katibi), Ş.Ə.Sadıqov (prorektor), R.Ə.Əliyev (komsomol komitəsinin katibi), İ.Q.Şıxlı (Rus və xarici ölkələr ədəbiyyatı kafedrasının müdiri), O.M.Rzayev (Fiziki coğrafiya kafedrasının dosenti), H.B.Əliyev (Həmkarlar İttifaqı Komitəsinin sədri), Ş.H.Hacıyev (katib müavini, Fəlsəfə kafedrasının dosenti), A.C.İmanova (qiyabi riyaziyyat fakültəsinin dekanı), S.M.Əzimov (Fizika kafedrasının dosenti), K.H.Hüseynova (Xarici dillər kafedrasının baş müəllimi), A.F.Rubalevskaya (Sov.İKP tarixi kafedrasının dosenti), E.S.Qriqoryan (Elementar riyaziyyat və onun tədrisi metodikası kafedrasının dosenti) və P.T.Əliyeva (Biologiya fakültəsinin tələbəsi) daxil edilmişdi.

1972-ci ildə institut partiya komitəsi öz ətrafında 43 qrup təşkilatları, 9 ilk partiya təşkilatını birləşdirirdi. İnstitut partiya komitəsinin uçotunda 648 nəfər partiya üzvü və 21 nəfər partiya üzvlüyünə namizəd vardı.Partiya komitəsi nəzdində xalq nəzarəti qrupu fəaliyyət göstərirdi ki, onun da sədri İbrahimxəlil Xəlilov idi. Partiya üzvlərinin və üzvlüyə namizədlərin sayı ildən-ilə artırdı. Əgər 1925-ci ildə institutda cəmi 25 nəfər partiya üzvü vardısa, 1971-ci ildə onların sayı 573-ə yüksəlmişdi.

60-80-ci illərdə Pedaqoji İnstitutun partiya komitəsinə ayrı-ayrı vaxtlarda Nəsib Əlizadə, Safa İmanov, Mürsəl Əliyev, Əhəd Əhmədov, İsmayıl Süleymanov, Soltansəlim Axundov, Xəlil Xəlilov, Yaqut Rzayeva, Əbdül Əlizadə, Əjdər Xəlilov, Eldar Abbazsadə və Sərdar Quliyev rəhbərlik etmişdir.

70-ci illərin əvvəllərində institut həmkarlar təşkilatının 1237 nəfər professor-müəllim və tədris köməkçi heyət, 7252 nəfər tələbə üzvü var idi. Təşkilata ayrı-ayrı vaxtlarda dos.Tofiq Rüstəmov, prof.Sabir İbrahimov, dos.Kamal İbrahimov, prof. Ədalət Fərəcov, dos.Aydın Məmmədov və dos. Nizami Xudiyev rəhbərlik etmişdir.



*Partiya komitəsinin katibi dos.X.Xəlilov iclas apararkən*

[183] *Partiya komitəsinin yeni heyəti. "Gənc müəllim" qəzeti, 6 dekabr 1973*

1977-ci ildə İbtidai təhsil pedaqogikası və metodikası fakültəsinin tələbəsi Yaqut Rzayeva Ümumittifaq Həmkarlar İttifaqının XVI qurultayının nümayəndəsi seçilib. Qurultayda 5 il müddətində (1977-1982) SSRİ Həmkarlar Təşkilatı təftiş komissiyasının üzvü seçilib. Mütəmadi olaraq Ümumittifaq Həmkarlar İttifaqının plenumlarında iştirak edən Yaqut Rzayeva müxtəlif mövzularda çıxış edib.

O dövrdə demək olar ki, institutla bağlı bütün məsələlər partiya təşkilatında müzakirə edilir, professor-müəllimlərin siyasi hazırlığına ciddi fikir verilirdi. İnstitutda oxuyan komsomolçu tələbələrin də sayı ildən-ilə artırdı.1967-ci ildə institut tələbələrinin 5000 nəfəri komsomolçu olduğu halda, 1973-cü ildə onların sayı 6868-ə yüksəlmişdi[184].

60-80-ci illərdə institutun komsomol komitəsinə Xəlil Xəlilov (1958-1963), Təzəxan Sultanov (1963-1966), Məlikməmməd Cəbrayılov (1966-1970), Zabit Məmmədov (1970), Rəcəb Əliyev (1970- 1974), Rabil Novruzov (1974 -1976), Aydın Məmmədov (1976-1978), Yaqut Rzayeva (1978-1979), Nəsibə Səmədova (1979-1980), Kərəm Bayramov (1980-1986), Allahyar İmanov (1986-1991) rəhbərlik etmişdir. İnstitut komsomol komitəsi gələcək müəllimlərin əxlaqi-mənəvi dəyərlər ruhunda səmərəli fəaliyyətinə görə 1968-ci ildə ÜİLKGİ-nin Fəxri Fərmanı ilə təltif edilmişdi. Komsomol komitəsi gələcək müəllimlərin əmək fəaliyyətinə hazırlanmasının ən yaxşı forması kimi tələbə inşaat dəstələrinə üstünlük verirdi.

Pedaqoji İnstitutda 1971-ci ildə 783 nəfərdən ibarət ilk ***tələbə inşaat dəstəsi*** təşkil olundu. Onlar Azərbaycanda və Moldova Respublikasında əmək semestrində iştirak etdilər. Moldovanın Suvorov rayonunda çalışan tələbələrimiz digər respublikaları təmsil edən 16 dəstənin içərisində I yeri tutdular.75 tələbəmiz Suvorov rayon komsomol komitəsinin "Fəxri fərmanı" və "Sosializm yarışının qalibi" döş nişanı ilə təltif olundular.1972-ci ildə Pedaqoji İnstitutun tələbə inşaat dəstəsi respublika ali məktəbləri arasında birinci yerə çıxdı və keçici Qırmızı bayraqla təltif edildi.1973-cü ildə Pedaqoji İnstitutun bir qrup tələbəsi əmək cəbhəsindəki uğurlarına görə respublika LKGİ MK tərəfindən mükafatlandırıldı. 1979-cu ildə institutun tələbə inşaat dəstəsi Tolyatti şəhərində sosializm yarışının qalibi olduğuna görə Kuybışev Vilayət LKGİ tərəfindən vımpel və I dərəcəli diplomla mükafatlandırıldı.

1979-cu ilin yayında 16 tələbəmiz Yuqoslaviya və Bolqarıstanda oldu. Həmin vaxt sovet nümayəndə heyətinin başçısı kimi Sofiya şəhərində olan Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev tələbələrimizlə görüşüb söhbət etdi. Respublika başçısının tələbələrimizə verdiyi tövsiyə və məsləhətlər onları daha da ruhlandırdı, plan və öhdəlikləri yerinə yetirmələri üçün güc və enerji verdi. İldən-ilə tələbə inşaat dəstəsinin coğrafiyası və marşurutu genişləndi. Tələbələrimiz Azərbaycanın şəhər və rayonları ilə bərabər, Moldovada, Stavropol və Kuybışev vilayətlərində, Yuqoslaviya və Bolqarıstanda əmək semestrində iştirak etdilər. 1972-1981-ci illərdə institutun tələbə inşaat dəstəsinin üzvü olan 5710 tələbə planlaşdırılan 6 milyon 653 min rubl. iş əvəzinə 7 milyon 800 min, 892 rubl.iş yerinə yetirdilər. Uğurlu nəticəyə görə tələbələrimizə ÜİLKGİ MK və Azərbaycan LKGİ MK tərəfindən Fəxri fərmanlar və pul mükafatları verildi, turist putyovkası ilə Suriya, Yunanıstan, Bolqarıstan və Macarıstana göndərildilər.



*Tələbə inşaat dəstəsinin üzvləri*

90-cı illərin əvvəllərində də tələbələrin yay əmək semestrinə cəlb edilməsi prosesi davam etdirildi. 1990-cı ilin yay əmək semestrində 6 dəstədə 233 tələbə iştirak etmişdir. Riyaziyyat fakültəsinin

[184] ***Əliyev R.*** *Zəhmət və hünər yolu."Gənc müəllim", 26 fevral 1973*

qızlardan ibarət "N.Tusi-90" dəstəsi (komandir Fikrət Əhmədov) Xaçmaz konserv zavodunda, oğlanlardan ibarət "Riyaziyyat-90" dəstəsi (Novruz Nəsirov) Qutqaşen (indiki Qəbələ rayonu) rayonunda, Fizika fakültəsinin "Kvant-90" dəstəsi (komandir Məcnun Hacıyev) Bakı şəhərində, Mühəndis-pedaqoji fakültənin "Texnik-90" dəstəsi (Akif İsmayılov) Bakı Şəhərində, Tarix fakültəsinin "Nərimanov-90" dəstəsi (komandir Mübariz Əmirov) Dəvəçi (indiki Şabran rayonu) rayonunda , "Pedaqoq-90" dəstəsi (komandir Mirəziz Əsgərov, komissar Abbas Əliyev, komandir müavini Qədir Nəzərov, Fəxrəddin Yusifov) Balakən rayonunda işləmişdir.

Tələbə inşaat dəstələrinin nəzdində təbliğat briqadası yaradılmışdı. Onlar xarici ölkələrdə və Rusiyanın şəhərlərində inşaat işləri görməklə yanaşı, həm də Azərbaycan günləri keçirməklə mədəniyyətimizi təbliğ edirdilər. Tələbə inşaat dəstəsinin üzvləri asudə vaxtlarında 135 konsert vermiş, 273 mövzuda məruzə etmişdilər.1979-cu ildə institutda 400 tələbənin iştirak etdiyi 14 pedaqoji dəstə təşkil edilmişdi.

Tələbələrin əmək fəaliyyətinə hazırlanmasının digər bir forması payız aylarında kənd təsərrüfatı rayonlarında pambıq yığımında iştirakları ilə bağlı idi. İnstitutun professor-müəllim və tələbə kollektivi Bərdə, Sabirabad, Kürdəmir, Qasım İsmayılov (Goranboy), Jdanov (İmişli) və respublikanın digər rayonlarında pambıq toplanışında fəal iştirak edirdilər. 10 il müddətində (1970-1980) Pedaqoji İnstitutun 40 min tələbəsi 50 min ton pambıq toplayıb təhvil vermişdi. Pedaqoji İnstitutun professor-müəllim və tələbə kollektivinin təhsillə yanaşı, əmək cəbhəsindəki uğuru ölkə rəhbərliyi tərəfindən yüksək dəyərləndirilmişdir. Belə ki, 31 dekabr 1981-ci ildə Lenin adına Sarayda[185] Sov.İKP MK-nın Baş katibi L.İ.Brejnevin də iştirak etdiyi Azərbaycan zəhmətkeşlərinin nailiyyətlərinə həsr olunmuş tədbirdə Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev pambıq toplanışında yüksək nəticələr göstərərək sosializm yarışının qalibləri olan tələbələrdən danışarkən V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun tələbəsi Mətanət Əliyevanın adını xüsusi vurğulamışdı.

70-ci illərdə institut kommunistlərinin və komsomolçularının təşəbbüsü ilə xeyli ictimai tədbirlər keçirildi. Professor-müəllim kollektivinin gücü ilə Bayıl qəsəbəsində yerləşən Xalqlar Dostluğu Parkında mütəmadi qulluq edilən 10 min ağac əkildi.

Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyevin Bakı şəhər partiya komitəsinin 43-cü konfransında ali məktəb tələbələrinin teatra, operaya və konsertlərə az getməsi ilə bağlı çıxışından sonra Pedaqoji İnstitutda bu sahəyə diqqət artırıldı.

Tələbələrdə yüksək vətəndaşlıq, əxlaqi-mənəvi və estetik keyfiyyətlərin formalaşdırılması məqsədilə Pedaqoji İnstitutda ***Tələbələrin Estetik Tərbiyəsi Universiteti*** (rektor fəlsəfə elmləri namizədi, dosent Aydın Mikayılov) təşkil olundu. Universitetdə tələbələrin estetik tərbiyəsi ilə bağlı "Musiqi və estetik tərbiyə", İncəsənət xalqa məxsusdur", "Mahnılar yaşamağa ruhlandırır və s. mövzularda



*Tələbələr pambıq toplanışında*



*Tələbələr pambıq toplanışında*

[185] *İndiki Heydər Əliyev Sarayı*

silsilə mühazirələr oxunurdu. Həmin dövrdə tələbələrin qrup halında teatr tamaşalarına, simfonik konsertlərə, muzeylərə gedişi mütəmadi xarakter aldı.

70-ci illərdə institutda tədris və elmi fəaliyyətə nəzarət məqsədilə ***xalq nəzarəti*** qrupu fəaliyyət göstərirdi. Ümuminstitut nəzarət qrupunda ayrı-ayrı strukturları 99 nəfər təmsil edirdi. Anoloji qruplar fakültələrdə də yaradılmışdı.

Azərbaycanda elmin, ədəbiyyatın və incəsənətin inkişafında böyük xidmətləri olan ziyalılarla tələbələrin görüşü onlarda yaradıcı təfəkkürün inkişafına kömək etməklə yanaşı, həm də onları elmi axtarışlara sövq edir.

70-ci illərdə Azərbaycan EA-nın prezidenti, SSRİ EA-nın müxbir üzvü, institutun yetirməsi Həsən Abdullayev, akademiklər Həsən Əliyev, Həmid Araslı, Məmmədcəfər Cəfərov, Əlisöhbət Sumbatzadə, *görkəmli şairlər* (Süleyman Rüstəm, Rəsul Rza, Bəxtiyar Vahabzadə, Nəbi Xəzri, Mirmehdi Seyidzadə, Hüseyn Arif, Cabir Novruz, Nəriman Həsənzadə, Hikmət Ziya, Xəlil Rza), *yazıçılar* (Süleyman Rəhimov, Mirzə İbrahimov, Anar), *tanınmış bəstəkarlar* (Səid Rüstəmov, Süleyman Ələsgərov, Emin Sabitoğlu), *Azərbaycan xalq artistləri* (Nəsibə Zeynalova və Şövkət Ələkbərova), SSRİ xalq artisti Lütviyar İmanov və SSRİ xalq rəssamı Mikayıl Abdullayev tələbələrin qonağı oldu.

Respublikada *İctimai peşələr fakültəsi* 1966-cı ildə ilk dəfə V.İ.Lenin adına APİ-də yaradılmışdır. Fakültədə bədii özfəaliyyət kollektivlərinə (musiqi, rəqs, teatr), foto-kino həvəskarları dərnəklərinə rəhbərlər, mühaziraçi-təbliğatçılar, ictimai müxbirlər, idmanın müxtəlif növləri üzrə ictimai təlimatçılar, məşqçilər və hakim hazırlanırdı. Təhsil müddəti 2 olan fakültədə məşğələlər axşam saat 17-də, şöbənin profilindən asılı olaraq həftədə iki dəfə (II və IV günlər) keçilirdi. İctimai peşələr fakültəsini müvəffəqiyyətlə bitirmiş müdavimlərə müvafiq ixtisas üzrə diplom-vəsiqə verilirdi. Fakültəyə seçdiyi peşə ilə bağlı qabiliyyəti olan, habelə dekanlıqdan və ictimai təşkilatlardan müsbət xasiyyətnamə almış tələbələr qəbul olunurdu.

Fakültədə gələcək müəllimlər ictimai fəaliyyətin nəzəri əsaslarına və əməli vərdişlərinə yiyələnirdilər. Fakültəyə 1968-1970-ci illərdə dos. İ.Bağırov, 1970-ci illərdə prof.Abbas İsmayılov rəhbərlik etmişdir. Sonrakı illərdə fakültəyə dos. Bəşir Quliyev rəhbərlik etmişdir. 1975-ci ildə İctimai peşələr fakültəsində aşağıdakı şöbələr fəaliyyət göstərirdi:

1.Musiqi (fortepiano sinfi, tar sinfi)
2.Xoreoqrafiya (xalq mahnı və rəqsləri, klassik rəqslər)
3.Foto və kino həvəskarları
4.Mühazirəçi təbliğatçılar məktəbi
5.Teatr
6.Jurnalistika
7.İdman
8.Avtomobil həvəskarları
9.Alpinist-ölkəşünaslıq
10.Müasir fizika və texniki tərəqqi
11.Kibernetika və həyat

## Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 60 illik yubileyi

80-ci illər Pedaqoji İnstitutun həyatında əlamətdar hadisələrlə yadda qaldı.1981-ci ilin avqust ayında Filologiya fakültəsinin dekanı ***prof.Afad Qurbanov*** ADPİ-nin rektoru təyin edildi. *Prof. Şükür Sadıqov* öz işində - tədris işləri üzrə prorektor vəzifəsində saxlanıldı. Həmin dövrdə elmi işlər üzrə prorektor vəzfəsində *prof.Nurəddin Kazımov* çalışırdı. 17 sentyabr 1982-ci ildə prof.N.Kazımov başqa işə keçirildi. 1983-cü ildə *prof.Kamal Hüseynov* elmi işlər üzrə prorektor təyin edildi. İnstitutun strukturunda və idarəetmə sistemində dəyişikliyin əsası qoyuldu.



***Afad Məhəmməd oğlu Qurbanov***
*AMEA-nın müxbir üzvü,*
*filologiya elmləri doktoru, professor*
*Dövlət mükafatı laureatı, Əməkdar elm xadimi,*
*(1929-2009)*

*1929-cu il yanvarın 10-da Qərbi Azərbaycanın Kalinino rayonunun əvvəllər Cuci, sonralar isə Qızıl Şəfəq adlanan kəndində yüksək rütbəli hərbçi ailəsində anadan olmuşdur. Orta təhsilini Qərbi Azərbaycanın Qızıl Şəfəq və İlməzli kənd məktəblərində almışdır. 1945-ci ildə Qızıl Şəfəq yeddiillik məktəbinin direktoru və Azərbaycan dili müəllimi təyin edilmişdir. 1946-1948-ci illərdə Gürcüstan Müəllimlər İnstitutunda oxumuşdur. Başkeçid rayonundakı Oruzman yeddiillik kənd məktəbində direktor və Azərbaycan dili və ədəbiyyatı müəllimi işləmişdir. 1951-ci ildə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Dil və ədəbiyyat fakültəsini bitirmişdir. Gürcüstan Respublikasının Başkeçid rayonundakı Hamamlı kənd orta məktəbinin direktoru vəzifəsində çalışmış, A.S.Puşkin adına Tbilisi Dövlət Pedaqoji İnstitutunda müəllim işləmişdir. 1956-cı ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Azərbaycan dilçiliyi kafedrasında aspiranturaya daxil olmuşdur. ADPİ-də, Bakı Ali Partiya Məktəbində və ADDİ-də müəllim işləmişdir. Prof.Ə.Dəmirçizadənin elmi rəhbərliyi altında Səməd Vurğunun dramaturgiyasının dili üzərində tədqiqat aparmışdır. 1962-ci ildə A.M.Qorki adına Türkmənistan Dövlət Universitetinin Elmi Şurasının qərarı ilə ona “S.Vurğunun “Vaqif” pyesinin dili və üslubu” mövzusunda müdafiə etdiyi namizədlik dissertasiyasına görə filologiya elmləri namizədi alimlik dərəcəsi verilib. 1968-ci ildə Azərbaycan EA-nın İctimai elmlər bölməsində “Müasir Azərbaycan ədəbi dili” mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 1965-ci ildə ona dosent elmi adı verilib. SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyi nəzdində fəaliyyət göstərən AAK tərəfindən ona 1969-cu ildə elmlər doktoru elmi dərəcəsi, 1970 -ci ildə professor elmi adı verilib.*

*1959-1965-ci illərdə ADPİ-nin Azərbaycan dilçiliyi kafedrasında assistent, müəllim, 1965-1970-ci illərdə dosent, 1970-2009-cu illərdə professor, 1967-1968-ci illərdə Filologiya fakültəsində dekan müavini, 1968-1981-ci illərdə dekan, 4 avqust 1981-ci ildən 7 aprel 1989-cu ilə kimi ADPİ-nin rektoru vəzifəsində işləmişdir.*

*1979-2009 -cu illərdə Azərbaycan dilçiliyi kafedrasının və 1992-2009-cu illərdə “Azərbaycan dilinin onomalogiyası problemləri” elmi-tədqiqat laboratoriyasının müdiri vəzifəsində çalışmışdır. 1969-cu ildən Ali və Orta İxtisas Təhsili Nazirliyinin və Maarif Nazirliyinin Azərbaycan dili üzrə Tədris-Metodiki Şuralarının sədr müavini, sonralar Təhsil Nazirliyinin Elmi-Metodiki Şurasının və Təhsil Problemləri üzrə Elmi-Metodik Mərkəzinin və bir çox komissiyalarının üzvü olmuşdur. 1979-cu ildən “Azərbaycan toponimlər lüğəti” ensiklopedik nəşrinin, “Dil və ədəbiyyat” məcmuəsinin, “Elm və həyat” jurnalının, “Təhsil” və “Türkologiya” jurnallarının redaksiya heyətinin üzvü, “Dilçilik” elmi-linqvistik və “Onomastika” elmi-onomastik jurnallarının təsisçisi, baş redaktoru olmuşdur. O, 1980-ci ildən Azərbaycan Əlifba Komissiyasının sədri, Azərbaycan EA-nın Terminologiya Komitəsinin, Adlar və Soyadlar üzrə Xüsusi Komissiyanın, Dövlət dili haqqında qanun layihəsinin hazırlanması üzrə Komissiyanın, Əlaqələndirmə Şurasının, Nəsimi adına Dilçilik İnstitutunda Elmi və Müdafiə Şuralarının, Azərbaycan Yazıçılar Birliyinin üzvü olmuşdur.*

*Azərbaycan elminin inkişafında və yüksəkixtisaslı elmi və pedaqoji kadrların hazırlanmasındakı xidmətlərinə görə dəfələrlə Ali Sovetin Rəyasət Heyəti, AMEA Rəyasət Heyəti və Təhsil Nazirliyi*

*tərəfindən fəxri fərmanlara, təltiflərə layiq görülmüşdür. 30 iyun 1983-cü ildə Azərbaycan EA-nın müxbir üzvü seçilmişdir. 1983-1989-cu illərdə Azərbaycan Respublikası "Bilik" cəmiyyətinin natiqlik və mühazirəçilik məharəti komissiyasının sədri və Azərbaycan Ali Məktəbləri Rektorlar Şurasının Rəyasət Heyətinin üzvü olmuşdur. 1984-1989-cu illərdə SSRİ EA-nın Sovet Türkoloqları Komitəsinin üzvü, Tədris-metodiki bölməsinin sədri, Türk onomastikası bölməsi bürosunun üzvü, sonralar həmin komitənin sədr müavini vəzifələrində çalışmışdır. Azərbaycan Milli Yaradıcılıq Akademiyasının, Beynəlxalq PEA-nın, Rusiya Pedaqoji və Sosial Elmlər Akademiyasının, Nyu-York Akademiyasının akademiki, Türk Dil Qurumunun şərəfli üzvü, Sürəkli Türk Dili Məclisinin həqiqi üzvü, Belçika Onomastika cəmiyyətinin, Finlandiyanın Fin-Uqor cəmiyyətinin və digər təşkilatların həqiqi və ya fəxri üzvü seçilmişdir.*

*1981 və 1987-ci illərdə Bakı şəhər Sovetinin deputatı, 1990-1995-ci illərdə isə Azərbaycan Ali Sovetinin deputatı (millət vəkili) olmuşdur.*

*Ümumi dilçilik, türkoloji dilçilik, Azərbaycan dilçiliyi elminin tədqiqinə dair 70-dən çox kitabın və 500-dən artıq elmi-metodiki məqalənin müəllifidir. O, Azərbaycan dilçilik tarixində elmi məktəb yaratmış alimlərimizdən biridir. "Azərbaycan dilinin onomologiyası" kitabına görə ona Dövlət mükafatı verilmişdir.*

*26 sentyabr 2009-cu ildə Bakı şəhərində vəfat etmişdir.*

Prof.Afad Qurbanovun fəaliyyətinin ilk illərində Pedaqoji İnstitut tikinti meydançasını xatırladırdı. İnstitutun ayrı-ayrı struktur bölmələrinin, fakültələrin və kafedraların işi yenidən quruldu. Fakültələr və kafedralar arasında yaxşı mənada rəqabət yaradıldı, ilin fakültəsi, ilin kafedrası seçildi. İnstitutun yeni loqosu hazırlandı (Həmin loqo 2016-cı ilə qədər istifadə olundu). İnstitutun həyətində tikintisi yarımçıq qalan 14 mərtəbəli binanın tikintisi başa çatdırıldı. Binanın açılışı çox böyük təntənə ilə baş tutdu.

Həmin tədbirlə bağlı "Gənc müəllim" qəzetinin 11 yanvar 1985-ci il sayında oxuyuruq: *"Yeni il ərəfəsində - dekabrın 29-da qocaman institutumuz bayram libasına bürünmüşdür. Son illər bu tədris ocağının həyatında əlamətdar hadisələr tez-tez olur. Bu gün isə heç birinə bənzəmirdi. Səhər tezdən şən musiqi sədaları ətrafa yayıldı. Həyətə toplaşmış müəllim və tələbələrin baxışlarından sonsuz sevinc, fərəh duyulurdu. Hamı institutun yeni tədris korpusunun istifadəyə verilməsini intizarla gözləyirdi. Bu münasibətlə keçirilən mitinqdə Azərbaycan SSR ali və orta ixtisas təhsili naziri Q.H.Əliyev, Azərbaycan SSR Nazirlər Soveti elm, texnika və tədris müəssisələrinin müdir müavini Q.Əmirov, 26 Bakı komissarları Rayon Partiya Komitəsinin birinci katibi X.J.Xəlilov, institutun rektoru, Azərbaycan SSR Elmlər Akademiyasının müxbir üzvü, Əməkdar elm xadimi, professor A.M.Qurbanov, institutun*



*2017-ci ildə Heydər Əliyev Fondu tərəfindən binanın üzlük hissəsi yenilənmişdir*



Dağıstan küçəsi, 31-də yerləşən tədris binası



Ə.Qasımzadə küçəsi, 58-də yerləşən tədris binası





İbtidai hərbi və fiziki təlim fakültəsində tədbir

*professor-müəllim heyəti, tələbələr və qonaqlar iştirak edirdilər. Təntənəli mitinqi Azərbaycan SSR ali və orta ixtisas təhsili naziri Q.H.Əliyev açdı. İnstitutun rektoru Azərbaycan SSR Elmlər Akademiyasının müxbir üzvü, Əməkdar elm xadimi, professor A.M.Qurbanov, professor H.Qədirov, professor Ə.Əlizadə, Tarix fakültəsinin IV kurs tələbəsi, Lenin təqaüdçüsü C.Qocayeva və b. çıxış etdilər. Tədbirdə Riyaziyyat fakültəsinin dekanı dos. F.Abdullayev yeni korpusun istifadəyə verilməsi münasibəti ilə yazdığı şeiri oxudu".*[186]

Əsas bina ilə bərabər Bakının müxtəlif yerlərində yerləşən *Coğrafiya* (Dağıstan küçəsi, 31), Filologiya (Ketsxoveli küçəsi), Pedaqoji və Mühəndis-pedaqoji fakültələrinin (Ənvər Qasımzadə küçəsi, 58) yerləşdiyi binalarda təmir-tikinti işlərinə başlanıldı. Həm binalar, həm də müəllim və tələbələr üçün nəzərdə tutulan yeməkxanalar əsaslı təmir edildi. Yeməkxanalar müasir restoranları xatırladırdı: divarın yarısı və sütunlar mebel taxta ilə üzlənmiş, qapı və pəncərələr dəyişdirilmiş, tavan incə zövqlə bəzədilmiş, yeni stol və stullar alınmışdı. Tavandan asılan büllur çilçıraqlarla bərabər divar boyu və sütunlarda əski lampanı xatırladan müasir lampalar quraşdırılmışdı.

SSRİ Nazirlər Sovetinin 25 avqust 1978-ci il tarixli qərarına uyğun olaraq orta ümumtəhsil məktəblərində "İbtidai hərbi hazırlıq" fənninin tədris səviyyəsinin yüksəltmək məqsədilə institutda təşkil edilən *İbtidai hərbi və fiziki təlim* fakültəsində quruculuq işləri başa çatdırıldı. Fakültənin dekanı dos.Rafiq Baxşəliyevin (1979-1989; 1994-2002) səyi nəticəsində müvafiq kafedralar peşəkar

[186] *Bax: "Gənc müəllim" qəzetinin 11 yanvar 1985-ci il*

hərbiçilər, elmi dərəcəlilər və mütəxəssislərlə komplektləşdirildi. Fakültə üçün ayrılan bina əsaslı şəkildə təmir edildi, tədrisin keyfiyyətli təşkili üçün silah-sursatlar, hərbi maşınlar alındı, maşınlar üçün bokslar tikildi. Bu fakültə Qafqazda birinci, SSRİ-də isə dördüncü idi.

1980/81-ci tədris ilində Pedaqoji fakültənin (indiki İbtidai təhsil) nəzdində musiqi və nəğmə ixtisası üzrə ümumtəhsil məktəbləri üçün ali təhsilli müəllim kadrları hazırlığına başlanıldı. Həmin dövrdə Pedaqoji İnstitutda əyani, qiyabi və axşam şöbələrində 9867 nəfər tələbə təhsil alırdı. Əyani və qiyabi şöbələri olan 10 fakültə, 67 laboratoriya, 8 tədris emalatxanası, elmi kitabxana, nəşriyyat, Zoologiya muzeyi fəaliyyət göstərirdi.

Bunların içərisində daha çox fərqlənən və fəaliyyəti ilə diqqəti cəlb edənləri Pedaqogika kafedrasının nəzdində yaradılan *"Ali məktəb pedaqogikası"* (rəhbəri prof.Hüseyn Əhmədov) və *"Şagirdlərin peşəyönümü"* (rəhbər prof.Hüseyn Əhmədov), Fizikanın tədrisi metodikası kafedrasının nəzdindəki *"Texniki vasitələrin proqramlaşdırılmış tədrisi"* (rəhbəri prof.Sədi İmanov), Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının nəzdindəki *"Təlimin texniki vasitələri"* (elmi rəhbəri dos.Həsən Balıyev) laboratoriyaları, Müasir Azərbaycan dili və Xarici dil kafedraları nəzdindəki *linqafon kabinetləri* (rəhbərləri prof.Afad Qurbanov, prof.Həsən Mirzəyev, prof. Balaxan Hüseynov) idi.

1981/82-ci tədris ilində institutun I kursuna 2205 tələbə qəbul olunmuşdu. 5 il əvvəl 15 ixtisas üzrə müəllim hazırlanırdısa, 1980/81-ci tədris ilində ixtisasların sayı 20-yə çatdırılmışdı. 500 tələbə (kimya-biologiya, biologiya-kimya, fizika-riyaziyyat, riyaziyyat-fizika) qoşa ixtisas üzrə ali təhsil alırdı. Riyaziyyat fakültəsinin əyani və qiyabi şöbələrində oxuyan 1800 tələbənin təhsil-tərbiyəsi ilə 85 nəfər professor-müəllim (5 elmlər doktoru, professor, 35 elmlər namizədi, dosent, 24 müəllim, 21 müəllim)[187], 13 nəfər baş laborant, 8 nəfər laborant, 3 nəfər riyazi proqramist, 1 mühəndis, 1 baş mühəndis, 2 laboratoriya müdiri, 2 maşın zalı rəisi[188] məşğul olurdu.

1970-1981-ci illərdə Pedaqoji İnstitutda tələbə kontingentinin inkişaf dinamikası (qəbul və buraxılış) aşağıdakı kimi olmuşdur:

| Tədris illəri | Əyani şöbə | | Qiyabi şöbə | | Axşam şöbəsi | | İnstitut üzrə | |
|---|---|---|---|---|---|---|---|---|
| | Qəbul | Məzun | Qəbul | Məzun | Qəbul | Məzun | Qəbul | Məzun |
| 1970/71 | 2258 | 1113 | 238 | 291 | 50 | 136 | 2546 | 1540 |
| 1971/72 | 2260 | 1318 | 794 | 833 | 175 | 254 | 3229 | 2405 |
| 1972/73 | 1878 | 1560 | 742 | 919 | 160 | 292 | 2780 | 2771 |
| 1973/74 | 1822 | 1627 | 575 | 720 | 175 | 60 | 2572 | 2407 |
| 1974/75 | 1682 | 1648 | 606 | 617 | 152 | 72 | 2440 | 2337 |
| 1975/76 | 1625 | 1512 | 625 | 553 | 100 | 132 | 2350 | 2197 |
| 1976/77 | 1675 | 1598 | 770 | 622 | - | 158 | 2445 | 2378 |
| 1977/78 | 1508 | 1404 | 818 | 717 | - | 137 | 2326 | 2258 |

[187] ***Abdullayev F.*** *Riyaziyyat."Gənc müəllim" qəzeti, 17 oktyabr 1981-ci il*

[188] *Yenə orada*

| | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| 1978/79 | 1483 | 1668 | 850 | 539 | - | 150 | 2333 | 2357 |
| 1979/80 | 1429 | 1480 | 684 | 580 | - | 156 | 2113 | 2216 |
| 1980/81 | 1428 | 1398 | 725 | 696 | - | - | 2153 | 1994 |

Həmin illərdə institutun ümumi tələbə kontingentinin sayında artmalar və azalmalar baş vermişdir.

1970-1981-ci illərdə Pedaqoji İnstitutda tələbə kontingentinin inkişaf dinamikası (ümumi kontingent) aşağıdakı kimi olmuşdur:

| Tədris illəri | Əyani şöbə | Qiyabi şöbə | Axşam şöbəsi | İnstitut üzrə |
|---|---|---|---|---|
| 1970/71 | 7350 | 1445 | 191 | 8986 |
| 1971/72 | 8203 | 4671 | 873 | 13746 |
| 1972/73 | 7862 | 4371 | 671 | 12904 |
| 1973/74 | 7837 | 3430 | 746 | 12013 |
| 1974/75 | 7189 | 3351 | 779 | 11359 |
| 1975/76 | 6959 | 3342 | 722 | 11014 |
| 1976/77 | 6775 | 3480 | 565 | 4722 |
| 1977/78 | 6551 | 3555 | 326 | 10432 |
| 1978/79 | 6516 | 3804 | 252 | 10572 |
| 1979/80 | 6106 | 3840 | 191 | 10137 |
| 1980/81 | 5899 | 3176 | - | 9075 |

Bu illər institutun həyatında əlamətdar hadisələrlə yadda qaldı. Həmin illərdə əyani, qiyabi və axşam şöbələrini 24760 nəfər yüksəkixtisaslı müəllim bitirdi. İnstitutda 18 yeni kafedra, üç yeni fakültə (texniki, bədii qrafika, bədən tərbiyəsi) açıldı, musiqi və nəğmə şöbəsi, hazırlıq şöbəsi, 2 və 8 aylıq hazırlıq kursları, ixtisasartırma fakültəsi, elm-tədqiqat bölməsi yaradıldı, institutun tədris sahəsi 1,5 dəfə artırıldı.

1981 -ci ildə institutda 53 kafedra, 10 fakültə, 1500 tələbənin istifadə etdiyi yataqxana, 1000-ə yaxın tələbəni birləşdirən müxtəlif adda 70 dərnək fəaliyyət göstərirdi.[189]

1981/82-ci tədris ilində Fiziki tərbiyə və Bədii qrafika fakültələri yaradıldı. 1981-ci ildə Təsviri incəsənət kafedrasına Xalq rəssamı, professor *İbrahim İsmayıl oğlu Zeynalov* müdir təyin edildi. Bu ixtisasa olan tələbatı və orada tədris olunan fənlərin xüsusiyyətlərini nəzərə alaraq yüksəkixtisaslı müəllim kadrlarının hazırlanması işini daha da inkişaf etdirmək məqsədi ilə həmin ildə İ.Zeynalovun təşəbbüsü ilə müstəqil Bədii qrafika fakültəsi yaradıldı. İ.Zeynalov fakültənin formalaşması və tədrisin keyfiyyətinin yüksəldilməsi sahəsində çox böyük işlər gördü. İbrahim Zeynalovun təşəbbüsü ilə R.Rəsulzadə, N.Hacıyev, H.Abdullayev, H.Qəh-

[189] *V.İ.Lenin adına Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutu. Foto-albom. Bakı, 1981*



*Prof. S.Quliyev tələbələri ilə*

rəmanov, A.Kazımov kafedrada müəllim kimi fəaliyyət göstərməyə başladılar.

Bədii qrafika fakültəsinə 1981-1988-ci illərdə dos.*Tofiq İsa oğlu Məmmədov,* 1989-1998-ci illərdə *dos.Məhəmməd Nəcməddin oğlu Yüzbaşıyev* rəhbərlik etmişdir.

Həmin dövrdə fakültədə üç kafedra fəaliyyət göstərirdi:

1)Rəsm, heykəltəraşlıq və boyakarlıq kafedrası (müdir prof.İbrahim Zeynalov),

2)Təsviri incəsənət və onun tədrisi metodikası kafedrası (müdir dos.Hüseyn Hüseynov),

3)Rəsmxətt və onun tədrisi metodikası kafedrası (müdir Nəriman Məhərrəmov).

1980/81-ci tədris ilində institutda musiqi və nəğmə ixtisası üzrə müəllim kadrları hazırlığına başlanıldı[190]. Bu məqsədlə musiqi avadanlıqları ilə təchiz edilmiş 10 laboratoriya yaradıldı. Təlim prosesində texniki vasitələrdən istifadəni genişləndirmək məqsədilə diafilm, diapozitiv, kinofilmləri göstərmək məqsədilə avadanlıqlarla təchiz edilmiş 14 ixtisaslaşdırılmış kabinet təşkil olundu, yaradılmış filmotekada 15,5 min tədris diafilmi və kinofraqmentlər qorunub saxlanırdı. Həmin resurslardan institutun tələbələri Təlimdə Texniki Vasitələr (TTV) dərslərində istifadə edirdilər.

1981-ci ildə İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsinin məktəbəqədər tərbiyə şöbəsinin əsasında Məktəbəqədər tərbiyə fakültəsi təşkil edildi.

## Ulu öndər Heydər Əliyev Azərbaycan Dövlət Pedaqoji İnstitutunda









[190] ***Курбанов А.М.,Садыхов Ш.А.,Салахов М.Н.*** *Первый педагогический институт Азербайджана.Баку,1981,с.91*

Tarix, Filologiya, Riyaziyyat, Fizika, Biologiya, İbtidai təhsilin pedaqogikası və metodikası, Məktəbəqədər tərbiyə fakültələrinin qiyabi şöbələrində 3997 nəfər təhsil alırdı. Həmin fakültələrin axşam şöbəsini on il müddətində 1547 nəfər bitirmişdi.

1981-ci ilin avqust ayında Pedaqoji İnstitutda quruculuq işləri və tələbə qəbulu prosesi ilə yaxından tanış olmaq məqsədi ilə Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev institutda oldu.

3 iyun 1981-ci ildə respublikanın ali məktəblərinin elmi həyatında mühüm hadisə baş verdi. Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyətinin qərarı ilə respublikanın ali məktəb müəllimlərinin 17 nəfərinə *Əməkdar elm* xadimi, 4 nəfərinə *Əməkdar elm və texnika xadimi*, 27 nəfərinə *Əməkdar ali məktəb işçisi*, 2 nəfərinə *Əməkdar incəsənət xadimi* fəxri adları verildi[191].

60 illik yubileyinə hazırlaşan Pedaqoji İnstitutun 8 nəfər professor-müəllimi fəxri ada layiq görülənlərin sırasında idi[192].

***"Əməkdar elm xadimi" fəxri adı ilə***

**1.Cavadov Mayis Həbib oğlu**- V.İ.Lenin adına APİ-nin kafedra müdiri, fizika-riyaziyyat elmləri doktoru, professor

**2.Kərimov Nurəddin** – V.İ.Lenin adına APİ-nin professoru, coğrafiya elmləri doktoru

**3.Qurbanov Afad Məmməd oğlu**- V.İ.Lenin adına APİ-nin kafedra müdiri, filologiya elmləri doktoru, professor

**4.Paşayev Nəzər Abdulla oğlu-** V.İ.Lenin adına APİ-nin kafedra müdiri, filologiya elmləri doktoru, professor

***"Əməkdar ali məktəb işçisi" fəxri adı***

**1.Abbasova Nəmidə Kabı qızı -** V.İ.Lenin adına APİ-nin professoru, filologiya elmləri doktoru,

**2.Əliyev Sadıq Yusif oğlu -** V.İ.Lenin adına APİ-nin kafedra müdiri, biologiya elmləri doktoru, professor

**3.Popov Vladislav Viktoroviç** - V.İ.Lenin adına APİ-nin dosenti, pedaqoji elmlər namizədi

**4.Tarıverdiyeva Kövsər Məmməd qızı** - V.İ.Lenin adına APİ-nin dosenti, filologiya elmləri namizədi

29 aprel 1981-ci ildə Azərbaycan SSR Ali və orta ixtisas təhsili naziri Qurban Əliyev 11-176/ok saylı məktubla Qırmızı Əmək Bayrağı Ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 60 illik yubileyinin keçirilməsi ilə bağlı Azərbaycan KP MK-ya müraciət etdi[193].


*M.Cavadov*


*N.Kərimov*


*A.Qurbanov*


*N.Paşayev*


*N.Abbasova*


*S.Əliyev*


*V.V.Popov*


*K.Taıverdiyeva*

Məktubda 60 il fəaliyyət göstərən Azərbaycan Dövlət Pedaqoji İnstitutunun pedaqoji kadr hazırlığındakı xidmətləri önə çəkilir, 1971-1981-ci illərdəki fəaliyyəti müqayisəli şəkildə təhlil edilərək yüksək dəyərləndirilirdi: "*1970-ci ildə 12 ixtisas üzrə müəllim kadrı hazırlayan Pedaqoji İnstitutda hazırda (1981-ci il nəzərdə tutulur – R.F.) 20 ixtisas üzrə kadr hazırlanır. Pedaqoji kadrların 50% -dən çoxu qoşa ixtisasda təhsil alırlar. Son on ildə 25 min yüksəkixtisaslı müəllim kadrı hazırlanıb, 15 yeni kafedra yaradılıb. Bununla da institutdakı kafedraların sayı 52-yə*

---

*[191] Bax: Azərbaycan Respublikasının Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi F.1,siy.68, iş.84,v.167-171*
*[192] Bax: "Gənc müəllim" qəzeti, 4 iyun 1981*
*[193] Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi.F.1,sax.vah. 68, iş 77, v.69-70*

*çatdırılıb. Yeni fakültələr, 40 laboratoriya, tədris kabineti və emalatxana, elektron hesablama maşınları ilə təchiz edilən hesablama mərkəzi yaradılıb.Təlimdə texniki vasitələr laboratoriyası və elmi-tədqiqat şöbəsi yaradılıb. Hər il təsərrüfat hesablı işlərin həcmi 300 min rubl yüksəlir, 9 mərtəbəli yataqxananın tikintisi başa çatdırılıb, 14 mərtəbəli tədris korpusunda tikinti işləri davam etdirilir. Son illərdə 17 elmlər doktoru, 72 elmlər namizədi yetişdirilib. Hazırda institutda müəllim kadrları hazırlığı ilə məşğul olan 1503 nəfərdən 672 nəfəri professor-müəllimdir ki, onlardan da 40 nəfəri elmlər doktoru, professor, 342 nəfəri elmlər namizədi, dosentdir."*[194]

1981-ci ilin oktyabrında institutun 60 illiyinin tamam olmasını diqqətə çatdıran Azərbaycan SSR Ali və orta ixtisas təhsili naziri Qurban Əliyev məktubda bununla bağlı təntənəli yığıncağın keçirilməsini və həmin tədbirə Gürcüstan, Türkmənistan, Dağıstan respublikalarından, Moskva və Leninqrad şəhərlərindən nümayəndələrin dəvət edilməsini, "Azərbaycan Dövlət Pedaqoji İnstitutu - 60" kitabının nəşr edilməsini, mətbuatda yubiley materiallarının çapını, institutun fəaliyyəti ilə bağlı televiziya verilişinin hazırlanmasını, 10-12 nəfərin fəxri adlarla, 15-20 nəfərin Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif edilməsini, institut əməkdaşlarının yaşayış şəraitinin yaxşılaşdırılması üçün 30 mənzilin ayrılmasını, instituta avtobus, "Raf" markalı mikroavtobus və yük maşınının ayrılmasını xahiş edir.

Azərbaycan KP MK-da bu məsələ müzakirə olunur və Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 60 illik yubileyinin təntənəli şəkildə keçirilməsi, müttəfiq respublikalardan və ayrı-ayrı şəhərdən qonaqların dəvət edilməsi, 8 professor-müəllimin fəxri adla, 12 nəfərin Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif edilməsi ilə bağlı Azərbaycan SSR Ali və orta ixtisas təhsili nazirinin təqdimat verməsinə razılıq verilir.

23 dekabr 1981-ci ildə Azərbaycan KP MK Bürosunda 60 illik yubileyi ilə əlaqədar olaraq Azərbaycan Dövlət Pedaqoji İnstitutunun həm özünün, həm də əməkdaşlarının Fəxri fərmanla və fəxri adla təltif edilməsi ilə bağlı Ali sovetin layihəsi bəyənilir.[195]

1981-ci ildə dekabr ayının 23-də Dövlət Təhlükəsizliyi Xidmətinin Mədəniyyət Mərkəzində respublikanın hökumət və dövlət nümayəndələrinin, pedaqoji ictimaiyyətin, institutun professor-müəllim heyətinin və görkəmli məzunlarının iştirakı ilə institutun 60 illik yubileyi keçirildi. Yubiley tədbirini Azərbaycan SSR Ali və orta ixtisas təhsili naziri Qurban Əliyev açdı. Sov.İKP MK-nın Siyasi Bürosu üzvlüyünə namizəd, Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev V.İ.Lenin adına ADPİ-nin 60 illik yubileyi münasibəti ilə kollektivi təbrik edərək geniş nitq söylədi: *"60 il ərzində institutunuz şanlı yol keçmiş, Azərbaycanın nailiyyətlər qazanmasında böyük rol oynamışdır. Həmin dövrdə 65 min nəfərdən artıq ali təhsilli mütəxəssis hazırlanmışdır. İnstitutun yetişdirmələri indi respublika həyatının bütün sahələrində fəal işləyirlər. İnstitut tərəfindən hazırlanmış və indi xalq maarifi sahəsində çalışan mütəxəssislər 60 il ərzində respublikanın gənc nəslinin təlim və tərbiyəsi işində, demək olar ki, əsas aparıcıdırlar. Eyni zamanda institutun yetirmələri elmi tədqiqat institutlarında, müxtəlif müəssisələrdə, mədəniyyət sahəsində və başqa sahələrdə müvəffəqiyyətlə fəaliyyət göstərirlər. Demək olar, respublikada elə bir guşə yoxdur ki, institutun diplomunu almış mütəxəssislər orada işləməsinlər. Sizin yetişdirmələriniz hər bir şəhərdə, hər bir kənddə yaşayır və çalışırlar, hər bir məktəbdə işləyirlər...*

*Ali məktəbinizin yubileyinin qeyd edilməsi respublikada ümumxalq bayramı olmuşdur. Bu yubileyi qeyd edərkən hər bir kəs öz şəxsi həyatında institutun rolunu böyük iftixar hissi ilə xatırlayır və qeyd edir. İnstitutda professor və müəllimlərin böyük kollektivi çalışır və 60 il ərzində bu kollektivdə bir neçə nəsil dəyişmişdir. İnstitutun bütün 60 illik yolu, onun indiki müvəffəqiyyətləri respublikanın partiya təşkilatlarını və bütün zəhmətkeşlərini ürəkdən sevindirir. Sizin nailiyyətləriniz göz qabağındadır və biz bunlar üçün sizinlə birlikdə fəxr edirik.*

---

[194] *Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Siyasi Sənədlər Arxivi. F.1,sax.vah. 68, iş 77, V.74-76*

[195] *Наука и образование в Азербайджане постановления бюро и секретариата ЦК КП Азербайджана (июль 1969 - ноябрь 1982 гг.). Том II (январ 1977 - ноябр 1982 гг.) (Ответственный составитель:* ***Э.С.Алекперова****).Баку,2019, с.348-350*

*50 illiyi ilə əlaqədar olaraq və müəllim kadrları hazırlanmasında böyük xidmətlərinə görə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu Qırmızı Əmək Bayrağı ordeni ilə təltif olunmuşdur. O vaxtdan 10 il keçmişdir. Bu müddətdə sizin ali məktəbiniz yeni müvəffəqiyyətlər qazanmış və deyə bilərəm ki, 70-ci illərdə onun fəaliyyəti daha da güclənmiş, daha səmərəli və daha faydalı olmuşdur. Biz respublikanın həyatında son 10 ildə baş vermiş müsbət dəyişikliklərdə institutun rolunu böyük razılıq hissi ilə qeyd edirik. İndi institutunuz Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif olunmuşdur. Mən səmimi qəlbdən sizi bu mükafat münasibəti ilə təbrik edir və onu sizə təqdim etmək istəyirəm".*

Ulu öndər Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fərmanının mətnini oxudu.




**V.İ.Lenin adına Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif edilməsi haqqında**

Yüksəkixtisaslı pedaqoji və elmi kadrlar hazırlanmasında, xalq maarifinin inkişafında böyük xidmətlərinə görə və yaradılmasının 60 illiyi ilə əlaqədar olaraq V.İ.Lenin adına Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutu Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif edilsin.

Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin sədri **Q.Xəlilov**
Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin katibi **P.Qazıyeva**
*Bakı şəhəri, 21 dekabr 1981-ci il*

Ulu öndər sözünə davam edərək dedi: ***"Müəllimlik işi həm şərəfli, həm də çətin işdir. Ali məktəb müəllimi olmaq, müəllimlər hazırlamaq, yəni müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda ikiqat məsuliyyətlidir.*** *Biz yaxşı bilirik ki, 65 min nəfərdən artıq müəllim hazırlamaq üçün professor və müəllimlərin bütün nəsilləri nə qədər zəhmət çəkmişlər*. Ulu öndər çıxışının sonunda dedi: *"Şadam ki, Qırmızı Əmək Bayrağı ordeninin də, respublikanın yeni yüksək mükafatını da sizə təqdim etmək mənə nəsib olmuşdur. Bu mükafatlar sizin böyük zəhmətinizə verilən yüksək qiymətdir. Bir daha sizi ürəkdən təbrik edirəm, institutun bütün professorlarına, müəllimlərinə, tələbələrinə, bütün kollektivinə cansağlığı, səadət, uzun ömür və böyük əmək müvəffəqiyyətləri arzulayıram*"[196]197.

Pedaqoji İnstitutun kollektivi adından rektor, prof.Afad Qurbanov və Coğrafiya fakültəsinin IV kurs tələbəsi, Lenin təqaüdçüsü Ruhəngiz Məmmədova çıxış edərək ali məktəbin fəaliyyətinə yüksək qiymət verdiklərinə görə, partiya və hökumət orqanlarına öz minnətdarlıqlarını ifadə etdilər.

Qonaqlardan- S.M.Kirov adına ADU-nun rektoru, prof.Faiq Bağırzadə, Azərbaycan SSR EA-nın prezidenti, SSRİ EA-nın müxbir üzvü Həsən Abdullayev, Tbilisi Pedaqoji İnstitutunun prorektoru, prof.Q.Ş.Barbakadze, X.Abovyan adına İrəvan Pedaqoji İnstitutunun rektoru, prof. L.A.Valesyan, Frunze Pedaqoji İnstitutunun rektoru, prof.Ç.Tatıbekova, Yevlax rayonu, Xaldan kənd məktəbinin direktoru, SSRİ Xalq müəllimi Zahid Şöyübov, institutun bolqar məzunu Əhməd Naimov yubiley münasibəti ilə institut əməkdaşlarını təbrik etdilər.

[196] *Pedaqoji kadr hazırlayan məktəbin 60 illiyi (V.İ.Lenin adına APİ-nin yubileyi şərəfinə təntənəli yığıncaq)."Azərbaycan müəllimi" qəzeti, 23 dekabr 1981*

V.İ.Lenin adına Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutunun işçilərinə Azərbaycan SSR fəxri adların verilməsi haqqında Ali Soveti Rəyasət Heyətinin Fərmanı ilə elmin inkişafında, yüksəkixtisaslı elmi-pedaqoji kadrların hazırlanmasındakı xidmətlərinə və institutun yaradılmasının 60 illiyi ilə əlaqədar olaraq adları aşağıda göstərilənlər fəxri adlarla təltif edildilər:

**Ulu öndər Heydər Əliyev ADPİ-nin 60 illik yubiley tədbirində**









***"Əməkdar elm xadimi" fəxri adı***

**1.Səfərov Rza İbrahim oğlu** – biologiya elmləri doktoru, professor, kafedra müdiri

***"Əməkdar ali məktəb işçisi" fəxri adı***

**2.Əliyeva Ofeliya Hüseynqulu qızı** – baş müəllim

**3.Əhmədov Hüseyn Mustafa oğlu** – pedaqoji elmlər doktoru, professor, kafedra müdiri

**4.Babayev İmran Əşrəf oğlu** – dosent

**5.Qəhrəmanov Kamal Mahmud oğlu** – filologiya elmləri namizədi, baş müəllim

**6.Hüseynov Novruz İmanqulu oğlu** – tarix elmləri doktoru, professor, kafedra müdiri

**7.İbrahimov Əsəd Yusif oğluna** –dosent

Uzun illər müvəffəqiyyətli işlərinə, pedaqoji kadrların hazırlanmasındakı xidmətlərinə görə institutun aşağıda adları göstərilən 11 nəfər əməkdaşı *Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı* ilə təltif edildi.

1.**Ağayev Qəzənfər Rəhim oğlu** –tarix elmləri namizədi, dosent

2.**Əbdülrəhimova Reyhan Əsədulla qızı** – kimya elmləri doktoru, professor

3.**Əlizadə Əbdül Əli oğlu** – psixologiya elmləri doktoru, professor, kafedra müdiri

4.**Gülxanım Məsim qızı** –xidmətçi

5.**Qafarov Cəlal İsgəndər oğlu** – baş müəllim

6.**Paşayev Novruz Əliheydər oğlu**- pedaqoji elmlər namizədi, dosent, kafedra müdiri

7.**Sadıqov Nüsrət Abdulla oğlu** – professor, kafedra müdiri

8.**Sarkisyan Sergey Aleksandroviç** – dosent

9.**Fərhadov Fərhad Qulam oğlu** – filologiya elmləri doktoru, professor, kafedra müdiri

10.**Xudiyev Nizami Manaf oğlu** – filologiya elmləri namizədi, dosent

11. **Şahmurov Əbdürrəhman Şahmur oğlu** – tarix elmləri doktoru, professor.

Pedaqoji kadrların hazırlanmasındakı xidmətlərinə görə təltif edilən alimlərin sırasına xidmətçi Gülxanım Məsim qızının necə düşməsi mənim üçün çox maraqlı idi. Doğrudanmı institutda müəllim hazırlığında xidməti olan professor və ya dosent yox idi? Araşdırma zamanı məlum oldu ki, institutun, Ali və Orta İxtisas Təhsili Nazirliyinin, hətta Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fərmanının layihəsində Gülxanım Məsim qızının adı yoxdur, onun yerinə Rus dili kafedrasının dosenti, pedaqoji elmlər namizədi Anna


*R.Səfərov*


*H.Əhmədov*


*İ.Babayev*


*K.Qəhramanov*


*N.Hüseynov*


*Ə.İbrahimov*


*O.Əliyeva*

Klimovanın adı verilib. Həmin layihə 23 dekabr 1981-ci ildə Azərbaycan KP MK-nın Büro iclasında[198] təsdiq olunub. Ola bilər ki, Anna Klimovanın institutun 50 illiyində Fəxr Fərmanla təltif edilməsi səbəbindən onun adı siyahıdan çıxarılıb.

İnstitutun 50 illiyində olduğu kimi, 60 illiyində də bu müqəddəs elm və təhsil məbədi ilə bağlı xeyli elmi-pedaqoji məqalələr və xatirə yazıları nəşr edildi. Yubiley münasibəti ilə institutun məzunu AMEA-nın müxbir üzvü Əziz Mirəhmədov yazırdı: *"Gözümdə dünyanın ən müqəddəs yerlərindən biri olan sevimli məktəbim- APİ-nin altmış illiyini alovlu övlad məhəbbəti ilə təbrik eləyir və onun əzəməti qarşısında baş əyirəm. Ömrümün onlarca mənalı günləri, həftələri, ayları üçün ona minnətdaram. Mənə sovet elminin görkəmli xadimləri kimi tanınan unudulmaz, qay-*


*Pedaqoji İnstitutun əməkdaşları (1973)*

[198] *Наука и образование в Азербайджане постановления бюро и секретариата ЦК КП Азербайджана (июль 1969 - ноябрь 1982 гг.). Том II (январ 1977 - ноябр 1982 гг.) (Ответственный составитель:* ***Э.С.Алекперова****). Баку,2019,с.349*

*ğıkeş, müdrik müəllimlər, bir-birindən ağıllı, çalışqan, mehriban tələbə dostlar verən odur. Bir çox həmkarlarım kimi, məni də elmin işıqlı yollarına o gətirmişdir. Var olsun illər ötdükcə gəncliyin yeni-yeni nəsillərini hərarətli qoynuna alan doğma, əziz təhsil ocağımız! Var olsun onun on minlərcə ürəklərə və beyinlərə nüfuz eləyən elm-mərifət işığı.”*[199]

Pedaqoji İnstitutun 60 illiyinə Qəbələ rayon xalq maarif şöbəsinin metodisti, institutun filologiya fakültəsinin məzunu Zahid Əfəndizadənin "Müqəddəs ocaq" şeirini verməyi məqsədəuyğun hesab edirik.

Adın çəkiləndə titrəyir ürək,
Burda hər alimin sözü müqəddəs.
Sənin 60 yaşın olsun mübarək,
Ay adı müqəddəs, özü müqəddəs.

Nəsillər bəslədin 60 ildə sən,
Hər eldə, obada söz-söhbətin var,
Ürəklər isinib hərarətindən-
Gör neçə könüldə məhəbbətin var.

Yaşar ürəyimdə İsmayıl Şıxlı,
Sinəsi xəzinə, özüsə sadə.
Çöhrəsi işıqlı, qəlbi işıqlı,
Mizə Feyzullayla, Dəmirçizadə.

Müqəddəs ocaqsan, olmarıq dönük,
Səndən od alıbdır diləklərimiz,
Sənin işığınıq, zərrələrinik –
Vətən torpağına səpilmişik biz.[200]

1981-1990-cı illərdə Pedaqoji İnstitut ölkədə pedaqoji və elmi-pedaqoji kadr hazırlığında oynadığı mərkəz rolunu qoruyub saxlamış, tələbə və müəllim kollektivində ciddi dəyişiklik olmamışdır.1981-1991-ci illərdə institutun əyani və qiyabi şöbələrinə 16484 tələbə qəbul edilmiş, 17728 nəfər məzun olmuşdur.

| Tədris illəri | Qəbul | | Buraxılış | | Cəmi | |
|---|---|---|---|---|---|---|
| | Əyani | Qiyabi | Əyani | Qiyabi | Qəbul | Buraxılış |
| 1981/82 | 1480 | 725 | 1028 | 728 | 2205 | 1756 |
| 1982/83 | 1298 | 610 | 1126 | 814 | 1908 | 1940 |
| 1983/84 | 1110 | 503 | 1225 | 784 | 1613 | 2009 |
| 1984/85 | 1113 | 470 | 1051 | 664 | 1583 | 1715 |
| 1985/86 | 991 | 605 | 1403 | 797 | 1596 | 2200 |
| 1986/87 | 950 | 569 | 1238 | 999 | 1519 | 2237 |
| 1987/88 | 842 | 295 | 1230 | 914 | 1137 | 2144 |
| 1988/89 | 815 | 335 | 1192 | 972 | 1150 | 2164 |
| 1989/90 | 1403 | 710 | 1151 | 894 | 2113 | 2000 |
| 1990/91 | 1068 | 592 | 1052 | 675 | 1660 | 1727 |

Həmin illərdə Pedaqoji İnstitutun elmi-pedaqoji kadr potensialı aşağıdakı kimi olmuşdur.

[199] ***Mirəhmədov Ə.*** *Sevimli məktəbim."Gənc müəllim" qəzeti, 1981 (xüsusi buraxılış)*
[200] ***Əfəndizadə Z.*** *Müqəddəs ocaq. "Azərbaycan müəllimi" qəzeti, 23 dekabr 1981*

| İllər | Kafedraların sayı | Əməkdaşların sayı | O cümlədən | | Baş müəliim, müəllim |
|---|---|---|---|---|---|
| | | | Elm.doktoru, professor | Elm namizədi, dosent | |
| 1981 | 54 | 694 | 36 | 327 | 331 |
| 1982 | 55 | 684 | 38 | 270 | 376 |
| 1983 | 57 | 692 | 34 | 399 | 259 |
| 1984 | 58 | 709 | 29 | 269 | 411 |
| 1985 | 58 | 705 | 43 | 340 | 322 |
| 1986 | 58 | 686 | 35 | 333 | 318 |
| 1987 | 58 | 595 | 53 | 335 | 307 |
| 1988 | 58 | 690 | 47 | 344 | 299 |
| 1989 | 58 | 692 | 56 | 352 | 284 |
| 1990 | 58 | 709 | 45 | 346 | 318 |
| 1991 | 58 | 701 | 57 | 387 | 257 |


*Rektor prof.A.Qurbanov iclas aparаrkən*



*Rektor prof.A.Qurbanov iclas aparаrkən*

1981-ci ildə institutda 54 kafedra fəaliyyət göstərdiyi halda, 1991-ci ildə onların sayı 58 olmuşdur. Əməkdaşların ümumi sayı 694 nəfərdən 701 nəfərə, elmlər doktoru, professorların sayı 36 nəfərdən 57 nəfərə, elmlər namizədi, dosentlərin sayı 327 nəfərdən 387 nəfərə yüksəlmişdi. Kafedraların sayı 54-dən 58-ə, əməkdaşların sayı 694-dən 701-ə, elmlər doktoru, professorların sayı 36-dan 57-ə, elmlər namizədi, dosentlərin sayı isə 327-dən 387-ə yüksəlmişdi. 331 nəfər baş müəllim və müəllimdən 74 nəfəri ya dissertasiya müdafiə edərək elmi ad və dərəcə almış, ya da başqa işə keçməsi ilə əlaqədar olaraq institutdan ayrılmışdı.

Həmin illərdə Pedaqoji İnstitutun xeyli məzunu təhsildə və elmdə yüksək nailiyyətlər qazanmaqla Azərbaycan EA-nın həqiqi və müxbir üzvü seçildi, Əməkdar elm xadimi, Əməkdar müəllim, Sosialist Əməyi Qəhrəmanı, SSRİ Xalq müəllimi fəxri adlarına layiq görüldü.

Pedaqoji İnstitutun 1941-ci il məzunu Zərbəli Səmədov 1960-cı ildə Əməkdar müəllim, 1968-ci ildə Sosialist Əməyi Qəhrəmanı, 1954-cü il məzunu Zahid Şöyübov Əməkdar müəllim (1960), SSRİ Xalq müəllimi (1981), Cəbrayıl Zəkiyev Əməkdar müəllim (1973), SSRİ Xalq müəllimi (1980), 1954-cü il məzunu İsrafil Şükürov Naxçıvan SSR Əməkdar müəllimi (1980) və SSRİ Xalq müəllimi fəxri adlarına layiq görüldülər.


*Z.Səmədov Sosialist Əməyi Qəhrəmanı*


*Z.Şöyübov SSRİ Xalq müəllimi*


*C.Zəkiyev SSRİ Xalq müəllimi*


*İ.Şükürov SSRİ Xalq müəllimi*

## Ədəbi -bədii yaradıcılıq məktəbi

Pedaqoji İnstitutun nəzdində yaradıcılıq (ədəbiyyat, musiqi və s.) dərnəyinin yaradılması institutun ilk illərinə təsadüf edir. 20-ci illərdə yaranan bu dərnək sonrakı illərdə ətrafına onlarla istedadlı tələbə toplamış, onlar üçün ədəbi yaradıcılıq laboratoriyasına çevrilmişdir. Respublikamızın bir sıra görkəmli şair və yazıçıları ilk qələm təcrübələrini burada sınaqdan keçirmişlər. İstedadlı yazıçı və ustad müəllim A.Şaiq institutda ədəbiyyat dərnəyinin də ilk təşkilatçısı və rəhbəri olmuşdur. Sonra dərnəyə müxtəlif vaxtlarda Əbdürrəhim bəy Haqverdiyev, Bəkir Çobanzadə, Hacıbaba Nəzərli, Əli Nazim, S.Vurğun və başqaları rəhbərlik etmişlər. Dərnəyin fəal üzvlərindən olan Mikayıl Rzaquluzadə, Məmməd Kazım Ələkbərli, Mikayıl Müşfiq, Mirvarid Dilbazi, Həmid Araslı, Cəfər Xəndan, Şıxəli Qurbanov, İsmayıl Şıxlı, İmran Babayev Ə.Hüseynov, D.Məmmədov sonralar yazıçı və ədib kimi şöhrətlənib dərnəyə rəhbərlik etmişlər.

Vaxtı ilə dərnəyə rəhbərlik etmiş filologiya elmləri namizədi, dosent İmran Babayev o illəri xatırlayaraq yazırdı:"*İnstitutun ədəbiyyat dərnəyi demək olar ki, Azərbaycan Sovet Yazıçılar İttifaqının bir filialı idi. Yazıçılar İttiffaqı uzun illər bu dərnəyin işi ilə maraqlanmış, ona yaxından köməklik göstərmiş, təcrübəli şair və yazıçıları dərnəyin məşğələlərində iştirak etməyə cəlb etmişdir. 1921-1930-cu illərdə dərnəyin rəhbəri Yazıçılar İttifaqının zəmanəti ilə təyin edilirdi. Azərbaycan Sovet Yazıçılar İttifaqının 1925-ci il 26 fevral tarixli və 721 nömrəli əmri ilə şair Mikayıl Müşfiq institutun ədəbiyyat dərnəyinin rəhbəri təyin edilmişdir*"[201]

30-40-cı illərdə ədəbiyyatının qarşısında çox ciddi ideoloji və sənətkarlıq məsələləri dururdu. Bu illərdə görkəmli Azərbaycan şairi S.Vurğun ədəbiyyat dərnəyinin məşğələlərində fəal iştirak edib tələbə şairlərin yaradıcılığına istiqamət verirdi. İnstitutun ədəbiyyat dərnəyi ayrı-ayrı illərdə "Ədəbi yaradıcılıq dərnəyi", "Sabir dərnəyi", "Füzuli dərnəyi", "Gənc qələmlər" dərnəyi kimi müxtəlif adlar daşısa da, həmişə gənc tələbələrin yaradıcılıq

[201] **Babayev İ.** *Ədəbi yaradıcılıq məktəbi."Gənc müəllim" qəzeti, 16 mart 1973*

qabiliyyətini təkmilləşdirmək məqsədi güdmüşdür. Dərnəyin bu gözəl qayəsi və fəaliyyəti çox faydalı olmuşdur. Mikayıl Müşfiq, Ə.Abbasov, İlyas Əfəndiyev, Əbülhəsən Ələkbərzadə, Böyükağa Qasımzadə, Zeynal Xəlil, Hümmət Əlizadə, Ə.Əlibəyli, T.Əyyubov, Seyidzadə, Cəfər Xəndan, Əli Sultanlı, Əlyar Qarabağlı, Osman Sarıvəlli, Zeynal Cabbarzadə, T.Əyyubov, Əhməd Cəmil, Əbdülhəsən, Gəray Fəzli, S.Əsəd, Qabil, Məmməd Rahim, İsmayıl Şıxlı, Sabit Rəhman, Həmid Araslı, Mirzəağa Quluzadə, Məmmədcəfər Cəfərov, Ağaməmməd Abdullayev, Fərhad Fərhadov, İlyas Tapdıq, Məstan Əliyev və başqalarının tanınmış şair, yazıçı və alim kimi formalaşmasında dərnək mühüm rol oynamışdır.

Dərnəyin gözəl ənənələrindən biri hər tədris ilinin sonunda müəllim və tələbələrin geniş yığıncağında hesabat verməli idi. Bu həvəskarları rəğbətləndirmək və gənc müəllimlərin işinə istiqamət verib fəaliyyətlərini hesaba almaq baxımından çox əhəmiyyətli bir tədbir idi. Dərnək məşğələlərində bəyənilən əsərlər dərc edilmək üçün institutun qəzetinə və respublikanın dövrü qəzet və məcmuə redaksiyalarına təqdim edilirdi. Məsələn, ədəbiyyat dərnəyinin 1947/48-ci tədris ilində keçirilən yekun tədbirində yaradıcılıq hesabatı ilə Mədinə Gülgün, Şıxəli Qurbanov, Gəray Fəzli, Qabil, Əlfi Qasımov çıxış etmişdi. Sonrakı illərdə istedadlı yazar tələbələr "Gənc qələmlər"in və "Ədəbiyyat dərnəyi"nin ətrafına toplanmışdı. "Ədəbiyyat dərnəyi"nə istedadlı şair Zeynal Xəlil rəhbərlik edirdi. Tanınmış şairlər Məmməd Araz, Cabir Novruz, Söhrab Tahir dərnəyin işində fəal iştirak edir, tələbələri bədii yaradıcılığın sirrləri ilə tanış edirdilər. Dərnəyin üzvlərinin bəyənilən şeirləri müxtəlif qəzetlərdə nəşr edilirdi.

50 –80-ci illərdə dərnəyin fəal üzvləri olan Məmməd Aslan, Alqayıt Xəlilov, Ramin Əhmədov, Ziyəddin Məhərrəmov, Firuzə Məmmədli, Xeyrəddin Qoca, Şəmşad Rza, Zivər Ağayeva, Tofiq Bayram, Rafiq Yusifoğlu, Avdı Qoşqar, Böyükkişi Heydərli, Fəridə Ləman, Firuz Mustafa, Alxan Bayramoğlu, Bədirxan Əhmədov, Əli Rza Xələfli, Eldar Sadıq, Tofiq Xəlil, Rahid Ulusel, Oqtay Abbasov, Çingiz Əliyev (Dalğın) və b. sonralar tanınmış şair və ədib oldular. 70-80-ci ilərdə həmin dərnəyə Zahid Xəlil rəhbərlik edib.

1994-2007-ci illərdə "Gənc müəllim" qəzetinin redaksiyasında Təranə Rəhimlinin rəhbərliyi ilə "Addımlar" poeziya dərnəyi fəaliyyət göstərib. Səhər Əhməd, Rakif Vaqifoğlu, Niyaməddin Fəda, Ülvi Nikbin və başqaları dərnəyin fəal üzvləri olub. Dərnəkdə Akif Səməd, Oqtay Rza, Ağamalı Sadiq, Vaqif Nəsir, Mətləb Nağı və b. şairlər yaradıcı gənclərlə görüşüb poeziya söhbətləri aparıb, yaradıcılıq məsləhətləri veriblər.

1972-ci ildə institut və fakültələr üzrə 10-dan artıq özfəaliyyət dərnəyində 300 nəfərdən çox tələbə çalışırdı.[202] Filologiya fakültəsində 3 dərnək – "Gənc dilçi", "Gənc ədəbiyyatçı" və " Gənc qələm" fəaliyyət göstərirdi. Fakültənin nəzdində "Məşəl" dram dərnəyi və "Filoloq" ansamblı yaradılmışdı.[203]



*"Gənc qələmlər" ədəbi birliyi*

Bu illərdə tələbələrin bədii zövqünün formalaşdırılmasında institutda fəaliyyət göstərən "Tələbə teatrı"nın əhəmiyyətli rolu olub. İlk dəfə Azərbaycan ədəbiyyatı tarixi kafedrasının baş müəllimi Əkbər Tağıyevin rəhbərlik etdiyi "Tələbə teatrı"nda filoloq tələbələrin iştirakı ilə C.Cabbarlının "Aydın" və M.Təhmasibin "Bahar", Y.Əzimzadənin "Aprel səhəri" pyesləri tamaşaya qoyulmuşdur. Filologiya fakültəsinin birinci kurs tələbəsi Füzuli Əsgərli bu tələbə teatrı kollektivinə bədii rəhbər təyin ediləndən sonra, əvvəl "Gənclik" və sonra

[202] **Əliyev H.** *Yeni vəzifələr qarşısında. "Gənc müəllim" qəzeti, 20 aprel 1972*
[203] **Qurbanov A.** *Filologiya fakültəsi. "Gənc müəllim" qəzeti, 30 mart 1972*



*"Çal oyna" rəqs qrupu*

"Məşəl" adlanan tələbə teatrının üzvlərinin sayı bir qədər də artmışdır. Bu illərdə F.Əsgərlinin rejissorluğu və filoloq tələbələrin iştirakı ilə iri həcmli əsərlər – S.Rəhmanın "Ulduz", "Xoşbəxtlər", "Toy", A.Məmmədovun "Həmyerlilər", "Kişilər", "Yadındamı?", Ə.Əsgərovun "Qız atası", Q.Rəsulovun "Söz yarası", M.Hüseyn və İ.Qasımovun "İntizar", rus dramaturqu A.Safronovun "Kişilərə inanmayın", N.Hikmətin "Unudulan adam" əsərləri tamaşaya qoyulmuşdur. Bu illərdə "Məşəl" tələbə teatrı Dövlət televiziya və radiosunda ("Firuzə" tələbə teatrında) müntəzəm çıxış etmiş, "Teatr baharı" respublika müsabiqələrində fəal iştirak etmişdir. Bu teatrın nəzdində "Tənqid-təbliğ" teatrı da ciddi fəaliyyət göstərmiş, respublika müsabiqəsində üçüncü yerə layiq görülmüşdür. "Məşəl" tələbə teatrının uğurlu çıxışlarına görə kollektivin bədii rəhbəri Füzuli Əsgərli 1975-ci ildə Ümumittifaq Həmkarlar İttifaqı Mərkəzi Şurasının "Bədii özfəaliyyətdə uğurlarına görə" döş nişanı ilə təltif edilmişdir. Onu da qeyd etmək yerinə düşər ki, Respublikanın Xalq artisti Ramiz Novruz da bir



*"Qobustan təranələri" xalq çalğı alətləri ansamblı*

vaxtlar bu kollektivdə fəaliyyət göstərmiş, burada püxtələşdikdən sonra təhsilini davam etdirmək üçün Teatr İnstitutuna köçürülmüşdür. Prof.Kamil Bəşirov və dos.Qüdrət Umudov bu teatrın fəal üzvlərindən olmuşlar. Fakültədə ədəbi yaradıcılıq ənənələri bu gün də yaşayır və inkişaf etdirilir.

Hazırda Filologiya fakültəsinin nəzdində dos. Qüdrət Umudovun rəhbərlik etdiyi “Meh” ədəbi dərnəyi fəaliyyət göstərir. Dərnəyin üzvlərinin yaradıcılıq nümunələri respublikanın ayrı-ayrı mətbuat orqanlarında və almanaxlarda nəşr edilir.

70-ci illərdə Pedaqoji İnstitutun ***“Qobustan təranələri”*** adlı xalq çalğı alətləri ansamblı çox məşhur idi. Ansambl musiqişünas alim, dos.Sabir Quliyevin təşəbbüsü ilə yaranmışdı. Ansambl tələbə inşaat dəstəsində çalışanlara dəstək vermək məqsədilə 1977-ci ildə Kuybışev vilayətində, 1979-cu ildə Azərbaycanın Kürdəmir və Neftçala rayonlarında konsert proqramı ilə çıxış etmişdi. İnstitutun “Çal oyna” rəqs qrupu, “Oxu tar” xalq çalğı alətləri ansamblı respublikanın bədii özfəaliyyət kollektivləri arasında II yer tutduğuna görə Fəxri fərman və diplomla təltif edilmişdi. 1977-ci ildə “Çal oyna”ansamblı institut xoru ilə birlikdə həvəskarların I Ümumittifaq bədii yaradıcılıq festivalının laureatı olmuşdu. 1981-ci ildə rəqs qrupu uğurlu çıxışına görə putyovka ilə Bolqarıstan Xalq Respublikasına göndərilmişdi. Bədii özfəaliyyət kollektivinin 20 nəfər üzvü XXII yay Olimpiya oyunlarının Moskvada keçirilən açılış mərasimində iştirak etmək hüququ qazanmışdı.

80-ci illərdə Pedaqoji İnstitutda qızlardan ibarət “Uzundərə” rəqs qrupu fəaliyyət göstərirdi. Qrupun bədii rəhbəri Azərbaycan SSR Əməkdar mədəniyyət işçisi Əlikram Aslanov idi. Qrupun 35 nəfər üzvü var idi. Ansambl zəngin repertuarlarla (“Qaval rəqsi”, “Lirik rəqs”, “Çal, oyna”, “Qarabağ maralı”, ”Qazağı”, “Yallı”, “Qaragöz” özbək rəqsi və s.) dəfələrlə A.Şərifzadə adına aktyor evində, Lenin sarayında (indiki Heydər Əliyev sarayı) konsertlərdə iştirak etmiş, televizorda çıxışlar etmişdi



*Qayğısız tələbəlik illəri (1981)*

# IV Fəsil

# Müstəqillik illərində Azərbaycan Dövlət Pedaqoji Universitetinin inkişafı

## Pedaqoji İnstitut Azərbaycanın müstəqilliyinin bərpasının ilk illərində

80-ci illərin sonu, 90-cı illərin əvvəllərində cəmiyyətdə baş verən ictimai-siyasi hadisələr, xalqın siyasi oyanışı müstəqil Azərbaycan dövlətinin yaranması ilə başa çatdı. Topxana meşəsi ilə bağlı başlanan 1988-ci ilin Meydan hadisələri daha sonra Azərbaycan Milli Azadlıq Hərəkatına çevrildi. 1988-1991-ci illərin xalq hərəkatı nəticəsində 18 oktyabr 1991-ci ildə "Azərbaycan Respublikasının Dövlət Müstəqilliyi haqqında" Konstitusiya Aktı qəbul olundu və Azərbaycan XX əsrdə ikinci dəfə müstəqil dövlət olaraq öz varlığını dünyaya elan etdi.

Müstəqilliyini əldə edən Azərbaycan daha ağır və mürəkkəb problemlə - müstəqilliyin qorunması ilə üzləşdi. Yeni tarixi inkişaf mərhələsində Azərbaycan Respublikasının qarşısında dövlət müstəqilliyinin möhkəmləndirilməsi, demokratik, hüquqi dövlətin qurulması, respublikanın ərazi bütövlüyünün bərpası, Dağlıq Qarabağ probleminin milli maraqlara uyğun həlli, əhalinin təhlükəsizliyinin və rifahının təmin edilməsi kimi tarixi vəzifələr dururdu.

Pedaqoji İnstitut Səbail rayonunda, Hökumət evinin yaxınlığında yerləşdiyindən onun milli azadlıq hərəkatının ön sıralarında yer alan professor-müəllim və tələbə kollektivi indiki "Azadlıq meydanı"nda günlərlə davam edən mitinqlərin iştirakçılarından idi. Ölkədə baş verən ictimai-siyasi proseslər müəllim və tələbələrin siyasi fəallığını xeyli artırmışdı.

Pedaqoji İnstitutun böyük zalında baş verən hadisələrlə bağlı demək olar ki, mütəmadi tədbirlər keçirilirdi. Müxtəlif vaxtlarda keçirilən tədbirlərdə institutun professor-müəllimləri çıxış edərək yadellilərin zaman-zaman Azərbaycan xalqının başına açdığı oyunlardan, torpaqlarımızın işğalından, "Gülüstan" və "Türkmənçay" sülh müqavilələrinin şərtlərindən, I Pyotrun vəsiyyətnaməsindən, Qarabağ xanlığının fəaliyyətindən, ermənilərin Qarabağa köçürülməsindən, azərbaycanlıların öz torpaqlarından (indiki Ermənistan ərazisindən) dəfələrlə deportasiyasından[204], SSRİ rəhbərliyinin müsəlman respublikalarında həyata keçirdiyi ikili siyasətindən, Heydər Əliyevin SSRİ Nazirlər Sovetinin birinci müavini və Siyasi Büronun üzvlüyündən çıxarılmasının xalqımız üçün daha ağır nəticələrə gətirib çıxaracağından, 20 Yanvar faciəsinin səbəblərindən, Sumqayıt hadisələrinin Moskvanın xeyir-duası ilə ermənilərin özlərinin törətməsindən, Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin başlanmasından danışırdılar.

İnstitutun professor-müəllim heyəti Qərbi Azərbaycandan (indiki Ermənistan ərazisindən) didərgin salınan 200 mindən artıq soydaşımıza, blokada şəraitində yaşayan Naxçıvana, ermənilərlə sərhəddə və Qarabağın dağlıq hissəsində qeyri-bərabər döyüşlər aparan silahsız əhaliyə hər cür maddi və mənəvi yardım edirdilər. 1988-ci il noyabrın 26-da respublika hökuməti doğma yurdlarını tərk etmək məcburiyyətində qalan qaçqınlarla bağlı qərar qəbul etdi. Respublikanın digər təhsil müəssisələri kimi, Pedaqoji İnstitutun əməkdaşları da onların ehtiyacını qarşılamaq məqsədilə xeyli tədbirlər həyata keçirdi. Bu proses sonralar da davam etdirildi.

SSRİ rəhbərliyi tərəfindən Azərbaycana qarşı aparılan mənəvi, ideoloji və siyasi təcavüz qısa

---

*[204] 1988-ci ildə Qərbi Azərbaycandan yalnız azərbaycanlılar yaşayan 172 kənddən, 89 qarışıq kənd və 6 şəhər tipli yaşayış məntəqəsindən 49928 ailə (250000 nəfər azərbaycanlı) öz doğma yurdlarından zorla qovuldular. Bu zaman 226 nəfər soydaşımız ermənilər tərəfindən öldürülmüşdür (güllələnmiş, qəsdən avtomobil qəzasına salınmış, dağ yollarında donmuş və s.), 400 nəfərdən çox adam bədən xəsarəti almışdır.*

müddət ərzində faciəli sonluqla bitdi. Yanvarın 19 -dan 20-nə keçən gecə dinc əhaliyə qarşı misli görünməmiş vəhşiliklər törədildi. Əksəriyyəti ermənilərdən ibarət olan hərbçilər Bakıda amansız dağıntılar törətdi, yüzlərlə silahsız adam, o cümlədən uşaqlar, yaşlılar, qadınlar, xəstələr misli görünməmiş xüsusi qəddarlıqla qətlə yetirildi, dövlət və inzibati binalara, nəqliyyat vasitələrinə, yaşayış evlərinə ciddi zərər vuruldu. Bəşər tarixində olmayan ən ağır cinayət törədən və insanlıq simasını itirən hərbçilər heç nəyə və heç kimə rəhm etmədən hamını güllələdilər. Hərbçilər gözyaşardıcı qazdan, müasir kimyəvi silahlardan istifadə edirdilər. Qaçıb canlarını qurtarmağa çalışan adamlar tankların tırtılları altına düşürdülər. Hərbçilər tibb müəssisələrini, xəstəxanaları mühasirəyə alaraq, yaralıların ora gətirilməsinə mane olurdular. Dünya müharibələri tarixində analoqu olmayan dəhşətli hadisələr baş verir, qanlı cinayət hərəkətləri törədilirdi. Sovet imperiya dövləti öz xalqına, öz vətəndaşlarına divan tuturdu.

20 Yanvar hadisəsindən sonra həyatını təhlükəyə atan Ulu öndər H.Əliyev yanvarın 21-də Azərbaycanın Moskvadakı nümayəndəliyində mətbuat konfransı keçirdi, 20 Yanvar faciəsinin mahiyyətini açıqladı. İmperiya rəhbərliyini qatil adlandıran Heydər Əliyev faciənin törədilmə səbəblərini və təşkilatçılarının adlarını açıqladı. 20 Yanvar faciəsini törədənlərin cinayət məsuliyyətinə cəlb edilməsini qətiyyətlə tələb edən Heydər Əliyev baş vermiş faciə ilə əlaqədar Azərbaycan xalqına başsağlığı verdi. Bu bəyanat tarixi əhəmiyyətə malik idi. Çünki SSRİ hökuməti törətdiyi qanlı cinayəti gizlətməyə çalışırdı. Azərbaycan informasiya blokadasında idi, radio, televiziya susdurulmuş, mətbuatın nəşrinə qadağa qoyulmuşdu. Belə bir şəraitdə Bakıda törədilən cinayətlə bağlı əsl həqiqəti Heydər Əliyev dünya liderlərinə, dövlət və hökumət başçılarına, tərəqqipərvər bəşəriyyətə çatdırmağa nail oldu. Baş verən hadisələr bir daha göstərdi ki, Heydər Əliyev böyük siyasi xadimdir, Azərbaycan xalqının XX əsrdə yetişdirdiyi ən böyük dövlət və siyasət adamıdır.

90-cı illərin əvvəllərində Azərbaycanın müstəqil dövlətçilik maraqları ilə üst-üstə düşməyən siyasət, hakimiyyət uğrunda kəskin çəkişmələr təhlükəli bir vəziyyət yaratmışdı. Kütləvi şüurda qarşıdurmaya və dağıdıcılığa olan meyil qazanılmış müstəqilliyin itirilməsi ilə nəticələnə bilərdi. Ölkə uçurumun qarşısında idi. Heydər Əliyev xalqın təkidli tələbi ilə siyasi gərginliyin, hakimiyyət böhranının kəskinləşdiyi bir dövrdə ikinci dəfə siyasi hakimiyyətə qayıtdı.



*Ulu öndər Heydər Əliyevin andiçmə mərasimi (1993)*

Vətəni təlatümdən, qarşıdurmadan, parçalanmaqdan xilas etdi. Heydər Əliyev müəllifi olduğu müstəqillik konsepsiyasının mahiyyətinə uyğun olaraq Azərbaycan xalqının müstəqilliyinin qorunmasını dünyada baş verən ictimai-siyasi hadisələrin fonunda həll etməyə nail oldu. Azərbaycan dövlətçiliyinə, müstəqilliyinə və ərazi bütövlüyünə qəsd etmək istəyənlər Ulu öndərin siyasi əzmkarlığı və qətiyyəti nəticəsində təslim oldular. Daxili çəkişmələrin, dövlət çevrilişlərinin qarşısı alındı. Dövlət ilə xalqın birliyi və yekdilliyi təmin edildi. Respublikamızda ictimai asayişin qorunması, cinayətkarlığa qarşı mübarizənin gücləndirilməsi, qanunçuluğun və hüquqi qaydaların möhkəmləndirilməsi istiqamətində səmərəli tədbirlər həyata keçirilməyə başlandı. Əldə edilmiş dönməz ictimai-siyasi sabit-

lik xarici investorların Azərbaycana sərmayə qoymasına stimul verdi. Müstəqil Azərbaycanın iqtisadi inkişaf modeli və neft strategiyası hazırlandı. Neft amilindən ölkənin və xalqın maraqları naminə istifadə olunması bu iqtisadi inkişaf modelinin əsasını təşkil edirdi. İqtisadi və siyasi müstəqilliyinin möhkəmləndirilməsinə, təhlükəsizliyinin təminatına hesablanmış Bakı-Tbilisi-Ceyhan kəməri Azərbaycanı Avropa ilə birləşdirdi. Bu iqtisadi kəmərdən daha çox, siyasi bir kəmər idi.

Heydər Əliyev XX əsrin 70-ci illərindən etibarən Azərbaycanı keçmiş SSRİ-nin qabaqcıl ölkəsinə çevirdiyi kimi, 90-cı illərin əvvəllərində xaos və tənəzzül dövrünü yaşayan ölkənin mükəmməl inkişaf strategiyasını hazırladı və həyata keçirtdi.

***

1988-1993-cü illərdə digər ali təhsil ocaqlarında olduğu kimi Pedaqoji Universitetin də tədris və elmi həyatında müəyyən geriləmələr baş verdi, normal təhsil-tərbiyə prosesi pozuldu. Tələbələrimizin bir qismi könüllü olaraq Qarabağ döyüşlərinin iştirakçısına çevrildi. İnstitutun Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin 300 tələbəsi[205] könüllü olaraq “qaynar” nöqtələrdə döyüşə yollandı, Kəlbəcər, Laçın, Zəngilan, Gədəbəy, Goranboy, Qazax rayonlarının müdafiəsində iştirak etdi. Universitetin sərhədyanı rayonlardan olan tələbələrinin doğma kəndlərinə getməsi üçün hər cür şərait yaradılmışdı. Həmin tələbələr doğma torpaqların müdafiəsində fədakarlıq göstərirdilər.

Kəlbəcər rayon İcra Hakimiyyətinin başçısı S.Ələkbərovun ADPU-nun rektoruna ünvanladığı məktubda oxuyuruq:”*Sizin universitetdə təhsil alan Kəlbəcər övladlarını öz doğma torpaqlarının müdafiəsinə göndərdiyinizə görə Sizə və universitetin pedaqoji kollektivinə bütün kəlbəcərlilər adından sonsuz təşəkkürümüzü və minnətdarlığımızı bildirirəm. Sizin tələbələrdən Aydınov Novruz, Abbasov Əziz, Məmmədov Şəmşir, Həsənov Adil, Göyüşov Yaşar, Əmirov İlqar və başqaları düşmənə qarşı fədakarlıqla döyüşürlər. Onların mərdliyi və cəsurluğu dillər əzbəri olmuşdur. Bu cür mərd mübarizlər tərbiyə etdiyiniz üçün çox sağ olun”*[206].

Bu tələbələrin hamısı SSRİ ordusunda xidmətdə olmuş keçmiş əsgərlər idi. Universitetin sakit auditoriyalarını Qarabağ müharibəsinin od-alovuna dəyişən tələbələrimizin taleyi üçün narahatlıq keçirən universitet əməkdaşları onlara maddi və mənəvi dəstək olmağa çalışırdılar.

Kəlbəcərin Söyüdlü hərbi hissəsində xidmət edən döyüşçü tələbələrin bölmə komandiri Novruz Aydınovun universitetin rektoruna göndərdiyi teleqramda yazırdı: ”*Sizin göndərdiyiniz sovqatı bizə olan daimi qayğınızın ifadəsi kimi çox böyük ruh yüksəkliyi ilə qarşıladıq. Biz, Kəlbəcər rayonunun Söyüdlü zastavasında qulluq edən tələbələr Sizə- universitetin rektorluğuna, ADPU-nun çoxminli kollektivinə öz dərin minnətdarlığımızı bildiririk”*[207].

1991-1994-cü illərdə erməni-rus birləşmələrinə qarşı böyük cəsarət və mərdliklə vuruşan 11557 Azərbaycan hərbçisi şəhid oldu ki, onların da içərisində Pedaqoji İnstitutun İbtidai hərbi və fiziki təlim fakültəsinin 20-yə yaxın məzunu olmuşdur.

Azərbaycan Respublikası Nazirlər Kabineti 22 avqust 1995–ci il tarixli 190 saylı qərarında gənclərin hərbi vətənpərvərlik tərbiyəsi işinin forma və metodlarının təkmilləşdirilməsi, orta məktəblərin hərbi rəhbərlərə olan tələbləri, hərbi vətənpərvərlik tərbiyəsinin gücləndirilməsi, ibtidai hərbi hazırlıq dərslərinin yüksək nəzəri və təşkilatı metodiki səviyyədə keçilməsi ilə bağlı ali məktəblər qarşısında mühüm vəzifələr qoydu. Təhsil Nazirliyinin Kollegiyasının 13 mart 1996-cı il tarixli 22/2 saylı qərarı ilə ali məktəblərin nəzdində peşə-tədris müəssisələrinin və liseylərin təsis edilməsinə icazə verməsi ilə əlaqədar olaraq Pedaqoji Universitet İbtidai hərbi və fiziki təlim fakültəsinin nəzdində ***hərbi təmayüllü liseyin*** açılması təşəbbüsü ilə çıxış etdi. Bu məqsədlə 23 noyabr 1996-cı ildə Azərbaycan Respublikası Müdafiə naziri general-leytenant Səfər Abıyevə və Azərbaycan Respublikası Təhsil naziri Lidiya Rəsulovaya müraciət edildi. Bu ideya nəinki gerçəkləşmədi, hətta az sonra İbtidai hərbi və fiziki təlim fakültəsinin statusu dəyişdirildi və hərbi kafedra ləğv edildi.

---

[205] *Oğlanlar müharibəyə gedir (AzərTAC). ”Gənc müəllim” qəzeti, 29 may 1992*
[206] *“Gənc müəllim” qəzeti, may 1992*
[207] *“Gənc müəllim”qəzeti, 26 may 1992*

## Pedaqoji İnstitutun Pedaqoji Universitetə çevrilməsi

80-ci illərin axırlarında ölkədə baş verən ictimai-siyasi proseslərlə bağlı olaraq hakimiyyət dəyişikliyi baş verdi. Bu da institut rəhbərliyinin dəyişilməsi ilə nəticələndi. Azərbaycan EA-nın müxbir üzvü, prof.***Səlvər Aslanov*** 7 aprel 1989-cu ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna rektor təyin edildi. O, 9 mart 1994-cü ilə kimi universitetə rəhbərlik etdi. Həmin dövrdə *prof.Nizami Xudiyev* tədris işləri, *prof.Edil Eyvazov* elmi işlər, *prof. Məlikməmməd Cəbrayılov* qiyabi təhsil üzrə, *prof. Kərim Paşayev* iqtisadi məsələlər üzrə, *Əlirza Eyyubov* inzibati-təsərrüfat işləri üzrə prorektor vəzifəsində çalışırdı. 1991-ci ildə universitetdə I prorektor vəzifəsi təsis edildi və həmin vəzifəyə prof.Nizami Xudiyev təyin olundu.



***Səlvər Riza oğlu Aslanov***
*AMEA-nın müxbir üzvü,*
*tarix elmləri doktoru, professor*
*(1930- 2000)*

*11 noyabr 1930-cu ildə Bakı şəhərində qulluqçu ailəsində anadan olub. Orta təhsilini Şamxor (Şəmkir) şəhər orta məktəbində alıb. 1949-cu ildə ADU-nun Tarix fakültəsinə daxil olub. 1950-ci ildə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin Tarix fakültəsinin II kursuna köçürülüb. 1954-cü ildə həmin universiteti bitirib. 1954-cü ildə V.İ.Lenin adına Muzeyin Bakı filialında kiçik elmi işçi kimi əmək fəaliyyətinə başlayıb. 1955-1960-cı illərdə respublika komsomol təşkilatında və ÜİLKGİ MK -da təlimatçı vəzifəsində işləyib. 1960-1961-ci illərdə Azərbaycan LKGİ MK-nın katibi, 1961-1963-cü illərdə Azərbaycan KP MK -nın Təbliğat-təşviqat şöbəsi müdirinin müavini və müdiri işləyib. 1963-1964-cü illərdə Sov.İKP MK-nın Zaqafqaziya bürosunun inspektoru olub, az sonra Bakı şəhər partiya komitəsinin katibi seçilib.*

*M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin Sov.İKP tarixi kafedrasının aspirantı olub. 1961-ci ildə namizədlik,1965-ci ildə doktorluq dissertasiyası müdafiə edib. 1966-ci ildə ona SSRİ Ali Attestasiya Komissiyası tərəfindən professor elmi adı verilmişdir. 1971-ci ildə Moskvanın "Ekonomika" nəşriyyatı tərəfindən "Azərbaycan SSRİ xalq təsərrüfatı sistemində" adlı monoqrafiyası nəşr olunmuşdur.*

*Səlvər Aslanov 1966-1973-cü illərdə D.Bünyadzadə adına Azərbaycan Xalq Təsərrüfatı İnstitutuna, 1974-1979-cu illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Sov.İKP tarixi kafedrasına rəhbərlik etmişdir.1979-1989-cu illərdə həmin kafedranın professoru, 7 aprel 1989-cu ildən 9 mart 1994-cü ilə kimi Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru olmuşdur.*

*VII çağırış Azərbaycan SSR Ali Sovetinin, VII-VIII çağırış Bakı şəhər Sovetinin deputatı seçilmişdir. Azərbaycan KP-nin XXVI qurultayında Azərbaycan KP MK-nın üzvlüyünə namizəd seçilmişdir. Bakı şəhər partiya komitəsinin büro üzvü, Azərbaycan KP-nin XXXII qurultayının nümayəndəsi olmuşdur.*

*10 monoqrafiyası, dərslik və dərs vəsaiti, 90-dan çox elmi məqaləsi nəşr olunmuşdur. ABŞ-da, İraqda, Kubada, Qvineyada, Moskvada, Leninqradda (indiki Sankt-Peterburqda) keçirilən bir sıra beynəlxalq konfrans və simpoziumlarda iştirak etmişdir. 1989-cu ildə Azərbaycan Elmlər Akade-*

*miyasının müxbir üzvü seçilmişdir. SSRİ Sosioloqlor Assosiasiyasının, SSRİ Jurnalistlər İttifaqının, SSRİ Ali və Orta İxtisas Təhsil Nazirliyinin elmi-metodik şurasının, S.M.Kirov adına ADU-nun Müdafiə Şurasının üzvü olmuşdur.*

*Elmi rəhbərliyi ilə 8 nəfər dissertasiya müdafiə edərək tarix elmləri namizədi alimlik dərəcəsi almışdır. Bakı, Moskva, Tbilisi, Mahaçqala və İrəvanda keçirilən Müdafiə Şuralarında 4 nəfərin doktorluq, 12 nəfərin namizədlik dissertasiyasının rəsmi opponenti kimi çıxış etmişdir.*

*SSRİ Xalq Təsərrüfatı Nailiyyətləri sərgisinin iştirakçısı olmuş, sərginin 2 qızıl medalı, "Leninin 100 illik yubileyi", "Əməkdə fərqlənməyə görə", "Əmək veteranı" medalı, "Şərəf Nişanı" ordeni və Azərbaycan SSR Ali Sovetinin Rəyasət Heyətinin, SSRİ Xalq Təhsil Nazirliyinin, SSRİ və Azərbaycan SSR "Bilik" cəmiyyətinin Fəxri Fərmanları ilə təltif olunmuşdur.*

*3 avqust 2000-ci ildə Bakı şəhərində vəfat etmişdir.*

Həmin dövrdə ən vacib məsələlərdən biri institutun 70 illik yubileyinin keçirilməsi ilə bağlı idi. Bu məsələ İnstitutun Elmi Şurasında geniş müzakirə edilmişdi. İnstitutun yubileyinə nümunəvi hazırlaşmaq və onu mütəşəkkil keçirmək üçün Yubiley komissiyası yaradılmışdı:

1) prof.Aslanov Sərvər –institutun rektoru- sədr
2) dos.Quliyev Sərdar- partiya komitəsinin katibi-üzv
3) dos.Abaszadə Eldar-tədris işləri üzrə prorektor- üzv
4) prof.Eyvazov Edil- elmi işlər üzrə prorektor-üzv
5) dos.Cəbrayılov Malik- qiyabi şöbə üzrə prorektor-üzv
6) Əyyubov Əlirza- təsərrüfat işləri üzrə prorektor- üzv
7) dos.Xudiyev Nizami- Həmkarlar İttifaqı Komitəsinin katibi-üzv
8) İmanov Allahyar – komsomol komitəsinin katibi- üzv
9) prof. Əzimov Hacıbaba- Sov.İKP tarixi kafedrasının müdiri-üzv
10) prof.Quliyev Cahid- Elmi kommunizm kafedrasının müdiri- üzv
11) dos.Qaraməmmədli Yasin- Fəlsəfə kafedrasının müdiri-üzv
12) dos.Qarayev Rasim- Siyasi iqtisad kafedrasının müdiri-üzv
13) prof.Əhmədov Hüseyn- Pedaqogika kafedrasının müdiri-üzv
14) prof.Əlizadə Əbdül- Psixologiya kafedrasının müdiri -üzv
15) prof.Fətəliyev Xəlil – Pedaqoji fakültənin dekanı- üzv
16) prof.Qüdrətov Dərgah-Tarix fakültəsinin dekanı- üzv
17) prof.Kazımov Qəzənfər -Filologiya fakültəsinin dekanı-üzv
18) prof.Həsənov Şahəli- Coğrafiya fakültəsinin dekanı-üzv
19) prof.Cəfərov İsgəndər –Fizika fakültəsinin dekanı-üzv
20) prof.Qafarova Roza- Kimya-biologiya fakültəsinin dekanı-üzv
21) b/m.Yüzbaşıyev Məhəmməd –Bədii qrafika fakültəsinin dekanı-üzv
22) dos.Həsənov Musa- Məktəbəqədər tərbiyə fakültəsinin dekanı-üzv
23) dos.Süleymanov Cəfər- Riyaziyyat fakültəsinin dekanı-üzv.

Komissiya bir ay müddətində tədbirlər planı hazırlamalı və komissiyanın iclasında təsdiq etməli idi. Nəzərdə tutulan əsas məsələlərdən biri Pedaqoji İnstitutun universitetə çevrilməsi, digəri isə institutun adının dəyişdirilməsi ilə bağlı idi.

Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 1991-ci il tarixli qərarı ilə Azərbaycan Dövlət Pedaqoji İnstitutu universitetə çevrildi, universitetin Şuşa və Şamaxı filialları yaradıldı.

Nazirlər Kabinetinin "V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Universitetə çevrilməsi haqqında" 1 aprel 1991-ci il tarixli 76 saylı qərarında deyilir.

"Azərbaycan Respublikası Nazirlər Kabineti qərara alır:

***1.V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunu V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji Universitetinə çevirmək haqqında institutun Xalq Təhsil Nazirliyi ilə razılaşdırılmış təklifi qəbul edilsin.***

***2.Azərbaycan Respublikası Xalq Təhsil Nazirliyi V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji Universitetinin nizamnaməsini qoyulmuş qaydada təsdiq etsin".***

Pedaqoji İnstitutun universitetə çevrilməsindən sonra universitetin rəhbərliyi V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji Universitetinin adının dəyişdirilməsi ilə bağlı təşəbbüslə çıxış etdi.

Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 1991-ci il tarixli qərarı ilə Universitetin adı dəyişdirildi. Nazirlər Kabinetinin "V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji Universitetinin adının dəyişdirilməsi haqqında" 26 noyabr 1991-ci il tarixli 292 saylı qərarda deyilir:

***"Azərbaycan Respublikasının Nazirlər Kabineti qərara alır:"Azərbaycan Respublikası Xalq Təhsil Nazirliyinin təklifini nəzərə alaraq V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji Universiteti Nəsirəddin Tusi adına Azərbaycan Dövlət Pedaqoji Universiteti adlandırılsın".***

Pedaqoji İnstitutun Universitetə çevrilməsi və ona böyük Azərbaycan mütəfəkkiri N.Tusinin adının verilməsi qocaman təhsil ocağının 70 illiyinə böyük töhfə idi. Ali pedaqoji məktəb institutdan universitetə çevrilməklə yeni mərhələyə qədəm qoydu. Təhsil ocağı ilə bərabər həm də elmi-tədqiqat mərkəzinə çevrildi. Dünyanın qabaqcıl ölkələrinin universitetləri ilə əlaqələri genişləndi. ABŞ, Türkiyə, İran, Çexoslovakiya[208], Polşa universitetlərinin ADPU-da qonaq olan görkəmli alimləri ilə görüşlər, onların təcrübəsinin öyrənilməsi birgə elmi-tədqiqat aparmaq sahəsində əməkdaşlığın hüdudlarını xeyli genişləndirdi. Universitetin Şuşada, Şamaxıda filialları, öz nəzdində isə Ali Humanitar Kollec yaradıldı.

Yubiley ərəfəsində universitetdə əyani, qiyabi və axşam şöbələrində 23 ixtisas üzrə 10 minə yaxın tələbə təhsil alırdı. Onların təhsil-tərbiyəsi ilə 56 kafedranın 734 nəfər professor-müəllimi məşğul olurdu. Onlardan 5 nəfəri AMEA-nın müxbir üzvü, 57 nəfəri elmlər doktoru, professor, 383 nəfəri elmlər namizədi, dosent idi[209].

21 iyul 1992-ci ildə Azərbaycan Respublikası Prezidentinin Fərmanı ilə Nazirlər Kabineti yanında Tələbə Qəbulu üzrə Dövlət Komissiyası yaradıldı. Ali məktəblərə qəbul imtahanları mərkəzləşdirilmiş qaydada, test üsulu ilə həyata keçirilməyə başladı.

Həmin dövrdə universitetdə *Tarix* (dekan prof. Dərgah Qüdrətov), *Filologiya* (dekan prof.Qəzənfər Kazımov), *Kimya- biologiya* (dekan prof.Roza Qafarova), *Fizika* (dekan prof.İsgəndər Cəfərov), *Riyaziyyat* (dekan dos.Cəfər Süleymanov), *Coğrafiya* (dekan Xostan Vəliyev), *İbtidai təhsilin pedaqogikası və metodikası* (dekan prof.Xəlil Fətəliyev), *Məktəbəqədər tərbiyə* (dekan prof. Məmməd Məmmədov), *Mühəndis-pedaqoji və bədii qrafika* (dekan prof.Kamal Hüseynov), *Fiziki tərbiyə və gənclərin çağırışaqədər hazırlığı* (prof.Ədalət Fərəcov) fakültələri fəaliyyət göstərirdi.

5 may 1990-cı ildə ADPİ üzrə verilmiş əmrə əsasən aşağıdakı ixtisasları əhatə edən axşam fakültəsi (şöbəsi) yaradılmışdı:1) Ümumi texniki fənlər və əmək; 2) İbtidai təlim pedaqogikası və metodikası; 3) Pedaqogika və psixologiya (məktəbəqədər); 4) İbtidai təhsilin pedaqogikası və metodikası əlavə musiqi. Fakültəyə rəhbərlik dos.Vəli Musayevə həvalə olunmuşdu. Həmin dövrdə qiyabi Tarix-filologiya fakültəsinə prof. Xeyrulla Məmmədov, 1№-li qiyabi Pedaqoji fakültəyə prof.Qulam Əzimov, 2 №-li Pedaqoji fakültəyə dos.İramin İsayev rəhbərlik edirdi.

1991/92-ci tədris ilində universitetin əyani şöbəsinə 1128, qiyabi şöbəsinə 522, axşam şöbəsinə 252, 1992/93-cü tədris ilində əyani şöbəyə 797, qiyabi şöbəyə 317, axşam şöbəsinə 68 tələbə qəbul edilmişdi. Azalmanın əsas səbəbi ümumtəhsil məktəblərində test üsulu ilə işləməyə alışmayan tələbələrin yeni üsulla qəbul imtahanları verməsi ilə bağlı idi. Qəbul imtahanlarında şəffaflığı və obyektivliyi təmin edən test üsulu qısa bir vaxt ərzində populyarlaşdı, abituriyentlər və onların valideynləri tərəfindən təqdir edildi.

---

[208] *Çexoslovakiya 1992-ci ilin iyununda Çex və Slovakiya respublikalarına bölünüb.*
[209] *"Gənc müəllim" qəzeti, 15 yanvar 1992*

Maddi-mənəvi çətinliklərə baxmayaraq, professor-müəllimlər planlaşdırılan elmi tədqiqat işlərini başa çatdırdılar. 1992-ci ildə 587 professor-müəllim və elmi-tədqiqat bölməsinin 31 əməkdaşı elmi-tədqiqata cəlb edilmişdi Həmin dövrdə institutda 77 elmlər doktoru, professor, 433 elmlər namizədi, dosent çalışırdı. 1992-ci ildə universitetdə 6013 nəfər (3948 əyani, 2065 qiyabi) tələbə təhsil alırdı. 61 aspirant (19 əyani, 42 qiyabi) namizədlik dissertasiyası üzərində çalışırdı. Hesabat ilində[210] əməkdaşlardan 7-i doktorluq, 12-i namizədlik dissertasiyası müdafiə etmişdi.

1992-ci ildə N.Tusi adına ADPU-nun professor-müəllim heyətinin 53-cü elmi-hesabat konfransı keçirildi[211]. Konfrans ADPU-nun 70 illiyinə həsr edilmişdi. Konfransda Riyaziyyat fakültəsinin 75, Fizika fakültəsinin 34, Kimya-biologiya fakültəsinin 65, Mühəndis-pedaqoji fakültənin 26, Filologiya fakültəsinin 115, Tarix fakültəsinin 58, Coğrafiya fakültəsinin 32, Pedaqoji fakültənin 92, Bədii qrafika fakültəsinin 12, Çağırışaqədər hərbi və fiziki hazırlıq fakültəsinin 31əməkdaşı məruzə ilə çıxış etdi.

1992-ci ildə Pedaqoji Universitetə ödənişli əsaslarla tələbə qəbulu həyata keçirildi. Bütün ixtisaslar üzrə qəbul olunan tələbələr bir fakültədə cəmlənmişdi. Fakültəyə rəhbərlik dos.Məlikməmməd Cəbrayılova tapşırılmışdı. Az sonra ödənişli əsaslarla qəbul edilən tələbələrin ixtisaslar üzrə fakültələrə verilməsi nəticəsində yeni yaranan fakültə ləğv olundu.

Xalq Təhsili Nazirliyinin 15 fevral 1993-cü il tarixli 136№-li əmrinə əsasən Pedaqoji Universitetdə 10 nəfərdən ibarət təhsil islahat komissiyası yaradıldı. Komissiyanın əsas məqsədi 1992-ci ildə qəbul edilmiş "Təhsil haqqında Azərbaycan Qanunu"nun tələblərinə uyğun olaraq Pedaqoji Universitetin mövcud strukturunu, ixtisaslarını, maddi-texniki bazasını, kadr hazırlığını yeni qanunun tələblərinə uyğunlaşdırmaq idi. Pedaqoji İnstitutda 1993/94-cü tədris ilindən üç pilləli təhsil sisteminə keçid nəzərdə tutuldu:1) bakalavriatura; 2) magistratura; 3) doktorantura.Yeni təhsil pilləsinə keçidin əsas səbəbi hazırlanan kadrların elmi, peşə və ümumi hazırlığının dünya standartlarına uyğun olması ilə bağlı idi. Pedaqoji Universitetdə çoxpilləli təhsil müddətinin ixtisaslardan asılı olaraq 4-5 il olması nəzərdə tutulurdu. Birinci pillənin bütün məzunları diplom işi yazmalı idi. Diplom işini müvəffəqiyyətlə müdafiə edənlərə fakültə elmi şurasının qərarı ilə "bakalavr" ixtisası və elmi dərəcəsi, diplom işini müdafiə etməyənlərə isə, sadəcə "bakalavr" ixtisası verilirdi. Birinci pillədə həm "bakalavr" ixtisası və elmi dərəcəsi olan məzunlar təhsillərini qəbul olunmuş qaydalara uyğun olaraq magistraturada davam etdirə bilərdi. Yalnız "bakalavr" ixtisas dərəcəsi alanlar isə istehsalatda ən azı iki il işləyib, mövcud qaydalara uyğun olaraq bakalavr elmi dərəcəsi alandan sonra magistraturaya qəbul oluna bilərdilər. Magistraturanı bitirənlər müdafiə etdikləri elmi işə görə ixtisaslaşdırılmış Elmi Şuranın qərarı ilə "magistr" ixtisası və elmi dərəcəsi alırdılar."Magistr" dərəcəsi verilərkən xüsusi elmi hazırlıq, bacarıq və konkret elmi nəticə nümayiş etdirmiş məzunlar ixtisaslaşdırılmış Elmi Şuranın qərarı ilə doktoranturada saxlanılırdılar.

Xalq Təhsili Nazirliyinin 19 mart 1993-cü il tarixli 45-11-934/87№li məktubuna uyğun olaraq Pedaqoji Universitetin strukturu aşağıdakı kimi müəyyənləşdirilmişdi:

1) Birinci prorektor (tədris işləri üzrə, elmi işlər üzrə, iqtisadi məsələlər üzrə, inzibati-təsərrüfat işləri üzrə prorektorlar, tədris hissəsi, hazırlıq şöbəsi);

2) 4 illik fakültələr (Pedaqoji, Mühəndis-pedaqoji, Bədii qrafika, Məktəbəqədər, Hərbi hazırlıq);

3) 5 illik fakültələr (Filologiya, Tarix, Riyaziyyat, Fizika, Coğrafiya, Kimya-biologiya)

4) Axşam şöbəsi;

5) Qiyabi şöbə (Filologiya-tarix,1№-li Pedaqoji Fakültə, 2 №-li Pedaqoji fakültə, Məktəbəqədər tərbiyə).

Təhsil müddəti dörd və beş il olan ixtisaslar üçün yeni tədris planları hazırlanmışdı. Hazırlanan tədris planları Xalq Təhsili Nazirliyinin 12 mart 1993-cü ildə qəbul etdiyi normativlərə uyğun idi.

---

*[210] ADPU-nun Arxivi.1992-ci ildə yerinə yetirilən elmi-tədqiqat işlərinə dair məlumat hesabatı. Bakı, 1993*
*[211] N.Tusi adına ADPU-nun professor-müəllim heyətinin 53-cü elmi-hesabat konfransının proqramı. Bakı:ADPU,1992, 70s.*

Yeni tədris planları üç blokdan ibarət idi:
I Blok- Sosial-siyasi və fəlsəfi fənlər;
II Blok- Ümumi təhsil fənləri;
III Blok: İxtisas və ixtisaslaşma fənləri.

Hər bloka ayrılacaq saatların miqdarı Xalq Təhsili Nazirliyi tərəfindən faizlə müəyyən edilmişdi. Humanitar ixtisaslar üçün: *birinci blok* 8-11%, *ikinci blok* 19-32 %, *üçüncü blok* 60-70%, Təbiət ixtisasları üçün *birinci blok* 6-8%, *ikinci blok* 22-34 %, *üçüncü blok* 60-70%. Təhsil müddəti 5 il olan fakültələrdə ümumi tədris yükü 4716 saat, 4 il olan fakültələrdə isə 3686 saat nəzərdə tutulurdu. Pedaqoji Universitetdə hazırlanan yeni tədris planlarında ixtisaslar üzrə ümumi tədris yükü bloklar üzrə aşağıdakı kimi bölünmüşdü.

| № | İxtisaslar | Təhsil müddəti | I blok | II blok | III blok | Cəmi |
|---|---|---|---|---|---|---|
| 1 | Humanitar | 5 il | 562 (11%) | 1296 (27%) | 2858 (62%) | 4716 |
| 2 | Humanitar | 4 il | 434 (11%) | 1116 (32%) | 2136 (57%) | 3686 |
| 3 | Təbiət | 5 il | 378 (8% | 1206 (25,5%) | 3239 (66,5) | 4716 |

Həm təhsil müddəti 5 il olan fakültələrdə (cəmi 12 həftə), həm də 4 il olan fakültələrdə 2 dəfə pedaqoji təcrübə keçmək nəzərdə tutulmuşdu. Sonuncu kurslarda diplom işinin hazırlanmasına da vaxt ayrılmışdı. 1994-cü ilin sentyabrından Pedaqoji Universitetdə I tədris ili tələbələri yeni tədris planları əsasında dərsə başladılar.

Xalq Təhsili Nazirliyinə ünvanlanan məktubda 1993/94–cü tədris ilindən etibarən Pedaqoji Universitetdə aşağıdakı ixtisaslar üzrə kadr hazırlığının aparılmasına icazə verilməsi xahiş olunurdu: 1) Astrofizika; 2)İnformatika və hesablama texnikasının əsasları; 3) məktəb pedaqoqu (sosial pedaqoq nəzərdə tutulur- F.R.) və psixoloqu.

Təhsil Nazirliyinin "Ali məktəblərdə elmi-pedaqoji kadrların ixtisasının artırılması və yenidən hazırlanması vəziyyəti və onun təkmilləşdirilməsi tədbirləri haqqında" 1995-ci il 6/2 saylı kollegiya qərarından sonra universitetdə professor-müəllim heyətinin ixtisasartırmadan keçmə qrafiki hazırlandı və təsdiq edildi. 5 illik qrafikə uyğun olaraq 1995-ci ildə 57, 1996-cı ildə I və II semestrdə 67 və 68, 1997-ci ildə I və II semestrdə 62 və 61, 1998-ci ildə 1 və II semestrdə 65 və 60, 1999-cu ildə I və II semestrdə 53 və 54, 2000-ci ildə I və II semestrdə 45 və 43 nəfər ixtisasartırma kursundan keçdilər. Pedaqoji Universitetdə digər ali məktəblərdən gələn pedaqoji kadrların ixtisasının artırılmasını yüksək səviyyədə təşkil etmək üçün baza kafedraları müəyyənləşdirildi.

1995-ci ildə Pedaqoji İnstitutda aşağıdakı qoşa ixtisasların açılması planlaşdırıldı: 1) riyaziyyat, əlavə informatika; 2) riyaziyyat, əlavə fizika; 3) kimya, əlavə biologiya; 4) biologiya, əlavə kimya; 5) fizika, əlavə astronomiya; 6)fizika, əlavə riyaziyyat; 7) əmək, əlavə fizika; 8) ibtidai təhsil pedagogikası və metodikası, əlavə musiqi; 9) tarix, əlavə hüquq; 10) kimya, əlavə ekologiya.

1995/96-cı tədris ilində universitetdə korreksiyaedici pedaqogika və xüsusi psixologiya (məktəbəqədər) ixtisası açıldı ki, onun da cəmi bir buraxılışı oldu. 1996/1997-ci tədris ilində defektologiya, 1997/98-ci tədris ilində Psixologiya ixtisası açıldı.

1997/98-ci tədris ilində Pedaqoji Universitetin axşam şöbəsinə tələbə qəbulu dayandırılsa da, əyani və qiyabi şöbələrə daxil olan tələbələrin sayı ildən-ilə artdı.

| İllər | Əyani | | Qiyabi | | Axşam | |
|---|---|---|---|---|---|---|
| | qəbul | məzun | qəbul | məzun | qəbul | məzun |
| 1991-1992 | 1128 | 944 | 522 | 330 | 252 | - |
| 1992-1993 | 797 | 978 | 317 | 214 | 68 | - |
| 1993-1994 | 906 | 625 | 207 | 600 | 123 | - |
| 1994-1995 | 798 | 980 | 91 | 660 | 110 | 84 |
| 1996-1997 | 1185 | 1508 | 304 | 422 | 209 | 47 |
| 1997-1998 | 1089 | 1168 | 555 | 379 | - | 112 |
| 1998-1999 | 1194 | 935 | 580 | 233 | - | 8 |
| 1999-2000 | 1101 | 1170 | 569 | 590 | - | 14 |
| 2000-2001 | 1135 | 1219 | 578 | 550 | - | 8 |
| 2001-2002 | 1155 | 1159 | 674 | 749 | - | - |
| 2002-2003 | 1007 | 1154 | 556 | 620 | - | - |
| 2003-2004 | 1009 | 1076 | 515 | 610 | - | - |
| 2004-2005 | 1124 | 1122 | 619 | 617 | - | - |
| 2005-2006 | 1214 | 971 | 612 | 658 | - | - |

1994-cü ildə universitetin I prorektoru prof. ***Nizami Xudiyev*** Pedaqoji Universitetə rektor təyin olundu. *Prof.Bəhlul Ağayev* tədris işləri üzrə prorektor vəzifəsinə irəli çəkildi. *Prof.Məlikməmməd Cəbrayılov* qiyabi təhsil üzrə prorektor, *prof. Edil Eyvazov* elmi işlər üzrə prorektor, *Əlirza Eyyubov* inzibati-təsərrüfat işləri üzrə prorektor vəzifələrində qalmaqla fəaliyyətlərini davam etdirdilər.



***Nizami Mənaf oğlu Xudiyev***
*filologiya elmləri doktoru, professor,*
*Əməkdar elm xadimi*
*(1949-2021)*

*1949-cu il aprelin 1-də Naxçıvan Muxtar Respublikasının Şahbuz rayonunda anadan olub. 1955-1966-cı illərdə Naxçıvan şəhər 1 və 2 №-li və Şahbuz qəsəbə orta məktəbində, 1966-1970-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Filologiya fakültəsində təhsil alıb. Təhsil illərində "Nizami Gəncəvi" adına təqaüdlə oxuyub, fakültə komsomol komitəsinin katibi olub. İnstitutu fərqlənmə diplomu ilə bitirən Nizami Xudiyev fakültə elmi şurasının qərarı ilə Azərbaycan dilçiliyi kafedrasında müəllim saxlanılıb. Hərbi xidmətdən (1972-1973) sonra həmin kafedrada pedaqoji fəaliyyətini davam etdirib*

*(1973-1975), baş müəllim (1975-1981) və fakültə həmkarlar təşkilatının sədri (1974-1979) vəzifələrində çalışıb. 1978-ci ildə "Abdulla Şaiqin nəsr dili (leksika və frazeologiya)" mövzusunda dissertasiya müdafiə edərək filologiya elmləri namizədi alimlik dərəcəsi alıb. 1981-ci ildə ona SSRİ Ali Attestasiya Komissiyası tərəfindən dosent elmi adı verilib. 1981-1990-cı illərdə Azərbaycan dilçiliyi kafedrasında dosent vəzifəsində çalışan Nizami Xudiyev 1979-1991-ci illərdə ADPU-nun Həmkarlar İttifaqı Komitəsinə rəhbərlik edib. 1990-cı ildə "Azərbaycan ədəbi dili lüğət tərkibinin inkişaf qanunauyğunluqları" mövzusunda doktorluq dissertasiyası müdafiə edərək filologiya üzrə elmlər doktoru elmi dərəcəsi alıb. Elə həmin ildə də Azərbaycan dilçiliyi kafedrasına professor vəzifəsinə seçilib. 1991-1994-cü illərdə ADPU-nun I prorektoru vəzifəsində çalışıb. Qısa müddətdə ADPU-nun rektoru (1994-1995) vəzifəsində çalışan Nizami Xudiyev 1996-2005-ci illərdə Azərbaycan Dövlət Televiziya və Radio Verilişləri Şirkətinin, 2005-2006-cı illərdə Azərbaycan Dövlət Televiziya və Radio Verilişləri Qapalı Səhmdar Cəmiyyətinin sədri olub. 2000-ci ildə 2 saylı Şərur-Babək seçki dairəsindən, 2005-ci ildə 56 saylı Xaçmaz kənd seçki dairəsindən Milli Məclisə deputat seçilib, Elm və təhsil məsələləri daimi komissiyasının üzvü olub. Müxtəlif dövlət və media mükafatlarına layiq görülüb. AMEA-nın Dilçilik İnstitutunda, ADPU-da, BDU-da, Naxçıvan Dövlət Universitetində namizədlik və doktorluq dissertasiyaları üzrə Müdafiə Şuralarının üzvü olub, elmi və elmi-pedaqoji kadr hazırlığında səmərəli fəaliyyət göstərib. Lütfizadə adına Amerika Beynəlxalq Müasir Elmlər Akademiyasının və Nyu-York Elmlər Akademiyasının həqiqi üzvü seçilib. Yeni Azərbaycan Partiyası Siyasi Şurasının və İdarə Heyətinin, Azərbaycan Yazıçılar Birliyinin, Azərbaycan Jurnalistlər Birliyinin, Azərbaycan Ziyalılar Cəmiyyətinin İdarə Heyətinin üzvüdür. Azərbaycan-Amerika Birləşmiş Ştatları, Azərbaycan-Belarus, Azərbaycan-Böyük Britaniya, Azərbaycan-Hindistan, Azərbaycan-Pakistan, Azərbaycan - Türkiyə parlamentlərarası əlaqələr üzrə işçi qruplarının üzvü olub. 2001-ci ildə İngiltərənin Kembric Beynəlxalq Bioqrafiya Mərkəzi tərəfindən "İlin beynəlxalq ziyalısı" adına və "Qızıl medala" layiq görülüb. 2002-ci ildə ABŞ Bioqrafiya İnstitutunun üzvü seçilən Nizami Xudiyevin adı "XXI əsrin böyük ziyalıları" kitabına daxil edilib. Eyni zamanda Kembric Beynəlxalq Bioqrafiya İnstitutu prof. Nizami Xudiyevi 2002-ci ildə "XXI əsrin intellektualı" seçərək onu xüsusi medal və diplomla təltif etmişdir. Elmi uğurlarına və bu sahədəki səmərəli fəaliyyətinə görə Kembric Beynəlxalq Bioqrafiya İnstitutunun baş direktorunun müavini vəzifəsinə seçilmişdir. 2002-ci ildə ABŞ Bioqrafiya İnstitutunun üzvü seçilib və adı "XXI əsrin böyük ziyalıları" (ali nəşr) kitabına daxil edilib. 2004-cü ildə Ankara şəhərində keçirilən Türk dili Qurultayında "Türk dilinə xidmət" ödülü ilə mükafatlandırılıb. Amerikanın Dünya Ədəbiyyatı Akademiyasının "Humanitar və fəlsəfə elmləri üzrə Sokrat sədri" (2004) seçilmiş və Kembric Beynəlxalq Bioqrafiya İnstitutunun "Beynəlxalq Şərəf Ordeni" (2004) ilə təltif olunmuşdur. Amerika Birləşmiş Ştatları Bioqrafiya İnstitutu tərəfindən "2005-ci İlin Adamı" seçilmiş və xatirə medalı ilə təltif edilmişdir.*

*2001-ci ildə Əməkdar elm xadimi fəxri adına layiq görülüb. Dilçilik elminin və türkologiyanın müxtəlif sahələrinə aid 600 əsərin (monoqrafiya, dərslik və dərs vəsaiti, kitab, ssenari, 400 elmi və publisistik məqalə) müəllifidir. Bakı, Moskva, Nalçik, Bişkek. Ufa, Aşqabad, Daşkənd, Alma-Ata, Ankara, İstanbul, Əskişəhər, İzmir, Adana və Konyada keçirilən türkoloji tədbirlərin – qurultay, beynəlxalq simpozium və elmi konfransların nümayəndəsi olub.*

*Azərbaycan Respublikasının ictimai-siyasi və mədəni həyatında fəal iştirakına görə 2009-cu ildə "Şöhrət" ordeni, 2012-ci ildə "Azərbaycan Respublikası Qabaqcıl təhsil işçisi" döş nişanı, 2013-cü ildə "Ən yaxşı vətənpərvər tədqiqatçı alim "Qızıl medalı ilə təltif edilib. 4 aprel 2019-cu ildə Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdünə layiq görülüb. 10 aprel 2019-cu ildə ADPU-nun Böyük zalında professor Nizami Xudiyevin 70 illik yubileyinə həsr olunmuş tədbir keçirilib.*

*25 may 2021-ci ildə Bakı şəhərində vəfat edib.*

Həmin dövrdə Pedaqoji Universitetdə ənənələr davam etdirildi, dövlətə və dövlətçiliyə sədaqəti ilə fərqlənən professor-müəllim heyəti tədris və elmi fəaliyyətlərində müəyyən uğurlara imza atdılar.

Belə ki, 1993-cü ildə Ulu öndər Heydər Əliyevin siyasi hakimiyyətə qayıdışı ilə ölkədə sakitlik və sabitlik yarandı, ölkə xaos, vətəndaş qarşıdurması, dövlət müstəqilliyinin itirilməsi təhlükəsindən xilas oldu. Heydər Əliyev Azərbaycan Respublikası Ali Sovetinin Sədri seçildi, ölkədə davam edən gərginlik və qarşıdurma azaldı, vətəndaş müharibəsi və parçalanma təhlükəsi aradan qalxdı. Bu mühüm tarixi gün xalqımızın yaddaşına Milli Qurtuluş Günü kimi daxil oldu. Bunlar təbii ki, Ümummilli liderin qətiyyəti, iradəsi sayəsində mümkün oldu. Ulu Öndər milli dövlətçiliyimizin konsepsiyasını yaratdı.3 oktyabr 1993-cü il tarixində Heydər Əliyevin müstəqil Azərbaycan Respublikasının Prezidenti seçilməsi milli dövlətçilik tariximizin ən mühüm səhifələrindən birinə çevrildi. Milli maraqlara əsaslanan, praqmatik və çoxşaxəli xarici siyasətin həyata kecirilməsi nəticəsində Azərbaycanın beynəlxalq mövqeyi möhkəmləndi, müstəqil milli dövlət kimi dünya birliyinə uğurla inteqrasiya olundu. Cəbhədə uğurlu əks hücumdan sonra sakitlik yarandı. Tənəzzüldən tərəqqiyə inkişaf başlandı.

Digər təhsil müəssisələrində olduğu kimi, Pedaqoji Universitetdə də tədris və elmi fəaliyyət canlandı, tədris prosesi nizama düşdü, könüllü olaraq erməni separatçılarına qarşı vuruşan tələbələr od qoxulu səngərlərdən tələbə auditoriyalarına qayıtdılar. Pedaqoji Universitet fəaliyyətini yeni məzmunda və istiqamətdə qurmağa başladı. Belə bir vaxtda Pedaqoji Universitetinin yubileyinin keçirilməsi məsələsi yenidən aktuallaşdı. Pedaqoji Universitetin 70 illik yubileyinin keçirilməsinə nail ola bilməyən kollektiv 75 illik yubileyin daha yüksək səviyyədə keçirilməsinə təşəbbüs göstərdilər. Pedaqoji Universitetin 75 illik yubileyinin keçirilməsi üçün respublika hökumətinə müraciət edilməsi ilə bağlı rektor, prof.Nizami Xudiyev 25 may 1995-ci ildə Azərbaycan Respublikasının Təhsil naziri Lidiya Rəsulovaya məktub ünvanladı. Məktubda universitetin ayrı-ayrı fakültələri əsasında yaranan ali təhsil ocaqları, məşhur məzunları, 75 ildə hazırlanan pedaqoji və elmi-pedaqoji kadrların Azərbaycanda elmin və maarifin inkişafındakı rolu əhatəli şəkildə səciyyələndirilirdi.Məktubda bildirilirdi ki, Universitedə və onun filiallarında 9 mindən artıq tələbə təhsil alır ki, onların da təhsil tərbiyəsi ilə 700-dən artıq müəllim məşğul olur. Əməkdaşlardan 84 nəfəri elmlər doktoru, professor, 422 nəfəri elmlər namizədi, dosentdir. Xarici ölkənin tələbə və aspirantlarının təhsil aldığı universitetdə son illər elmi-pedaqoji əlaqələr xeyli genişlənmişdir. Məktubda universitetin 50 və 60 illik yubileylərinin Ulu öndərin rəhbərliyi ilə yüksək səviyyədə keçdiyi bildirilir. 70 illik yubiley kimi 75 illik yubiley də keçirilmədi.



*ADPU-nun rektoru, prof.C.Cəfərov prof.N.Xudiyevi 70 illik yubileyi münasibəti ilə təbrik edərkən*

1996-cı il sentyabr ayının 5-də prof.Nizami Xudiyev Azərbaycan Respublikası Dövlət Radio və Televiziya Verilişləri Şirkətinə sədr təyin edildiyindən onun yerinə prof.***Bəhlul Ağayev*** rektor vəzifəsinə irəli çəkildi. *Prof.Məlikməmməd Cəbrayılov* tədris işləri üzrə prorektor, *prof.Vilayət Əliyev* elmi işlər üzrə prorektor vəzifəsinə təyin edildilər. *Dos. Vaqif Həsənov* tədris-metodika şöbəsinə müdir təyin edildi.

Prof.Bəhlul Ağayev 21 aprel 2006-cı ilə kimi Pedaqoji Universitetə rəhbərlik etdi.

***Bəhlul İsfəndiyar oğlu Ağayev***
*biologiya elmləri doktoru, professor*
*(1937)*



*1937-ci ilin oktyabr ayının 28-də Qərbi Azərbaycanın Qafan rayonunun Pəyəhan kəndində anadan olmuşdur. 1956-cı ildə Qafan rayon Gığı kənd orta məktəbini, 1963-cü ildə Azərbaycan Dövlət Universitetini bitirmişdir. 1963-1970-ci illərdə Sabirabad və Saatlı rayonlarında müəllim işləmişdir. 1966-cı ildə Azərbaycan EA-nın Zoologiya İnstitutunun aspiranturasına qəbul olunmuş, 1971-ci ildə namizədlik dissertasiyası müdafiə edərək biologiya elmləri namizədi elmi dərəcəsi almışdır. 1990-cı ildə Kiyev şəhərində Ukrayna EA Zoologiya institutunda "Şərqi Zaqafqaziyanın şıqqıltılı böcəkləri (Elateridae, Coleoptera)" mövzusunda dissertasiya müdafiə edərək biologiya elmləri doktoru elmi dərəcəsi almışdır.*

*Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Zoologiya kafedrasında laborant, assistent, baş müəllim, dosent (1977-1991), professor (1991-2017) vəzifələrində işləmişdir. 2017-ci ildən ADPU-nun Biologiya və onun tədrisi metodikası kafedrasının professorudur.*

*1973-1977-ci illərdə Kimya-biologiya fakültəsinin dekan müavini, 1977-2017-ci illərdə Zoologiya kafedrasının müdiri olmuşdur. 1994-1996-cı illərdə ADPU-nun tədris işləri üzrə prorektoru, 1996-2006-cı illərdə ADPU-nun rektoru vəzifəsində çalışmışdır. 2000-2006-cı illərdə ADPU-nun nəzdində fəaliyyət göstərən "Ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi" və "Təlim və tərbiyənin nəzəriyyəsi və metodikası" ixtisasları üzrə Müdafiə Şurasının sədri olmuşdur. 2001-ci ildə Beynəlxalq Elmlər Akademiyasının, 2002-ci ildə Beynəlxalq Pedaqoji Akademiyanın həqiqi üzvü seçilmişdir.*

*"Ümumi entomologiya. I hissə. (1979), "Ümumi entomologiya. II hissə. (1981), "Onurğasızlar zoologiyasından laboratoriya məşğələləri" (1997), "Biologiyadan suallar və cavablar: (sınaq testləri ilə)" (1999), "Onurğasızlar zoologiyasından praktikum" (1993), "Biologiya (Sorğu materialları) (1998), "Zoocoğrafiya (Zoologiyanın əsasları ilə) (1999), "Onurğasızlar zoologiyası" (1985) "Ümumi entomologiya" (2004), "Onurğasızlar zoologiyasından laboratoriya məşğələləri" (2004), "Onurğasızlar zoologiyası" (2008) dərslik və dərs vəsaitləri, 100-ə yaxın elmi, metodiki və publisistik məqaləsi nəşr olunub.*

Həmin illərdə universitetin tədris və elmi həyatında xeyli dəyişikliklər baş verdi. Universitetdə müxtəlif ölkələrlə tələbə mübadiləsi, birgə elmi-tədqiqatların aparılması, beynəlxalq və regional təhsil layihələrində iştirak etmək istiqamətində müəyyən işlər görüldü. Fransanın Strasburq Dilçilik Universiteti ilə bağlanmış müqaviləyə əsasən 1999/2000-ci tədris ilində Fransa səfirliyinin təşəbbüsü ilə ADPU-da fransız dili şöbəsi açıldı və xarici dil (fransız dili) ixtisası üzrə kadr hazırlığına başlanıldı. İran Azad İslam Universitetinin Astara, Tonkabon və Rəşt filialları ilə elmi-pedaqoji əlaqə yaradıldı. Cənubi Azərbaycanda yaşayan soydaşlarımızın universitetimizdə ali pedaqoji təhsil almasına, dissertasiya yazmasına imkan və şərait yaradıldı.

1992/93-cü tədris ilində universitetə xarici ölkələrdən tələbə qəbul edib, oxutmaq məqsədilə bəzi ölkələrin şirkətləri və firmaları ilə kontrakt əsasında müvavilə imzalandı:1) Türkiyənin "Elis" fiması (İstanbul); 2)"Trek Travel İnterneşnl" (İstanbul); 3)"Özəl Sönməz Lisan" mərkəzi limitid şirkəti (Trabzon); 4)İran İslam Respublikasının "İbn Sina" firması (Təbriz).

Türkiyə universitetləri ilə əlaqə yaratmaq məqsədilə universitetin I prorektoru, prof.Nizami Xudiyevin rəhbərliyi ilə Pedaqoji Universitetin nümayəndə heyəti 1993-cü ilin 23-30 iyulunda İstanbul şəhərində elmi ezamiyyətdə olmuşdu.

1991-2006-cı illərdə universitetin bakalavriatura səviyyəsini 151, aspiranturasını 2 nəfər xarici ölkə vətəndaşı bitirmişdi. Həmin dövrdə magis-

traturada 4 nəfər Türkiyə Respublikasının, 1 nəfər İran İslam Respublikasının vətəndaşı təhsil almışdır. 2002-ci ildə Pedaqoji Universitetdə 240 nəfər əcnəbi tələbə, 1 magistr, 1 aspirant və 1 dissertant təhsil alırdı[212]. 2 nəfər Yəmən Respublikasının vətəndaşı Ümumi psixologiya kafedrasında namizədlik dissertasiyası yazmış və müdafiə etmişdi.

1996-cı ildə universitetdə 8 müxtəlif elmi istiqamət üzrə 5 əyani və 20 qiyabi aspirant təhsil alırdı.

23 noyabr 1996-cı ilin məlumatına görə Pedaqoji Universitetin tədris strukturu aşağıdakı kimi idi:1)Filologiya fakültəsi (dekan prof.Qəzənfər Kazımov); 2) Tarix fakültəsi (dekan dos.Rəhim Əliyev); 3) Riyaziyyat fakültəsi (dekan dos.Şakir Məmmədov); 4)Fizika fakültəsi (dekan prof.Mirzəli Murğuzov); 5)Kimya-biologiya fakültəsi (dekan prof.Roza Qafarova); 6)Pedaqogika və psixologiya fakültəsi (prof.Məmməd Məmmədov); 7) Pedaqoji fakültə (prof.Xəlil Fətəliyev); 8) Coğrafiya fakültəsi (dekan dos.Yavər Əliyev); 9) Mühəndis-pedaqoji fakültə (dekan prof.Kamal Hüseynov); 10) Bədii qrafika fakültəsi (dekan M.Yüzbaşıyev);11) İbtidai hərbi və fiziki təlim fakültəsi (dekan Rafiq Baxşəliyev); 12)Filologiya fakültəsi (qiyabi və axşam) (dekan prof.Xeyrulla Məmmədov); 13) Pedaqoji fakültə (qiyabi və axşam) (dekan prof.Qulam Əzimov); 14) Pedaqogika və psixologiya fakültəsi (qiyabi və axşam) (dekan dos.Musa Həsənov); 15) İxtisasartırma və yenidənhazırlama fakültəsi (dekan prof.Mikayıl Əliyev); 16) Şuşa filialı (direktor dos. Ənvər Əhmədov); Şamaxı filialı (dos.Mayıl Alıcanov).

Pedaqoji Universitetin 55 kafedrasında 16 ixtisas üzrə müəllim kadrları hazırlanırdı. Həmin dövrdə Pedaqoji İnstitutun özündə 6860 tələbə (4038-i əyani, 479-u axşam, 1284-ü qiyabi), Şuşa filialında 578 tələbə ( 420-i əyani, 158-i qiyabi), Şamaxı filialında 481 tələbə (315-i əyani, 166-ı qiyabi) oxuyurdu. Universitetdə təhsil alan 111 tələbənin 103-ü əyani, 8 nəfəri qiyabi təhsil alırdı. Azərbaycanlı tələbələrdən 1492 nəfəri (1000-i əyani, 304-ü qiyabi, 91-i axşam), xarici tələbələrdən 97 nəfəri ( 92-si əyani, 5-i qiyabi) ödənişli əsaslarla təhsil alırdı.1996-cı ildə universitetin 300 tələbəsinə maddi yardım göstərilmişdi.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin "Magistr hazırlığı haqqında" 13 fevral 1997 -ci il tarixli qərarına uyğun olaraq 1997-ci ilin sentyabrında ADPU-da aspirantura şöbəsinin bazası əsasında magistratura və doktorantura şöbəsi yaradıldı. *Dos.İsa İsmayılov* şöbəyə müdir təyin edildi. ADPU-nun magistraturasına BDU, NDU, BSU, LDU, ADU, BQU, kimi dövlət və qeyri-dövlət ali məktəblərinin məzunlarının qəbul olunması Pedaqoji Universitetin elmi-pedaqoji kadr hazırlığındakı nüfuzu ilə bağlı idi.

Magistraturanın ilk buraxılışı 1999/2000-ci tədris ilində oldu. Universiteti 10 istiqamət, 33 ixtisas üzrə 59 nəfər, 2000/2001-ci tədris ilində 33 ixtisas üzrə 116 nəfər bitirdi. Ümumiyyətlə, 5 il ərzində magistraturanı 10 istiqamət, 33 ixtisas üzrə 248 magistrant uğurla başa vurdu.

1997-2006-cı illərdə riyaziyyat, fizika, kimya, biologiya, coğrafiya ixtisasları üzrə magistraturaya

| İllər | İxtisaslar | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Riyaziyyat | | Fizika | | Kimya | | Biologiya | | Coğrafiya | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 1997 | 8 | - | 4 | - | 3 | - | 5 | - | 7 | - |
| 1998 | 9 | - | 6 | - | 9 | - | 9 | - | 10 | - |

212 **Ağayev B.** *Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi (1921-2001). Bakı, ADPU, 2002,s.284*

| | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| 1999 | 11 | - | 1 | - | 1 | - | 9 | - | 9 | - |
| 2000 | 13 | - | - | - | 2 | - | 17 | - | 8 | - |
| 2001 | 12 | - | 2 | - | 3 | - | 11 | - | 4 | - |
| 2002 | 11 | - | 4 | - | 6 | - | 16 | 2 | 6 | - |
| 2003 | 5 | - | 2 | - | 6 | - | 9 | 9 | 4 | - |
| 2004 | 7 | - | 5 | - | 8 | - | 15 | 10 | - | 2 |
| 2005 | 1 | - | 11 | - | 8 | - | 20 | 14 | 9 | 7 |
| 2006 | 13 | 10 | 6 | - | 12 | - | 19 | 18 | 9 | 8 |

1997-2006-cı illərdə filologiya, dilşünaslıq, tarix, psixologiya, maarif, musiqişünaslıq ixtisasları üzrə magistraturaya qəbul (əyani və qiyabi) aşağıdakı kimi olmuşdur

| İllər | İxtisaslar | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Filologiya | | Dilşünaslıq | | Tarix | | Psixologiya | | Maarif | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 1997 | 6 | - | 6 | - | 12 | - | 4 | - | 9 | - |
| 1998 | 12 | - | 8 | - | 24 | - | 13 | - | 20 | - |
| 1999 | 10 | - | 12 | - | 15 | - | 1 | - | 8 | - |
| 2000 | 7 | - | 13 | - | 11 | - | 5 | - | 16 | - |
| 2001 | 8 | 1 | 8 | - | 14 | - | 6 | - | 29 | - |
| 2002 | 13 | - | 12 | 3 | 19 | 2 | 6 | - | 12 | 6 |
| 2003 | 8 | 7 | 8 | 5 | 19 | 3 | 6 | - | 18 | 15 |
| 2004 | 8 | 6 | 7 | 5 | 11 | 8 | 4 | - | 7 | 11 |
| 2005 | 7 | 13 | 15 | 13 | 15 | 10 | 16 | 3 | 20 | 18 |
| 2006 | 8 | 9 | 18 | 9 | 18 | 13 | 18 | - | 37 | 48 |

Azərbaycan Respublikası Təhsil nazirinin 10 avqust 1999-cu il tarixli əmri ilə ali məktəblərdə tələbələrin biliyinin çoxballı sistemlə qiymətləndirilməsi haqqında Əsasnamə təsdiq edildi. Çoxballı sistem tələbələrin bilik, bacarıq və vərdişlərinin qiymətləndirilməsini, təkmilləşdirməni və onun səmərəliliyini artırmaq məqsədi ilə hər bir tələbəyə fərdi yanaşmanı nəzərdə tuturdu.Tələbə bir semestr (tədris ili) ərzində hər hansı fənn üzrə maksimum 100 bal toplaya bilərdi. Bunun yarısı semestr (tədris ili) ərzindəki fəaliyyətə, digər yarısı isə imtahanın nəticələrinə görə toplanırdı. Konkret fənn üzrə semestr (il) ərzində toplanmış balın miqdarına görə tələbələrin biliyi aşağıdakı kimi qiymətləndirilirdi: 50 baldan aşağı (50-də daxil olmaqla), - "qeyri kafi", 51-70 bal – "kafi", 71-90 bal – "yaxşı", 91-100 bal – "əla". Universitetdə tələbələrin biliyinin 100 ballı sistemlə qiymətləndirilməsi istiqamətində xeyli iş görüldü, tələbələr üçün yaddaş kitabçaları hazırlandı, seminar-məşğələlər təşkil edildi və hər bir tələbəyə semestr ərzində tələbələrin dərslərə davamiyyəti və keçilən dərslər üzrə fənn proqramlarının mənimsəmə göstəricilərinə dair özünənəzarət qrafiki verildi.

Həmin illərdə Universitetdə çalışan professor-müəllimlərin sayı artdı, tərkibi elmi dərəcəlilərin hesabına xeyli yaxşılaşdı. Əgər 1991-ci ildə universitetin 58 kafedrasında 701 nəfər (57 elmlər doktoru, professor,387 fəlsəfə doktoru, dosent, 257 baş müəllim və müəllim) çalışırdısa, 2000-ci ildə 62 kafedrada 749 nəfər (76 elmlər doktoru, professor, 332 fəlsəfə doktoru, dosent, 335 baş müəllim və müəllim), 2006-cı ildə 51 kafedrada 733 nəfər (54 elmlər doktoru, professor, 236 fəlsəfə doktoru, dosent, 459 baş müəllim və müəllim çalışırdı.

| İllər | Kafedraların sayı | Əməkdaşların sayı | O cümlədən | | Baş müəllim, müəllim |
|---|---|---|---|---|---|
| | | | Elm. dok.prof. | Fəlsəfə dok.dos. | |
| 1991 | 58 | 701 | 57 | 387 | 257 |
| 1992 | 58 | 699 | 57 | 370 | 272 |
| 1993 | 58 | 842 | 73 | 274 | 495 |
| 1994 | 60 | 701 | 54 | 291 | 356 |
| 1995 | 60 | 736 | 52 | 288 | 396 |
| 1996 | 61 | 708 | 80 | 330 | 298 |
| 1997 | 61 | 717 | 49 | 290 | 378 |
| 1998 | 61 | 700 | 66 | 298 | 336 |
| 1999 | 61 | 727 | 80 | 332 | 315 |
| 2000 | 62 | 743 | 76 | 332 | 335 |
| 2001 | 50 | 797 | 70 | 347 | 380 |
| 2002 | 50 | 786 | 67 | 314 | 405 |
| 2003 | 50 | 767 | 57 | 297 | 413 |
| 2004 | 50 | 779 | 59 | 287 | 433 |

| | | | | | |
|---|---|---|---|---|---|
| 2005 | 50 | 750 | 59 | 277 | 414 |
| 2006 | 51 | 749 | 54 | 236 | 459 |

Bu illərdə ADPU-nun əməkdaşlarından Azadxan Adıgözəlov (1992), Məlikməmməd Cəbrayılov (1998) riyaziyyat, Rəcəb Əliyev (1999) kimyanın tədrisi metodikası, Əzizxan Tanrıverdiyev (1998), Buludxan Xəlilov (1999), Mirvari İsmayılova (2002), Elman Quliyev (2004), Mahmud Allahmanov (2007), Ramazan Qafarlı (2010), Ramin Əhmədov (2011) filologiya, Oqtay Sultanov (1996) tarix, Fərrux Rüstəmov (2003) pedaqogika, Əli Hüseynov (2003) biologiyanın tədrisi metodikası, Əli Allahverdiyev (2005) iqtisadi nəzəriyyə ixtisasları üzrə doktorluq dissertasiyaları müdafiə etdilər.

Həmin illərdə *Vəli Əliyev*[213] çoxşaxəli elmi yaradıcılığına və elmi-pedaqoji kadr hazırlığındakı xidmətlərinə görə Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, *Hüseyn Əhmədov*[214], *Sədi İmanov*[215] isə Rusiya Təhsil Akademiyasının xarici üzvü seçildilər. Onlarla əməkdaş Nyu-York Akademiyasının, Beynəlxalq Pedaqoji Akademiyanın, Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi və müxbir üzvləri seçildi.

1991-2006-cı illərdə də doktorantura (əyani, qiyabi və dissertantura) elmi-pedaqoji kadr hazırlığında əsas yol hesab olunurdu. Pedaqoji Universitetin doktoranturasına müxtəlif ixtisaslar üzrə 111 nəfər qəbul edilmişdi. Universiteti fərqlənmə diplomu ilə bitirənlərə, ikiillik pedaqoji təcrübəsi olanlara doktoranturaya qəbul zamanı üstünlük verilirdi. Həmin illərdə də Pedaqoji Universitet pedaqogika, psixologiya və fənlərin tədrisi metodikası ixtisasları üzrə kadr hazırlığında üstünlüyünü qoruyub saxlayırdı.

| İllər | Qəbul | | Cəmi | Buraxılış | | Cəmi |
|---|---|---|---|---|---|---|
| | əyani | qiyabi | | əyani | qiyabi | |
| 1991 | 3 | 17 | 20 | 6 | - | 6 |
| 1992 | 9 | 7 | 16 | 12 | - | 12 |
| 1993 | - | - | - | 13 | 13 | 26 |
| 1994 | 1 | 9 | 10 | 3 | 7 | 10 |
| 1995 | 3 | 4 | 7 | 12 | 17 | 29 |
| 1996 | 3 | 7 | 10 | - | 7 | 7 |
| 1997 | 1 | 1 | 2 | 2 | - | 2 |
| 1998 | 2 | 4 | 6 | 3 | 8 | 11 |
| 1999 | 1 | - | 1 | 4 | 5 | 9 |
| 2000 | 2 | - | 2 | 1 | 5 | 6 |
| 2001 | 3 | 1 | 4 | 1 | 1 | 2 |

*[213] Prof.Vəli Əliyev 2003-cü ildə Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü seçilmişdir.*
*[214] Prof.Hüseyn Əhmədov 1990-cı ildə SSRİ PEA-nın müxbir üzvü seçilmişdi.*
*[215] Prof.Sədi İmanov 1984-cü ildə SSRİ PEA-nın müxbir üzvü, 1990-cı ildə SSRİ PEA-nın Rəyasət heyətinin üzvü seçilmişdi.*

| | | | | | | |
|---|---|---|---|---|---|---|
| 2002 | 3 | 1 | 4 | 2 | 5 | 7 |
| 2003 | 2 | 11 | 13 | - | - | - |
| 2004 | 3 | 3 | 6 | 3 | - | 3 |
| 2005 | 3 | 3 | 6 | 2 | 1 | 2 |
| 2006 | 2 | 2 | 4 | 2 | - | 2 |

Bu dövrdə Azərbaycan Dövlət Pedaqoji Universitetində yeni elmi-tədqiqat laboratoriyaları fəaliyyətə başladı. 2000-ci ilin dekabr ayında ictimai elmlər sahəsi üzrə uzun illər fəaliyyət göstərən üç problem laboratoriyanın bazasında "Dədə Qorqud" elmi tədqiqat laboratoriyası (rəhbər prof.Buludxan Xəlilov) yaradıldı. Laboratoriyanın 3 bölməsi vardı:1) Onomastika-dialektologiya-etimologiya (müdir prof. Afad Qurbanov); 2) Folklor-etnoqrafiya -mifologiya (müdir prof.Mürsəl Həkimov); 3) Pedaqogika - psixologiya-fəlsəfə (müdir dos.Fərrux Rüstəmov).

2000-ci illərin əvvəllərində yenidən Azərbaycan Dövlət Pedaqoji Universitetinin yubileyinin keçirilməsi məsələsi aktuallaşdı. Müəyyən hazırlıqdan sonra ADPU-nun rektoru, prof.Bəhlul Ağayev Təhsil Nazirliyinə yubileyin keçirilməsi ilə bağlı müraciət etdi. Təhsil Nazirliyinə ünvanlanan məktubda deyilirdi: *"26 avqust 2001-ci il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin 80 yaşı tamam olacaqdır. Yarandığı gündən bu ali təhsil ocağı Azərbaycanda təhsilin inkişafında önəmli rol oynamış,nəinki respublikamızda, həm də Gürcüstan, Ermənistan və Dərbənd bölgələri üçün yüksəkixtisaslı müəllim kadrları hazırlamışdır. ADPU-nun alim-pedaqoqları Azərbaycan elminin inkişafına önəmli töhfələr vermişlər. Onlar elmin aktual sahələrində səmərəli elmi axtarışlar aparır, dərslik, dərs vəsaiti və proqramlar hazırlayır, çoxpilləli təhsilin həyata keçirilməsində əzmlə çalışır, müstəqil Azərbaycan Respublikasının möhkəmlənməsi və müdrik prezidentimiz cənab H.Əliyevin qarşıya qoyduğu siyasi, iqtisadi və mənəvi tələbləri həyata keçirmək üçün var qüvvələri ilə çalışırlar. Universitetimizin 80 ildə əldə etdiyi nailiyyətlərin böyük bir hissəsi hörmətli prezidentimiz H.Əliyevin ardıcıl və məqsədyönlü fəaliyyəti, Azərbaycan təhsilinə, elminə və mədəniyyətinə gündəlik qayğısı, nadir təşkilatçılığı ilə bağlı olmuşdur. Onun 1971, 1973,1977-ci illərdə 3 dəfə universitetə[216] gəlişi bu təhsil ocağında təlim-tərbiyə prosesinin yaxşılaşmasına, universitetdə mənəvi-psixoloji şəraitin yaranmasına ruhlandırıcı amil olmuşdur.*

*Universitetimizin 80 illik yubileyi müstəqil Azərbaycan Respublikasının 10-cu ildönümünə təsadüf edir. ADPU-nun professor-müəllim və tələbə kollektivi bu tarixi bayramları təhsil islahatının həyata keçirilməsi sahəsində fərəhli uğurlarla qarşılayırlar. Azərbaycan Respublikasının Prezidenti dünya şöhrətli siyasi lider cənab Heydər Əliyevi və Sizi, respublikanın Təhsil nazirini əmin edirik ki, Azərbaycan təhsilinin, elminin, mədəniyyətinin tərəqqisi naminə,*



Rektor prof.B.Ağayev iclas apararkən

[216] *Ulu öndər Heydər Əliyev iki dəfə də 80-ci illərdə (1981 və 1982) Azərbaycan Dövlət Pedaqoji Universitetində olmuşdur.*

*saf və sağlam gənclər tərbiyə etmək sahəsində universitetimiz səylərini bundan sonra da əsirgəməyəcək"*

Məktubda ADPU-nun 80 illik yubileyinin təntənəli şəkildə keçirilməsi ilə əlaqədar yuxarı təşkilatlara müraciət edilməsi xahiş olunur. Universitetin 80 illik yubileyinin keçirilməsi ilə bağlı xeyli tədbirlərin həyata keçirilməsi planlaşdırılsa da, onların böyük əksəriyyətini həyata keçirmək mümkün olmadı. Yalnız "Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi (1921-2001)" kitabı[217] və "Azərbaycan Dövlət Pedaqoji Universiteti" adlı buklet nəşr edildi. Yubiley isə keçirilmədi.

2004-cü il oktyabrın 1-də ADPU-da "Türk dili və ədəbiyyatı okuma odası" fəaliyyətə başladı. "Türk odası"Türkiyənin Azərbaycandakı Səfirliyi tərəfindən rəsmi olaraq qeydə alındı."Oda"nın vasitəçiliyi ilə universitetdə Türkiyə Cümhuriyyətinin Azərbaycandakı Böyük Elçiliyi arasında mədəni əlaqələrin qurulmasına, Türkiyə universitetləri ilə tanışlıq xarakterli elmi-pedaqoji əlaqələrin yaradılmasına nail olundu.

2005-ci ilin dekabr ayında universitetdə Əcnəbi tələbələrin işi üzrə fakültə yaradıldı.Yeni təşkil olunan bu fakültəyə 2006-cı ildən başlayaraq fizika, kimya, biologiya və riyaziyyat ixtisasları üzrə 500-dən artıq xarici ölkə (xüsusilə Türkiyə) vətəndaşı qəbul olundu.

2006-cı ildə Türkiyə Cümhuriyyətinin Hacəttəpə Universiteti ilə əməkdaşlıq müqaviləsi bağlandı. 2006-cı ildə Filologiya və Kimya fakültələrində eksperiment qaydasında kredit sisteminin tətbiqinə başlanıldı. Bu məqsədlə kredit sisteminə uyğunlaşdırılmış tədris planları hazırlandı.

1996-2006-cı illərdə universitetin nəşriyyatında (müdir Hüseyn Hacıyev) bakalavriat pilləsi üçün 18 ixtisas üzrə 308 fənn proqramı 1125 dərslik, dərs vəsaiti Təhsil Nazirliyinin müvafiq qrifləri ilə çap olundu. Magistratura pilləsi üçün 28 ixtisas üzrə fənn proqramlarının çapı başa çatdırıldı.

İldən-ilə genişlənən kitabxana (müdir Məmməd Həsənov) fondunda 708000 kitab, jurnal və qəzet komplektləri, dissertasiya var idi. Tələbələrə 3 ixtisaslaşmış xidmət şöbəsinin əməkdaşları 5 oxu zalında xidmət göstərirdilər. Kitabxananın 8 şöbə və 11 bölməsində 70 əməkdaş çalışırdı.

2003-cü ildən sonra Ulu öndər Heydər Əliyevin xatirəsini əbədiləşdirmək, onun zəngin və mənalı həyat yolunu, çoxşaxəli fəaliyyətini dərindən öyrənmək, təbliğ etmək, gələcəyin müəllimlərini dövlətçiliyə sədaqət və azərbaycançılıq ruhunda tərbiyə etmək ADPU-nun professor-müəllim heyətinin ən ümdə vəzifələrindən birinə çevrildi. Ulu öndərin xatirəsinə ehtiram əlaməti olaraq ADPU-nun foyesində onun abidəsi qoyuldu, nadir eksponatları sərgiləyən, professor-müəllimlərin, tələbələrin və universitetin qonaqlarının ziyarət məkanına çevrilən Heydər Əliyev Muzeyi yaradıldı. Zəngin irsinin gənc nəslə çatdırılması məqsədilə "Heydər Əliyev məktəbinin lektoriyası" təşkil edildi.



*Rektor prof.B.Ağayev iclas apararkən*

## Pedaqoji Universitetin strukturu
### *(2000-ci illərin əvvəllərində)*

2000/01-ci tədris ilində Pedaqoji Universitetdə 10 fakültə, 50 kafedra və 2 filial fəaliyyət göstərirdi:

**I.Filologiya fakültəsi**

(dekan prof.*Həsən Balıyev)*

1.1.Azərbaycan dilçiliyi kafedrası - müdir prof. Afad Qurbanov

[217] ***B.İ.Ağayev.*** *Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi (1921-20001) (Elmi redaktorları:prof.F.A.Rüstəmov, b/m.H.Q.Əliyev).Bakı, ADPU,202, 299 s.*

1.2.Müasir Azərbaycan dili kafedrası - müdir prof. Həsən Mirzəyev

1.3.Azərbaycan dilinin tədrisi metodikası kafedrası- müdir əvəzi dos.Musa Həsənov

1.4.Azərbaycan və dünya ədəbiyyatı tarixi kafedrası - müdir prof.Abbas Hacıyev

1.5.Ədəbiyyatın tədrisi metodikası kafedrası - müdir prof.Aydın Hacıyev

1.6.Xarici dillər kafedrası - müdir dos.prof. Balaxan Hüseynov

1.7. Rus dili kafedrası - müdir dos. Tamuris Əliyeva

**II.Tarix fakültəsi**

(dekan dos. *Rəhim Əliyev)*

2.1. Azərbaycan tarixi kafedrası - müdir prof. Süleyman Məmmədov,

2.2.Türk və Şərqi Avropa xalqları tarixi və tarixin metodikası kafedrası- müdir prof.Oqtay Sultanov

2.3. Ümumi tarix kafedrası - müdir prof.Vəli Əliyev

2.4. Ümumi pedaqogika kafedrası - müdir prof. Hüseyn Əhmədov,

2.5.Fəlsəfə kafedrası - müdir dos.Bəşir Fərəcov

2.6. İqtisadi və sosial fənlər kafedrası - müdir prof.Əli Allahverdiyev)

**III.Kimya-biologiya fakültəsi**

(dekanı prof.*Ələkbər Qurbanov)*

3.1. Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrası – müdir prof.Ələkbər Qurbanov

3.2. Üzvi kimya və kimya texnologiyası kafedrası - dos.Rafiq Ələkbərov

3.3.Analitik və fiziki kimya kafedrası - prof. NailəVerdizadə

3.4.Zoologiya kafedrası müdir prof.Bəhlul Ağayev 3.5.Botanika kafedrası müdir prof.Yusif Əhmədov

3.6.İnsan və heyvan fiziologiyası kafedrası müdir prof.Ədalət Fərəcov

3.7.Mülki müdafiə və tibbi biliklərin əsasları kafedrası – müdir prof.Tamella Feyzullayeva

3.8 Biologiyanın tədrisi metodikası kafedrası - müdir dos..Əli Hüseynov

**IV.Fizika fakültəsi**

(dekan prof.*Mirzəli Murğuzov)*

4.1.Mexanika və molekulyar fizika kafedrası- müdir dos.Ə.Əhmədov

4.2.Elektrik və optika kafedrası- müdir prof. Mirzəli Murğuzov

4.3.Nəzəri fizika və astronomiya kafedrası- müdir prof.İsgəndər Cəfərov

4.4.Fizikanın tədrisi metodikası kafedrası- müdir prof.Sədi İmanov

**V.Riyaziyyat fakültəsi**

**(***dekan dos.Maqsud Nəcəfov***)**

5.1.Riyazi analiz kafedrası- müdir prof.Məlikməmməd Cəbrayılov

5.2.Cəbr və həndəsə kafedrası- müdir dos.Yafəs Baxşəliyev

5.3.İnformatika və hesablama riyaziyyatı kafedrası- müdir dos.Zenfira Tağıyeva

5.4.Funksiyalar nəzəriyyəsi kafedrası- müdir prof.Qardaşxan Orucov

5.5.Riyaziyyat və onun orta məktəbdə tədrisi metodikası kafedrası- müdir dos.Tinatin Əliyeva

**VI.Pedaqoji fakültə**

(*dekan prof. Zahid Xəlilov*)

6.1.İbtidai təhsilin pedaqogikası və metodikası kafedrası- müdir *dos.Həmzə Əliyev*

6.2. Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrası – müdir prof.Seyidağa Həmidov

6.3.Musiqi fənləri və onun tədrisi metodikası kafedrası- müdir dos.Jalə Qədimova

6.4.Musiqi alətləri kafedrası - müdir dos.Minarə Dadaşova

6.5.İbtidai siniflərdə rus dili kafedrası - müdir dos.Ramidə Məmmədova

**VII. Coğrafiya**

(*dekan dosent Yavər Əliyev)*

7.1.Ümumi coğrafiya kafedrası -müdir dos. Mustafa Əliyev

7.2.Fiziki coğrafiya kafedrası- müdir dos.Alı Əliyev

7.3.İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrası- müdir dos. Dadaş Ələsgərov

**VIII.Pedaqogika və psixologiya fakültəsi**
**(***dekan dos.Allahverdi Hacıyev***)**

8.1.Ümumi psixologiya kafedrası- müdir prof.Əbdül Əlizadə

8.2.Məktəbəqədər pedaqogika kafedrası- müdir dos.Raya Mursaqulova

8.3.Yaş və pedaqoji psixologiya kafedrası- - müdir prof.Ərəstun Baxşəliyev

**IX.Mühəndis-pedaqoji və bədii qrafika fakültəsi**
*(dekan prof. Həşim Həşimov)*

9.1.Elektroradiotexnika kafedrası- müdir dos. Ədnan Ağalarov

9.2.İstehsalatın əsasları və fizika kafedrası- dos.Saleh Abdullayev

9.3.Maşınşünaslıq kafedrası- müdir dos.Akif Məmmədov

9.4.Təsviri incəsənət, rəsmxət və onların tədrisi metodikası kafedrası- müdir dos.Soltan Atayev

9.5. Rəsm, heykəltəraşlıq və boyakarlıq kafedrası- müdir dos.Fərahim Zeynalov

**X.Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsi**
*(dekan dos.Rafiq Baxşəliyev)*

10.1.Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı onun tədrisi metodikası kafedrası - müdir b/m.Tahir Fərzəliyev

10.2.Bədən tərbiyəsi və yüngül atletikanın tədrisi metodikası kafedrası - müdir dos.Rafiq Baxşəliyev

10.3.Təknövlülük və idman oyunlarının tədrisi metodikası kafedrası - müdir dos.Əziz Muradov

10.4.Bədən tərbiyəsi və idman kafedrası-müdir dos.Əli Mehtiyev

Universitetdə *Pedaqoji kadrların ixtisaslarının artırılması və yenidən hazırlanması fakültəsinin* (*dekan dos.İbrahim Bayramov*) təşkilatçılığı ilə ildə 120 nəfər professor-müəllim fevral və oktyabr aylarında Azərbaycan Müəllimlər İnstitutunda üç aylıq ixtisasartırma kurslarında iştirak edirdi. Fakültənin yenidənhazırlama şöbəsində 198 nəfər dinləyici təhsil alırdı ki, onların da təhsil-tərbiyəsi ilə 25 professor-müəllim məşğul olurdu

## Pedaqoji Universitetin Şuşa filialı

Şuşa filialı 1973-cü ildə Pedaqoji İnstitutun Xankəndi filialının bazasında müstəqil institut kimi təşkil edilən Xankəndi Pedaqoji İnstitutunun Azərbaycan bölməsi əsasında yaranmışdır. 1988-ci illərdə qədim Azərbaycan torpağı olan Qarabağın dağlıq hissəsində yaşayan ermənilərin ərazi iddiaları ilə çıxış etmələri Xankəndi Pedaqoji İnstitutunda tədris prosesinin pozulması ilə nəticələndi. Xankəndi Pedaqoji İnstitutunun azərbaycanlı professor-müəllim və tələbə kollektivi erməni millətçilərinin əməllərinin, məkrli planlarının həyata keçirilməsinə maneçilik törətdiyindən onlara ciddi fiziki və mənəvi təzyiq göstərilirdi. Ölüm təhlükəsi ilə üzbəüz qalan institutun Azərbaycan şöbəsinin müəllim və tələbələri 1988-ci il mayın 16-da erməni silahlıları tərəfindən Xankəndindən qovuldu. Pedaqoji kollektiv Şuşa şəhərində müvəqqəti sığınacaq tapdı. Şuşa Mədəni Maarif Texnikumunun tədris binası və yataqxanasında yerləşdirildi. 26 iyun 1998-ci ildə texnikumun binasında Şuşa ictimaiyyəti ilə görüşən Xüsusi İdarəetmə Komissiyasının sədri A.Volski növbəti tədris ilində tələbələrin Xankəndi Pedaqoji İnstitutuna qaytarılacağı haqqında söz verdi. Erməni iddialarının getdikcə genişlənməsi problemin tezliklə həllinə şübhə yaradırdı. Azərbaycanlı tələbələrin yenidən Xankəndi Pedaqoji İnstitutuna qayıdaraq ermənilərlə birlikdə təhsil alması qeyri-mümkün idi. 14 oktyabr 1988-ci ildə SSRİ Nazirlər Sovetinin sədri N.Rıjkov Xankəndi Pedaqoji İnstitutunun fəaliyyətinin müvəqqəti dayandırılması haqqında qərar verdi. Bununla əlaqədar olaraq SSRİ Xalq Təhsili Komitəsinin sədr müavini Q.F.Qusev 17 oktyabr 1988-ci il tarixində 6 maddədən ibarət 382 saylı qərar verdi. Qərarda Azər-

baycan və Ermənistan xalq təhsili nazirlərinə tapşırıldı ki, Xankəndi Pedaqoji İnstitutunun 2 il müddətinə müvəqqəti olaraq bağlanması ilə əlaqədar olaraq institutun tələbələri həmin ilin noyabrın 1-nə kimi Azərbaycanın Gəncə, Ermənistanın Yerevan, Leninakan və Kirovakan pedaqoji institutlarına köçürülsünlər. Erməni şöbəsi qərara etinasız yanaşaraq öz fəaliyyətini Sovet Azərbaycanının 60 illiyi adına Xankəndi Pedaqoji İnstitutunda davam etdirdi.Azərbaycan Xalq təhsil naziri Müslüm Məmmədov Azərbaycan şöbəsi tələbələrinin bir hissəsinin Gəncə, digər hissəsinin isə Naxçıvan pedaqoji institutlarına köçürülməsi qərarına gəldi. İki yerə bölünmə ilə bağlı kollektivin (*kollektivə müvəqqəti olaraq Raqub Kərimov rəhbərlik edirdi*) ciddi etirazından sonra 100 nəfərlik professor-müəllim kollektivi və 1200 nəfər tələbə Gəncə Pedaqoji İnstitutuna köçürüldü. Müəllim və tələbələrin Gəncə Pedaqoji İnstitutuna köçürülməsi ilə bağlı Azərbaycan Xalq təhsil naziri Müslüm Məmmədov18 oktyabr 1988-ci ildə 6 maddədən ibarət 121 saylı qərar verdi və köçürülmə ilə bağlı komissiya (14 nəfərdən ibarət) yaratdı. Komissiyanın sədri, nazir müavini Y.İ.Korotkov, müavin B.A.Xankişiyev idi.

Həmin dövrdə Gəncə Pedaqoji İnstitutuna *Qurban Qurbanov* rəhbərlik edirdi. O, Şuşadan gələn tələbələrin Gəncə Pedaqoji İnstitutuna yerləşdirilməsi ilə bağlı 22 oktyabr 1988-ci il tarixli 5/199 saylı əmr imzaladı. Tələbələr həmin ilin noyabrın 25-də Gəncədə tədrisə başladılar. Bir ilə yaxın Gəncədə fəaliyyət göstərən pedaqoji kollektivin təkidli tələbi ilə şöbənin Şuşaya köçürülməsi qərara alındı.1989-cu il oktyabrın 25-də pedaqoji kollektiv Şuşaya köçürüldü. Bir gün sonra dərslər başlandı. Müəllim və tələbələrin Şuşaya köçürülməsində dos.Raqub Kərimovun, dos.Ənvər Əhmədin, dos.Mayıl Alıcanovun, dos.Zəfər Hüseynovun, dos.Mirələm Vəliyevin, dos.Süleyman Zeynalovun mühüm xidmətləri oldu.

Azərbaycan SSR Xalq təhsili naziri R.Feyzullayevin 1 noyabr 1989-cu il tarixli 1160 saylı əmrinə əsasən Şuşada Azərbaycan Pedaqoji İnstitutunun ***Şuşa fakültəsi*** yaradıldı. Fakültə Şuşa internat məktəbinin bazasında yerləşdirildi. Fakültənin normal fəaliyyət göstərməsi üçün tədris binası əsaslı təmir edildi. Bu məqsədlə Şuşa rayon Partiya Komitəsi 160 min rubl. ayırdı. Xankəndi Pedaqoji İnstitutunun ləğvindən sonra Gəncəyə və digər ali pedaqoji məktəbə gedən tələbələr öz fakültələrinə qayıtdı. 15 noyabr 1989-cu ildə ADPİ-nin rektoru,prof.S.Aslanovun əmri ilə tarix elmləri na-




*Şuşa qalası*



*Xarı bülbül - ordumuzun zəfər simvolu*



*ADPU-nun Şuşa filialının binası*

mizədi, dosent ***Mail Alıcanov*** fakültənin dekanı, dos.*Zəfər Hüseynov* dekan müavini təyin edildi. Prof.Nəcəf Quliyev, prof.Nazim Axundov, prof. Kamil Quliyev, dos.Süleyman Zeynalov, dos.Ənvər Əhməd, dos.Mirələm Vəliyev, dos.Yusif Ağayev, dos.Zabil Bayramov, dos.Şahlar Kərimov, dos.Yusif Fərzəliyev, dos.İnqilab Quliyev, dos.Kazım Mirzəyev, dos.İslam Həşimov, dos.Raqub Kərimov, dos.Nəsib Şəfiyev, dos.Məhəmməd Hüseynov və b Şuşa fakültəsində öz fəaliyyətlərini davam etdirməyə başladılar.

***Mail Sədyar oğlu Alıcanov***
***tarix elmləri namizədi, dosent***
*(1939)*



*1939-cu ildə Şamaxının Ovculuda kəndində anadan olmuşdur.1957-ci ildə orta məktəbi, M.Ə.Sabir adına Pedaqoji Məktəbi, 1962-ci ildə ADU-nun tarix fakültəsini bitirib. Mərəzə rayonunun Ağdərə kəndində müəllim, Şamaxı rayonunun Bağırlı kənd orta məktəbində dərs hissə müdiri işləyib. 1968-1971-ci illərdə Azərbaycan EA-nın Tarix İnstitutunun əyani aspirantı olub. Prof.Qaraş Mədətovun elmi rəhbərliyi ilə "Azərbaycan döyüşçülərinin Ukrayna və Belorusiyada partizan hərəkatında iştirakı" mövzusunda namizədlik dissertasiyası müdafiə edib. 1979-1988-ci illərdə Sovet Azərbaycanının 60 illiyi adına Xankəndi Pedaqoji İnstitutunda baş müəllim, dosent, kafedra müdiri vəzifələrində çalışıb.1989-1991-ci illərdə ADPİ-nin Şuşa fakültəsinin ilk dekanı və ADPU-nun Şuşa filialının ilk direktoru olub.1991-2000-ci illərdə ADPU-nun Şamaxı filialının, 2000-2002-ci illərdə Azərbaycan Müəllimlər İnstitutunun Şamaxı filialının direktoru olub. ADPU-nun Şamaxı filialının Sosial və pedaqoji elmlər kafedrasının müdiri, Şamaxı rayon ziyalılarının sədridir. 7 kitabın, 70-dən artıq məqalənin müəllifidir.*

Xalq Təhsili Nazirliyinin icazəsi ilə fakültədə riyaziyyat, Azərbaycan dili və ədəbiyyat, tarix, ibtidai təhsilin pedaqogikası və metodikası ixtisasları üzrə pedaqoji kadr hazırlığı davam etdirildi. Nazir R.Feyzullayevin əmri ilə fakültənin strukturunun və ştat cədvəlinin müəyyənləşdirilməsi və əmrə nəzarət Plan-iqtisad idarəsinin rəisi Bəybala Xankişiyevə və Ali təhsil idarəsinin rəisi Misir Mərdanova, fakültənin Əsasnaməsinin hazırlanması ADPU-nun rektoru prof.Səlvər Aslanova həvalə edildi.

Az sonra Şuşa rayon Partiya Komitəsinin birinci katibi, SSRİ Ali Sovetinin üzvü *Vaqif Cəfərov* ADPU-nun Şuşa fakültəsinin filiala çevrilməsi ilə bağlı Azərbaycan SSR Nazirlər Sovetinin sədri *Həsən Həsənova* məktubla müraciət etdi. Məktubda Şuşa fakültəsinin təşkili üçün zəruri olan tədbirlərin həyata keçirildiyi bildirilir və Şuşa fakültəsinin APİ-nin filialına çevrilməsinə kömək göstərməsi xahiş olunurdu[218]. Məktubda yazılırdı:"*Qarabağa Xalq Yardım Komitəsinin vəsaiti ilə 7 mərtəbəli yataqxananın və əlavə tədris korpusunun tikintisi planlaşdırılır. Şuşa fakültəsində riyaziyyat, Azərbaycan dili və ədəbiyyat, tarix, ibtidai təhsilin pedaqogikası və metodikası ixtisaslarında 600 –dən artıq tələbə təhsil alır. Fakültədə bir neçə tədris laboratoriyası təşkil olunmuş və müasir avadanlıqlarla təchiz edilmişdir.Yeni fənn kabinetləri yaradılmışdır. Rektorluq fakültəyə hesablama maşınları vermişdir. 20 min nüsxədən artıq dərslik və dərs vəsaiti alınmışdır. Fakültədə 7 kafedra var.*

[218] *AŞuşa fakültəsinin filiala çevrilməsi haqqında sənədlər.(Filialın ilk direktoru M.Alıcanovun təqdim etdiyi sənədlər müəllifin arxivindədir).*

*Kafedralarda 36 professor-müəllim fəaliyyət göstərir ki, onlardan da 3-ü elmlər doktoru, professor, 23-ü elmlər namizədi, dosentdir. Xalq Təhsili Nazirliyinin 26 aprel 1990-cı il tarixli 48004-1939 16 saylı əmri ilə qəbul imtahanlarının Şuşa şəhərində keçirilməsinə icazə verilmişdir.Bu məqsədlə APİ-dən fakültəyə ezam olunmuş 2 elmlər doktoru, professorun və 5 elmlər namizədi, dosentin iştirakı ilə qəbul komissiyası yaradılmışdır. 1990/91-ci tədris ilində Şuşa fakültəsinin əyani və qiyabi şöbələrinə Azərbaycan dili və ədəbiyyat, tarix əlavə sovet hüququ, riyaziyyat, informatika və hesablama texnikasının əsasları, ÜTF və fizika, İbtidai təlim pedaqogikası və metodikası, pedaqogika və psixologiya (məktəbəqədər tərbiyə) ixtisasları üzrə 250 tələbə qəbul olunmuşdur."*

Fakültənin dekanı dos. Mail Alıcanov, dekan müavini dos.Zəfər Hüseynov, partiya təşkilatının katibi dos.M.Hüseynov, həmkarlar təşkilatının sədri dos.Y.Ağayev də fakültənin filiala çevrilməsinə köməklik göstərməsi üçün Nazirlər Sovetinin sədri *Həsən Həsənova* məktubla müraciət etmişdilər. V.İ.Lenin adına ADPİ-nin Şuşa fakültəsinin professor-müəllim heyəti və tələbə kollektivi adından fakültənin filiala çevrilməsi ilə bağlı Azərbaycan KP MK-nın birinci katibi *Ayaz Mütəllibova* müraciət etmişdi. Fakültənin kollektivi bununla bağlı mətbuatda xeyli yazılar dərc etdirmişdilər.

ADPİ-nin rektorluğunun Şuşa fakültəsinin filiala çevrilməsi ilə bağlı 13-03/265 saylı 17 mart 1990-cı il tarixli məktubuna Xalq Təhsili Nazirliyi müsbət rəy vermişdir. Nazirliyin Ali təhsil idarəsinin rəisi Misir Mərdanov 28 mart 1990-cı ildə Plan iqtisad idarəsinin rəisi Bəybala Xankişiyevə ünvanladığı məktubda yazırdı*:"V.İ.Lenin adına APİ-nin Şuşa şəhərində fəaliyyət göstərən fakültəsinin maddi-texniki bazasının və professor-müəllim heyətinin bugünkü tələbə cavab verməsini nəzərə alaraq Nazirliyin Ali təhsil idarəsi Şuşa fakültəsinin V.İ.Lenin adına APİ-nin Şuşa filialına çevrilməsi məsələsinin müsbət həll olunmasını məqsədəuyğun hesab edir".*

14 aylıq mübarizədən sonra Nazirlər Sovetinin sədri Həsən Həsənov Şuşa rayon Xalq Deputatları Soveti İcraiyyə Komitəsi və Xalq Təhsili Nazirliyinin təkliflərini nəzərə alaraq Şuşa fakültəsinin əsasında ADPİ-nin ***Şuşa filialının*** təşkili haqqında 26 yanvar 1991-ci ildə 4 maddədən ibarət 23 saylı sərəncam imzaladı. Nazirlər Sovetinin sədrinin sərəncamına uyğun olaraq 22 fevral 1991-ci ildə Xalq Təhsili Nazirliyi 22 maddədən ibarət 116 saylı əmr, 25 mart 1991-ci ildə ADPU-nun rektoru, prof.S.Aslanov 3/93 saylı əmr imzaladı.İnstitut üzrə verilən əmrə nəzarət tədris işləri üzrə prorektor prof.Eldar Abbaszadəyə, qiyabi və axşam şöbələri üzrə prorektor Məlikməmməd Cəbrayılova həvalə edildi.

Xalq təhsil naziri prof.R.Feyzullayevin imzaladığı həmin əmrlə Şuşa filialının 14 maddəlik Əsasnaməsi təsdiq olundu. Şuşa fakültəsinin dekanı dosent ***Mail Alıcanov*** filialın direktoru vəzifəsinə təyin edildi. ADPİ-nin rektorunun əmri ilə dosent ***Zəfər Hüseynov*** tədris və elmi işlər üzrə, ***Səyyar Əliyev*** isə inzibati-təsərrüfat işləri üzrə direktor müavinləri təyin edildilər.

1 aprel 1991-ci ildə ADPİ-nin rektoru, prof. S.Aslanovun imzaladığı 1/183 saylı əmrlə filialın strukturu aşağıdakı kimi təsdiq edildi:

Filialda 3 fakültə:1) ***Tarix-filologiya*** (dekan dos.Raqub Kərimov); 2) ***Pedaqoji*** (dekan dos. İslam Həşimov); 3) ***Fizika-riyaziyyat*** (dekan dos. Nəsib Şəfiyev) yaradıldı.

Filialda aşağıdakı kafedralar fəaliyyət göstərirdi:

1.Ədəbiyyat və onun tədrisi metodikası kafedrası[219] (müdir *prof.Kamil Quliyev);*

2.Dilçilik və onun tədrisi metodikası kafedrası (müdir dos.*İlhami Cəfərsoylu);*

3.Ümumi tarix kafedrası[220] *(müdir dos. Kazım Mirzəyev*);

4. SSRİ tarixi kafedrası (*müdir dos.Yusif Fərzəliyev*);

5.Ümumi riyaziyyat kafedrası[221] *(müdir dos. Cəfər Zeynalov*);

---

[219] *Ədəbiyyat və onun tədrisi metodikası kafedrası prof.N.Axundov və prof. K.Quliyev rəhbərlik etmişdir.*

[220] *Ümumi tarix kafedrasının ilk müdiri dos.Rəftar İmanov olmuşdur.*

[221] *Ümumi riyaziyyat kafedrasının ilk müdiri N.Məmmədov olmuşdur. Sonrakı illərdə kafedraya dos.Cəfər Zeynalov (1992-2000) rəhbərlik etmişdir.*

6.Fizika və ÜTF kafedrası[222] (*müdir prof.Əbülfət Rüstəmov*);

7.Sosial-siyasi elmlər kafedrası (*müdir dos. Yusif Ağayev*);

8.Pedaqogika və psixologiya kafedrası[223] (*müdir dos. Mirələm Vəliyev*);

9.Bədən tərbiyəsi kafedrası (*müdir b/m. İsa Qasımov).*

Həmin əmrlə 44 nəfər (30 müəllim, 14 tədris-köməkçi heyət) işə qəbul edilir ki, onlardan da 21 nəfərinin elmi dərəcəsi var idi. Filialın inkişafına, tələbə və müəllimlərin sayının artmasna, maddi-texniki bazanın möhkəmlənməsinə, yeni laboratoriya və kabinetlərin yaradılmasına, onların avadanlıqlarla təchiz edilməsinə həm Xalq Təhsili Nazirliyi, həm də ADPU-nun rektorluğu qayğı ilə yanaşırdı. 1991-ci ildə ADPU-nun Şuşa filialına daxil olmaq üçün ərizə verənlərin sayı çox olduğundan 30 nəfər müvəffəq qiymət alsalar da, müsabiqədən keçə bilməmişdi. 12 avqust 1991-ci il tarixində Azərbaycan KP Şuşa Rayon Komitəsinin birinci katibi, SSRİ Ali Sovetinin üzvü V.Cəfərov Xalq təhsili naziri, Sov.İKP Nəzarət-təftiş komissiyasının üzvü, prof.R.Feyzullayevə məktubla müraciət edərək müsabiqədən keçməyən həmin tələbələrin tələbə heyətinə daxil edilməsi üçün sərəncam verməyi xahiş edir. Nazirlik bütün imtahanlardan müvəffəq qiymət alaraq müsabiqədən keçməyən 30 nəfərin ("Pedaqogika və psixologiya"- 6 nəfər, "İbtidai təlim pedaqogikası və metodikası"- 14 nəfər, "Tarix, əlavə sovet hüququ"-8, "Azərbaycan dili və ədəbiyyatı"-1, "ÜTF, əlavə fizika"-1) tələbələr sırasına daxil edilməsinə müsbət yanaşıb.

Tez-tez filialın fəaliyyətini təşkil etmək məqsədilə institutun əməkdaşları Şuşa filialına ezam olunur. Həmin dövrdə Pedaqoji Universitetin tədris işləri üzrə prorektoru vəzifəsində çalışan prof. Məlikməmməd Cəbrayılov o günləri belə xatırlayır*:"Qarabağ hadisələri başlananda erməni millətçiləri Xankəndi Pedaqoji İnstitutunu hədəfə almışdılar. Bu institutun Qarabağ bölgəsində təhsilin, maarifçiliyin inkişafında müstəsna xidmətləri olmuşdu. Azərbaycanlı müəllim və tələbələr Xankəndindən qovulanda onlar Şuşada yerləşdilər. Xankəndi Pedaqoji İnstitutunun Azərbaycan şöbəsi ADPU-nun filialı kimi yenidən təşkil olunanda rektor Səlvər Aslanov, mən və Qulu müəllim Şuşaya getməli olduq. Vəziyyət həddən artıq təhlükəli idi. Mən onda gördüm ki, Səlvər müəllim çox cəsarətli, vətənpərvər və qorxmaz adamdır. Biz Ağdama getdik, oradan da Xankəndindən keçməklə Şuşaya qalxdıq. Bizi az sonra müdafiə naziri olan general Dadaş Rzayev müşayiət edirdi. Səlvər Aslanov o dövrdə Azərbaycan Ali Sovetinin deputatı idi. Şuşada filial üçün yaxşı bir bina ayrılmışdı. Filiala rəhbərlik dos.Mail Alıcanova həvalə olunmuşdu. Filialın müəllimləri, tələbələri ilə maraqlı və yadda qalan görüşlərimiz oldu. Tədrisin təşkili ilə bağlı xeyli təklif və tövsiyələrimiz oldu. Bütün çətinliklərə baxmayaraq filialın professor-müəllimləri əzmlə çalışırdılar. Kollektivdə nikbin əhvali-ruhiyyə hökm sürürdü. Tələbələrin hamısı Şuşaya qayıtmışdı. Axşama yaxın Ağdama qayıtmalı idik. Xəbər gəldi ki, ermənilər daha da azğınlaşıb, azərbaycanlıların maşınlarını gülləbaran edir, insanları girov götürürlər. Biz vertolyotla Ağdama, oradan da maşınla Bakıya gəldik. Səhərisi gün Səlvər müəllim rektoryanı müşavirə çağırdı.Şuşa filialı ilə bağlı prorektorlara və struktur rəhbərlərinə konkret tapşırıqlar verdi".*

Çətin dövrlər olmasına baxmayaraq, kollektiv tədrisin keyfiyyətinin aşağı düşməməsinə çalışırdı.



*ADPU-nun rektoru prof.S.Aslanov, prorektor M.Cəbrayılov və filialın müəllimləri. Şuşa. 1991*

[222] *Fizika və ÜTF kafedrasına prof.Əbülfət Rüstəmovdan sonra dos.Ə.Hümbətov rəhbərlik etmişdir.*

[223] *Pedaqogika və psixologiya kafedrasının ilk müdiri dos.İslam Həşimov olmuşdur.Sonrakı illərdə kafedraya dos.Mirələm Vəliyev, dos.Süleyman Zeynalov, dos.Şərqiyyə Quliyeva, dos.Tahir Hüseynov rəhbərlik etmişdir.*

Ermənilərin tez-tez yolu bağlaması, avtobusların düşmən hücumlarına məruz qalması professor-müəllim və tələbə kollektivini ruhdan salmırdı. Əsas çətinlik ondan ibarət idi ki, Bakıdan filial üçün ayrılan avadanlıqlar maşınla Ağdama aparılır, oradan Şuşaya vertolyotla Müəllimlərin əksəriyyəti günlərlə Ağdam aeroportunda qalmalı olurdu. Erməni təxribatı, demək olar ki, hər gün genişlənirdi. Erməni qəsbkarlarının açdığı atəş nəticəsində filialın iki müəllimi Böyük Vətən Müharibəsi veteranı Mürşüd Dünyamalıyev və gənc alman dili müəllimi Sara Əliyeva, filialın iki tələbəsi *Elsevər* və *İldırım* şəhid oldular. Xeyli tələbə müxtəlif dərəcəli xəsarət almışdı. Xocalı faciəsi erməniləri daha da azğınlaşdırmışdı. Növbəti hədəf Qarabağın tacı Şuşa idi. Şuşa şəhəri topxana tərəfdən “Alazan” tipli raketlərlə atəşə tutulurdu. Filialın yerləşdiyi bina düşmənin əsas hədəflərindən biri idi. Şəhərdə vahiməli bir ab-hava hökm sürürdü.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 1 iyul 1991-ci il 200 saylı əmri ilə Şamaxıda N.Tusi adına ADPU-nun filialı açıldı. Həmin ilin avqust ayında dos. Mail Alıcanov yeni yaranan filiala direktor vəzifəsinə köçürüldü. ADPU-nun Şuşa filialında kadr dəyişikliyi baş verdi. Belə ki, ***dos.Zəfər Hüseynov*** filiala direktor, dos.*Ənvər Əhməd* direktor müavini təyin edildi. İnzibati-təsərrüfat işləri baş müəllim *Ənvər Quliyevə* həvalə olundu.



***Zəfər Qafar oğlu Hüseynov***
*fizika-riyaziyyat elmləri namizədi, dosent*
*(1953)*

*1953-cü ildə Şuşa şəhərində anadan olub. 1970-ci ildə H.Hacıyev adına 4 №-li Şuşa şəhər məktəbini, 1975-ci ildə ADU-nu bitirib. 1985-ci ildə “Sinqulyar inteqrallar üçün kvadratur və kubatur düsturlar və onların tətbiqləri” mövzusunda namizədlik dissertasiyası müdafiə edib. Xankəndi Pedaqoji İnstitutunda dosent, ADPİ-nin Şuşa fakültəsinin dekan müavini, Şuşa filialının tədris və elmi işlər üzrə direktor müavini, direktoru (1991-1994) vəzifələrində işləyib. ADPU-nun Hesablama riyaziyyatı və informatika kafedrasının dosenti olub. 2002-ci ildən Sumqayıt Dövlət Universitetinn Riyaziyyat fakültəsinə rəhbərlik edir. Əməkdar müəllim fəxri adına (2012) layiq görülüb.*

ADPU-nun Şuşa filialının fəaliyyəti uzun sürmədi. O dövrdə erməni silahlıları azərbaycanlılar yaşayan kəndlərə tez-tez hücum edirdilər. Bir neçə azərbaycan kəndi ermənilər tərəfindən işğal olunmuşdu. Tələbələrin və müəllimlərin həyatı üçün ciddi təhlükə yaranmışdı. Bütün bunlara baxmayaraq, ADPU-nun Şuşa filialı öz fəaliyyətini davam etdirirdi. Filialın fəaliyyətini genişləndirmək, əlavə olaraq, Şuşada Azərbaycan Neft-Kimya İnstitutunun və Azərbaycan Tibb Universitetinin filiallarını açmaq nəzərdə tutulsa da, bunları reallaşdırmaq mümkün olmadı. ADPU-nun Şuşa filialının təhlükəsiz yerə köçürülməsi qərara alındı.1992-ci ilin mart ayının 25-də filialın kollektivi Ağcabədi şəhərinə 1 saylı məktəbin binasına köçürüldü, daha sonra 114 saylı Texniki Peşə Məktəbinin binasında yerləşdirildi. Respublikda tələbə qəbulunun test üsulu ilə aparılması Şuşa filialının tələbə kontingentinin ildən-ilə azalmasına səbəb oldu.

1994-cü ilin iyun ayının 28-də Şuşa filialının rəhbərliyində kadr dəyişikliyi aparıldı. ***Dos.Ənvər Əhməd*** filialın direktoru təyin edildi. Filialda üç fakültədə 6 ixtisas üzrə pedaqoji kadr hazırlığı aparılırdı.

***Ənvər Misir oğlu Əhmədov***
*filologiya elmləri namizədi, dosent*
*(1943)*



*1943-cü il avqustun 8-də Ağcabədi rayonunun Salmanbəyli kəndində anadan olmuşdur. Ağcabədi 5 №-li şəhər orta məktəbini, Bakı Statistika Texnikumunu (1961), Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsini (1968) bitirmişdir. "M. Ə. Sabirin poetikası" mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir (1982). Ağcabədi rayon "Sürət" (indiki "Aran") qəzetində ədəbi işçi, müxbir, məktublar şöbəsinin müdiri (1968-1976), Xankəndi Dövlət Pedaqoji İnstitutunun Azərbaycan dili və ədəbiyyatı kafedrasında müəllim, sonra dosent (1976-1994) işləmişdir. N.Tusi adına ADPU-nun Şuşa filialının direktoru (1994-2000), Azərbaycan Müəllimlər İnstitutunun Ağcabədi filialının direktoru (2000-2002), Təhsil İnstitutunun şöbə müdiri olmuşdur. Azərbaycan Yazıçılar Birliyinin Qarabağ filialının sədri seçilmişdir (1991). 30 -dək elmi və bədii kitabın müəllifidir.*

Tarix-filologiya fakültəsinə dos.*Raqub Kərimov*, Pedaqoji fakültəyə dos. *İslam Həşimov*, Riyaziyyat fakültəsinə 1996-cı ildən baş müəllim *Ənvər Quliyev* rəhbərlik edirdi. Filialda tədris işləri ilə yanaşı elmi-tədqiqat işlərinə də ciddi fikir verilirdi. Əvvəlki strukturdan fərqli olaraq burada Xarici dillər kafedrası təşkil edilmişdi. Kafedraya dos. *Ə.Səfərova* rəhbərlik edirdi. ADPU-nun rektoru, prof.Bəhlul Ağayevin təşəbbüsü ilə ildə iki dəfə ADPU-nun Elmi Əsərlərinə əlavə olaraq filialın əməkdaşlarının əsərlərindən ibarət məqalələr məcmuəsinin nəşri qərara alınmışdı.

Filialda tədris və elmi işlərin yüksək səviyyədə aparılmasına həm Pedaqoji Universitetin (prof.Həsən Mirzəyev, dos.Bəşir Fərəcov və b.), həm də digər ali təhsil və elmi-tədqiqat institutlarının əməkdaşları (prof.Bala İsgəndərov, dos. Ataş Abdullayev, dos.Mirələm Vəliyev, prof.C.Vəliyev, prof.Ə.Vəliyev və b.) yaxından kömək etmişdir.

Azərbaycan Respublikasının Prezidenti H.Əliyevin 2000-ci il 13 iyun tarixli 349 saylı Fərmanı ilə Filial Azərbaycan Müəllimlər İnstitutunun tərkibinə daxil edildi. ADPU-nun Ağcabədidə tədris məntəqəsi (rəhbər dos.Raquf Kərimov) yaradıldı.

## Pedaqoji Universitetin Şamaxı filialı

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 1 iyul 1991-ci il tarixli 200 saylı qərarı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialı təşkil edildi. Filiala tarix elmləri namizədi, dosent ***Mail Alıcanov*** direktor, Vahid Xanəliyev tədris və elmi işlər üzrə direktor müavini təyin edildi.

Xalq Təhsili Nazirliyinin sərəncamı ilə 1991-ci ilin sentyabrında Şamaxı filialında tarix, Azərbaycan dili və ədəbiyyatı, riyaziyyat, ibtidai təlim pedaqogikası və metodikası, pedaqogika və psixologiya (məktəbəqədər tərbiyə) ixtisasları üzrə qiyabi şöbəyə qəbul keçirilmişdir. 1992-ci ildə Xalq Təhsili Nazirliyinin rəhbərliyinin dəyişdirilməsi Şamaxı filialına ögey münasibətin yaranmasına səbəb oldu. Filialın fakültəyə çevrilməsi və ya bağlanması məsələsi müzakirə predmetinə çevrildi. Bunu N.Tusi adına ADPU-nun Şamaxı filialının

direktoru, dos.Mail Alıcanovun Azərbaycan Respublikası Xalq təhsili naziri Firudin Cəlilova 12 sentyabr 1992-ci ildə ünvanladığı 58 saylı məktub sübut edir. Məktubda oxuyuruq:” *Filialın təşkili ilə əlaqədar Şirvan zonası rayonlarında pedaqoji kadrlara olan tələbatı təhlil edilərkən məlum olmuşdur ki, ümumtəhsil məktəblərinin müəllimlərlə təmin edilməsi cəmi 50-65% təşkil edir. Bununla əlaqədar filialın əhatə etdiyi bütün rayonların İcra Hakimiyyətinin başçıları və Xalq Təhsili Şöbələri ilə 2000-ci ilədək müqavilə bağlanılmış və Respublika Xalq Təhsili Nazirliyinə təqdim olunmuşdur. Hazırda filialın tam fəaliyyət göstərməsi sahəsində xeyli iş görülmüş, müasir tələblərə cavab verən auditoriyalar və fənn kabinetləri yaradılmış, möhkəm maddi-texniki baza təşkil edilmiş, bir milyon manatdan çox avadanlıq gətirilmişdir. Respublika Nazirlər Kabineti və Xalq Təhsili Nazirliyinin razılığı əsasında smeta dəyəri on milyon manat olan 5650№-li obyektin inzibati binası Şamaxı filialına verilmişdir. 1992/93-cü tədris ili üzrə qiyabi və əyani şöbələrə tələbə qəbulu planı müəyyənləşdirilməmişdir. Lakin bizə məlum olmayan səbəblərə görə Şamaxı filialının bağlanması və yaxud onun fakültəyə çevrilməsi barədə müxtəlif şayiələr danışılır”.*

Həqiqətən də həmin illərdə Mingəçevir və Lənkəran filialları müstəqil institutlara çevrildiyi, Quba, Qazax, Şəki filiallarına əyani və qiyabi şöbələrinə qəbul planı verildiyi halda, onlardan da əvvəl yaranan Şamaxı filialına qəbul planı verilməmişdi. Filialın ciddi arqumentlər əsasında yazdığı məktub filialın birdən-birə bağlanması təhlükəsinin qarşısını aldı. Ulu öndər Heydər Əliyevin ikinci dəfə xalqın təkidli tələbi ilə siyasi hakimiyyətə qayıdışı, ölkə həyatının bütün sahələrində olduğu kimi, ali pedaqoji təhsil sahəsində də yeni inkişafın əsasını qoydu. ADPU-nun Şamaxı filialı bir milyondan artıq əhalisi olan Şirvan zonası və ətraf rayonlar üçün pedaqoji kadr hazırlığı mərkəzinə çevrildi.



*ADPU-nun Şamaxı filialının direktoru, dos.M.Alıcanov (ortada) və müəllimlər qrupu*

Filialın ***Pedaqoji*** fakültəsində Azərbaycan dili və ədəbiyyat, tarix-coğrafiya, pedaqogika və psixologiya (məktəbəqədər tərbiyə), riyaziyyat ixtisasları üzrə pedaqoji kadr hazırlığı həyata keçirilirdi.

Filialda 4 kafedra:1) *Dil-ədəbiyyat* (dos. S.Qəniyev); 2)*Tarix* (dos.Maarif Xalıqov (1992-1993), dos.İlham Həsənov (1993-1995), Fazil Osmanov (1996-2000); 3) *İbtidai təhsilin pedaqogikası və metodikası* (dos.Ə.Mustafayev), 4) *Riyaziyyat və informatika* (dos.Əlsahib Abudov) fəaliyyət göstərirdi. Sonrakı illərdə Riyaziyyat, pedaqogika və psixologiya ixtisaslarını əhatə edən Pedaqoji və təbiət elmləri kafedrası yaradıldı. Dos.Əlsahib Mustafayev kafedraya müdir təyin olundu.



*Prof.M.Salahov və dos.Ə.Haqverdiyev filialın qiyabi şöbəsində qəbul imtahanı zamanı. (1991)*

Şamaxı filialının əyani və qiyabi şöbələrinin 1991-2000-ci illərdə 1460 nəfər məzunu olmuşdur. Məzunlardan 24 nəfəri filialı fərqlənmə diplomu ilə bitirmişdir. Filialda 8 fənn kabineti, 2 laboratoriya, 2 kompüter kabineti, zəngin kitab fondu olan kitabxana, idman zalı, 200 yerlik klub, 50 yerlik yeməkxana, oxu zalı fəaliyyət göstərirdi.



*Filialın tələbələri İsmayıllıda folklor təcrübəsində. Sağdan üçüncü şair Musa Yaqub*

Tələbələrin təhsil-tərbiyəsi ilə 42 nəfər professor-müəllim məşğul olurdu ki, onlardan da 5 nəfəri elmlər doktoru, 3 nəfəri professor, 7 nəfəri dosent, 18 nəfəri elmlər namizədi idi. Elmlər doktoru, professorlar ADPU-dan və pedaqoji təmayüllü ali məktəblərdən dəvət olunanlar idi. Prof. Məlikməmməd Cəbrayılov, prof.Azadxan Adgözəlov, prof. Məmməd Balıyev, prof.Həmzağa Orucov, prof. Həmdulla Aslanov, prof. Tofiq Mustafazadə, prof. İsmayıl Məmmədov, dos. Miri Həsənov, dos.Zəfər Hüseynov, dos.Bəyməmməd Cəbrayılov, dos.Vasif Nəbiyev filialda ayrı-ayrı ixtisaslardan mühazirələr oxuyurdular.

Filialın əməkdaşlarından 3-ü tarix, 5-i ədəbiyyatşünaslıq və dilçilik, 4-ü pedaqogika və psixologiya, 1-i fizika-riyaziyyat, 3-ü siyasi elmlər, 1-i coğrafiya, 1-i fəlsəfə, 1-i fizika-riyaziyyat ixtisasları üzrə namizədlik, 1-i doktorluq dissertasiyası müdafiə etdi. Dissertasiya müdafiə edənlərdən Seyfəddin Qəniyev (doktorluq) Eyvaz Eminalıyev, Əlistan Əkbərov, Xudaverdi Lazımov, Zərifə Cavadova, Şahsəddin Mikayılov, Fəxrəddin Məmmədov, Ceyhun Alıyev, Kamal Balakişiyev və b. uzun müddət filialda elmi-pedaqoji fəaliyyətlə məşğul oldular.

Filialın özfəaliyyət kollektivi 1993-cü ildə türk dilli gənclərin Türkiyədə keçirilən beynəlxalq folklor festivalında mükafata layiq görülmüşdülər.

Filialın direktor müavini, prof. Seyfəddin Qəniyevin təşəbbüsü ilə S.Ə.Şirvaninin yadigarı olan “Beytüs-Səfa” məclisinin 132 illik yubileyi keçirilmiş və o yenidən təsis olunmuşdur.

2000-ci ildə filialda tarix, Azərbaycan dili və ədəbiyyat, riyaziyyat, ibtidai təhsilin pedaqogikası və metodikası ixtisasları üzrə 500 nəfərdən artıq tələbə təhsil alırdı.

Filialın əməkdaşları 8 istiqamətdə (tarix, ədəbiyyatşünaslıq, dilçilik, coğrafiya, pedaqogika, riyaziyyat, fəlsəfə, psixologiya) 22 mövzu üzrə elmi -tədqiqat işləri aparırdılar. 14 nəfər ADPU-nun və digər ali təhsil və elmi tədqiqat müəssisələrinin doktorant və dissertantları kimi tarix, riyaziyyat, dilçilik, fizika, ədəbiyyatşünaslıq, pedaqogika, psixologiya elminin aktual problemləri ilə bağlı fəlsəfə doktoru dissertasiyası üzərində işləyirdilər.

Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin 2000-ci ilin 13 iyun tarixli 349 saylı sərəncamı ilə Şamaxı filialı yeni yaradılan Azərbaycan Müəllimlər İnstitutunun tərkibinə daxil edildi. ADPU-nun Şamaxı şəhərində tədris məntəqəsi təşkil edildi. Tədris məntəqəsi *dos.Mail Alıcanova* həvalə edildi.

## Azərbaycan Dövlət Pedaqoji Universitetinin 85 illik yubileyi

2006-cı ilin aprel ayının 21-də Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə AMEA-nın müxbir üzvü, əməkdar elm xadimi, fizika-riyaziyyat elmləri doktoru, prof. ***Yusif Məmmədov*** Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru vəzifəsinə təyin olundu.

Tədris işləri üzrə prorektor, prof.*Məlikməmməd Cəbrayılov*, elmi işlər üzrə prorektor, prof.*Vilayət Əliyev*, ümumi işlər üzrə prorektor dos.*Vüqar Mehrabov*, tərbiyə işləri üzrə prorektor prof.*Rafiq Baxşəliyev* öz vəzifələrində saxlanıldılar.



***Yusif Əbülfət oğlu Məmmədov***
*AMEA-nın həqiqi üzvü, Əməkdar elm xadimi,*
*fizika-riyaziyyat elmləri doktoru, professor*
*(1950)*

*1950-ci ilin yanvar ayının 24-də Qərbi Azərbaycanın Sisiyan rayonunun Dəstəgird qəsəbəsində anadan olub. 1966-cı ildə Dəstəgird qəsəbə orta məktəbini qızıl medalla bitirib. 1971-ci ildə ADU-nun Mexanika-riyaziyyat fakültəsini fərqlənmə diplomu ilə bitirib. Akademik Məcid Rəsulovun elmi rəhbərliyi ilə 1974-cü ildə ADU-nun Mexanika-riyaziyyat fakültəsinin nəzdindəki Dissertasiya Şurasında "Korrekt birölçülü məsələlər və onların həllinin analitik göstərilişi" mövzusunda namizədlik, 1990-cı ildə Tbilisi Riyaziyyat İnstitutunun İxtisaslaşdırılmış Dissertasiya Şurasında "Ümumi şəkilli adi diferensial tənliklər sistemi üçün spektral məsələlərin tədqiqi və uyğun qarışıq məsələlərin həlli üçün çıxıqlar üsulunun əsaslandırılması" mövzusunda doktorluq dissertasiyası müdafiə edib. 1971-1992-ci illərdə həmin kafedrada assistent, baş müəllim, dosent vəzifələrində çalışıb. 1991-ci ildə ona professor elmi adı verilib. 1992-1993-cü illərdə İstanbul Texniki Universitetində professor vəzifəsində çalışıb. 1993-cü ildə BDU-nun riyazi fizika kafedrasının müdiri vəzifəsinə seçilib. 2000-2004-cü illərdə BDU-nun tətbiqi riyaziyyat və kibernetika fakültəsinin dekanı, 2004-2006-cı illərdə BDU-nun I prorektoru - elmi işlər üzrə prorektoru, 2006-2016-cı illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru vəzifələrində çalışıb.*

*Prof.Yusif Məmmədov Moskva, Novosibirsk, Tbilisi, Afina, İstanbul, Zəncan şəhərlərində keçirilmiş müxtəlif miqyaslı konfranslarda Azərbaycan riyaziyyat elmini layiqincə təmsil etmişdir. Onun məruzələri V.İ.Steklov adına Rusiya Elmlər Akademiyasının Riyaziyyat İnstitutunun, Moskva Dövlət Universitetinin Mexanika-riyaziyyat, Tətbiqi riyaziyyat və kibernetika fakültələrinin, Novosibirsk Dövlət Universitetinin, Ukrayna EA-nın Tətbiqi Riyaziyyat İnstitutunun, Tbilisi Riyaziyyat İnstitutunun elmi seminarlarında görkəmli riyaziyyatçı alimlərin (V.P.Mixaylov, A.A.Dezin, A.Q.Kostyuçenko, A.A.Şkalikov, A.Q.Şveşnikov, S.A.Qabov, L.V.Skrıpnik, M.V.Fedoryuk, V.N.Vraqov, İ.T.Kıquradze və b.) böyük marağına səbəb olmuşdur.*

*Prof.Yusif Məmmədovun fəaliyyət istiqamətlərindən birini də milli riyaziyyatçı kadrların hazırlanması təşkil edir. Onun rəhbərliyi ilə 20 fəlsəfə doktoru və 3 elmlər doktoru dissertasiyası müdafiə olunmuşdur. O, çoxsaylı fəlsəfə doktoru və elmlər doktoru dissertasiyalarının rəsmi opponenti olmuşdur. BDU və AMEA-nın Riyaziyyat və Mexanika İnstitutunun nəzdində elmlər doktoru və fəlsəfə doktoru alimlik dərəcələri verən Müdafiə Şurasının üzvü kimi səmərəli fəaliyyət göstərmiş, ayrı-ayrı vaxtlarda ADPU-nun nəzdindəki Dissertasiya Şurasının və Azərbaycan Respublikası Prezidenti yanında AAK-ın riyaziyyat və mexanika elmləri üzrə Ekspert Şurasının sədri olmuşdur. O, Təhsil Nazirliyi Kollegiyasının, YUNESKO-nun "Elmi biliklərin və texnologiyaların etikası" Azərbaycan Komitəsinin üzvü, Təhsil Nazirliyi nəzdində fəaliyyət göstərən fasiləsiz pedaqoji təhsil üzrə Koordinasiya Şurasının sədri olmuşdur. "ADPU-nun Xəbərləri" elmi məcmuəsinin baş redaktoru, "AMEA-nın Xəbərləri", "BDU-nun Xəbərləri", "Riyaziyyat və Mexanika İnstitutunun Əsərləri", "Sumqayıt Dövlət Universitetinin Xəbərləri", "Kurikulum" jurnallarının redaksiya heyətinin üzvü kimi səmərəli fəaliyyət göstərmişdir. Onun Azərbaycanın və xarici ölkələrin nüfuzlu nəşrlərində 130-dan artıq elmi əsəri nəşr olunmuşdur.*

*Azərbaycan Dövlət Pedaqoji Universitetinin 85 və 90 illik yubiley tədbirlərinin təntənəli şəkildə dövlət səviyyəsində keçirilməsində prof.Yusif Məmmədovun xüsusi xidmətləri olmuşdur.*

*Akademik Yusif Məmmədovun elmi və pedaqoji fəaliyyəti dövlət tərəfindən yüksək qiymətləndirilib. 2000-ci ildə ona Əməkdar elm xadimi fəxri adı verilib. 2001-ci ildə Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, 2017-ci ildə həqiqi üzvü (akademiki) seçilib. 2010-cu ildə "Şöhrət" ordeninə, 2019-cu ildə isə 2-ci dərəcəli "Əmək" ordeninə layiq görülüb. 2016-2017-ci illərdə Azərbaycan Respublikası Təhsil nazirinin müşaviri vəzifəsində çalışıb. Hazırda BDU-nun Riyazi fizika tənlikləri kafedrasının müdiridir.*



*ADPU-nun kollektivi Fəxri xiyabanda*

Həmin illərdə respublikada təhsilin bütün səviyyə və pillələrində, o cümlədən ali pedaqoji təhsil sahəsində intensiv islahatlar həyata keçirilirdi. Bu məqsədlə Təhsil Nazirliyi nəzdində Fasiləsiz Pedaqoji Təhsil üzrə Koordinasiya Şurası yaradıldı və Pedaqoji Universitetin rektoru, prof. Y.Məmmədov həmin şuraya sədr təyin olundu. Pedaqoji Universitet ali pedaqoji təhsil sahəsində islahatların strategiya və taktikasını hazırlayan qərərgaha çevrildi. Respublikada müəllim kadrları hazırlığını həyata keçirən təhsil müəssisələrinin professor-müəllimlərinin də təmsil olunduğu Koordinasiya Şurası ali pedaqoji təhsilin məzmununun təkmilləşdirilməsi, yeni tədris plan və standartlarının tərtibində uğurlu işlərə imza atdı.




*ADPU-da azərbaycanlıların soyqırımına həsr olunmuş tədbir*

Yeni dövrün çağırışlarına uyğun olaraq ADPU-nun maddi-texniki bazasının möhkəmləndirilməsi və infrastrukturunun yeniləndirilməsi, tədrisin keyfiyyətinin yüksəldilməsi, müəllim kadrları hazırlığının təkmilləşdirilməsi istiqamətində xeyli işlər görüldü. Belə qiymətləndirmə ilk dəfə Pedaqoji Universitetdə həyata keçirildi. İctimai-siyasi, elmi-pedaqoji və kütləvi tədbirlərin keçirildiyi böyük zal yenidən quruldu, oturacaqlar yeniləndi. Yeni elmi-tədqiqat və tədris laboratoriyaları, kompüter mərkəzi quruldu və müasir avadanlıqlarla təchiz edildi. Professor-müəllim kollektivinin fəaliyyəti universitetin 85 illik yubileyinin yüksək səviyyədə keçirilməsinə istiqamətləndirildi. Qısa bir müddətdə ali pedaqoji təhsilin təşkilində, məzmunun təkmilləşdirilməsində, tələbələrin təlim nailiyyətlərinin obyektiv və şəffaf qiymətləndirilməsində, beynəlxalq elmi-pedaqoji əlaqələrin genişləndirilməsində əsaslı dəyişiklik baş verdi. Maddi-texniki bazanın möhkəmləndirilməsi, professor-müəllim və tələbə kollektivi arasında mənəvi-psixoloji mühitin sağlamlaşdırılması istiqamətində ciddi islahatların əsası qoyuldu.

Pedaqoji kadr hazırlığının mərkəzi hesab edilən Pedaqoji Universitetdə aparılan müsbət işlər ölkə rəhbərliyinin diqqətindən yayınmadı. Universitetin 85 illik yubileyinin dövlət səviyyəsində keçirilməsi qərara alındı. Bu məqsədlə Universitetin struktur rəhbərlərinin iştirakı ilə təşkilat komitəsi yaradıldı.Universitetin rektoru, AMEA-nın müxbir üzvü,



Rumıniyanın Babeş-Bolyai Universitetinin rektoru prof. A.Marqa ADPU-nun Heydər Əliyev muzeyi ilə tanış olarkən



Türkiyə Cümhuriyyəti YÖK-nin başkanı Yusif Ziya Azərbaycan Dövlət Pedaqoji Universitetində




ADPU-nun 85 illik yubiley tədbirində




ADPU-nun 85 illik yubileyi münasibəti ilə buraxılan xatirə medalı

professor Yusif Məmmədovun rəhbərliyi ilə "Azərbaycan Dövlət Pedaqoji Universiteti (1921-2006)"[224] kitabı və Azərbaycan, rus və ingilis dillərində "Azərbaycan Dövlət Pedaqoji Universiteti"[225] adlı məlumat kitabı hazırlandı.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 26 dekabr 2006-cı il tarixli Sərəncamı ilə Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə Pedaqoji Universitetin bir qrup əməkdaşı yüksək dövlət mükafatlarına layiq görüldü. 28 dekabr 2006-cı ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin əsas binasında (Səbail korpusu) bu ali təhsil ocağının 85 illik yubileyinə həsr olunmuş təntənəli yığıncaq keçirildi. Milli Məclisin deputatlarının, Təhsil Nazirliyi rəhbərliyinin, bir sıra Dövlət Komitələri sədrlərinin, Bakının bir sıra rayonları icra hakimiyyəti başçılarının, müxtəlif universitetlərin nümayəndələrinin iştirak etdiyi tədbiri Təhsil naziri Misir Mərdanov açaraq, kollektivə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin təbrikini çatdırdı. Sonra cənab Prezidentin 26 dekabr 2006-cı il tarixli Sərəncamının mətnini səsləndirdi, yüksək dövlət mükafatına layiq görülən professor-müəllimləri təbrik etdi. Məlum oldu ki, dövlətimizin başçısı Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə universitetin 2 əməkdaşını "Şöhrət" ordeni, 16 nəfərini "Tərəqqi" medalı ilə təltif etmiş, 2 nəfərə "Əməkdar elm xadimi", 19 nəfərə "Əməkdar müəllim" fəxri adı vermişdir.

224 *Azərbaycan Dövlət Pedaqoji Universiteti (1921-2006). (Elmi redaktoru və buraxılışa məsul: prof.V.Əliyev, prof.F. Rüstəmov). Bakı: ADPU, 2006, 312 s.*

225 ***V.Əliyev, F.Rüstəmov, D.Əhədova.*** *Azərbaycan Dövlət Pedaqoji Universiteti. Bakı:2006, 52 s.*

## Azərbaycan Dövlət Pedaqoji Universitetinin əməkdaşlarının təltif edilməsi haqqında Azərbaycan Respublikasının Prezidentinin Sərəncamı

Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə Azərbaycan Dövlət Pedaqoji Universitetinin aşağıdakı əməkdaşları təltif edilsin:

***"Şöhrət"ordeni ilə***

1.Əlizadə Əbdül Əli oğlu
2.Murquzov Mirzəli İsmayıl oğlu

***"Tərəqqi" medalı ilə***

1.Ağalarov Ədnan Məmməd oğlu
2.Baxşəliyev Rafiq Məmmədbağır oğlu
3.Hacıyev Abbas Məmməd oğlu
4.Hacıyev Allahverdi Şəmistan oğlu
5.Həşimov Həşim İsaq oğlu
6.Hüseynov Balaxan Qaraxan oğlu
7.Hüseynov Kamal Dadaş oğlu
8.Xəlilov Buludxan Əziz oğlu
9.Xəlilov Zahid Abdulla oğlu
10.Qasımov Himalay Ənvər oğlu
11.Musayev Nəsrəddin İsa oğlu
12.Nəcəfov Maqsud Ağaqulu oğlu
13.Novruzov Tərlan Cabbar oğlu
14.Paşayev Əmrulla Xanməd oğlu
15.Rüstəmov Fərrux Abbas oğlu
16.Sultanov Oqtay Balaqadaş oğlu

***İlham Əliyev,***
***Azərbaycan Respublikasının Prezidenti***
***Bakı şəhəri, 26 dekabr 2006-cı il***

## Azərbaycan Dövlət Pedaqoji Universitetinin əməkdaşlarına fəxri adların verilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə Azərbaycan Dövlət Pedaqoji Universitetinin aşağıdakı əməkdaşlarına Azərbaycan Respublikasının fəxri adları verilsin:

***"Əməkdar elm xadimi" fəxri adı ilə***

1.Əfəndiyev Paşa Şərif oğlu
2.Məmmədov Süleyman Abbas oğlu

***"Əməkdar müəllim" fəxri adı ilə***

1.Balıyev Həsən Balı oğlu
2.Cəbrayılov Məlikməmməd Saday oğlu
3.Əbdülov Məmmədəli Şamil oğlu
4.Əhmədov Yusif Kərəm oğlu
5.Əliyev Mustafa Cahan oğlu
6.Əliyev Rəhim İbrahim oğlu
7.Əliyev Vilayət Hüseyn oğlu
8.Əliyeva Tinatin Məmməd qızı
9.Həmidov Seyidağa Sail oğlu
10.Həsənov Şahəli Gülmalı oğlu
11.Hüseynov Əli Məhərrəm oğlu
12.İsmayılov Məbud Üzeyir oğlu
13.Quliyev Əsab Astan oğlu
14.Qurbanov Ələkbər Nemət oğlu
15.Qüdrətov Dərgah Humay oğlu
16.Musayev Vəli Mustafa oğlu
17.Orucov Qardaşxan Əliməmməd oğlu
18.Tahirli Zemfira Cəlil qızı
19.Verdizadə Nailə Allahverdi qızı

***İlham Əliyev,***
***Azərbaycan Respublikasının Prezidenti***
***Bakı şəhəri, 26 dekabr 2006-cı il***

## "Şöhrət"ordeni ilə təltif olunanlar



*Ə.Əlizadə*



*M.Murquzov*

## “Tərəqqi” medalı ilə təltif olunanlar



*Ə.Ağalarov*



*R.Baxşəliyev*



*A.Hacıyev*



*A.Hacıyev*



*H.Həşimov*



*B.Hüseynov*



*K.Hüseynov*



*B.Xəlilov*



*Z.Xəlilov*



*H.Qasımov*



*N.Musayev*



*M.Nəcəfov*


*T.Novruzov*


*Ə.Paşayev*


*F.Rüstəmov*


*O.Sultanov*

**“Əməkdar elm xadimi” fəxri adı ilə təltif olunanlar**


*P.Əfəndiyev*


*S.Məmmədov*

**“Əməkdar müəllim” fəxri adı ilə təltif olunanlar**


*H.Balıyev*


*M.Cəbrayılov*


*M.Əbdülov*


*Y.Əhmədov*


*M.Əliyev*


*R.Əliyev*


*V.Əliyev*


*T.Əliyeva*


*S.Həmidov*


*Ş.Həsənov*


*Ə.Hüseynov*


*M.İsmayılov*


*Ə.Quliyev*


*Ə.Qurbanov*


*D.Qüdrətov*


*V.Musayev*


*Q.Orucov*


*Z.Tahirli*

Prezidentin digər bir sərəncamı ilə Pedaqoji Universitetin 85 illik yubileyi münasibəti ilə Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə prof.*Ədalət Fərəcova* Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdü verildi. Bundan əlavə, Təhsil Nazirliyinin Kollegiyasının qərarı ilə bir


N.Verdizadə


Fərəcov Ədalət
Prezident təqaüdçüsü

qrup əməkdaş "Qabaqcıl təhsil işçisi" döş nişanına və Fəxri fərmanlara layiq görüldü.

Tədbirdə universitetin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, prof.Yusif Məmmədov "ADPU-85:uğurlar" mövzusunda məruzə ilə çıxış etdi. Təhsil ocağının tarixi, keçdiyi yol haqqında məlumat verən prof.Y.Məmmədov universitetin inkişafını rəqəmlərin dili ilə təqdim etmişdir:"*Universitetin 10 fakültəsində 8 minə yaxın tələbə, magistraturada 10 istiqamət, 33 ixtisas üzrə 512 magistr təhsil alır, 9 aspirant, 56 dissertant, 24 doktorant elmin müxtəlif sahələri ilə bağlı araşdırma aparır. 50 kafedrada 56 elmlər doktoru, professor, 450 nəfərə yaxın elmlər namizədi, dosent, AMEA-nın 3 müxbir üzvü, Rusiya Təhsil Akademiyasının 2 əcnəbi üzvü çalışır. Kadr hazırlığı sahəsində xüsusi rolu olan 49 tədris, 4 elmi tədqiqat laboratoriyası, 12 fənn kabinəsi, 10 rəsm, 5 tədris emalatxanası, zoologiya muzeyi, zəngin kitabxana, 500 yerlik 3 oxu zalı, 200 yerlik tələbə yeməkxanası, poliklinika, 11 kompüter sinfi, internet şəbəkəsi fəaliyyət göstərir"*[226].

Prof.Y.Məmmədov nitqinin sonunda Azərbaycan təhsilinə, təhsil işçilərinə, xüsusilə də Pedaqoji Universitetin əməkdaşlarına göstərdiyi diqqət və qayğıya görə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevə kollektivin minnətdarlığını ifadə etdi. Sonra söz qonaqlara verildi. Azərbaycan Dövlət İqtisad Universitetinin rektoru, prof.Şəmsəddin Hacıyev, Azərbaycan Dövlət Tibb Universitetinin prorektoru, millət vəkili Rafiq Məmmədov, ADPU-nun məzunları- Dövlət Torpaq və Xəritəçəkmə Komitəsinin sədri Qərib Məmmədov, Nərimanov rayon İcra Hakimiyyətinin başçısı Abdin Fərzəliyev, Səbail rayon İcra Hakimiyyətinin başçısı Sahib Ələkbərov, ADPU-nun kafedra müdiri, professor Həsən Mirzəyev, AMEA-nın müxbir üzvü, prof.Vaqif Abbasov və b. universitetin əməkdaşlarını yubiley münasibəti ilə təbrik etdilər.

Yubiley tədbirində Azərbaycan Dövlət Pedaqoji Universiteti kollektivinin Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevə müraciəti qəbul edildi. Müraciəti Pedaqoji fakültənin dekanı, professor *Fərrux Rüstəmov* səsləndirdi.

## Azərbaycan Dövlət Pedaqoji Universiteti kollektivinin Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevə M Ü R A C İ Ə T İ

***Möhtərəm cənab Prezident!***

*85 illik yubiley təntənələrini yaşayan Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim heyətinin böyük bir qrupunu Vətənin yüksək orden və medalları, fəxri adları ilə təltif etməklə sevincimizə sevinc qatdığınıza görə, Sizə olan hörmət və ehtiramımızı, dərin minnətdarlığımızı ifadə etməkdən məmnunluq duyur, bundan sonra da pedaqoji və elmi pedaqoji kadr hazırlığında əzmlə çalışacağımıza, Vətən elminin inkişafı üçün gərgin yaradıcılıq axtarışları aparacağımıza söz veririk.*

[226] **İbrahimli M.** *ADPU-85:uğurlar."Gənc müəllim" 31 yanvar 2006*

***Möhtərəm cənab Prezident!***

*Azərbaycan Dövlət Pedaqoji Universitetində yaşanan bayram əhvali –ruhiyyəsi ulu öndərimizin, Ümummilli liderimiz Heydər Əliyevin qurub-yaratdığı, şah əsəri hesab olunan müstəqil Azərbaycanımızdakı sakitliyin, sabitliyin, tərəqqinin, sosial-iqtisadi inkişafın, təhsilə və təhsil işçilərinə verdiyiniz yüksək qiymətin təzahürüdür. Ulu öndərimizin, həmişəyaşar liderimizin uzun illər ərzində həyata keçirdiyi təhsil siyasətinin uğurlu davamıdır.*

***Möhtərəm cənab Prezident!***

*Sizin müstəsna təşkilatçılığınız, siyasi uzaqgörənliyiniz, milli və bəşəri ideallara sadiqliyiniz nəticəsində Azərbaycan bütün sahələrdə inkişaf edərək böyük beynəlxalq nüfuz,siyasi və iqtisadi güc qazanmış və regionun lider dövlətinə çevrilmiş, iqtisadi inkişaf tempinə görə isə dünya dövlətləri arasında ön sıraya çıxmışdır. Sizin təhsili Azərbaycanın davamlı inkişaf strategiyasının ən öncül istiqamətlərindən biri hesab etməyiniz, maddi dəyərlərimizi,iqtisadi potensialımızı insan kapitalına çevirmək istiqamətində gördüyünüz işlər cəmiyyətimiz tərəfindən böyük razılıqla qarşılanır. Memarı ulu öndərimiz Heydər Əliyev olan təhsil islahatları sahəsində fəaliyyət Sizin rəhbərliyinizlə uğurla davam etdirilir. Yeni-yeni məktəb binaları tikilir, müasir avadanlıqla təchiz edilir, kompüterləşdirilir, dərslik və dərs vəsaitləri, elmi-bədii kitablarla təmin olunur, istedadlı uşaqların üzə çıxarılması üçün yaradıcılıq müsabiqəsi keçirilir, müəllimlərin və tələbələrin sosial müdafiəsi istiqamətində məqsədyönlü işlər görülür. Bu gün Azərbaycanın ən ucqar dağ kəndlərində müasir tipli məktəblərin inşası Avropaya inteqrasiya edən təhsilimizin yaxın gələcəkdə daha yüksək inkişafından, Azərbaycan dövlətinin dünya dövlətləri birliyində daha mühüm yer tutacağından xəbər verir. Çünki təhsil bütün tərəqqinin və inkişafın mənbəyi, əsas şərtidir.*

***Möhtərəm cənab Prezident!***

*Bu, sizin Vətənə, xalqa dərin məhəbbətinizdən çox məmnun olur, qürur hissi duyur, əmin edirik ki, elmimizin, təhsilimizin inkişafında, dünyaya inteqrasiyasında, Azərbaycanımız üçün pedaqoji və elmi-pedaqoji kadr hazırlığı işində var qüvvəmizlə çalışacaq, bu istiqamətdəki şərəfli fəaliyyətinizin köməkçisi olacağıq.*

***Möhtərəm cənab Prezident!***

*Azərbaycan Dövlət Pedaqoji Universitetinin çoxminli professor-müəllim və tələbə kollektivinə göstərdiyiniz diqqət və qayğıya, əməyimizə verdiyiniz yüksək qiymətə görə Sizə dərin minnətdarlığımızı bildirir, qarşıdan gələn Dünya Azərbaycanlılarının Həmrəylik günü, Qurban bayramı və Yeni il münasibəti ilə Sizi ürəkdən təbrik edir, işlərinizdə böyük uğurlar arzulayırıq.*

*Sizi əmin edirik ki, qayğınıza əməli işimizlə cavab verəcək, Azərbaycan dövlətinin və dövlətçiliyinin inkişafı yolunda öz səyimizi, bilik və bacarığımızı heç vaxt əsirgəməyəcəyik.*

*Müraciət Azərbaycan Dövlət Pedaqoji Universitetinin 85 illik yubileyi münasibəti ilə 2006-cı il dekabrın 28-də keçirilmiş təntənəli mərasimdə qəbul edilmişdir.*
*Rektor:* ***Yusif Məmmədov***

ADPU-da professor-müəllim heyətinin elmi araşdırmalarının nəşrinə xüsusi diqqət yetirilməyə başlanıldı. 2007/08-ci tədris ilində ADPU-da “Kompüter mərkəzi” yenidən təşkil olundu.

4 aprel 2008-ci ildə ADPU-nun yeni nizamnaməsini Azərbaycan Respublikası Ədliyyə Nazirliyi təsdiq (nömrəsi: 1108-A3-459) etdi. “2007-2012-ci illərdə ADPU-da təhsilin informasiyalaş-

dırılması üzrə 5 illik strategiya" və müvafiq tədbirlər planı hazırlandı. Strategiyaya uyğun olaraq, tələbələrin biliklərinin qiymətləndirilməsinə son 20 ildə bir çox qabaqcıl dünya universitetlərində uğurla tətbiq edilən "Elektron test sistemi" layihəsi hazırlanıb müvəffəqiyyətlə sınaqdan keçirildi. 2007/08-ci tədris ilinin imtahan sessiyaları və buraxılış imtahanları universitet tarixində ilk dəfə olaraq elektron test üsulu ilə aparıldı.

"Kompüter mərkəzi"nin təşkilatçılığı ilə "Təhsildə İKT" (2009) adlı elmi-metodik jurnalın ilk nömrəsi nəşr olundu."Kompüter mərkəzi" 2008-ci ildə "Təhsildə qloballaşma və İKT" adlı beynəlxalq, 2010-cu ilin iyununda "Fasiləsiz pedaqoji təhsildə elektron təlim texnologiyalarının tətbiqi" adlı respublika elmi konfransları təşkil etdi.

2007-ci ildə Pedaqoji fakültənin nəzdində "Pedaqoji təhsilin problemləri" adlı elmi-tədqiqat laboratoriyası yaradıldı. Elmi-tədqiqat laboratoriyasına 2008-2011-ci illərdə prof.Fərrux Rüstəmov, dos. Bəhruz Nəsirov, 2011-2016-cı illərdə prof. Abdulla Mehrabov, 2016-2019-cu illərdə dos.Gülşən Novruzova rəhbərlik etdi. Laboratoriyada pedaqoji təhsilin keyfiyyətinin yüksəldilməsi, müasir beynəlxalq təcrübə və milli ənənələr əsasında ali pedaqoji təhsilin məzmunu və strukturunun yeniləşdirilməsi, pedaqoji prosesdə yeni texnologiyaların, innovasiyaların tətbiqinin təmin olunması və digər problemlər tədqiq edildi.

Həmin dövrdə Təhsil Nazirliyinin müvafiq əmri ilə universitetdə "Bioinformatika" (müdir dos. Vaqif Əmikişiyev) yaradıldı.

2008-ci il mayın 17-19-da universitetdə Təhsil Nazirliyinin Pedaqoji Təhsil üzrə Koordinasiya Şurası, ADPU və Hacəttəpə Universiteti ilə birlikdə "Təhsildə qloballaşma və İKT"mövzusunda Beynəlxalq Elmi Konfrans keçirildi .İki gün davam edən konfrans zamanı 50-dən artıq məruzə dinlənildi. 2010-cu ilin may ayında ADPU-nun 34 nəfər əməkdaşı Hacəttəpə Universitetində keçirilən "Müəllim hazırlama siyasəti və problemləri" Beynəlxalq Elmi Konfransında iştirak etdi.

Universitetdə Gender Təhsili Araşdırma Mərkəzi, "Müasir təlim texnologiyaları, təlim və resurs mərkəzi" təşkil edildi

Universitetin beynəlxalq əlaqələri xeyli genişləndi. 2 oktyabr 2009-cu ildə Mehmet Akif Ersoy Universiteti (Türkiyə), 14 may 2010-cu ildə Tatar Dövlət Humanitar-Pedaqoji Universiteti (Kazan), 31 may 2011-ci ildə Babeş-Bolyai Universiteti (Rumıniya), 20 noyabr 2011-ci ildə Muğla Universiteti, 17 dekabr 2012-ci ildə Balıkesir Universiteti ilə əməkdaşlıq müqaviləsi bağlandı.

Pedaqoji Universitet həmçinin Avropa və Amerikanın 60-dan çox qabaqcıl və nüfuzlu universitetini özündə birləşdirən ETEN-ə (Avropa Müəllim Hazırlayan Ali Məktəblər Birliyi) və Qara Dəniz Hövzəsi Ölkələrinin Universitetləri Assosiasiyasına üzv seçildi.

2006-2007-ci tədris ilində Kimya və Filologiya, 2007-2008-ci tədris ilində Biologiya və Fizika, 2008-2009-cu tədris ilində Pedaqoji, Tarix, Riyaziyyat, 2009-2010-cu tədris ilində Pedaqogika-psixologiya, Coğrafiya və çağırışaqədər hazırlıq, Mühəndis-pedaqoji və bədii qrafika fakültələrində Kredit Transfer Sistemi tətbiq edildi. Bu məqsədlə kredit sisteminin tələblərinə cavab verən yeni tədris proqramları, fənlərin reyestri, tədris qrafikləri, sillabuslar, fənlərin semestrlər üzrə bölgüsünü göstərən sənədlər hazırlandı, "Tyutor hazırlığı layihəsi" reallaşdırılaraq 40 nəfər tyutor tədris prosesinə cəlb olundu. Kredit sisteminin təşkili qaydaları, tələbə nailiyyətlərinin yeni metodlarla qiymətləndirilməsi, yay məktəbinin təşkili mexanizmi, kollokviumların keçirilməsi, sərbəst işlərin yoxlanılması, laboratoriya, kurs və buraxılış işlərinin müdafiəsi ilə maarifləndirmə işləri aparıldı.

2011/12-ci tədris ilində Pedaqoji Universitetdə 8 fakültə və 52 kafedra fəaliyyət göstərirdi:

**I.Filologiya fakültəsi**

*(dekan prof.Buludxan Xəlilov)*

1.1.Azərbaycan dilçiliyi kafedrası - müdir prof. Nizami Xudiyev

1.2.Müasir Azərbaycan dili kafedrası - müdir prof.Həsən Mirzəyev 1.3.Azərbaycan dilinin tədrisi metodikası kafedrası- müdir prof.Əzizxan Tanrıverdiyev

1.4.Azərbaycan və dünya ədəbiyyatı tarixi kafedrası - müdir prof.Himalay Qasımov

1.5.Folklor və qədim ədəbiyyat kafedrası - müdir prof.Tərlan Novruzov

1.6.Ədəbiyyat və onun tədrisi metodikası kafedrası - müdir prof.Zahid Xəlilov

1.7.Xarici dillər kafedrası - müdir dos.Gülçöhrə Alıyeva

1.8.İngilis dili və onun tədrisi metodikası kafedrası - müdir prof.Balaxan Hüseynov

1.9.Rus dili kafedrası - müdir dos.Leyla Vəzirova

**II.Tarix fakültəsi**

(*dekan prof. Oqtay Sultanov*)

2.1.Azərbaycan tarixi kafedrası - *müdir prof. Süleyman Məmmədov*

2.2.Türk və Şərqi Avropa xalqları tarixi kafedrası- *müdir dos.Rəcəb Əliyev*

2.3.Ümumi tarix kafedrası - *müdir prof.Vəli Əliyev*

2.4.Ümumi pedaqogika kafedrası - *müdir prof. Hüseyn Əhmədov*

2.5.Fəlsəfə kafedrası- *müdir prof.Məmməd Balayev*

2.6.İqtisadi və sosial fənlər kafedrası - *müdir prof.Əli Allahverdiyev*

**III.Pedaqoji fakültə**

(*dekan prof. Fərrux Rüstəmov*)

3.1.İbtidai təhsilin pedaqogikası və metodikası kafedrası- müdir dos Yaqut Rzayeva

3.2.Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrası- müdir prof.Seyidağa Həmidov

3.3.Musiqi fənləri və onun tədrisi metodikası kafedrası- müdir prof.Jalə Qədimova

3.4.Musiqi alətləri kafedrası- müdir prof.Minarə Dadaşova

3.5.İbtidai siniflərdə rus dili kafedrası- müdir dos.Ramidə Məmmədova

**IV .Kimya fakültəsi**

(*dekanı dos.Vaqif Həsənov*)

4.1.Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrası - müdir prof.Ələkbər Qurbanov

4.2.Üzvi kimya və kimya texnologiyası kafedrası - müdir dos.Rəfiqə Məmmədova

4.3.Analitik və fiziki kimya kafedrası - müdir prof.NailəVerdizadə

**IV.Biologiya fakültəsi**

(*dekanı prof.Yusif Əhmədov*)

4.1.Zoologiya kafedrası- müdir prof.Bəhlul Ağayev

4.2.Botanika kafedrası- müdir prof.Yusif Əhmədov

4.3.İnsan və heyvan fiziologiyası kafedrası- müdir prof.Ədalət Fərəcov

4.4.Mülki müdafiə və tibbi biliklərin əsasları kafedrası - müdir prof.Tamella Feyzullayeva

4.5.Biologiyanın tədrisi metodikası kafedrası- müdir prof.Əli Hüseynov

**V.Fizika fakültəsi**

*(dekan prof.Mirzəli Murğuzov)*

5.1.Mexanika və molekulyar fizika kafedrası- müdir prof.Edil Eyvazov

5.2.Elektrik və optika kafedrası- müdir prof. Mirzəli Murğuzov)

5.3.Nəzəri fizika kafedrası- müdir prof.İsgəndər Cəfərov

5.4.Fizikanın tədrisi metodikası kafedrası- müdir dos. Rasim Abdurazaqov

**VI.Riyaziyyat fakültəsi**

(*dekan dos. Maqsud Nəcəfov*)

6.1.Riyazi analiz kafedrası- müdir prof.Məlikməmməd Cəbrayılov

6.2.Cəbr və həndəsə kafedrası- müdir ped.elm. doktoru Yafəs Baxşəliyev

6.3.Hesablama riyaziyyatı və informatika kafedrası- müdir dos.Zenfira Tağıyeva

6.4.Funksiyalar nəzəriyyəsi kafedrası- müdir prof.Qardaşxan Orucov

6.5.Riyaziyyat və onun tədrisi metodikası kafedrası – müdir prof.Azadxan Adıgözəlov

**VII.Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsi**

*(dekan dos.Mətanət Əsgərova)*

7.1.Ümumi coğrafiya kafedrası- müdir dos.Mətanət Əsgərova

7.2.Fiziki coğrafiya kafedrası – müdir dos.Nərminə Süleymanova

7.3.İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrası- müdir b/m.Kərəm Bayramov

7.4.Ekologiya kafedrası – müdir dos Yavər Əliyev

7.5.Fiziki tərbiyə və gənclərin çağırışaqədər hazırlığı fənləri və onların tədrisi metodikası kafedrası- müdir dos.Akif Əmiraslanov

7.6.Bədən tərbiyəsi kafedrası- müdir prof.Əli Mehdiyev

7.7.İdman fənləri kafedrası- müdir dos.Gülbala Quliyev

**VII.Pedaqogika və psixologiya fakültəsi**
*(dekan dos. Şəhla Əliyeva)*

3.1.Ümumi psixologiya kafedrası- müdir prof.Əbdül Əlizadə

3.2.Məktəbəqədər pedaqogika kafedrası- müdir dos.Raya Mursaqulova

3.3.Yaş və pedaqoji psixologiya kafedrası- müdir prof.Ərəstun Baxşəliyev

**VIII.Mühəndis-pedaqoji və bədii qrafika fakültəsi**
*(dekan dosent Arif Mustafayev)*

8.1.İstehsalatın əsasları kafedrası- dos.Səadət Musayeva

8.2. Elektroradiotexnika kafedrası- dos.Akif İsmayılov

8.3.Maşınşünaslıq kafedrası- dos.Niyazi Qasımov

8.4.Təsviri incəsənət, rəsmxət və onların tədrisi metodikası kafedrası- dos.Soltan Atayev

8.5.Rəsm, heykəltəraşlıq və boyakarlıq kafedrası Fərahim Zeynalov

Universitetdə *Əcnəbi tələbələr üzrə fakültə* və *Əlavə təhsil fakültəsi* fəaliyyət göstərirdi.

***Əcnəbi tələbələr üzrə fakültə*** (*dekan dosent Nurəddin Uluxanlı*) 2005-ci ilin dekabrında riyaziyyat, fizika, kimya və biologiya fakültələrində təhsil alan 395 nəfər əcnəbi tələbələrdən ibarət kontingent əsasında yaranmışdı. 2005/06-cı tədris ilində həmin fakültənin 85 nəfər məzunu olmuşdu ki, onlardan da 34-ü riyaziyyat, 13-ü fizika, 15-i kimya, 23-ü biologiya ixtisasına yiyələnmişdi. 2006/07-ci tədris ilində həmin ixtisaslara 100 nəfər əcnəbi tələbə qəbul edilmiş, 54 nəfər məzun olmuşdu. 2007-2009-cu illərdə fakültəyə qəbul keçirilmədi. Əvvəlki illərin tələbələrindən 227 nəfəri məzun oldu. Türkiyə Cümhuriyyəti Ali Təhsil Şurasının (YÖK) Tələbə Seçimi və Yerləşdirilməsi Mərkəzi ilə aparılan danışıqlar nəticəsində 2009/10-cu tədris ilində 35 nəfər, 2010/11-ci tədris ilində 23 nəfər, 2011/12-ci tədris ilində Pedaqoji Universitetə 29 nəfər türk tələbəsi qəbul edildi. 2009/10-cu ildə fakültənin 40 nəfər məzunu olmuşdu. 2011/12-ci tədris ilində universitetdə əcnəbi tələbələrin hazırlığı şöbəsi yaradıldı və Əcnəbi tələbələrin işi üzrə fakültənin nəzdinə verildi. Əvvəllər ADPU-ya pedaqoji təhsil almağa gələn türk öyrənciləri pedaqoji profili olmayan Azərbaycan Dövlət Neft Akademiyasında və Azərbaycan Memarlıq və İnşaat Mühəndisləri Universitetində hazırlıq keçirdilər. Bu da pedaqoji yönümlü fənlərin tədrisində bir sıra çətinliklər yaratmaqla yanaşı, əcnəbi tələbələrin təlim nəticələrinə əsaslı şəkildə təsir edirdi. 2011/12-ci tədris ilində hazırlıq şöbəsində məktəbəqədər təlim və korreksiyaedici təlim ixtisasları üzrə 37 dinləyici təhsil alırdı.



*Əcnəbi tələbələr üzrə fakültənin əməkdaşları*

***Əlavə təhsil fakültəsi*** əvvəlcə İxtisasartırma fakültəsi kimi yaradılmış, Təhsil Nazirliyinin 7 oktyabr 1995-ci il tarixli əmri ilə fakültəyə yenidənhazırlanma statusu verilərək İxtisasartırma və yenidənhazırlanma fakültəsi adlandırılmışdır. Təhsil Nazirliyinin 10 iyun 2010-cu il tarixli məktubuna əsasən Əlavə təhsil fakültəsi adlandırılmışdı. Fakültədə (*dekan prof.Mehralı Yusifov*) Azərbaycan dili və ədəbiyyat müəllimliyi, riyaziyyat və informatika müəllimliyi, təhsildə sosial-psixoloji xidmət və məktəbəqədər təlim və tərbiyə ixtisasları üzrə yenidənhazırlanma təhsili həyata keçirilirdi.

2011/12-ci tədris ilində ali təhsilin bakalavr pilləsində 23 ixtisas üzrə 8000-ə yaxın tələbə təhsil alırdı. 2007/08-ci tədris ilində universitetdə bakalavriat pilləsində ilk dəfə “Təhsilin təşkili və idarə olunması” (Menecment), 2008-2009-cu tədris ilində isə “Ekologiya” ixtisası üzrə kadr hazırlığına başlanıldı.

*2006-2011-ci illərdə Pedaqoji Universitetin əyani və qiyabi şöbələrinə qəbul olunan və universiteti bitirən tələbələrin inkişaf dinamikası.*

| İllər | Əyani | | Qiyabi | |
|---|---|---|---|---|
| | qəbul | məzun | qəbul | məzun |
| 2006-2007 | 1062 | 990 | 560 | 581 |
| 2007-2008 | 1222 | 1078 | 527 | 493 |
| 2008-2009 | 1308 | 1170 | 494 | 647 |
| 2009-2010 | 1350 | 1142 | 486 | 672 |
| 2010-2011 | 1357 | 1232 | 472 | 609 |

**Magistratura və doktorantura şöbəsi.** Şöbəyə filologiya elmləri doktoru, professor *İbrahim Bayramov* rəhbərlik edirdi. Şöbə doktorant, dissertant və magistr hazırlığı ilə məşğul olurdu.

Magistratura pilləsində əyani şöbə üzrə 11 istiqamət, 37 ixtisas, qiyabi şöbə üzrə 8 istiqamət, 20 ixtisas üzrə 802 magistr təhsil alırdı.

2007-2011-ci illərdə ayrı-ayrı ixtisaslaşmalar üzrə magistratura səviyyəsində kadr hazırlığı aşağıdakı kimi olmuşdur.

| İllər | İxtisaslar | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Riyaziyyat | | Fizika | | Kimya | | Biologiya | | Coğrafiya | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2007 | 29 | 11 | 20 | - | 13 | - | 15 | 19 | 7 | 9 |
| 2008 | 17 | 15 | 17 | 8 | 19 | - | 18 | 13 | 7 | 9 |
| 2009 | 29 | 16 | 26 | 6 | 19 | - | 18 | 14 | 10 | 9 |
| 2010 | 21 | 20 | 21 | - | 19 | - | 24 | 18 | 9 | 11 |
| 2011 | 24 | 18 | 24 | 24 | 23 | - | 20 | 17 | 10 | 15 |

| İllər | İxtisaslar | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Filologiya | | Dilşünaslıq | | Tarix | | Psixologiya | | Maarif | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2007 | 9 | 8 | 18 | 8 | 15 | 13 | 6 | - | 53 | 47 |
| 2008 | 8 | 8 | 15 | 8 | 18 | 12 | 12 | 3 | 22 | 26 |
| 2009 | 10 | 10 | 20 | 11 | 23 | 14 | 14 | 2 | 48 | 41 |
| 2010 | 13 | 11 | 24 | 10 | 21 | 10 | 10 | 4 | 26 | 38 |
| 2011 | 13 | 11 | 24 | 13 | 23 | 15 | 15 | 5 | 48 | 55 |

Musiqişünaslıq ixtisasının əyani şöbəsinə qəbul 2008-ci ildə başlamışdı. 2008-ci ildə 3, 2009-cu ildə 2, 2010-cu ildə 4, 2011-ci ildə 5 magistrant qəbul olunmuşdu.

Həmin illərdə Universitetimizdə çalışan professor-müəllim heyətinin sayı artmış, tərkibi elmi dərəcəlilərin hesabına xeyli yaxşılaşmışdır. 1991-ci ildə universitetin 58 kafedrasında 701 nəfər (57 nəfər elmlər doktoru, professor, 387 fəlsəfə doktoru dosent 335 nəfər baş müəllim) çalışırdısa, 2010-cu ildə 53 kafedrada 730 nəfər (52-si elmlər doktoru, professor, 230-u fəlsəfə doktoru, dosent, 448 nəfəri baş müəllim və müəllim) pedaqoji fəaliyyətlə məşğul idi.

2007-2010-cu illərdə ADPU-da elmi-pedaqoji kadr potensialının inkişaf dinamikası aşağıdakı kimi olmuşdur:

| İllər | Kafedraların sayı | Əməkdaşların sayı | O cümlədən | | B/m və müəllim |
|---|---|---|---|---|---|
| | | | Elmlər doktoru, professor | Fəlsəfə doktoru, dosent | |
| 2007 | 51 | 763 | 54 | 247 | 462 |
| 2008 | 52 | 733 | 54 | 242 | 437 |
| 2009 | 53 | 730 | 54 | 232 | 444 |
| 2010 | 53 | 730 | 52 | 230 | 448 |

2010/11-ci tədris ilində Pedaqoji Universitetdə tədris –metodika şöbəsi (dos.Namiq Hacıyev), beynəlxalq əlaqələr şöbəsi (müdir dos.Azər Sərdarlı), kompüter mərkəzi (müdir dos.İlham Əhmədov), mətbuat və informasiya şöbəsi (Mənsur İbrahimli), kitabxana (müdir Azər Hüseynov), Həmkarlar İttifaqı Komitəsi (dos.Vaqif Əliyev), Tələbə Həmkarlar İttifaqı Komitəsi (dos.Vurğun Əyyubov), tələbə gənclər təşkilatı, idman klubu, inzibati-təsərrüfat şöbəsi, nəşriyyat şöbəsi (müdir Hüseyn Hacıyev) fəaliyyət göstərirdi.

## Azərbaycan Dövlət Pedaqoji Universitetində elmi-tədqiqat işlərinin təşkili (1991-2011-ci illərdə)

**Filologiya** fakültəsində *(dekan prof.Buludxan Xəlilov)* elmi-tədqiqat işləri 9 kafedrada aparılırdı. Fakültənin bakalavriat səviyyəsində tələbələr Azərbaycan dili və ədəbiyyatı, xarici dil (ingilis və fransız dilləri) ixtisaslarına, magistraturada Azərbaycan dili, ümumi dilçilik, ədəbiyyat nəzəriyyəsi, Azərbaycan ədəbiyyatı, folklorşünaslıq və mifologiya, Azərbaycan dili və ədəbiyyatın tədrisi metodikası, xarici dil (ingilis və fransız dilləri) ixtisaslarına yiyələnirdilər.

Fakültədə 1224 tələbənin təhsil-tərbiyəsi ilə 200 nəfərdən artıq professor-müəllim və tədris-köməkçi heyət məşğul olurdu.



*Filologiya fakültəsinin Elmi Şurasının iclasında*

***Müasir Azərbaycan dili*** kafedrasında 12 professor-müəllim (6 elmlər doktoru, professsor, 1 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, müəllim və 2 müəllim) Dərələyəzin folkloru, toponim və şivələri (*prof.Həsən Mirzəyev*), Heydər Əliyevin dil siyasəti (*prof.V.Əliyev*), türkologiyanın mühüm problemləri, müasir Azərbaycan dilinin morfologiyası və leksikologiyası (*prof.Buludxan Xəlilov*), linqvistik təhlil, nitq hissələrində keçid prosesləri və konversiya (*prof.Cəfər Cəfərov*), Azərbaycan dili terminologiyasının linqvistik təhlili və leksik-qrammatik xüsusiyyətləri (*prof.Mirvari İsmayılova*), Qərbi Azərbaycanın türk mənşəli toponimləri, şivələrinin leksikası, dialekt leksikası *(prof.İbrahim Bayramov*), Azərbaycan dilində linqvistik ekvivalentlər (*dos.Füruzə Məmmədova*), Qərbi Azərbaycanın etnotoponimlərinin arealları *(Könül Səmədova*) mövzularda araşdırmalar aparmışdır.

***Azərbaycan dilçiliyi kafedrasında*** 10 professor-müəllim (2 elmlər doktoru, professsor, 7 fəlsəfə doktoru, dosent, 1 baş müəllim) Azərbaycan ədəbi dil tarixi, Azərbaycan antroponimlərinin təşəkkülü və inkişafı (*prof.Nizami Xudiyev)*, Azərbaycan hidronimlərinin semantik xüsusiyyətləri (*prof.Nəbi Əsgərov)*, romanın üslub xüsusiyyətləri, dil sənətkarlığı, poeziya dilinin milli qaynaqları (*dos.Məhərrəm Hüseynov*), Mir Cəlalın bədii əsərlərinin dili və üslubu (*Həcər Hüseynova*) mövzularında tədqiqat aparmışdır.



*Müasir Azərbaycan dili kafedrasının əməkdaşları*

***Azərbaycan və dünya ədəbiyyatı tarixi kafedrasında*** 10 professor-müəllim ( 3 elmlər doktoru, professor, 5 fəlsəfə doktoru, dosent,1 fəlsəfə doktoru, baş müəllim, 1 müəllim) elmi-tədqiqat işlərinə cəlb edilmişdi. Tədqiqatlarının nəticəsi kimi *prof. Himalay Qasımovun* "Azərbaycan ədəbiyyatının yaradıcılıq problemləri" (2004), "Səməd Vurğunun poetik dünyası" (2006), Azərbaycan romanının inkişaf problemləri" (2008), "Azərbaycan şeirinin poetikası" (2008), *prof.Elman Quliyevin* "Şəhriyar poeziyası və milli təkamül" (2004), "Türk xalqları ədəbiyyatı" (2009,2011), "Şərq xalqları ədəbiyyatı. 2 cilddə." (2011), *prof.Təyyar Cavadovun* "Müasir Azərbaycan romanının poetikası" (2005), "Müasir Azərbaycan romanı: janr təkamülü (XX əsrin 80-ci illəri) (2007), "Ən yeni Azərbaycan ədəbiyyatı məsələləri" (2008), *dos.Ramin Əhmədovun* "Azərbaycan dramaturgiyası: ideallıqla reallığın vəhdəti

(H.Cavid, C.Cabbarlı və S.Vurğunun pyesləri əsasında) (2009) kitabları nəşr olunmuşdur.

***Folklor və qədim ədəbiyyat kafedrasında*** 11 professor-müəllim (5 elmlər doktoru, professor, 1 elmlər doktoru, 4 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim) antik və orta əsr ədəbiyyatı *(prof.Tərlan Novruzov),* Azərbaycan folklorşünaslığının problemləri *(prof.Paşa Əfəndiyev*), Azərbaycan poemasının sənətkarlıq xüsusiyyətləri *(prof. Rafiq Yusifoğlu),* Krım tatar ədəbiyyatı, aşıq Ömərin yaradıcılığı (prof.Mahmud Allahmanlı), Heydər Əliyev və ədəbiyyat *(dos.Akif Əliyev*), Azərbaycan türklərinin mifologiyası *(dos. Ramazan Qafarlı),* təriqət ədəbiyyatı, ana dilli Azərbaycan ədəbiyyatının təşəkkülü *(dos.Yaqub Babayev*), Azərbaycan folklorşünaslığının tarixi və müasir problemləri *(dos.Qüdrət Umudov)* mövzularında tədqiqat aparmışdır.

***Azərbaycanın dilinin tədrisi metodiksı kafedrasında*** 25 professor-müəllim (2 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor,12 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, müəllim, 4 baş müəllim, 4 müəllim) Azərbaycan dilinin tarixi qrammatikası, qədim türk mənbələrində yaşayan şəxs adları, "Dədə Qorqud" kitabının dil xüsusiyyətləri *(prof.Əzizxan Tanrıverdiyev),* ədəbi tələffüz təliminin metodikası *(prof.Nadir Abdullayev*), rus dilində türk sözləri *(prof.Minaxanım Nuriyeva*), orta məktəbdə morfologiyanın tədrisi, oğuz qrupu türk dillərində qrammatik morfemlər *(dos.Kamil Bəşirov*), təlim rus dilində olan məktəblərdə Azərbaycan dilinin tədrisi *(dos.Ənvər Abbasov*), Azərbaycan dili dərslərində fəndaxili və fənlərarası əlaqə *(dos.Rəhilə Məhərrəmova*), ibtidai siniflərdə fonetikanın tədrisi *(dos.Pəri Paşayeva)*, ibtidai siniflərdə bədii mətnin tədrisi *(dos.Şəlalə Nəbiyeva)* ilə bağlı araşdırmalar apardılar.

***Ədəbiyyatın tədrisi metodikası kafedrasında*** 14 professor-müəllim (1 elmlər doktoru, professor,10 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 1 fəlsəfə doktoru, müəllim, 1 baş müəllim) uşaq ədəbiyyatının müasir problemləri *(prof.Zahid Xəlilov, dos.Füzuli Əsgərli, dos.Zemfira Tahirli*), orta məktəbdə ədəbiyyatın tədrisi məsələləri (*dos.Soltan Hüseynov, dos.Fəxrəddin Yusifov*) mövzularında araşdırma aparmışdır.

***Xarici dillər kafedrasında*** 45 nəfər (4 nəfər fəlsəfə doktoru,dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 17 baş müəllim, 23 müəllim) qeyri-ixtisas qruplarında xarici dillərin (*dos.Gülçöhrə Alıyeva, dos.Səkinəxanım Vəliyeva, dos.Aygün İsmayılova, dos.Yaşar Qaraxanov* və b.), ***İngilis dili və onun tədrisi metodikası kafedrasında*** 16 nəfər (1 elmlər doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 5 baş müəllim, 8 müəllim) ixtisas qruplarında ingilis dilinin (*prof.Balaxan Hüseynov, dos.Nailə Əhmədzadə, dos. Faidə İsayeva* və b.), ***Rus dili kafedrasında*** 19 professor-müəllim (4 fəlsəfə doktoru, dosent, 8 baş müəllim, 7 müəllim) rus dilinin (*dos. Leyla Vəzirova, dos.Sevinc Sadıxova, dos.Nurlana Kazımova, dos. Larisa Kolesnikova* və b.) tədrisinin keyfiyyətinin yüksəldilməsi ilə bağlı tədqiqatlar aparmışdır.

"***Türk araşdırmaları"*** ETM-də (müdir *prof. Elman Quliyev*) 7 nəfər türk ədəbiyyatının, "***Dədə Qorqud"*** ETM-də (müdir *prof.Ramazan Qafarov*) 11 nəfər onomostika, dialektologiya, etimologiya, folklor, etnoqrafiya, mifologiya, pedaqogika, psixologiya və fəlsəfə sahəsində araşdırma aparırdı.



*"Türk araşdırmaları" ETM-nin əməkdaşları*

**Tarix** fakültəsinin (*dekan prof.Oqtay Sultanov*) bakalavriat səviyyəsinin "Tarix müəllimliyi" və "Tarix-coğrafiya müəllimliyi" ixtisaslarında 899 (544 əyani, 355 qiyabi) tələbənin təhsil-tərbiyəsi ilə 104 professor-müəllim məşğul olurdu.

***Azərbaycan tarixi kafedrasında*** 19 professor-müəllim (3 elmlər doktoru, professor, 11 fəlsəfə doktoru, dosent, 2 nəfər fəlsəfə doktoru, baş müəllim, 3 nəfər fəlsəfə doktoru, müəllim) Azərbaycan tarixinin Yeni və Ən yeni dövr tarixinin mühüm problemləri (*prof.Süleyman Məmmədov, prof.Xəlil*


*Tarix fakültəsinin Elmi Şurasının iclasında*

*Köçərli, prof.Əli Məmmədov* və b.),***Türk və Şərqi Avropa xalqları tarixi kafedrasında*** 19 professor-müəllim (2 elmlər doktoru, professor,1 elmlər doktoru,12 fəlsəfə doktoru, dosent, 2 baş müəllim,2 müəllim) 90-cı illərin əvvəllərində Azərbaycanda siyasi mübarizə (*prof.Oqtay Sultanov*), Azərbaycanda milli-azadlıq hərəkatı, Şərqi Avropada türk tayfaları birliyi (*prof.Mais Əmrahov*), ümumtəhsil məktəblərində tarixin tədrisi keyfiyyətinin yüksəldilməsi (*dos.Mübariz Əmirov*), Azərbaycanın beynəlxalq vəziyyəti, türk tarixinin mühüm problemləri (*dos.Pərviz Səfərov, dos.Sevinc Seyidova, dos.Qabil Bəşirov, dos.Elman Məmmədov* və b.), ***Ümumi tarix kafedrasında*** 11 professor-müəllim (1 AMEA-nın müxbir üzvü, elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor, 8 fəlsəfə doktoru, dosent, 1 baş müəllim) Naxçıvanın qədim şəhər mədəniyyəti (*prof.Vəli Əliyev*), Avropa təhlükəsizliyi problemi (*prof.Musa Həsənov*), Böyük ipək yolu və Azərbaycan (dos.İbadulla Məmmədov), ***İqtisadi və sosial fənlər kafedrasında*** 14 nəfər (3 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor, 3 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, 2 baş müəllim, 2 müəllim) bazar iqtisadiyyatının təşəkkülü prosesində makroiqtisadi dinamik və struktur dəyişikliklərin tənzimlənməsi, makroiqtisadiyyatın nəzəriyyə və praktikası (*prof.Əli Allahverdiyev*), Azərbaycan iqtisadiyyatın mühüm problemləri, Azərbaycan Konstitutsiyası və hüququnun əsasları (*prof.Ənvər Seyidov, b/m. Zakir Nağıyev*), ***Fəlsəfə kafedrasında*** 9 professor-müəllim (1 elmlər doktoru, professor, 6 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 1 baş müəllim) Azərbaycanda islam dininin öyrənilməsi (*prof.Məmməd Balayev*), riskin idarə olunmasında insan amili-psixoloji faktorlar (*dos.Yasin Qaraməmmədli*), orta əsr mütəfəkkirlərinin fəlsəfi baxışları, müasir dövrün ekoloji, gender və mədəniyyət problemləri (*dos.Kamal Hüseynov, dos. Zemfira Zülalova, dos.Svetlana Adıgözəlova, Leyla Quliyeva* və b.), ***Ümumi pedaqogika kafedrasında*** 22 professor-müəllim (3 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor, 9 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim, 1 fəlsəfə doktoru, müəllim, 3 baş müəllim, 3 müəllim) pedaqogika tarixi (*prof.Hüseyn Əhmədov, prof.Əmrulla Paşayev, prof.İramin İsayev*) və təhsil-tərbiyə nəzəriyyəsinin aktual problemləri (*dos.Miri Həsənov, dos.Müseyib İlyasov, Heydər Cəfərov, dos.Kəmalə Quliyeva, dos.Şiruyə Azadəliyeva* və b.) ilə bağlı araşdırmalar aparmışdır. H.Əhmədovun "Из истории педагогики Азербайджана" (I-II-III hissə) (1991, 1993, 1995), "Azərbaycanda məktəb və pedaqoji fikir tarixi" (Azərbaycan və rus dillərində - 2001), 2014-cü ildə tam təkmilləşdirilmiş formada İ.Musayevin "Pedaqogikanın ümumi əsasları" (1992), B.Abdullayevin "Didaktika" (1997), İ.İsayevin "Pedaqogika" (1993, 2003, 2006) Ə.Paşayev, F.Rüstəmovun "Pedaqogika" (2002), F.Rüstəmovun "Şərq pedaqogika tarixi" (2002), "Qərb pedaqogika tarixi" (2003), "Yeni dövrün pedaqogika tarixi" (2005), "Ən yeni dövrün pedaqogika tarixi" (2005), "Pedaqogika tarixi" (2006) kitabları nəşr olunmuşdur.

**Kimya** fakültəsində *(dekanı dos.Vaqif Həsənov*) bakalavriat səviyyəsində 465 tələbə, magistratura səviyyəsində 43 magistrant təhsil alırdı. Onların təhsil-tərbiyəsi ilə 40 professor-müəllim məşğul olurdu.

***Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrasında*** 14 professor-müəllim (1 elmlər dok-


*Kimya fakültəsinin Elmi Şurasının iclasında*

toru, professor, 8 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim, 2 fəlsəfə doktoru, müəllim, 1 müəllim) ümumi kimya və kimyanın tədrisi metodikası (*dos.Nigar Seyidova, dos.Aysəba Məmmədova, dos.Mədəd Şahbazov, dos.Asəf Quliyev, Reyhan Ağayeva* və b.), ***Üzvi kimya və kimya texnologiyası kafedrasında*** 16 professor-müəllim (9 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim, 1 baş müəllim, 4 müəllim) üzvi kimyanın (*dos.Rəfiqə Məmmədova, dos.Vaqif Həsənov* və b.), ***Analitik və fiziki kimya kafedrasında*** 10 professor –müəllim (2 elmlər doktoru, professor, 6 fəlsəfə doktoru, dosent, 2 müəllim) analitik və fiziki kimyanın müasir problemləri ilə (*prof.Nailə Verdizadə, prof.Telman Ağdamski, dos.Əli Zalov, dos.Kərəm Quliyev və b.*) bağlı araşdırma aparmışdır.

**Biologiya** fakültəsinin (*dekanı prof.Yusif Əhmədov*) ***Botanika kafedrasında*** 17 professor-müəllim (1 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor, 7 fəlsəfə doktoru, dosent, 4 fəlsəfə doktoru, baş müəllim, 2 baş müəllim, 2 müəllim) bitki ekologiyası, coğrafiyası və fiziologiyası (*prof.Yusif Əhmədov, dos.Anaxanım Yusifova* və b.), ***Zoologiya kafedrasında*** 11 professor-müəllim (1 elmlər doktoru, professor, 7 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim, 1 müəllim) parazit xəstəliklərinin törədicisinin faunası, növdaxili dəyişkənliyi, ekologiyası, onurğasızlar zoologiyası, ümumi entomologiya (prof.Bəhlul Ağayev və b.), ***İnsan və heyvan fiziologiyasında*** 20 professor-müəllim (2 elmlər doktoru, professor, 10 fəlsəfə doktoru, dosent, 3 baş müəllim, 5 müəllim) histologiya, insan anatomiyası, idman fiziologiyası, biofizika, fərdi inkişafda neyrohumoral tənzim mexanizmləri ilə bağlı tədqiqatlar (*prof.Ədalət Fərəcov, prof.Məmməd Qarayev* və b.) aparmışdır. ***Mülki müdafiə və tibbi biliklərin əsasları kafedrasının*** 22 nəfər əməkdaşı (1 fəlsəfə doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 15 baş müəllim, 3 müəllim) həyat fəaliyyətinin təhlükəsizliyi və sağlam həyat tərzi, ***Biologiyanın tədrisi metodikası kafedrasının*** 15 professor-müəllimi (1 elmlər doktoru, professor, 6 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 1 baş müəllim, 4 müəllim) ümumtəhsil məktəblərində biologiyanın tədrisinin keyfiyyətinin yüksəldilməsi ilə bağlı araşdırmalar aparmış, ümumtəhsil məktəbləri üçün dərslik və dərs vəsaitinin hazırlanmasında həmmüəllif kimi iştirak etmişdir.

**Fizika** fakültəsinin (dekan *prof.Mirzəli Murğuzov*) bakalavriat səviyyəsində 450 tələbə, magistratura səviyyəsində 18 nəfər magistrant təhsil alırdı. ***Mexanika və molekulyar fizika kafedrasında*** 11 (2 elmlər doktoru, professor, 7 fəlsəfə



*Biologiya fakültəsinin Elmi Şurasının iclasında*



*Zoologiya kafedranın əməkdaşları*



*Fizika fakültəsinin Elmi Şurasının iclasında*

doktoru, dosent, 1 fəlsəfə doktoru, müəllim), ***Elektrik və optika kafedrasında*** 14 (2 elmlər doktoru professor, 6 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 5 fəlsəfə doktoru, müəllim), ***Nəzəri fizika kafedrasında*** 8 (2 elmlər doktoru, professor, 3 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim, 1 baş müəllim), ***Fizikanın tədrisi metodikası kafedrasında*** 23 (2 elmlər doktoru, 10 fəlsəfə doktoru, dosent, 2 baş müəllim, 2 müəllim) professor-müəllim *(prof.Mirzəli Murğuzov, prof.Edil Eyvazov, prof.Vaqif Nəsirov, prof. İsgəndər Cəfərov, prof.Hüseyn İbrahimov* və b.) bərk cisimlər fizikası, yarımkeçiricilər və dielektriklər fizikası, elementar zərrəciklər və nüvə fizikası, kristalloqrafiya, astrofizika və fizikanın tədrisi metodikası sahəsində maraqlı araşdırmalar aparmış, monoqrafiya, dərslik və dərs vəsaitləri nəşr etdirmişlər.

**Riyaziyyat** fakültəsinin (*dekan dos.Maqsud Nəcəfov*) bakalavriat səviyyəsində 1071 tələbə (703 əyani, 368 qiyabi) təhsil alırdı ki, onlardan da 34 nəfəri xarici ölkə vətəndaşları idi.



*Nəzəri fizika kafedrasının əməkdaşları*

Fakültənin ***Riyazi analiz kafedrasında*** 15 (2 elmlər doktoru, professor, 7 fəlsəfə doktoru, dosent, 1 baş müəllim, 5 müəllim), ***Cəbr və həndəsə kafedrasında*** (1 elmlər doktoru, 11 fəlsəfə doktoru, dosent, 1 baş müəllim), ***Hesablama riyaziyyatı və informatika kafedrasında*** 14 (1 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor, 1 elmlər doktoru, dosent, 9 fəlsəfə doktoru, dosent, 2 müəllim), ***Funksiyalar nəzəriyyəsi kafedrasında*** 9 (1 elmlər doktoru, professor, 4 fəlsəfə doktoru, dosent, 4 baş müəllim), ***Riyaziyyat və onun tədrisi***



*Riyaziyyat fakültəsinin Elmi Şurasının iclasında*

***metodikası kafedrasında*** 15 (1 elmlər doktoru, professor, 7 fəlsəfə doktoru, dosent, 3 baş müəllim, 3 müəllim) professor-müəllim *(prof.Məlikməmməd Cəbrayılov,prof.Vəli Qurbanov, prof.Azadxan Adıgözəlov, dos.Bəhram Əliyev, dos.Maqsud Nəcəfov və b.)* riyazi analiz, cəbr, həndəsə, hesablama riyaziyyatı, İKT, informatika və riyaziyyatı tədrisi metodikası sahəsində maraqlı araşdırmalar aparmış, tədqiqatlarının nəticələrinin xarici ölkələrin nüfuzlu jurnallarında nəşrinə nail olublar.

**Pedaqoji** fakültənin *(dekan prof.Fərrux Rüstəmov)* bakalavriat səviyyəsində 1025 (530 əyani, 495 qiyabi), magistratura səviyyəsində 91 nəfər tələbənin təhsil -tərbiyəsi ilə 10 elmlər doktoru, professor, 40 fəlsəfə doktoru, dosent, 50 baş müəllim və müəllim məşğul olurdu.

***İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasında*** 20 professor-müəllim (2 elmlər doktoru, professor, 10 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, müəllim, 3 baş müəllim, 3 müəllim) ibtidai siniflərdə təhsil-tərbiyənin təşkili xüsusiyyətlərini



*Pedaqoji fakültəsinin Elmi Şurasının iclasında*

(*prof.Fərrux Rüstəmov, prof.Sərdar Quliyev, dos. Yaqut Rzayeva, dos.Bəhruz Nəsirov, dos.Tamilla Vahabova, dos.Teyyubə Hüseynova dos. İsmət Məmmədova, dos.Təranə Əliyeva, dos.Səfurə İbrahimova*), ***Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasında*** 15 professor-müəllim (1 elmlər doktoru, professor, 9 fəlsəfə doktoru, dosent, 4 fəlsəfə doktoru, baş müəllim, 1 baş müəllim, 1 müəllim) ibtidai və orta məktəblərdə riyaziyyat təliminin təkmilləşdirilməsi, gələcək ibtidai sinif müəllimlərinin və bağça tərbiyəçilərinin hazırlığında riyaziyyatın rolu ilə bağlı tədqiqatlar aparmışdır.

Məktəbəqədər təhsil müəssisələrində , ibtidai və orta məktəblərdə musiqi fənninin tədrisinin səviyyəsinin yüksəldilməsi ilə bağlı araşdırmalar Pedaqoji fakültənin nəzdindəki ***Musiqi alətləri kafedrasının*** (2 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim, 1 fəlsəfə doktoru, 10 baş müəllim) və ***Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının*** (1 elmlər doktoru, professor, 5 fəlsəfə doktoru, dosent, 9 baş müəllim, 5 müəllim) əməkdaşları tərəfindən aparılırdı. ***İbtidai siniflərdə rus dili kafedrasında*** 10 nəfər (1 fəlsəfə doktoru, professor), 3 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 3 nəfər baş müəllim, 2 müəllim) rus dilinin nəzəriyyəsi, nitq mədəniyyəti, rus dilinin tədrisi metodikası ilə bağlı araşdırmalar aparır, fakültənin istiqamətinə uyğun dərslik və dərs vəsaitləri hazırlayırdılar.

**Pedaqogika və psixologiya** fakültəsinin *(dekan dos. Şəhla Əliyeva)* bakalavriat pilləsinin əyani şöbəsində 505, qiyabi şöbəsində 195 tələbə təhsil alırdı. Fakültədə məktəbəqədər təlim və tərbiyə, təhsildə sosial-psixoloji xidmət, korreksiyaedici təlim ixtisasları üzrə kadr hazırlığı aparılırdı.

***Ümumi psixologiya*** kafedrasında 13 (1 elmlər doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, 4 baş müəllim, 3 müəllim) ***Məktəbəqədər pedaqogika kafedrasında*** 17 (8 fəlsəfə doktoru, dosent, 6 baş müəllim, 3 müəllim), ***Yaş və pedaqoji psixologiya*** kafedrasında 14 (1 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 1 baş müəllim, 9 müəllim) professor-müəllim şəxsiyyətlərarası münasibətlər,



*Pedaqogika və psixologiya fakültəsinin Elmi Şurasının iclasında*

təxəyyül psixologiyası, taksonomiya konsepsiyasının Azərbaycan modelinin yaradılması (*prof. Əbdül Əlizadə*), məktəbəqədər pedaqogikanın nəzəriyyəsi və tarixi (*dos.Raya Mursaqulova, dos. Şəhla Əliyeva, dos.Nazimə Rüstəmova* və b.), Azərbaycanda psixoloji fikrin inkişaf tarixi *(prof. Ərəstun Baxşəliyev),* yaş və pedaqoji psixologiyanın aktual problemləri *(prof.Qulam Əzimli)* sahəsində önəmli elmi nəticələrə gəldilər.

Prof. Ə.S.Bayramov və prof. Ə.Ə.Əlizadənin “Psixologiya” (1989) və “Sosial psixologiya” (2003) dərslikləri nəşr olundu.

**Coğrafiya və çağırışaqədər hazırlıq** fakültəsinin (*dekan dosent Mətanət Əsgərova) Ümumi coğrafiya kafedrasında* 12 (1 elmlər doktoru, professor, 9 fəlsəfə doktoru, dosent, 2 müəllim) və



*Coğrafiya fakültəsinin Elmi Şurasının iclasında*

*Fiziki coğrafiya kafedrasında* 5 (1 elmlər doktoru, 4 fəlsəfə doktoru, dosent), *İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasında* 14 (5 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, 2 baş müəllim, 6 müəllim), *Ekologiya kafedrasında* 8 (1 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, 2 baş müəllim, 3 müəllim) ümumi, fiziki, iqtisadi coğrafiyanın, ekologiyanın və coğrafiyanın tədrisi metodikası ilə bağlı xeyli elmi araşdırmalar aparılmışdır. Həmin dövrdə fakültənin *Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı kafedrasında* 8 (1 fəlsəfə doktoru, professor, 1 fəlsəfə doktoru, dosent, 5 baş müəllim, 1 müəllim) *Bədən tərbiyəsi kafedrasında* 13 (1 fəlsəfə doktoru, professor, 10 baş müəllim, 2 müəllim ), *İdman fənləri kafedrasında* 4 (1 dosent, 2 baş müəllim, 1 müəllim) professor-müəllim çalışırdı.

**Mühəndis-pedaqoji və bədii qrafika** fakültəsinin (*dekan dosent Arif Mustafayev*) bakalavriatura səviyyəsində 679 tələbə təhsil alırdı. Fakültədə peşə təlimi, ümumtexniki fənlər və fizika, təsviri incəsənət, rəsmxət və əmək təlimi ixtisasları üzrə kadr hazırlığı aparılırdı. 2010-cu ildən fakültədə "Texnologiya müəllimliyi" ixtisası üzrə də kadr hazırlığına başlanıldı. Elmi-tədqiqat işləri *İstehsalatın əsasları kafedrasında* 10 (2 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 1 dosent, 3 baş müəllim, 3 müəllim) *Elektroradiotexnika kafedrasında* 8 (4 fəlsəfə doktoru, dosent, 3 baş müəllim, 1 müəllim), *Maşınşünaslıq kafedrasında* 12 ( 5 fəlsəfə doktoru, dosent, 4 baş müəllim, 3 müəllim), *Təsviri incəsənət, rəsmxət və onların tədrisi metodikası kafedrasında* 12 (5 fəlsəfə doktoru, dosent, 2 baş müəllim, 5 müəllim) , *Rəsm, heykəltəraşlıq və boyakarlıq kafedrasında* 11 (3 fəlsəfə doktoru, dosent, 6 baş müəllim, 2 müəllim) əməkdaş tərəfindən aparılırdı.

Kafedralarla bərabər ***"Türk araşdırmaları"*** (prof.Elman Quliyev), ***"Dədə Qorqud"*** (prof. Ramazan Qafarlı), ***"Pedaqoji təhsilin problemləri"*** (prof.A.Mehrabov, dos.Bəhruz Nəsirov), ***"Nadir torpaq metal materiallarının fizikası"*** (rəhbər prof.Mirzəli Murğuzov), ***"Koordinasion birləşmələr"*** (rəhbəri prof.NailəVerdizadə),***"Yeni bioloji aktiv birləşmələr"*** (rəhbəri dos.Vaqif Həsənov) elmi-tədqiqat laboratoriyalarında Azərbaycan dili və ədəbiyyat, pedaqogika-psixologiya, kimya və fizika ilə bağlı sistemli araşdırmalar aparılırdı.



*Mühəndis-pedaqoji və bədii qrafika fakültəsinin Elmi Şurasının iclasında*



*"Yeni bioloji aktiv birləşmələr" ETL-nin əməkdaşları*

## Azərbaycan Dövlət Pedaqoji Universitetinin 90 illik yubileyi

Pedaqoji Universitetin 90 illik yubileyinin təntənəli şəkildə qeyd edilməsi universitetin professor-müəllim və tələbə kollektivinin həyatında mühüm hadisəyə çevrildi.

20 aprel 2012-ci ildə universitetin əsas binasında (Səbail korpusu) dövlət və hökumət nümayəndələri, millət vəkilləri, universitet rektorları, elm və təhsil xadimləri, tanınmış ziyalılar, respublikamızın ali təhsil müəssisələrinin, elmi-tədqiqat institutlarının, eləcə də Türkiyənin, Şimali Kiprin nüfuzlu universitetlərinin nümayəndələrinin və universitetin müəllim-tələbə heyətinin iştirakı ilə Pedaqoji Universitetin 90 illik yubileyi keçirildi. Tədbiri giriş sözü ilə açan Təhsil naziri Misir Mərdanov pedaqoji kadr hazırlığında böyük xidmətləri olan ADPU-nun 90 illik yubileyi münasibətilə ölkə Prezidenti cənab İlham Əliyevin kollektivə təbrikini çatdırdı. Sonra cənab Prezidentin 18 aprel 2012-ci il tarixli Sərəncamının mətnini səsləndirdi, yüksək dövlət mükafatına layiq görülən professor-müəllimləri təbrik etdi. Məlum oldu ki, dövlətimizin başçısı Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə universitetin 9 nəfərini "Tərəqqi" medalı ilə təltif etmiş, 3 nəfərə "Əməkdar elm xadimi", 20 nəfərə "Əməkdar müəllim", 2 nəfərə "Əməkdar rəssam", 1 nəfərə "Əməkdar jurnalist", 1 nəfərə "Əməkdar mədəniyyət işçisi", 1 nəfərə "Əməkdar mühəndis" fəxri adı vermişdir.



*ADPU-nun 90 illiyinə həsr olunmuş tədbir*



*ADPU-nun 90 illiyinə həsr olunmuş tədbir*

## Azərbaycan Dövlət Pedaqoji Universitetinin əməkdaşlarının "Tərəqqi" medalı ilə təltif edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 23-cü bəndini rəhbər tutaraq qərara alıram:

Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə Azərbaycan Dövlət Pedaqoji Universitetinin aşağıdakı əməkdaşları **"Tərəqqi"** medalı ilə təltif edilsinlər:

Dadaşova Minarə Rəhim qızı
Əhmədov İlham Bəşir oğlu
Həsənov Vaqif Səməd oğlu
Qədimova Jalə Həmid qızı
Quliyev Edisson Məmməd oğlu
Quliyev Elman Hilal oğlu
Mehdizadə Nizam Mirxas oğlu
Mehrabov Vüqar Abdulla oğlu
Məmmədova Firuzə Nurəddin qızı
Uluxanlı Nurəddin Dostuməli oğlu

***İlham Əliyev***
***Azərbaycan Respublikasının Prezidenti***
***Bakı şəhəri, 18 aprel 2012-ci il.***

## Azərbaycan Dövlət Pedaqoji Universitetinin əməkdaşlarına fəxri adların verilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 23-cü bəndini rəhbər tutaraq qərara alıram:

Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə Azərbaycan Dövlət Pedaqoji Universitetinin aşağıdakı əməkdaşlarına Azərbaycan Respublikasının fəxri adları verilsin:

***"Əməkdar müəllim"***

Abdullayev Nadir Əziz oğlu
Abdullayev Saleh İsmayıl oğlu
Ağdamski Telman Əhməd oğlu
Baxşəliyev Yafəs Rəsul oğlu
Balayev Məhəmməd Alı oğlu
Cəfərov Cəfər Əsəd oğlu
Eyvazov Edil Əli oğlu
Əfəndiyeva Elmira Musa qızı
Feyzullayeva Tamilla Ələkbərovna
Hüseynov Azər Əliş oğlu
Hüseynov Balaxan Qaraxan oğlu
Xəlilov Zahid Abdulla oğlu
Köçərli Xəlil Süleyman oğlu
Quliyev Sərdar Musa oğlu
Nəcəfov Maqsud Ağaqulu oğlu
Novruzov Tərlan Cabbar oğlu
Paşayev Əmrulla Xanməd oğlu
Rzalı Oqtay Məhərrəm oğlu
Rzayev Əbdülməcid Seyid Rza oğlu
Sultanov Oqtay Balaqədəş oğlu

***"Əməkdar elm xadimi"***

Cəfərov İsgəndər Həsən oğlu
Əlizadə Əbdül Əli oğlu
Rüstəmov Fərrux Abbas oğlu

***"Əməkdar rəssam"***

Atayev Soltan Həmid oğlu
Zeynalov Fərahim İbrahim oğlu

***"Əməkdar jurnalist"***

Qaraməmmədli Yasin Alı oğlu

***"Əməkdar mühəndis"***

Hüseynov Səfər Əhli oğlu

***"Əməkdar mədəniyyət işçisi"***

Hüseynov Azər Umud oğlu

***İlham Əliyev***
***Azərbaycan Respublikasının Prezidenti***
***Bakı şəhəri, 18 aprel 2012-ci il***

## "Tərəqqi" medalı ilə təltif olunanlar


*M.Dadaşova*


*İ.Əhmədov*


*V.Həsənov*


*J.Qədimova*


E.Quliyev


E.Quliyev


N.Mehdizadə


V.Mehrabov

## Əməkdar müəllim fəxri adı ilə təltif olunanlar


F.Məmmədova


N.Uluxanlı


N.Abdullayev


S.Abdullayev


T.Ağdamski


Y.Baxışəliyev


M.Balayev


C.Cəfərov


E.Eyvazov


E.Əfəndiyeva


T.Feyzullayeva


A.Hüseynov


B.Hüseynov


Z.Xəlilov


X.Köçərli


S.Quliyev


M.Nəcəfov


T.Novruzov


Ə.Paşayev


O.Rzalı


Ə.Rzayev


O.Sultanov

**Əməkdar elm xadimi fəxri adı ilə təltif olunanlar**


İ.Cəfərov


Ə.Əlizadə

**Əməkdar elm xadimi**


F.Rüstəmov

**Əməkdar rəssam fəxri adı ilə təltif olunanlar**


S.Atayev


F.Zeynalov

**Əməkdar jurnalist**


Y.Qaraməmmədli

Yubiley tədbirində Azərbaycan Dövlət Pedaqoji Universitetin rektoru, AMEA-nın müxbir üzvü, prof. Yusif Məmmədov "ADPU-nun tarixi, bu günü, perspektivləri" mövzusunda məruzə ilə çıxış etdi. Məruzədə universitetin yaranma tarixi, zəngin inkişaf yolunda qazandığı uğurlar, ölkəmizin təhsil müəssisələri üçün kadr hazırlığı ilə yanaşı, həm də xarici ölkələr üçün elmi-pedaqoji kadr hazırlığı sahəsində göstərdiyi mühüm xidmətlər tədbir iştirakçılarının diqqətinə çatdırıldı.

Sonra universitetin yubiley mərasiminə həsr olunmuş film nümayiş etdirildi.

Yubiley tədbirində Milli Məclisin sədr müavini *Bahar Muradova*, Bakı Dövlət Universitetinin rektoru *Abel Məhərrəmov*, Azərbaycan Tibb Universitetinin rektoru *Əhliman Əmiraslanov*, Yeni Azərbaycan Partiyasının sədr müavini *Əli Əhmədov*, Azərbaycan Dövlət İqtisad Universitetinin rektoru *Şəmsəddin Hacıyev*, Azərbaycan Müəllimlər İnstitutunun rektoru *Aqiyə Naxçıvanlı*, Səbail RİH-in başçısı *Asif Əsgərov,* AMEA-nın birinci vitse-prezidenti *Arif Həşimov*, Bakı Slavyan Universitetinin rektoru *Kamal Abdulla, ADPU-nun Fəxri doktoru Tincal Özgen*

**Əməkdar mühəndis**



S.Hüseynov

**"Əməkdar mədəniyyət işçisi**



A.Hüseynov

və başqaları çıxış edərək universitetin professor-müəllim və kollektivini təbrik etdilər.

Yubiley tədbirində Azərbaycan Dövlət Pedaqoji Universiteti kollektivinin Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevə müraciəti[227] qəbul edildi. Müraciəti tribunadan Pedaqoji fakültənin dekanı, professor *Fərrux Rüstəmov* səsləndirdi.




## Azərbaycan Dövlət Pedaqoji Universiteti kollektivinin Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevə M Ü R A C İ Ə T İ

***Möhtərəm cənab Prezident!***

Azərbaycan Dövlət Pedaqoji Universitetinin 90 illik yubileyi münasibəti ilə universitetin professor-müəllim heyətinin böyük bir qrupunu "Tərəqqi" medalı və fəxri adlarla təltif etməklə sevincimizə sevinc qatdığınıza, böyük ənənələri olan bu təhsil ocağının pedaqoji və elmi-pedaqoji kadr hazırlığındakı roluna yüksək qiymət verdiyinizə görə Sizə olan hörmət və ehtiramımızı, dərin minnətdarlığımızı ifadə etməkdən məmnunluq duyuruq.

***Möhtərəm cənab Prezident!***

Bilavasitə Sizin rəhbərliyinizlə Azərbaycanda siyasi, sosial-iqtisadi, hüquqi islahatların həyata keçirilməsində, vətəndaş cəmiyyətinin qurulmasında, milli və Avropa dəyərlərinin bərqərar edilməsində, insan hüquqlarının və azadlıqlarının təmin olunmasında, demokratik təsisatlarının yaradılmasında, bazar iqtisadiyyatına keçid prosesində böyük nailiyyətlər əldə olunmuşdur.Sizin müstəsna təşkilatçılığınız, siyasi uzaqgörənliyiniz, milli və bəşəri ideallara sadiqliyiniz nəticəsində Azərbaycan bütün sahələrdə inkişaf edərək böyük beynəlxalq nüfuz, siyasi və iqtisadi güc qazanaraq regionun lider dövlətinə çevrilmiş, iqtisadi inkişaf tempinə görə dünya dövlətləri arasında ön sıraya çıxmışdır.Son illərdə ölkəmizdə ictimai-siyasi sabitliyin qorunmasını təmin edən əsaslar daha da möhkəmləndirilmiş, dünyanın örnək kimi qəbul etdiyi milli, dini, mədəni tolerantlıq mühiti daha da yaxşılaşdırılmışdır. Bakı Avropa və dünya elm, təhsil, mədəniyyət forumlarının və idman yarışlarının keçirildiyi məkana çevrilmiş, Azərbaycan BMT-nin Təhlükəsizlik Şurasının qeyri-daimi üzvü seçilməyi ilə siyasi nüfuzunun ən yüksək pilləsinə qalxmışdır. Bakının "Eurovizion" mahnı

[227] *Bax:"Gənc müəllim" qəzeti, aprel 2012*

müsabiqəsinə ev sahibliyi etməsi ölkəmizin yaxın gələcəkdə dünya əhəmiyyətli, beynəlxalq miqyaslı mədəni-kütləvi tədbirlərin keçirilməsinə zəmin yaradır. Elmimizin və təhsilimizin inkişafı, bu sahədə aparılan məqsədyönlü islahatlar, həyata keçirilən proqramlar, beynəlxalq təşkilatlarla səmərəli əməkdaşlıq, onu deməyə əsas verir ki, Azərbaycan elmi və təhsili özünün zəngin və mütərəqqi ənənələrinə, milli-mənəvi və ümumbəşəri dəyərlərə, beynəlxalq təcrübəyə əsaslanaraq ümummilli liderimiz Heydər Əliyevin müəyyənləşdirdiyi və cənab Prezident, Sizin uğurla davam etdirdiyiniz strateji kursa uyğun inkişaf edir. Cəmiyyətin intellektual potensialının formalaşmasında, maddi sərvətlərin insan kapitalına çevrilməsində, ölkənin təhlükəsizliyinin, sabitliyinin təmin edilməsində mühüm amil kimi çıxış edən təhsil sahəsində uğurlu islahatlar həyata keçirilir. Yeni-yeni məktəb binaları tikilir, müasir avadanlıqlarla təchiz edilir, kompüterləşdirilir, dərslik və dərs vəsaitləri, elmi-bədii kitablarla təmin olunur, istedadlı uşaqların üzə çıxarılması üçün yaradıcılıq müsabiqələri keçirilir, müəllimlərin və tələbələrin sosial müdafiəsi istiqamətində məqsədyönlü işlər görülür. Dünyanın aparıcı ölkələrində istedadlı gənclərimizin təhsilinə diqqət və qayğı dövlət siyasəti səviyyəsinə yüksəldilmişdir.Bu inkişafın etibarlı təməl üzərində qurulması Azərbaycan təhsilinin dünya təhsil məkanına uğurla inteqrasiyasını təmin edəcəkdir.

***Möhtərəm cənab Prezident*!**

Azərbaycan Dövlət Pedaqoji Universitetində yaşanan bayram əhvali- ruhiyyəsi Ulu öndərimiz Heydər Əliyevin qurub-yaratdığı, şah əsəri hesab olunan müstəqil Azərbaycanımızdakı sabitliyin, tərəqqinin, sosial-iqtisadi inkişafın, təhsilə və təhsil işçilərinə verdiyiniz yüksək qiymətin təzahürüdür. Son 6 ildə əməkdaşlarımızın fəaliyyəti Sizin tərəfinizdən yüksək qiymətləndirilmiş, 4 nəfərə “Şöhrət” ordeni, 26 nəfərə “Tərəqqi” medalı, 6 nəfərə “Əməkdar elm xadimi”, 39 nəfərə “Əməkdar müəllim”, 1 nəfərə ”Əməkdar mədəniyyət işçisi”, 2 nəfərə “Əməkdar rəssam”, 1 nəfərə “Əməkdar jurnalist”, 1 nəfərə əməkdar mühəndis” fəxri adları, 4 nəfərə Prezident təqaüdü verilmişdir. Bu, respublikada ali pedaqoji təhsilə və təhsil işçilərinə Sizin diqqət və qayğınızın təzahürüdür.

***Möhtərəm cənab Prezident!***

Biz sizin Vətənə, xalqa dərin məhəbbətinizdən çox məmnun olur, qürur hissi duyur, əmin edirik ki, elmimizin, təhsilimizin inkişafında, dünyaya inteqrasiyasında, Azərbaycanımız üçün pedaqoji və elmi pedaqoji kadr hazırlığı işində var qüvvəmizlə çalışacaq, bu istiqamətdəki şərəfli fəaliyyətinizin köməkçisi olacağıq.

***Möhtərəm cənab Prezident!***

Azərbaycan Dövlət Pedaqoji Universitetinin çoxminli professor- müəllim və kollektivinə göstərdiyiniz diqqət və qayğıya, verdiyiniz yüksək qiymətə görə Sizə dərin minnətdarlığımızı bildirir, Sizi əmin edirik ki, qayğınıza əməli işimizlə cavab verəcək, Azərbaycan dövlətinin və dövlətçiliyinin inkişafı yolunda öz səyimizi, bilik və bacarığımızı heç vaxt əsirgəməyəcəyik.

***Müraciət Azərbaycan Dövlət Pedaqoji Universitetinin 90 illik yubileyi münasibəti ilə 2012-ci ilin aprelin20-də keçirilmiş təntənəli mərasimdə qəbul edilmişdir.***
***Rektor: Yusif Məmmədov***

Yubiley tədbirinin rəsmi hissəsi sözləri şair Oqtay Rzaya, musiqisi, Əməkdar incəsənət xadimi, prof.Elnarə Dadaşovaya aid olan ADPU-nun himninin səsləndirilməsi ilə başa çatdı. Sonra tələbələrin iştirakı ilə bayram konserti oldu.

Qeyd etmək lazımdır ki, həm yubileylər arasında, həm də son yubileydən sonra Pedaqoji Universitetin əməkdaşları Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin müvafiq sərəncamları ilə yüksək dövlət mükafatlarına layiq görülüblər.

ADPU-nun rektoru, prof.Yusif Məmmədov 21 yanvar 2010-cu ildə, Azərbaycan dilçiliyi kafedrasının müdiri, prof.Nizami Xudiyev 30 mart 2009-cu ildə "Şöhrət" ordeni ilə, Müasir Azərbaycan dili kafedrasının müdiri, prof.Həsən Mirzəyev 3 oktyabr 2007-ci ildə Əməkdar elm xadimi, Həmkarlar İttifaqı Komitəsinin sədri, dos.Vaqif Əliyev 4 iyun 2010-cu ildə Əməkdar mədəniyyət işçisi, dos. Gülbala Quliyev 22 dekabr 2009-cu ildə Əməkdar bədən tərbiyəsi və idman xadimi, dos.Tamilla Vahabova 3 oktyabr 2013-cü ildə, dos.Allahverdi Hacıyev 18 noyabr 2017-ci ildə, Sakibə Ələsgərova 3 oktyabr 2017-ci ildə Əməkdar müəllim fəxri adları ilə təltif olunmuş, prof.Həsən Mirzəyevə (13 aprel 2009) və Hüseyn Əhmədova (3 oktyabr 2007) Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdü verilmişdir.


*Y.Məmmədov*


*H.Mirzəyev*


*N.Xudiyev*


*H.Əhmədov*


*V.Əliyev*


*T.Vahabova*


*A.Hacıyev*


*S.Ələsgərova*

Pedaqoji Universitetdə struktur dəyişikliyi edildi. 2015-ci il oktyabrın 20-dən Fizika və Mühəndis-pedaqoji və bədii qrafika fakültələri birləşdirilərək onların bazasında Fizika və Texnologiya fakültəsi yaradıldı. Mühəndis-pedaqoji və bədii qrafika fakültəsinin "Təsviri incəsənət müəllimliyi" ixtisasının və Pedaqoji fakültənin "Musiqi müəllimliyi" ixtisaslarının bazasında Musiqi və təsviri incəsənət fakültəsi yaradıldı. Fakültəyə rəhbərlik Pedaqoji fakültənin dekanı prof. Fərrux Rüstəmova həvalə olundu. Tarix və Coğrafiya fakültələrinin bazasında Tarix və coğrafiya fakültəsi təşkil olundu. Fakültəyə rəhbərlik dos.Rəcəb Əliyevə həvalə edildi. Coğrafiya fakültəsinin nəzdində olan Gənclərin çağırışaqədər hazırlığı ixtisası Musiqi və təsviri incəsənət fakültəsinin tərkibinə verildi. 2016-



*G.Quliyev*

cı ildə Kimya və Biologiya fakültələri birləşdirildi və onların əsasında Kimya və biologiya fakültəsi yaradıldı. Fakültəyə rəhbərlik prof.Bəhlul Ağayevə həvalə olundu.

2016-cı ilin iyul ayına qədər Azərbaycan Dövlət Pedaqoji Universitetində 11 fakültə, 45 kafedra olmaqla 1800 ştat mövcud idi. Onlardan 694 nəfər professor-müəllim heyəti, 908 nəfər inzibati işçi, o cümlədən 69 nəfər kitabxanaçı, 207 nəfər laborant və böyük laborant idi.

2015-ci ildə institutun tərbiyə işləri üzrə prorektoru, prof.Rafiq Baxşəliyev Fiziki tərbiyə və çağırışaqədər fənlərin tədrisi metodikası kafedrasına müdir vəzifəsinə seçildiyinə görə vəzifəsindən azad olundu. Tərbiyə işləri üzrə prorektor vəzifəsinə *prof.Fikrət Rzayev* təyin olundu. Elmi işlər üzrə prorektor *prof.Vilayət Əliyev* rektorun müşaviri təyin olundu. 18 mart 2016-cı ildə *prof.Asəf Zamanov* elm və innovasiyalar üzrə prorektoru vəzifəsinə təyin olundular.

## ADPU-nun inkişafında yeni mərhələ: Azərbaycan Müəllimlər İnstitutunun və onun filiallarının Pedaqoji Universitetə qoşulması

Azərbaycan Respublikası Prezidentinin 24 oktyabr 2013-cü il tarixli Sərəncamı ilə təsdiq olunmuş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda nəzərdə tutulan ən mühüm vəzifələrdən biri də müasir tələblərə cavab verən təhsil infrastrukturunun yaradılması və təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılmasıdır. Dövlət Strategiyasının bu tələblərinə uyğun olaraq, ölkə Prezidentinin 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutunun (AMİ) ADPU-ya qovuşması və onun 7 filialının (Qazax, Zaqatala, Şəki, Quba, Ağcabədi, Cəlilabad, Şamaxı) da ADPU -nun strukturuna çevrilməsi nəticəsində ADPU ölkədə pedaqoji kadr hazırlığı ilə məşğul olan vahid ixtisaslaşmış ali təhsil müəssisəsinə çevrildi.

### Azərbaycan Müəllimlər İnstitutunun Azərbaycan Dövlət Pedaqoji Universitetinə qoşulması barədə Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

*Pedaqoji kadrların müasir tələblər səviyyəsində hazırlanmasını təmin etmək, ali təhsil müəssisələrinin sayını optimallaşdırmaq, mövcud maddi-texniki və kadr potensialından istifadənin səmərəliliyini artırmaq məqsədi ilə Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq qərara alıram:*

*1. Azərbaycan Müəllimlər İnstitutu Azərbaycan Dövlət Pedaqoji Universitetinə qoşulsun.*

*2. Azərbaycan Müəllimlər İnstitutunun Ağcabədi, Cəlilabad, Qazax, Quba, Şamaxı, Şəki və Zaqatala filialları Azərbaycan Dövlət Pedaqoji Universitetinin filialları hesab olunsun.*

*3. Azərbaycan Respublikasının Nazirlər Kabinetinə tapşırılsın ki, bir ay müddətində:*

*3.1. qüvvədə olan qanunvericilik aktlarının bu Sərəncama uyğunlaşdırılması barədə təkliflərini hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;*

*3.2. Azərbaycan Respublikası Nazirlər Kabinetinin və müvafiq mərkəzi icra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının bu Sərəncama uyğunlaşdırılmasını təmin etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;*

*3.3. bu Sərəncamdan irəli gələn digər məsələləri həll etsin.*

*4. Azərbaycan Respublikasının Təhsil Nazirliyi Azərbaycan Respublikasının Maliyyə Nazirliyi və Azərbaycan Respublikasının Əmlak Məsələləri Dövlət Komitəsi ilə birlikdə bu Sərəncamın icrası nəticəsində qənaət olunan maliyyə vəsaitinin Azərbaycan Dövlət Pedaqoji Universitetinin elmi-pedaqoji potensialının gücləndirilməsinə yönəldilməsini, həmçinin azad olmuş maddi-texniki bazadan təhsil sisteminin məqsədləri üçün istifadə olunmasını təmin etsin.*

***İlham Əliyev***
*Azərbaycan Respublikasının Prezidenti*
*Bakı şəhəri, 26 noyabr 2015-ci il.*

Qeyd etmək lazımdır ki, Azərbaycan Müəllimlər İnstitutunun ADPU-nun strukturuna çevrilməsi üçün bir ilə yaxın vaxt lazım oldu. Həmin dövrdə Azərbaycan Müəllimlər İnstitutunun rektoru vəzifəsi Azərbaycan Respublikasının Təhsil naziri Mikayıl Cabbarovun əmri ilə fizika-riyaziyyat elmləri doktoru, professor ***Asəf Dağbəyi oğlu Zamanova***[228] həvalə olundu. Azərbaycan Müəllimlər İnstitutunun ADPU-ya qoşulması tam başa çatana kimi o, həmin vəzifəni icra etdi. Bununla yanaşı, Nazirlər Kabinetinin 3 fevral 2016-cı il tarixli qərarı ilə Bakı Sənaye-Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Kollecinə (ADPK) birləşdirilməklə ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci kimi fəaliyyət göstərməyə başladı. Azərbaycan Respublikasının Prezidentinin 2016-cı il 29 aprel tarixli Sərəncamı ilə ADPU-nun Qazax filialı Bakı Dövlət Universitetinə, Zaqatala filialı isə Azərbaycan Dövlət İqtisad Universitetinə verildi[1]. Pedaqoji Universitet Şəki, Quba, Ağcabədi, Cəlilabad və Şamaxı filialları ilə fəaliyyətini davam etdirməli oldu.



***Asəf Zamanov***
*fizika-riyaziyyat elmləri doktoru, professor*
*(1957)*

*10 may 1957-ci ildə Naxçıvan Muxtar Respublikasının Şahbuz rayonunda anadan olub. 1979-cu ildə Bakı Dövlət Universitetinin Tətbiqi riyaziyyat və kibernetika fakültəsini bitirmişdir. 1978/79-cu tədris ilində Moskva Dövlət Universitetinin Hesablama riyaziyyatı və kibernetika fakültəsində təhsil alıb, SSRİ Dövlət mükafatı laureatı, professor A.S.İlinskinin rəhbərliyi ilə diplom işi yerinə yetirib. AMEA-nın Riyaziyyat və Mexanika İnstitutunda kiçik elmi işçi, elmi işçi, aparıcı elmi işçi və baş elmi işçi (1979-1994), AMEA-nın Rəyasət Heyətinin Fizika-riyaziyyat və texnika elmləri bölməsinin elmi katibi (1994-1997), Təhsil Nazirliyinin Elm idarəsinin rəisi (1997-2007), eyni zamanda Təhsil Problemləri İnstitutunun direktoru (2000-2001), Bakı Pedaqoji Kadrların İxtisasartırma və Yenidənhazırlanma İnstitutunun (Təhsil İşçilərinin Peşəkar İnkişafı İnstitutu) rektoru (2007-2016) vəzifələrində işləyib. Azərbaycan Müəllimlər İnstitutunun rektoru (2015-2016) vəzifəsini icra edib.*

*[228] 2016-cı il iyul ayının 1-dən ADPU-nun Qazax filialı Bakı Dövlət Universitetinin Qazax filialı, Zaqatala filialı isə Azərbaycan Dövlət İqtisad Universitetinin Zaqatala filialı kimi fəaliyyətə başladı.*

*18 mart 2016-cı ildən ADPU-nun elm və innovasiyalar üzrə prorektorudur. 2017-ci ildən Beynəlxalq TURKSOY Təşkilatı ilə birgə yaradılmış Turksoy kafedrasının rəhbəri, 2021-ci ildən şəxsi təşəbbüsü ilə yaradılmış Təhsil menecmenti kafedrasının müdiri vəzifəsini icra edir. 2014-cü ildən Bakı şəhər Binəqədi rayon Ziyalılar Cəmiyyətinin sədridir.*

*AMEA-nın Riyaziyyat və Mexanika İnstitutunun aspiranturasında (1983-1986)əyani təhsil almışdır. 1986-cı ildə «Устойчивость полых ц илиндрических тел под одновременным действием «мертвых» и «следящих» нагрузок» mövzusunda namizədlik dissertasiyasını, 2003-cü ildə «Собственные и вынужденные колебания пластин из композитного материала с искривленными структурами» mövzusunda doktorluq dissertasiyasını müdafiə etmişdir. SSRİ Nazirlər Soveti yanında Ali Attestasiya Komissiyası tərəfindən fizika-riyaziyyat elmləri namizədi (1986) elmi dərəcəsinə, baş elmi işçi (1990) elmi adına, Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyası tərəfindən fizika-riyaziyyat elmləri doktoru (2003) elmi dərəcəsinə, professor (2009) elmi adına layiq görülmüşdür. Professor A.D.Zamanovun elmi əsərləri mexanikanın müasir və aktual sahələrindən olan əyri struktura malik kompozit materiallardan hazırlanmış konstruksiya elementlərinin hesabatının fundamental nəzəri əsaslarına həsr olunmuşdur. Aldığı elmi nəticələr strukturunda periodik və lokal əyriliyi olan kompozitlərin kontinual nəzəriyyəsinin təkmilləşdirilməsinə və konkret məsələlərin həllinə tətbiq olunmuşdur. Hissə-hissə bircins cisim modeli çərçivəsində başlanğıc gərginlikli mühitlərdə xəttiləşdirilmiş üçölçülü dalğa yayılması nəzəriyyəsi tətbiq edilərək yüksək elastiki sıxılan materialdan hazırlanmış sonlu başlanğıc deformasiyalı lövhənin laylarında simmetrik və antisimmetrik Lamb dalğalarının yayılması tədqiq edilmişdir.*

*Azərbaycan Memarlıq və İnşaat Universitetinin Nəqliyyat tikintisi və yol hərəkətinin təşkili kafedrasının professoru (2004-2014), Bakı Pedaqoji Kadrların İxtisasartırma və Yenidənhazırlanma İnstitutunun Riyaziyyat və informatika kafedrasının müdiri (ictimai əsaslarla) və professoru (2008-2016) vəzifələrində işləmişdir. 2016-cı ildən ADPU-nun Riyazi analiz kafedrasının professoru vəzifəsində çalışır.*

*Колебания пластин из композитного материала с искривленными структурами" (2011) adlı monoqrafiyanın, ali məktəblər üçün "Riyaziyyat" (2006) və "Sosial işin əsasları" (2015) dərsliklərinin, 10 dərs vəsaitinin, respublikada və xarici ölkələrdə nəşr edilən beynəlxalq jurnallarda çap olunmuş 130-a qədər elmi məqalənin müəllifidir. Rusiya, Ukrayna, Özbəkistan, Latviya, Almaniya, Fransa, ABŞ, İtaliya, İsveç, İspaniya, Cənubi Koreya, Finlandiya, Sinqapur, Türkiyə, İranvə Gürcüstanda keçirilən beynəlxalq səviyyəli konfrans və simpoziumlarda elmi məruzələrlə çıxış edib, elmi bölmələrə rəhbərlik edib. Elmi rəhbərliyi ilə 9 fəlsəfə doktorluğu dissertasiyası hazırlanıb müdafiə edilmişdir. Onlarla monoqrafiya, dərslik və dərs vəsaitlərinin elmi redaktoru, elmlər doktorluğu və fəlsəfə doktorluğu dissertasiya işlərinin rəsmi opponenti olub.*

*1997-ci ildən Beynəlxalq Elmlər Akademiyaları Hesablama Riyaziyyatı üzrə Koordinasiya Komitəsinin, 2001-ci ildən YUNESKO-nun Bioetika, Elm və Texnologiyaların Etikası Azərbaycan Komitəsinin, 2011-ci ildən ABŞ-da (ingilis dilində) və Latviyada (rus dilində) nəşr edilən impakt faktor göstəricili "Mechanics of Composite Materials", 2018-ci ildən "Післядипломнаосвіта в Україні" beynəlxalq elmi jurnallarının, 2004-cü ildən "Beynəlxalq Mexanika-Maşınqayırma" elmi jurnalının, 2006-cı ildən "Təhsildə İKT" elmi-metodik jurnalının, 2008-ci ildən "Azərbaycan məktəbi", "Tarix, insan və cəmiyyət" və s. jurnalların redaksiya heyətinin üzvüdür. Azərbaycan Texniki Universitetinin nəzdində fəaliyyət göstərən Dissertasiya Şurasının (2004-2005), Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının Riyaziyyat və Mexanika ixtisasları*

*üzrə Ekspert Şurasının (2005-2014), AMEA Riyaziyyat və Mexanika İnstitutunun nəzdində fəaliyyət göstərən Dissertasiya Şurasının (2014-2016) üzvü olub. 2016-cı ildən ADPU-nun nəzdində fəaliyyət göstərən FD 02.061 Dissertasiya Şurasının, həmçinin bir neçə birdəfəlik dissertasiya şuralarının sədr müavinidir. "Pedaqoji Universitetin Xəbərləri. Humanitar, ictimai, pedaqoji-psixoloji elmlər seriyası" (2016-cı ildən) dövri-elmi jurnalının baş redaktorunun müavinidir. "Pedaqoji Universitetin Xəbərləri. Riyaziyyat və təbiət elmləri seriyası" (2019-cu ildən) və "Magistrant" (2021-ci ildən) dövri-elmi jurnallarının baş redaktorudur.*

*Azərbaycan Respublikası Prezidentinin Sərəncamı ilə elmin və təhsilin inkişafında xidmətlərinə görə "Tərəqqi" medalı (2005), həmçinin "Azərbaycan Həmkarlar İttifaqı Konfederasiyasının 100 illik yubiley medalı" (2007) və Təhsil Nazirliyinin "Qabaqcıl təhsil işçisi" (2007) döş nişanı ilə təltif edilmişdir.*

Deyirlər ki, tarix təkrar olunur: 2 dəfə (1927-1929 və 1941-1943-cü illərdə) Pedaqoji İnstitut Azərbaycan Dövlət Universitetinə birləşdirilib, Azərbaycan SSR Ali Sovetinin 26 mart 1959-cu il tarixli qərarı ilə Azərbaycan Qiyabi Pedaqoji İnstitutu bütövlükdə və 1 iyul 1959-cu il tarixli qərarı ilə isə Gəncə Pedaqoji İnstitutunun Tarix-filologiya fakültəsi Azərbaycan Dövlət Pedaqoji İnstitutunun tərkibinə verilib. Pedaqoji İnstitutun müvafiq fakültəsi əsasında Xarici Dillər İnstitutu yaradılıb. Müharibə dövründə Xarici Dillər İnstitutu yenidən Pedaqoji İnstitutun tərkibinə verilib, sonra hər ikisi birlikdə ADU-ya birləşdirilib və 1943-cü ildə yenidən ayrılıb. Bütün bu birləşmələr və ayrılmalar ciddi problemlər yaradıb.




*Elmi Şuranın iclası (2015)*



*Elmi Şuranın iclası (2015)*

Azərbaycan Müəllimlər İnstitutunun Pedaqoji Universitetə qoşulması da ciddi struktur və kadr islahatlarının aparılması zərurəti yaratdı. Birləşmənin optimal yollarının müzakirə edildiyi bir vaxtda - 5 may 2016-cı ildə universitetin rektoru, AMEA-nın müxbir üzvü, prof.Yusif Məmmədov rektor vəzifəsindən azad edilərək 7 may 2016-cı ildə Təhsil nazirinin müşaviri vəzifəsinə təyin edildi. ADPU-nun rektoru vəzifəsi tədris işləri üzrə prorektor, prof.***Məlikməmməd Cəbrayılova*** həvalə edildi. Həmin dövrdə universitetin akkreditasiyası ilə bağlı işlər yekunlaşdı. ADPU 7 iyun 2016-cı il tarixli 005 nömrəli sertifikatla 5 il müddətinə akkreditasiyadan keçmiş hesab edildi.

***Məlikməmməd Saday oğlu Cəbrayılov***
*fizika-riyaziyyat elmləri doktoru, professor*
*Əməkdar müəllim*
*(1945)*



*15 may 1945-ci ildə Hacıqabul (Qazıməmməd) rayonunun Atbulaq Sovetliyinin Qızılburun kəndində anadan olub. 1961-ci ildə Atbulaq kənd orta məktəbini, 1967-ci ildə V.Lenin adına ADPİ-nin Riyaziyyat fakültəsini bitirib. Tələbəlik illərində ən yüksək tələbə təqaüdünə -Lenin təqaüdünə layiq görülüb. 1966-cı ildə Moskvada SSRİ tələbələrinin I forumunda iştirak edib. İnstitutu fərqlənmə diplomu ilə bitirib. Lenin təqaüdçüsü olduğu üçün universitet Elmi Şurasının qərarı ilə Riyazi analiz kafedrasında assistent saxlanılıb. 1966-1970-ci illərdə ADPU-nun komsomol komitəsinin ştatlı katibi olub. 1970-1974-cü illərdə aspiranturada təhsil alıb. 1974-cü ildə "Çoxdəyişənli diferensiallanan funksiyalar nəzəriyyəsinin bəzi məsələləri" mövzusunda namizədlik, 1998-ci ildə "Vektorqiymətli funksiyalar üçün Besov fəzalarında daxilolma teoremləri və onların operator-diferensial tənliklərə tətbiqləri" mövzusunda doktorluq dissertasiyası müdafiə edib.*

*ADPU-nun Riyazi analiz kafedrasında müəllim (1967-1980), dosent (1980-1991) vəzifələrində işləyib, 1991-ci ildə həmin kafedraya professor seçilib. 1989-1996-cı illərdə ADPU-nun qiyabi təhsil üzrə prorektoru, 1996-2017-ci illərdə tədris işləri üzrə prorektoru,1998-2012-ci illərdə Riyazi analiz kafedrasının müdiri vəzifələrində çalışıb. Hazırda həmin kafedranın professorudur.*

*1989-1992-ci illərdə Azərbaycan ali pedaqoji məktəblərinin Elmi Metodiki Birləşməsinin sədri, sonrakı illərdə Təhsil Nazirliyinin müxtəlif işçi qruplarının və komissiyalarının üzvü olub. 2006, 2009 və 2012-ci illərdə Təhsil Nazirliyinin Dövlət Təhsil Proqramlarını (Dövlət standartları) hazırlayan işçi qrupuna rəhbərlik edib.*

*2009-2018-ci illərdə ADPU-nun nəzdində fəaliyyət göstərən ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi, təlim və tərbiyənin nəzəriyyəsi və metodikası ixtisasları üzrə Dissertasiya Şurasının üzvü, AMEA-nın Riyaziyyat və Mexanika İnstitutunda namizədlik və doktorluq dissertasiyalarının müdafiəsini keçirən birdəfəlik şuraların sədr müavini olmuşdur. Onun elmi rəhbərliyi ilə 7 nəfər riyazi analiz və riyaziyyatın tədrisi metodikası ixtisasları üzrə fəlsəfə doktoru elmi dərəcəsi almış, 1 nəfər elmlər doktoru, 4 nəfər fəlsəfə doktoru dərəcəsi almaq üçün dissertasiyalarını tamamlamışdır. 21 dissertasiya işinin rəsmi opponenti olmuşdur.*

*1 monoqrafiya, 120-dən artıq elmi və metodiki məqalə, 11 dərs vəsaiti və 2 metodik vəsaitin müəllifidir. Məqalələrinin xeyli hissəsi Rusiya və Ukrayna Elmlər Akademiyalarının Xəbərlərində və digər nüfuzlu elmi jurnallarda nəşr olunub. "Ədədi üsullardan mühazirələr" (1989), "Metrik fəzalar və çoxdəyişənli funksiyaların diferensial hesabı" (1982), "Metrik və normalı fəzalar. Xətti operatorlar" (2004), "Riyazi analiz" (diferensial hesabı) (2006,2010) və "Riyazi analiz" (inteqral hesabı) (B.Əliyevlə birlikdə) (2016) dərs vəsaitləri nəşr olunub.*

*Moskva Pedaqoji Universitetinin əməkdaşları ilə birlikdə Rusiya Təhsil Nazirliyinin qrifi ilə dərs vəsaiti kimi təsdiq edilən "Riyazi analiz" (I-II hissə) (Moskva, 2005,2006) kitabının nəşrinə nail olub.*

*Ali pedaqoji təhsilin və riyazi analizin tədrisinin aktual problemləri ilə bağlı Bakı, Ankara, Kiyev, Moskva, Odessa, Düşənbə, Kaluqa, Saratov, Teberda, Voronejdə keçirilən Beynəlxalq və respublika səviyyəli konfransların iştirakçısı olub. "Ömür boyu təhsil" layihəsi çərçivəsində Sankt-Peterburq, Roma, Afina, İstanbul, Helsinki şəhərlərində keçirilən konfrans və treninqlərdə iştirak edib. "ADPU-nun Xəbərləri" məcmuəsinin redaksiya heyətinin üzvüdür. 2002-ci ildə Beynəlxalq Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü seçilmişdir. Təhsil Nazirliyinin Kollegiyasının qərarı ilə "Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi" döş nişanı (2006), "Rəşadətli əməyə görə" medalı (1970), müxtəlif diplom və Fəxri fərmanlarla təltif olunub.*

*2006-cı ildə ona Əməkdar müəllim fəxri adı verilib. 2018-ci ildən ADPU Ağsaqqallar Şurasının sədridir.*

Əsas problem sentyabr ayına kimi AMİ-nin professor-müəllim və tələbə kollektivinin Pedaqoji Universitetə yerləşdirilməsinin başa çatdırılması idi. Bununla bağlı ADPU-nun struktur rəhbərlərinin və ləğv edilmiş AMİ-nin professor-müəllimlərinin iştirakı ilə geniş müşavirə keçirildi.

Prof.M.Cəbrayılovun sədrliyi ilə keçən həmin müşavirədə AMİ-nin 100 nəfərdən artıq professor-müəllimi Pedaqoji Universitetin müvafiq kafedralarına, tələbələr isə uyğun fakültələrə yerləşdirildi. İnzibati və tədris-köməkçi heyətin yerləşdirilməsi məqsədi ilə xüsusi komissiya yaradıldı.

Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin 23 iyun 2016-cı il tarixli sərəncamı ilə prof. ***Cəfər Məmməd oğlu Cəfərov*** Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru vəzifəsinə təyin olundu. Qarşıda duran ən mürəkkəb və çətin vəzifə Azərbaycan Müəllimlər İnstitutunun Azərbaycan Dövlət Pedaqoji Universitetinə birləşdirilməsini tam başa çatdırmaqdan ibarət idi. Bütün obyektiv və subyektiv çətinliklərə, narazılıqlara baxmayaraq, birləşmə prosesi qısa bir zamanda başa çatdı, universitetin sakit həyatı bərpa edildi və ciddi quruculuq işlərinə başlanıldı. Prof.Cəfər Cəfərovun rəhbərliyi ilə universitetin inkişaf strategiyası hazırlandı və uğurla həyata keçirilməyə başlandı.



## *Cəfər Məmməd oğlu Cəfərov*
*tarix elmləri doktoru, professor*
*(1960)*

*1960-cı il aprel ayının 21-də Naxçıvan şəhərində mühəndis ailəsində anadan olmuşdur. 1977-ci ildə Bakı şəhəri 158 №-li orta məktəbi bitirmiş və Azərbaycan Dövlət Universitetinin Tarix fakültəsinə daxil olmuşdur. 1980-1983-cü illərdə universitetin göndərişi əsasında təhsilini Moskva Dövlət Universitetinin (MDU) Tarix fakültəsində davam etdirmişdir. 1983-cü ildə Moskva Dövlət Universitetinin Tarix fakültəsinin aspiranturasına daxil olmuş, 1987-ci ildə dissertasiya işini müdafiə edərək tarix elmləri namizədi elmi dərəcəsi almışdır. Moskvada təhsil aldığı dövrdə Azərbaycanlı Tələbə və Aspirantlar Şurasının sədr müavini olmuşdur. 1987-1994-cü illərdə Azərbaycan Dövlət Universitetinin (1989-cu ildən BDU) Tarix fakültəsində böyük laborant, Azərbaycan tarixi kafedrasında müəllim, baş müəllim, dosent vəzifələrində çalışmışdır. 1990-1994-cü illərdə BDU-da Tarix üzrə İxtisaslaşmış Dissertasiya Şurasının elmi katibi, 1992-1994-cü illərdə Tarix fakültəsinin dekan müavini, 1994-1998-ci illərdə Azərbaycan Respublikası Gənclər və İdman Nazirliyinin Gənclərlə İş üzrə Baş İdarəsinin rəisi vəzifələrində işləmişdir.*

*1998-2003-cü illərdə BMT İnkişaf Proqramı və Azərbaycan hökumətinin "Azərbaycanda QHT/İƏT-lərin institusional potensialının artırılması ilə vətəndaş cəmiyyətinin gücləndirilməsi" birgə layihəsinin milli koordinatoru olmuşdur. 2000-2001-ci illərdə Fulbrayt proqramının qalibi kimi ABŞ Dövlət Departamentinin təqaüdü ilə Nyu-York Universitetinin Dövlət İdarəçiliyi Məktəbində tədqiqatçı alim vəzifəsində çalışmış, dərslərdə iştirak etmiş, mühazirələrlə çıxış etmişdir. Həmin dövrdə həm də BMT-nin mərkəzi qərargahında "Elektron Hökumət" layihəsinin icraçılarından biri olmuşdur. 2000-ci ildə ABŞ Dövlət Departamenti tərəfindən maliyyələşən Müasir Məsələlər üzrə Təqaüdlər Proqramının qalibi olmuşdur.*

*2002-ci ildə Azərbaycan Respublikasının Prezidenti tərəfindən Azərbaycan Respublikasının İnsan Hüquqları üzrə Müvəkkili (Ombudsman) vəzifəsinə təqdim olunan 3 namizəddən biri olmuşdur. 2001-ci ilin noyabr ayında keçirilən Dünya Azərbaycanlılarının I Qurultayında Dünya Azərbaycanlılarını Əlaqələndirmə Şurasının İdarə Heyətinin üzvü seçilmiş, 2003-2004-cü illərdə Beynəlxalq Mətbuat Mərkəzinin (BMM) direktoru vəzifəsində işləmişdir.*

*2004-2006-cı illərdə BMT İnkişaf Proqramı və Azərbaycan hökumətinin "Azərbaycan Respublikasında yoxsulluğun azaldılması məqsədilə daxili turizmin səmərəli inkişafının təmin olunması üzrə Azərbaycan Respublikasının Gənclər, İdman və Turizm Nazirliyinə institusional yardım" birgə layihəsinin milli koordinatoru olmuşdur.*

*17 fevral 2010-cu ildə AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunda tarix üzrə elmlər doktoru alimlik dərəcəsi almaq üçün doktorluq dissertasiyası müdafiə etmişdir. 2013-cü ildən professordur.*

*Azərbaycan tarixinin müasir problemləri, XX əsrin 20-ci illərinin sonu- 30-cu illərində Azərbaycan kəndi, vətəndaş cəmiyyətinin inkişafı, dövlət idarəçiliyi və cəmiyyətin demokratikləşməsi, turizmin və ali pedaqoji təhsilin inkişaf perspektivləri ilə bağlı respublikada və xaricdə nəşr olunan 90-dan çox kitabın, tədris-metodiki vəsaitin, elmi məqalənin müəllifidir. 36 xarici ölkədə keçirilən 100-dən çox beynəlxalq seminar, konfrans və simpoziumun iştirakçısı olmuşdur. 2006-2014-cü illərdə Azərbaycan Turizm İnstitutunun, 2014-2016-cı illərdə onun bazasında yaradılan Azərbaycan Turizm və Menecment Universitetinin rektoru olmuşdur. Azərbaycan Respublikasının Prezidenti İ.Əliyevin 23 iyun 2016-cı il tarixli Sərəncamı ilə prof. Cəfər Cəfərov Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru vəzifəsinə təyin olunmuşdur.*

*2013-2016-cı illərdə "Turizm və qonaqpərvərlik tədqiqatları" jurnalının baş redaktoru olub. 2016-2019-cu illərdə ADPU-nun nəzdində fəaliyyət göstərən "Ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi", "Təlim və tərbiyənin nəzəriyyəsi və metodikası" ixtisasları üzrə Dissertasiya Şurasının sədri olub. 2019-cu ildən isə ADPU-nun nəzdində fəaliyyət göstərən FD 2.15 Dissertasiya Şurasının sədridir.*

*Hazırda "ADPU-nun Xəbərləri", "Təhsildə İKT", "Tarix, insan və cəmiyyət" jurnallarının baş redaktoru, "Azərbaycan məktəbi", "Kurikulum" və Moskvada nəşr edilən "İnsan kapitalı" ("Человеческий капитал"* Журнал Московского университета*) elmi-praktik jurnallarının, "Kommunikologiya" ("Коммуникология") beynəlxalq elmi jurnalının, Rusiya Dövlət Humanitar Universitetinin* "Avrasiya tədqiqatları. Tarix. Politologiya. Beynəlxalq münasibətlər" elmi *jurnalının (*Вестник РГГУ. Серия «Евразийские исследования. История. Политология. Международные отношения». Научный журнал) *redaksiya heyətinin üzvüdür.*

Avrasiya İpək Yolu Universitetləri Konsorsiumu (ESRUC) İcraedici Şurasının üzvüdür. *2020-ci ildə Türkiyənin Ali Təhsil Keyfiyyət Şurasının xarici qiymətləndiricisi (ekspert) seçilib. 12 dekabr 2017-ci ildə Avstriyanın IMC/FH KREMS Universitetinin fəxri doktoru adına layiq görülüb.*

*Azərbaycan Respublikasının Prezidenti İ.Əliyevin sərəncamı ilə "Azərbaycan Xalq Cümhuriyyətinin 100 illiyi (1918–2018)" və "Bakı Dövlət Universitetinin 100 illiyi (1919-2019)" yubiley medalları ilə təltif olunub.*

*ABŞ-da təhsil alan Azərbaycanlı Məzunlar Assosiasiyasının "Təhsil sahəsində ən yaxşı nəticəyə görə" diplomu (2008), "Fəxri turizm işçisi" döş nişanı (2014), Humanist Pedaqogikanın Beynəlxalq Mərkəzi tərəfindən "Humanist pedaqogikanın cəngavəri" adı və "Ürək və qu quşu" döş nişanı (2017), Azərbaycan Respublikası Müharibə, Əmək və Silahlı Qüvvələr Veteranları Təşkilatının "General Həzi Aslanov" (2019) və Azərbaycan Vətən Müharibəsi Veteranları Birliyinin "Milli Ordunun 100 illik yubileyi" (2019) medalları və müxtəlif media mükafatları ilə təltif edilib.*








*ADPU-da keçirilən "Təhsildə mənəvi-əxlaqi dəyərlər: harmonik şəxsiyyətin inkişafı" mövzusunda II beynəlxalq konfrans-seminarda:prof.C.Cəfərov və akademik Ş.Amonaşvili*

ADPU Elmi Şurasının 11 iyul 2016-cı il tarixli iclasında rektor prof.Cəfər Cəfərov *"ADPU-nun idarə edilməsinin təkmilləşdirilməsi"* mövzusunda geniş məruzə ilə çıxış etdi. Rektor çıxışında universitetdə pedaqoji və elmi-pedaqoji kadr hazırlığında on illərlə formalaşmış ənənələri qoruyub saxlamaq şərti ilə yeni inkişaf istiqamətlərini müəyyənləşdirdi.

Universitetin maliyyə dayanıqlılığının qorunub saxlanılması, infrastrukturunun yeniləşdirilməsi, maddi texniki bazasının tədrisin müasir səviyyəsinə uyğunlaşdırılması, professor-müəllim heyətinin

sosial müdafiəsinin gücləndirilməsi məqsədilə fakültələrin, eyni profilli və tədris yükü az olan kafedraların birləşdirilməsinin vacib olduğunu əsaslandırdı.

Bu məqsədlə Elmi Şurada Kimya və biologiya fakültəsinin strukturunda zəruri dəyişiklik edildi. İnsan və heyvan fiziologiyası və Mülki müdafiə və tibbi biliklərin əsasları kafedralarının bazasında *İnsan və heyvan fiziologiyası kafedrası*, Botanika, Zoologiya və Biologiyanın tədrisi metodikası kafedralarının bazasında *Biologiya və onun tədrisi metodikası kafedrası*, Üzvi kimya və kimya texnologiyası kafedrası ilə Analitik və fiziki kimya kafedralarının bazasında *Üzvi və analitik kimya kafedrası*nın yaradılması qərara alındı.

AMİ-nin ADPU-ya qoşulması ilə əlaqədar 212 nəfər əməkdaş (96 professor-müəllim, 76 tədris-köməkçi heyət, 40 texniki işçi) qanunvericiliyə uyğun olaraq ADPU-da işlə təmin edildi. Bununla da ADPU inkişafının keyfiyyətcə yeni mərhələsinə qədəm qoydu.

2015-2020-ci illər üçün nəzərdə tutulan Azərbaycan Dövlət Pedaqoji Universitetinin strateji inkişaf planı[229] mütəxəssislər tərəfindən təhlil edilərək universitetin inkişaf istiqamətlərini özündə ehtiva edən yeni sənədlər: "Azərbaycan Dövlət Pedaqoji Universiteti: mövcud vəziyyət, islahatlar, görülən işlər və inkişaf istiqamətləri (iyul – oktyabr 2016)", "Azərbaycan Dövlət Pedaqoji Universitetinin tədrisin keyfiyyətinin yüksəldilməsinə dair 10 illik strateji inkişaf planı" (2016), "Azərbaycan Dövlət Pedaqoji Universitetinin strateji inkişaf məsələlərinə təkliflər paketi: transformasiya üçün yol xəritəsi" (2016), "2018-2021-ci illər üzrə Strateji inkişaf planı"[230] (2018) hazırlandı. Yerli və beynəlxalq ekspertlərin ADPU-da apardığı tədqiqatların nəticəsinə əsasən hazırlanan "Strateji inkişaf planı"nın icrasına başlanıldı.

## Rəqabət mühiti yaradan, stimullaşdırma və karyera inkişafını nəzərdə tutan layihə

İnfrastrukturun yeniləşdirilməsi, auditoriyaların təmiri, ümumtəhsil məktəbləri və xarici ölkələrin pedaqoji kadr hazırlığını həyata keçirən ali məktəbləri ilə əlaqələrin genişləndirilməsi, "Açıq qapı" günlərinin keçirilməsi, yüksək bal toplayan tələbələrin universitetimizə cəlbi, xarici və milli təhsil ekspertlərinin, elm və sənət adamlarının iştirakı ilə "Pedaqoji Forum"ların təşkili, müəllim kadrları hazırlığının nəzəri və praktiki problemləri ilə bağlı beynəlxalq və respublika səviyyəli konfransların təşkili sahəsində mühüm addımlar atıldı.

ADPU-nun "Səbail" tədris korpusunda əsaslı təmir işləri həyata keçirildi. Heydər Əliyev Fondunun maliyyə dəstəyi ilə 14 mərtəbəli tədris binası əsaslı şəkildə yenidən quruldu.

Universitetdə nəşr olunan jurnalların elmi statusu və periodikliyi təmin edildi. I kurs tələbələrinin biliyinin qiymətləndirilməsində test sistemindən imtina edildi. Obyektivliyi və şəffaflığı təmin etmək məqsədilə 2008-ci ildən universitetdə tətbiq edilən test sisteminin müəyyən dövrdən sonra qüsurları üzə çıxdı. Hafizəyə əsaslanan test sistemi tələbələri əzbərçiliyə istiqamətləndirirdi. Tələbələr mühazirə və seminar məşğələlərinə həvəssiz gəlir, müstəqil işləmək, əlavə kitab oxumaq istəmirdilər. Tələbələrin bəziləri hüsnxət qaydasında yazmaq (bu, xüsusilə, ibtidai sinif müəllimləri üçün çox zəruridir), rabitəli, ifadəli və obrazlı danışmaq qabiliyyətlərini demək olar ki, itirmişdi. II-IV kurs tələbələrinə imtahan formasını seçmək imkanı verildi. Bəzi imtahanlar ənənəvi qaydada - şifahi formada aparıldı. Universitetdə elmi seminarların keçirilməsi, qarşılıqlı dərs dinləmələri, tələbə debatları, idman yarışları mütəmadi xarakter aldı.

Tədris köməkçi heyətin (laborant, tyutor) peşəkarlıq səviyyəsini yoxlamaq məqsədilə təhsil ekspertləri prof.Şahlar Əsgərovun, prof.Əjdər Ağayevin iştirakı ilə komissiya yaradıldı. İşlədiyi

[229] *ADPU-nun Elmi Şurasının 12 fevral 2015-ci il tarixli iclasında (protokol № 9) təsdiq edilmişdir.*
[230] *ADPU-nun Elmi Şurasının 14 sentyabr 2018-ci il tarixli iclasının qərarı ilə (protokol №1) təsdiq edilmişdir.*

sahənin tələblərinə cavab verməyən, elementar texnoloji bacarığı olmayan, iş qabiliyyətini çoxdan itirmiş 70-80 yaşlı laborantlar tutduqları vəzifəyə uyğun hesab edilmədilər.

Universitetdə tədris prosesinin təkmilləşdirilməsi və daha səmərəli qurulması, əməkdaşlıq mühitinin yaradılması, sağlam rəqabətin formalaşdırılması dərin elmi-metodik biliyi, kreativ düşüncəsi, geniş erudisiyası, pedaqoji-psixoloji hazırlığı, yüksək mənəvi-əxlaqi keyfiyyətləri, akademik bacarığı, tədris təcrübəsi və peşəkarlıq səviyyəsi ilə fərqlənən müəllimlərdən birbaşa asılıdır. ABŞ-ın Şimali Karolina Universitetinin professoru, Nobel mükafatı laureatı Əziz Sancar Bakıda tələbələrlə görüşlərinin birində demişdi: *"Özünüzə yaxşı müəllim seçin*". On illərdir ki, azərbaycanlı tələbələrin də müəllim seçmək hüququ olsa da, amma bu seçimi reallaşdırmaq mexanizmi yoxdur. Əgər biz Avropa ölkələrində olduğu kimi müəllim seçimində peşəkarlığı, pedaqoji-psixoloji və metodiki hazırlığı önə çəkməyi qarşımıza məqsəd qoymuşuqsa onda seçki sisteminin metodologiyasını dəyişməliyik. Təbii ki, bu, mürəkkəb, çətin və ağrılı prosesdir. İşin pioneri olmaq həmişə çətin olub. Yeni bir ideya ortaya atılanda ilk mərhələdə çoxları onun əleyhinə çıxır, ideyanı illüziya hesab edirlər. İkinci mərhələdə bəziləri buna laqeyd yanaşır, yarı lehinə, yarı da əleyhinə danışır. Sonda hamı həmin ideyanı təqdir edir, hətta əvvəldən həmin fikirdə olduqlarını söyləyirlər.




*Ulu öndər H.Əliyevin xatirəsinə həsr olunmuş tədbir*

ADPU-da professor, dosent, baş müəllim və müəllim vəzifələrinin tutulması qaydalarındakı dəyişiklik qısa bir vaxtda həm seçkidə iştirak edənlərin, həm də universitet əməkdaşlarının seçki sistemi və tədris prosesi ilə bağlı baxışlarında köklü dəyişiklik yaratdı. Müsabiqənin şərtləri universitetin Elmi Şurasında müzakirə və təsdiq edildikdən sonra adpu.edu.az saytında yerləşdirildi, fakültələrdə seçkinin keçirilməsi şərtləri ilə bağlı maarifləndirici tədbirlər həyata keçirildi.

5 aprel 2017-ci il tarixində Azərbaycan Dövlət Pedaqoji Universitetində ayrı-ayrı fənlər üzrə professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün keçirilən müsabiqədə 114 yer uğrunda 500 nəfər mübarizə apardı. Müsabiqənin keçirilmə qaydalarına və şərtlərinə uyğun olaraq Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru dos.Sənan Əliyevin nəzarəti ilə fakültələrdə açıq dərslər keçirildi. Fakültə Tədris Metodiki Şurasının üzvləri tərəfindən həmin dərslər 33 kriteriya üzrə obyektiv və şəffaf qiymətləndirildi. 14 may 2017-ci il tarixində müsabiqənin son mərhələsi başa çatdı. Təhsil Nazirliyinin nümayəndələrinin də iştirak etdiyi genişləndirilmiş universitet Elmi Şurasında yekun nəticələr müzakirə olundu, qaliblərə sertifikatlar təqdim edildi. Müsabiqədə 112 nəfər uğur qazandı. Onlardan 12 nəfəri professor, 45 nəfəri dosent, 44 nəfəri baş müəllim, 11 nəfəri müəllim idi. Qalib gələnlərin 90%-i, yəni 100 nəfəri ADPU-nun əməkdaşları, 10%-i, yəni 12 nəfəri isə kənardan müsabiqədə iştirak edənlər idi.

2018-ci ildə bu ənənə davam etdirildi. Kafedralar üzrə boş olan 135 vəzifə uğrunda 376 nəfər mübarizə apardı. Onlardan 114 nəfəri müsabiqədə qalib gələrək müvafiq vəzifələrə təyin olundular. 2019-cu ildə boş olan professor-müəllim yerinə mübarizə aparan 361 namizəddən 187 nəfəri müsabiqədə uğur qazanaraq müvafiq vəzifələrə təyin edildilər. 2017-ci ildə 4 fakültə dekanı, 14 kafedra müdiri, 2018-ci ildə 6 kafedra müdiri, 2019-cu il

tarixində 1 kafedra müdiri, 1 mərkəz müdiri, 10 kafedra müdiri müsabiqə əsasında seçildi.

Universitetdə rəqabət mühiti yaradan, stimullaşdırma və karyera inkişafını nəzərdə tutan yeni model sınaqdan uğurla keçdi. Qaliblərə sertifikat təqdim olundu, bir ştat yarım tədris yükü ilə təmin edilmələri ilə bağlı göstəriş verildi. Qaliblərin əməkhaqqına əlavələr edildi.

Pedaqoji Universitetin respublikanın ali təhsil müəssisələri arasında reytinqinin ildən-ilə yüksəlməsinin nəticəsidir ki, AzEdu.az təhsil portalının keçirdiyi sorğunun nəticələrinə görə, ADPU "İlin ən yaxşı ali təhsil müəssisəsi" (2018) elan olundu. "Məktəb guşəsi" jurnalının Azərbaycanın 43 ali məktəbinin tələbələri arasında apardığı sorğu Pedaqoji Universitet üçün uğurlu olub. "Təhsil almaq üçün hansı universiteti seçərdiniz? nominasiyasına görə ADPU ikinci, "Hansı universitetin rektoru tələbəyə və cəmiyyətə əlçatandır? nominasiyasına görə isə birinci yeri tutdu. Uğurlu nəticəyə görə prof.Cəfər Cəfərov "Məktəb guşəsi" jurnalının təsis etdiyi "Təşəkkürnamə" ilə təltif edildi.





*"Azərbaycançılıq - milli ideologiyamız" mövzusunda ziyalılarla tələbələrin görüşü*

## Azərbaycan Dövlət Pedaqoji Universitetində tədrisin və elmi işlərin təşkili (2011-2021-ci illər)

Universitetin son onillik fəaliyyətini iki mərhələyə bölmək olar:1) 2011-2015-ci illər; 2) 2015-2021-ci illər.

*Birinci mərhələ* Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 28 sentyabr 2010-cu il tarixli 167 nömrəli qərarı ilə təsdiq edilmiş "Təhsil müəssisələrinin akkreditasiyası haqqında Qaydalar"a və Azərbaycan Respublikası Təhsil Nazirliyinin 22.05.2014-cü il məktubuna uyğun olaraq universitetin akkreditasiyadan keçirilməsi ilə, *ikinci mərhələ* Azərbaycan Müəllimlər İnstitutunun Azərbaycan Dövlət Pedaqoji Universitetinə qoşulması və idarəetmənin optimallaşdırılması ilə bağlıdır.

2011-2015-ci illərdə universitetdə ilkin müəllim hazırlığını həyata keçirən 10 fakültə fəaliyyət göstərirdi: 1) Filologiya fakültəsi (dekan prof.Buludxan Xəlilov); 2)Tarix fakültəsi (dekan prof. Oqtay Sultanov); 3)Pedaqoji fakültə (dekan prof. Fərrux Rüstəmov); 4)Kimya fakültəsi (dekan dos.Vaqif Həsənov); 5)Biologiya fakültəsi (dekan prof.Yusif Əhmədov); 6)Fizika fakültəsi (dekan prof.Mirzəli Murğuzov); 7)Riyaziyyat fakültəsi (dekan dos.Maqsud Nəcəfov); 8)Coğrafiya və çağırışaqədərki hazırlıq fakültəsi (dekan dos. Mətanət Əsgərova); 9)Pedaqogika və psixologiya fakültəsi (dekan dos. Şəhla Əliyeva; 10)Mühəndis-

pedaqoji və bədii qrafika fakültəsi (dekan dosent Arif Mustafayev). Bununla bərabər universitetdə Əcnəbi tələbələr üzrə fakültə (dekan dosent Nurəddin Uluxanlı) və Əlavə təhsil fakültəsi (prof. Mehralı Yusibov) fəaliyyət göstərirdi.

2010-2014-cü illərdə universitetin bakalavriatura səviyyəsində Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, xarici dil müəllimliyi (dillər üzrə) (ingilis, fransız), fizika müəllimliyi, riyaziyyat və informatika müəllimliyi, riyaziyyat müəllimliyi, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi (qızlar üçün fiziki tərbiyə), texnologiya müəllimliyi, musiqi müəllimliyi, biologiya müəllimliyi, kimya müəllimliyi, kimya və biologiya müəllimliyi, tarix müəllimliyi, tarix və coğrafiya müəllimliyi, coğrafiya müəllimliyi, informatika müəllimliyi, təsviri incəsənət müəllimliyi, ibtidai sinif müəllimliyi, korreksiyaedici təlim, məktəbəqədər təlim və tərbiyə, təhsildə sosial-psixoloji xidmət, menecment (təhsilin idarə olunması), ekologiya ixtisasları üzrə kadr hazırlığı həyata keçirilirdi.

Həmin illərdə kadr hazırlığı 2009 və 2014-cü ildə təsdiq olunmuş tədris planları[231] əsasında aparılırdı. Bakalavriatura təhsil səviyyəsində tələbələrin həftəlik tədris yükü orta hesabla 24 saat, nəzəri tədris müddəti I –V semestrlərdə 15 həftə, VI -VIII semestrdə 10 həftə, hər semestrdə imtahanların sayı 7, tədris ili ərzində tətil müddəti 12 həftə (2 həftə qış dövründə), magistratura təhsil səviyyəsində tədris müddəti I–III semestrlərdə 15 həftə, IV semestrdə 8 həftə elmi və tədris-pedaqoji təcrübə, dissertasiya işinin müdafiəsi nəzərdə tutulmuşdu. 2007/08-ci tədris ilindən orta balı 81-dən yuxarı olan və elmi yaradıcılığa həvəs göstərən tələbələr buraxılış işi yazır, digərləri isə dövlət imtahanı verirdi. Magistratura təhsil səviyyəsində yekun dövlət attestasiyası dissertasiya işinin yazılması və ixtisaslaşdırılmış Elmi Şurada müdafiəsi ilə yekunlaşırdı.

2011-ci ildən başlayaraq universitetin tələbə kontingentinin həm ümumi, həm də əyani şöbəyə qəbul olunanların sayında artım baş verdiyi halda, ildən ilə qiyabi şöbəyə ayrılan plan yerləri azaldıldı. 2011/12-ci tədris ilində qiyabi şöbəyə 472 tələbə qəbul edildiyi halda, 2014/15-ci illərdə cəmi 107 tələbə qəbul olundu. Daha keyfiyyətli pedaqoji kadr hazırlığı məqsədilə 2015/16-cı tədris ilində qiyabi şöbəyə tələbə qəbulu tamamilə dayandırıldı.

2011-2016-cı illərdə universitedə tələbələrin inkişaf dinamikası aşağıdakı kimi olmuşdur.

| Tədris illəri | Tələbələrin sayı | | Qəbul | | Məzun | |
|---|---|---|---|---|---|---|
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2011/12 | 5429 | 2526 | 1357 | 472 | 1232 | 609 |
| 2012/13 | 5785 | 2188 | 1597 | 155 | 1201 | 520 |
| 2013/14 | 6216 | 1857 | 1730 | 126 | 1256 | 495 |
| 2014/15 | 6770 | 1511 | 1882 | 107 | 1271 | 509 |
| 2015/16 | 7421 | 1096 | 2073 | - | 1441 | 482 |

Həmin dövrdə universitetin tərkibində struktur bölmə kimi 48 kafedra, magistratura və doktorantura şöbəsi, tədris-metodika şöbəsi, plan-maliyyə şöbəsi, elm və innovasiyalar şöbəsi, kadrlar şöbəsi, tələbələr şöbəsi, beynəlxalq əlaqələr şöbəsi, ümumi şöbə (dəftərxana), mətbuat və informasiya şöbəsi, hərbi səfərbərlik və xüsusi şöbə, təsərrüfat və texniki istismar şöbəsi, mülki müdafiə qərargahı,

*[231] 2014-cü ildə təsdiq olunmuş təhsil proqramları Azərbaycan Respublikası Nazirlər Kabinetinin 24 dekabr 2013-cü il tarixli 348 nömrəli əmri ilə təsdiq edilmiş "Ali təhsil müəssisələrinin bakalavriat və magistratura səviyyələrində kredit sistemi ilə tədrisin təşkili Qaydaları"nın tələblərinə uyğun hazırlanmışdır.*

mühasibat, kompüter mərkəzi, kurikulum və tyutor xidmətinə nəzarət bölməsi, tələbə məzun dövlət elektron məlumat sistemi bölməsi, muzey, kitabxana, Müasir təlim texnologiyaları təlim və resurs mərkəzi və 7 elmi-tədqiqat laboratoriyası fəaliyyət göstərirdi.

Bakalavriat səviyyəsində 23 ixtisas (4 ixtisas qrupu) üzrə mütəxəssis hazırlığı aparılırdı. 1 oktyabr 2015-ci il tarixə olan məlumata görə[232], bakalavriatura səviyyəsində təhsil alan tələbələrin ümumi sayı 8372 nəfər, o cümlədən əyani təhsil forması üzrə 6861 nəfər, qiyabi təhsil forması üzrə 1511 nəfər, magistratura səviyyəsində 885 nəfər, o cümlədən əyani təhsil forması üzrə 602 nəfər, qiyabi təhsil forması üzrə 283 nəfər olmuşdur ki, onlardan da 106 (103 bakalvr, 3 magistr) nəfəri xarici ölkə vətəndaşı olub. Ümumilikdə universitetin tələbə kontingenti 9257 nəfər olub.

2010-2015-ci illərdə universitetin bakalavriatura səviyyəsində 130 nəfər xarici ölkə vətəndaşı, o cümlədən 2010/11-ci tədris ilində 55 (Türkiyə vətəndaşı), 2011/12-ci tədris ilində 84 (Türkiyə vətəndaşı), 2012/13-cü tədris ilində 100 (Türkiyə vətəndaşı), 2013/14-cü tədris ilində 94 (3 Gürcüstan, 91 Türkiyə vətəndaşı), 2014/15-ci tədris ilində 103 (2 Rusiya, 10 Gürcüstan, 91 nəfər Türkiyə vətəndaşı) tələbə təhsil almışdır.

Həmin illərdə ayrı-ayrı fakültələrdə pedaqoji kadr hazırlığı aşağıdakı kimi olmuşdur.

**I.Filologiya fakültəsi.** Fakültənin (dekan *prof. Buludxan Xəlilov*) Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasında 780, ingilis dili müəllimliyi ixtisasında 311, fransız dili müəllimliyi ixtisasında 98 cəmi 1189 nəfər tələbə təhsil alırdı. Fakültənin fəaliyyətinə tərkibi 41 nəfərdən ibarət olan (17 elmlər doktoru, professor, 5 elmlər doktoru, dosent, 17 fəlsəfə doktoru, dosent, 1 dosent əvəzi, 1 tələbə) Fakültə Elmi Şurası rəhbərlik edirdi.

Fakültənin tərkibində 9 kafedra fəaliyyət göstərirdi.

*Azərbaycan dilçiliyi kafedrasında* (kafedra müdiri prof.Nizami Xudiyev) 2 elmlər doktoru, professor, 7 fəlsəfə doktoru, dosent, 1 baş müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 4014 saat təşkil edirdi.

*Müasir Azərbaycan dili kafedrasında* (kafedra müdiri prof.Həsən Mirzəyev) 6 elmlər doktoru, professor, 3 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 5704 saat təşkil edirdi.

*Azərbaycan ədəbiyyatı tarixi kafedrasında* (kafedra müdiri prof.Himalay Qasımov) 5 elmlər doktoru, professor, 5 fəlsəfə doktoru, dosent, 3 baş müəllim, 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 6196 saat təşkil edirdi.



*Azərbaycan dilçiliyi kafedrasının əməkdaşları*

*Dünya ədəbiyyatı kafedrasında* (kafedra müdiri prof.Tərlan Novruzov) 3 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 4199 saat təşkil edirdi.

*Azərbaycan dili və onun tədrisi metodikası kafedrasında* (kafedra müdiri prof.Əzizxan Tanrıverdiyev) elmlər doktoru, professor, 8 fəlsəfə doktoru, dosent, 6 baş müəllim, 6 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 15710 saat təşkil edirdi.



*Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının əməkdaşları*

[232] *Universitetin akkreditasiyası üzrə özünütəhlilin nəticələri haqqında hesabat. Hesabat ADPU-nun Elmi Şurasının 12 fevral 2015-ci il tarixli iclasında təsdiq edilmişdir.*



*Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının əməkdaşları*

*Ədəbiyyat və onun tədrisi metodikası kafedrasında* (kafedra müdiri prof.Zahid Xəlilov) 1 elmlər doktoru, professor, 10 fəlsəfə doktoru, dosent, 2 nəfər baş müəllim, 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 6996 saat təşkil edirdi.

*İngilis dili və onun tədrisi metodikası kafedrasında* (kafedra müdiri prof.Nailə Sadıqova) 1 elmlər doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 4 fəlsəfə doktoru, baş müəllim, 6 baş müəllim, 6 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 16219 saat təşkil edirdi.



*İngilis dili və onun tədrisi metodikası kafedrasının əməkdaşları*

*Rus dili və onun tədrisi metodikası kafedrasında* (kafedra müdiri dos.Leyla Vəzirova) 4 fəlsəfə doktoru, dosent, 1 baş müəllim, 4 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 3669 saat təşkil edirdi.

*Xarici dillər kafedrasında* (kafedra müdiri dos.Gülçöhrə Alıyeva) 1 elmlər doktoru, professor, 4 fəlsəfə doktoru, dosent, 18 baş müəllim, 34 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 43834 saat təşkil edirdi.

**II.Tarix fakültəsi.** Fakültədə (*dekan prof.Oqtay Sultanov*) tarix müəllimliyi ixtisasında 729, tarix və coğrafiya müəllimliyi ixtisasında 596, cəmi 1325 nəfər tələbə təhsil alırdı. Fakültənin fəaliyyətinə tərkibi 21 nəfərdən (1 nəfər AMEA-nın müxbir üzvü, 5 nəfər professor, 10 nəfər dosent, 2 nəfər baş müəllim, 2 nəfər müəllim, 1 nəfər tələbə) ibarət olan Fakültə Elmi Şurası rəhbərlik edirdi.

Fakültənin tərkibində 6 kafedra fəaliyyət göstərirdi:

*Ümumi tarix kafedrasında* (kafedra müdiri prof.Vəli Əliyev) 1 AMEA-nın müxbir üzvü, professor, 1 elmlər doktoru, professor, 7 fəlsəfə doktoru, dosent, 4 nəfər baş müəllim, 3 nəfər müəllim vəzifəsində çalışırdı. Kafedranın illik ümumi tədris yükü 7073 saat təşkil edirdi.



*Ümumi tarix kafedrasının əməkdaşları*

*Azərbaycan tarixi kafedrasında* (kafedra müdiri prof.Süleyman) Məmmədov) 2 elmlər doktoru, professor, 6 fəlsəfə doktoru, dosent, 4 fəlsəfə doktoru, baş müəllim, 3 baş müəllim, 3 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 10303 saat təşkil edirdi.



*Azərbaycan tarixi kafedrasının əməkdaşları*

*Ümumi pedaqogika kafedrasında* (kafedra müdiri prof.İramin İsayev) 1 fəlsəfə doktoru, professor, 8 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 2 fəlsəfə doktoru, müəllim, 4 baş müəllim və 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 15449 saat təşkil edirdi.



*Ümumi pedaqogika kafedrasının əməkdaşları*

*Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası* kafedrasında (kafedra müdiri dos.Rəcəb Əliyev) 2 elmlər doktoru, professor, 2 elmlər doktoru, dosent, 9 fəlsəfə doktoru, dosent, 4 fəlsəfə doktoru, baş müəllim, 1 fəlsəfə doktoru, müəllim, 3 baş müəllim, 2 müəllim çalışırdı. Kafedranın illik ümumi dərs yükü 11663 saat təşkil edirdi.



*Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının əməkdaşları*

*İqtisadi və sosial fənlər kafedrasında* (kafedra müdiri əvəzi b/m.Vaqif Əliyev) 1 elmlər doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim, 2 baş müəllim, 3 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 3847 saat təşkil edirdi.

Fəlsəfə kafedrasında (kafedra müdiri prof. Məmməd Balayev) 1 elmlər doktoru, professor, 6 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 1 baş müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 3886 saat təşkil edirdi.



*İqtisadi və sosial fənlər kafedrasının əməkdaşları*

**III. Biologiya fakültəsi**. Fakültədə (dekan *prof.Yusif Əhmədov*) biologiya müəllimliyi ixtisası üzrə əyani şöbədə 478, qiyabi şöbədə 192 tələbə təhsil alırdı. Fakültənin fəaliyyətinə tərkibi 25 nəfərdən (5 elmlər doktoru, professor, 10 dosent, 8 baş müəllim, 2 tələbə) ibarət olan Fakültə Elmi Şurası rəhbərlik edirdi.

Fakültənin tərkibində 5 kafedra fəaliyyət göstərirdi:

*Biologiyanın tədrisi metodikası* kafedrasında (kafedra müdiri prof. Əli Hüseynov) 1 elmlər doktoru, professor, 6 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 1 baş müəllim, 4 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 9980 saat təşkil edirdi.

*Botanika kafedrasında* (kafedra müdiri dos. Anaxanım Yusifova) 2 elmlər doktoru, professor, 6 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 3 baş müəllim, 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 7757 saat təşkil edirdi.

*Zoologiya kafedrasında* (kafedra müdiri prof. Bəhlul Ağayev) 1 elmlər doktoru, professor, 8 fəlsəfə doktoru, dosent, 2 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 7010 saat təşkil edirdi.

*İnsan və heyvan fiziologiyası kafedrasında* (kafedra müdiri prof.Ədalət Fərəcov) 2 elmlər doktoru, professor, 9 fəlsəfə doktoru, dosent, 2 baş müəllim, 7 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 8326 saat təşkil edirdi.



*İnsan və heyvan fiziologiyası kafedrasının əməkdaşları*

*Mülki müdafiə və tibbi biliklərin əsasları kafedrasında* (kafedra müdiri prof.Tamilla Feyzullayeva) 1 fəlsəfə doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 16 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 10665 saat təşkil edirdi.

**IV.Coğrafiya və gənclərin çağırışaqədər hazırlığı fakültəsi**. Fakültədə (dekan dos.Mətanət Əsgərova) coğrafiya müəllimliyi ixtisasında 507 (380 əyani, 127 qiyabi), fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi ixtisasında 135, menecment ixtisasında 55, ekologiya ixtisasında 24 (cəmi 721) tələbə təhsil alırdı. Fakültənin fəaliyyətinə tərkibi 23 nəfərdən (1 elmlər doktoru, professor, 2 fəlsəfə doktoru, professor, 1 elmlər doktoru, 12 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 2 müəllim və 2 tələbə) ibarət olan Fakültə Elmi Şurası rəhbərlik edirdi.

Fakültənin tərkibində 5 kafedra fəaliyyət göstərirdi:

*İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasında* (kafedra müdiri dos.Oqtay Alxasov) 5 nəfər fəlsəfə doktoru, dosent, 3 baş müəllim, 6 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 10449 saat təşkil edirdi.

*Fiziki coğrafiya və ekologiya kafedrasında* (kafedra müdiri c.ü.e.d. Məhəmməd Abduyev) 2 elmlər doktoru, professor, 1 elmlər doktoru, dosent, 3 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim, 1 fəlsəfə doktoru, müəllim, 3 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 5720 saat təşkil edirdi.

*Ümumi coğrafiya kafedrasında* (kafedra müdiri dos.Fərrux Həsənli) 8 fəlsəfə doktoru, dosent, 1 baş müəllim, 2 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 6715 saat təşkil edirdi.

*Fiziki tərbiyə və çağırışaqədərki hazırlığın tədrisi metodikası kafedrasında* (kafedra müdiri dos.Akif Əmiraslanov) 1 fəlsəfə doktoru, professor, 3 fəlsəfə doktoru, dosent, 6 baş müəllim, 2 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 4260 saat təşkil edirdi.

*Bədən tərbiyəsi kafedrasında* (kafedra müdiri prof. Əli Mehdiyev) 1 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, baş müəllim, 7 baş müəllim, 3 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 4421 saat təşkil edirdi.

**V.Riyaziyyat və informatika fakültəsi.** Fakültədə (dos.Maqsud Nəcəfov) riyaziyyat müəllimliyi ixtisasında 695 (481 əyani, 214 qiyabi), riyaziyyat və informatika müəllimliyi ixtisasında 333, informatika müəllimliyi ixtisasında 208, cəmi 1236 nəfər tələbə təhsil alırdı. Fakültənin fəaliyyətinə tərkibi 23 nəfərdən (5 nəfər professor, 3 nəfər elmlər doktoru, 12 dosent, 1 nəfər fəlsəfə doktoru, baş müəllim və 2 nəfər tələbə) ibarət olan Fakültə Elmi Şurası rəhbərlik edirdi.



*İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasının əməkdaşları*



*Riyazi analiz kafedrasının əməkdaşları*

Fakültənin tərkibində 5 kafedra fəaliyyət göstərirdi.

*Riyazi analiz kafedrasında* (kafedra müdiri prof.Vəli Qurbanov) 2 nəfər elmlər doktoru, professor, 1 nəfər elmlər doktoru, dosent, 6 nəfər fəlsəfə doktoru, dosent, 1 nəfər fəlsəfə doktoru, baş müəllim, 1 nəfər baş müəllim, 3 nəfər müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 9798 saat təşkil edirdi.



*Riyaziyyatın tədrisi metodikası kafedrasının əməkdaşları*

*Cəbr və həndəsə kafedrasında* (kafedra müdiri dos. Zahirəli Sadıqov) 9 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 1 baş müəllim, 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 10179 saat təşkil edirdi.

*Riyaziyyatın tədrisi metodikası* kafedrasında (kafedra müdiri prof.Azadxan Adıgözəlov) 1 elmlər doktoru, professor, 5 fəlsəfə doktoru, dosent, 5 baş müəllim, 4 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 14599 saat təşkil edirdi.

*Funksiyalar nəzəriyyəsi kafedrasında* (kafedra müdiri prof.Rəhim Rzayev) 1 elmlər doktoru, professor, 1 elmlər doktoru, dosent, 2 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 3 baş müəllim, 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 4067 saat təşkil edirdi.

*Hesablama riyaziyyatı və informatika kafedrasında* (kafedra müdiri dos.Zemfira Tağıyeva) 3 elmlər doktoru, professor, 9 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 1 fəlsəfə doktoru, müəllim, 1 baş müəllim, 3 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 15330 saat təşkil edirdi.

**VI. Kimya fakültəsi.** Fakültədə (dekan dos. Vaqif Həsənov) kimya müəllimliyi ixtisasında 269, kimya və biologiya müəllimliyi ixtisasında 253, cəmi 522 tələbə təhsil alırdı.

Fakültənin fəaliyyətinə tərkibi 14 nəfərdən (3 nəfər professor, 8 dosent, 2 baş müəllim və 1 tələbə) ibarət olan Fakültə Elmi Şurası rəhbərlik edirdi.

Fakültənin tərkibində 3 kafedra fəaliyyət göstərirdi:

*Üzvi kimya və kimya texnologiyası kafedrasında* (kafedra müdiri dos.Rəfiqə Məmmədova) 9 fəlsəfə doktoru, dosent, 2 baş müəllim, 5 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 7489 saat təşkil edirdi.



*Üzvi kimya və kimya texnologiyası kafedrasının əməkdaşları*

*Analitik və fiziki kimya kafedrasında* (kafedra müdiri prof.Nailə Verdizadə) 2 elmlər doktoru, professor, 8 fəlsəfə doktoru, dosent, 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 6321 saat təşkil edirdi.

*Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrasında* (kafedra müdiri prof.Ələkbər Qurbanov) 1 elmlər doktoru, professor, 7 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim, 2 fəlsəfə doktoru, müəllim, 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 9162 saat təşkil edirdi.

**VII. Fizika fakültəsi**. Fakültənin (dekan prof. Mirzəli Murquzov) fizika müəllimliyi ixtisasında 378 nəfər tələbə təhsil alırdı. Fakültənin fəaliyyətinə tərkibi 16 nəfərdən (5 nəfər professor, 2 nəfər elmlər doktoru, dosent, 5 nəfər fəlsəfə doktoru, dosent, 1 baş müəllim, 1 müəllim və 2 tələbə) ibarət olan Fakültə Elmi Şurası rəhbərlik edirdi.



*Analitik və fiziki kimya kafedrasının əməkdaşları*

Fakültənin tərkibində 4 kafedra fəaliyyət göstərirdi.

*Nəzəri fizika kafedrasında* (kafedra müdiri əvəzi fəlsəfə doktoru Asəf Nəbiyev) 2 elmlər doktoru, professor, 4 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim, 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 4211 saat təşkil edirdi

*Elektrik və optika kafedrasında* (kafedra müdiri dos.Cahangir Hüseynov) 2 elmlər doktoru, professor, 6 fəlsəfə doktoru, dosent, 1 baş müəllim, 2 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 4858 saat təşkil edirdi.

*Mexanika və molekulyar fizika kafedrasında* (kafedra müdiri prof.Edil Eyvazov) 1 elmlər doktoru, professor, 5 fəlsəfə doktoru, dosent, 2 fəlsəfə doktoru, baş müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 4070 saat təşkil edirdi.



*Elektrik və optika kafedrasının əməkdaşları*

*Fizikanın tədrisi metodikası kafedrasında* (kafedra müdiri dos.Rasim Abdurazaqov) 1 elmlər doktoru, professor, 8 fəlsəfə doktoru, dosent, 3 baş müəllim, 2 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 6213 saat təşkil edirdi.



*Mexanika və molekulyar fizika kafedrasının əməkdaşları*

**VIII. Pedaqoji fakültə.** Fakültədə (dekan prof. Fərrux Rüstəmov) ibtidai sinif müəllimliyi ixtisasında 1101 (805 əyani, 296 qiyabi), musiqi müəllimliyi ixtisasında 94 (cəmi 1195) tələbə təhsil alırdı. Fakültənin fəaliyyətinə tərkibi 25 nəfərdən (7 nəfər elmlər doktoru, professor, 16 nəfər fəlsəfə doktoru, dosent və 2 nəfər tələbə) ibarət olan Fakültə Elmi Şurası rəhbərlik edirdi.

Fakültənin tərkibində 4 kafedra fəaliyyət göstərirdi.

*İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasında* (kafedra müdiri dosent Yaqut Rzayeva) 2 elmlər doktoru, professor, 9 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 4 baş müəllim, 3 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 12336 saat təşkil edirdi.



*İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının əməkdaşları*

*Riyaziyyatın ibtidai kursu və onun tədrisi metodikası kafedrasında* (kafedra müdiri prof. Seyidağa Həmidov) 1 elmlər doktoru, professor, 9 fəlsəfə doktoru, dosent, 3 baş müəllim, 2 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 9999 saat təşkil edirdi.


Riyaziyyatın ibtidai kursu və onun tədrisi metodikası kafedrasının əməkdaşları

*Musiqi fənləri və onun tədrisi metodikası kafedrasında* (kafedra müdiri prof. Jalə Qədimova) 1 elmlər doktoru, professor, 4 fəlsəfə doktoru, dosent, 9 baş müəllim, 6 nəfər müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 10596 saat təşkil edirdi.

*Musiqi alətləri fənlərinin tədrisi metodikası kafedrasında* (kafedra müdiri prof.Minarə Dadaşova) elmlər doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 13 baş müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 10188 saat təşkil edirdi.

**IX. Pedaqogika və psixologiya fakültəsi.** Fakültədə (dekan dos.Şəhla Əliyeva) məktəbəqədər təlim və tərbiyə ixtisasında 416 (284 əyani, 132 qiyabi), təhsildə sosial -psixoloji xidmət ixtisasında 182, korreksiyaedici təlim ixtisasında 246, cəmi 844 nəfər tələbə təhsil alırdı. Fakültənin fəaliyyətinə tərkibi 15 nəfərdən (2 professor, 6 dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 1 müəllim və 2 tələbə) ibarət olan Fakültə Elmi Şurası rəhbərlik edirdi.

Fakültənin tərkibində 3 kafedra fəaliyyət göstərirdi.

*Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasında* (kafedra müdiri prof.Müseyib İlyasov) 1 elmlər doktoru, dosent, 7 fəlsəfə doktoru, dosent, 7 baş müəllim, 1 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 11094 saat təşkil edirdi.

*Ümumi psixologiya kafedrasında* (kafedra müdiri prof.Ramiz Əliyev) 1 elmlər doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 1 fəlsəfə doktoru, müəllim, 4 baş müəllim, 5 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 12612 saat təşkil edirdi.

*Yaş və pedaqoji psixologiya kafedrasında* (kafedra müdiri prof.Ərəstun Baxşəliyev) 2 elmlər doktoru, professor, 2 fəlsəfə doktoru, dosent, 5 baş müəllim, 5 müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 9688 saat təşkil edirdi.

**X. Mühəndis pedaqoji və bədii qrafika fakültəsi.** Fakültədə (dekan dos.Arif Mustafayev) texnologiya müəllimliyi ixtisasında 440 (310 əyani, 130 qiyabi), təsviri incəsənət müəllimliyi ixtisasında 343 (cəmi 783) tələbə təhsil alırdı. Fakültənin fəaliyyətinə tərkibi 17 nəfərdən (12 nəfər dosent, 2 nəfər baş müəllim, 1 nəfər müəllim və 2 nəfər tələbə) ibarət Fakültə Elmi Şurası rəhbərlik edirdi.

Fakültənin tərkibində 4 kafedra fəaliyyət göstərirdi.

*İstehsalatın əsasları kafedrasında* (kafedra müdiri dos.Səadət Musayeva) 2 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 5 baş müəllim, 5 müəllim vəzifəsində çalışırdı. Kafedranın illik ümumi tədris yükü 8247 saat təşkil edirdi.

*Rəsm, heykəltəraşlıq və boyakarlıq kafedrasında* (kafedra müdiri dos.Fərahim Zeynalov) 3 fəlsəfə doktoru, dosent, 7 baş müəllim çalışırdı. Kafedranın illik ümumi tədris yükü 6663 saat təşkil edirdi.

*Ümumi texniki fənlər kafedrasında* (kafedra müdiri dos.Akif İsmayılov) 5 nəfər fəlsəfə doktoru, dosent, 6 nəfər baş müəllim, 2 nəfər müəllim vəzifəsində çalışır. Kafedranın illik ümumi dərs yükü 7254 saat təşkil edir.


İstehsalatın əsasları kafedrasının əməkdaşları

*Təsviri sənət, rəsmxət və onların tədrisi metodikası kafedrasında* (kafedra müdiri dos.Çingiz Rüstəmov) 5 fəlsəfə doktoru, dosent, 4 baş müəl-

lim, 7 müəllim vəzifəsində çalışırdı. Kafedranın illik ümumi tədris yükü 12294 saat təşkil edirdi.

**XI. Əlavə təhsil fakültəsi.** İxtisasartırma məqsədi ilə yaradılan fakültəyə 7 oktyabr 1995-ci ildə Təhsil Nazirliyinin müvafiq əmri ilə yenidənhazırlanma statusu verilərək İxtisasartırma və yenidənhazırlanma fakültəsi adlandırıldı. Təhsil Nazirliyinin 10 iyun 2010-cu il tarixli 46-25-3576/17 nömrəli məktubuna əsasən fakültənin statusu xeyli genişləndirildi və *Əlavə təhsil fakültəsi* adlandırıldı. Əlavə təhsil fasiləsiz təhsilin və peşə hazırlığının tərkib hissəsi olmaqla, peşə ixtisas təhsilinin hər hansı pilləsini bitirmək haqqında dövlət sənədi olan hər bir vətəndaşın fasiləsiz təhsil almaq imkanını təmin edir. Əlavə təhsil peşə hazırlığı səviyyəsinin yüksəldilməsi və təkmilləşdirilməsi, onların daim dəyişən və yeniləşən əmək şəraitinə uyğunlaşdırılması, yaşlı vətəndaşların ölkənin sosial, iqtisadi, siyasi və mədəni həyatında fəal və səmərəli iştirakının təmin edilməsi vəzifəsini daşıyır.Fakültədə tədris işləri Nazirlər Kabinetinin 2010-cu il 6 sentyabr tarixli 163 nömrəli qərarı ilə təsdiq edilmiş "Əlavə təhsilin məzmunu, təşkili və əlavə təhsilin hər hansı istiqaməti üzrə təhsil almış şəxslərə müvafiq sənədin verilməsi qaydası"na müvafiq olaraq qurulurdu. Ayrı-ayrı ixtisaslara qəbul əvvəlki və yenidən hazırlanacaq ixtisasların tədris planları arasındakı fərqə əsasən müəyyən edilirdi. Belə ki, əgər bu fərq 1260 saatdan az olardısa dinləyici yenidənhazırlanma təhsilinə cəlb edilirdi. Digər hallarda ixtisasın dəyişdirilməsinə yalnız ikinci ali təhsil almaq yolu ilə icazə verilirdi.

2011- 2016-ci illərdə fakültənin 845 nəfər məzunu olmuşdur.

| İxtisas | 2011 2012 | | 2012 2013 | | 2013 2014 | | 2014 2015 | | 2015 2016 | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Qəbul | Məzun | Qəbul | Məzun | Qəbul | Məzun | Qəbul | Məzun | Qəbul | Məzun |
| Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | 159 | 136 | 85 | 66 | 14 | 14 | 25 | 254 | | |
| Riyaziyyat müəllimliyi | 118 | 113 | 67 | 64 | 27 | 27 | 43 | 43 | | |
| İnformatika müəllimliyi | | | | | | | | | 12 | 8 |
| Təhsildə sosial-psixoloji xidmət | 61 | 57 | 44 | 304 | 14 | 141 | 21 | 20 | 16 | 15 |
| Məktəbəqədər təlim və tərbiyə | 27 | 21 | 6 | 44 | 11 | 8 | 60 | 601 | 33 | 31 |
| İbtidai sinif müəllimliyi | | | | | | | 31 | 15 | | |
| Tarix və coğrafiya müəllimliyi | | | | | | | 17 | 7 | | |
| Kimya və biologiya müəllimliyi | | | | | | | 17 | 10 | | |
| Kimya müəllimliyi | | | | | | | | | 9 | 9 |
| Biologiya müəllimliyi | | | | | | | | | 5 | 5 |
| CƏMİ : | 365 | 327 | 242 | 204 | 66 | 63 | 214 | 180 | 75 | 68 |

**XII. Magistratura və doktorantura şöbəsi.** Şöbədə (şöbə müdiri prof.İbrahim Bayramov) magistratura təhsil səviyyəsində aşağıdakı ixtisaslar üzrə mütəxəssis hazırlığı həyata keçirilirdi:



*Magistratura və doktorantura şöbəsinin əməkdaşları*

*1.Azərbaycan dili və ədəbiyyatı müəllimliyi* (Azərbaycan dili və ədəbiyyatının tədrisi metodikası və metodologiyası);

*2.Xarici dil müəllimliyi (dillər üzrə)* (xarici dilin tədrisi metodikası və metodologiyası);

*3.Fizika müəllimliyi* (fizika fənninin tədrisi metodikası və metodologiyası);

*4.Riyaziyyat müəllimliyi* (riyaziyyatın tədrisi metodikası və metodologiyası);

*5.Texnologiya müəllimliyi* (texnologiya fənninin tədrisi metodikası və metodologiyası);

*6.Musiqi müəllimliyi* (musiqi fənninin tədrisi metodikası və metodologiyası);

*7.Biologiya müəllimliyi* (biologiya fənninin tədrisi metodikası və metodologiyası)

*8.Kimya müəllimliyi* (kimya fənninin tədrisi metodikası və metodologiyası);

*9.Tarix müəllimliyi* (tarix fənninin tədrisi metodikası və metodologiyası);

*10.Coğrafiya müəllimliyi* (coğrafiya fənninin tədrisi metodikası və metodologiyası);

*11.İnformatika müəllimliyi* (informatika fənninin tədrisi metodikası və metodologiyası);

*12.Təsviri incəsənət müəllimliyi* (təsviri incəsənət fənninin tədrisi metodikası və metodologiyası);

*13.İbtidai sinif müəllimliyi* (ibtidai sinifdə tədrisin metodika və metodologiyası);

*14.Korreksiyaedici təlim* (korreksiyaedici təlimin metodika və metodologiyası);

*15.Məktəbəqədər təlim və tərbiyə* (məktəbəqədər təlim və tərbiyənin metodika və metodologiyası);

*16.Təhsildə sosial-psixoloji xidmət* (təhsildə sosial-psixoloji xidmət);

*17.Pedaqogika* (pedaqogika nəzəriyyəsi və tarixi; təhsildə qiymətləndirmə və monitorinq)

*18.Filologiya* (ədəbiyyatşünaslıq (ölkələr və sahələr üzrə), Azərbaycan ədəbiyyatı, Azərbaycan dili, dilşünaslıq (dillər və sahələr üzrə);

*19.Tarix* (Azərbaycanın qədim və orta əsrlər tarixi, arxeologiya və etnoqrafiya, Avropa və Amerikanın yeni və ən yeni tarixi, Türk dünyası tarixi, Azərbaycanın yeni və ən yeni tarixi);

*20.Psixologiya* (ümumi psixologiya, pedaqoji psixologiya);

*21.Riyaziyyat* (riyazi analiz, funksional analiz, həndəsə, cəbr və topologiya);

*22.Fizika* (nəzəri və riyazi fizika, yarımkeçiricilər fizikası, istilik fizikası və molekulyar fizika);

*23.Kimya* (qeyri-üzvi kimya, üzvi kimya, analitik kimya);

*24.Biologiya* (insan və heyvan fiziologiyası, botanika, onurğasızlar zoologiyası, onurğalılar zoologiyası);

*25.Coğrafiya* (iqtisadi və sosial coğrafiya, landşaftşünaslıq, Azərbaycanın fiziki coğrafiyası);

*26.Kompüter elmləri* (informatika).

2012-2015-ci illərdə universitetin magistratura səviyyəsinin Azərbaycan dili və ədəbiyyat müəllimliyi ixtisasına 74 (65 əyani, 9 qiyabi), biologiya müəllimliyi ixtisasına 46 (39 əyani, 7 qiyabi), coğrafiya müəllimliyi ixtisasına 26 (əyani), İbtidai sinif müəllimliyi ixtisasına 130 (95 əyani, 35 qiyabi), fizika müəllimliyi ixtisasına 37 (28 əyani, 9 qiyabi), informatika müəllimliyi ixtisasına 51 (əyani) magistrant qəbul olunmuşdur.

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Azərbaycan dili və ədəbiyyat müəllimliyi | | Biologiya müəllimliyi | | Coğrafiya müəllimliyi | | İbtidai sinif müəllimliyi | | Fizika müəllimliyi | | İnformatika müəllimliyi | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2012 | 6 | 3 | 3 | 3 | 4 | - | 11 | 20 | 2 | 5 | 10 | - |
| 2013 | 5 | 6 | 4 | 4 | 3 | - | 19 | 15 | 3 | 4 | 9 | - |
| 2014 | 15 | - | 7 | - | 3 | - | 37 | - | 6 | - | 9 | - |
| 2015 | 39 | - | 25 | - | 16 | - | 28 | - | 17 | - | 14 | - |

Kimya müəllimliyi ixtisasında 25, korreksiyaedici təlim ixtisasında 20, menecment ixtisasında 53, məktəbəqədər təhsil və tərbiyə ixtisasında 41 (30 əyani, 11 qiyabi), musiqi müəllimliyi ixtisasında 5, pedaqogika nəzəriyyəsi və tarixi ixtisasında 54 (34 əyani, 20 qiyabi) magistrant təhsil almışdır.

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Kimya müəllimliyi | | Korreksiyaedici təlim | | Menecment | | Məktəbəqədər təhsil və tərbiyə | | Musiqi müəllimliyi | | Pedaqogika nəzəriyyəai və tarixi | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2012 | 3 | - | - | - | 5 | - | 2 | 12 | 3 | - | 2 | 8 |
| 2013 | 4 | - | 3 | - | 4 | - | 8 | 9 | 1 | - | 5 | 10 |
| 2014 | 3 | - | 9 | - | 24 | - | 17 | - | - | - | 13 | - |
| 2015 | 15 | - | 8 | - | 20 | - | 13 | - | 1 | - | 14 | - |

Təhsildə qiymətləndirmə və monitorinq ixtisasında 41, riyaziyyat müəllimliyi ixtisasında 60 (45 əyani, 15 qiyabi), tarix müəllimliyi ixtisasında 51 (42 əyani, 9 qiyabi), texnologiya müəllimliyi ixtisasında 14 (10 əyani, 4 qiyabi) magistrant təhsil almışdır.

| İllər | İxtisaslar | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | Təhsildə qiymətləndirmə və monitorinq | | Riyaziyyat müəllimliyi | | Tarix müəllimliyi | | Texnologiya müəllimliyi | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2012 | 6 | - | 3 | 11 | 2 | 6 | - | 3 |
| 2013 | 10 | - | 9 | 4 | 8 | 3 | 5 | 1 |
| 2014 | 10 | - | 10 | - | 7 | - | 4 | - |
| 2015 | 15 | - | 23 | - | 25 | - | 1 | - |

Təhsildə sosial-psixoloji xidmət ixtisasında 51, təsviri incəsənət müəllimliyi ixtisasında 10, xarici dil (İngilis dili) müəllimliyi ixtisasında 19, pedaqoji psixologiya ixtisasında 12 magistrant təhsil almışdır.

| İllər | İxtisaslar | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Təhsildə sosial-psixoloji xidmət | | Təsviri incəsənət müəllimliyi | | Xarici dil (İngilis dili) müəllimliyi | | Ümumi psixologiya | | Pedaqoji psixologiya | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2012 | 20 | - | 3 | - | 4 | - | 6 | - | 6 | - |
| 2013 | 7 | - | 3 | - | 15 | - | 4 | - | 3 | - |

| | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| 2014 | 9 | - | 1 | - | - | - | 5 | - | 3 | - |
| 2015 | 15 | - | 3 | - | - | - | - | - | - | - |

2012-2014-cü illərdə ədəbiyyatşünaslıq (türk xalqları tarixi) üzrə 4, dilşünaslıq (ümumi dilçilik) üzrə 8, informatika üzrə 25, riyazi analiz üzrə 36 (20 əyani, 16 qiyabi), funksional analiz üzrə 10, cəbr və topologiya üzrə 23 (11 əyani, 12 qiyabi) magistr hazırlanmışdır.

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Ədəbiyyatşünaslıq (Türk xalqları tarixi) | | Dilşünaslıq (Ümumi dilçilik) | | İnformatika | | Riyazi analiz | | Funksional analiz | | Cəbr və topologiya | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2012 | 4 | - | - | 8 | 11 | - | 6 | 11 | 4 | - | 2 | 7 |
| 2013 | - | - | - | - | 3 | - | 5 | 5 | 4 | - | 4 | 5 |
| 2014 | - | - | - | - | 11 | - | 9 | - | 2 | - | 5 | - |

2012-2014-cü illərdə nəzəri və riyazi fizika üzrə 12, yarımkeçiricilər fizikası üzrə 18, istilik fizikası üzrə 5, qeyri-üzvi kimya üzrə 15, üzvi kimya üzrə 20, analitik kimya üzrə 21 magistr hazırlanmışdır.

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Nəzəri və riyazi fizika | | Yarımkeçiricilər fizikası | | İstilik fizikası | | Qeyri-üzvi kimya | | Üzvi kimya | | Analitik kimya | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | ə yani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2012 | 5 | - | 8 | - | 5 | - | 7 | - | 6 | - | 7 | - |

| | | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| 2013 | 4 | - | 5 | - | - | - | 4 | - | 7 | - | 7 | - |
| 2014 | 3 | - | 5 | - | - | - | 4 | - | 7 | - | 7 | - |

2012-2014-cü illərdə botanika üzrə 25 (17 əyani, 8 qiyabi), onurğasızlar zoologiyası üzrə 11 (3 əyani, 8 qiyabi), onurğalılar zoologiyası üzrə 21, insan və heyvan fiziologiyası üzrə 35 (25 əyani, 10 qiyabi), iqtisadi və sosial coğrafiya üzrə 17 (11 əyani, 6 qiyabi), landşaftşünaslıq üzrə 19 (9 əyani, 10 qiyabi) magistr hazırlanmışdır.

| **İllər** | **İxtisaslar** | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | **Botanika** | | **Onurğasızlar zoologiyası** | | **Onurğalılar zoologiyası** | | **İnsan və heyvan fiziologiyası** | | **İqtisadi və sosial coğrafiya** | | **Landşaftşünaslıq** | |
| | **Qəbul** | | **Qəbul** | | **Qəbul** | | **Qəbul** | | **Qəbul** | | **Qəbul** | |
| | **əyani** | **qiyabi** | **əyani** | **qiyabi** | **əyani** | **qiyabi** | **əyani** | **qiyabi** | **əyani** | **qiyabi** | **əyani** | **qiyabi** |
| 2012 | 4 | 4 | - | 4 | 9 | - | 10 | 6 | 4 | 2 | 2 | 6 |
| 2013 | 4 | 4 | - | 4 | 6 | - | 6 | 4 | 3 | 4 | 3 | 4 |
| 2014 | 9 | - | 3 | - | 6 | - | 9 | - | 4 | - | 4 | - |

2012-2014-cü illərdə Azərbaycanın fiziki coğrafiyası üzrə 23 (13 əyani, 23 qiyabi), Azərbaycan ədəbiyyatı üzrə 19 (8 əyani, 11 qiyabi), Azərbaycan dili üzrə 20 (9 əyani, 11 qiyabi), dilşünaslıq (ingilis dili) üzrə 13, Azərbaycanın qədim və orta əsrlər tarixi üzrə 11 (3 əyani, 8 qiyanbi), arxeologiya və etnoqrafiya üzrə 6 magistr hazırlanmışdır.



*Fəlsəfə doktoru proqramı üzrə imtahan zamanı*

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Azərbaycanın fiziki coğrafiyası | | Azərbaycan ədəbiyyatı | | Azərbaycan dili | | Dilşünaslıq (İngilis dili) | | Azərbaycanın qədim və orta əsrlər tarixi | | Arxeologiya və etnoqrafiya | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2012 | 2 | 6 | 1 | 8 | 3 | 7 | 5 | - | - | 5 | 2 | - |
| 2013 | 5 | 4 | 2 | 3 | 2 | 4 | - | - | - | 3 | 2 | - |
| 2014 | 6 | - | 5 | - | 4 | - | 8 | - | 3 | - | 2 | - |

2012-2014-cü illərdə Türk dünyası tarixi üzrə 14 (6 əyani, 8 qiyabi), Azərbaycanın yeni və ən yeni tarixi üzrə 16, Avropa və Amerikanın yeni və ən yeni tarixi üzrə 9, həndəsə üzrə 7, istilik fizikası və molekulyar fizika üzrə 8, dilşünaslıq (ümumi dilçilik) üzrə 8 (4 əyani, 4 qiyabi) magistr hazırlanmışdır.

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Türk dünyası tarixi | | Azərbaycanın yeni və ən yeni tarixi | | Avropa və Amerikanın yeni və ən yeni tarixi | | Həndəsə | | İstilik fizikası və molekulyar fizika | | Dilşünaslıq (Ümumi dilçilik) | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2012 | - | 5 | 3 | - | 3 | - | 4 | - | 3 | - | - | - |
| 2013 | 2 | 3 | 7 | - | 3 | - | - | - | - | - | 1 | 4 |
| 2014 | 4 | - | 6 | - | 3 | - | 3 | - | 5 | - | 3 | - |

2012-2014-cü illərdə ədəbiyyatşünaslıq (türk xalqları ədəbiyyatı) üzrə 6, ədəbiyyatşünaslıq (ədəbiyyat nəzəriyyəsi) üzrə 4, ədəbiyyatşünaslıq (folklorşünaslıq və mifologiya) üzrə 3, ədəbiyyatşünaslıq (dünya ədəbiyyatı) üzrə 6 magistr hazırlanmışdır.

| İllər | İxtisaslar | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | Ədəbiyyatşünaslıq (Türk xalqları ədəbiyyatı) | | Ədəbiyyatşünaslıq (Ədəbiyyat nəzəriyyəsi) | | Ədəbiyyatşünaslıq (Folklorşünaslıq və mifologiya) | | Ədəbiyyatşünaslıq (Dünya ədəbiyyatı) | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2012 | 3 | - | 2 | - | 2 | - | 1 | - |
| 2013 | - | - | - | - | - | - | - | - |
| 2014 | 3 | - | 2 | - | 1 | - | 5 | - |

Ümumiyyətlə, 2010/11-ci tədris ilində magistraturaya 311, 2011/12-ci tədris ilində 388, 2012/13-cü tədris ilində 365,2013/14-cü tədris ilində 344, 2014/15-ci tədris ilində 342 magistrant qəbul olunmuşdur.

12 fevral 2015-ci ilin məlumatına görə, universitetdə əyani təhsil üzrə 602, qiyabi təhsil üzrə isə 283 magistrant təhsil alırdı. 2010-2014-cü illərdə magistratura səviyyəsini 919 nəfər bitirmişdir.

2010/11-ci tədris ilində magistratura səviyyəsində 1 (Gürcüstan vətəndaşı), 2011/12-ci tədris ilində 2 (Gürcüstan vətəndaşı), 2012/13-cü tədris ilində 2 (Gürcüstan vətəndaşı), 2013/14-cü tədris ilində 2 (1 Türkiyə vətəndaşı, 1 Gürcüstan vətəndaşı), 2014/15-ci tədris ilində 3 (2 nəfər Türkiyə vətəndaşı, 1 Gürcüstan vətəndaşı) xarici ölkə vətəndaşı təhsil almışdır.

2013/14-cü tədris ilində universitetin magistratura səviyyəsini əyani şöbə üzrə 194 nəfər magistr dissertasiyası müdafiə edərək bitirmişdir. Onlardan 104 nəfər əla (53,6%), 90 nəfər yaxşı (46,4%) qiymət almışdır. 4 nəfər təhsil səviyyəsini fərqlənmə diplomu ilə bitirmişdir. Qiyabi şöbə üzrə 136 nəfər magistr dissertasiyası müdafiə etmişdir. Onlardan 74 nəfər əla (55%), 62 nəfər yaxşı (45%) qiymət almışdır.

2011-2015-ci illərdə universitetdə ildən-ilə fəlsəfə doktoru proqramı üzrə doktorantların, fəlsəfə doktoru və elmlər doktoru proqramları üzrə dissertantların sayı azalmışdır. 2011-ci ildə 59 nəfər tədqiqatçı fəlsəfə və doktorluq dissertasiyaları üzərində işlədiyi halda, 2015-ci ildə tədqiqatçıların sayı 32 nəfər olmuşdur.

| İllər | Fəlsəfə doktoru proqramları üzrə doktorantların sayı | Fəlsəfə doktoru proqramları üzrə dissertantların sayı | Elmlər doktoru proqramları üzrə dissertantların sayı |
|---|---|---|---|
| 2011 | 24 | 18 | 17 |
| 2012 | 20 | 19 | 8 |
| 2013 | 10 | 15 | 8 |
| 2014 | 16 | 5 | 5 |
| 2015 | 18 | 9 | 5 |

2012-2015-ci illərdə Vətən tarixi üzrə 2, analiz və funksional analiz üzrə 2, differensial tənliklər üzrə 3, nəzəri fizika üzrə 1, analitik kimya üzrə 2, qeyri üzvi kimya üzrə 1, botanika üzrə 2, Azərbaycan dili üzrə 6, Azərbaycan ədəbiyyatı üzrə 4, ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi üzrə 6, pedaqoji psixologiya üzrə 2, yarımkeçiricilər fizikası üzrə 1, riyaziyyatın tədrisi metodikası üzrə 6, biologiyanın tədrisi metodikası üzrə 5, fizikanın tədrisi metodikası üzrə 6, Azərbaycan dilinin tədrisi metodikası üzrə 2, kimyanın tədrisi metodikası üzrə 1, insan və heyvan fiziologiyası üzrə 2, arxeologiya üzrə 1, iqtisadi coğrafiya üzrə 1,Türk xalqları ədəbiyyatı üzrə 1, rus dilinin tədrisi metodikası üzrə 1,ümumi psixologiya üzrə 1, zoologiya üzrə 1 nəfər *fəlsəfə proqramı üzrə doktoranturaya,* insan və heyvan fiziologiyası üzrə 4, dil nəzəriyyəsi üzrə 9, ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi üzrə 11, yarımkeçiricilər fizikası üzrə1,üzvi kimya üzrə 1, Azərbaycan dili üzrə 4,Türk xalqları ədəbiyyatı üzrə 1, riyaziyyatın tədrisi metodikası üzrə 1, pedaqoji psixologiya üzrə 1, ümumi psixologiya üzrə 1, iqdisadi coğrafiya üzrə 2, ümumi tarix üzrə 1,Vətən tarixi üzrə 1, Azərbaycan ədəbiyyatı üzrə 1, informatikanın tədrisi metodikası üzrə 2, coğrafiyanın tədrisi metodikası üzrə 1, Azərbaycan dilinin tədrisi metodikası üzrə 1, ingilis dili üzrə 2, kimyanın tədrisi metodikası üzrə 2, iqtisadi coğrafiya üzrə 1, diferensial tənliklər üzrə 1 nəfər *fəlsəfə doktoru proqramı üzrə dissertanturaya,* Azərbaycan ədəbiyyatı üzrə 3, yarımkeçiricilər fizikası üzrə 1, insan və heyvan fiziologiyası üzrə 1, Azərbaycan dili üzrə 1, dünya ədəbiyyatı üzrə 1, riyaziyyatın tədrisi metodikası üzrə 3, ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi üzrə 5, zoologiya üzrə 1, informatikanın tədrisi metodikası üzrə 1, fizikanın tədrisi metodikası üzrə1, diferensial tənliklər üzrə 2, dil nəzəriyyəsi üzrə 1, folklorşünaslıq üzrə 1, ümumi psixologiya üzrə 1 nəfər *elmlər doktoru proqramı üzrə dissertanturaya* qəbul olunmuşdur.

2012-ci ildə 9 (Türkiyə), 2014-cü ildə 1 (Gürcüstan), 2014-cü ildə 1 nəfər (Türkiyə) xarici ölkə vətəndaşı doktoranturaya qəbul olunmuşdur.

2010-2014-cü illərdə universitet əməkdaşlarından 19 nəfər elmlər doktoru, 47 nəfər fəlsəfə doktorluğu dissertasiyası müdafiə etmişdir.

Universitetin professor-müəllimlərinin və gənc tədqiqatçıların elmi erudisiyasının yüksəlməsində universitetin kitabxanası mühüm rol oynamışdır. Həmin dövrdə kitabxananın fondunda 710930 nüsxə ədəbiyyat mövcud idi ki, ondan da 296158-i tədris, 115744-ü elmi, 188510-u bədii ədəbiyyat, 10709-u xarici ədəbiyyat idi.

2010-2014-cü illərdə kitabxanaya orta hesabla hər ildə 3312 nüsxə kitab, 21 adda elmi, elmi-texniki və ictimai-siyasi jurnal, 18 adda qəzet alınmışdır. 2015-ci ildə kitabxana 11 adda informasiya xarakterli jurnal və 15 adda qəzet almışdır. 2015-ci il oktyabrın 1-ə olan məlumata görə, kitabxananın oxucularının sayı 10468 nəfər olmuşdur ki, onlardan da 768-i professor-müəllim, 9281-i tələbə, 419-u digər kateqoriyalı oxucular olmuşdur.

Həmin illərdə kitabxananın 8 şöbəsində və 11 bölməsində 72 nəfər çalışırdı ki, onlardan da 47-si ali təhsilli, 25-i orta ixtisas təhsilli idi.

2010-2014-cü illərdə universitetin əməkdaşları tərəfindən 170 adda dərslik, dərs vəsaiti, 129 adda monoqrafiya, 3311 jurnal məqaləsi (481-i xaricdə), 1070 konfrans materialı (157-si xaricdə) və metodik vəsait nəşr etdirilmişdir ki, onların da mütləq əksəriyyəti kitabxanaya verilmişdir. 2600 adda kitab elektron kataloqa daxil edilmişdi ki, bu da professor - müəllim və tələbələrin kitabxanadan istifadəsini xeyli asanlaşdırmışdı.

## İdarəçilik strukturunun optimallaşdırılmasının ilk mərhələsi

2013-2015-ci illərdə universitetdə tədrisin təşkili, elmi tədqiqatların aparılması, maddi-texniki təchizat və s. üzrə işlərin təkmilləşdirilməsi üçün idarəçilik strukturunun optimallaşdırılması istiqamətində müəyyən işlər görüldü, dərs saatları kifayət qədər olmayan aşağıdakı kafedralar ləğv edildi və ya birləşdirildi:1)Coğrafiya və gənclərin çağırışaqədər hazırlığı fakültəsinin Ekologiya və Fiziki coğrafiya kafedraları ləğv edilərək əvəzində Coğrafiya və ekologiya kafedrası yaradıldı (28 fevral 2013-cü il), 2) Coğrafiya və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin İdman fənləri və Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fənləri və onların tədrisi metodikası kafedralarının bazasında yeni Fiziki tərbiyə və çağırışaqədərki hazırlığın tədrisi metodikası kafedrası yaradıldı (28.02.13), 3)Rus dili və İbtidai siniflərdə rus dili kafedraları ləğv edilərək onların bazasında Rus dili və onun tədrisi metodikası kafedrası yaradıldı (14.10.14); 4) Sosial və iqtisadi fənlər və Fəlsəfə kafedralarının bazasında Fəlsəfə və sosial fənlər kafedrası yaradıldı (12.02.15), 5)Nəzəri fizika kafedrası ləğv edildi, bu kafedraya aid fənlərin tədrisi Elektrik və optika, Mexanika və molekulyar fizika kafedrasına həvalə edildi (12.02.15), 6) Əcnəbi tələbələrin işi üzrə dekanlıq ləğv edilərək, əcnəbi tələbələrin işi üzrə şöbə yaradıldı (12.02.15), 7)Təhsil Nazirliyinin müvafiq qərarına uyğun olaraq SABAH qrupları yaradıldı (12.06.14), 8) Tədris-metodika şöbəsinin nəzdində *tələbə- məzun dövlət elektron məlumat sistemi* (14.11.13), *kurikulum və tyutor xidmətinə nəzarət* bölməsi (05.03.14), *monitorinq, qiymətləndirmə və İKT-nin tədrisə tətbiqi* mərkəzi (12.02.15) və elmi- tədqiqat işlərinin səmərəliliyini yüksəltmək məqsədilə *elm və innovasiyalar* şöbəsi (2014) yaradıldı.

2015-ci il oktyabr ayında Mühəndis-pedaqoji və bədii qrafika fakültəsi ləğv olundu. Texnologiya ixtisası Fizika fakültəsinə birləşdirildi. Bədii qrafika və Pedaqoji fakültənin nəzdindəki musiqi şöbəsinin bazasında Musiqi və təsviri sənət fakültəsi yaradıldı. Fakültəyə rəhbərlik müvəqqəti olaraq İbtidai təhsil fakültəsinin dekanı, prof.Fərrux Rüstəmova həvalə edildi. 2016-cı ilin mart ayında Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsi ləğv edildi. Coğrafiya ixtisası Tarix fakültəsi ilə, çağırışaqədər hazırlıq ixtisası isə Musiqi və təsviri sənət fakültəsi ilə birləşdirildi. 2016-cı ilin mart ayında Kimya və Biologiya fakültələri birləşdirildi. Tarix və coğrafiya fakültəsinə rəhbərlik dos.Rəcəb Əliyevə, Kimya və biologiya fakültəsinə rəhbərlik dos. Bəhlul Ağayevə həvalə edildi.

12 fevral 2015-ci ildə Kompüter Mərkəzinin bazasında İnformasiya Kommunikasiya Texnologiyaları, Monitorinq və Qiymətləndirmə Mərkəzi yaradıldı.

Universitetdə professor-müəllim heyətinin peşəkarlığının yüksəldilməsi, elmi-metodiki hazırlığının yüksəldilməsi məqsədilə *Müasir təlim texnologiyaları təlim və resurs mərkəzi* (2010) yaradıldı. Mərkəzin köməyi ilə universitetin fakültə dekanları, kafedra müdirləri, pedaqogika, psixolo-

giya və fənlərin tədrisi metodikası kafedrasının əməkdaşlarının iştirakı ilə ayrı-ayrılıqda müasir təlim texnologiyalarının tədrisə tətbiqi ilə bağlı 30 saatlıq treninqlər keçirildi.

Mərkəzdə ingilis dilini tədris edən Xarici dillər kafedrasının müəllimlərinin peşəkarlıq səviyyəsinin artırılması üçün TİELC LLC (Teaching İnternational English License and Certificate - Atlanta, Georgia, USA) beynəlxalq tədris mərkəzi ilə 3 aylıq müqavilə əsasında treninqlər keçirildi. Treninqin nəticələrinə görə Xarici dillər kafedrasının 26 müəllimi I, II, III dərəcəli sertifikatlara layiq görüldü.

Fransız dilini tədris edən müəllimlərin peşəkarlığını artırmaq, həmin ixtisası üzrə təhsil alan tələbələrin dil bacarıq və vərdişlərinin inkişaf etdirmək məqsədilə 2008/2009, 2009/2010 və 2014/2015-ci tədris illərində Fransadan stajor-müəllimlər dəvət olunmuşdu.

Akademik məsləhətçilərin - tyutorların hazırlanması məqsədilə kurikulum və tyutor xidmətinə nəzarət bölməsi tərəfindən tyutor hazırlayan kurs təşkil edildi. 2014 -cü ildə 8 nəfər tyutor bu kursu uğurla başa vurub ayrı-ayrı fakültələrdə fəaliyyətə başladılar.

2014/2015-ci tədris ilində ştatda olan professor-müəllim heyətinin 3 nəfəri AMEA-nın müxbir üzvü, 51 nəfəri elmlər doktoru, professor,10 nəfəri fəlsəfə doktoru, professor, 8 nəfəri elmlər doktoru, dosent, 245 nəfəri fəlsəfə doktoru, dosent, 81 nəfəri fəlsəfə doktoru, baş müəllim, 16 nəfəri fəlsəfə doktoru, müəllim, 6 nəfəri dosent, 138 nəfəri baş müəllim, 147 nəfəri müəllim idi. 2014/15-ci tədris ilində universitetdə saathesabı ilə işləyən professor-müəllim heyətinin üzvlərinin 5 nəfəri elmlər doktoru, professor, 46 nəfəri fəlsəfə doktoru, 98 nəfəri baş müəllim və müəllim idi.

Universitetdə elmi-tədqiqat işləri 49 kafedrada və 7 elmi tədqiqat laboratoriyalarında - Yeni bioloji aktiv birləşmələr (müdir dos.R.Məmmədova), Koordinasion birləşmələr (müdir dos.N.Novruzova), Nadir torpaq elementləri (müdir X.Həsənova), Dədə Qorqud (müdir prof.R.Qafarov), Türk araşdırmaları (müdir prof.E.Quliyev), Pedaqoji təhsilin problemləri (müdir prof.A.Mehrabov), Bioinformatika (müdir dos.V.Əmikişiyev) aparılırdı. 2014/15-ci tədris ilində 78 problem üzrə 449 mövzuda elmi-tədqiqat işləri aparılmış, onlardan 52-si tədris prosesinə tətbiq edilmişdi.

2010-2014-cü illərdə əməkdaşlar tərəfindən 650 dərslik, dərs vəsaiti, 129 monoqrafiya, 3406 elmi məqalə (onlardan 576-sı xaricdə), 1092 tezis (onlardan 157-si xaricdə), 917 proqram və metodik tövsiyə nəşr edilmiş, 7 patent alınmışdır. 2013-cü ildə 12, 2014-cü ildə 15 nəfərin impakt-faktoru olan jurnallarda məqalələri nəşr olunmuşdur. 2011-2015-ci illərdə universitetdə 8 beynəlxalq, 26 respublika, 42 universitetdaxili elmi-praktik konfrans keçirilmişdir.

2013/2014-cü tədris ilində universitetdə təhsil alan 6861 tələbədən 817 nəfəri Tələbə Elmi Cəmiyyətinin üzvü olmuşdu ki, bu da tələbələrin ümumi sayının 12%-ni təşkil edirdi. ADPU-nun "Xəbərləri"nin **(**təbiət, humanitar və pedaqoji-psixoloji seriyalar) və "İnformatika və İKT" jurnallarının ildə 4 sayı nəşr olunurdu.

## Elmi-pedaqoji kadr hazırlığı

Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının 28 aprel 2009-cu il tarixli əmri ilə ADPU-da yaradılan Dissertasiya şurası (sədr prof.Yusif Məmmədov, sədr müavini prof.Fərrux Rüstəmov, elmi katib dos.Yaqut Rzayeva) iki il fəaliyyət göstərdi. Ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi, təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (Azərbaycan dilinin tədrisi metodikası, ədəbiyyatın tədrisi metodikası, riyaziyyatın tədrisi metodikası, fizikanın tədrisi metodikası, biologiyanın tədrisi metodikası, tarixin tədrisi metodikası) ixtisasları üzrə fəaliyyət göstərən Disssertasiya şurasında 34 dissertasiya müdafiə olundu ki, onlardan da 4-ü doktorluq (Müdafiə




*Dissertasiya Şurasının iclası (2012)*

Mahmudov, Yafəs Baxşəliyev, Tağı Tağıyev, Piralı Əliyev) dissertasiyası idi.

Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının 7 iyun 2010-cu il tarixli əmri ilə ADPU-nun nəzdində 13 nəfərdən ibarət birdəfəlik doktorluq dissertasiyalarının müdafiəsini təşkil edən Dissertasiya şurası (sədr prof.Yusif Məmmədov, sədr müavini prof.Fərrux Rüstəmov, elmi katib dos.Yaqut Rzayeva) yaradıldı. Vəli Qocayev fizikanın tədrisi metodikası, Əbülfət Pələngov riyaziyyatın tədrisi metodikası ixtisası üzrə doktorluq dissertasiyaları müdafiə etdilər. Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının 12 yanvar 2011-ci il tarixli əmri ilə ADPU-da Ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi, təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (Azərbaycan dilinin tədrisi metodikası, ədəbiyyatın tədrisi metodikası, riyaziyyatın tədrisi metodikası, biologiyanın tədrisi metodikası, tarixin tədrisi metodikası) ixtisasları üzrə Dissertasiya şurası (sədr prof.Yusif Məmmədov, sədr müavini prof.Fərrux Rüstəmov, elmi katib dos.Yaqut Rzayeva) yaradıldı. Dissertasiya şurasında 56 nəfər fəlsəfə doktoru, 6 nəfər (Hümeyir Əhmədov, Müseyib İlyasov, Tovuz Eminli, Sərxan Feyziyev, İsa İsmayılov, Akif Əliyev) elmlər doktorluğu dissertasiyası müdafiə etdilər. Həmin dövrdə şuranın 35 iclası keçirilmişdi ki, onlardan da 16-sı Ali Attestasiya Komissiyasının razılığı ilə növbədən və limitdənkənar keçirilmişdi. Dissertasiya şurasının müddəti bitdikdən sonra Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının 21 yanvar 2013-cü il tarixli əmri ilə ADPU-da üçüncü dəfə ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi, təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (Azərbaycan dilinin tədrisi metodikası, riyaziyyatın tədrisi metodikası, biologiyanın tədrisi metodikası) ixtisasları üzrə Dissertasiya şurası (sədr prof.Yusif Məmmədov, sədr müavini prof.Fərrux Rüstəmov, elmi katib dos.Kəmalə Quliyeva) təşkil olundu. Dissertasiya şurasında 40 nəfər fəlsəfə doktoru, 6 nəfər (Mobil Aslanlı, Novruz Musayev, Nasim Abışov, Mönsüm Alışov, Şəhla Əliyeva, Həqiqət Hacıyeva) elmlər doktorluğu dissertasiyası müdafiə etdilər.

Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının 6 fevral 2015-ci il tarixli əmri ilə ADPU-da ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi, təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (Azərbaycan dilinin tədrisi metodikası, riyaziyyatın tədrisi metodikası,



*Dissertasiya Şurasının iclası (2012)*



*Dissertasiya Şurasının iclası (2021)*

biologiyanın tədrisi metodikası) ixtisasları üzrə fəaliyyət göstərən Dissertasiya şurasında (sədr Yusif Məmmədov, sədr müavini prof.Fərrux Rüstəmov, elmi katib dos. Kəmalə Quliyeva) 44 nəfər fəlsəfə doktoru, 6 nəfər (Almaz Tağıyeva, Vaqif Qurbanov, Natiq Əliyev, Nabat Cəfərova, Zəhra Muradova, Yusif Qazıyev) elmlər doktorluğu dissertasiyası müdafiə etmişdir.

Azərbaycan Respublikası Prezidenti yanında AAK tərəfindən 3 mart 2017-ci ildə universitetdə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim olunan dissertasiyaların müdafiəsini keçirən FD 02.061 Dissertasiya Şurası yaradılıb. 2 il fəaliyyət göstərən həmin şuranın tərkibi aşağıdakı kimi təsdiq olunmuşdu:1) prof.Cəfərov Cəfər (sədr); 2) prof.Zamanov Asəf (sədr müavini); 3) dos.Hümbətəliyev Rövşən (elmi katib); 4) prof.Abbasov Akif; 5) dos.Abbasov Ənvər; 6) prof.Adıgözəlov Azadxan; 7) prof.Babayev Məcnun; 8) dos.Bəşirov Kamil; 9) prof.Cəbrayılov Məlikməmməd;10) prof.Əhmədov Hümeyir;11) dos.Əliyeva Şəhla; 12) prof.Əliyev Vəli; 13) prof.Əmirov Mübariz; 14) prof.İsayev İramin 15) dos.Hüseynova Nailə; 16) prof.Xalıqov Fikrət; 17) prof.Xəlilov Buludxan; 18) prof. Məmmədov Xəqani; 19) prof.Pələngov Əbülfət; 20) prof.Rüstəmov Fərrux; 21) prof.Sultanov Oqtay; 22) prof.Vəzirova Leyla; 23) prof.Tanırverdiyev Əzizxan; 24) prof.Ağayev Əjdər; 25) prof.Həmidov Seyidağa.



*Dissertasiya Şurasının iclası (2021)*

Dissertasiya Şurasına ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi, təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (riyaziyyatın tədrisi metodikası, tarixin tədrisi metodikası, Azərbaycan dilinin tədrisi metodikası), korreksiya pedaqogikası ixtisasları üzrə dissertasiya müdafiəsinə icazə verilmişdi. 2018-ci ilin sonuna kimi fəaliyyət göstərən Dissertasiya Şurasında 26 nəfər fəlsəfə doktoru, 6 nəfər (Həsən Bayramov, Elza Mollayeva, Şiruyə Azadəliyeva, Talıb Əhmədov, Şərafət Baxışova, Kamal Camalov) elmlər doktoru elmi dərəcəsi almaq üçün dissertasiya müdafiə etmişdir.

Bunlardan ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi (5804.01) ixtisası üzrə 18 nəfər, təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (5801.01) ixtisası üzrə 6 nəfər, korreksiya pedaqogikası (5805.01) ixtisası üzrə 2 nəfər dissertasiya müdafiə etmişdir.

2010-2015-ci illərdə həm universitetin nəzdində, həm də digər ali məktəblərdə və AMEA-nın ayrı-ayrı institutlarında fəlsəfə və elmlər doktorluğu dissertasiyası müdafiə edənlərin sayı artdı. Həmin illərdə universitetdə tədris və elmi fəaliyyətlə məşğul olan əməkdaşların inkişaf dinamikası aşağıdakı kimi olmuşdur.

| İllər | Kafedraların sayı | Əməkdaşların sayı | Elmlər doktoru, prof. | Elmlər doktoru, dos. | Fəlsəfə doktoru, dosent | Fəlsəfə doktoru, b/m,m | B/m. və müəllim |
|---|---|---|---|---|---|---|---|
| 2010/11 | 53 | 744 | 63 | - | 295 | 82 | 304 |
| 2011/12 | 52 | 728 | 66 | 3 | 285 | 86 | 288 |
| 2012/13 | 52 | 717 | 64 | 2 | 274 | 87 | 290 |
| 2013/14 | 51 | 730 | 61 | 5 | 285 | 89 | 290 |
| 2014/15 | 49 | 703 | 62 | 7 | 269 | 91 | 274 |

## Beynəlxalq əməkdaşlıq

2011-2016-cı illərdə ADPU-nun beynəlxalq imicinin formalaşdırılması və beynəlxalq nüfuzunun artırılması istiqamətində (yeni əməkdaşlıq formalarının qurulması, aktual məsələlərə həsr olunan layihələrin hazırlanması, müxtəlif beynəlxalq konfransların, simpoziumların, seminarların, görüşlərin və digər mədəni, elmi tədbirlərin təşkili) bir sıra işlər görüldü. Xarici ölkələrin tanınmış universitetləri ilə əlaqələr yaratmaq üçün həmin ölkələrin Azərbaycanda fəaliyyət göstərən səfirlikləri və nümayəndəlikləri ilə əməkdaşlıq genişləndirildi. 2011-ci ildə Tacikistan Respublikasının “Abuabdullo Rudaki” adına Kulyab Dövlət Pedaqoji Universiteti, Rumıniyanın Babeş-Bolyai Universiteti, 2012-ci ildə Rusiya Elmlər Akademiyasının Radiotexnika və Elektronika İnstitutu, Türkiyə Cümhuriyyətinin Hacəttəpə Universiteti, A.Kunanbayev adına Qazaxıstan Milli Pedaqoji Universiteti, Türkiyə Cümhuriyyətinin Muğla Sıtkı Koçman Universiteti, Türkiyə Cümhuriyyətinin Balıkesir Universiteti, 2013-cü ildə Rusiya Federasiyasının Dağıstan Dövlət Pedaqoji Universiteti, Moldova Respublikasının “İon Kreanga” adına Dövlət Pedaqoji Universiteti, Ukraynanın M.P.Draqomonov adına Milli Pedaqoji Universiteti, Özbəkistan Respublikasının Nizami adına Daşkənd Dövlət Pedaqoji Universiteti, Türkiyə Cümhuriyyətinin Canik Basari Universiteti, Türkiyə Cümhuriyyətinin Adnan Menderes Universiteti,Türkiyə Cümhuriyyətinin Qafqaz-Qars Universiteti, Türkiyə Cümhuriyyətinin Kastamonu Universiteti, 2014-cü ildə Türkiyə Cümhuriyyətinin Fırat Universiteti, Kastamonu Universiteti, Rusiya Federasiyasının Penza Dövlət Universiteti, A.S.Puşkin adına Leninqrad Dövlət Universiteti, 2015-ci ildə Bosniya Hersoqovina Respublikasının Bihac Universiteti, Litva Respublikasının Litva Dövlət Universiteti ilə əməkdaşlıq müqaviləsi imzalandı.

Ümummilli lider Heydər Əliyevə həsr olunmuş “Müəllim hazırlama siyasəti və problemləri” adlı beynəlxalq konfrans 2013-cü ildə Bakıda, 2014-cü ildə Ankarada, 2015-ci ildə Bakıda keçirildi və iki ildən bir keçirilməsi planlaşdırıldı.

Prof. Elman Quliyev Ərzurum şəhərində (2012), dos.Yaqut Rzayeva Astana şəhərində (2013), Elman Quliyev, Leyla Kərimova Qırğızıstan Respublikasında (2014), dos.Yaqut Rzayeva və dos.Tamilla Vahabova Finlandiyada (2014), f.ü.f.d. Taliyə

Məmmədova Türkiyədə (2014) keçirilən Beynəlxalq konfranslarda elmi məruzələrlə çıxış etmişlər. “Dədə Qorqud” elmi-tədqiqat laboratoriyasının pedaqoji-psixoloji fəlsəfi araşdırmalar bölməsinin əməkdaşı Gülşən Mehdizadə Abay adına Qazaxıstan Milli Pedaqoji Universitetinin Psixologiya və Pedaqogika İnstitutunun “Məktəbəqədər və ibtidai təhsilin metodikası və nəzəriyyəsi kafedrasında 1 aylıq elmi təcrübə (19 noyabr 2014-19 dekabr 2014) keçdi.

YUNESKO-nun Rusiya Federasiyasının Sankt-Peterburq şəhərində yerləşən “Avropa evi”nin dəvəti ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin prorektoru prof.M.Cəbrayılov, Pedaqoji fakültənin dekanı, prof.F.Rüstəmov və İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dosent Y.Rzayeva 20-27 mart 2013-cü il tarixində Yunanıstan-Albaniya-İtaliyada, 12-22 avqust 2013-cü il tarixində Skandinaviya ölkələrində (Finlandiya-Danimarka-İsveç-Norveç) “Ömür boyu təhsil - yaşlıların təhsili” mövzusunda keçirilən beynəlxalq seminarlarda iştirak etdilər.

2014-cü ilin 15-21 fevral tarixində ENOTES-Azərbaycanda ECDL Milli Operator və Test Mərkəzləri TEMPUS Qrant layihəsi çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Universitetinin əməkdaşları Litvanın Kaunas şəhərinə ezam olundular. Beynəlxalq əməkdaşlıq çərçivəsində Nəzəri fizika kafedrasının dosenti Y.H.Hüseynəliyev, Hesablama riyaziyyatı və informatika kafedrasının dosenti A.M.Quliyev, dosent S.C.Tağıyeva, İKT-nin əməkdaşı R.Əliyev Latviya Respublikasının Riqa şəhərində USMA Tətbiqi Elmlər Universitetində aparılan təlimlərdə (2-6 iyun 2014) iştirak etdilər.

20-28 mart 2014-cü il tarixində YUNESKO-nun Rusiya Federasiyasının Sankt-Peterburq şəhərində yerləşən “Avropa evi”nin dəvəti ilə ADPU-nun bir qrup əməkdaşı - tədris işləri üzrə prorektor, prof. M.Cəbrayılov, universitetin elmi katibi, dos. L.Həsənova, Pedaqoji fakültənin dekanı, prof. F.Rüstəmov, Coğrafiya fakültəsinin dekanı, dos. M.Əsgərova, İqtisadi coğrafiya kafedrasının dosenti N.Süleymanova, İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, dos. Y.Rzayeva və həmin kafedranın dosenti T.Vahabova, Ədəbiyyatın tədrisi metodikası kafedrasının professoru Y.Babayev İspaniya və Portuqaliyada keçirilən “Ömür boyu təhsil - yaşlıların təhsili” adlı beynəlxalq seminarlarda iştirak etdilər.

## İdarəçilik strukturunun optimallaşdırılmasının ikinci mərhələsi

AMİ-nin ADPU-ya birləşdirilməsi və akkreditasiyanın nəticələri (2015) universitetdə ciddi struktur və məzmun islahatlarının aparılması zərurəti yaratdı. ADPU-nun rektoru, professor Cəfər Cəfərovun rəhbərliyi ilə pedaqoji kadr hazırlığının insan kapitalının inkişafı çağırışlarına cavab verməsi məqsədilə pedaqoji təhsilin keyfiyyətinin yüksəldilməsi, idarəetmə sisteminin yenidən qurulması, insan resurslarının inkişaf etdirilməsi, müasir standartlara cavab verən təhsil infrastrukturunun yaradılması və müəllim əməyinin stimullaşdırılması istiqamətində mühüm işlər görüldü. Professor-müəllim heyətinin peşəkarlığının artırılması ən vacib məsələ kimi önə çəkildi. Universitetdə tədris prosesinin təkmilləşdirilməsi, daha səmərəli idarəetmə mexanizminin qurulması, əməkdaşlıq mühitinin yaradılması, sağlam rəqabətin formalaşdırılması dərin



elmi-metodik biliyi, kreativ düşüncəsi, geniş erudisiyası, pedaqoji-psixoloji hazırlığı, yüksək mənəvi-əxlaqi keyfiyyətləri, akademik bacarığı, tədris təcrübəsi və peşəkarlıq səviyyəsi ilə fərqlənən müəllimlərdən birbaşa asılıdır. Müvafiq stimullaşdırıcı tədbirlər və səmərəli monitorinq vasitəsi ilə təhsilverənlərin fəaliyyətinin səmərəliliyi, məhsuldarlığı, keyfiyyəti, ən əsası isə rəqabətə davamlılığı artırıla bilər. Qısa bir müddətdə universitetdə əsaslı dəyişikliklərin nəticəsində təhsilverənlərin müasirləşdirilməsi, yeniləşdirilməsi, peşəkarlıq səviyyəsinin yüksəldilməsi sahəsində zəngin təcrübə toplandı.

2016-cı ilin iyul ayına qədər Azərbaycan Dövlət Pedaqoji Universitetində 11 fakültə, 45 kafedra olmaqla 1800 ştat mövcud idi. Onlardan 694 nəfər professor-müəllim heyəti, 908 nəfər inzibati işçi, o cümlədən 69 nəfər kitabxanaçı, 207 nəfər laborant və böyük laborant idi. ADPU Elmi Şurasının 11 iyul 2016-cı ildə keçirilən iclasının qərarı ilə universitetin yeni sturukturu və ştat cədvəli təsdiq




*Tələbə-gənclərin "Gələcəyin qurucuları" adlı I Forumunun rəyasət heyəti (2019)*

olundu. Aparılan optimallaşdırma nəticəsində 11 fakültənin bazasında 8 fakültə, 45 kafedranın bazasında 32 kafedra təşkil edildi. Kitabxanaçıların sayı 69-dan 30-a, laborant və böyük laborantların sayı 207-dən 143-ə endirildi.

2015-2021-ci illərdə universitetdə elm və tədris fəaliyyəti ilə məşğul olan əməkdaşların inkişaf dinamikası aşağıdakı kimi olmuşdur.

| İllər | Kafedraların sayı | Əməkdaşların sayı | Elmlər doktoru,prof | Elmlər doktoru, dos. | Fəlsəfə doktoru, dos. | Fəlsəfə dokt, b/m. və müəl. | B\m. və müəl. |
|---|---|---|---|---|---|---|---|
| 2015/16 | 46 | 677 | 61 | 6 | 257 | 98 | 255 |
| 2016/17 | 39 | 742 | 64 | 7 | 277 | 99 | 295 |
| 2017/18 | 35 | 785 | 68 | 11 | 256 | 104 | 346 |
| 2018/19 | 35 | 765 | 68 | 12 | 269 | 116 | 300 |
| 2019/20 | 32 | 777 | 66 | 13 | 273 | 113 | 312 |
| 2020/21 | 32 | 760 | 62 | 11 | 266 | 111 | 310 |

2020/21-ci tədris ilinin 1 aprelinə olan məlumata görə, universitetdə ilkin müəllim hazırlığını həyata keçirən 8 fakültədə və Sabah qrupunda 9654 (Azərbaycan bölməsində 9048, rus bölməsində 606) tələbə təhsil alırdı.

**I.Filologiya fakültəsi**

Fakültənin (dekan prof.Mahirə Hüseynova) Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasında 714, ingilis dili müəllimliyi ixtisasında 137, fransız dili müəllimliyi ixtisasında 89 (cəmi 940) tələbə təhsil alır.



*Filologiya fakültəsinin Elmi Şurası*

Fakültənin tərkibində 6 kafedra fəaliyyət göstərir.

*Azərbaycan dilçiliyi kafedrasında* (kafedra müdiri prof.Nizami Xudiyev) 2 filologiya elmləri doktoru, professor, 5 filologiya üzrə fəlsəfə doktoru, dosent, 5 baş müəllim çalışır. Kafedranın illik ümumi tədris yükü 5269 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 13 fənn tədris edirlər.

*Müasir Azərbaycan dili kafedrasında* (kafedra müdiri prof.Buludxan Xəlilov) 5 filologiya elmləri doktoru, professor, 6 filologiya üzrə fəlsəfə doktoru, dosent, 1 baş müəllim, 2 müəllim çalışır. Kafedranın illik ümumi tədris yükü 5269 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 11 fənn tədris edirlər.

*Ədəbiyyatın tədrisi texnologiyası kafedrasında* (kafedra müdiri dos.Nazilə Abdullazadə) 3 elmləri doktoru, professor, 12 fəlsəfə doktoru, dosent, 1 baş müəllim, 2 müəllim fəaliyyət göstərir. Kafedranın illik ümumi tədris yükü 8687,5 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 5, magistratura səviyyəsində 10 fənn tədris edirlər.

*Ədəbiyyat kafedrasında* (kafedra müdiri dos. Razim Məmmədov) 5 elmləri doktoru, professor, 4 fəlsəfə doktoru, dosent 2 baş müəllim, 4 müəllim fəaliyyət göstərir.Kafedranın illik ümumi tədris yükü 6418 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 18 fənn tədris edirlər.

*Azərbaycan dili və onun tədrisi metodikası kafedrasında* (kafedra müdiri dos.Sevda Abbasova) 3 elmlər doktoru, professor,15 fəlsəfə doktoru, dosent, 9 baş müəllim, 7 müəllim fəaliyyət göstərir. Kafedranın illik ümumi tədris yükü 17336,5 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 16, magistratura səviyyəsində 16 fənn tədris edirlər.

*Xarici Dillər Mərkəzində* (müdir Ülviyyə Hacıyeva) 2 elmlər doktoru, professor, 10 fəlsəfə doktoru, dosent, 37 baş müəllim, 48 müəllim fəaliyyət göstərir. Kafedranın illik ümumi tədris yükü 49955 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 84, magistratura səviyyəsində 25 fənn tədris edirlər.

**II.Tarix və coğrafiya fakültəsi.** Fakültənin (dekan vəzifəsini icra edən dos.Asif Axundov[233]) tarix müəllimliyi ixtisasında 580, tarix və coğrafiya müəllimliyi ixtisasında 420, coğrafiya müəllimliyi ixtisasında 431, sosial iş ixtisasında 192 (cəmi 1623) tələbə təhsil alır.

*Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedrasında* (kafedra müdiri t.ü.e.d.,dos. Sevinc Əliyeva) 2 elmlər doktoru, professor 2 elmlər doktoru, dosent, 11 fəlsəfə doktoru, dosent, 5 fəlsəfə doktoru, baş müəllim, 1 fəlsəfə doktoru, müəllim, 5 nəfər müəllim fəaliyyət göstərir. Kafedrada tədrisin yüksək səviyyədə təşkili məqsədilə 3 əvəzçi müəllim (2 elmlər doktoru, dosent, 1 fəlsəfə doktoru, müəllim) və 9 saathesabı müəllim (2 fəlsəfə doktoru, dosent 1 fəlsəfə doktoru, baş müəllim, 5 fəlsəfə doktoru, müəllim, 1 nəfər müəllim cəlb edilmişdir. Kafedranın ümumi tədris yükü 19109 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 34, magistratura səviyyəsində 16 fənn tədris edirlər.

*Azərbaycan tarixi kafedrasında* (kafedra müdiri dos. Naibə Əhmədova) 3 tarix üzrə elmlər doktoru, professor, 6 tarix üzrə fəlsəfə doktoru, dosent, 4 tarix üzrə fəlsəfə doktoru, baş müəllim, 3 baş müəllim, 2 müəllim fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 8188 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 11 fənn tədris edirlər.



*Tarix və coğrafiya fakültəsinin Elmi Şurası*

*Azərbaycan coğrafiyası və coğrafiyanın tədrisi texnologiyası kafedrasında* (kafedra müdiri dos.Oqtay Alxasov) 6 pedaqogika üzrə fəlsəfə doktoru, dosent, 2 nəfər fəlsəfə doktoru, baş müəllim, 3 nəfər baş müəllim), 5 nəfər müəllim fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 11438,5 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 21, magistratura səviyyəsində 18 fənn tədris edirlər.

*Fəlsəfə və sosial elmlər kafedrasında* (dos.Asif Axundov) 1 elmlər doktoru, dosent, 10 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 3 baş

[233] *2017-2019-cu illərdə Tarix və coğrafiya fakültəsinə dos.Şahin Məhəmməd oğlu Pənahov rəhbərlik etmişdir. O, BDU-da Beynəlxalq əlaqələr üzrə prorektor vəzifəsinə təyin edildiyinə görə dekan vəzifəsini dos.Asif Axundov icra edir.*

müəllim, 1 müəllim çalışır. Kafedranın ümumi tədris yükü 12541 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 9, magistratura səviyyəsində 47 fənn tədris edirlər.

*Ümumi coğrafiya kafedrasında* (kafedra müdiri c.ü.e.d.,dos.Məhəmməd Abduyev) 1 elmlər doktoru, 5 coğrafiya üzrə fəlsəfə doktoru, dosent, 2 kənd təsərrüfatı üzrə fəlsəfə doktoru, dosent, 1 pedaqogika üzrə fəlsəfə doktoru, dosent, 1 biologiya üzrə fəlsəfə doktoru, dosent, 1 coğrafiya üzrə fəlsəfə doktoru, baş müəllim, 1 baş müəllim, 3 müəllim fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 7892 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 40 fənn tədris edirlər.

*Ümumi pedaqogika kafedrasında* (kafedra müdiri prof.İramin İsayev) 1 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor, 9 pedaqogika üzrə fəlsəfə doktoru, dosent, 5 pedaqogika üzrə fəlsəfə doktoru, baş müəllim 4 baş müəllim, 1 müəllim fəaliyyət göstərirlər. Kafedraya əvəzçiliklə 3 pedqogika üzrə fəlsəfə doktoru dəvət olunmuşdur. Kafedranın ümumi tədris yükü 19236 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 1, magistratura səviyyəsində 44 fənn tədris edirlər.

**III.Riyaziyyat fakültəsi.** Fakültənin (dekan dos. Araz Fərəcov) riyaziyyat-informatika ixtisasında 482, riyaziyyat müəllimliyi ixtisasında 459, informatika müəllimliyi ixtisasında 383 (cəmi 1324) tələbə təhsil alır.

Hazırda riyaziyyat fakültəsinin nəzdində 4 ixtisas kafedrası fəaliyyət göstərir.

*Riyazi analiz kafedrasında* (müdiri prof.Bəhram Əliyev) 6 elmlər doktoru, professor, 7 fəlsəfə doktoru, dosent, 5 fəlsəfə doktoru, baş müəllim, 1 müəllim çalışır. Kafedranın ümumi tədris yükü 9500 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 39 fənn tədris edirlər.

*Cəbr və həndəsə kafedrası* (dos.Araz Fərəcov) 6 riyaziyyat üzrə fəlsəfə doktoru, dosent,1 fəlsəfə doktoru, baş müəllim, 2 baş müəllim, 1 müəllim çalışır. Kafedranın ümumi tədris yükü 5519 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 20 fənn tədris edirlər.

*Kompüter elmləri kafedrası* (dos.Səadət Mazanova) 1 elmlər doktoru, professor, 10 fəlsəfə dok-



*Riyaziyyat fakültəsinin Elmi Şurası*

toru, dosent, 5 fəlsəfə doktoru, baş müəllim, 3 baş müəllim və 2 müəllim çalışır. Kafedranın ümumi tədris yükü 19537 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 40, magistratura səviyyəsində 12 fənn tədris edirlər.

*Riyaziyyat və onun tədrisi texnologiyası kafedrası* (dos.Allahverdi Cəfərov) 1 pedaqoji elmlər doktoru, professor, 3 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim 2 baş müəllim, 3 müəllim çalışır. Kafedranın ümumi tədris yükü 14539 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 10, magistratura səviyyəsində 17 fənn tədris edirlər.

**IV. Kimya və biologiya fakültəsi**. Fakültədə (dekan dos.Elnarə Mehbalıyeva) kimya müəllimlyi ixtisasında 364, kimya-biologiya müəllimliyi ixtisasında 441, biologiya müəllimliyi ixtisasında 501 (cəmi 1306) tələbə təhsil alır.

Hazırda fakültədə 4 ixtisas kafedrası fəaliyyət göstərir.

*Biologiya və onun tədrisi texnologiyası kafedrasında* (kafedra müdiri dos.Anaxanım Yusifova) 2 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor, 19 fəlsəfə doktoru, dosent 7 fəlsəfə doktoru, baş müəllim 3 fəlsəfə doktoru, baş müəllim, 6 baş müəllim, 3 müəllim fəaliyyət göstərir. Kafedrann nəzdində 1 Zoologiya muzeyi və 2 laboratoriya vardır. Kafedranın ümumi tədris yükü 19769 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 25, magistratura səviyyəsində 16 fənn tədris edirlər.

*Ümumi kimya və kimyanın tədrisi texnologiyası kafedrasında* (kafedra müdiri dos. Reyhan Ağayeva) 10 kimya üzrə fəlsəfə doktoru, dosent 2 kimya üzrə fəlsəfə doktoru, baş müəllim, 1 nəfər kimya üzrə fəlsəfə doktoru, müəllim, 1 nəfər baş müəllim fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 11534 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 19, magistratura səviyyəsində 15 fənn tədris edirlər.

*Analitik və üzvi kimya kafedrasında* (kafedra müdiri prof.Əli Zalov) 3 elmlər doktoru, professor, 13 kimya üzrə fəlsəfə doktoru, dosent 3 kimya üzrə fəlsəfə doktoru, baş müəllim 1 baş müəllim 1 kimya üzrə fəlsəfə doktoru,müəllim 4 müəllim fəaliyyət göstərir. Kafedranın nəzdində 6 laboratoriya vardır. Kafedranın ümumi tədris yükü 12505 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 39 fənn tədris edirlər.

*Fiziologiya kafedrasında* (dos.Nizam Mehdiyev, 2021-ci ilin martından dos.Elnarə Mehbalıyeva) 2 elmlər doktoru, professor, 9 fəlsəfə doktoru,



*Kimya və biologiya fakültəsinin Elmi Şurası*

dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 2 fəlsəfə doktoru, müəllim, 16 baş müəllim, 6 müəllim fəaliyyət göstərir. Kafedranın nəzdində 1 laboratoriya, 1 vivarium fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 19769 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 26 fənn tədris edirlər.

**V.Məktəbəqədər təhsil fakültəsi.** Fakültənin (dekan dos.Şəhla Əliyeva) məktəbəqədər təlim və tərbiyə ixtisasında 477, təhsildə sosial-psixoloji xidmət ixtisasında 524, korreksiyaedici təlim ixtisasında 368 (cəmi 1369) tələbə təhsil alır.

lavriatura səviyyəsində 31, magistratura səviyyəsində 16 fənn tədris edirlər.

*Ümumi psixologiya kafedrasında* (kafedra müdiri prof.Ramiz Əliyev) 1 elmlər doktoru, professor, 1 psixologiya üzrə fəlsəfə doktoru, professor, 5 psixologiya üzrə fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, müəllim, 1 fəlsəfə doktoru, baş müəllim, 6 baş müəllim, 4 müəllim fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 17435 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 17, magistratura səviyyəsində 12 fənn tədris edirlər.



*Məktəbəqədər təhsil fakültəsinin Elmi Şurası*

Hazırda fakültədə 4 ixtisas kafedrası fəaliyyət göstərir:

*Məktəbəqədər təhsilin pedaqogikası kafedrasında* (kafedra müdiri prof.Müseyib İlyasov) 2 pedaqogika üzrə elmlər doktoru, professor, 4 pedaqogika üzrə fəlsəfə doktoru, dosent, 6 pedaqogika üzrə fəlsəfə doktoru, baş müəllim, 3 baş müəllim, 3 pedaqogika üzrə fəlsəfə doktoru, müəllim, 7 müəllim çalışır. Kafedranın ümumi tədris yükü 15551 saat təşkil edir. Kafedra əməkdaşları baka-

*Pedaqoji psixologiya kafedrasında* (kafedra müdiri p.ü.e.d.,dos. Qızxanım Qəhrəmanova) 1 psixologiya elmlər doktoru, professor,1 psixologiya elmlər doktoru, 4 psixologiya üzrə fəlsəfə doktoru, dosent, 1 psixologiya üzrə fəlsəfə doktoru, 4 baş müəllim, 9 müəllim çalışır. Kafedranın ümumi tədris yükü 12912 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 19, magistratura səviyyəsində 9 fənn tədris edirlər.

*Xüsusi təhsil kafedrasında* (kafedra müdiri dos.Nailə Hüseynova) 3 fəlsəfə doktoru, dosent, 1 baş müəllim,10 müəllim çalışır. Kafedranın ümumi tədris yükü 10831 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 30, magistratura səviyyəsində 18 fənn tədris edirlər.

**VI.İncəsənət və fiziki tərbiyə fakültəsi**. Fakültədə (dos. Laçın Həsənova) musiqi müəllimliyi ixtisasında 62, təsviri incəsənət müəllimliyi ixtisasında 511, fiziki tərbiyə və çağırışaqədər hazırlıq müəllimliyi ixtisasında 324 (cəmi 897) tələbə təhsil alır. Magistratura pilləsində 16 nəfər təhsil alır. təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 41, magistratura səviyyəsində 22 fənn tədris edirlər.

*Təsviri incəsənət və onun tədrisi texnologiyası kafedrasında* (kafedra müdiri dos.Yeganə Cəlilova)[234] 5 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 1 dosent, 3 fəlsəfə doktoru, müəllim, 12 baş müəllim, 14 müəllim fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 23077 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 41 magistratura səviyyəsində 21 fənn tədris edirlər.



*İncəsənət və fiziki tərbiyə fakültəsinin Elmi Şurası*

Fakültənin nəzdində 3 ixtisas kafedrası fəaliyyət göstərir**:**

*Musiqi və onun tədrisi texnologiyası* kafedrasında (kafedra müdiri prof. Zemfira Abdullayeva) 3 elmlər doktoru, professor, 1 fəlsəfə doktoru, professor, 8 fəlsəfə doktoru, dosent 1 fəlsəfə doktoru, baş müəllim, 10 baş müəllim, 2 müəllim, 2 fəlsəfə doktoru, konsertmeyster, 6 konsertmeystr fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 13835 saat

*Fiziki tərbiyə və çağırışaqədər hazırlığın tədrisi texnologiyası* (kafedra müdiri, polkovnik-leytenant Eldar Abdullayev) 1 professor, 4 fəlsəfə doktoru, dosent, 7 baş müəllim, 5 müəllim fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 23077 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 48, magistratura səviyyəsində 16 fənn tədris edirlər.

[234] *2016-2020-ci illərdə kafedraya dos.Çingiz Rüstəmov rəhbərlik etmişdir.Dos.Yeganə Cəlilova 2020-ci ilin sentyabrından kafedraya rəhbərlik edir..*

**VII.Fizika fakültəsi.** Fakültənin (dekan dos. Arzu Daşdəmirov) fizika müəllimliyi ixtisasında 362, texnologiya müəllimliyi ixtisasında 241 (cəmi 603) tələbə təhsil alır.

Fakültənin nəzdində 3 ixtisas kafedrası fəaliyyət göstərir:

1.Ümumi fizika kafedrasında (kaferda müdiri f.e.d.,dos.Cahangir Hüseynov) 4 elmlər doktoru, professor, 12 fəlsəfə doktoru, dosent, 3 baş müəllim çalışır. Kafedranın nəzdində 2 laboratoriya fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 8982 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 84, magistratura səviyyəsində 25 fənn tədris edirlər.

*Fizikanın tədrisi texnologiyası kafedrasında* (kafedra müdiri dos. Sevinc Cəlilova) 2 elmlər doktoru, professor, 5 fəlsəfə doktoru, dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 2 baş müəllim çalışır. Kafedranın nəzdində 2 laboratoriya fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 7045 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 10, magistratura səviyyəsində 12 fənn tədris edirlər.

*Əməyin texnologiyası kafedrasında* (kafedra müdiri dos. Səadət Musayeva) 7 fəlsəfə doktoru, dosent, 1 dosent, 1 fəlsəfə doktoru, baş müəllim, 3 baş müəllim, 4 müəllim çalışır. Kafedranın nəzdində 2 laboratoriya fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 7559 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 35 fənn tədris edirlər.





*Fizika fakültəsinin Elmi Şurası*

**VII.İbtidai təhsil fakültəsi.** Fakültənin (dekan prof.Fərrux Rüstəmov) ibtidai sinif müəllimliyi ixtisasında Azərbaycan, rus və ingilis bölmələrində 1268 tələbə təhsil alır.



*İbtidai təhsil fakültəsinin Elmi Şurası*

Fakültənin nəzdində 2 ixtisas kafedrası fəaliyyət göstərir:

*İbtidai təhsil pedaqogikası kafedrasında* (müdir dos.Y.Rzayeva) 1 elmlər doktoru, professor, 11 fəlsəfə doktoru, dosent, 7 fəlsəfə doktoru, baş müəllim, 5 baş müəllim, 7 müəllim fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 16523 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 14, magistratura səviyyəsində 25 fənn tədris edirlər.

*Riyaziyyatın ibtidai kursunun tədrisi texnologiyası kafedrasında* (müdir dos.S.Tağıyeva) 9 nəfər fəlsəfə doktoru, dosent, 3 nəfər fəlsəfə doktoru, baş müəllim, 4 nəfər baş müəllim, 2 nəfər müəllim fəaliyyət göstərir. Kafedranın ümumi tədris yükü 11043 saat təşkil edir. Kafedra əməkdaşları bakalavriatura səviyyəsində 15, magistratura səviyyəsində 6 fənn tədris edirlər.

## Yeni təhsil proqramlarının hazırlanması

Universitetdə hər üç təhsil səviyyəsində (bakalavriatura, magistratura, doktorantura) kadr hazırlığı həyata keçirilir. 2016-2020-ci illərdə universitetdə pedaqoji kadr hazırlığı 2014 və 2015-ci illərdə təsdiq edilmiş tədris planları əsasında həyata keçirilmişdir. Yeni tədris planları hazırlamaq məqsədilə cəmiyyətin ali pedaqoji məktəblərdən gözləntiləri ilə yanaşı xarici təcrübə öyrənilmişdir. Bu məqsədlə ABŞ səfirliyinin təhsil mütəxəssisləri ilə birlikdə ingilis dili müəllimliyi ixtisasının təhsil proqramlarının ekspertizası keçirilmiş, inklüziv təhsil layihəsi çərçivəsində məktəbəqədər təhsil, ibtidai təhsil, təhsildə sosial-psixoloji xidmət və korreksiyaedici təlim ixtisaslarının tədris planlarına inklüziv təhsillə bağlı fənlər əlavə edilmiş, Təhsil Nazirliyi ilə Avropa İttifaqının Tvininq Layihəsi çərçivəsində 5 pilot pedaqoji ixtisasın (ingilis dili müəllimliyi, riyaziyyat müəllimliyi, ibtidai sinif müəllimliyi, kimya müəllimliyi və informatika müəllimliyi) yeni dövlət standartlarının layihəsi hazırlanmış, müvafiq fənləri tədris edəcək müəllimlər təlimlərə cəlb edilmişdir. Avropa İttifaqının EQAS layihəsi çərçivəsində Ali Təhsil üzrə Avropa Keyfiyyət Standartlarına uyğun olaraq tələbəyönümlü, əməkbazarının tələblərinə uyğun təlim nəticələri dəqiq müəyyənləşdirilmiş tədris planlarının hazırlanması üzrə təlimlər təşkil edilmişdir.

Azərbaycan Respublikası Nazirlər Kabineti 11 fevral 2019 -cu ildə ”Ali təhsilin bakalavriat (əsas baza ali) tibb təhsili) səviyyəsi üzrə ixtisasların (proqramların)Təsnifat”ını təsdiq etdi. Bundan sonra bütün ixtisaslar üzrə müasir tələblərə və əmək bazarının ehtiyaclarına cavab verən kompetensiya əsaslı və tələbəyönümlü təhsil proqramlarının hazırlanmasına başlanıldı. Bu məqsədlə Təhsil nazirinin 11 mart 2020-ci il tarixli F-172 saylı əmri ilə 11 nəfərdən ibarət komissiya və işçi qruplar yaradıldı. ADPU-nun rektoru, prof.*Cəfər Cəfərov* təhsil ixtisasları üzrə təhsil proqramlarını hazırlayacaq işçi qrupunun sədri təyin edildi. Ciddi metodoloji hazırlıqlardan sonra pedaqoji ixtisaslarla bağlı yeni nəsil təhsil proqramlarının hazırlanmasına başlanıldı. İşçi qrupunun tərkibi aşağıdakı kimi formalaşdırıldı: prof.Cəfər Cəfərov (sədr), prof.Əfqan Abdullayev (Təhsil Nazirliyinin Elm, ali və orta ixtisas təhsili şöbəsinin sektor müdiri), dos.Ənvər Abbasov (Təhsil İnstitutunun direktor müavini), dos.Eldar Aslanov (ADPU-nun tədris işləri üzrə prorektoru), dos.Aytən Bayramova (ADU-nun kafedra müdiri), prof.Gülnar Hüseynzadə (ADU-nun kafedra müdiri), prof.Mübariz Xəlilov (BDU-nun kafedra müdiri), dos.Rəhim Rəhimov (BDU-nun kafedra müdiri), dos.Yasin Cəfərov (BDU-nun kafedra müdiri), prof.İlham Zeynalov (BDU-nun fakültə dekanı vəzifəsini icra edən), prof.Məhərrəm Məmmədov (BDU-nun kafedra müdiri), dos.Rafiq Rəhimov (NDU-nun prorektoru), dos.Allahverdi Quliyev (GDU-nun kafedra müdiri), dos.Nailə Hüseynova (ADPU-nun kafedra müdiri), Fərrux Rüstəmov (ADPU-nun

[235] *Hazırda Bakı şəhəri üzrə Təhsil idarəsinin müdiri vəzifəsində çalışır.*

fakültə dekanı), dos.Araz Fərəcov (ADPU-nun fakültə dekanı), prof.Ramiz Əliyev (ADPU-nun kafedra müdiri), Sevinc Əliyeva (ADPU-nun kafedra müdiri), dos.Rəhman Səfərov (ADPU-nun bölmə müdiri), prof.Telman Cəfərov (BSU-nun prorektoru), Zəfər Hüseynov (SDU-nun fakültə dekanı), Emin Axundov (Microsoft-un təhsil proqramları meneceri), Mehriban Vəliyeva (Z.Əliyeva adına məktəbin direktoru)[235], Gülşən Orucova (6№-li məktəb-liseyin direktoru), Tariyel Talıbov (Fizika-riyaziyyat təmayüllü məktəbin direktoru).

Təhsil nazirinin 13 mart 2020-ci il tarixli F-226 nömrəli əmrlə təsdiq etdiyi "Bakalavriat səviyyəsinin (əsas baza ali) tibb təhsilinin) ixtisas üzrə təhsil proqramının çərçivə sənədi əsasında gələcək müəllimlərin bilik, bacarıq və vərdişlərinə qoyulan tələbləri özündə əks etdirən 20 təhsil proqramları hazırladı. Peşəkarlıqla hazırlanan həmin təhsil proqramları Təhsil nazirinin 21 avqust 2021-ci il tarixli, F-381 nömrəli əmri ilə təsdiq edildi. Bununla da 2020/21-ci tədris ilindən başlayaraq universitetin bütün I tədris ili tələbələri yeni təhsil proqramları əsasında hazırlanmış tədris planları ilə tədrisə başladılar.

Yeni nəsil təhsil proqramlarında:

-ixtisas üzrə məzunun kompetensiyaları, ixtisas çərçivəsi, fənlər üzrə təlim və öyrənmə metodları, qiymətləndirmə üsulları, təlim nəticələri, kadr hazırlığı aparmaq üçün infrastruktura və kadr potensialına olan tələblər, tələbənin təcrübə keçmə, işə düzəlmə və təhsilini artırma imkanları müəyyənləşdirilir;

-tələbələri və işəgötürənləri məzunların əldə etdiyi bilik və bacarıqlar, eləcə də təlim nəticələri barədə məlumatlandırır.

240 AKTS kreditindən ibarət olan yeni təhsil proqramlarının strukturu aşağıdakı kimidir**:**

1) ümumi fənlər - 24 AKTS; 2) Seçmə fənlər 6 AKTS; 3) ixtisas fənləri- 120 AKTS; 4) ali təhsil müəssisəsi tərəfindən müəyyən edilən fənlər -60 AKTS; 5) təcrübə və buraxılış işi - 30 AKTS.

Universitetdə tədris Boloniya prosesinin tələblərinə və təhsil qanunvericiliyinin tələblərinə uyğun kredit sistemi əsasında həyata keçirilir. Tədris planında fənlər vacibliyinə, məzmununa və mənimsənilmə ardıcıllığına görə aşağıdakı 3 qrupa bölünür:

•A qrupu - məcburi və ardıcıl öyrənilən fənlər;

•B qrupu - məcburi, lakin ardıcıllığı vacib olmayan fənlər;

•C qrupu - tələbələrin öz seçimi əsasında öyrənilən fənlər.

ADPU-da kredit sistemi əsasında təşkil olunan tədris prosesi aşağıdakı xüsusiyyətləri ilə səciyyələnir:

- tədris prosesində müasir təlim texnologiyalarının tətbiqi;

-kredit sisteminin tətbiqi;

-tədrisin təqdimat və müzakirə formasında aparılması;

-əvvəlcədən müzakirə ediləcək mövzuların tələbələrə paylanması;

-tələbələrin fənn və müəllim seçiminin real olaraq təmin edilməsi;

-tələbələrin "aşağıdan" və "yuxarıdan" fənn seçməsi üçün hazırlanması;

-hər bir tələbə üçün fərdi tədris planının hazırlanması;

-tələbələrlə fərdi işlərin qurulması, tyutor fəaliyyətinin təşkili;

-tələbələrin elmi və tədris-tədqiqat işlərinə cəlb edilməsi;

-tələbə-müəllim münasibətlərinin humanistləşdirilməsi;

pedaqoji kadr hazırlığını həyata keçirən digər ali təhsil müəssisələri ilə elmi-pedaqoji əməkdaşlıq;

-aralıq imtahanlarının keçirilməsi və onların nəticələrinin yekun imtahanda nəzərə alınması.

Kredit sistemində tələbənin sərbəstliyi deyildikdə aşağıdakılar nəzərdə tutulur:

-tələbənin özü tərəfindən tərtib olunmuş "Fərdi tədris planı" əsasında təhsil alması;

-fənn və müəllimi müstəqil seçmə imkanının olması;

-normativ müddətdən tez və ya gec ali təhsil müəssisəsini bitirməsi;

-"yuxarıdan", "aşağıdan" və "yandan" fənləri seçə bilməsi.

## Akademik məsləhət və ya tyutor xidməti

Universitetdə hər 100 tələbəyə bir tyutor akademik məsləhət verir. Tyutor fakültənin profilinə uyğun olan magistr dərəcəsi olan şəxslər arasında seçilir. Seçim zamanı tyutor hazırlığı kurslarını keçib, müvafiq sertifikat alanlara üstünlük verilir. 2020/21-ci tədris ilində universitetin 8 fakültəsində, əlavə təhsil, magistratura və doktorantura şöbəsində 62 tyutor fəaliyyət göstərir. Tyutorun əsas vəzifələrinə aşağıdakılar daxildir:

tələbələrin akademik maraqlarını qorumaq və müdafiə etmək;

-tədris prosesinin təşkili ilə bağlı bütün zəruri məlumatları və sənədləri tələbələrə çatdırmaq;

-fərdi və işçi planlarının tərtibi üçün tələbələrə qrup halında və ya fərdi məsləhətlər vermək;

-müəyyən olunmuş müddətdə tələbələrin fərdi planlarının və istiqamətlər (ixtisaslar) üzrə işçi planlarının tərtibində iştirak etmək;

-tələbələrə fərdi tədris planlarında dəyişikliklər aparmaqda kömək göstərmək;

-tələbələrin fənlər üzrə attestasiyalarının keçirilməsinə nəzarət etmək və s.

## Təcrübə semestri

ADPU-da gələcək müəllimlərin peşə hazırlığında pedaqoji təcrübəyə xüsusi diqqət verilir. 2014 və 2015-ci illərdə təsdiq edilmiş tədris planlarına görə bakalavriat səviyyəsinin tələbələri VIII semestrdə 14 həftəlik istehsalat (pedaqoji) təcrübəsində (21 AKTS) olurlar. Bu proses ADPU-nun Təcrübə komissiyası tərəfindən tənzimlənir. Təcrübə proqramı Təcrübə komissiyasının 2019-cu il 14 fevral tarixli iclasının qərarı ilə təsdiqlənmiş “Tələbələrin pedaqoji təcrübəsinə dair yaddaş”a uyğun aparılır. Pedaqoji təcrübənin məzmununu, təcrübə iştirakçılarının (müəllimlərin, tələbələrin, təcrübə təşkil edilən müəssisə rəhbərliyinin, təcrübə rəhbərinin) hüquq və vəzifələri “Ali (orta ixtisas) təhsil müəssisələri tələbələrinin ixtisas üzrə təcrübəsinin keçirilməsi haqqında əsasnamə” ilə tənzimlənir.

Təhsil ixtisasları qrupuna daxil olan bakalavriat səviyyəsinin ixtisasları üzrə 2014 və 2015-ci illərdə təsdiq olunmuş təhsil proqramlarına (standartlara) uyğun olaraq təşkil olunan 14 həftəlik pedaqoji təcrübə Təhsil Nazirliyi üzrə 126 orta məktəb, Bakı şəhəri üzrə Təhsil İdarəsi üzrə 329 məktəb və 24 lisey, Bakı Şəhəri İcra Hakimiyyətinin məktəbəqədər təhsil müəssisələri və Uşaq Evləri İdarəsi üzrə 344 məktəbəqədər təhsil müəssisələrində və 6 özəl müəssisədə, o cümlədən filiallar üzrə 34 məktəbdə təşkil olunur. Azərbaycan Respublikası Təhsil nazirinin 20 iyul 2016-cı il tarixli əmri ilə Bakı şəhərindəki M.Rahim adına 7 saylı tam orta məktəb 2016/17-ci tədris ilindən etibarən ADPU-nun baza məktəbinə çevrilmişdir. Universitetin coğrafiya və biologiya ixtisaslarında təhsil alan tələbələr Abşeron, Xızı və Şirvan Milli Parklarında çöl təcrübəsi keçirlər.

Təhsil nazirinin 21 avqust 2021-ci tarixli F-381 nömrəli əmri ilə təsdiq edilən təhsil proqramlarında da tələbələrin VIII semestrdə 14 həftəlik istehsalat (pedaqoji) təcrübəsində (30 AKTS) olması planlaşdırılmışdır.

## Tələbə nailiyyətlərinin qiymətləndirilməsi

Tələbə nailiyyətlərinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin yeganə prinsip olması təlimin keyfiyyətinin yüksəldilməsinə səbəb olmaqla yanaşı, ölkədə Azərbaycan Dövlət Pedaqoji Universiteti ilə bağlı fərqli bir imicin formalaşmasına səbəb olmuş, kəmiyyət dəyişikliyi keyfiyyət dəyişikliyi ilə müşayiət olunmuşdur. Dəyişiklik təhsilverənlərlə yanaşı, həm də təhsilalanları əhatə etmişdir.

2019-cu ildə Müəllimlərin İşə Qəbulu müsabiqəsində Filologiya fakültəsinin 1 məzunu 60, İbtidai təhsil fakültəsinin 3 məzunu 58, 2 məzunu 57, Fizika fakültəsinin 1 məzunu 57, Riyaziyyat fakültəsinin 1 məzunu 57, Tarix fakültəsinin 1 məzunu 57 bal toplayaraq ölkə birinciləri oldular.

2019-cu ildə Müəllimlərin İşə Qəbulu müsabiqəsində iştirak edən ADPU məzunların 61 nəfəri, 2019/20-ci illərdə 347 nəfər 50-60 bal arası nəticə göstərmişdir.

| Tədris illəri | Tələbələrin sayı | MİQ -də iştirak edənlərin sayı | MİQ-dən keçən tələblərin sayı | 50-60 bal toplayanlar |
|---|---|---|---|---|
| 2015/16 | 2877 | 1857 | 795 | 61 |
| 2016/17 | 3393 | 2264 | 963 | 86 |
| 2017/18 | 2474 | 1559 | 1204 | 72 |
| 2018/19 | 1984 | 1727 | 1553 | 106 |
| 2019/20 | 2099 | 1314 | 879 | 347 |

## Elmi-metodiki təminat

Təhsilin keyfiyyətini şərtləndirən əsas amillərdən biri də tədris prosesinin elmi əsaslarla təşkilinin təmin edilməsidir. Buna görə də universitetdə elmi-metodiki tədqiqatların aparılmasına, nəşrinə və təbliğinə xüsusi diqqət yetirilir. Son illərdə elmi-tədqiqat sferasında görülən işlərin həcmi və keyfiyyəti xeyli artmışdır. 2016-2020-ci illərdə 1097 fənn proqramı, dərslik, dərs vəsaiti və metodiki vəsait Təhsil Nazirliyinin və universitetin Tədris-Metodiki Şurasının qərarı ilə nəşr olunmuşdur.

| Tədris ili | Fənn proqramlarının sayı | Metodiki vəsaitlərin sayı | Dərs vəsaitlərinin sayı | Dərsliklərin sayı | Cəmi |
|---|---|---|---|---|---|
| 2015/16 | 222 | 14 | 48 | 16 | **300** |
| 2016/17 | 86 | 15 | 63 | 15 | **179** |
| 2017/18 | 79 | 18 | 63 | 23 | **183** |
| 2018/19 | 88 | 20 | 71 | 18 | **197** |
| 2019/20 | 133 | 31 | 64 | 10 | **238** |
| **Cəmi** | **608** | **98** | **309** | **82** | **1097** |

Universitetdə elmi və elmi-təşkilati fəaliyyət 8 fakültə üzrə 32 kafedrada, o cümlədən Türksoy kafedrasında, Elmi Tədqiqat Mərkəzində, Elmi-təşkilati, Magistratura və doktorantura şöbələri vasitəsi ilə həyata keçirilir. Son illərdə təsdiq edilmiş elmi-tədqiqat planı əsasında 741 nəfərdən ibarət professor-müəllim heyəti 67 istiqamətdə, 106 problem üzrə 386 mövzuda elmi-tədqiqat işləri aparmışdır.

2020/21-ci tədris ilində təsdiq edilmiş elmi-tədqiqat planı əsasında 791 nəfərdən ibarət professor-müəllim heyəti 54 istiqamətdə, 166 problem üzrə 521 mövzuda elmi-tədqiqat işlərini davam etdirmiş, tətbiqi və innovasiya xarakterli 56 iş tədris prosesinə tətbiq edilmişdir.

2016-2020-ci illərdə ayrı-ayrı fakültələrdə çalışan professor-müəllimlərin beynəlxalq elmi jurnallara çıxış imkanlarını təmin edən "Web of Science" elmi bazasına sərbəst şəkildə daxil olması və oradakı elmi məqalələrlə tanış olması nəticəsində onların elmi yaradıcılıq məhsulu xeyli artmışdır.

| Nəşrin adı | 2016 | 2017 | 2018 | 2019 | 2020 | Cəmi |
|---|---|---|---|---|---|---|
| Monoqrafiya | 24 | 18 | 32 | 37 | 12 | 111 |
| Dərslik | 34 | 28 | 32 | 17 | 16 | 111 |
| Dərs vəsaiti | 100 | 83 | 83 | 94 | 45 | 360 |
| Fənn proqramı və metodik vəsait | 283 | 181 | 233 | 256 | 178 | 953 |
| Məqalə | **590** | **849** | **1104** | **1023** | **852** | **3114** |
| *-O cümlədən xaricdə:* | 76 | 161 | 235 | 127 | 321 | 599 |
| *-O cümlədən impakt faktorlu jurnalda:* | 41 | 37 | 30 | 33 | 23 | 141 |
| Tezis | **244** | **345** | **364** | **336** | **226** | **1289** |
| *Azərbaycanda* | 193 | 295 | 220 | 237 | 104 | 945 |
| *xaricdə* | 51 | 50 | 144 | 99 | 122 | 344 |
| Beynəlxalq konfrans və simpoziumlar | 1 | 4 | 4 | 1 | 1 | 10 |
| Respublika konfrans və simpoziumları | 7 | 7 | 10 | 12 | 2 | 30 |
| Tələbə elmi konfransları | 11 | 9 | 9 | 10 | | 39 |

Universitetin professor-müəllim heyətinin bu sahədəki peşəkarlığını artırmaq məqsədilə "Clarivate Analytics"ın əməkdaşlarının ADPU-da təşkil etdiyi seminarların nəticəsində əməkdaşların elmi məhsuldarlığının artım dinamikası bir çox universitetləri qabaqlamışdır. 2018-ci ildə "Clarivate Analytics" şirkəti tərəfindən ADPU son "İnkişaf sürəti"nə görə 3 ilin "Web of Science»" elmi bazasının "Ən mütərəqqi universitet"i mükafatına layiq görülmüşdür. ADPU əməkdaşlarının elmi nəşrlərinin müqayisəli təhlili göstərir ki, 1975-2018-ci illərdə beynəlxalq jurnallarda nəşr edilən 303 elmi məqalənin 58-i 2016, 2017, 2018-ci illərdə çap olunmuşdur ki, bu da ümumi nəticənin 20%-ni təşkil edir. 2019-2020-ci illərdə professor-müəllimlərin elmi məhsuldarlığı xeyli yüksəlmişdir.










*Rektor prof.C.Cəfərov doktorantları təbrik edərkən*

Elmi-tədqiqat laboratoriyalarının yeni maliyyələşdirmə mexanizminə keçməsi ilə əlaqədar olaraq 37 nəfər əməkdaşın çalışdığı *Yeni bioloji aktiv birləşmələr, Koordinasion birləşmələr, Nadir torpaq metal materiallarının fizikası, Dədə Qorqud, Pedaqoji təhsilin problemləri, Türk araşdırmaları, Bioinformatika* elmi tədqiqat laboratoriyalarının bazasında *Elmi Tədqiqatlar Mərkəzi* yaradılmışdır.

2019/20-ci tədris ilində universitetdə fəlsəfə doktoru proqramı üzrə 45 doktorant, fəlsəfə doktoru proqramı üzrə 30 dissertant, elmlər doktoru proqramı üzrə 21 nəfər elmi araşdırmalarını davam

etdirmişdir. 2018-ci ildə universitetdə "Gənc Alimlər Şurası" yaradılmışdır.

2016-2019-cu illərdə beynəlxalq və respublika səviyyəli elmi konfranslarda iştirak edən əməkdaşların sayı artmışdır. ADPU-da 2016-cı ildə 1, 2017-ci ildə 4, 2018-ci ildə 4, 2019-cu ildə 2 Beynəlxalq konfrans, 2016-cı ildə 7, 2017-ci ildə 7, 2018-ci ildə 10, 2019-cu ildə 10 Respublika konfransları təşkil edilmişdir. 2018-ci ildə universitet əməkdaşları 144 beynəlxalq və 220 respublika elmi konfranslarında iştirak etmişdir. 2017-2018-ci illərdə 2 nəfər elmlər doktorluğu, 5 nəfər fəlsəfə doktorluğu dissertasiya işini müdafiə etmiş, 5 nəfər professor və 7 nəfər dosent elmi adına layiq görülmüşdür.

Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyası Rəyasət heyətinin 18 noyabr 2019-cu il tarixli qərarı ilə ADPU-nun nəzdində fəlsəfə doktoru dissertasiyalarının müdafiəsini keçirən Dissertasiya Şurası (sədr prof.Cəfər Cəfərov, sədr müavini prof.Asəf Zamanov, elmi katib dos. Mələk Zamanova) yaradılmışdır. Dissertasiya Şurası 5801.01 - təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (riyaziyyatın tədrisi metodikası), 5801.01-təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (fizikanın tədrisi metodikası), 5801.01-təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (kimyanın tədrisi metodikası) və 5804.01-ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi ixtisasları üzrə fəlsəfə doktoru dissertasiyalarının müdafiəsini təşkil edir.

Pedaqoji Universitetin kitabxanası professor-müəllim və tələbələrin ehtiyaclarına uyğun olaraq təkmilləşdirilmişdir. Kitabxanaya Azərbaycan, rus və digər xarici dillərdə 2403 nüsxə ədəbiyyat verilmişdir. Təhsil Nazirliyi tərəfindən kitabxanaya 184 adda 916 nüsxə orta məktəb dərsliyi hədiyyə olunmuşdur. Müəllimlər İnstitutunun ADPU-ya qoşulması ilə əlaqədar olaraq həmin institutun kitabxanasında olan 37636 nüsxə ədəbiyyat da Kitabxana İnformasiya Mərkəzinin fonduna daxil edilmişdir.

| № | Fondun göstəriciləri | Sayı |
|---|---|---|
| 1. | Kitab və kitabçalar | 686.632 |
| 2. | Jurnallar | 3106 |
| 3. | Dissertasiyalar | 1179 |
| 4. | Avtoreferatlar | 17514 |
| 5. | Magistr dissertasiyaları | 4085 |
| 6. | Referativ jurnallar | 1016 |
| 7. | Universitet müəllimlərinin elmi tədqiqat işləri | 2270 |
| 8 | Azərbaycan Müəllimlər İnstitutunun fondu | 37636 |
| | **Cəmi** | **753.438** |

Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun 2018-ci ildə elan etdiyi qrant layihələri içərisində ADPU üzrə dəyəri 235 min manat olan 5 layihə qalib olmuşdur ki, bu da universitet əməkdaşlarının elmi uğurlarının bariz nümunəsidir.

## ADPU-nun dövrü elmi nəşrləri

Professor-müəllim heyətinin elmi tədqiqat işlərinin informasiya təminatını reallaşdırmaq üçün ADPU "Clarivate Analytics (Thomson Reuters)" Agentliyi tərəfindən "Web of Science" Məlumat Platformasına qoşulmuşdur.

ADPU-da Azərbaycan Respublikasında dissertasiyaların əsas nəticələrinin dərc olunması tövsiyə edilən dövri elmi nəşrlərin sırasına daxil edilmiş 6 dövri elmi jurnalı nəşr edilir:

1) "Pedaqoji Universitetin Xəbərləri" (humanitar, ictimai və pedaqoji-psixoloji elmlər seriyası) (baş redaktor prof.Cəfər Cəfərov)

2) "Pedaqoji Universitetin Xəbərləri" (riyaziyyat və təbiət elmləri seriyası) (baş redaktor prof. Asəf Zamanov)

3) "Tarix, insan və cəmiyyət" (baş redaktor prof.Cəfər Cəfərov)

4) "Magistrant" (baş redaktor prof.Asəf Zamanov)

5) "Fizika, riyaziyyat və informatika tədrisi" (baş redaktor prof.Həmzə Seyidli)

6) "Musiqi elmi, mədəniyyəti və təhsilinin aktual problemləri" (baş redaktor prof.Jalə Qədimova)

7) "Təhsildə İKT" (redaksiya şurasının sədri prof.Cəfər Cəfərov)

8) "Magistrant" (baş redaktor prof.Asəf Zamanov).

Bu jurnallarda universitet əməkdaşları ilə yanaşı, respublikamızın, eləcə də xarici ölkə mütəxəssislərinin də məqalələri dərc olunur.

## Beynəlxalq əməkdaşlıq yeni mərhələdə

Son illərdə ADPU-da beynəlxalq əlaqələrin genişlənməsinə xüsusi diqqət yetirilir. İldən-ilə beynəlxalq konfranslarda və tədbirlərdə iştirak edən universitet əməkdaşlarının sayı artır. Universitet əməkdaşları 2016-cı ildə 50, 2017-ci ildə 144, 2018-ci ildə 99, 2019-cu ildə 344 beynəlxalq elmi konfrans və tədbirlərdə çıxış etmişdir.

2018-ci ildə universitetin əməkdaşları dos.Həcər Hüseynova Antalya, prof.Elman Quliyev Ankara və İstanbul, dos.Rövşən Hümbətəliyev Rusiya Federasiyasının Novorossiysk, dos.Həcər Hüseynova, dos.Pəri Paşayeva və f.ü.f.d.Təranə Nağıyeva Ankara, Gülşən Novruzova Amasya şəhərlərində, prof.Asəf Zamanov və dos.Yaqut Rzayeva Finlandiyanın Saimaa Universitetində, dos.Yusif Alıyev Almaniya Respublikasında keçirilən konfranslarda məruzə ilə çıxış etmişlər.



*Kazan Federal Universiteti ilə əməkdaşlıq müqaviləsi imzalanarkən*

Pandemiya şəraitinin yaratdığı çətinliklərə baxmayaraq, professor-müəllimlər onlayn rejimdə Avropa ölkələrində, Türkiyədə, Rusiyada və digər ölkələrdə keçirilən beynəlxalq konfranslarda məruzələrlə çıxış etmişlər.

Təhsildə qloballaşma və beynəlmiləlləşmə faktorlarının olduqca mühüm əhəmiyyət kəsb etdiyi müasir dövrdə universitetin beynəlxalq əlaqələri genişlənir, dünyanın müxtəlif ali təhsil ocaqları, həmçinin beynəlxalq şirkət və qurumları, xarici ölkələrin ölkəmizdəki səfirlikləri ilə əlaqələrin yaradılması və inkişafı istiqamətində səmərəli işlər həyata keçirilir.

ADPU Türkiyə Respublikasının müxtəlif universitetləri ilə ikitərəfli əməkdaşlıqdan əlavə, *Mövlanə Mübadilə proqramı çərçivəsində* də əməkdaşlıq edir. Sözügedən mübadilə proqramı çərçivəsində 2016-cı ildə ADPU-nun İbtidai təhsil fakültəsinin 1 nəfər tələbəsi Kastamonu Universitetinin Təhsil fakültəsində, Təsviri incəsənət, musiqi



*Dokuz Eylül Universiteti ilə əməkdaşlıq müqaviləsi imzalanarkən*

və çağırışaqədər hazırlıq fakültəsinin 1 nəfər tələbəsi Kahramanmaraş Sütçü İmam Universitetinin Güzel sanatlar fakültəsində mübadilə proqramında iştirak edib. 2016-2019-cu illərdə Türkiyənin 10 universiteti ilə Mövlanə Mübadilə proqramı çərçivəsində protokol, 5 ikitərəfli əməkdaşlıq müqaviləsi imzalanıb.

2016-2020-ci illərdə universitetin *MDB ölkələri ilə əlaqələri* genişlənib, Qazaxıstanın və Rusiyanın ali təhsil müəssisələrinin nümayəndələri ilə 9 görüş keçirilib. Görüşlərin nəticəsi olaraq 8 əməkdaşlıq müqaviləsi imzalanıb, Rusiyanın Dövlət Humanitar Universiteti (RDHU) ilə anlaşma çərçivəsində tələbə mübadiləsi həyata keçirilib. Belə ki, RDHU-nun Beynəlxalq əlaqələr ixtisası üzrə təhsil alan 8 tələbəsi ADPU-da iki həftəlik yay məktəbində iştirak edib.

*Avropa universitetləri ilə əlaqələri* genişləndirmək, tələbə (müəllim) mübadiləsi həyata keçirmək məqsədilə Kopenhagen Universitet Kolleci ilə ERASMUS+ KA1 proqramı çərçivəsində müəssisələrarası müqavilə imzalanıb. 2016-2019-cu illərdə ERASMUS+ KA1 çərçivəsində ADPU-nun 4 tələbəsi, 7 müəllimi mübadilə proqramında iştirak edib. Danimarkanın Kopenhagen Universitet Kollecindən 4 müəllim mübadilə proqramı çərçivəsində ADPU-da olub.

ERASMUS+ KA 2 çərçivəsində Pedaqoji Universitet 2 layihədə - Azərbaycan universitetlərində təlim və tədrisin təkmilləşdirilməsi (PETRA), Azərbaycan universitetlərində keyfiyyətin təminatı mərkəzlərinin yaradılması (EQAC) layihələrində tərəfdaş kimi iştirak edir. 2016-cı ildə PETRA layihəsi, 2017-ci ildə EQAC layihəsi qrant qazanıb. PETRA layihəsi çərçivəsində keçirilən 6 təlim səfərinin 4-də Pedaqoji Universitet 16 nəfərlə təmsil olunub. Layihə çərçivəsində *Təlim, tədris və resurs mərkəzi* yaradılıb. EQAC layihəsi çərçivəsində *Keyfiyyətin təminatı* şöbəsi yaradılıb. Layihə çərçivəsində keçirilmiş 6 təlim səfərinin 6-da Pedaqoji Universitet 17 nəfərlə təmsil olunub.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov ADPU-nun ERASMUS+ KA1 çərçivəsində tərəfdaşı olan Kopenhagen Universitet Kollecinə (UCC) əməkdaşlıq çərçivəsində səfər edib.

ADPU-nun 2 nəfər tələbəsi Avropa təhsil, gənclik və idmana dövlət dəstəyi proqramı Erasmus + çərçivəsində Belçika Türk Dərnəkləri Birliyinin Miras Mədəni İrsinin öyrənilməsinə kömək İctimai Birliyi ilə birgə layihəsi olan “Yüksək tədris və fərdi inkişafın təşviq olunması qarşılıqlı təcrübədən yararlanmaq” layihəsində iştirak ediblər.

Son illərdə *ikitərəfli əməkdaşlıq görüşləri* genişlənib, müxtəlif xarici ölkələrin ali təhsil müəssisələrinin, səfirliklərin, beynəlxalq təşkilatların nümayəndələri ADPU-da qonaq olub, əlaqələrin genişləndirilməsi istiqamətində danışıqlar aparılıb, niyyət protokolu imzalanıb. ADPU rəhbərliyinin müxtəlif səfirlərin, xarici universitetlərin rektorlarının, beynəlxalq təşkilatların nümayəndələrinin iştirakı ilə 37 görüş baş tutub. Görüşlərin nəticəsində Türkiyənin 15, Rusiyanın 8, Qazaxıstanın 3, ABŞ-ın 1, Danimarkanın 1, İsveçrənin 1, İndoneziyanın 1, Dubayın 1, Ukraynanın 1, Ruminiyanın 1 universiteti və TÜRKSOY-la əməkdaşlıq müqaviləsi imzalanıb.

Son illərdə *ABŞ-ın Bakıdakı Səfirliyi ilə əməkdaşlıq* intensiv xarakter alıb. Universitet əməkdaşları səfirliyin dəstəyi ilə müxtəlif proqramlar və



*Türkiyənin Azərbaycandakı səfiri Erkan Özoral ADPU-da*



*Yeni görüş, yeni əməkdaşlıq*

layihələrdə iştirak edib. “Fulbright” proqramı üzrə 5 nəfər ABŞ mütəxəssisləri-2016-cı ildə Nyu-York Texnologiya İnstitutunun müəllimi Melda Yıldız, 2017-ci ildə Diana Whaley, 2018-ci ildə ABŞ-ın Lehigh universitetinin eksperti professor Jill Sperandio, İan Dooley, 2019-cu ildə Diana Whaley və “English Language Fellow” proqramı çərçivəsində Richard Schlight (2019/2020) ADPU-da pedaqoji fəaliyyətlə məşğul olub. ABŞ səfirliyinin dəstəyi ilə 3 mütəxəssis ADPU-nun professor-müəllim və tələbələrinin iştirakı ilə keçirilən seminarlarda müxtəlif mövzularda çıxışlar edib. ABŞ Konqresi tərəfindən dəstəklənən 10 günlük Açıq dünya (Open World) təlim proqramı çərçivəsində Pedaqoji Universitetin 1 nəfər müəllimi ABŞ-da səfərdə olub.

Universitetdə *ingilis dilinin tədrisi səviyyəsinin yüksəldilməsi* məqsədilə Azərbaycan Müəllim İnkişaf Mərkəzi (AMİM) və ABŞ-ın ölkəmizdəki səfirliyinin təşəbbüsü ilə birgə layihə həyata keçirilmişdir. Bununla bağlı ADPU Elmi şurasının 16 may 2018-ci il tarixli iclasında qərar qəbul edilmişdir. Layihə çərçivəsində ADPU-nun ingilis



*Rusiya Dövlət Peşə Pedaqoji Universiteti ilə əməkdaşlıq müqaviləsi imzalanarkən*

dili müəllimləri və ingilis dili ixtisasının I, III və IV tədris ili tələbələri, həmçinin Şəki filialının ingilis dili müəllimlərinin dil bilik səviyyələrinin yoxlanması məqsədilə AMİM tərəfindən “Cambridge English Placement Test” (CEPT) imtahanları təşkil olunmuş və imtahanın nəticəsinə uyğun olaraq müəllimlər üçün “Teaching Knowledge Test (TKT) Modul 1” və B1 səviyyələri üzrə English class təlimləri təşkil edilmişdir.

ADPU-nun rektoru, prof.Cəfər Cəfərovun 12.11.2018-ci il tarixli 3/166 nömrəli əmrinə əsasən A2 və B1 səviyyələri üzrə nəticələr əldə etmiş III tədris ili tələbələri üçün əlavə ingilis dili dərsləri təşkil olunmuşdur. Dərslər müəllimlər üçün təşkil olunmuş CEPT imtahanlarından C+ səviyyəsi üzrə nəticə əldə etmiş 4 nəfər müəllim və “Fulbright İngilis dilinin tədris köməkçisi proqramı” çərçivəsində 2018-ci ilin sentyabr ayından 10 ay müddətində ADPU-da pedaqoji fəaliyyət göstərən İan Dooley tərəfindən aparılmışdır. Beləliklə, tədris ilinin sonunda tələbələrin nəticəsinin ölçülməsi məqsədilə AMİM tərəfindən təşkil olunan imtahanda 22 nəfər tələbə iştirak etmişdir. Eyni zamanda universitetin və Şəki filialının ingilis dili müəllimləri üçün 2019-cu ilin fevral ayından TKT Modul 2 (Dil tədrisinin planlaşdırılması) üzrə təlimlərin ikinci mərhələsi keçirilmişdir. İyun və iyul aylarında AMİM tərəfindən təşkil olunmuş imtahanlarda iştirak edən təlim iştirakçıları beynəlxalq sertifikatlar əldə etmişlər. 23 oktyabr 2019-cu ildən ingilis dili müəllimləri üçün 4 aylıq B2 səviyyəsi üzrə English class təlimləri keçirilmişdir. 2019-cu il 5-7 dekabr tarixlərində A2 və B1 səviyyələri üzrə əlavə ingilis dili dərslərində iştirak edən tələbələrdən 14 nəfəri AMİM tərəfindən keçirilən Cambridge imtahanlarında iştirak etmiş və beynəlxalq sertifikatlara layiq görülmüşdür.

Müxtəlif *xarici ölkələrin nümayəndələri ilə universitetin professor-müəllim və tələbə heyəti ilə keçirilən görüşlər* həm əməkdaşlığın inkişafı, həm də təcrübə və bilik mübadiləsi baxımından əhəmiyyətli rol oynayır. Son illərdə Pedaqoji Universitetdə ABŞ-ın Azərbaycandakı səfiri Robert Cekuta, Fələstin Dövlətinin Bakıdakı səfiri Nasser Abdel Karim, Rusiya Təhsil Akademiyasının akademiki, Beynəlxalq Humanist Pedaqogika Assosiasiyasının

prezidenti Şalva Amonaşvili, Leicester Universitetinin mütəxəssisi Mark Vindal, Regional ingilis dili üzrə məsul şəxs Con Silver, Avropa İttifaqının Azərbaycandakı səfiri Kestutis Yankauskas, İndoneziya Respublikasının Azərbaycandakı səfiri Hüsnan Bəy Fanani ilə görüşlər keçirilib. Görüşlərdə ayrı-ayrı ölkələrdə müəllim kadrları hazırlığı, pedaqoji təhsilin məzmunu, təhsil sahəsində əməkdaşlığın istiqamətləri və s. məsələlər müzakirə olunub.

Son illərdə ADPU-nun beynəlxalq təşkilat və qurumlarla əlaqəsinin genişlənməsində rektor, prof.Cəfər Cəfərovun mühüm rolu olub. Bu məqsədlə o, 10 xarici səfərdə ADPU-nu təmsil edib, Avropa Müəllim Hazırlığı Şəbəkəsi ETEN tərəfindən İsveçin Gotenburq şəhərində yerləşən Gotenburq Universitetinin Təhsil fakültəsinin təşəbbüsü ilə keçirilən konfransda, Danimarkanın Kopenhagen şəhərindəki Universitet Kollecində (UCC) əməkdaşlıq çərçivəsində keçirilən görüşdə, universitet Prezidentlərinin Beynəlxalq Assosiasiyasının (UPBA) Vyanada (Avstriya) keçirilən “Təhsildə innovasiya” adlı konfransda iştirak edib. Bundan əlavə, o, həm də Türkiyədə keçirilən 5 konfrans, forum və konqreslərdə (Vitse Kanslerlərin Forumu, Tükiyə və Azərbaycan ali təhsil sistemləri çərçivəsində əməkdaşlıq imkanları, KÜNİB VII Konqresi, Şeb-i Arus, EYFOR) iştirak edib.

Universitetin *nüfuzunun yüksəldilməsi və təhsilin keyfiyyətinin artırılması* ilə bağlı bir sıra tədbirlər və layihələr həyata keçirilir. Bu baxımdan



*Rektor prof.C.Cəfərov və prof.M.Foyer*

ABŞ-ın Vaşinqton şəhərində yerləşən Corc Vaşinqton Universiteti ilə ikili diplom proqramı layihəsi üzrə keçirilən müxtəlif görüşlərdə ADPU rəhbərlik səviyyəsində təmsil olunmuş, universitetlərarası memorandumun imzalanması üzrə danışıqlar aparılmışdır. Qarşılıqlı əlaqələrin inkişaf etdirilməsi məqsədilə Corc Vaşinqton Universitetinin nümayəndələri ilə Vaşinqtonda iki görüş, Bakıda bir görüş keçirilmişdir. ABŞ-ın Corc Vaşinqton Universitetinin Ali Təhsil və İnsan inkişafı Məktəbinin nümayəndə heyəti ADPU-da səfərdə olub. 28 iyun 2019-cu ildə ADPU-nun Corc Vaşinqton Universiteti ilə ikili diplom proqramı ilə bağlı ADPU-nun rektoru, professor Cəfər Cəfərov və Corc Vaşinqton Universitetinin dekanı Maykl Föyer tərəfindən bəyannamə imzalandı.

2020-ci ilin yanvarın 31-də Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) və ABŞ-ın Corc Vaşinqton Universiteti arasında ikili diplom proqramı üzrə saziş imzalandı. Tədbirdə Təhsil naziri

**ADPU və ABŞ-ın Corc Vaşinqton Universiteti arasında ikili diplom proqramı imzalanarkən**





















Ceyhun Bayramov, Corc Vaşinqton Universitetinin Təhsil və insan inkişafı fakültəsinin dekanı Maykl Foyer, ADPU-nun rektoru Cəfər Cəfərov, ABŞ-ın ölkəmizdəki səfiri Örl Litzenberqer Azərbaycan və ABŞ arasında təhsil sahəsində əməkdaşlığın perspektivlərindən danışdılar. İkili diplom proqramında təhsil sahəsində təhsil menecerlərinin hazırlanması nəzərdə tutuldu.

Proqram çərçivəsində 2020/21 -ci tədris ilindən ADPU-da magistratura səviyyəsinə qəbul aparılır. Tədrisin 2 il müddətində və ingilis dilində təşkil edildiyi magistratura səviyyəsinə ilk mərhələ üçün 25 tələbə cəlb olundu: 1) Abazov Emil Nazim oğlu; 2) Musazadə Nurlan Salman oğlu; 3) Pənahova Jalə Vüqar qızı; 4) Nəzirova Vəfa Nadir qızı; 5) Mütəllibova Vüsalə Hicran qızı; 6) Əzimova Aytən Qurban qızı; 7) Xankişizadə Ziyadxan Tariyel oğlu; 8) Müslümov Bəhruz Firizman oğlu; 9) Məlikova Zöhrə Asif qızı; 10) Rəsulova İlahə Zahid qızı; 11) Abdullayeva Səbinə Məmməd qızı; 12) Nəbizadə Sevinc Kamal qızı; 13) Axundov Elnur Elxan oğlu; 14) İbrahimxəlilov Şahin Abdüləziz oğlu; 15) Bağı-




*I tədris ilinə qəbul olunmuş magistrantlarla*
*Təhsil naziri E.Əmrullayevin və rektor prof.C.Cəfərovun görüşü*

rova Nərmin Azad qızı; 16) İbrahimova Nərgiz Abuzər qızı; 17) Soltanlı Lalə Çingiz qızı; 18) Qulusoy Cavid Zahid oğlu; 19) Övsətova Günəş Müslüm qızı; 20) Əhmədova Emiliya Oqtay qızı; 21)Bədəlova Çiçək Vəzir qızı; 22) Sadıxov Tofiq Vəfadar oğlu; 23) Bağırova Aygül Ayət qızı; 24) İsayeva Aydan Məmməd qızı; 25) Səfərəliyeva Şəms Elçin qızı.

İddiaçılar magistraturaya qəbul olunmaq üçün həm Dövlət İmtahan Mərkəzinin, həm də Corc Vaşinqton Universitetinin əməkdaşlarının iştirakı ilə keçirilən imtahanlarda iştirak etməlidir. Tədris həm Corc Vaşinqton Universitetindən dəvət olunan, həm də milli professor-müəllimlər tərəfindən aparılır. Məzunlara Azərbaycan Dövlət Pedaqoji Universitetinin və Corc Vaşinqton Universitetinin diplomlarının verilməsi nəzərdə tutulur. Azərbaycan Dövlət Pedaqoji Universiteti və Corc Vaşinqton Universiteti arasında magistr dərəcəsi üzrə ikili diplom layihəsinin Rəhbər Komitəsinin qərarına əsasən Proqramın Baş Direktoru vəzifəsinə *Tofiq Teymur oğlu Əhmədov,* Baş Direktorun Katibi vəzifəsinə *Ümid Səməndər oğlu Mehdiyev* təyin edilmişdir.

ADPU-nun 2016-2019-cu illərdə 39 nəfəri mübadilə çərçivəsində olmaqla ümumilikdə 68 nəfər əməkdaşı xarici universitetlər və təşkilatlar tərəfindən təşkil olunan seminarlarda, konfranslarda və təlimlərdə iştirak etmiş, 6 nəfər tələbəsi mübadilə proqramı çərçivəsində xaricdə təhsil almışdır. Bu illər ərzində 34 beynəlxalq müqavilə imzalanmışdır.

Pedaqoji Universitetdə beynəlxalq əlaqələrin genişləndirilməsinə xüsusi diqqət yetirilir. Universitetin dünyanın 52 qabaqcıl və nüfuzlu universitetləri ilə əməkdaşlıq müqaviləsi[236] vardır.

2016-cı ildə Pedaqoji Universitet ilə Cenevrə Akademik Mərkəzi (İsveçrə), Kazan Federal Universiteti (Rusiya Federasiyasının Tatarıstan Respublikası), Kotelnikov adına Radiotexnika və Elektronika İnstitutu (Rusiya), 2017-ci ildə Alanya Alaaddin Keykubat Universiteti (Türkiyə), Bülent Ecevit Universiteti (Türkiyə), Cənubi Qazaxıstan Pedaqoji Universiteti (Qazaxıstan Respublikası), Final Beynəlxalq Universiteti (Şimali Kipr), Səlcuq Universiteti (Türkiyə), M.Akmulla adına Başqırdstan Dövlət Pedaqoji Universiteti (Rusiya), Çankırı Karatekin Universiteti (Türkiyə), TÜRKSOY

[236] *ADPU-ya qoşulana kimi AMİ də 13 xarici ölkə universitetləri ilə müqavilə imzalamışdır.*

Əməkdaşlıq Protokolu, 2018-ci ildə Naberejnye Çelnıy Dövlət Pedaqoji Universiteti, M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin Tarix fakültəsi, Yessenov Universiteti (Qazaxıstan), Qazi Universiteti (Türkiyə),Hacettepe Universiteti (Türkiyə), Van Yüzüncü Yıl Universiteti (Türkiyə), Mordovia Dövlət Pedaqoji İnstitutu, Vollonqonq Universiteti (Dubay), Atatürk Universiteti, Kafkas Universiteti (Türkiyə), Kopenhagen Universitet Kolleci (UCC-Danimarka), Aydın Adnan Menderes Universiteti (Türkiyə), 2019-cu ildə Rusiya Dövlət Humanitar Universiteti (Rusiya), Əhməd Dahlan Universiteti (İndoneziya), İğdir Universiteti (Türkiyə), Qazax Milli Pedaqoji Qızlar Universiteti (Qazaxıstan) Corc Vaşinqton Universiteti Təhsil və İnsan İnkişafı məktəbi (ABŞ), Aurel Vlaysu Universiteti (Rumınya), Rusiya Dövlət Peşə Pedaqoji Universiteti (Rusiya), Van Yüzüncü Yıl Universiteti (Türkiyə), Ukrayna Təhsil Elmləri Milli Akademiyasının Təhsil Menecmenti Universiteti (Ukrayna), Dokuz Eylül Universiteti (Türkiyə) arasında əməkdaşlıq müqaviləsi imzalanıb.

2016-2019-cu illərdə ADPU-da 78 əcnəbi tələbə və magistrant, 85 nəfər əcnəbi dinləyici məzun olmuşdur. Hazırda 180-dən çox əcnəbi vətəndaş ADPU-nun hazırlıq, bakalavriat və magistratura səviyyələrinin müxtəlif ixtisaslarında təhsil alır. Onların arasında Türkiyə, Rusiya, Gürcüstan, Çin, Türkmənistan, Suriya, Ukrayna vətəndaşları vardır.

## Beynəlxalq elmi qurumlarda təmsilçilik

Universitet əməkdaşları beynəlxalq elmi qurumlarda təmsil olunurlar. Professor Cəfər Cəfərov 2018-ci ildən Moskvada nəşr olunan impakt faktor göstəricili "Коммуникология" beynəlxalq elmi jurnalının redaksiya heyətinin üzvüdür. Professor Asəf Zamanov Nyu-Yorkda ingilis dilində, Riqada rus dilində nəşr edilən Mechanics of Composite materials dövri elmi jurnalının Beynəlxalq redaksiya heyətinin 2011-ci ildən üzvüdür. 1997-ci ildən Hesablama riyaziyyatı üzrə Beynəlxaq Elmlər Akademiyaları Koordinasiya Komitəsinin üzvüdür. 2001-ci ildən YUNESKO-nun Bioetika, Elm və Texnologiyaların Etikası Azərbaycan Komitəsinin üzvüdür.

Professor Fərrux Rüstəmov YUNESKO-nun yaşlıların təhsili ilə bağlı "Avropa evi" İctimai Birliyi tərəfindən Sankt-Peterburqda nəşr etdirdiyi 10 cildlik "Образование на протяжении всей жизни: разнообразие идей концепций форм методов технологий" beynəlxalq monoqrafiyanın redaktorlarından biridir. Professor Əli Zalov Avstriyada çap olunan "International Journal of Analytical Chemistry" jurnalının redaksiya heyətinin (2015) və İngilis "Kral kimya cəmiyyətinin" (2015) üzvüdür.

## Bakalavriat səviyyəsi üzrə tələbə qəbulu

2016/17-ci tədris ilində Azərbaycan dili və ədəbiyyatı müəllimliyinə 173, biologiya müəllimliyinə 141, coğrafiya müəllimliyinin Azərbaycan bölməsinə 86, rus bölməsinə 12, fizika müəllimliyinin Azərbaycan bölməsinə 85, rus bölməsinə 7, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyinin Azərbaycan bölməsinə 50, rus bölməsinə 20, ibtidai sinif müəllimliyinin Azərbaycan bölməsinə 293, rus bölməsinə 20, informatika müəllimliyinə 75, kimya müəllimliyinə 77, kimya və biologiya müəllimliyinin Azərbaycan bölməsinə 75, rus bölməsinə 5, korreksiyaedici təlimə 46, məktəbəqədər təhsilin Azərbaycan bölməsinə 130, rus bölməsinə 6, musiqi müəllimliyinə 21, riyaziyyat müəllimliyinə 109, riyaziyyat və informatika müəllimliyinin Azərbaycan bölməsinə 100, rus bölməsinə 23, sosial işə 23, tarix müəllimliyinin Azərbaycan bölməsinə 124, rus bölməsinə 24, tarix və coğrafiya müəllimliyinə 60, təhsildə sosial-psixoloji xidmətin Azərbaycan bölməsinə 97, rus bölməsinə 10, təsviri incəsənət müəllimliyinin Azərbaycan bölməsinə 93, rus bölməsinə 22, tex-



*Filologiya fakültəsində sənəd qəbulu*



*Riyaziyyat fakültəsində sənəd qəbulu*


*Kimya və biologiya fakültəsində sənəd qəbulu*



*Tarix və coğrafiya fakültəsində sənəd qəbulu*

nologiya müəllimliyinə 88, xarici dil müəllimliyinə (fransız dili üzrə) 24, xarici dil müəllimliyinə (ingilis dili üzrə) 50 tələbə qəbul olunmuşdur. Azərbaycan şöbəsinə 2010 (1231-i dövlət sifarişli, 779 ödənişli), rus şöbəsinə 149 (27-si dövlət sifarişli, 122-si ödənişli) tələbə qəbul olunmuşdur.

2017/18-ci tədris ilində universitetin Azərbaycan bölməsinə 1942, rus bölməsinə 122 nəfər tələbə qəbul olunmuєdur. Qəbul planı 93,8% yerinə yetirilmişdi.

2017/18-ci tədris ilində Azərbaycan dili və ədəbiyyatı müəllimliyinə 173, biologiya müəllimliyinə 113, coğrafiya müəllimliyinin Azərbaycan bölməsinə 100, rus bölməsinə 13, fizika müəllimliyinin Azərbaycan bölməsinə 84, rus bölməsinə 5, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyinin Azərbaycan bölməsinə 50, rus bölməsinə 20, ibtidai sinif müəllimliyinin Azərbaycan bölməsinə 272, rus bölməsinə 21, informatika müəllimliyinə 73, kimya müəllimliyinə 80, kimya və biologiya müəllimliyinin Azərbaycan bölməsinə 75, rus bölməsinə 10, korreksiyaedici təlimə 73, məktəbəqədər təhsilin Azərbaycan bölməsinə 119, rus bölməsinə 1, musiqi müəllimliyinə 5, riyaziyyat müəllimliyinə 100, riyaziyyat və informatika müəllimliyinin Azərbaycan bölməsinə 100, rus bölməsinə 12, sosial işə 25, tarix müəllimliyinin Azərbaycan bölməsinə 119, rus bölməsinə 14, tarix və coğrafiya müəllimliyinə 75, təhsildə sosial-psixoloji xidmətin Azərbaycan bölməsinə 13, rus bölməsinə 1, təsviri incəsənət müəllimliyinin Azərbaycan bölməsinə 97, rus bölməsinə 25, texnologiya müəllimliyinə 47, xarici dil müəllimliyinə (fransız dili üzrə) 24, xarici dil müəllimliyinə (ingilis dili üzrə) 25 tələbə qəbul olunmuşdur.

2018-2021-ci illərdə bakalavriatura səviyyəsi üzrə qəbulun nəticələri aşağıdakı kimi olmuşdur.

| İxtisas | Plan | | | Qəbul olunan | | |
|---|---|---|---|---|---|---|
| | 2018/19 | 2019/20 | 202/21 | 201/19 | 201/20 | 2020/21 |
| Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | 175 | 180 | 200 | 174 | 180 | 200 |
| Biologiya müəllimliyi | 125 | 125 | 130 | 121 | 122 | 130 |
| Coğrafiya müəllimliyi | 100 | 100 | 110 | 100 | 99 | 98 |
| Coğrafiya müəllimliyi (rus) | 15 | 15 | 15 | 4 | 2 | 0 |
| Fizika müəllimliyi | 85 | 90 | 90 | 85 | 89 | 90 |
| Fizika müəllimliyi (rus) | 15 | 15 | 15 | 2 | - | - |
| Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi | 50 | 55 | 50 | 49 | 55 | 50 |
| Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi (rus) | 20 | 25 | 30 | 20 | 25 | 30 |
| İbtidai sinif müəllimliyi | 275 | 300 | 300 | 273 | 298 | 300 |
| İbtidai sinif müəllimliyi (rus) | 25 | 25 | 30 | 24 | 25 | 30 |
| İnformatika müəllimliyi | 75 | 100 | 110 | 74 | 98 | 110 |
| Kimya müəllimliyi | 85 | 90 | 90 | 83 | 86 | 90 |
| Kimya və biologiya müəllimliyi | 75 | 90 | 90 | 74 | 90 | 90 |
| Kimya və biologiya müəllimliyi (rus) | 15 | 20 | 15 | 15 | 6 | 5 |
| Korreksiyaedici təlim | 75 | 90 | 100 | 75 | 90 | 100 |
| Korreksiyaedici təlim (rus) | - | 15 | 15 | - | 2 | 8 |
| Məktəbəqədər təhsil | 120 | 120 | 120 | 120 | 120 | 120 |
| Məktəbəqədər təhsil (rus) | 15 | 15 | 15 | 7 | 13 | 11 |
| Musiqi müəllimliyi | 20 | 20 | 20 | 19 | 10 | 20 |
| Riyaziyyat müəllimliyi | 100 | 100 | 110 | 100 | 100 | 110 |
| Riyaziyyat və informatika müəllimliyi | 100 | 100 | 110 | 100 | 100 | 110 |
| Riyaziyyat və informatika müəllimliyi (rus) | 20 | 25 | 15 | 20 | 11 | 10 |
| Sosial iş | 50 | 60 | 60 | 49 | 60 | 60 |

| | | | | | | |
|---|---|---|---|---|---|---|
| Tarix müəllimliyi | 125 | 125 | 125 | 125 | 124 | 125 |
| Tarix müəllimliyi (rus) | 25 | 25 | 25 | 22 | 23 | 16 |
| Tarix və coğrafiya müəllimliyi | 75 | 100 | 100 | 75 | 100 | 100 |
| Təhsildə sosial-psixoloji xidmət | 120 | 120 | 120 | 119 | 117 | 120 |
| Təhsildə sosial-psixoloji xidmət (rus) | 15 | 20 | 15 | 14 | 7 | 4 |
| Təsviri incəsənət müəllimliyi (Azərb.) | 100 | 100 | 100 | 97 | 97 | 100 |
| Təsviri incəsənət müəllimliyi (rus) | 25 | 25 | 25 | 21 | 23 | 25 |
| Texnologiya müəllimliyi (Azərb.) | 50 | 60 | 60 | 48 | 60 | 60 |
| Texnologiya müəllimliyi (rus) | - | 15 | 15 | - | 12 | 15 |
| Xarici dil müəllimliyi (fransız dili üzrə) | 25 | 25 | 25 | 23 | 24 | 25 |
| Xarici dil müəllimliyi (ingilis dili üzrə) | 30 | 30 | 50 | 30 | 30 | 50 |
| Azərbaycan bölməsi | **2035** | **2180** | **2270** | **2013** | **2149** | **2258** |
| Rus bölməsi | **190** | **240** | **230** | **149** | **149** | **154** |
| Cəmi | **2225** | **2420** | **2500** | **2162** | **2298** | **2412** |

Universitetə 2018/19-cu tədris ilində 2162 (2013 Azərbaycan bölməsi, 149 rus bölməsi), 2019/20-ci tədris ilində 2298 (2149 Azərbaycan bölməsi, 149 rus bölməsi), 2020/21-ci tədris ilində 2412 (2258 Azərbaycan bölməsi, 154 rus bölməsi) tələbə qəbul olunmuşdur. Azərbaycan bölməsinə 2232, rus bölməsinə 148 nəfər olmaqla 2378 nəfər qeydiyyatdan keçmişdir. 2010/11-ci tədris ili ilə müqayisədə tələbələrin sayında xeyli dəyişiklik olmuşdur. Belə ki, 2010/11-ci tədris ilində universitetə 1829 (1357 əyani, 472 qiyabi) qəbul olunduğu halda, 2020/21-ci tədris ilində onların sayı 2378 nəfər olmuşdur. 1 nəfər Kimya və biologiya, 1 nəfər Tarix və Coğrafiya fakültələrinə müsabiqədənkənar (respublika olimpi-



*Məktəbəqədər təhsil fakültəsində sənəd qəbulu*




*Fizika fakültəsində sənəd qəbulu*

yadasında 3-cü yer tutduqlarına görə) qəbul olunub. Universitetə dövlət sifarişli 1649, ödənişli əsaslarla 731 nəfər tələbə qəbul olunub ki, onlardan da 2001-i qız, 379-u oğlan olub.

2020/21-ci tədris ilində universitetin bakalavriatura səviyyəsinə qəbul olunub qeydiyyatdan keçənlər nəzərdə tutulan tələbələrin 98,7% -ni təşkil etmişdir. Universitet qəbul planını 98 və ya 99 faiz yerinə yetirən ali təhsil müəssisələri içərisində xüsusi yer tutur. Pedaqoji Universitetə qəbul olan tələbələrin arasında yüksək bal toplayanların sayı ildən ilə artır.

*2017-2020-ci tədris illəri üzrə 500 və 500-dən çox bal toplayan tələbələrin sayı haqqında məlumat*[237]

| İxtisas | 2016/17 | | 2017/18 | | 2018/19 | | 2019/20 | | 2020/21 | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | 500 | 600 | 500 | 600 | 500 | 600 | 500 | 600 | 500 | 600 |
| Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | 39 | - | 87 | 1 | 103 | 2 | 180 | - | 99 | - |
| Biologiya müəllimliyi | - | - | 2 | | 11 | | 1 | | | |
| Coğrafiya müəllimliyi | - | - | | | 2 | | | | | |
| Fizika müəllimliyi | 1 | - | | | 2 | | | | | |
| İbtidai sinif müəllimliyi | - | - | 28 | - | 126 | | 11 | | 2 | |
| İbtidai sinif müəllimliyi (rus) | | | 1 | | 3 | | 1 | | 1 | 1 |
| Kimya müəllimliyi | | | | | 3 | | 2 | | | |
| Kimya və biologiya müəllimliyi | 7 | | 11 | | 68 | 6 | 24 | | 15 | |
| Korreksiyaedici təlim | 2 | | | | 2 | | | | | |
| Məktəbəqədər təhsil | | | | | 1 | | | | | |
| Riyaziyyat müəllimliyi | 1 | | 7 | | 14 | | 5 | | 6 | - |
| Riyaziyyat və informatika müəllimliyi | 13 | 1 | 48 | 1 | 66 | 3 | 43 | 1 | 31 | |
| Sosial iş | 2 | | 7 | | 11 | | 3 | | | |

[237] *Cədvəldə 500 və 500-dən çox və 600 və 600-dən çox bal toplayan tələbələrin sayı haqqında məlumat verilmişdir.*

| | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| Tarix müəllimliyi | 32 | 1 | 40 | | 36 | | 52 | | 9 | |
| Tarix və coğrafiya müəllimliyi | 12 | | 19 | | 27 | | 8 | | 2 | 1 |
| Təhsildə sosial-psixoloji xidmət | | | 4 | | 19 | | | | | |
| Təhsildə sosial-psixoloji xidmət (rus) | | | 1 | | | | | | | |
| Xarici dil müəllimliyi (ingilis dili üzrə) | 6 | | 4 | | 22 | | 9 | | 10 | |
| **Yekun** | 115 | 2 | 259 | 2 | 516 | 11 | 337 | 1 | 175 | 2 |

2016/17-ci tədris ilində 117, 2017/18 -ci tədris ilində 261, 2018/19-cu tədris ilində 527, 2019/20-ci tədris ilində 338, 2020/21-ci tədris ilində 177 tələbə yüksək balla universitetə qəbul olunmuşdur.

2017/18-ci tədris ilində universitetə qəbul olunan tələbələrin 11,8 %-ni, 2018/19-cu tədris ilində 24,3%-ni, 2019/20-ci tədris ilində 14,6 %-ni, 2020-2021-ci tədris ilində isə 7,4 %-ni yüksək bal toplayanlar təşkil etmişdir. Azərbaycan dili və ədəbiyyat müəllimliyi ixtisası üzrə 99 nəfər (49,5%), tarix müəllimliyi ixtisası üzrə 9 nəfər (7,2%), tarix və coğrafiya müəllimliyi ixtisası üzrə 2 nəfər (2%), riyaziyyat -informatika müəllimliyi ixtisası üzrə 31 nəfər (28,18%), riyaziyyat müəl-



*İncəsənət və fiziki tərbiyə fakültəsində sənəd qəbulu*



*İbtidai təhsil fakültəsində sənəd qəbulu*

limliyi ixtisası üzrə 6 nəfər (5,5%), kimya- biologiya müəllimliyi ixtisası üzrə 15 nəfər (16,85%), ibtidai sinif müəllimliyi ixtisası üzrə 3 nəfər (0,9%), ingilis dili müəllimliyi ixtisası üzrə 10 nəfər (20%) tələbə birinci yerdə müəllimlik ixtisasını seçmişdir. 2 nəfər 600 baldan yuxarı (1 nəfər ibtidai sinif müəllimliyi, 1 nəfər tarix-coğrafiya müəllimliyi) bal toplayıb.

Ümumiyyətlə, 2016/17-2020/21-ci tədris illərində Pedaqoji Universitetdə tələbələrin inkişaf dinamikası aşağıdakı kimi olmuşdur.

| Tədris illəri | Tələbələrin sayı | | Qəbul | | Məzun | |
|---|---|---|---|---|---|---|
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2016/17 | 9117 | 689 | 2165 | - | 1830 | 522 |
| 2017/18 | 9344 | 430 | 2066 | - | 1893 | 240 |
| 2018/19 | 9612 | 224 | 2167 | - | 1894 | 199 |
| 2019/20 | 9534 | 57 | 2308 | - | 2341 | 157 |
| 2020/21 | 9746 | 18 | 2380 | - | 2176 | 30 |

İldən-ilə universitetə qəbul olunan tələbələrin sayı artır. 2021/22-ci tədris ilində Təhsil Nazirliyinin təsdiq etdiyi qəbul planına görə ADPU-ya 2475 nəfər tələbənin (2245-i Azərbaycan, 200-ü rus, 30-u ingilis bölməsi) daxil olması nəzərdə tutulur.

| İxtisasın şifri | İxtisasın adı | Cəmi | Təhsil müəssisəsinin təklif etdiyi yerlər | | |
|---|---|---|---|---|---|
| | | | Azərbaycan bölməsi | rus bölməsi | ingilis bölməsi |
| | | | əyani | əyani | əyani |
| 050101 | Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | 200 | 200 | | |
| 050102 | Biologiya müəllimliyi | 130 | 130 | | |
| 050103 | Coğrafiya müəllimliyi | 125 | 125 | | |
| 050105 | Fizika müəllimliyi | 90 | 90 | | |
| 050106 | Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi | 80 | 50 | 30 | |
| 050107 | İbtidai sinif müəllimliyi | 345 | 300 | 30 | 15 |
| 050108 | İnformatika müəllimliyi | 110 | 110 | | |
| 050109 | Kimya müəllimliyi | 90 | 90 | | |
| 050110 | Kimya və biologiya müəllimliyi | 105 | 90 | 15 | |
| 050111 | Korreksiyaedici təlim | 115 | 100 | 15 | |
| 050112 | Məktəbəqədər təhsil | 135 | 120 | 15 | |
| 050113 | Musiqi müəllimliyi | 20 | 20 | | |

| | | | | | |
|---|---|---|---|---|---|
| 050105 | Fizika müəllimliyi | 90 | 90 | | |
| 050106 | Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi | 80 | 50 | 30 | |
| 050107 | İbtidai sinif müəllimliyi | 345 | 300 | 30 | 15 |
| 050108 | İnformatika müəllimliyi | 110 | 110 | | |
| 050109 | Kimya müəllimliyi | 90 | 90 | | |
| 050110 | Kimya və biologiya müəllimliyi | 105 | 90 | 15 | |
| 050111 | Korreksiyaedici təlim | 115 | 100 | 15 | |
| 050112 | Məktəbəqədər təhsil | 135 | 120 | 15 | |
| 050113 | Musiqi müəllimliyi | 20 | 20 | | |
| 050114 | Riyaziyyat müəllimliyi | 125 | 110 | | 15 |
| 050115 | Riyaziyyat və informatika müəllimliyi | 125 | 110 | 15 | |
| 050116 | Tarix müəllimliyi | 150 | 125 | 25 | |
| 050117 | Tarix və coğrafiya müəllimliyi | 60 | 60 | | |
| 050118 | Təhsildə sosial-psixoloji xidmət | 135 | 120 | 15 | |
| 050119 | Təsviri incəsənət müəllimliyi | 125 | 100 | 25 | |
| 050120 | Texnologiya müəllimliyi | 75 | 60 | 15 | |
| 050121 | Xarici dil müəllimliyi (ingilis dili üzrə) | 50 | 50 | | |
| 050121 | Xarici dil müəllimliyi (fransız dili üzrə) | 25 | 25 | | |
| Cəmi | | 2475 | 2245 | 200 | 30 |

## Magistratura səviyyəsinə tələbə qəbulu

2016-2021-ci illərdə ADPU-da magistratura səviyyəsi üzrə kadr hazırlığı davam etdirildi. 2011-2013-cü illərdə Azərbaycan dili və ədəbiyyat müəllimliyi, biologiya müəllimliyi, ibtidai sinif müəllimliyi, fizika müəllimliyi, məktəbəqədər təhsil və tərbiyə, pedaqogika nəzəriyyəsi və tarixi, texnologiya müəllimliyi, riyaziyyat müəllimliyi, tarix müəllimliyi, riyazi analiz, cəbr və topologiya, botanika, onurğasızlar zoologiyası, insan və heyvan fiziologiyası, iqtisadi və sosial coğrafiya, landşaftşünaslıq, azərbaycanın fiziki coğrafiyası, Azərbaycan ədəbiyyatı, Azərbaycan dili və Türk dünyası tarixi ixtisaslarında həm əyani, həm qiyabi şöbələrdə magistr hazırlığı həyata keçirilirdi. 2013-cü ildən sonra isə yalnız əyani şöbə üzrə magistr hazırlığı aparılır.

Hazırda Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasında 54, Biologiya müəllimliyi ixtisasında 37, Coğrafiya müəllimliyi ixtisasında 38, İbtidai sinif müəllimliyi ixtisasında 25, Fizika müəllimliyi ixtisasında 35, İnformatika müəllimliyi ixtisasında 42 nəfər magistrant təhsil alır.

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Azərbaycan dili və ədəbiyyat müəllimliyi | | Biologiya müəllimliyi | | Coğrafiya müəllimliyi | | İbtidai sinif müəllimliyi | | Fizika müəllimliyi | | İnformatika müəllimliyi | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2016 | 50 | - | 30 | - | 31 | - | 47 | - | 18 | - | 16 | - |
| 2017 | 43 | - | 34 | - | 23 | - | 36 | - | 19 | - | 20 | - |
| 2018 | 30 | - | 19 | - | 18 | - | 28 | - | 20 | - | 14 | - |
| 2019 | 24 | - | 18 | - | 20 | - | - | - | 18 | - | 24 | - |
| 2020 | 30 | - | 19 | - | 18 | - | 25 | - | 17 | - | 18 | - |

Kimya müəllimliyi ixtisasında 37, korreksiyaedici təlim ixtisasında 18, menecment ixtisasında 39, məktəbəqədər təhsil və tərbiyə ixtisasında 29, musiqi müəllimliyi ixtisasında 6, Pedaqogika nəzəriyyəsi və tarixi ixtisasında 30 magistrant təhsil alır.

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Kimya müəllimliyi | | Korreksiyaedici təlim | | Menecment | | Məktəbəqədər təhsil və tərbiyə | | Musiqi müəllimliyi | | Pedaqogika nəzəriyyəsi və tarixi | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2016 | 27 | - | 8 | - | 26 | - | 19 | - | 1 | - | 22 | - |
| 2017 | 17 | - | 9 | - | 20 | - | 21 | - | 4 | - | 12 | - |

| | | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| 2018 | 15 | - | 9 | - | 25 | - | 18 | - | 1 | - | 9 | - |
| 2019 | 20 | - | 9 | - | 19 | - | 15 | - | 1 | - | 15 | - |
| 2020 | 17 | - | 9 | - | 20 | - | 14 | - | 5 | - | 15 | - |

Hazırda sosial pedaqogika ixtisasında 30, təhsildə qiymətləndirmə və moni-torinq ixtisasında 30, sosial iş ixtisasında 9, riyaziyyat müəllimliyi ixtisasında 40, tarix müəllimliyi ixtisasında 42, texnologiya müəllimliyi ixtisasında 7 nəfər magis-trant təhsil alır.

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Sosial pedaqogika | | Təhsildə qiymətləndirmə və monitorinq | | Sosial iş | | Riyaziyyat müəllimliyi | | Tarix müəllimliyi | | Texnologiya müəllimliyi | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2016 | - | - | 24 | - | - | - | 29 | - | 24 | - | 4 | - |
| 2017 | - | - | 27 | - | - | - | 41 | - | 33 | - | - | - |
| 2018 | - | - | 24 | - | - | - | 6 | - | 29 | - | - | - |
| 2019 | 15 | - | 15 | - | 4 | - | 20 | - | 18 | - | 2 | - |
| 2020 | 15 | - | 15 | - | 5 | - | 20 | - | 24 | - | 5 | - |

Hazırda təhsildə sosial-psixoloji xidmət ixti-sasında 38, təsviri incəsənət müəllimliyi ixtisasında 10, xarici dil (ingilis dili) müəllimliyi ixtisasında 20, fiziki tərbiyə və çağırışaqədər hazırlıq müəl-limliyi ixtisasında 1 magistrant təhsil alır.

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Təhsildə sosial-psixoloji xidmət | | Təsviri incəsənət müəllimliyi | | Xarici dil (İngilis dili b)müəllimliyi | | Fiziki tərbiyə və çağırışaqədər hazırlıq müəllimliyikadr hazırlığı | | Ümumi psixologiya | | Pedaqoji psixologiya | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 2016 | 28 | - | 3 | - | - | - | 2 | - | - | - | - | - |
| 2017 | 30 | - | 6 | - | - | - | - | - | - | - | - | - |
| 2018 | 20 | - | 1 | - | 3 | - | - | - | - | - | - | - |
| 2019 | 18 | - | 5 | - | 10 | - | 1 | - | - | - | - | - |
| 2020 | 20 | - | 5 | - | 10 | - | - | - | - | - | - | - |

2021/22-ci tədris ilində ayrı-ayrı ixtisaslar üzrə 372 nəfər magistrantın (ondan 347-si Azərbaycan, 25-i ingilis bölməsi) qəbul edilməsi nəzərdə tutulub.

## ADPU-nun filiallarına tələbə qəbulu

2019-2020-ci tədris ilində ADPU-ya ali təhsilin bakalavriat səviyyəsində 8 fakültə, 22 ixtisas üzrə 2293 nəfər (1441 tələbə dövlət sifarişi, 852 nəfər tələbə ödənişli əsaslarla) qəbul olunub.

## Şəki filialı

Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə AMİ və onun filialları ilə birgə Şəki filialı da Azərbaycan Dövlət Pedaqoji Universitetinə qoşulmuş və Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şəki filialı adlandırılmışdır. 2015/16-cı tədris ilində filiala 203, 2016/17-ci tədris ilində 202, 2017/18-ci tədris ilində 179, 2018/19-cu tədris ilində 189 tələbə qəbul olunub. Filialda təhsil alan tələbələrin ümumi sayı 2015/16-cı tədris ilində 851, 2016/17-ci tədris ilində 1112, 2017/18-ci tədris ilində 942, 2018/19-cu tədris ilində 989, 2019/20-ci tədis ilində 877, 2020/21-ci tədris ilində 915 olmuşdur. 2019-2021-ci illərdə Şəki filialının müvafiq ixtisaslarının I tədris ilinə qəbul olunmuş tələbələrin sayında müəyyən artım olmuşdur.

| Fakültələrin adları | Plan | | Qəbul | | 500-dən çox bal toplayanlar | | Dövlət sifarişi | | Ödənişli | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 |
| **Pedaqoji fakültə** | **175** | **185** | **138** | **139** | **2** | **3** | **50** | **47** | **87** | **92** |
| Riyaziyyat və informatika müəllimliyi | 40 | 50 | 39 | 44 | 1 | 2 | 13 | 18 | 26 | 26 |
| Riyaziyyat müəllimliyi | 20 | 20 | 2 | 2 | - | | - | | 2 | 2 |
| İbtidai sinif müəllimliyi | 25 | 30 | 24 | 29 | - | 1 | 5 | 7 | 19 | 22 |
| Tarix və coğrafiya müəllimliyi | 40 | 30 | 24 | 12 | 1 | | 11 | 7 | 13 | 5 |
| Məktəbəqədər təhsil | 25 | 25 | 25 | 24 | - | | 8 | 10 | 17 | 14 |
| Təhsildə sosial psixoloji xidmət | 25 | 30 | 24 | 28 | - | | 13 | 5 | 11 | 23 |
| **Filologiya fakültəsi** | **85** | **100** | **82** | **99** | **9** | **1** | **10** | **2** | **72** | **97** |
| Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | 30 | 40 | 30 | 40 | 6 | 1 | 7 | 2 | 23 | 38 |
| Xarici dil (ingilis dili) müəllimliyi | 30 | 30 | 30 | 30 | 3 | | 3 | | 27 | 30 |
| Xarici dil (fransız dili) müəllimliyi | 25 | 30 | 22 | 29 | - | | - | | 22 | 29 |
| **Cəmi** | 260 | 285 | 220 | 238 | 11 | 4 | 60 | 49 | 160 | 189 |

ADPU-nun Şəki filialına 2018/19-cu tədris ilində 8 ixtisas üzrə 189 (41 dövlət sifarişli, 148 ödənişli), 2019/20-ci tədris ilində 9 ixtisas üzrə 220, 2020/21-ci tədris ilində 238 tələbə qəbul olunmuşdur. 189 tələbədən 17-si, 220 tələbədən 29-u, 238 tələbədən 40-ı təhsil illərində güzəştli şərtlərdən yararlanan tələbələr (köçkün, şəhid və valideyn himayəsindən məhrum olan) olmuşdur. 2018/2019-cu tədris ilində filiala qəbul olunan tələbələrdən 18-i 500-dən, 3-ü 600-dən, 2019/20-ci tədris ilində 10-u 500-dən, 1-i 600-dən, 1920/21-ci tədris ilində isə 5-i 500-dən yuxarı bal toplamışdır.

2021/22-ci tədris ilində filiala 270 tələbənin (45 nəfər Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, 30 nəfər ibtidai sinif müəllimliyi, 25 nəfər məktəbəqədər təhsil, 50 nəfər riyaziyyat və informatika müəllimliyi, 20 nəfər tarix və coğrafiya müəllimliyi, 30 nəfər təhsildə sosial-psixoloji xidmət, 30 nəfər xarici dil müəllimliyi (ingilis dili üzrə), 20 nəfər xarici dil müəllimliyi (fransız dili üzrə), 20 nəfər sosial iş) qəbulu nəzərdə tutulmuşdur.

## Quba filialı

Azərbaycan Müəllimlər İnstitutunun Azərbaycan Dövlət Pedaqoji Universitetinə qoşulması barədə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 26 noyabr 2015-ci il 1582 №-li Sərəncamı ilə AMİ-nin Quba filialı ADPU-nun Quba filialı adlandırılmışdır.

2015/16-cı tədris ilində filiala 184, 2016/17-ci tədris ilində 197, 2017/18-ci tədris ilində 148, 2018/19-cu tədris ilində 181 tələbə qəbul olunmuşdur. Filialda təhsil alan tələbələrin ümumi sayı 2015/16-cı tədris ilində 700, 2016/17-ci tədris ilində 779, 2017/18-ci tədris ilində 751, 2018/19-cu tədris ilində 793, 2019/20-ci tədis ilində 824, 2020/21-ci tədris ilində 847 olmuşdur. Son illərdə filiala tələbələrin qəbulu aşağıdakı kimi olmuşdur.













| İxtisaslar | Plan | | Qəbul | | 500-dən çox bal toplayanlar | | Dövlət sifarişi | | Ödənişli | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 |
| İbtidai sinif müəllimliyi | 40 | 50 | 40 | 44 | | | 7 | 5 | 33 | 39 |
| Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | 40 | 50 | 40 | 50 | 6 | 6 | 7 | 7 | 33 | 33 |
| Riyaziyyat və informatika müəllimliyi | 30 | 30 | 29 | 29 | 3 | 4 | 19 | 19 | 10 | 10 |
| Tarix və coğrafiya müəllimliyi | 40 | 40 | 40 | 40 | | 1 | 9 | 9 | 31 | 31 |
| Məktəbəqədər təlim və tərbiyə | 30 | 30 | 23 | 23 | | | 5 | 5 | 17 | 17 |
| Təhsildə sosial – psixoloji xidmət | 30 | 30 | 30 | 30 | | | 9 | 9 | 16 | 16 |
| **Cəmi** | **210** | **240** | **202** | **211** | **9** | **11** | **56** | **58** | **140** | **135** |

ADPU-nun Quba filialına 2018/19-cu tədris ilində 6 ixtisas üzrə 181 (25 dövlət sifarişli, 156 ödənişli), 2019/20-ci tədris ilində 9 ixtisas üzrə 202, 2020/21-ci tədris ilində 211 tələbə qəbul olunmuşdur. 181 tələbədən 14-ü, 220 tələbədən 93-ü güzəştli şərtlərdən yararlanan tələbələr (köçkün, şəhid və valideyn himayəsindən məhrum olan) olmuşdur. 2018/19-cu tədris ilində filialın I tədris ilinə qəbul olunmuş tələbələrdən 7-si 500-dən, 2019/20-ci tədris ilində 8-i 500-dən, 1-i isə 600-dən, 2020/21-ci tədris ilində isə 11-i 500-dən çox bal toplamışdır.

2021/22-ci tədris ilində filiala 295 tələbənin (50 nəfər Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, 25 nəfər coğrafiya müəllimliyi, 50 nəfər ibtidai sinif müəllimliyi, 30 nəfər məktəbəqədər təhsil, 30 nəfər riyaziyyat müəllimliyi, 30 nəfər riyaziyyat və informatika müəllimliyi, 25 nəfər tarix müəllimliyi, 30 nəfər təhsildə sosial-psixoloji xidmət, 25 nəfər sosial iş) qəbulu nəzərdə tutulub.

## Ağcabədi filialı

2015/16-cı tədris ilində filiala 149, 2016/17-ci tədris ilində 150, 2017/18-ci tədris ilində 119, 2018/19-cu tədris ilində 133 tələbə qəbul olunmuşdur. Filialda təhsil alan tələbələrin ümumi sayı 2015/16-cı tədris ilində 560, 2016/17-ci tədris ilində 591, 2017/18-ci tədris ilində 563, 2018/19-cu tədris ilində 592, 2019/20-ci tədris ilində 578, 2020/21-ci tədris ilində 585 olmuşdur.





Son illərdə filialda tələbə qəbulu aşağıdakı kimi olmuşdur.

| Fakültələrin adları | Plan | | Qəbul | | Dövlət sifarişli | | Ödənişli əsaslarla | |
|---|---|---|---|---|---|---|---|---|
| | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 |
| Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | 30 | 50 | 30 | 50 | 3 | 1 | 27 | 49 |
| Tarix və coğrafiya müəllimliyi | 30 | 30 | 27 | 6 | 2 | 4 | 25 | 2 |
| Riyaziyyat və informatika müəllimliyi | 30 | 30 | 21 | 27 | 2 | 4 | 19 | 23 |
| İbtidai sinif müəllimliyi | 30 | 50 | 29 | 49 | 3 | - | 26 | 49 |
| Təhsildə sosial psixoloji xidmət | 30 | 30 | 30 | 28 | 2 | - | 28 | 28 |
| **Cəmi** | 150 | 190 | 137 | 160 | 12 | 9 | 125 | 151 |






ADPU-nun Ağcabədi filialına 2018/19-cu tədris ilində 5 ixtisas üzrə 131 (3-ü dövlət sifarişli, 128 ödənişli), 2019/20-ci tədris ilində 137, 2020/21-ci tədris ilində 160 tələbə qəbul olunmuşdur. 131 tələbədən 3-ü, 137 tələbədən 2-si, 160 tələbədən 3-ü 500-dən çox bal toplamışdır. 2018/19-cu tədris ilində I tədris ilinə qəbul olunanların 45-i, 2019/20-ci tədris ilində 57-si, 2020/21-ci tədris ilində 81-i güzəştli şərtlərdən yararlanan tələbələr (köçkün, şəhid və valideyn himayəsindən məhrum olan) olmuşdur.

2021/22-ci tədris ilində filiala 285 tələbənin (50 nəfər Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, 25 nəfər tarix və coğrafiya müəllimliyi, 25 nəfər fizika müəllimliyi, 50 nəfər ibtidai sinif müəllimliyi, 30 nəfər məktəbəqədər təhsil, 25 nəfər riyaziyyat müəllimliyi, 30 nəfər riyaziyyat və informatika müəllimliyi, 20 nəfər xarici dil müəllimliyi (ingilis dili üzrə), 30 nəfər təhsildə sosial-psixoloji xidmət) qəbulu planlaşdırılıb.

## Şamaxı filialı

Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin 26 noyabr 2015-ci il tarixli Sərəncamı ilə AMİ və onun filialları ilə birgə Şamaxı filialı da Azərbaycan Dövlət Pedaqoji Universitetinin tabeliyinə verilmişdir.

2015/16-cı tədris ilində filiala 140, 2016/17-ci tədris ilində 124, 2017/18-ci tədris ilində 108, 2018/19-cu tədris ilində 119 tələbə qəbul olunmuşdur. Filialda təhsil alan tələbələrin ümumi sayı 2015/16-cı tədris ilində 555, 2016/17-ci tədris ilində 539, 2017/18-ci tədris ilində 513, 2018/19-cu tədris ilində 518, 2019/20-ci tədis ilində 523, 2020/21-ci tədris ilində 540 olmuşdur.











| İxtisas | Plan | | Qəbul | | Dövlət sifarişli | | Ödənişli | |
|---|---|---|---|---|---|---|---|---|
| | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 |
| Riyaziyyat və informatika müəllimliyi | 30 | 30 | 30 | 27 | 5 | 7 | 25 | 20 |
| Tarix və coğrafiya müəllimliyi | 30 | 25 | 24 | 6 | 7 | 3 | 17 | 3 |
| Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | 30 | 30 | 29 | 29 | 4 | 2 | 25 | 27 |
| İbtidai sinif müəllimliyi | 40 | 50 | 39 | 48 | 3 | 2 | 36 | 46 |
| Məktəbəqədər təlim və tərbiyə | 25 | 25 | 21 | 24 | 4 | 3 | 17 | 21 |
| Cəmi | 155 | 160 | 143 | 134 | 23 | 17 | 120 | 117 |







Son illərdə filiala tələbə qəbulu aşağıdakı kimi olmuşdur.

ADPU-nun Şamaxı filialına 2018/19-cu tədris ilində 5 ixtisas üzrə 119 (6-sı dövlət sifarişli, 113-ü ödənişli) , 2019/20-ci tədris ilində 143, 2020/21-ci tədris ilində 134 tələbə qəbul olunmuşdur. 119 tələbədən 2-si, 143 tələbədən 4-ü, 134 tələbədən 1-i 500-dən çox bal toplamışdır. 2018/19 –cu tədris ilində I tədris ilinə qəbul olunanların 19-u, 2019/20-ci tədris ilində 19-u, 2020/21-ci tədris ilində 17-si güzəştli şərtlərdən yararlanan tələbələr (köçkün, şəhid və valideyn himayəsindən məhrum olan) olmuşdur.

2021/22-ci tədris ilində I tədris ilində 210 tələbənin (30 nəfər Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, 25 nəfər fizika müəllimliyi, 50 nəfər ibtidai sinif müəllimliyi, 25 nəfər məktəbəqədər təhsil, 30 nəfər riyaziyyat və informatika müəllimliyi, 25 nəfər tarix və coğrafiya müəllimliyi, 25 nəfər təhsildə sosial-psixoloji xidmət) qəbulu nəzərdə tutulub. Filialda fizika və təhsildə sosial-psixoloji xidmət ixtisaslarına ilk dəfə qəbul həyata keçiriləcək.

## Cəlilabad filialı

Azərbaycan Respublikasının Prezidenti İ.Əliyevin 2015-ci il 26 noyabr tarixli Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutu ADPU-ya qoşulduğundan onun Cəlilabad filialı da universitetin filialına çevrilmişdir.

2015/16-cı tədris ilində filiala 107, 2017/18-ci tədris ilində 107, 2018/19-cu tədris ilində 122 tələbə qəbul olunmuşdur. 2016/17-ci tədris ilində filiala tələbə qəbulu aparılmamışdır. Filialda təhsil alan tələbələrin ümumi sayı 2015/16-cı tədris ilində 473, 2016/17-ci tədris ilində 358, 2017/18-ci tədris ilində 330, 2018/19-cu tədris ilində 352, 2019/20-ci tədis ilində 385, 2020/21-ci tədris ilində 498 olmuşdur.

Son illərdə filiala tələbə qəbulu aşağıdakı kimi olmuşdur.





Son illərdə filiala tələbə qəbulu aşağıdakı kimi olmuşdur.

| İxtisas | Plan | | Qəbul | | Dövlət sifarişli | | Ödənişli | |
|---|---|---|---|---|---|---|---|---|
| | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 | 2019/20 | 2020/21 |
| Tarix və coğrafiya müəllimliyi | 30 | 30 | 30 | 24 | 6 | 8 | 24 | 16 |
| Azərbaycan dili və ədəbiyyatı müəllimliyi | 40 | 50 | 40 | 50 | 3 | 5 | 37 | 45 |
| İbtidai sinif müəllimliyi | 40 | 50 | 39 | 49 | 2 | 2 | 37 | 47 |
| Məktəbəqədər təlim və tərbiyə | 30 | 30 | 24 | 24 | 2 | 2 | 22 | 22 |
| Cəmi | 140 | 160 | 133 | 147 | 13 | 17 | 120 | 130 |





ADPU-nun Cəlilabad filialına 2018/19-cu tədris ilində 4 ixtisas üzrə 122 (5-i dövlət sifarişli, 117-si ödənişli), 2019/20-ci tədris ilində 133, 2020/21-ci tədris ilində 147 tələbə qəbul olunmuşdur. 122 tələbədən 3-ü, 133 tələbədən 3-ü, 147 tələbədən 3-ü 500-dən çox bal toplamışdır. 2018/19 -cu tədris ilində I tədris ilinə qəbul olunanların 21-1, 2020/21-ci tədris ilində 25-i güzəştli şərtlərdən yararlanan tələbələr (köçkün, şəhid və valideyn himayəsindən məhrum olan) olmuşdur.

2021/22-ci tədris ilində filiala 160 tələbənin (50 nəfər Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, 50 nəfər ibtidai sinif müəllimliyi, 30 nəfər məktəbəqədər təhsil, 30 nəfər tarix və coğrafiya müəllimliyi) qəbulu planlaşdırılıb.

## Azərbaycan Dövlət Pedaqoji Kolleci

1919-cu ildə Bakı Kişi Müəllimləri Seminariyası kimi əsası qoyulan bu təhsil ocağı fəaliyyəti dövründə müxtəlif adlar altında fəaliyyət göstərib. 1936- 1999-cu illərdə böyük Azərbaycan şairi M.Ə.Sabirin adını daşıyıb. 13 iyun 2000-ci ildə Azərbaycan Dövlət Pedaqoji Kolleci adlandırılıb. 4 mart 2016-cı ildə Bakı Sənaye Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Kollecinə birləşdirilib. 2016-cı ilin aprelində Azərbaycan Dövlət Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdinə verilib. Kollecə hüquq üzrə fəlsəfə doktoru, ***dos.Qulu Novruzov*** direktor təyin olunub.







**Qulu Novruz oğlu Novruzov**
*gömrük xidməti general-mayoru,*
*hüquq elmləri üzrə fəlsəfə doktoru*
*(1970)*

*1970-ci il martın 7-də Naxçıvan Muxtar Respublikasının Nehrəm kəndində anadan olub. 1977-1987-ci illərdə Nehrəm kənd orta məktəbində oxuyub. 1988–1990-ci illərdə Moskva Hərbi Dairəsində hərbi xidmətdə olub. 1992-1997-ci illərdə BDU-nun Beynəlxalq hüquq və beynəlxalq münasibətlər fakültəsində təhsil alıb. Universiteti fərqlənmə diplomu ilə bitirib. 1997-1999-cu illərdə təhsil aldığı fakültənin dekanlığında metodist vəzifəsində çalışıb.1999-cu ildən Təhsil Nazirliyində müxtəlif vəzifələrdə və həm də Bakı Dövlət Universitetində müəllim kimi çalışıb. Fransanın Nitsa Sofia-Antipolis, ABŞ-ın Minnesota və Kanzas universitetlərində, Beynəlxalq Əmək Təşkilatının Turindəki təlim mərkəzində, həmçinin Yapon Beynəlxalq Əməkdaşlıq Agentliyinin və Koreya Beynəlxalq Əməkdaşlıq Agentliyinin müvafiq ölkələrdə təşkil etdiyi müxtəlif təlim proqramlarının iştirakçısı olub. 2005-2006-cı illərdə Amerika Beynəlxalq Təhsil Şurasının həyata keçirdiyi Ali Məktəb Müəllimlərinin İnkişafı Proqramı (JFDP) üçün təşkil edilmiş müsabiqənin qalibi kimi ABŞ-ın Vaşinqton Universitetinin Hüquq məktəbində qonaq alim statusunda proqram kursunu tamamlamış və tədqiqat aparmışdır.*

*Avropa Şurası və Avropa Birliyinin təhsillə bağlı Almaniya, Fransa, Belçika, Latviya, Norveç, Rumıniya, Rusiyada və digər ölkələrdə keçirilmiş müxtəlif konfranslarında iştirak etmişdir. Müxtəlif ölkələr və beynəlxalq təşkilatlarla ikitərəfli əməkdaşlıq üzrə hökumətlərarası və hökumət işçi qrupunun tərkibində təhsil üzrə ekspert kimi çalışmışdır. 2003-2010-cu illərdə Avropa Şurasının Təhsil üzrə Rəhbər Komitəsinin, 2007-2011-ci illərdə isə İSESCO İcraiyyə Komitəsinin üzvü kimi Azərbaycanı təmsil etmişdir.*

*2000-2007-ci illərdə Azərbaycan Respublikası Təhsil Nazirliyində Xaricdə təhsil alan tələbələr üzrə iş sektorunun müdiri, 2007-2010-cu illərdə Beynəlxalq əlaqələr şöbəsinin müdiri, 2011-2013-cü illərdə Təhsil nazirinin müavini vəzifələrində çalışmışdır 2013-2016-cı illərdə Təhsil Problemləri İnstitutunun (indiki Təhsil İnstitutu) direktoru, 2016-2018-ci illərdə isə ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin direktoru vəzifəsində çalışıb. Hər iki müəssisəyə rəhbərliyi dövründə radikal islahatların müəllifi kimi tanınıb.*

*30 oktyabr 2018-ci ildə Azərbaycan Respublikası Prezidentinin Sərəncamı ilə Dövlət Gömrük Komitəsi Akademiyasının rəisi vəzifəsinə təyin edilmişdir. Gömrük xidmət general-mayorudur. 2010-cu ildə beynəlxalq hüquq sahəsində hüquq üzrə fəlsəfə doktoru elmi dərəcəsini almışdır. 30-dan artıq elmi məqalə, bir monoqrafiya, bir metodik vəsait, bir dərs vəsaiti və bir neçə proqramın müəllifidir.*







2016-cı ildə Azərbaycan Dövlət Pedaqoji Kolleci inkişafının yeni mərhələsinə qədəm qoydu. Kollecin həyatında islahatlar dövrü kimi səciyyələndirilən həmin dövrdən başlayaraq təhsilverənlərin peşəkarlığının artırılması, təhsilalanların və onların valideynlərinin məmnunluğunun təmin edilməsi məqsədilə nüfuzlu tərəfdaş qurumlarla (Azərbaycan Respublikası yanında Bilik Fondu, Təhsil İşçilərinin Peşəkar İnkişafı İnstitutu, Dini Qurumlar üzrə Dövlət Komitəsi, Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsi və müxtəlif qeyri-hökumət təşkilatları) çoxsaylı layihələr həyata keçirildi. Kollecin inkişaf strategiyası hazırlandı və yeni hədəflər müəyyənləşdirildi. Beynəlxalq təcrübənin öyrənilməsində mühüm əhəmiyyət daşıyan seminar və treninqlərdə müəllimlərin iştirakı təmin edildi. Akademik Ş.Amonaşvilinin iştirakı ilə kollecdə Humanist Pedaqogika Mərkəzi yaradıldı.

2017-ci ildə kollecdə Tailant Texnoloji Elmi-Tədqiqat İnstitutunun direktoru, professor Art Onq Jumsainin "Mənəvi-əxlaqi dəyərlərin təhsilə tətbiqi" mövzusunda 2 günlük beynəlxalq seminar keçirildi. 2017/18-ci tədris ilində beynəlxalq əməkdaşlıq çərçivəsində kollecin bir qrup müəllim və tələbələri Türkiyənin Bilkent Universitetinin "Türkiye Türkçesi Hizmet İçi Eğitim Kursu"nda kolleci uğurla təmsil etdi.

Dos.Qulu Novruzov Dövlət Gömrük Akademiyasının rəisi vəzifəsinə irəli çəkildiyindən həmin vəzifəyə 22 noyabr 2018-ci ildə dos.*İsrayıl İsa oğlu İsgəndərov* təyin olundu.

2019/20-ci tədris ilindən başlayaraq ADPK-nın strukturu ADPU-nun strukturuna, tədris planları və proqramları ADPU-nun müvafiq ixtisaslarının tədris planları və proqramlarına uyğunlaşdırıldı, subbakalavr pilləsindən bakalavr pilləsinə keçid



üçün zəmin yaradıldı, kollecdə tyutor, tibbi və psixoloji xidmət formalaşdırıldı.

"Mektebgushesi.az" saytının keçirdiyi və 19 mindən artıq respondentin iştirak etdiyi "Hansı kollecdə yay imtahan sessiyası şəffaf keçirilir" mövzusunda virtual sorğunun nəticəsinə görə 2018/ 19-cu tədris ilində ikinci dəfə, 2020/2021-ci tədris ilində 3-cü dəfə Azərbaycan Dövlət Pedaqoji Kolleci I yerə layiq görüldü.



Kollecdə məktəbəqədər təhsildə korreksiyaedici təlim, məktəbəqədər təlim və tərbiyə, peşə təlimi, texnologiya müəllimliyi, fiziki tərbiyə müəllimliyi, ailə və ev təhsili, təsviri incəsənət müəllimliyi və sosial iş ixtisasları üzrə mütəxəssislər hazırlanır.

2018/19-cu tədris ilində kollecin məzunları MİQ imtahanlarında yüksək nəticələr göstərmişlər. İbtidai sinif müəllimliyi ixtisasının 2 məzunu 58, 5 nəfəri 50 -dən çox, 8 nəfəri 40-50 bal arası nəticə göstərmişdir. Texnologiya müəllimliyi ixtisası üzrə 1 məzun 55 balla respublika ikincisi olmuşdur.

Kollecdə peşə təlimi, texnologiya müəllimliyi, fiziki tərbiyə müəllimliyi, təsviri incəsənət müəllimliyi, məktəbəqədər təlim və tərbiyə, məktəbəqədər təhsildə korreksiyaedici təlim, ailə və ev təhsili, sosial iş ixtisasları üzrə subbakalavr hazırlığı həyata keçirilir.

Pedaqoji Kollecə ümumi orta təhsil bazasından (9-illik) qəbul olunan tələbələr (2016-2021-ci illər)

| № | İxtisaslar | 2016/17 | 2017/18 | 2018/19 | 2019/20 | 2020/21 |
|---|---|---|---|---|---|---|
| 1 | Texnologiya müəllimliyi | 95 | 133 | 108 | 129 | 120 |
| 2 | Peşə təlimi | 217 | 270 | 223 | 210 | 168 |
| 3 | Peşə təlimi (rus bölməsi) | - | 9 | - | - | |
| 4 | Fiziki tərbiyə müəllimliyi | 19 | 27 | 49 | 40 | 40 |
| 5 | Ailə və ev təhsili | 96 | 85 | 55 | 58 | 58 |
| 6 | Ailə və ev təhsili (rus bölməsi) | - | 12 | 15 | 11 | 15 |
| 7 | Məktəbəqədər təlim və tərbiyə | 97 | 147 | 100 | 100 | 100 |
| 8 | Məktəbəqədər təlim və tərbiyə (rus bölməsi) | 25 | 34 | 20 | 20 | 19 |
| 8 | Təsviri incəsənət müəllimliyi | 24 | 22 | 63 | 49 | 50 |
| 9 | Məktəbəqədər təhsildə korreksiyaedici təlim | - | 50 | 47 | 49 | 59 |
| 10 | Məktəbəqədər təhsildə korreksiyaedici təlim (rus bölməsi) | - | - | 17 | 11 | 19 |
| 11 | Sosial iş | - | - | - | - | 19 |
| 12 | İbtidai sinif müəllimliyi | 19 | 27 | - | - | - |
| 13 | İbtidai sinif müəllimliyi (rus bölməsi) | - | 25 | - | - | - |
| Cəmi: | | 592 | 841 | 697 | 677 | 667 |

Pedaqoji Kollecə tam orta təhsil bazasından (11-illik) qəbul olunan tələbələr (2016-2021-ci illər)

| № | İxtisaslar | 2016/17 | 2017/18 | 2018/19 | 2019/20 | 2020/21 |
|---|---|---|---|---|---|---|
| 1 | Texnologiya müəllimliyi (ə) | 25 | 58 | 69 | 57 | 60 |
| 2 | Texnologiya müəllimliyi (q) | - | - | - | - | - |
| 3 | Peşə təlimi (ə) | - | - | - | - | - |
| 4 | Peşə təlimi (q) | - | - | 38 | 9 | 10 |
| 3 | Fiziki tərbiyə müəllimliyi(ə) | 20 | 38 | 49 | 39 | 40 |
| 5 | Fiziki tərbiyə müəllimliyi(q) | - | - | - | - | - |
| 6 | Ailə və ev təhsili Ə) | 50 | 30 | 49 | 40 | 40 |
| 7 | Ailə və ev təhsili (q) | - | - | 18 | 10 | 10 |
| 8 | Ailə və ev təhsili (rus) (ə) | - | 9 | - | 17 | 20 |
| 9 | Ailə və ev təhsili (rus) (q)) | - | - | - | - | - |
| 10 | Məktəbəqədər təlim və tərbiyə (ə) | 25 | 60 | 95 | 78 | 99 |
| 11 | Məktəbəqədər təlim və tərbiyə (q) | - | - | 20 | 10 | 10 |
| 12 | Məktəbəqədər təlim və tərbiyə (rus) (ə) | - | 20 | 25 | 20 | 20 |
| 13 | Məktəbəqədər təlim və tərbiyə (rus)(q) | - | - | 15 | 15 | 15 |
| 14 | Təsviri incəsənət müəllimliyi (ə) | - | - | - | 18 | 19 |
| 15 | Təsviri incəsənət müəllimliyi (q) | - | - | - | - | - |
| 16 | Məktəbəqədər təhsildə korreksiyaedici təlim (ə) | - | - | 44 | 39 | 50 |
| 17 | Məktəbəqədər təhsildə korreksiyaedici təlim (q) | - | - | 15 | 10 | 10 |
| 18 | Məktəbəqədər təhsildə korreksiyaedici təlim (rus) (ə) | - | 25 | 19 | 17 | 20 |
| 19 | Məktəbəqədər təhsildə korreksiyaedici təlim (rus) (q) | - | - | - | - | - |
| 20 | Sosial iş (ə) | - | - | - | - | 20 |
| 21 | Sosial iş (q) | - | - | - | - | - |
| Cəm: | | 120 | 240 | 456 | 379 | 443 |

Ümumiyyətlə, son 5 ildə Pedaqoji Kollecdə tələbələrin inkişaf dinamikası aşağıdakı kimi olmuşdur.

| Tədris illəri | Ümumi orta təhsil bazasından qəbul olunanlar | Tam orta təhsil bazasından qəbul olunanlar | Qəbul olunanların sayı | Ümumi tələbələrin sayı |
|---|---|---|---|---|
| 2016/17 | 592 | 120 | 712 | 3836 |
| 2017/18 | 841 | 240 | 1081 | 3185 |
| 2018/19 | 697 | 456 | 1153 | 3704 |
| 2019/20 | 677 | 379 | 1056 | 4047 |
| 2020/21 | 667 | 443 | 1110 | 4454 |

## ADPU-nun Fəxri doktor və professorları

ADPU Elmi Şurasının 30 yanvar 2019-cu il tarixli iclasında "ADPU-nun Fəxri doktoru" və "ADPU-nun Fəxri professoru" adlarının verilməsi, "Şərəf kitabı"nın hazırlanması və auditoriyalara fəxri adların verilməsi haqqında Əsasnamə təsdiq edildi. Əsasnaməyə görə, "ADPU-nun Fəxri doktoru", "ADPU-nun Fəxri professoru" fəxri adı elmin, təhsilin və mədəniyyətin inkişafında xüsusi xidmətləri olan tanınmış elm, mədəniyyət, ictimai-siyasi xadimlərə verilən fəxri elmi dərəcə və fəxri elmi addır. "ADPU-nun Fəxri professoru" adı bir qayda olaraq elmi adı və elmi dərəcəsi olan şəxslərə, "ADPU-nun fəxri doktoru" adı isə elmi adı və elmi dərəcəsi olmayan şəxslərə də verilə bilər. Fəxri adlar Pedaqoji Universitetin əməkdaşı olmayan, təhsilin, elmin, texnikanın, sənayenin, idarəetmənin, beynəlxalq münasibətlərin inkişafında, sülhün qorunması və möhkəmlənməsində xüsusi xidmətləri olan şəxslərə verilir.

Fəxri elmi ad və elmi dərəcənin "Əsasnamə"si 2019-cu ildə təsdiq edilsə də, indiyə kimi xarici ölkələrin 6 nəfər tanınmış elm, mədəniyyət və ictimai-siyasi xadiminə "ADPU-nun Fəxri doktoru" elmi adı verilmişdir. İlk "ADPU-nun Fəxri doktoru" adı 1994-cü ildə görkəmli cərrah və ədəbiyyatşünas ***Cavad Heyətə,*** 1995-ci ildə ***Otto Ernst Kelmə***, 1996-cı ildə İslam Azad Universitetinin təsisçisi və rektoru, professor ***Abdullah Cəfərəli Caspiyə***, 2007-ci ildə Hacəttəpə Universitetinin rektoru, professor ***Tunçalp Özgenə***, 2011-ci ildə



*T.Özgenə Fəxri doktor adı verilərkən*



*A.A.Marqaya Fəxri doktor adı verilərkən*

Rumıniya Mədəniyyət Universitetinin prezidenti, görkəmli ictimai-siyasi xadim ***Andrei Alexandru Marqaya***, 2013-cü ildə Qazi Universitetinin Gözəl sənətlər fakültəsinin dekanı, professor ***Alev Çakmakoğlu Kuruya*** verilmişdir.



*C.Heyət*



*A.C.Caspi*



*T.Özgen*



*A.Marqa*



*A.Ç.Kuru*

## İxtisaslaşdırılmış auditoriyalar

Universitetdə ixtisaslaşdırılmış auditoriyaların yaradılmasına, həmin auditoriyalara fəxri adların verilməsinə xüsusi diqqət yetirilir. ADPU Elmi Şurasının 30 yanvar 2019 -cu il tarixli iclasında təsdiq olunan "ADPU-da auditoriyalara fəxri adların verilməsi haqqında Əsasnamə"nin tələblərinə görə universitetin inkişafında müstəsna xidmətləri olmuş alimlərin, tanınmış məzunların, təhsilin, elmin, texnikanın, sənayenin, idarəetmənin, beynəlxalq münasibətlərin inkişafında, sülhün qorunması və möhkəmlənməsində xüsusi xidmətləri olan şəxslərin adının əbədiləşdirilməsi məqsədilə universitetin ayrı-ayrı auditoriyalarına onların adları verilir.

Əgər əvvəllər yalnız Filologiya fakültəsində ***Cəfər Xəndan*** adına auditoriya fəaliyyət göstərirdisə, son illərdə Kimya-biologiya fakültəsində akademik ***Yusif Məmmədəliyev***, Riyaziyyat fakültəsində akademik ***Zahid Xəlilov***, Fizika fakültəsində akademik ***Həsən Abdullayev*** və SSRİ PEA-nın müxbir üzvü ***Abasqulu Abaszadə*** adına ixtisaslaşdırılmış auditoriyalar yaradılmış və zəruri avadanlıqlarla təchiz edilmişdir.

Auditoriyalarının açılışında və ADPU-da bütün elm sahələri üzrə keçirilmiş olimpiadaların qaliblərinin təltifedilmə mərasimində AMEA-nın prezidenti, akademik Akif Əlizadə, Təhsil naziri Ceyhun Bayramov, Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun icraçı direktoru Elçin Babayev, AMEA-nın Riyaziyyat-Mexanika İnstitutunun direktoru, AMEA-nın müxbir üzvü, prof.Misir Mərdanov və b. iştirak ediblər.

## Akademiklər Yusif Məmmədəliyev və Zahid Xəlilov adına ixtisaslaşdırılmış auditoriyaların açılışı





ADPU-nun tanınmış məzunları və keçmiş əməkdaşlarının adının əbədiləşdirilməsi məqsədilə fakültə elmi şurasının təşəbbüsü, universitet Elmi Şurasının qərarı və rektorun əmri ilə müvafiq yerdə barelyef vurulur. AMEA-nın müxbir üzvü, filologiya elmləri doktoru, professor ***Afad Qurbanovun*** 90 illik yubileyinə həsr olunmuş Beynəlxalq konfrans zamanı (7 iyun 2019-cu il) Filologiya fakültəsinin Azərbaycan dilçiliyi kafedrasının önünə prof.Afad Qurbanovla bağlı xatirə lövhəsi vurulmuşdur. "Xatirə lövhəsi"nin açılışında ADPU-nun rektoru, professor Cəfər Cəfərov, Təhsil nazirinin müavini Məhəbbət Vəliyeva, Türk Dil Qurumunun sabiq sədri, Hacəttəpə Universitetinin Sözlükçülük Mərkəzinin sədri, professor Şükrü Halük Akal, AMEA-nın Humanitar Elmlər Bölməsinin akademik-katibi, Əlyazmalar İnstitutunun direktoru, akademik Teymur Kərimli, Litvanın ölkəmizdəki səfiri Valdas Lastauskas, İ.Cavaxişvili adına Tbilisi Dövlət Universitetinin Türk dili və ədəbiyyatı kafedrasının müdiri, professor Marika Jikia, Serbiya Elmlər və İncəsənət Akademiyasının Serb Dili İnstitutunun İdarə Heyətinin üzvü, professor Marija Dindic və Türkiyə, Rusiya, Gürcüstan, Finlandiyadan beynəlxalq konfransda iştirak edən nümayəndələr iştirak etmişdir.














## ADPU-nun təşkilatçısı, qurucusu və məzunu olan məşhurlar

Böyük zəka sahiblərindən dərs alan universitetin məzunlarının və aspirantlarının əksəriyyəti istedadlı alim, mədəniyyət xadimi, yazıçı və şair kimi məşhurlaşmış, partiya və dövlət xadimi kimi tanınmış, qabaqcıl müəllim kimi ad-san qazanmışdır.

### AMEA-nın həqiqi üzvləri



*Y.Məmmədəliyev*



*Z. Xəlilov*



*H. Abdullayev*



*H.Hüseynov*



*İ.İbrahimov*



*S.Vurğun*



*Ə. Hüseynov*



*M. Rəsulov*



*M.A.Dadaşzadə*



*Ə.Sumbatzadə*


M. Şirəliyev


M. Cəfərov


H.Araslı


F.Qasımzadə


İ.Hüseynov


B. Budaqov


Q. Məmmədov


İ.Həbibbəyli


B. Tağıyev


C. Abdinov


İ. Hacıyev


V. Abbasov

## AMEA-nın müxbir üzvləri


Ə.Dəmirçizadə


M.Mövsümzadə


M,Cavadov


Ş.Məmmədov


M.Ramazanzadə


C. Zülfüqarlı


A.Qurbanov


*Z.Budaqova*


*O. Həsənli*


*H.Səfərli*


*Q.Qədirzadə*

## SSRİ PEA-nın həqiqi üzvü


*M. Mehdizadə*

## SSRİ PEA-nın müxbir üzvləri


*A.Abaszadə*


*H. Əhmədov*


*S. İmanov*

## Görkəmli şair və yazıçılar


*Ə.Cavad*


*Ə.Ələkbərzadə*


*M.Rzaquluzadə*


*M.Müşfiq*


*İ.Əfəndiyev*


*İ.Şıxlı*


*S.Rəhimov*


*Q.İlkin*


*Ə.Abbasov*


*M.Rahim*


*M.Dilbazi*


*M.Ələkbərli*


*Z.Xəlilov*


*Z.Cabbarzadə*


*B.Qasımov*


*S.Rəhman*


*M.Hüseyn*


*M.Araz*


*İ.Tapdıq*


*T.Bayram*


*G.Fəzli*


*M.Quluzadə*

**Dövlət xadimləri**


*Ş.Qurbanov*


*F.İbrahimli*

## Görkəmli bəstəkarlar və musiqiçilər


*S.Rüstəmov*


*O.Rəcəbov*


*N.Mirməmmədli*


*Ə.Sadıqov*

## Məzun generallarımız


*General-palkovnik Ə.Nağıyev*


*General-mayor R.Musayev*


*General-mayor R.Əliyev*


*General-mayor V.Əliyev*


*General-leytenant V.Nağıyev*


*General-leytenant R.Mirzeyev*

Universitetin məzunlarından *Yusif Məmmədəliyev, Heydər Hüseynov, Səməd Vurğun, İbrahim İbrahimov, Zahid Xəlilov, Həsən Abdullayev, Məcid Rəsulov, Əşrəf Hüseynov, İsmayıl Hüseynov, Abdulla Qarayev, Əlisöhbət Sumbatzadə, Məmməd Arif Dadaşzadə, Məmmədcəfər Cəfərov, Məmmədağa Şirəliyev, Həmid Araslı, Feyzulla Qasımzadə, Budaq Budaqov, Qərib Məmmədov, Vaqif Abbasov, İsmayıl Hacıyev, Bahadur Tağıyev, Cavad Abdinov* Azərbaycan EA-nın həqiqi üzvü, *Mehdi Mehdizadə SSRİ PEA-nın həqiqi üzvü, Əbdüləzəl Dəmirçizadə, Mövsüm Mövsümzadə, Maqsud Cavadov, Mais Cavadov, Şamxal Məmmədov, Afad Qurbanov, Zərifə Budaqova, Cümşüd Zülfüqarlı, Oruc Həsənli* Azərbaycan EA-nın müxbir üzvü, *Abasqulu Abaszadə, Hüseyn Əhmədov və Sədi İmanov* SSRİ PEA-nın müxbir üzvü seçilmişdir.

1968-1972-ci illərdə fəaliyyət göstərən ADPİ-nin Naxçıvan filialının məzunlarından *İsa Həbibbəyli* AMEA-nın həqiqi üzvü və vitse-prezidenti, *Hacı Qadir Qədirzadə* və *Hacıfəxrəddin Səfərli* AMEA-nın müxbir üzvləri seçilmişdir.

1924-1931-ci illərdə Pedaqoji Universiteti AMEA-nın həqiqi üzvləri *Yusif Məmmədəliyev, Həmid Araslı, Feyzulla Qasımzadə,* müxbir üzvləri *Maqsud Cavadov, Cümşüd Zülfüqarlı, SSRİ PEA-nın həqiqi üzvü Mehdi Mehdizadə, müxbir üzvü Abasqulu Abaszadə* ilə bərabər, Azərbaycan SSR

Xalq maarif komissarı (1946-1952), Azərbaycan SSR Mədəniyyət naziri (1955-1956), ADPİ-nin direktoru (1944) vəzifələrində işləmiş *Məmməd Ələkbərov*, şair, tənqidçi, ədəbiyyatşünas, filologiya elmləri doktoru, professor, ADPİ-nin (1948-1950) və ADU-nun rektoru (1950-1954) işləmiş *Cəfər Hacıyev (Cəfər Xəndan),* Azərbaycan SSR xalq yazıçısı *Əbülhəsən Ələkbərzadə*, şair, tərcüməçi *Əhməd Cavad,* nasir, şair, tərcüməçi *Mikayıl Rzaquluzadə,* Azərbaycan SSR Xalq şairi *Məmməd Rahim,* Azərbaycan SSR xalq şairi *Mirvarid Dilbazi,* yazıçı, tənqidçi, filosof, Azərbaycan Dövlət Universitetinin rektoru (1934-1935) *Məmmədkazım Ələkbərli,* görkəmli şair *Mikayıl Müşfiq,* kimya elmləri doktoru, professorlar *Murtuza Əhmədli* və *Şixbala Əliyev,* yazıçı, şair, dramaturq, nasir, jurnalist, Azərbaycan SSR əməkdar incəsənət xadimi *Əyyub Abbasov* və b. bitirmişdi.

Fəxrlə qeyd olunmalıdır ki, Azərbaycan Milli Elmlər Akademiyasını təsis edən 15 nəfərdən 3 nəfəri (*Yusif Məmmədəliyev, Heydər Hüseynov, S.Vurğun*) Azərbaycan Dövlət Pedaqoji Universitetin məzunu, 5 nəfəri müəllimi (*Yusif Məmmədəliyev, Heydər Hüseynov, Aleksandr Qrossheym, Üzeyir Hacıbəyov, Mir Əsədulla Mirqasımov*), 3 nəfəri isə prezidenti (*Yusif Məmmədəliyev, Zahid Xəlilov, Həsən Abdullayev*) olmuşdur. Akademik Yusif Məmmədəliyev iki dəfə (1947-1951 və 1958-1961) Azərbaycan Milli Elmlər Akademiyasına rəhbərlik etmişdir.

1931-1941-ci illərdə institutun məzunları arasında Azərbaycan EA-nın həqiqi üzvləri *Səməd Vurğun, Zahid Xəlilov, Həsən Abdullayev, İbrahim İbrahimov, Əşrəf Hüseynov, Məcid Rəsulov, Məmmədağa Şirəliyev, Məmmədcəfər Cəfərov*, Azərbaycan EA-nın müxbir üzvləri *Əbdüləzəl Dəmirçizadə, Abbas Zamanov, Şamxal Məmmədov*, elmlər doktoru, professorlar *Muxtar Hüseynzadə, Əli Sultanlı, Səlim Cəfərov, Məmmədhüseyn Təhmasib, Mirzağa Quluzadə, Hidayət Əfəndiyev, Ağaməmməd Abdullayev, Əkbər Ağayev, Nazim Axundov, Mehdixan Vəkilov, Nəzər Paşayev, Məmmədəli Şərifli, Mərdan Muradxanov, Novruz Hüseynov, Nurəddin Kərəmov, Aben Kərimov, Midhəd Ağamirov, İslam Əlizadə, Püstəxanım Rzazadə, Ələkbər Kərimov, Allahverdi Verdizadə, Abbas Misgərli*, görkəmli şair və yazıçılar *İlyas Əfəndiyev, İsmayıl Şıxlı, Zeynal Xəlilov, Zeynal Cabbarov, Böyükağa Qasımov, Qılman İlkin, Süleyman Rəhimov, Sabit Rəhman*, görkəmli dövlət xadimi, yazıçı, dramaturq, şair, filoloq-alim *Şıxəli Qurbanov*, bəstəkar, Azərbaycan SSR Xalq artisti *Səid Rüstəmov* və b. vardı.

Azərbaycan Dövlət Pedaqoji İnstitutunu 1945-1980-ci illərdə bitirənlərin arasında AMEA-nın həqiqi üzvləri *Cavad Abdinov, Bahadur Tağıyev, Budaq Budaqov, Qərib Məmmədov, İsmayıl Hacıyev, Vaqif Abbasov,* AMEA-nın müxbir üzvü *Oruc Həsənli*, SSRİ PEA-nın müxbir üzvü *Sədi İmanov* və onlarla elmlər doktoru, professorlar, görkəmli şair və yazıçılar (*Məmməd Araz, İlyas Tapdıq, Tofiq Bayram, Məstan Əliyev, Kələntər Kələntərov* və b.), görkəmli bəstəkar, Əməkdar incəsənət xadimi Oqtay Rəcəbov olmuşdur.

Dövlət Mükafatı laureatı, kimya elmlər doktoru Püstəxanım Rzazadə, Dövlət xadimi, Azərbaycan Milli Məclisinin sədr müavini, tarix elmləri doktoru, professor *Fəzail İbrahimli,* SSRI Xalq müəllimləri *Zahid Şöyübov, Cəbrayıl Zəkiyev və İsrafil Şükürov,* Sosialist Əməyi Qəhrəmanları *Səfa İmanov, Zərbəli Səmədov və Rüstəm Səfərəliyevin,* Sovet İttifaqı Qəhrəmanları *Mehdi Hüseynzadə, Xıdır Mustafayev, Fariz Səfərov və Səlahəddin Kazımov* Pedaqoji Universitetin məzunları olmuşdur.

Dövlət Təhlükəsizlik Xidmətinin rəisi, general-polkovnik *Əli Nağıyev*, polis general-mayoru *Rasim Musayev*, general-mayor *Rasim Əliyev*, general-mayor *Vidadi Əliyev*, Azərbaycan Respublikası Dövlət Miqrasiya Xidməti rəisinin birinci müavini, general-leytenant *Vəli Nağıyev*, Əməkdar incəsənət xadimi, Əməkdar müəllim, pedaqoji elmlər doktoru, professor *Oqtay Rəcəbov,* Xalq artisti *Ənvər Sadıqov*, Əməkdar incəsənət xadimi *Nailə Mirməmmədli* ADPU-nun məzunları olmuşdur.

ADPU-nun onlarla məzunu ayrı-ayrı elm sahələri üzrə elmlər doktoru elmi dərəcəsinə və professor elmi adına, Əməkdar elm xadimi və Əməkdar müəllim fəxri adlarına layiq görülmüş, respublikanın qabaqcıl müəllimləri kimi ad-san qazanmışdır.

## Pedaqoji Universitetin tələbə və məzunlarının Vətən müharibəsində iştirakı

ADPU-nun tələbə və məzunları həm birinci, həm də ikinci Vətən müharibəsinin fəal iştirakçılarından olmuş, düşmənə qarşı ölüm-dirim savaşında əsl qəhrəmanlıq və şücaət göstərmişlər. Birinci Vətən müharibəsi 1988-ci ildən 1994-cü ilin mayına kimi davam etmişdir. Azərbaycanın ayrılmaz hissəsi olan Qarabağ bölgəsində Ermənistan tərəfindən dəstəklənən Qarabağın etnik ermənilərinin əksəriyyətinin iştirakı ilə baş verən etnik və ərazi münaqişəsi sonralar elan edilməmiş müharibəyə çevrildi. Döyüş əməliyyatlarında 11557 Azərbaycan hərbçisi şəhid oldu, 1 milyona yaxın azərbaycanlı öz ata-baba torpağından didərgin düşdü. Azərbaycan ordusu Ağdam şəhəri uğrunda gedən döyüşlərində və habelə 1994-cü ilin qış-yaz aylarında Kəlbəcəri geri almaq üçün təşkil edilmiş hücum əməliyyatlarında xeyli itki verdi. Qeyri bərabər döyüşdə Azərbaycan oğulları vətən torpağını canları, qanları bahasına qorudular, sinələrini düşmən gülləsinə sipər etdilər. Həmin döyüşlərdə şəhid tələbələrimiz Mirələkbər İbrahimov (1961-1992), Mətləb Quliyev (1959-1992), A.Rzayev (1968-1993), Hilal Ələkbərov (1968-1992), İ.Salıfov (1967-1992), N.Qasımov (1961-1992), S.Abbasov (1966-1992), V.İsmayılov (1968-1993), İ.Əsədov (1967-1992), E.Qədirov (1961-1994), Ehtiram Hüseynov (1972-1992), İ.İsmayılov (1967-1995), V.Bünyatov (1959-1992), M.Kərimov (1967-1992), N.Abdullayev (1967-1995) və İ.Allahyarov (1961-1994) şəhidlik zirvəsinə yüksəlməklə, adlarını millətimizin mərdlik, mübarizlik və qəhrəmanlıq tarixinə qızıl hərflərlə yazdılar.

Şəhid məzunlarımız ***Mirələkbər İbrahimov***, ***Mətləb Quliyev, Şakir Salahov*** Qarabağ uğrunda gedən döyüşlərdəki şücaətinə görə ***"Azərbaycanın Milli Qəhrəmanı"*** adına layiq görüldü, ***Mürşüd Məmmədov və Malik Bayramov*** isə ***"Azərbaycan bayrağı"*** ordeni ilə təltif edildilər.



### *Mirələkbər Mirələsgər oğlu İbrahimov*
### *Azərbaycanın Milli Qəhrəmanı*
### *(1961-1994)*

*30 sentyabr 1961-ci ildə Qərbi Azərbaycanın Vedibasar mahalının Xalisa kəndində anadan olub. İbtidai təhsilini doğma kəndlərində alıb. Ailəsinin Bakıya köçməsi ilə əlaqədar olaraq 1978-ci ildə Bakı şəhərindəki 158 saylı orta məktəbi bitirib. 1982-1986-cı illərdə V.İ.Lenin adına ADPİ-nin İbtidai hərbi və fiziki təlim fakültəsində təhsil alıb. Bakı şəhərindəki 153 saylı orta məktəbdə ibtidai hərbi hazırlıq müəllimi işləyib. Könüllü olaraq cəbhəyə gedib.1993-cü ildə yeni yaradılan Yasamal taboruna komandir təyin edilib. Mirələkbər öz taboru ilə Füzuli rayonunun Kürdmahmudlu, Aşağı Seyidəhmədli kəndləri uğrunda gedən döyüşlərdə qəhrəmancasına vuruşub. 5 mart 1994-cü ildə işğal edilmiş kəndlərimizi düşməndən azad edərkən qəhrəmanlıqla şəhid olub. Azərbaycan Respublikası Prezidentinin 16 sentyabr 1994-cü il tarixli 203 saylı Fərmanı ilə kapitan İbrahimov Mirələkbər Mirələsgər oğlu ölümündən sonra "Azərbaycanın Milli Qəhrəmanı" adına layiq görülüb. Bakı şəhərinin Şəhidlər xiyabanında dəfn edilib.153 saylı orta məktəb onun adını daşıyır.*

2020-ci ilin sentyabrın 27-də əks-hücumla başlanan ikinci Vətən müharibəsi cəmi 44 gün çəkdi. Bu müddətdə müzəffər Azərbaycan ordusu Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə Ermənistan ordusuna amansız zərbələr vuraraq zəfər salnaməsi yazdı, qısa bir müddətdə "məğlubedilməz erməni ordusu" mifini dağıtdı və Ermənistan hakimiyyətini təslim aktı imzalamağa vadar etdi. Azərbaycan əsgəri öz şücaəti ilə millətin psixologiyasını dəyişdi, xalqının qürurunu, mənliyini və şərəfini özünə qaytardı. Milli qürur simvoluna çevrilən Şuşa şəhərinin azad edilməsindən sonra İlham Əliyev, Rusiya Prezidenti Vladimir Putin və Ermənistanın baş naziri Nikol Paşinyan arasında 10 noyabr 2020-ci il, saat 00:00-dan etibarən bütün döyüş əməliyyatlarını dayandıran atəşkəs bəyanatı imzalandı. Bəyanata əsasən, Azərbaycan müharibə zamanı işğaldan azad etdiyi ərazilərə nəzarəti əlində saxladı. Ermənistan isə işğal altında olan digər ətraf əraziləri Azərbaycana qaytardı. Azərbaycan, həmçinin Türkiyə və İranla həmsərhəd olan Naxçıvana dəhliz əldə etdi. Təxminən 2000 rus əsgəri Ermənistan və Dağlıq Qarabağ arasındakı Laçın dəhlizi boyunca ən azı 5 il müddətinə sülhməramlı qüvvələr olaraq yerləşdirildi.

44 günlük Vətən müharibəsində yurdumuzun yüzlərlə oğulları şəhidlik zirvəsinə ucalaraq bizə qələbə bəxş etdilər. Onların arasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin tələbə və məzunları da ön sıralarda idi. Tarixə "dəmir yumruq əməliyyatı" adı ilə düşən bu müharibədə ADPU-nun tələbə və məzunlarından 11-i şəhidlik zirvəsinə yüksəldi:

1.Tahirov Firdovsi Balaxan oğlu - Tarix və coğrafiya fakültəsi

2.Baş leytenant Əzizov Elgün Elman oğlu - ADPU-nun Şamaxı filialı

3.Leytenant Nəbiyev Orxan Rza oğlu - ADPU-nun Şamaxı filialı

4.Baxışova Arəstə Kərim qızı - Azərbaycan Dövlət Pedaqoji Kolleci ( II Qarabağ müharibəsinin ilk xanım şəhidi)

5.Lətifov Rəvan Ömür oğlu - Coğrafiya və GÇH fakültəsi

6.Nüsrətli Ceyhun Vaqif oğlu - Kimya və biologiya fakültəsi

7.Ömərov Qoşqar Səxavət oğlu - Riyaziyyat fakültəsi

8.Baş leytenant Abbasov Ağaqardaş İlham oğlu - ADPU-nun Ağcabədi filialı

9.Ağaquliyev İlkin Saməddin oğlu - Azərbaycan Dövlət Pedaqoji Kollecinin məzunu

***Mətləb Kamran oğlu Quliyev***
***Azərbaycanın Milli Qəhrəmanı***
*(1959-1992)*



*9 yanvar 1959-cu ildə Beyləqan rayonunda anadan olub. Beyləqan 3 saylı orta məktəbində və C.Naxçıvanski adına hərbi məktəbdə təhsil alıb. 1981-1985-ci illərdə V.İ.Lenin adına ADPİ-nin İbtidai hərbi və fiziki təlim fakültəsində təhsil alıb. Sumqayıt şəhərindəki 3 saylı məktəbdə hərbi hazırlıq müəllimi kimi pedaqoji fəaliyyətə başlayıb. 1992-ci ildə Daxili İşlər Nazirliyində işə düzələn M.Quliyev polis zabiti kimi torpaqlarımızın azadlığı uğrunda döyüşmək üçün cəbhəyə gedib. Xeyli uğurlu döyüş əməliyyatlarının iştirakçısı olub. 31 avqust 1992-ci ildə Ağdam rayonu ərazisində gedən ağır döyüşlərdə xüsusi qəhrəmanlıq göstərib. Yüksəklikləri ələ keçirən erməni quldurlarını məhv etmək üçün qeyri-bərabər döyüşə atılıb və döyüş sursatları bitənə qədər qəhrəmancasına vuruşub və şəhid olub. Azərbaycan Respublikası Prezidentinin 6 noyabr 1992-ci il tarixli 290 saylı Fərmanı ilə baş leytenant Quliyev Mətləb Kamran oğlu ölümündən sonra "Azərbaycanın Milli Qəhrəmanı" adına layiq görülüb.Bakı şəhərindəki Şəhidlər xiyabanında dəfn edilib. Sumqayıt şəhər 3 saylı məktəb onun adını daşıyır, məktəbin önündə büstü qoyulub. Yaşadığı binanın önünə xatirə lövhəsi vurulub, adına bulaq var.*



### *Şakir Şamil oğlu Salahov*
### *Azərbaycanın Milli Qəhrəmanı*
### *(1966-1992)*

*15 iyun 1966-cı ildə Xocalı rayonunun Cəmilli kəndində anadan olub. 1981-ci ildə Cəmilli kənd səkkizillik məktəbində və həmin kənddəki qiyabi orta məktəbdə təhsil alıb. 1984-1986-cı illərdə hərbi xidmətdə olub. 1986-cı ildən Xankəndi şəhər Daxili İşlər idarəsinin mühafizə şöbəsində xidmətə başlayıb. 1990-cı ildə Yuxarı Qarabağda yaşayan azərbaycanlıların təhlükəsizliyini təmin etmək üçün Azərbaycan Daxili İşlər Nazirliyi Cəmilli kəndində polis bölməsi yaradıb. Ş. Salahov ilk gündən həmin bölmədə fəaliyyətə başlayıb. 1991-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şuşa filialının fizika-riyaziyyat fakültəsinin qiyabi şöbəsinə daxil olub. Kosalar və Cəmilli kəndlərinini mühafizəsində əsl fədakarlıq və qəhrəmanlıq göstərib, düşmənin xeyli canlı qüvvəsini və ağır texnikasını məhv edib. 1992-ci ilin yanvar ayının 28-də ermənilər tərəfindən raketlə vurulan Ağdam - Şuşa marşrutu ilə uçan vertolyotda o da olub. Azərbaycan Respublikasının Prezidentinin 8 oktyabr 1992-ci il tarixli 264 saylı Fərmanı ilə Salahov Şakir Şamil oğluna (ölümündən sonra) "Azərbaycanın Milli Qəhrəmanı" adı verilib.*

*Bərdə şəhərindəki Şəhidlər Xiyabanında dəfn edilmişdir.*

10.Hüseynli Ehtiram Həsən oğlu - ADPU-nun Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsi

11.Nəbiyev Cilingir Azad oğlu - Azərbaycan Dövlət Pedaqoji Kollecinin texnologiya müəllimliyi ixtisasının məzunu.

Tarix və coğrafiya fakültəsinin tarix müəllimliyi ixtisasının məzunu Firdovsi Tahirov ölümündən sonra Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin müvafiq sərəncamları ilə "Vətən uğrunda" və "Cəsur döyüşçü", Təhsilin təşkili və idarə olunması ixtisasının məzunu Rəvan Lətifov "Vətən uğrunda", "Cəsur döyüşçü" "Şuşanın azad olunmasına görə", Kimya və biologiya fakültəsinin 2016-cı il məzunu Ceyhun Nüsrətli "Vətən uğrunda", Riyaziyyat fakültəsinin məzunu Qoşqar Ömərov “Vətən uğrunda", "Füzulinin azad olunmasına görə”, "Xocavəndin azad olunmasına görə", Fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı fakültəsinin məzunu Ehtiram Hüseynli "Vətən uğrunda" "Cəbrayılın azad olunmasına görə", "Qubadlının azad olunmasına görə", Şamaxı filialının Azərbaycan dili və ədəbiyyat ixtisasının məzunu leytenant Orxan Nəbiyev “Vətən uğrunda”, “Döyüşdə fərqlənməyə görə”, Şamaxı filialının Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisası üzrə məzunu baş leytenant Elgün Əzizov “Vətən uğrunda", "Füzulinin azad olunmasına görə", "Xocavəndin azad olunmasına görə", Ağcabədi filialının Azərbaycan dili və ədəbiyyat ixtisasının məzunu Ağaqardaş Abbasov “Vətən uğrunda", "Füzulinin azad olunmasına görə", Azərbaycan Dövlət Pedaqoji Kollecinin məzunu Arəstə Baxışova "Vətən uğrunda", Azərbaycan Dövlət Pedaqoji Kollecinin məzunu İlkin Ağaquliyev "Vətən uğrunda", "Suqovuşanın azad olunmasına görə", ADPU-nun Azərbaycan Dövlət Pedaqoji Kollecinin texnologiya müəllimliyi ixtisasının məzunu Cilingir Nəbiyev "Vətən uğrunda", "Füzulinin azad olunmasına görə", ADPU-nun İncəsənət və fziki tərbiyə fakültəsinin məzunu Elvin Zakirov "Vətən uğrunda" "Xocavəndin azad olunmasına görə" "Füzulinin azad olunmasına görə", "İgidliyə görə" və "Cəbrayılın azad olunmasına görə" medalları ilə təltif edildilər.

Ümumiyyətlə, qələbənin qazanılmasında ADPU ailəsinin 200 nəfər tələbə və məzunu iştirak etmişdir ki, onlardan da 12-i şəhid, 5-i (Rəsulov Elvin, Quliyev Taleh, Hüseynov Murad, Xanışlı Səttərxan, Qəhrəmanlı Hatəm) qazi kimi millətimizin qəhrəmanlıq və şücaət simvoluna çevrilmişdir:

Qazilərimizdən 1 nəfəri Cəlilabad filialının, 2 nəfəri Ağcabədi filialının məzunlarıdır.

## Vətən müharibəsi şəhidlərimiz



*F.Tahirov*



*R.Lətifov*



*C.Nüsrətli*




*Q.Ömərov*



*E.Hüseynli*



*O.Nəbiyev*



*E.Əzizov*



*A.Abbasov*



*A.Baxışova*



*İ.Ağaquliyev*



*Ç.Nəbiyev*



*E.Zakirov*

## Şərəfli yüz il

Azərbaycan Dövlət Pedaqoji Universiteti 100 il ərzində öz missiyasına sadiq qalmış, ölkə üçün 160 mindən çox yüksəkixtisaslı müəllim kadrları hazırlamışdır. Universitet yalnız Azərbaycan üçün deyil, həm də Gürcüstan, Ermənistan və Dağıstandakı Azərbaycan məktəbləri üçün müəllim kadrları hazırlığını həyata keçirmişdir. Mərkəzi Asiya ölkələrindən və Bolqarıstan Respublikasından gələn xeyli gənc də öz ali təhsilini burada almışdır. Sovet hakimiyyəti illərində universitetin sələfi olan V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu İttifaq miqyasında tanınmış elm və təhsil ocağı olmuşdur. Pedaqoji kadr hazırlığı ilə bağlı İttifaq səviyyəli konfransların, elmi sessiyaların və simpoziumların məhz V.İ.Lenin adına ADPİ-də keçirilməsi SSRİ miqyasında bu ali pedaqoji təhsil ocağının nüfuzunun təsdiqi kimi dəyərləndirilməlidir. 1982-ci ildə SSRİ-nin pedaqoji institutlarında Lenin təqaüdü ilə oxuyan tələbələrin elmi-praktik konfransı da ADPİ-də keçirilmişdir. Həmin tədbirin iştirakçısı kimi deyə bilərəm ki, tədbirdə yalnız Lenin təqaüdü ilə oxuyan tələbələr deyil, həm də keçmiş İttifaqda çox yaxşı tanınan görkəmli alimlər iştirak edirdi.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin inkişafının son 50 illik mərhələsi Ulu öndər Heydər Əliyevin və onun siyasi kursunun layiqli davamçısı Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin adı ilə bağlıdır. Universitetin 50 və 60 illik yubileylərinin keçirilməsi Ulu öndər Heydər Əliyevin, 85, 90 və 100 illik yubileylərinin keçirilməsi Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin adı ilə bağlıdır.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 17 aprel 2021 -ci il tarixli ”*Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında*” Sərəncamı bir daha sübut etdi ki, ölkədə yüksəkixtisaslı pedaqoji və elmi-pedaqoji kadr hazırlığı dövlət başçısının diqqət mərkəzindədir.

Bakı Dövlət Universitetinin 100 illik yubiley tədbirində çıxışı zamanı cənab Prezident İlham Əliyev demişdir:”Mən də müəllim olmuşam, ona görə bu peşə mənə yad deyil”. Son illərdə onun rəhbərliyi ilə təhsil sistemində həyata keçirilən bütün işlər, 3 mindən artıq məktəbin tikilməsi, təhsilin maliyyələşdirilməsinin artırılması, idarə edilməsinin təkmilləşdirilməsi və digər islahatlar bütövlükdə təhsilimizin aparıcı qüvvəsi olan müəllimin mövqeyinin gücləndirilməsi üçün möhkəm zəmin yaratmışdır.

Bununla yanaşı, cənab Prezident İ.Əliyev çıxışlarının birində xüsusi vurğulamışdı ki, Azərbaycanın əldə etdiyi bütün nailiyyətlərin əsasında məhz müəllimin gərgin zəhməti və gündəlik fəaliyyəti durur. Azərbaycan müəllimi gənc nəslin vətənpərvərlik ruhunda tərbiyə olunması, azərbaycançılıq məfkurəsinə sadiq və qloballaşan dünyada ölkəmizi layiqincə təmsil etməyə qadir vətəndaş yetişdirilməsində var qüvvəsini əsirgəmir.

”Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında” Sərəncamda cənab Prezident İlham Əliyev Pedaqoji Universitetin pedaqoji və elmi-pedaqoji kadr hazırlığındakı roluna yüksək qiymət vermişdir: ”*Azərbaycan Dövlət Pedaqoji Universiteti ölkəmizin təhsil tarixində xüsusi yer tutan, zəngin ənənələrə malik ali təhsil müəssisələrindəndir. Yarandığı vaxtdan etibarən Universitet üzərinə düşən vəzifələri həmişə layiqincə yerinə yetirmiş, respublikamızla yanaşı, bir sıra digər ölkələr üçün elmi-pedaqoji kadr hazırlanması işini müvəffəqiyyətlə həyata keçirmişdir. Azərbaycanın tanınmış ictimai, elm və mədəniyyət xadimləri arasında Universitetin çox sayda məzunları vardır.*

*İxtisaslaşmış ali təhsil müəssisəsi kimi Azərbaycan Dövlət Pedaqoji Universiteti müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə müstəqil Azərbaycanın inkişafına töhfələrini əsirgəmir. Universitetdə qabaqcıl elmi nailiyyətlərdən, innovativ təlim-tədris texnologiyalarından faydalanmaqla ali təhsilin məzmun və keyfiyyət göstəricilərinin təkmilləşdirilməsi istiqamətində zəruri addımlar atılır”.*

ADPU-nun əməkdaşları 100 illik yubiley təntənələrini yaşamaqdadır. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 17 aprel 2021 -ci il tarixli ”Azərbaycan Dövlət Pedaqoji Univer-

sitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncamına və Təhsil Nazirliyinin 3 may 2021-ci il tarixli əmrinə müvafiq olaraq ADPU-nun rektoru, prof.Cəfər Cəfərov 4 may 2021-ci ildə "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin keçirilməsi barədə" əmr imzalamışdır. Yubiley tədbirlərinin təşkili və həyata keçirilməsi üçün zəruri hazırlıq işlərinin aparılması, o cümlədən nəzərdə tutulmuş tədbirlərin icrasını təmin etmək məqsədilə aşağıdakı tərkibdə Təşkilat komitəsi yaradılmışdır:

**Təşkilat komitəsinin sədri**

Prof.C.Cəfərov- rektor

**Təşkilat komitəsinin sədr müavinləri**

Dos.E.Aslanov- tədris işləri üzrə prorektor

Prof.A.Zamanov- elm və innovasiyalar üzrə prorektor

T.Cəlilov- ümumi işlər üzrə prorektor

Prof.F.Rzayev- sosial və humanitar məsələlər üzrə prorektor

Prof.M.Hüseynova- beynəlxalq əlaqələr üzrə prorektor

**Təşkilat komitəsinin üzvləri**

Ü.Mehdiyev- rektorun müşaviri

Z.Nağıyev- baş hüquqşünas

Dos.S.Əliyev – Tədris departamentinin direktoru

Prof.M.Hüseynova- Filologiya fakültəsinin dekanı vəzifəsini icra edən

Dos.A.Axundov- Tarix və coğrafiya fakültəsinin dekanı

Dos.A.Fərəcov- Riyaziyyat fakültəsinin dekanı

Dos.E.Mehbalıyeva- Kimya və biologiya fakültəsinin dekanı

Dos.Ş.Əliyeva- Məktəbəqədər təhsil fakültəsinin dekanı

Dos.L.Həsənova- İncəsənət və fiziki tərbiyə fakültəsinin dekanı

Dos.A.Daşdəmirov- Fizika fakültəsinin dekanı

Prof.F.Rüstəmov- İbtidai təhsil fakültəsinin dekanı

Prof.İ.Bayramov- Magistratura və doktotrantura şöbəsinin müdiri

Dos.L.Mürsəlbəyova - SABAH mərkəzinin rəhbəri

Dos.R.Sadıqov - davamlı təhsil və innovasiyalar şöbəsinin müdiri

M.Quliyeva- baş mühasib

Q.Qədimova- insan resursları şöbəsinin müdiri

Z.Həsənova- kitabxana informasiya mərkəzinin direktoru vəzifəsini icra edən

S.Abdullayev- inzibati təsərrüfat şöbəsinin müdiri

X.Əliyeva- ümumi şöbənin müdiri

F.Mirəliyev- informasiya və kommunikasiya texnologiyaları mərkəzinin direktoru

T.Kərimli- tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri

C.Hüseynov- mətbuat katibi

Dos.V.Əliyev- Həmkarlar İttifaqı Komitəsinin sədri

Dos.V.Məmmədov- Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri

İ.Nəsirov- Tələbə Gənclər Təşkilatının sədri

Təşkilat komitəsi tərəfindən Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin keçirilməsi ilə əlaqədar tədbirlər planı hazırlanaraq təsdiq edilmişdir. Tədbirlər planında aşağıdakılar nəzərdə tutulub:1) Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyi ilə bağlı təntənəli mərasimin keçirilməsi; 2) yubileyin beynəlxalq təşkilatlarla birgə qeyd edilməsi; 3) universitet məzunlarının forumunun keçirilməsi və Məzunlar cəmiyyətinin yaradılması; 4) ADPU-nun filiallarında və ali təhsil müəssisələrində Universitetin 100 illiyi münasibətilə tədbirlərin, silsilə elmi-praktiki konfransların keçirilməsi; 5) Xalq Təhsili Muzeyində Azərbaycan Dövlət Pedaqoji Universitetinin şərəfli inkişaf yolunu əks etdirən xüsusi guşənin yaradılması; 6) universitetin tarixini əks etdirən kitabların hazırlanması və nəşr olunması; 7) universitet haqqında sənədli filmin çəkilişi; 8) "Yubiley" medalının, poçt markasının, pul sikkələrinin, döş nişanlarının buraxılması ilə bağlı təkliflərin verilməsi; 9) intellektual və idman yarışlarının keçirilməsi; 10) universitet əməkdaşlarının dövlət səviyyəsində təltifi ilə bağlı təkliflərin verilməsi və s.

24-25 may 2021-ci i tarixlərində Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Türkiyə Cümhuriyyətinin İqtisadi İnkişaf və Sosial Araşdırmalar İnstitutu (İKSAD) ilə birgə ADPU-nun 100 illik yubileyinə həsr olunmuş "Elmdə və

təhsildə innovativ texnologiyalar" III Beynəlxalq simpoziumu keçirildi. ADPU-nun rektoru, professor Cəfər Cəfərov İKSAD ilə ilk dəfə birgə təşkil olunan elmi simpoziumun Türkiyənin elm və təhsil qurumları ilə ADPU arasındakı elmi əlaqələrdə yeni səhifə açdığını qeyd etdi. Simpoziumda Azərbaycan və Türkiyə alimləri ilə yanaşı, bir sıra başqa ölkələrin də elm nümayəndələrinin iştirak etməsinə diqqət yönəldən professor Cəfər Cəfərov III Beynəlxalq simpoziumun ADPU-nun 100 illik yubileyinə töhfə olmaqla bərabər, həm də gələcək elmi əməkdaşlığa və növbəti elmi araşdırmalara təkan verəcəyini bildirdi. İqtisadi İnkişaf və Sosial Araşdırmalar İnstitutunun rəhbəri doktor Mustafa Latif Emek Azərbaycan ilə Türkiyə arasında dostluq əlaqələrinin inkişafının əhəmiyyətini qeyd edərək, elmi əməkdaşlığın genişlənməsində ADPU ilə birgə fəaliyyətdən məmnunluğunu ifadə etdi.

ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, beynəlxalq əlaqələr üzrə prorektoru, professor Mahirə Hüseynova və Elmi-Tədqiqat Mərkəzinin müdiri, dosent Ərəstun Mehdiyev simpoziumun beynəlxalq statusa malik olaraq elmi müzakirələr üçün vacib platforma olduğunu qeyd etdilər.

11 iyun 2021-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyi ilə əlaqədar universitet rəhbərliyinin ölkənin ***aparıcı media qurumlarının nümayəndələri*** ilə görüşü keçirildi. Görüşün məqsədi media qurumlarını ölkənin yeganə ixtisaslaşmış pedaqoji ali təhsil müəssisəsinin 100 illiyi ilə bağlı görülən işlər, universitetdə tətbiq edilən yeniliklər və qarşıda duran vəzifələrlə tanış etmək, bu sahədə Kütləvi İnformasiya Vasitələri (KİV) ilə əməkdaşlıq və qarşılıqlı fəaliyyət imkanlarını müzakirə etmək idi.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov Pedaqoji Universitetin 100 illiyi ilə bağlı ölkə prezidenti İlham Əliyevin aprelin 17-də sərəncam imzaladığını və burada ADPU-nun zəngin və məhsuldar inkişaf yoluna xüsusilə qiymət verildiyini qeyd edərək son illərdə universitetdə pedaqoji və elmi pedaqoji kadr hazırlığında, təhsil və elm sahəsində qazanılan uğurları media nümayəndələrinin diqqətinə çatdırdı.

ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov Vətən müharibəsi iştirakçıları olan tələbələrə qayğı, işğaldan azad olunan bölgələrdə təhsil quruculuğunda Pedaqoji Universitetin rolu, yeni dövrün təhsil trendləri, bakalavriat, magistratura səviyyələrində tətbiq edilən yeniliklərlə bağlı jurnalistlərin suallarını cavablandırdılar.

16 iyun 2021-ci il tarixində ***Bakı Dövlət Universitetində*** (BDU) Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr olunmuş dəyirmi masa keçirildi. Dəyirmi masada BDU-nun rektoru, dosent Elçin Babayev, ADPU-nun rektoru, professor Cəfər Cəfərov, BDU-nun So-







siologiya kafedrasının professoru İzzət Rüstəmov, ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, BDU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, dosent Şahin Pənahov çıxış etdilər. Dəyirmi masada universitetdə görülən işlər, mübadilə proqramları, yeniliklər, strateji inkişaf planı, ali məktəbin tədris, təlim-tərbiyə, elmi tədqiqat, beynəlxalq əlaqələri istiqamətindəki fəaliyyəti, aparılan islahatlar, elmi-tədqiqat layihələri, BDU ilə ADPU arasında əməkdaşlığın istiqamətləri müzakirə edildi.

18 iyun 2021-ci ildə ***Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetində*** Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr olunmuş dəyirmi masa keçirildi. Dəyirmi masada ADMİU-nun rektoru, professor Ceyran Mahmudova, ADPU-nun rektoru, professor Cəfər Cəfərov, ADMİU-nun tədris işləri üzrə prorektoru, ADPU-nun məzunu olan professor Validə Məmmədova, elm və yaradıcılıq işləri üzrə prorektoru, dosent Sədaqət Əliyeva, kafedra müdirləri, professor Əli Əmirli və ADPU-nun aspirantı olmuş dosent Yeganə Eyvazova, ADPU-nun məzunu, baş müəllim Əminə Qədimova, ADPU-nun İncəsənət və fiziki tərbiyə fakültəsinin dekanı,





dosent Laçın Həsənova və kafedra müdiri, professor Zemfira Abdullayeva çıxış etdilər. Dəyirmi masada ADPU-nun inkişafının ən mühüm məqamları, burada aparılan islahatların əsas istiqamətləri müzakirə edildi, hər iki ali təhsil müəssisəsi arasında əməkdaşlığa dair müqavilə imzalandı. Qeyri-rəsmi hissədə ADMİU-nun yaradıcı kollektivi ADPU-nun 100 illiyi münasibətilə hazırlanmış xüsusi konsert proqramı ilə çıxış etdilər.

24 iyun 2021-ci ildə ***Sumqayıt Dövlət Universitetinin*** (SDU) təşkilatçılığı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr olunmuş "Azərbaycanda elmin və təhsilin inkişafında Azərbaycan Dövlət Pedaqoji Universi-







tetinin rolu" mövzusunda onlayn elmi-praktik konfrans keçirildi. Konfransda SDU-nun rektoru, professor Elxan Hüseynov, ADPU-nun rektoru, professor Cəfər Cəfərov ADPU-nun 100 illik yubileyinin dövlət səviyyəsində qeyd edilməsinin əhəmiyyətindən, hər iki ali təhsil müəssisəsi arasında əməkdaşlığın perspektivlərindən danışdılar. SDU-nun Filologiya fakültəsinin dekanı, dosent, ADPU-nun məzunu Sevinc Həmzəyevanın "Azərbaycanda elmin və təhsilin inkişafında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" və ADPU-nun pro-

fessoru, Universitet Ağsaqqallar Şurasının sədri Məlikməmməd Cəbrayılovun "Azərbaycanın ictimai-siyasi və mədəni həyatında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzularında məruzələri dinlənildi. Məruzələr ətrafında ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, prof.Asəf Zamanov, SDU-nun dosentləri Cavid Məmiyev, Riyaziyyat və onun tədrisi metodikası kafedrasının müdiri, dos.Xalidə Həsənova və Pedaqogika və psixologiya kafedrasının müdiri, dosent Aytəkin Məmmədova və b. çıxış etdilər.

29 iyun 2021-ci ildə ***Lənkəran Dövlət Universitetində*** ADPU-nun 100 illiyinə həsr olunmuş "Azərbaycanda müəllim kadrlarının hazırlanmasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzusunda onlayn konfrans keçirildi. Konfransda LDU-nun rektoru, professor Natiq İbrahimov, ADPU-nun rektoru, professor Cəfər Cəfərov ADPU-nun ölkədə müəllim kadrları hazırlığındakı rolundan danışdılar. LDU-nun İbtidai təhsil və məktəbəqədər təlim kafedrasının müdiri, dosent Ayəddin Əliyev "Azərbaycanda müəllim kadların hazırlanmasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzusunda, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov "Azərbaycanın ictimai-siyasi həyatında




və elm aləmində Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzusunda məruzə ilə çıxış etdilər. LDU-nun tədrisin təşkili və təlim texnologiyaları üzrə prorektoru, dosent İdrak Əsgərov konfransın əməkdaşlığın inkişafına verəcəyi töhfədən söz açaraq Pedaqoji Universitetin 100 illik yubileyinin keçirilməsinin ölkə miqyaslı əlamətdar tarixi hadisələrdən biri olduğunu qeyd etdi.

30 iyun 2021-ci iltarixində ***Bakı Mühəndislik Universitetində*** Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinə həsr edilən onlayn tədbir keçirildi. Tədbirdə BMU-nun rektoru, professor Havar Məmmədov, ADPU-nun rektoru, professor Cəfər Cəfərov, ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov, ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, BMU-nun Azərbaycan dili və ədəbiyyatı kafedrasının müdiri, dosent Emin Ağayev çıxış ediblər.




8 sentyabr 2021-ci il tarixində ***Naxçıvan Dövlət Universitetinin*** (NDU) təşkilatçılığı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr edilmiş konfrans keçirildi.

"Zoom" platforması üzərindən onlayn şəkildə təşkil olunan konfransda NDU-nun rektoru, dosent Elbrus İsayev, ADPU-nun rektoru, professor Cəfər Cəfərov, ADPU-nun elm və innovasiyalar üzrə





prorektoru, professor Asəf Zamanov, NDU-nun Azərbaycan tarixi kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Zəhmət Şahverdiyev, ADPU-nun Riyazi analiz kafedrasının professoru Məlikməmməd Cəbrayılov, NDU-nun Kimya kafedrasının dosenti Akif Əliyev çıxış etdilər. Tədbirdə ADPU-nun və Naxçıvan Dövlət Universitetinin Azərbaycanda elmi-pedaqoji potensialın formalaşmasında, pedaqoji və elmi-pedaqoji kadr hazırlığındakı xidmətləri önə çəkilmiş, qarşılıqlı fikir mübadiləsi aparılmış, əməkdaşlığın yolları müəyyənləşdirilmişdir.

26 avqust 2021-ci il tarixində ***Azərbaycan Dövlət Pedaqoji Universitetinin*** (ADPU) 100 illik yubileyi münasibətilə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, prorektorlar, fakültə dekanları, ictimai və tələbə təşkilatlarının nümayəndələri ***Fəxri xiyabanda, Şəhidlər xiyabanında və İkinci Fəxri xiyabanda*** oldular. Əvvəlcə kollektiv Fəxri xiyabanda Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin xatirəsini ehtiramla anaraq abidəsi önünə əklil qoydular. Daha sonra görkəmli oftalmoloq-alim Zərifə xanım Əliyeva, dövlət və ictimai xadim Əziz Əliyev və əməkdar elm xadimi, professor Tamerlan Əliyevin xatirələrini ehtiramla anaraq məzarları üzərinə gül dəstələri düzdülər.

ADPU kollektivi Pedaqoji Universitetin 100 illik fəaliyyəti dövründə yetişdirdiyi akademiklər Yusif Məmmədəliyev, Heydər Hüseynov, Zahid Xəlilov, xalq şairi Səməd Vurğun, İsmayıl Şıxlı, Süleyman Rəhimov, dövlət və ictimai xadim Şıxəli Qurbanov, Sovet İttifaqı Qəhrəmanları Xıdır Mustafayev, Fariz Səfərov, Səlahəddin Kazımov və başqalarının məzarlarını da ziyarət etdi. Sonra Şəhidlər xiyabanını ziyarət edən kollektiv Şəhidlər xiyabanında əbədi məşəl kompleksi önünə əklil qoydu, şəhid türk əsgərlərinin xatirəsinə ucaldılmış abidəni ziyarət etdilər. Daha sonra İkinci Fəxri xiyabanı ziyarət edən universitet kollektivi Vətənimizin azadlığı uğrunda canından keçən şəhidlərin əziz xatirəsini ehtiramla andılar.







## Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixinin ən mühüm hadisələri

**1921-ci il, 13 iyun -** Azərbaycan SSR Xalq Maarif Komissarlığı tərəfindən Ali Pedaqoji Kişi İnstitutun nizamnaməsi təsdiq edilmişdir.
**1921-ci il, 26 avqust -** Ali Kişi Pedaqoji İnstitutunun açılması ilə bağlı Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri N.Nərimanov tərəfindən dekret imzalanmışdır.
**1921-1924-cü illər -** Ali Kişi Pedaqoji İnstitutuna Fətulla bəy Rzabəyli rəhbərlik etmişdir.
**1921-ci il, 12 noyabr -** Ali Pedaqoji Kişi İnstitutunun Pedaqoji Şurasının ilk iclası keçirilmişdir.
**1921-ci il -** Ali Pedaqoji İnstitutun ilk himni -"Gənclik marşı" (sözləri A.Şaiq, musiqisi Ü.Hacıbəyov) yazılmışdır.
**1922-ci il, 29 noyabr -** Birinci Məktəbəqədər Qadın Tərbiyə İnstitutu Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri Q.Musabəyovun dekreti əsasında Azərbaycan Qadın Pedaqoji İnstitutuna çevrilmişdir.
**1922/23-cü tədris ili-** 12 saylı məktəb Fətulla bəy Rzabəyli tərəfindən Ali Pedaqoji Kişi İnstitutunun binasına köçürülmüş və burada Nümunə məktəbi kimi fəaliyyətə başlamışdır.
**1924-cü il-** Xalq Maarif Komissarlığının Baş ictimai tərbiyə idarəsi tərəfindən Nümunə məktəbinə onun yaradıcısı Abdulla Şaiqin adı verilmişdir.
**1924-cü il -** Ali Pedaqoji Kişi Pedaqoji İnstitutunu 28 nəfər bitirmişdir.
**1924-cü il -** Xalq Maarif Komissarlığının Azərbaycan Dövlət Xalq nəşriyyatında "Ali Pedaqoji İnstitutu salnaməsi" (1924) məcmuəsi nəşr olunmuşdur.
**1924-cü il -** Ali Pedaqoji Kişi İnstitutuna Məmməd Əfəndiyev rəhbərlik etmişdir.
**1924/25-ci tədris ili-** Ali Pedaqoji Kişi İnstitutunda 4 illik tədris planı tətbiq edilmişdir.
**1925-ci il-** Azərbaycan SSR XMK Kollegiyasının 1923-cü il 3 aprel tarixli qərarına uyğun olaraq Ali Pedaqoji Kişi İnstitutu və Ali Pedaqoji Qadın İnstitutu inzibati cəhətdən birləşdirildi.
**1925-ci il -** Ali Pedaqoji Kişi Pedaqoji İnstitutunu Həbib bəy Mahmudbəyov və Şarif Əhmədzyanoviç Manatov rəhbərlik etmişdir.
**1926-1927-ci illər -** Ali Pedaqoji Kişi Pedaqoji İnstitutuna Cəlil Məmmədzadə rəhbərlik etmişdir.
**1927-ci il-** Ali Pedaqoji İnstitut V.İ.Lenin adına Azərbaycan Dövlət Universitetinin Pedaqoji fakültəsi ilə birləşdirildi
**1929-cu il, 28 sentyabr -**Azərbaycan SSR XMK-nın əmri ilə Ali Pedaqoji İnstitutun yenidən təşkil edilməsi qərara alındı.
**1930-cu il -** V.İ.Leninin adı Azərbaycan Dövlət Pedaqoji İnstitutuna verildi.
**1930-cu il, 14 yanvar-** Bakı Opera Teatrının binasında ADU-nun 10 illiyinə həsr olunmuş möhtəşəm tədbir keçirildi.
**1930-cu il, 10 iyun-** Azərbaycan SSR Xalq Komissarları Sovetinin qərarı ilə ADU-nun ayrı-ayrı fakültələrinin bazasında müstəqil sahə institutları yaradıldı. Azərbaycan Pedaqoji İnstitutu kimi yenidən təşkil olundu.
**1930/31-ci tədris ili-** Azərbaycan Pedaqoji İnstitutunda Müfəttiş-inspektor fakültəsi açılmışdır.
**1931-ci il, 1 yanvar-** Məmməd Abbas oğlu Bayramov Azərbaycan Pedaqoji İnstitutuna direktor təyin edildi.
**1932/33-cü tədris ili-** Azərbaycan Pedaqoji İnstitutunda Siyasi maarif fakültəsi açılmışdır.
**1933-cü il -** Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutu və Xalq Maarif Kadrlarının İxtisasını Artırma İnstitutu Azərbaycan Pedaqoji İnstitutuna birləşdirildi.
**1931-ci il, 15 sentyabr-** Azərbaycan Pedaqoji İnstitutunun direktoru M.Bayramov ÜİK(b)P-nin Zaqafqaziya Vilayət katibi Kartvelişviliyə, Azərbaycan K(b)P MK-nın katibi Ağa Sultanova, Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri Dadaş Bünyadzadəyə, Xalq maarif komissarı Maqsud Məmmədova Azərbaycan Pedaqoji İnstitutunun V.İ.Lenin adına Azərbaycan Pedaqoji Akademiyasına çevrilməsi ilə bağlı məktub ünvanlamışdır.
**1932-ci il-** Azərbaycan Pedaqoji İnstitutunda 3 fakültə fəaliyyət göstərirdi:1) Ədəbiyyat-ictimaiyyat; 2)Pedologiya-pedaqoji; 3) Təbiyyat-riyaziyyat.
**1932-ci il, 17 fevral** –Azərbaycan Pedaqoji İnstitutunun aspiranturasına ilk qəbul keçirildi.
**1933-cü il, avqust** – Azərbaycan Pedaqoji İnstitutunda 26 kafedra fəaliyyət göstərirdi.
**1933-cü il, avqust-dekabr-**Azərbaycan Pedaqoji İnstitutunun direktoru vəzifəsində Bəşir Nurəli oğlu Bünyatov çalışırdı.
**1933-cü il, dekabr -** Azərbaycan K(b)P MK-nın büro iclasında Mirzə Sultan oğlu Məmmədov Azərbaycan Pedaqoji İnstitutuna direktor təyin edildi.
**1934-1940-cı illər -** Azərbaycan Pedaqoji İnstitutunda "Lenin tərbiyəsi uğrunda" qəzet nəşr olunub.
**1935-ci il -** "Azərbaycan Pedaqoji İnstitutunun Xəbərləri"nin I buraxılışı nəşr olunub.
**1936-cı il-** Azərbaycan Pedaqoji İnstitutunun Pedaqoji fakültəsinin məktəbəqədər şöbəsi müstəqil fakültəyə çevrildi. Fakültənin dekanı vəzifəsinə dos. Dilrubə Mustafayeva təyin olundu.
**1938/39-cu tədris ili-** V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunda rus dili və ədəbiyyatı şöbələri açıldı.
**1938-ci il, 2 noyabr-** Azərbaycan Xalq Maarif Komissarlığının əmri ilə Azərbaycan Pedaqoji İnstitutunun nəzdindəki ikiillik Müəllimlər İnstitutu ayrılıb müstəqil instituta çevirdi.
**1939-cu il, 29 aprel-** SSRİ Nazirlər Soveti yanında Ali Məktəb İşləri üzrə Ümumittifaq Komitəsi tərəfindən

Azərbaycan Dövlət Pedaqoji İnstitutunun yeni Nizamnaməsi təsdiq olunub.
**1940-cı il, 11 mart -** Azərbaycan K(b)P MK bürosunun qərarı ilə Ələsgər Mahmud oğlu Həşimov Azərbaycan Pedaqoji İnstitutuna direktor təyin edildi.
**1941-ci il, 5 sentyabr -** Azərbaycan Xalq Komissarları Sovetinin qərarı ilə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutu Azərbaycan Pedaqoji İnstitutunun qiyabi şöbəsinə, Xarici Dillər İnstitutu isə Xarici dillər fakültəsinə çevrildi.
**1941-ci il, 24 iyun -** İnstitut müvəqqəti olaraq Voroşilov (indiki Səbail) rayonunun Mədəniyyət Sarayına köçürüldü. Binada 1543 №-li hərbi hospital yerləşdirildi. Saray 9 yanvar (indiki Xaqani küçəsi, 45) küçəsi ilə Kirov (Bülbül prospekti, 22) prospektinin kəsişməsində yerləşirdi.
**1941-ci il, 19 sentyabr-** Azərbaycan Xalq Komissarları Soveti və Azərbaycan K(b)P MK "V.İ.Lenin adına APİ-nin S.M.Kirov adına ADU ilə birləşdirilməsi haqqında" qərar qəbul etdi. Pedaqoji İnstitut müvəqqəti olaraq Azərbaycan Dövlət Universitetinə birləşdirildi.
**1943-cü il, 1 oktyabr-** Azərbaycan Pedaqoji İnstitutu ADU-dan ayrılaraq öz fəaliyyətini yenidən bərpa etdi. Ağaməd Səməd oğlu Abdullayev instituta direktor təyin edildi.
**1943-cü il-** Pedaqoji İnstitutda Azərbaycan tarixi kafedrası təşkil olundu. Kafedraya İsmayıl Hüseynov rəhbərlik edirdi.
**1945-ci il, yanvar-iyun-** Pedaqoji İnstituta Məmməd Həmid oğlu Ələkbərov rəhbərlik etdi. Sonra onu Əhməd Yusif oğlu Seyidov əvəz etdi.
**1948/49-cu tədris ili-** V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Xarici dillər fakültəsinin bazasında Pedaqoji Xarici Dillər İnstitutu təşkil olundu.
**1948/49-cu tədris ili-** Pedaqoji İnstitutda Rus dili və ədəbiyyatı fakültəsi, **1949/50-ci tədris ili-** Pedaqoji İnstitutda Bədən tərbiyəsi fakültəsi yaradıldı.
**1947/48-ci tədris ili-** Pedaqoji İnstitutda Dil-ədəbiyyat, Tarix, Fizika-riyaziyyat, Təbiyyat, Xarici dillər fakültələri fəaliyyət göstərirdi.
**1946-cı il, 26 oktyabr -** Azərbaycan K(b)P MK-nın büro iclasında V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun 25 illik yubileyinin keçirilməsi qərara alındı.
**1952-ci il, 24 iyun-** Pedaqoji İnstitutun Rus dili və ədəbiyyatı fakültəsi M.F.Axundov adına Rus dili və Ədəbiyyatı İnstitutunun tərkibinə verildi.
**1950-ci il, may -avqust** – Pedaqoji İnstituta Cəfər Xəndan Hacıyev rəhbərlik etdi.
**1950-ci il avqust - 1951 -ci il dekabr -** Pedaqoji İnstituta Mehdi Mehdizadə rəhbərlik etdi.
**1951-ci il dekabr -1954-cü il -** Pedaqoji İnstituta Həmid Qədirov rəhbərlik etdi.
**1953-cü il -** "ADPİ-nin Elmi əsərləri"nin I cildi nəşr olundu.
**1954-cü ilin iyun - 1956-cı il dekabr-** Pedaqoji İnstituta Cəbrayıl Ələsgərov rəhbərlik etdi.
**1956-cı il dekabr -1962-ci il sentyabr -** Pedaqoji İnstituta Mehdixan Vəkilov rəhbərlik etdi.
**1954-cü il, oktyabr -** Pedaqoji İnstitutda Bədən tərbiyəsi fakültəsi yaradıldı.
**1958/1959-cu tədris ili-** Pedaqoji İnstitutda İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsi açıldı.
**1956/1957-ci tədris ili-** Pedaqoji İnstitutda 23 kafedra fəaliyyət göstərirdi.
**1958-ci il, 1 sentyabr-** "Gənc müəllim" qəzetinin ilk sayı nəşr olunub.
**1959-cu il, 1 iyul-** Azərbaycan Qiyabi Pedaqoji İnstitutu Azərbaycan Dövlət Pedaqoji İnstitutuna birləşdirildi.
**1966-cı il-** Pedaqoji İnstitutun fasadına V.V.Mayakovskinin xatirə lövhəsi vurulmuşdur.
**1966-cı il -** V.İ.Lenin adına APİ-də İctimai peşələr fakültəsi yaradıldı.
**1966-cı il, 11 oktyabr-** Azərbaycan KP MK və Nazirlər Sovetinin 564 nömrəli qərarına uyğun olaraq 1967/68-ci tədris ilində Azərbaycan Pedaqoji İnstitutunun Naxçıvan şəhərində filialı açıldı.
**1968/69-cu tədris ili-** Pedaqoji İnstitutun Xankəndi filialı yaradıldı.
**1970-ci il, yanvar -** Pedaqoji İnstitutda əyani şöbədə 9, qiyabi şöbədə 6, axşam şöbəsində isə 2 fakültə fəaliyyət göstərirdi. Əyani şöbənin 9 fakültəsində 8200 tələbə təhsil alırdı.
**1970-ci il, 14 iyul- 1981-ci il, 5 avqust** –Həşim Nizam oğlu Ağayev Pedaqoji İnstitutun rektoru vəzifəsində çalışıb.
**1971-ci il, dekabr-** Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev Pedaqoji İnstitutun kommunistlərinin ümumi yığıncağında iştirak edib və geniş nitq söyləyib.
**1972 -ci il, sentyabr-** Pedaqoji İnstitutun qiyabi və axşam şöbələrində 6186 tələbə təhsil alırdı.
**1972-ci il, 13 aprel -** Pedaqoji İnstitutda Naxçıvan filialı günləri keçirilib.
**1972-ci il, 4 oktyabr-** Azərbaycan KP MK-nın I katibi Heydər Əliyev Naxçıvanda olarkən filialın əməkdaşları ilə görüşüb və regionda müstəqil institutun yaradılmasının vacibliyi məsələsini irəli sürüb.
**1972-ci il, 20 iyun -** Azərbaycan KP MK-nın Büro iclasında (protokol №41) "Naxçıvan Pedaqoji İnstitutunun təşkili haqqında" qərar qəbul edilib.
**1972-ci il, 2 fevral-** Azərbaycan KP MK Büro iclasında (protokol №29) Pedaqoji İnstitutun 50 illik yubileyinin keçirilməsi məsələsi müzakirə olunub və "Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 50 illiyi haqqında" qərar qəbul edilib.
**1972-ci il, 19 may -** C.Məmmədzadə adına Naxçıvan Dövlət Musiqili Dram Teatrında ADPİ-nin 50 illik yubileyi ilə bağlı elmi sessiya keçirilib.

**1972-ci il, 26 may -** SSRİ Ali Soveti Rəyasət Heyətinin Fərmanı ilə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu Qırmızı Əmək Bayrağı ordeni ilə təltif edildi.
**1972-ci il, 15 iyun -** Pedaqoji İnstitutda elmi-tədqiqat şöbəsi yaradıldı.
**1973-cü il, 28 noyabr-** Pedaqoji İnstitutun filialının bazasında müstəqil Xankəndi Pedaqoji İnstitutu təşkil edildi.
**1973-cü il, 2 mart -** V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 50 illiyi şərəfinə təntənəli yığıncaq indiki Dövlət Təhlükəsizliyi Xidmətinin Mədəniyyət Mərkəzində keçirilib.
**1973-cü il -** Azərbaycan SSR Ali və Orta İxtisas Təhsil Nazirliyi və Azərbaycan SSR Maarif Nazirliyinin birgə əmri ilə Azərbaycan Pedaqoji İnstitutunda İxtisasartırma fakültəsi yaradıldı.
**1975-ci il -** Pedaqoji İnstitutda "Şagirdlərin peşəyönümü" elmi-tədqiqat laboratoriyası təşkil olundu.
**1981-ci il, avqust-** Prof.Afad Qurbanov ADPİ-nin rektoru təyin edildi.
**1981-ci il, avqust -** Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev Pedaqoji İnstitutda quruculuq işləri və tələbə qəbulu prosesi ilə yaxından tanış olmaq məqsədi ilə institutda olmuşdur.
**1981-ci il, 23 dekabr-** Azərbaycan KP MK Bürosunda Azərbaycan Dövlət Pedaqoji İnstitutunun 60 illik yubileyinin keçirilməsi qərara alındı.
**1981- ci il, 21 dekabr** -Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fərmanı ilə V.İ.Lenin adına Qırmızı Əmək Bayrağı ordenli Azərbaycan Dövlət Pedaqoji İnstitutu Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif edilmişdir.
**1981-ci il, 23 dekabr-** Dövlət Təhlükəsizliyi Xidmətinin Mədəniyyət Mərkəzində Sov.İKP MK-nın Siyasi Bürosu üzvlüyünə namizəd, Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyevin iştirakı ilə V.İ.Lenin adına ADPİ-nin 60 illik yubileyi keçirildi.
**1989-cu il, 7 aprel-** Azərbaycan EA-nın müxbir üzvü, prof.Səlvər Aslanov Azərbaycan Dövlət Pedaqoji İnstitutuna rektor təyin edildi.
**1989-cu il, 1 noyabr-** Azərbaycan SSR Xalq təhsili nazirinin 1160 saylı əmrinə əsasən Şuşada Azərbaycan Pedaqoji İnstitutunun Şuşa fakültəsi yaradıldı.
1991-ci il, 26 yanvar- ADPİ-nin Şuşa fakültəsinin bazasında Şuşa filialı yaradıldı.
**1991-ci il, 1 aprel -** Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 76 saylı qərarı ilə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu Universitetə çevrildi.
**1991-ci il, 26 noyabr-** Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 292 saylı qərarı ilə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji Universiteti Nəsirəddin Tusi adına Azərbaycan Dövlət Pedaqoji Universiteti adlandırıldı.
**1991-ci il, 1 iyul -** Azərbaycan Respublikası Nazirlər Kabinetinin 200 saylı əmri ilə Şamaxıda N.Tusi adına ADPU-nun filialı açıldı.
**1994-cü il-** Pedaqoji Universitetin I prorektoru prof.Nizami Xudiyev Pedaqoji Universitetə rektor təyin olundu.
**1996-cı il, 5 sentyabr-** prof.Bəhlul Ağayev Pedaqoji Universitetin rektoru təyin edildi.
**1997-ci il, sentyabr-** ADPU-da aspirantura şöbəsinin bazası əsasında magistratura və doktorantura şöbəsi yaradıldı.
**2005-ci il, dekabr-** Pedaqoji Universitetdə Əcnəbi tələbələrin işi üzrə fakültə yaradıldı.
**2006-cı il, 21 aprel-** AMEA-nın müxbir üzvü, əməkdar elm xadimi, fizika-riyaziyyat elmləri doktoru, prof.Yusif Məmmədov Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru vəzifəsinə təyin olunmuşdur.
**2006-cı il, 26 oktyabr-** Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin Sərəncamı ilə Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə Pedaqoji Universitetin bir qrup əməkdaşı yüksək dövlət mükafatlarına layiq görülmüşdür.
**2006-cı il, 28 dekabr-** Azərbaycan Dövlət Pedaqoji Universitetinin əsas binasında (Səbail korpusu) bu ali təhsil ocağının 85 illik yubileyinə həsr olunmuş təntənəli yığıncaq keçirilmişdir.
**2007-ci il-** ADPU-nun Pedaqoji fakültənin nəzdində Pedaqoji təhsilin problemləri adlı elmi-tədqiqat laboratoriyası yaradılmışdır.
**2008-ci il, 4 aprel** - ADPU-nun yeni nizamnaməsini Azərbaycan Respublikası Ədliyyə Nazirliyi tərəfindən təsdiq olunmuşdur.
**2012-ci il, 20 aprel -** Azərbaycan Dövlət Pedaqoji Universitetinin əsas binasında (Səbail korpusu) bu ali təhsil ocağının 90 illik yubileyinə həsr olunmuş təntənəli yığıncaq keçirilmişdir.
**2012-ci il, 18 aprel-** Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin Sərəncamı ilə Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə Pedaqoji Universitetin bir qrup əməkdaşı yüksək dövlət mükafatlarına layiq görülmüşdür.
**2015-ci il, 26 noyabr -** Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin Sərəncamı ilə Azərbaycan Müəllimlər İnstitutu (AMİ) ADPU-ya qoşuldu və onun 7 filialı (Qazax, Zaqatala, Şəki, Quba, Ağcabədi, Cəlilabad, Şamaxı) ADPU -nun strukturuna çevrildi.
**2016-cı il, 3 fevral-** Azərbaycan Respublikası Nazirlər Kabinetinin qərarı ilə Bakı Sənaye-Pedaqoji Kolleci Azərbaycan Dövlət Pedaqoji Kollecinə (ADPK) birləşdirilməklə ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci kimi fəaliyyət göstərməyə başladı.
**2016-cı il, 29 aprel-** Azərbaycan Respublikasının Prezidenti İ.Əliyevin Sərəncamı ilə ADPU-nun Qazax

filialı Bakı Dövlət Universitetinə, Zaqatala filialı isə Azərbaycan Dövlət İqtisad Universitetinə verildi.
**2016-cı il, 23 iyun-** Azərbaycan Respublikasının Prezidenti İ.Əliyevin Sərəncamı prof.Cəfər Məmməd oğlu Cəfərov Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru vəzifəsinə təyin olundu.
**2019-cu il, 28 iyun** - Corc Vaşinqton Universiteti ilə ikili diplom proqramı ilə bağlı ADPU-nun rektoru, professor Cəfər Cəfərov və Corc Vaşinqton Universitetinin dekanı Maykl Föyer tərəfindən bəyannamə imzalandı.
**2020-ci il, 31 yanvar** - Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) və ABŞ-ın Corc Vaşinqton Universiteti arasında ikili diplom proqramı üzrə saziş imzalandı.
**2016-cı il-** Pedaqoji Universitet ilə Cenevrə Akademik Mərkəzi (İsveçrə), Kazan Federal Universiteti (Rusiya Federasiyasının Tatarıstan Respublikası), Kotelnikov adına Radiotexnika və Elektronika İnstitutu (Rusiya) arasında əməkdaşlıq müqaviləsi imzalandı.
**2017-ci il -** Alanya Alaaddin Keykubat Universiteti (Türkiyə), Bülent Ecevit Universiteti (Türkiyə), Cənubi Qazaxıstan Pedaqoji Universiteti (Qazaxıstan Respublikası), Final Beynəlxalq Universiteti (Şimali Kipr), Səlcuq Universiteti (Türkiyə), M.Akmulla adına Başqırdstan Dövlət Pedaqoji Universiteti (Rusiya), Çankırı Karatekin Universiteti (Türkiyə) arasında əməkdaşlıq müqaviləsi imzalandı.
**2018-ci il-** Naberejnye Çelnıy Dövlət Pedaqoji Universiteti, M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin Tarix fakültəsi, Yessenov Universiteti (Qazaxıstan), Qazi Universiteti (Türkiyə), Hacettepe Universiteti (Türkiyə), Van Yüzüncü Yıl Universiteti (Türkiyə), Mordovia Dövlət Pedaqoji İnstitutu, Vollonqonq Universiteti (Dubay), Atatürk Universiteti, Kafkas Universiteti (Türkiyə), Kopenhagen Universitet Kolleci (UCC-Danimarka), Aydın Adnan Menderes Universiteti (Türkiyə) arasında əməkdaşlıq müqaviləsi imzalandı.
**2019-cu il-** Rusiya Dövlət Humanitar Universiteti (Rusiya), Əhməd Dahlan Universiteti (İndoneziya), İğdir Universiteti (Türkiyə), Qazax Milli Pedaqoji Qızlar Universiteti (Qazaxıstan) Corc Vaşinqton Universiteti Təhsil və İnsan İnkişafı məktəbi (ABŞ), Aurel Vlaysu Universiteti (Rumınya), Rusiya Dövlət Peşə Pedaqoji Universiteti (Rusiya), Van Yüzüncü Yıl Universiteti (Türkiyə), Ukrayna Təhsil Elmləri Milli Akademiyasının Təhsil Menecmenti Universiteti (Ukrayna), Dokuz Eylül Universiteti (Türkiyə) arasında əməkdaşlıq müqaviləsi imzalandı.
**2019-cu il, 30 yanvar-** ADPU Elmi Şurasında "ADPU-nun Fəxri doktoru" və "ADPU-nun Fəxri professoru" adlarının verilməsi, "Şərəf kitabı"nın hazırlanması və auditoriyalara fəxri adların verilməsi haqqında Əsasnamə təsdiq edilmişdir.
**2021-ci il, 17 aprel-** Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncam imzalamışdır.
**2021-ci il, 4 may -** ADPU-nun rektoru, prof.Cəfər Cəfərov "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin keçirilməsi barədə" əmr imzalamış, nəzərdə tutulmuş tədbirlərin icrasını təmin etmək məqsədilə Təşkilat komitəsi yaradılmışdır:
**2021-ci il, 16 iyun** - Bakı Dövlət Universitetində (BDU) Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr olunmuş dəyirmi masa keçirilmişdir.
**2021-ci il, 18 iyun-** Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr olunmuş dəyirmi masa keçirilmişdir.
**2021-ci il, 24 iyun -** Sumqayıt Dövlət Universitetinin (SDU) təşkilatçılığı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr olunmuş "Azərbaycanda elmin və təhsilin inkişafında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzusunda onlayn elmi-praktik konfrans keçirilmişdir.
**2021-ci il, 29 iyun -** Lənkəran Dövlət Universitetində ADPU-nun 100 illiyinə həsr olunmuş "Azərbaycanda müəllim kadrlarının hazırlanmasında Azərbaycan Dövlət Pedaqoji Universitetinin rolu" mövzusunda onlayn konfrans keçirilmişdir.
**2021-ci il, 30 iyun-** Bakı Mühəndislik Universitetində Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinə həsr edilən onlayn tədbir keçirilmişdir.
**2021-ci il, 26 avqust-** Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyi münasibətilə ADPU-nun rektoru, professor Cəfər Cəfərov, prorektorlar, fakültə dekanları, ictimai və tələbə təşkilatlarının nümayəndələri Fəxri xiyabanda, Şəhidlər xiyabanında və İkinci Fəxri xiyabanda oldular.
**2021-ci il, 8 sentyabr -** Naxçıvan Dövlət Universitetinin (NDU) təşkilatçılığı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyinə həsr edilmiş konfrans keçirilmişdir.

# Mündəricat

## IV Fəsil
## Müstəqillik illərində Azərbaycan Dövlət Pedaqoji Universitetinin inkişafı



Redaktor: **dos.Ərəstun Mehdiyev**
Dizayner: **Zahid Məmmədov**
Fotoqraf: **Nurlan Səmədov**
Texniki redaktor: **Aynur Abıyeva**
Korrektor: **Elnarə Mirzəli**